***Biz artıq böyük türk dünyası, türk xalqları, türkdilli xalqların ümumi kökləri, müştərək mədəniyyəti haqqında danışırıq. Bunları böyük tarixi şəxsiyyətlərin yaradıcılığı əsasında edirik.***

**Heydər Əliyev**
**Azərbaycan Respublikasının Prezidenti**

## ANAR

*şer mətnlərinin, müəlliflər və əsərlər haqqında məlumatların, lüğətin tərtibçisi, ön və son sözlərin müəllifi*

## NAZİM İBRAHİMOV

*kitabın layihəsi, dizaynı və çapa hazırlanması*

***Biz artıq böyük türk dünyası, türk xalqları, türkdilli xalqların ümumi kökləri, müştərək mədəniyyəti haqqında danışırıq. Bunları böyük tarixi şəxsiyyətlərin yaradıcılığı əsasında edirik.***

**Heydər Əliyev**
**Azərbaycan Respublikasının Prezidenti**


**ANAR**

*şer mətnlərinin, müəlliflər və əsərlər haqqında məlumatların, lüğətin tərtibçisi, ön və son sözlərin müəllifi*

**NAZİM İBRAHİMOV**

*kitabın layihəsi, dizaynı və çapa hazırlanması*

*“Kitabi - Dədə Qorqud” dastanının 1300 illik yubileyinə həsr olunur*

# MİN BEŞ YÜZ İLİN OĞUZ ŞERİ

## *Antologiya*

**I kitab**

AZƏRBAYCAN NƏŞRİYYATI
BAKI—1999

# ÖN SÖZ

Bu gün Oğuz dili adlanan bir dil yoxdur. Ancaq Oğuzlar çağdaş Türkiyə və Azərbaycan türklərinin, türkmənlərin və qaqauzların əcdadı olduğu kimi, indi danışdığımız dillər də türk dillərinin Oğuz qrupuna aiddir. "Kitabi Dədəm Qorqud" qədim Oğuzların oğuz dilində yaranmış abidəsidir. "Koroğlu" dastanı, Yunus İmrənin, Füzulinin, Məxtumqulunun şerləri Oğuzların varisləri — Türkiyə və Azərbaycan türklərinin, türkmənlərin ortaq mənəvi və mədəni sərvətləridir. Azərbaycanda da, Türkiyədə də, Türkmənistanda da bu xalqların çoxəsrlik şer xəzinəsini ehtiva edən neçə-neçə poeziya antologiyaları nəşr edilmişdir. Oxuculara təqdim etdiyimiz bu antologiya onlardan fərqlidir. İlk dəfə olaraq Oğuzların varisləri Azəri və Türkiyə türklərinin, türkmənlərin və qaqauzların şer sərvəti bir kitabda toplanır və antologiyamızı "Min beş yüz ilin Oğuz şeri" adlandırmağımız bununla bağlıdır. Min beş yüz il — on beş əsr tarixi isə Oğuz qrupunun da, başqa türk xalqlarının da müştərək yazılı abidələrinin — Orxon-Yenisey yazılarının VI-VIII əsrlərə aid olmasına əsaslanır. Yəni, dilimizin ən qədim mətnləri — bir çox alimlərin fikrincə, bunlar məhz şer mətnləridir — min beş yüz il bundan qabaq varmış. Türk dillərinin müştərək abidələrini — Qaşqarlı Mahmudun "Divani lüğat-it-Türk" əsərindəki şer örnəklərini, Yusif Balasaqunlunun "Qutadğu bilik" poemasından parçaları, Əhməd Yəsəvinin hikmətlərindən nümunələri antologiyaya daxil etməklə bərabər, Oğuz qrupuna daxil olmayan türk dillərində yaranmış və türk dünyasının iftixarı olan şah əsərləri, fraqmentlər şəklində olsa da, oxuculara təqdim edirik. Məsələn, qırğızların "Manas" dastanından bir parça, özbək şairi Ə. Nəvainin qəzəlləri, qazax şairi Abaydan və tatar şairi Tukaydan bəzi nümunələr.

Zənnimcə, məhz bu prinsiplərlə tərtib edilmiş antologiya Türkiyə, Azərbaycan, Türkmənistan şeri haqqında, ümumiyyətlə, türk şerinin qədimlərdən bu günə qədər gələn zəngin inkişaf yolu haqqında dolğun və aydın təsəvvür yarada bilər.

Türk şairlərinin bəziləri — Nizami, Xaqani, C. Rumi və başqaları əsərlərini doğma dillərində deyil, fars dilində yaratmışlar. Milli ədəbiyyatlarımızın ayrılmaz tərkib hissəsi sayılan bu əsərlərdən nümunələri də sətri, yaxud poetik tərcümələrlə antologiyamıza daxil edirik.

Türk şerinin, özəlliklə qədim Oğuz — bugünkü türk, azəri, türkmən şerinin tarixi və xüsusiyyətləri haqqında son sözdə daha ətraflı danışılacaq.

Oğuz xalqlarının uzun əsrlər boyu yaranmış zəngin folklorunu — müəlliflərinin adları əksər hallarda məlum olmayan şifahi şerin örnəklərini antologiyamızın 1 cildinin sonunda veririk. Çünki XX əsr ədəbiyyatını (20-30 illərdə yaradıcılığa başlamış şairlərdən 90-cı illərdə ədəbiyyata gəlmiş müəlliflərə qədər) əhatə edən ikinci cildə daxil olan şifahi şerlərin yaradıcılarının adları və yaşadıqları illər məlumdur və onlar (məsələn, Türkiyədən Aşıq Ehsani, Azərbaycandan Mikayıl Azaflı) münasib yerlərdə təqdim olunacaqdır.

**ANAR**

# TÜRK XALQLARININ ORTAQ YAZILI VƏ ŞİFAHİ ƏDƏBİYYATI

## ORXON-YENİSEY YAZILARI
(VI-VIII əsrlər)

*Orxon-Yenisey yazılarını rus alimlərindən S. Malovun, İ. Steblevanın, Türkiyə alimlərindən N. H. Orkunun, R. R. Aratın, M. Erginin, T. Tekinin, Ə. B. Ercilasunun, Azərbaycan alimlərindən F. Zeynalovun, Ə. Rəcəbovun, Y. Məmmədovun nəşrləri və ruscaya, Türkiyə türkcəsinə və Azəri türkcəsinə tərcümələri əsasında antologiyamız üçün hazırlayarkən mətnlərin cümlə quruluşunu və leksik tərkibini mümkün qədər saxlamağa çalışdım. Azəricəyə yalnız fonetik cəhətdən uyğunlaşdırdım. Məsələn: yir-yer, olurtdum-oturtdum, tört-dörd, bolmuş-olmuş, barmış-varmış, esit-eşit, tokuz-doqquz və s. və b. k. Maraqlıdır ki, bir çox hallarda Orxon-Yenisey kitabələrində Türkiyə türkcəsindən daha çox azəri türkcəsinə aid olan sözlər işlədilir. Məsələn: ben yox mən, kəndim yox, özim (özüm) və s. Mətnlərdə bugünkü dilimizə tam uyğun olan və fonetik cəhətdən cüzi dəyişmiş sözləri kursivlə verirəm.*

*Gül-Təkin abidəsi İltəriş Xaqanın oğlu, Bilgə Xaqanın kiçik qardaşı Gül-Təkinin vəfatından sonra (685-ci il fevralın 27-si) onun şərəfinə qoyulmuşdur. Bir çox çağdaş araşdırıcılar bu mətnləri şer, nəzm örnəkləri hesab edir və onların üslub xüsusiyyətlərinin ən çox "Kitabi - Dədəm Qorqud" mətninə yaxın olduğunu qeyd edirlər.*

## GÜL-TƏKİN ABİDƏSİ. KİÇİK DAŞ

**Tanrı tək tanrıda olmuş**
Türk Bilgə[1] **xaqan** bu vaxt
taxta oturdum.
Sözümün tükətin[2] eşidin.
Məndən sonra gələn qohum-qardaşım, **oğlanım**
qəbiləm, budunum.
Sağda duran şad-aput[3] **bəylər**
**Doqquz Oğuz bəyləri,** budunu
bu sözümü yaxşıca **eşit,**
qatıca[4] **dinlə.**
İləri Gündoğuşunda,
Geri Günbatsığında
Yuxarı dün[5] gecə ortasında
Ondan içəridəki budun hamısı **məni görür**[6]
O qədər budun topladım, birləşdirdim.
Türk Xaqan Ötükən ormanında oturanda
**eldə bun**[7] **yox.**
İləri Şandun **yazısına təki** suladım[8]
**Dənizə kiçik** çatmadım[9].
Geridə İnci çayını üzüb keçdim
**Dəmir Qapıya təki** suladım
**Doqquz** ərsəngə **təki** suladım
Tibetə **kiçik** çatmadım.
Bunca **yerə** təki yürüdüm
Ötükən ormanından yaxşı **yer yox** imiş.
**El** tutacaq yer Ötükən ormanı imiş.
Bu **yerdə** oturub Tabğaç budun ilə düzælişdim.
Qeydsiz-şərtsiz o qədər
**Altun, gümüş,** taxıl, ipək
verdilər.
Tabğaç budunun **sözü sıcaq**
**ağzı yumşaq** imiş.
**Sıcaq** sözü, **yumşaq** dili ilə
**iraq** budunu yaxınlaşdırırmış

---

[1] Bilgə — müdrik, Göy türk xaqanlarından birinin adıdır
[2] Tükətin — tükənməsini, bitməsini, yekununu
[3] Şad-aput — mənsəblər, titullardır
[4] Qatıca — burda möhkəmcə
[5] Dün — gecə
[6] Məni görür — mənə tabedir
[7] Bun — kədər, dərd
[8] Su — qoşun, suladım — qoşun yeritdim
[9] Kiçik çatmadım — azacıq çatmadım

**Yaxın qonduqdan**[1] sonra **onlara** pis əməllər öyrədirmiş
**Bilgə** (müdrik, bilikli) **kişiləri** yarıtmaz edirmiş.
**Sıcaq sözünə, yumşaq ağzına** aldanıb
Çoxlu sayda türk budunu **öldü.**
Türk budunun bir hissəsi
"Sağdakı Çuray ormanına **deyil,**
**Dün yazısına qonayın" dedi.**
**Pis kişilər** belə öyrədirmiş:
**İraq olsaq,** bizə pis, ucuz hədiyyələr verərlər,
**Yavuq olsaq,** yaxşı hədiyyələr verərlər,
**Bilik bilməz kişilər**[2] **ol sözü alıb**
**yavuq varıb** çox sayda **öldük.**
**Ol yerlərə varsan,** Türk budun — **öləcəksən.**
Ötükən **yerində** oturub **arğış,** karvan göndərsən
**heç bunun yox.**
Ötükən ormanında otursan türk budun,
**tox olasısan.**
**Bir doysan ac olmazsan.**
Səni ucaltmış **xaqanın sözünü almadın**
**Yer sayı vardın**
arıtlandın, seyrəldin.
**Orda qalmışın yer sayı**
Hamısı **diri-ölü** yürüyür.
**Tanrı** yardım etdiyi **üçün**
**Özüm qutum**[3] **var üçün**
**xaqan oturdum** (taxta oturdum).
**Xaqan oturub yoxa** çıxan budunu
qaldırdım, artırdım.
**Yoxa** çıxan budunu **bay qıldım,**
az budunu **çox qıldım.**
Məgər bu sözümdə şişirtmə var?
Türk **bəylər,** budun, **bunu eşidin**
Türk budunun dirçəlib,
**elini tutacağını burda vurdum.**[4]
Yanılarsa parçalanacağını
yenə **burda vurdum.**
Nə qədər sözüm varsa,
bəngü[5] **daşa vurdum.**

---

[1] Yaxın qonduqdan — yaxında yerləşdikdən
[2] Bilik bilməz kişilər — ağılsız adamlar
[3] Qut—bəxt. Özüm qutum var üçün — bəxtim olduğu üçün
[4] Daşa həkk elətdirdim, vurdurdum
[5] Bəngü — əbədi

**Onu görüb bilin**
Türk indiki budun, **bəylər**
Taxta bağlı **bəylər**
axı, yanılacaqsız.
Mən bəngü **daşı** düzəltdim;
Tabğaç xaqandan bədizçi[1] gətirdim bədizdim.
**Mənim** sözümü **sındırmadı**
Tabğaç **xaqanın** saray bədizçisi idi.
**Adımca** bədiz **vurdurdum.**
**Daş** düzəltdim.
**Könüldəki** sözümü **eşidin.**
**On ox oğluna, tatına təki**
**bunu görüb bilin.**
Bəngü **daşı** düzəltdim.
Bəngü **daşı** bititdim[2].
Bu **bitik** bititdi
qohumu Yolığ-təkin.

## GÜL-TƏKİN ABİDƏSİ. BÖYÜK DAŞ

**Bəyləri,** budunu **düz** olmadığı **üçün**
Tabğaç budun **adi** güclü **olduğu üçün**
bu təbliğlə **kiçiyi—böyüyü** küsdürdüyü **üçün**
Bəylə budunu bir—birinə salışdırdığı **üçün**
Türk budun **ellədiyi[3] elini uçurdu,**
**xaqanladığı xaqanı** itirdi.
**Bəylik** oğlu Tabğaç budununa **qul oldu**
Bakirə **qızı** kəniz **oldu.**
Türk **bəylər** türk **adın atıb**
Tabğaçlı **bəylərin adın tutuban**
Tabğaç **xaqanını görmüş[4].**
**Əlli il işini-gücünü[5]** Tabğaç **xaqanına vermiş**
Türk **qara** budun hamsı **belə demiş:**
**Ellik** budun **idim**
**Elim** indi **hanı?**
Kimə el qazanıram?

---

[1] Bədizçi — nəqqaş, bədizmək — nəqş etmək
[2] Bitik—yazı; bititmək — yazdırmaq
[3] Ellədiyi — yaratdığı, qurduğu, el etdiyi
[4] Tabğaç xaqanını görmüş — Çin xaqanına tabe olmuş
[5] Əlli il işini-gücünü — əlli il zəhmətini, əməyini

**Xaqanlıq budun idim**
**Xaqanım hanı?**
Nə **xaqana işimi-gücümü verirəm?**
Beləcə deyib Tabğaç xaqana **yağı** olmuş
"Türk budun, **öləyin—**
nəslimizi kəsəyin"—**deyir imiş**
**yoxluğa varır imiş.**
**Uca** türk **tanrısı**
Türk müqəddəs **yeri—suyu belə demiş:**
Türk budun **yox olmasın—deyib.**
Budun **olsun—deyib.**
Atam İltəriş **xaqanı,**
Anam Elbilgə **xatunu**
**tanrı təpəsində tutub**
yuxarı götürmüş.
**Xanım xaqan yeddi iyirmi**[1] **ərin daşımış**[2]
**Dişarı** yüyürür — **deyə** səs **küy eşidib**
balıqdakı[3] dağa çıxmış, **dağdakı enmiş**
**Tanrı güc verdiyi üçün**
**Xanım xaqan** susu[4] börü[5] **tək imiş**
**Yağısı qoyun tək imiş.**
**Yağının qanı suca yüyürdü,** axdı
**Sümüyü dağca yatdı.**
Gül-təkin **bir qırx**[6] **yaşında** idi
Alp Şalçı **atını minib** hücuma keçdi
**Altı ər sancdı**[7]
Qoşun davasında **yeddinci əri qılıcladı.**
Gül-təkin **olmasaydı**
Hamınız **öləcəkdiniz.**
Gül-təkin **qoyun ilində**
**yeddi iyirmidə**[8] uçdu.[9]
**Doqquzuncu ay yeddi otuzda**[10]
dəfn etdik.

---

[1] Yeddi iyirmi — on yeddi
[2] Daşımış — özüylə aparmış
[3] Balıq — şəhər
[4] Susu — qoşunu
[5] Börü — qurd
[6] Bir qırx yaşında — otuz bir yaşında
[7] Sancdı — nizələdi
[8] Yeddi iyirmi (ayın on yeddisi)
[9] Uçdu — öldü.
[10] Yeddi otuzda — iyirmi yeddisində



Kiçik qardaşım Gül-təkin **öldü**
**özüm saqındım.**
**Görür gözüm görməz tək,**
**bilir biliyim bilməz tək oldu.**
**Özüm saqındım.**
Vaxtı **tanrı yazar**
**Kişi oğlu** hamsı **ölümlü törəmiş**
**Gözdən yaş gəlsə,**
**könüldən sıtqa gəlsə,**
**yanaraq saqındım.**
**Yuğçu, sağuçu** gəldi.
Bərkin,[1] bədizin, **bitik daşın**
meymun **ilində yeddinci ay**
**yeddi otuzda** tamamladıq.
Gül-təkin öləndə **qırx artıq yeddi** yaşında[2] idi.

## YENİSEY MƏZAR YAZILARI

Sarayda **xanımıma, sizə** yazıq, cəsur oğlum
**sizdən** ayrıldım.
**Yüz ər qardaşım** güclü olduğu **üçün, yüz ərən əlli**
**öküzü təpdiyi üçün** ayrıldım.
**Göy tanrıdan**[3] **günü, ayı azdım**[4], yerimə yazıq,
**sizdən** ayrıldım.
**Xanımdan, elimdən, sizdən** böymədim[5], ayrıldım.
**Xanıma, elimə** yazıq.
Qara budunum, möhkəmlənin
**El** törəsin[6] itirmisiz nə yazıq!
**Elim uğrunda** qoşun olan **ərlərim,** bəxtim yox.
Kədər **mənə batmış, öldüm** nə yazıq
**Qardaşıma,** kəmərimə, **atıma** yazıq, **qara** budunumdan
ayrıldım, **yazıq mən.**

---

[1] Bərk — sərdabə
[2] Qırx artıq yeddi yaşında — qırx yeddi yaşında
[3] Tanrı — burada səma, göy
[4] Azdım — itirdim
[5] Böymədim — doymadım.
[6] El törəsi — elin qanunu

## "KİTABİ DƏDƏM QORQUD"

*"Kitabi Dədəm Qorqud ala lisani taifeyi Oğuzan" — Azəri və Türkiyə türklərinin, türkmənlərin əcdadları olan Oğuzların möhtəşəm sənət abidəsidir. İstər dil özəllikləri, istərsə də coğrafi sahə baxımından (Dərbənd, Gəncə, Bərdə, Əlincəqala) "Kitabi Dədəm Qorqud" daha çox Azərbaycanla bağlıdır.*

*Bu gün "Kitab"ın iki nüsxəsi məlumdur. On iki boydan ibarət Drezden nüsxəsi və altı boydan ibarət Vatikan nüsxəsi. "Kitabi Dədəm Qorqud"un qaynaqları, yaranma tarixi çox-çox qədimlərə qədər uzanır. Alman araşdırıcısı Dits "Dədə Qorqud" motivlərinin hətta Homerin qədim yunan əsatirindən daha əsgi olduğunu fərz edirdi.*

*Əlimizdə olan nüsxələrdə İslam dininin təsiri açıq duyulsa da, İslamdan önçəki inancların, məişət, adət-ənənələrin izləri, mətnin dərin qatlarında gizlənən çox uzaq zamanların əks-sədası, ərəb-fars dillərinin sonrakı ədəbiyyatımızda tutduğu yeri burda hələ tutmaması, dastan qəhrəmanlarının türk adları daşıması, nəhayət, XI əsrdə Qaşqarlı Mahmudun lüğətində türk şerinin heca vəznini və qafiyə sistemini mənimsəməsini göstərən dəqiq örnəklər olduğu halda Dədə Qorqud şerlərinin — SÖYLƏMƏLƏRİNİN — daha arxaik sərbəst biçimləri bu ölməz əsərin əlimizdəki mətnlərinin daha qədim qaynaqlara əsaslandığını təsdiq edir. Eyni zamanda mətndə "İstanbul" kəlməsinin olması da onu XVI əsrə gətirib çıxarır.*

*"Kitabi Dədəm Qorqud"un VII əsrə aid edilməsi şərti olsa da, hər-halda müəyyən dərəcədə məqbuldur və məntiqidir, çünki əvvələn mətnin özündəki bir tutarqaya əsaslanır: "Kitab"da Dədə Qorqud Həzrət Məhəmmədin müasiri kimi, yəni VII əsrdə yaşamış bir şəxs kimi təqdim olunur. İkincisi, üslub baxımından da "Dədə Qorqud" mətnləri ən çox VI-VII əsrlərdə yaranmış Orxon-Yenisey abidələrinə yaxındır. Azərbaycan Prezidenti Heydər Əliyevin "Kitabi Dədəm*

*Qorqud"un 1300 illiyinin geniş qeyd edilməsi haqqında fərmanı da məhz bu mülahizələrə əsaslanır.*



*"Kitabi Dədəm Qorqud"dakı nəzm parçaları — söyləmələrlə yanaşı, antologiyamıza Dədə Qorqudla və dastanın digər personajlarıyla bağlı müxtəlif əsrlərə aid olan bəzi başqa mətnləri də daxil edirik. Bunların sırasında Yazıcıoğlu Əlinin "Oğuznamə"sindən parçalar, alman araşdırıcısı Ditsin nəşr etdiyi mətnlər, XVIII əsr türkmən tarixçisi Əbülqazi xanın "Şəcəreyi tərakimə" əsərindən Salur Qazana aid şer, M. F. Axundzadənin arxivindən tapılmış Dədə Qorqudla bağlı dördlük — dastandakı personajların, adların, motivlərin Anadoluda, Azərbaycanda, Türkmənistanda XVIII-XIX əsrlərə qədər hafizələrdə yaşadığını, eyni zamanda milli şer biçimlərinin inkişaf və təkamül prosesini göstərir.*

Rəsul əleyhissəlam zamanına yaxın
Bayat boyından, Qorqud ata derlər, bir ər qopdı.
Oğuzun ol kişi tamam bilicisiydi—nə desə, olurdu.
Qaibdən dürlü xəbər söylərdi.
Haqq təala onun könlünə ilham edərdi...
Qorqud ata ayıtdı: "Axır zamanda xanlıq geri — Qayıya dəyə, kimsənə əllərindən almıya".
Axır zaman olub qiyamət qopınca bu dediyim Osman nəslidir.
İşdə sürülüb gedə-yürür" və dəxi neçə buna bənzər söz söylədi.
Qorqud ata Oğuz qövmünün müşkilini həll edərdi. Hər nə iş olsa, Qorqud ataya danışınca işləməzlərdi.
Hər nə ki, buyursa, qəbul edərlərdi; sözün tutub tamam edərlərdi...

**Dədə Qorqud söyləmiş:**

Allah-allah deməyincə işlər olmaz.
Qadir tanrı verməyincə ər bayımaz.
Əzəldən yazılmasa, qul başına qəza gəlməz.
Əcəl vədə verməyincə kimsə ölməz.

Ölən adam dirilməz, çıxan can geri gəlməz.
Bir igidin Qara dağ yumrusunca malı olsa,
yığar-dərər, tələb eylər, nəsibindən artığın yeyə bilməz.
Ulaşıban sular daşsa, dəniz dolmaz.
Təkəbbürlük eyləyəni tanrı sevməz.
Könlün uca tutan ərdə dövlət olmaz.
Yad oğlu saxlamaqla oğul olmaz—
böyüyəndə salır gedər, gördüm deməz...
Kül təpəcik olmaz.
Qara eşşək başına yüyən vursan qatır olmaz.
Qaravaşa don geyirsən xatun olmaz.
Yapa-yapa qarlar yağsa, yaza qalmaz
Yapağlı göycə çəmən güzə qalmaz.
Əski pambıq bez olmaz.
Qarı düşmən dost olmaz.
Qarağaca qıymayınca yol alınmaz.
Qara polad üz qılıcı çalmayınca qınım dönməz.
Ər, malına qıymayınca adı çıxmaz.
Qız, anadan görməyincə öyüd almaz.
Oğul, atadan görməyincə süfrə çəkməz.
Oğul atanın yetiridir, iki gözünün biridir
Dövlətli oğul olsa, ocağının közüdür.
Oğul dəxi neyləsin, baba ölüb malı qalmasa,
Baba malından nə fayda, başda dövlət olmasa...
Dövlətsiz şərindən allah saxlasın, xanım sizi.

**Dədə Qorqud bir dəxi söyləmiş, görəlim,**
**xanım nə söyləmiş:**

Getdikdə yerin otlaqların keyik bilir.
Kənəz yerlər çəmənlərin qulan bilir.
Ayrı-ayrı yollar izin dəvə bilir.
Yeddi dərə qoxuların tülkü bilir.
Dünlə karvan keçdiyin torağay bilir.
Oğul kimdən olduğunu ana bilir.
Ərin ağzın yeynisini at bilir.
Ağır yüklər zəhmini qatır bilir.
Nə yerdə sıyrılır varsa, çəkən bilir.
Qafil başın ağrısını beyni bilir.
Qolça qopuz götürüb eldən-elə, bəydən-bəyə ozan gəzər,
Ər namərdin, ər nakəsin ozan bilir.
El-evinizdə çalıb-ayıdan ozan olsun!
Azıb gələn qəzanı tanrı savsın, xanım, hey.



Ozan aydır:
Qanlar dörd dürlüdü:
birisi solduran soydur,
birisi dolduran toydur,
birisi evin dayağıdır,
birisi, necə söylərsən, bayağıdır.

## DİRSƏ XAN OĞLU BUĞAC BOYUNDAN

### Söyləmə

Salqum-salqum dan yelləri əsdiyində,
Saqqallı bozac turağay sayrıdıqda,
Saqqallı uzun tat əri banladıqda,
Bədəvi atlar issini görüb oğradıqda,
Ağlı-qaralı seçilən çağda
Köysü gözəl qaya dağlara gün dəyəndə,
Bəy igidlər, cilasunlar bir-birinə qoyulan çağda
Ala sabah Dirsə xan qalxıbanı yerindən uru durub,
Qırx igidin boynuna alıb,
Bayandır xanın söhbətinə gəlirdi.

### Dirsə xanın xatununa söyləməsi

Bəri gəlgil, başım baxtı, evim taxtı!
Evdən çıxıb yürüyəndə səlvi boylum!
Topuğunda sarmaşanda qara saçlım!
Qurulu yaya bənzər çatma qaşlım!
Qoşa badam sığmayan dar ağızlım
Güz almasına bənzər al yanaqlım!

### Buğacın anasının söyləməsi

Qara qıyma gözlərini uyğu almış, açgil axı!
Ol ikicə sümücüyün uzun olmuş, yığışdır axı!
Tanrı verən dadlı canın seyranda imiş, endi dəxi.
Üz-gözündə canın varsa, oğul, xəbər mənə
Qara başım qurban olsun, oğul sənə.
Nə Qazlıq dağı axar sənin suların
Axar ikən axmaz olsun!
Bitər sənin otların Qazlıq dağı
Bitər ikən bitməz olsun!

Qaçar sənin keyiklərin Qazlıq dağı
Qaçar ikən qaçmaz olsun, daşa dönsün.
Nə biləyin, oğul, arslandanmı oldu, yoxsa qaplandanmı oldu?
Nə biləyin, oğul, bu qəzalar sənə nərədən gəldi?
Ol gövdəndə canın varsa, oğul xəbər mənə
Qara başım qurban olsun, oğul sənə
Ağız-dildən bir qaç kəlmə xəbər mənə.

## SALUR QAZANIN EVİNİN YAĞMALANDIĞI BOYUNDAN

### Qaracıq Çobanın kafirlərə söyləməsi

Arqırı söyləmə, mərə itim kafər!
İtim ilə bir yalaqda yudum içən azğın kafər!
Altındakı alaca atın nə öyərsən?
Ala başlı keçimcə gəlməz mənə!
Başındakı tulğulğanı nə öyərsən, mərə kafər?
Başımdakı börkümcə gəlməz mənə!
Altmış tutam köndərini nə öyərsən, murdar kafər?
Qızılcıq dəyənəyimcə gəlməz mənə!
Qılıcını nə öyərsən, mərə kafər?
Əyri başlı çomağımca (çokanımca) gəlməz mənə.
Belində doxsan oxun nə öyərsən, mərə kafər?
Ala qollı sapanımca gəlməz mənə.
İrağından-yaxınından bəri kəlgil!
İgidlərin zərbin görgil, ondan ötgil!

### Uruzun anasına söyləməsi

Xatun ana! Qarşım alıb nə böyrərsən?
Nə bozlarsan, nə ağlarsan?
Bağrımla ürəyim nə dağlarsan?
Keçmiş mənim günümü nə andırarsan?
Hey, ana! Ərəbi atlar olan yerdə
Bir qulunu olmazmı olur?
Qızıl dəvələr olan yerdə
Bir köşəyi olmazmı olur?
Ağca qoyunlar olan yerdə
Bir quzucuğu olmazmı olur?
Sən sağ ol, xatun ana! Babam sağ olsun!
Bir mənim kimi oğul bulunmazmı olur?

**Uruzun ağaca söyləməsi**

"Ağac! Ağac!" dersəm sənə ərinmə, ağac!
Məkkə ilə Mədinənin qapısı ağac!
Museyi-kəlimin əsası ağac!
Böyük-böyük suların körpüsü ağac!
Qara-qara dənizlərin gəmisi ağac!
Şahi-mərdan Əlinin Düldülinin əyəri ağac!
Zülfüqarın qını ilə qəbzəsi ağac!
Şah Həsənlə Hüseynin beşiyi ağac!
Əgər ərdir, əgər övrətdir, qorxusu ağac!
Başın ala baxar olsam, başsız ağac!
Dibin ala baxar olsam, dibsiz ağac!
Məni sənə asarlar götürməgil, ağac!
Götürəcək olursan, igidliyim səni tutsun, ağac!
Bizim eldə gərək idin, ağac!
Qara hindu qullarıma buyuraydım,
Səni para-para doğrayarlardı, ağac!
Tovla-tovla bağlananda, atıma yazıq!
Qardaş deyə sızlayanda, yoldaşıma yazıq!
Yuruğunda talbınanda, şahin quşuma yazıq!
Yetər ilə tutanda, tazıma yazıq!
Bəyliyə doymadım, özümə yazıq!
İgidliyimə usanmadım, canıma yazıq!

## QAM BÖRÜNÜN OĞLU BAMSI BEYRƏYİN BOYUNDAN

**Beyrəyin andı**

Qılıncıma doğranayın!
Oxuma sancılayın!
Yer kimi kərtiləyin, torpaq kimi sovrulayın!
Sağlıqla varcaq olursam,
Oğuza gəlib səni halallıqla almaz isəm!

**Banıçiçəyin Beyrək üçün ağlaması**

Vay, al duvağım yiyəsi!
Vay, alnım-başım umuru!
Vay, şah iyidim, vay, şahbaz iyidim!
Doyunca üzünə baxmadığım xanım igid!
Qanda getdin, məni yalnız qoyub xanım igid!

Göz açıban gördüyüm, könül ilə sevdiyim,
Bir yasdıqda baş qoyduğum! Yolunda öldüyüm!
Qurban olduğum!
Vay, Qazan bəyin inağı!
Vay, Qalın Oğuzun imrəncisi Beyrək!

**Beyrəyin boz ayğırını öyməsi**

Açıq-açıq meydana bənzər sənin alıncığın,
İki şəbçırağa bənzər sənin gözciyəzin,
Əbrişimə bənzər sənin yeliciyin,
Əri muradına yetirər sənin arxacığın
At deməzəm sənə, qardaş deyərəm.
Qardaşımdan yey!
Başıma iş gəldi, yoldaş deyərəm!
Yoldaşımdan yey!

**Beyrəyin bacısının söyləməsi**

Qarşı yatan qara dağım yıxılıbdır,
Ozan sənin xəbərin yox.
Kölgəlicə qaba ağacım kəsilibdir,
Ozan sənin xəbərin yox.
Dünyəlikdə bir qardaşım alınıbdır,
Ozan sənin xəbərin yox.
Çalma ozan, ayıtma ozan,
Qaralıca mən qızın nəsinə gərək ozan?
El-evində düyün var,
Düyünə varıb ötgil!

**Bacısının Beyrəyə söyləməsi**

Qara qıyma gözlərin çöngəlməsəydi,
"Ağam Beyrək" deyərdim ozan, sənə.
Üzünü qara saç örtməsəydi,
"Ağam Beyrək" deyərdim ozan, sənə.
Qunt-qunt biləklərin solmasaydı,
"Ağam Beyrək" deyərdim ozan, sənə.
Apul-apul yürüşündən,
Aslan kimi duruşundan,
Qanrılıban baxışından
Ağam Beyrəyə bənzədirəm ozan, səni
Sevindirdin, yerindirmə ozan, məni.

**Beyrəklə Banıçiçəyin söyləmələri**

B e y r ə k :

Beyrək gedəli Bam-bam təpə başına çıxdınmı, qız?
Qanladıb dörd yanına baxdınmı, qız?
Qarğı kimi qara saçın yoldunmu, qız?
Qara gözdən acı yaş tökdünmü, qız?
Güz alması kimi al yanağını yırtdınmı, qız?
Sən ərə varırsan, altun üzük mənimdir, ver mənə, qız.

B a n ı ç i ç ə k :

Beyrək gedəli Bam-bam təpə başına çıxdığım çox.
Qarğı kimi qara saçım yolduğum çox.
Güz alması kimi al yanağım yırtdığım çox.
Gələnlə gedəndən sorduğum çox.
"Vardı, gəlməz bəy iyidim" deyə ağladığım çox.
Sevişdiyim Bamsı Beyrək sən deyilsən.
Altun üzük sənin deyildir.
Altun üzükdə çox nişan vardır
Altun üzüyü istərsən, nişanın söylə!

B e y r ə k :

Ala sabah, xan qızı, yerimdən durmadımmı?
Boz ayğırın belinə minmədimmi?
Sənin odan üzərinə sığın-keyik yığmadımmı?
Sən məni yanına çağırmadınmı?
Səninlə meydanda at çapmadıqmı?
Sənin atını mənim atım keçmədimi?
Ox atanda mən sənin oxunu yarmadımmı?
Güləşdə mən səni basmadımmı!
Üç öpüb, bir dişləyib altun üzüyü
barmağına keçirmədimmi?
Sevişdiyin Bamsı Beyrək mən deyilmiyəm?

**Banıçiçəyin qayınatasına — qayınanasına söyləməsi**

Arğab-arğab qara dağın yıxılmışdı, ucaldı, axır!
Qanlı-qanlı suların sovğulmuşdu, çağladı, axır!
Qaba ağacın qurumuşdu, yaşardı, axır!
Şahbaz atın qarımışdı, qulun verdi, axır!
Qızıl dəvələrin qarımışdı, köşək verdi, axır!
Ağ ayılda qoyunun qarımışdı, quzu verdi, axır!
On altı illik həsrətin — oğulun Beyrək gəldi, axır!
Qayınata-qayınana, muştuluq mənə nə verərsiz?

## URUZ BƏYİN DUSTAQ OLDUĞU BOYDAN

### Boyu uzun Burla xatunun söyləmələri

Bəri kəlgil, Salur bəyi, Salur görkü!
Başım bəxti, evim təxti!
Xan babamın göyküsü,
Xatun anamın sevgisi.
Atam-anam verdiyi,
Göz açıban gördüyüm,
Könül verib sevdiyim,
Bəy iyidim Qazan!
Qalxıbanı yerindən uru durdun,
Oğlunla yelisi qara Qazlıq atın bütün mindin.
Boynu uzun bədəvi keyikin alıb yığdın,
Sən atın yüklətdin, geri döndün,
İki vardın, bir gəlirsən, yavrım hanı?
Qara gərdunda bulduğum oğlım hanı?
Bir bəyim görünməz, bağrım yanar.
Asılı asılan qayalardan
Qazan, oğlan uçurdunmu?
Talı sazın aslanına yedirdinmi?
Ağ əllərin gerisindən bağlatdınmı?
Kafər önüncə yürütdünmü?
Dili-damağı quruyub dörd yanına baxdırdınmı?
Qara gözdən acı yaşın tökdürdünmü?
"Xatun ana, bəy baba" deyə bozlatdınmı?

Oğul, oğul, ay oğul! Ortacım oğul!
Qarşı yatan qara dağım yüksəyi oğul!
Qaranlıqca gözlərim aydını oğul!
Sam yelləri əsmədən, Qazan, qulağım çınlar.
Sarımsaq otun yemədən, Qazan, içim göynər.
Sarı ilan soxmadan ağca tənim qalxar-şişər.
Qurumuşca köksümdə südüm oynar.
Yalnızca oğul görünməz, bağrım yanar.
Yalnız oğul xəbərin, Qazan, degil mənə!
Deməz olursan, yana-göynə qarğaram, Qazan, sənə!

Qarğı cida oynadanlar vardı, gəldi,
Altun cida oynadana, yarəb, noldu?
Qaraquc ata minənlər vardı, gəldi,
Bədəvi atlı bir oğula, yarəb, noldu?
Nökər gəldi, naib gəldi
Yalnız bir oğula, yarəb, noldu?

Yalnız oğul xəbərin, Qazan, degil mənə
Deməz olsan, yana-göynə qarğaram, a Qazan, sənə!

Quru-quru çaylara su saldım.
Qara donlu dərvişlərə nəzir verdim.
Yanıma ala baxdığımda qonşuma eyi baxdım.
Umanana-usanana aş yedirdim.
Ac görsəm doyurdum,
Yalıncıq görsəm donatdım.
Dilək ilə bir oğulu güclə buldum.
Yalnız oğul xəbərin, a Qazan, degil mənə!
Deməz olsan, yana-göynə qarğaram, Qazan, sənə.

Qarşı yatan qara dağdan
Bir oğul uçurdunsa, degil mənə,
külünglə yıxdırayım!
Qamən axan yüyrək sudan
Bir oğul uçurdunsa, degil mənə,
damarların doğradayım.
Azğın dinli kafərlərə
Bir oğul tutdurdunsa, degil mənə
Xan babamın yanına mən varayın,
Ağır ləşkər, bol xəzinə alayın.
Paralanıb Qazlıq atımdan enməyincə,
Yönümlə alca qanım silməyincə,
Qol-bud olub yer üzünə düşməyincə,
Yalnız oğul xəbərin almayınca
Kafər yollarından dönməyəyin.

Yoxsa, a Qazan, ayağımdan sərmüzə atayınmı?
Qara dırnaq ağ üzümə çalayınmı?
Güz alması kimi al yanaqlarım yırtıyınmı?
Çənbərimə alca qanım tökəyinmi?
Ağır şivən sənin orduna qoyayınmı?
"Oğul, oğul" deyübən bozlayayınmı?

Qaytabanda qızıl dəvə bundan keçdi.
Torumları bundan bozlayıb belə keçdi.
Torumcuğum aldırmışam, bozlayayınmı?
Qaraqucda Qazlıq atı bundan keçdi.
Quluncuğu kişnəyib belə keçdi.
Quluncuğum aldırmışam, kişnəyəyinmi?
Ağ ayılda ağca qoyun bundan keçdi
Quzucuğu mənrişib belə keçdi.
Quzucuğum aldırmışam, mənriyəyinmi?
"Oğul" deyə bozlayayınmı?

Qalxıbanı yerimdən duram, derdim,
Yelisi qara Qazlıq atıma minəm, derdim.
Qalın Oğuz içinə girəm, derdim.
Ala gözlü gəlin alam, derdim.
Qara yerdə ağ otaq tikəm, derdim.
Murada yetirmədin məni,
Qara başım qarğışı tutsun, Qazan, səni!
Bir bəyim görünməz, bağrım yanar.
Neylədin, degil mənə?!
Deməz olsan, yana-göynə qarğaram, Qazan, sənə!

**Xan Qazanın oğlu Uruza söyləməsi**

Oğul, oğul, ay oğul!
Qarşı yatan qara dağım yüksəyi oğul!
Güclü belim qüvvəti, canım oğul!
Qaranqulu gözlərim aydını oğul!
Ala danla yerimdən durduğum sənin üçün.
Qonur atım yorultmuşam sənin üçün.
Ağ donuma kir əkləndi sənin üçün
Mənim başım qurban olsun, canım oğul, sənin üçün.
Sən gedəli ağlamağım göydə ikən yerə endi
Gumbur-gumbur davullar döyülmədi.
Ağır ulu divanım sürülmədi.
Səni bilən bəy oğulları
ağ çıxardı, qara geydi.
Qaza bənzər qızım-gəlinim
ağ çıxardı, qara geydi.
Qarıcıq anan qan-yaş tökdü.
Ağ saqqallı baban bunlu oldu.
Qayıdıban buradan, oğul, evə varsam,
Ağca üzlü anan qarşı gəlib "oğul" desə,
Ağ əlləri ardına bağlı, deyəyinmi?
Ağ boynunda qıl örkən taxılı, deyəyinmi?
Kafər yanınca yayaq yürür, deyəyinmi?
Mənim namusum qanda vara, oğul?
Qıl kəpənək boyuncuğun sürər, deyəyinmi?
Ağ buxağı topuqcuğun döyər, deyəyinmi?
Arpa əkməyi, acı soğan öynəciyi, deyəyinmi?

Qarşı yatan qara dağlar
Qarısa, otu bitməz, el yaylamaz.
Axıntılı görklü sular
Qarısa, qara daşmaz.

Qaytabanlar qarısa kürüm verməz.
Qaracuqlar qarısa qulun verməz.
Ər igidlər qarısa oğul doğmaz.
Baban qarı, anan qarı
Səndən yeyrək qadir bizə oğul verməz.
Versə dəxi sənin yerin tuta bilməz.
Asimanlı göydə qara bulud oluban
Kafərin üzərinə gurluyayım.
Ağ yıldırım olub şaxıyayım.
Kafəri qamış kimi od oluban yandırayım.
Doqquzunu bir yerinə saydırayım.
Vuruşmadan, döyüşmədən aləmi dolduraym.
Yaradan allahdan mədəd!

## DƏLİ DOMRUL BOYUNDAN

### Dəli Domrulun Əzrayıla söyləməsi

Mərə, nə heybətli qocasan.
Qapıçılar səni görmədi,
Çavuşlar səni duymadı.
Mənim görər gözlərim görməz oldu.
Tutar mənim əllərim tutmaz oldu.
Titrədi mənim canım cuşə gəldi.
Altun əyağım əlimdən yerə düşdü.
Ağzım içi buz kimi,
Sümüklərim duz kimi oldu.
Mərə, saqqalcığı ağca qoca
Gözcügəzi çöngə qoca.
Mərə, nə heybətli qocasan, degil mənə.
Qadam-balam toxunar bu gün sənə!

### Əzrayılın Dəli Domrula söyləməsi

Mərə, dəli qavat!
Gözüm çöngə idiyin nə bəyənməzsən?
Gözü göyçək qızların-gəlinlərin
canını çox almışam!
Saqqalım ağardığın nə bəyənməzsən?
Ağ saqqallı, qara saqqallı igidlərin
canını çox almışam
Saqqalım ağardığının mənası budur.

**Dəli Domrulun övrətinə söyləməsi**

Bilirmisən, nələr oldu?
Göy üzündən al qanadlı Əzrayıl uçub gəldi.
Ağca mənim köksümü basıb qondu,
Dadlı mənim canımı alır oldu.
Babama "ver" dedim, can vermədi,
Anama vardım, can vermədi,
"Dünya şirin, can dadlı!" dedilər.
İndi yüksək-yüksək qara dağlarım
sənə yaylaq olsun!
Soyuq-soyuq sularım
sənə içət olsun!
Tovla-tovla şahbaz atlarım
sənə minət olsun!
Dünlüyü altun ban evim
sənə kölgə olsun!
Qatar-qatar dəvələrim
sənə yüklət olsun!
Ağ ayılda ağca qoyunum
sənə şülən olsun!
Gözün kimi tutarsa,
Könlün kimi sevərsə,
Sən ona vargil
İki oğlancığı ögsüz qoymagil!

**Övrətinin Dəli Domrula söyləməsi**

Nə dersən, nə söylərsən,
Göz açıban gördüyüm!
Könül verib sevdiyim!
Qoç iyidim, şah iyidim.
Dadlı damağ verib soruşduğum,
Bir yastıqda baş qoyub əmişdiyim.
Qarşı yatan qara dağları
Səndən sonra mən neylərəm?
Yaylar olsam, mənim gorum olsun!
Soyuq-soyuq suların içər olsam,
Mənim qanım olsun!
Altun-axçan xərcləyir olsam,
Mənim kəfənim olsun.
Tovla-tovla şahbaz atın minər olsam,
Mənim tabutum olsun!
Səndən sonra bir igidi sevib varsam,
belə yatsam,

Ala ilan olub məni soxsun.
Sənin ol müxənnət anan-baban
Bir canda nə var ki, sənə qıymamışlar?
Ərş tanıq olsun, kürsi tanıq olsun,
Yer tanıq olsun, göy tanıq olsun,
Qadir tanrı tanıq olsun,
Mənim canım sənin canına qurban olsun!

**Dəli Domrulun allaha yalvarması**

Ucalardan ucasan,
Kimsə bilməz necəsən!
Görklü tanrı,
Çox cahillər səni
göydə arar, yerdə istər.
Sən xud möminlərin könlündəsən.
Daim duran cabbar tanrı.
Ulu yollar üzərinə
İmarətlər yapayım sənin üçün.
Ac görəm doyurayım sənin üçün.
Yalıncıq görsəm, donatayım sənin üçün.
Alırsan, ikimizin canın belə algil
Qoyursan, ikimizin canın belə qoygil.
Kərəmi çox qadir tanrı!

## QANTURALI BOYUNDAN

**Selcan Xatunun Qanturalıya söyləməsi**

Hey iyidim, bəy iyidim!
Qaytabanlar torumundan dönərmi olur?
Qaraqucda Qazlıq atlar quluncuğun təpərmi olur?
Ağ ayılda ağca qoyun quzucuğun süsərmi olur?
Alp igidlər, yey igidlər görklüsünə qıyarmı olur?
İgidim, bəy igidim!
Bu yağının bir ucun mənə, bir ucun sənə!

**Qanturalının Selcan Xatuna söyləməsi**

Qalxıbanı Selcan Xatun, durduğunda,
Yelisi qara Qazlıq atın mindiyində,
Babamın ağ ban eşiyinə düşdüyündə,
Oğuzun ala gözlü qızı-gəlini bildikdə,
Hər kişi sözün söylədikdə,
Sən orada durarsan, özün öyərsən
"Qanturalı zəbun oldu,

At ardında aldım çıxdım" deyərsən.
Gözüm döndü, könlüm getdi.
Öldürərəm səni.

**Selcan Xatunun Qanturalıya söyləməsi**

Bəy igid, öyünərsə, ər öyünsün — aslandır!
Öyünməklik övrətlərə böhtandır.
Öyünməklə övrət ər olmaz.
Ala yorğan içində səninlə dolaşmadım.
Dadlı damağ tutubanı soruşmadım.
Al duvağım altında söyləşmədim.
Tez sevdin, tez usandın, qavat oğlu, qavat!
Qadir - allah bilir, mən sənə munisəm, yaram,
qıyma mənə!

**Qanturalının Selcan Xatuna söyləməsi**

Yalab-yalab yalabıyan incə donlum!
Yer basmayıb yürüyən,
Qan üzərinə qan dammış kimi qızıl yanaqlım!
Qoşa badam sığmayan dar ağızlım!
Qələmçilər çaldığı qara qaşlım!
Burması qırx tutam qara saçlım!
Aslan urığı, sultan qızı,
Öldürməyə mən səni qıyarmıdım?
Öz canıma qıyam, mən sənə qıymıyam.
Mən səni sınardım.

## BASATIN TƏPƏGÖZÜ ÖLDÜRDÜYÜ BOYDAN

**Təpəgözün söyləməsi**

Gözüm, gözüm, yalnız gözüm!
Sən yalnız gözlə sən Oğuzu sındırmışdım.
Ala gözdən ayırdın igid məni!
Dadlı candan ayırsın qadir səni!
Elə kim mən çəkərəm göz bununu,
Heç igidə verməsin qadir tanrı göz bu günü.

Ağ saqqallı qocaları çox ağlatmışam
Ağ saqqallı qarğışı tutdu ola, gözüm səni?
Ağ birçəkli qarıcıqları çox ağlatmışam.
Gözü yaşı tutdu ola, gözüm səni?
Bığcığı qaralmış igidcikləri çox yemişəm

İgidlikləri tutdu ola, gözüm səni?
Əlciyəzi xınalı qızcığazları çox yemişəm,
Qarğışları tutdu ola, gözüm səni?
Elə ki mən çəkərəm göz bununu
Heç igidə verməsin qadir tanrı göz yükünü!
Gözüm, gözüm, ay gözüm!
Yalnız gözüm!

## SALUR QAZAN DUSTAQ OLUB OĞLU URUZ ÇIXARDIĞI BOYDAN

### Qazanın kafərlərə söyləməsi

On-min ərdən yağı gördümsə, oyunum dedim.
Yigirmi min ər yağı gördümsə, yılamadım.
Otuz min ər yağı gördümsə, ota saydım.
Qırx min ər yağı gördümsə, qıya baxdım.
Əlli min ər gördümsə, əl vermədim.
Altmış min ər gördümsə, aytışmadım.
Səksən min ər gördümsə, səksənmədim.
Doxsan min ər gördümsə, donatmadım.
Yüz min ər gördümsə, yüzüm dönmədi.
Üzü dönməz qılıcım ələ aldım,
Məhəmmədin dini eşqinə qılıc vurdum.
Ağ meydanda yumru başı topca kəsdim.
Onda dəxi "ərəm, bəyəm" deyə öyünmədim.
Öyünən ərləri xoş görmədim!
Əlinə girmiş ikən, mərə kafər, öldür məni.
Qara qılıcın sal boynuma kəs başım
Qılıcından saparım yox.
Kəndi əslim, kəndi köküm söyməyim yox.

Yüksək-yüksək qara dağdan daş yuvalansa,
Qaba öncəm-oyluğum qarşı tutan Qazan ər idim.
Firon şişlər yüksəlib yerdən çıxsa,
Qaba öncəmlə pərçin qılan Qazan ər idim.
Qaba-qaba bəylər oğlu qovğa qılsa,
Qamçı salıb tökdürən Qazan ər idim.
Uca dağları duman tutsa,
Qara pusarıq dolu qopsa,
Qaraqucumun qulağı görünməz olsa,
Qeyri ərən qılavuzsuz yol yanılsa,
Qılavuzsuz yol başaran Qazan ər idim.

Yeddi başlı əjdərhaya yetib vardım
Heybətindən sol gözüm yaşardı.
"Hey gözüm, namərd gözüm, müxənnət gözüm.
Bir ilandan nə var ki, qorxdun" — dedim
Onda dəxi "ərəm, bəyəm" — deyə öyünmədim.
Öyünən ərənləri xoş görmədim.
Əlinə girmişkən, mərə, kafər, öldür məni, yetir məni!
Sal qılıcın, kəs başım
Qılıcından saparım yox.
Kəndi əslim, kəndi kököm söyməyim yox.
Oğuz ərənləri durarkən səni öyməyim yox.
İt kimi gu-gu edən çərkəz xırslı
Kiçicik donuz şülənli,
Bir torba saman döşəkli,
Yarım kərpic yastıqlı,
Yonma ağac tanrılı,
Köpəyim kafər
Oğuzu görərkən səni öyməyim yox.
Ondan öldürərsən, mərə kafər, öldür məni,
Öldürməzsən, qadir qoyarsa,
Öldürəyim kafər səni!

## BÜTÜN BOYLARIN SONUNDA DƏDƏ QORQUDUN SÖYLƏMƏLƏRİNDƏN

Dədəm Qorqud boy boyladı, söy söylədi, bu Oğuznaməni düzdü, qoşdu, böylə dedi:

Hanı dediyim bəy ərənlər?
Dünya mənim deyənlər
Əcəl aldı, yer gizlədi,
Fani dünya kimə qaldı?
Gəlimli-gedimli dünya
Son ucu ölümlü dünya!
Onlar dəxi bu dünyaya gəldi, keçdi,
Karvan kimi qondu, köçdü.
Onları dəxi əcəl aldı, yer gizlədi
Fani dünya yenə qaldı.
Əl-aqibət uzun yaşın ucu ölüm, axırı ayrılıq
Ölüm vaxtı gəldiyində arı imandan ayırmasın
Qadir səni namərdə möhtac eləməsin.
Allah verən ümidin üzülməsin

Sağlıqla sağıncın, dövlətin həq artırsın
Ol öydüyüm uca tanrı dost oluban mədəd versin.
Yerli qara dağların yıxılmasın!
Kölgəlicə qaba ağacın kəsilməsin!
Qamən axan görklü suyun qurumasın!
Qanadların ucları qırılmasın!
Çaparkən ağ-boz atın büdrəməsin!
Çalışanda qara polad üz qılıcın gödəlməsin!
Dürtüşərkən ala köndərin ufanmasın!
Ağ birçəkli anan yeri behişt olsun!
Ağ saqqallı baban yeri uçmağ olsun!
Həq yandıran çırağın yana dursun!
Oğulla qarındaşdan ayırmasın!
"Amin" deyənlər didar görsün!
Ağ alnında beş kəlmə dua qıldıq, qəbul olsun!
Yığışdırsın, duruşdursun, günahınızı
Adı görklü Məhəmməd Mustafa üzü suyuna
bağışlasın!
Xanım, hey!

## YAZICI OĞLU ƏLİNİN "OĞUZNAMƏ"SİNDƏN PARÇALAR

Gün doğuşu gen yerdən qopan Oğuz
Gümüş köklü, ban evli, bargahlı Oğuz
Arı suyu yayxandıqda abdəstli Oğuz
Alın yerə qoyduqda namazlı Oğuz
Bir tanrıyı bilib arı din sərvəri
Məhəmmədün Nəbi dildə yadlu Oğuz
Ala xalı, örün döşəkli Oğuz
Qəbzəsi altunlu, gərdəkli Oğuz.
Qızları qiymətli
İgidləri mürüvvətli,
Qocaları taətli, hörmətli Oğuz.
Köküslücə qara dağları yaylalı Oğuz
Quytumda dağ salların qışlaqlı Oğuz
Qanlı kafər ellərindən xərac alan Oğuz
Xərac verməyəni qıran Oğuz
Bayandır xan şülənli Oğuz
Ulaş Salur Qazan bəylərbəyli Oğuz
Əmir Süleyman uğurlu Oğuz
Dədə Qorqud bilikli Oğuz.
Görklü evin aydını,

Doğalıdan dövlətli,
Olalıdan səadətli,
Ulu sultan budağı,
Qazi xanın torunu,
Qara belin ürkünü,
Qara dağın qaplanı,
Qara şahin yavrusu,
Sarı sazın arslanı,
Qaytabanın buğrası.
Yağı görsə yardımlı,
Qaçım görsə durumlu.
Türküstanın dirəyi,
Tülü quşun yavrusu,
Ulu bəylər yığnağı,
Ağca çadır çanqılı,
Ala xalı ürünlü
Ağca qoyun yəxnili.
Yalın gəlsə donatan,
Acın gəlsə doyutan,
Güclünün gücün qıran
Gücsüzə dadın verən,
Qanlı kafər ellərində qan qaşandıran,
Qara başların bunlu edən,
Oğlancıqların ağladan,
Tavuqların qığıldadan,
Oğlancıqların ağlatmayan
Tavuqların banlatmayan
Nakusların çaldırmayan Osmanoğlu.

Qazılıq atınıza minib qaftan donunuz geyən ozan olsun.
Ağır ağ altun, ağ axçanız alan ozan olsun.
Sərp hasar duma donlu salqum-salqum don geyən,
Qonur atın oynadan
Qanlı kafər ellərindən adlu Xorasana ad çağırdan
Ağcahisarın əklik salıb alan
İtlərin uluşduran,
Tavuqların qığıldaşdıran
Ulaş oğlu Salur Qazan bəy.
Doxsan dəridən kürk olsa, topuğun örtməyən
Doqquz dəridən şəbkülah olsa, tülügün örtməyən
Doxsan qoyun dovğalıq, on qoyun öynəlik yetməyən
Doqquz yaşar cöngəni silkib atan
Qıynağında göydə tutan
At başın yalmayıb bir gəz udan
Əfrasiyab oğlu Alp Aruz bəy.

## DƏDƏ QORQUDUN SÖZLƏRİ

***(Alman araşdırıcısı Ditsin nəşr etdiyi Atalar sözündən)***

Əvvəl sağlığa çalalım, sağlıq gəlsin.
Əsənliyə çalalım, əsənlik gəlsin.
Dövlətə çalalım, dövlətiniz qayım olsun.
Dostluğa çalalım, düşmanınız nayim olsun.
Uğura çalalım, uğurunuz xeyir olsun.
İşiniz, gücünüz daim seyir olsun.
Haqdan bunu istəriz ki, süfrəniz açıq olsun.
Sizləri sevməyənlər mini buçuq olsun.

Qonşu-qonşu evinə varmaqdan əyri xəyal ola.
Şərə bazara seyr etməyə gələn türklər, türkmənlər
oranı bir nəsnəyi bəyənməyələr.
Bəlkə qah-qah çalmağa və könlünü məlalət tutduqca
Əlinə almağa bir eyi qaval ola.
Könlü çəkən taşra çalağan qızlar ola.
Və onların hər vəzinə, vüqarına imrənib bağağan bizlər ola.
Bəylər, paşalar önündə söylənən yalan, yanlış sözlər ola.
Ulular, akabirlər məclisində söylətmək üçün
qəzzabları, qəllaşları ola.
Ol günləri görmədən söylədim mən Dədə Qorqud
Görmüşcə inanın Oğuz qövmi.
Ol günlərə qoymagil,
Mənim canım algil,
Qadir tanrım.

Əyricə, bügrücə ağac-uğac almaya, saban ola.
Çoluq-çulaq qalmaya, çoban ola.
Qavuqca, savuqca ağac qalmaya, boyunduruq ola.
At, eşşək qalmaya, öküz ola,
Dərə-təpə qalmaya, tarla ola,
Ulu kiçik qalmaya, mülük ola,
İgidlər, qocalar, arvadlar kimi çavlağı yüzlük ola.
Libasda ər ilə arvad seçilməyə,
Kimsənin kimsə yanında ödüncdən, görüncdən hacəti bitməyə,
Cibi və kisəsi dəlik ola.
Bir kişinin bir kişi yanında hörməti, izzəti qalmaya.
Atanın, ananın oğula, qıza şəfqəti və mərhəməti olmaya
Oğul və qız xud anaları hərgiz riayət qılmaya
Atalar dururkən oğullar söyləyə
Analar dururkən qızlar buyruq eyləyə
Ol günləri görmədən söylədim mən Dədə Qorqud

Görmüşcə inanın mənə, Oğuz qövmi, derlər.
Ol günlərə qoymagil,
Mənim canım algil,
Qadir tanrım!

Apalaca çiçəkdən öndüm mən Dədə Qorqud.
Bir qətrə murdar mənidən döndüm mən Dədə Qorqud.
Ana rəhninə düşdüm, ata belindən endim mən Dədə Qorqud.
Ala göz dev qızından doğdum mən Dədə Qorqud.
Tanrı bir, peyğəmbəri haqq bildim mən Dədə Qorqud.
Oğuz xalqının başına xeyir gələsini, şər gələsini
ona tanıtdım mən Dədə Qorqud.
Haqq-taalanın əmanətini boynuma aldım mən Dədə Qorqud.
Əvət, kəndi-kəndimə qatı güc qıldım mən Dədə Qorqud.
Ola ki, işimin axırını haqqa saldım mən Dədə Qorqud.

Ataların sözü Qurana girməz
Od quran yanınca yalın-yalın yalışır
Atalar sözünü tutmayan yabana atılır
Axirətdə tamu əhlinə qatılır.
Atalara: atam öldü demişlər.
İş başına düşmüş — demiş.
Anam öldü — demişlər, öksüz qalmışsan — demiş.
Oğlum öldü — demişlər, ürəyinə od toxunmuş — demiş.
Qızım öldü — demişlər, xərcdən qurtulmuşsan — demiş.
Qarındaşım öldü — demişlər, qərib olmuşsan — demiş.
Arvadım öldü — demişlər, döşəyin yenilənmiş — demiş.
Qonşum öldü — demişlər, tanışıqçün getmiş — demiş.

Oğuz ataya ayıtmışlar:
Aləmdə nə bilmədin?
Oğuz ata ayıtmış:
Kim ölüb, kim qalacağın bilmədim,
Kim qazanıb, kim yeyəcəyin bilmədim...

## DARTIM

### *(Əbülqazi xanın "Şəcəreyi tərakimə" əsərindən)*

### Qorqud Atanın Salur Qazan alpını mədh tartımı budur:

İt Biçənə görüb onu issi getdi
Alplar, bəylər görən varmı Qazan kimi?
Bir qazana qırx bir atın ətin saldı,
Ol qazanı sol əlinə birlən aldı,

Sağ əlini birlən ilə ulaşdırdı
Alplar, bəylər görən varmı Qazan kimi?

Göy asmandan enib gəldi tinli ilan,
Hər adamı udar irdi görən zaman,
Salur Qazan başın kəsdi vermaz aman
Alplar, bəylər görən varmı Qazan kimi?

Otuz, qırx min ləşkər ilən Qazan varıb,
İt Biçənə ellərini gəldi qırıb,
Bir neçəsi qurtuldular kop yalvarıb
Alplar, bəylər görən varmı Qazan kimi?

Türki-türkmən, ərəb, əcəm, rəiyyətlər,
Qazan aldı müsəlmanca tərbiyətlər,
Kafərlərin qırdı uş alp kop firsətlər
Alplar, bəylər görən varmı Qazan kimi?

Ondan hünər götürdülər varca ullu,
Bəziləri urun verdi sağlı-sollu,
Bizə oldu qamuğ elin urnu döllü
Alplar, bəylər görən varmı Qazan kimi?

Səyyah Qorqud ölər oldun indi bilgil,
Ol Qazanın dövlətinə dua qılgil,
Karvan getdi kop gec qaldın yola girgil
Alplar, bəylər görən varmı Qazan kimi?

## MİRZƏ FƏTƏLİ AXUNDZADƏNİN ARXİVİNDƏN TAPILMIŞ DÖRDLÜK

Gəlinə ayıran demədi ol Dədə Qorqud
Ayrana doyran demədi ol Dədə Qorqud
İynəyə tikən demədi ol Dədə Qorqud
Tikənə sökən demədi ol Dədə Qorqud

# "MANAS"

*"Manas" dastanı qırğız xalqının möhtəşəm sənət abidəsidir. Həcm etibarilə "Manas" dünya folklorunun ən böyük əsəridir. Qırğız dili Oğuz qrupuna aid olmasa da, Türk dünyasının şah əsərlərindən olan bu dastanı antologiyamıza daxil edirik. Antologiyamıza "Manas" orijinalın dilində kiçik fraqmentlə və şair Adil Cəmilin qırğız dilindən Azəri türkcəsinə poetik tərcüməsiylə daxil edilir. Orijinaldan fraqment verməklə oxucuda "Manas"ın dili, vəzn və qafiyə xüsusiyyətləri haqqında təsəvvür oyatmaq istəyirik. "Manas"ın kökləri çox qədim əsrlərə aid olsa da, onu X əsrə aid etməyimiz 1995-ci ildə YUNESKO-nun qərarıyla dastanın 1000 illiyinin geniş qeyd olunmasıyla bağlıdır. "Manas" Qırğızıstanda bugün də yaşamaqda və yaranmaqdadır. Çağdaş manasçılar ona yeni-yeni motivlər və çalarlar əlavə edirlər.*

## "MANAS"dan bir parça

**orijinal:**

Cakib Kan Curciday katından
Em erkək bala tuurdu
Emi erkək bala qarasa
Apak əti çüşdidey
Ustukan sööqu mistidey
Ak boz bie soydurdu
Cakib Kan tuuqan balasının
Tört payqambar kocoqo
Atın Manas qoydurdu.
Tört payqambar kinadı
Payqambar balanı sınadı.

**tərcümə:**

Cakib xan Cörci kimi qadından
Həm də erkək bala doğurtdu
İndi erkək balaya baxsa
Ap-ağ əti pambıq kimi
Sümüyü mis kimi
Ağ boz qısraq soydurdu
Cakib xan doğulan balasının
Dörd peyğəmbər qocaya
Adın Manas qoydurdu.
Dörd peyğəmbər qucaqladı
Peyğəmbər balanı sınadı.

## MANASIN DOĞULMASI

Artıq söhbət nə lazım
İndisə qulaq asın
Sizə dastan söyləyim
Ər Manasdan söyləyim...
Toydan iki il keçdi
İl yox, sanki yel keçdi
Manas ana boynunda
Olanda üç ayında
Baybikənin ürəyi
İstəmədi yeməyi.
Anladı ki, o, daha
Dəyişibdir iştahı —
Qaçır baldan, şəkərdən.
Ağlına gəldi hərdən
Yesin pələng ürəyi —
Budur arzu- diləyi.
O da ki, deyil asan —
Axı, necə tapasan.
Fikrə getdi Baybikə:
— Qismətimdə var bəlkə...
Xəbər gəldi: — İlxıçı
Nişan alıb gözücu
Bir pələng yaralayıb,
Bağrını paralayıb,
Dərisini soyubdur,
Ətin yerdə qoyubdur...
Bu xəbəri eşidən
Çıyırdı qalxdı birdən,
Çəkdi onu muradı —
Görüşünə tələsdi,
Gəlib yolunu kəsdi.
Gələndə xeyli gümüş,
Özü ilə götürmüş.
Dedi: — Sərvət alarsan,
Çoxlu dövlət alarsan,
Atını çap ilxıçı,
Bir pələng tap ilxıçı.
Yar, gətir ürəyini,
Göyərt bu diləyimi.
Sən atamdan, anamdan

İndi mənə yaxınsan
Nə istəsən al-verim,
Qızıl, gümüş, mal verim.
... İlxıçı bu söz ilə
Qəfil tapdı xəzinə.
Bir alıcı quş oldu,
Əzablara tuş oldu.
Aşırımlar aşdı o.
Dağları dolaşdı o.
Yatdı yolun üstündə.
Gördü yolun üstündə
Uzanıbdır bir pələng —
Vurdu onu bu zirəng.
Ürəyini çıxartdı,
Arzuya, kama çatdı...
Atını geri sürdü.
Yolda daha nə gördü:
Gördü ayğır at ölüb-
İlxıçılar tökülüb
Dərisini soyublar
Düşündü ki, nə olar
Onun da ürəyini
Aparsam olmaz yəni...
Əlində iki ürək,
İlxıçı sevinərək
Gəlib çıxdı obaya —
Pay düşürdü o "paya"...
Çəkildi qara kölgə
İşıqlandı Baybikə.
İşıqlandı alaçıq —
Arzu-kama yol açıq.
Sığmayır yerə-göyə
Yanaşdı Bədəl bəyə.
Dedi: "Oğlum, nə sirdi —
İki ürək gətirdin
Belə çox idi pələng?
Yoxsa tərpənib zirəng
Bir oxla ikisini
Vurmusan. De düzünü.
Özgə heyvan ürəyi
Deyil mənim gərəyim
Bədəl bəy, ay oğlum, sən
Bəlkə yalan deyirsən".
Şübhələndi Baybikə

Üzdü onu bu “bəlkə”
Bədəl bəy dedi: — Vallah
Şahiddir ki, bir Allah
Dediyim yalan deyil,
Bu qan özgə qan deyil —
Bu pələng ürəyidir,
Əgər varsa yalanım,
Qılıncımla doğranım.
Yox daha söz söhbətim —
Bu da mənim qiymətim...
O yandı için-için
Bu şübhəli söz üçün.
İnandı ki, Baybikə
Yalan demir bu əkə.
Su gətirdi bir səhəng.
Önündə iki ürək —
Onları pak elədi,
Bişməmiş çiy-çiy yedi.
Pay vermədi heç kəsə
Yedi bircə nəfəsə.
Töküb qanlı suyunu
Ləzzətlə içdi onu.
Daha gəldi özünə
Bəxti güldü üzünə...

*Poetik tərcümə*
**Adil Cəmilindir**



# QAŞQARLI MAHMUD

*Qaşqarlı Mahmud Qaraxanlılar imperiyası dövründə, — Doğu Türküstanda, XI əsrin birinci yarısında dünyaya gəlmiş, türk dünyasının təməl əsərlərindən olan "Divani lüğat-it-türk"-ü, — müxtəlif türk ləhcələri haqqında ensiklopedik biliklər toplusu olan türcə-ərəbcə lüğətini — 1070-ci ildə başlayıb, 1076-1077-ci illər arasında bitirmişdir. "Divan" ikidilli, eyni zamanda izahlı lüğətdir, təxminən 9000 sözdən və onların izahından ibarətdir. Gətirdiyi sözləri izah etmək üçün müəllif atalar sözü və məsəllərdən, dastanlardan, şer və mahnılardan örnəklər gətirir. Beləliklə, "Divan" türk sözlərinin ərəbcə mənasını verən lüğət olmaqdan başqa qədim türk ədəbiyyatının və o sıradan qədim türk şerinin örnəklərini bizə çatdıran nadir məxəzdir. Əsərdə adı çəkilən türkdilli şerlərin müəllifi Cücü ortaq türk ədəbiyyatının bizə adı bəlli ilk şairidir.*

*Başqa türk ləhcələriylə bir sırada Mahmud Qaşqarlı bizə oğuz dilində yaranan ilk şer nümunələrini də çatdırmışdır. Tarixdə türk dilinin ilk təəssübkeşlərindən olan böyük alim əsərinin əsas qayəsini açıqlayarkən bunu xüsusilə qeyd edir ki, "ən açıq və doğru dil, ancaq bir dil bilib, farslarla qarışmayan və yabançı ölkələrə gedib–gəlməyənlərin dilidir".*

*Orxon yazılarından və Dədə Qorqud söyləmələrindən sonrakı türk şerinin inkişaf mərhələsini əks etdirən nümunələr — Qaşqarlının topladığı şerlər — türk poeziyasının heca və qafiya sisteminə uyğun gələn qoşma, gəraylı və bayatı kimi biçimlərdədir.*

*Bu cəhətdən şer tariximizi Qaşqarlının gətirdiyi nümunələrsiz təsəvvür etmək olmaz. Türkiyədə Bəsim Atalayın nəşrindən götürdüyümüz bu şer örnəkləri orijinalda və çağdaş Azəri türkcəsinə tərcümədə təqdim olunur.*

## "DİVANİ - LÜĞAT - İT - TÜRK"dən ŞER ÖRNƏKLƏRİ

### BAHAR ŞERİ

**Orijinal:**

Yay baruban ərküzi
Aqtı aqın munduzı
Toğdı yaruq yulduzu
Tinlə sözüm gülgüsüz.

Aqdı bulut kükrəyi
Yağmur tolu sekriyü
Kalik anı ürkiyi
Qanğa banr belgisiz.

Qar buz qamuq ərişdi
Tağlar suyu axışdı
Göysüz bulut örüşdü
Qayıq nolub egrüşür.

Qış yaz ilə toqquşdu
Kinqir gözün baxışdı
Tutuşqalı yaxlaşdı
Utqalı mat uğraşır.

**Tərcümə:**

Yaz gəldi, qar suları
Axdı dəlicə selləri
Doğdu səhər ulduzu
Dinlə sözüm gülgüsüz.

Çıxdı bulut kükrəyir
Yağmur, dolu yağır
Külək onu sovurur
Hara gedir bilinməz.

Qar, buz hamsı əridi
Dağlar suyu axışdı
Göy (mavi) bulud yüksəldi
Qayıq kimi salınır.

Qış yaz ilə toqquşdu
Düşmən gözlə baxışdı
Tutuşmaqçün yaxlaşdı
Yenmək üçün uğraşır.

### AĞI

Yağı odun öcürkən
Toydun ani köçürgən
İşlər üzüb keçirkən
Tekdi onu öldürü.

Yağı odun söndürən
Ortadan onu köçürən
İşləri üzüb keçirən
Zaman onu öldürdü.

### ALP ƏR TONQA SAĞUSU (ağısı)

Alp Ər Tonqa öldümü?
İsiz açun qaldımı?
Ödlək öcün aldımı?
İmdi ürək yırtılır.

Könlüm için örtədi
Yatmış başıq qartadı
Keçmiş ödük irtədi
Dün gün keçib irtədir.

Alp Ər Tonqa öldümü?
Pis dünya qaldımı?
Zaman öcün (intiqamın) aldımı?
İndi ürək yırtılır.

Könlümün içini yandırdı
Yatmış yaramı qaşıdı
Keçmiş günü aradı
Keçmiş günlər istənir.

## EŞQ

Könlüm anqar qaynayı
İçtən anqar oynayı
Gəldi mənə boynayı
Oynar məni arqarur.

Bardı gözüm yaruğu
Aldı özüm qonuğu
Qanda erinc qanığı
Ümdi udin odqurur.

Könlüm coşar qaynaşır
Evdə onunla oynaşır
Gəlib üstümə nazlaşır
Oynayıb məni yorur.

Getdi gözüm işığı
Aldı özümün ruhunu
Hardadır indi
Gözümə yuxu getmir.

## DEDİM - DEDİ

Aydım: anqar sevik
Biznə tapa nelik
Keçdin yazı kerik?
Qırlar ediz, bedük.

Aydı: sənin udu
Emgək təlim idu
Yumşaq katıq udu
Könlüm sənə yükrük.

Dedim: sevgilim
Bizə necə gəldin
Yazıları (çölləri) necə keçdin?
Təpələr yüksək, böyük.

Dedi: sənin üçün
Çox zəhmətlər çəkdim
Qatı dağlar yumşaldı
Könlüm sənə yüyürdü.

## ÖLDÜRÜŞ

Anın işin keçirdim
Eşin yeme kaçırdım
Ölüm otun içirdim
İçdi bolub yüzi türi.

Görüb neçik qaçmadın?
Yamar suyun keçmədin?
Tavarını seçmədin
Yesin səni ər börü.

Yaruq yulduz toğarda
Uznu gəlib bakarmən
Satulayı sayrışıb
Tatluğ ünün quş ötər.

Gəldi mənə tat
Aydım imdi yat
Quşqa bolub ət
Səni tilər ac börü.

Onun işin bitirdim
Eşini də qaçırdım
Ölüm otun içirdim
İçdi, bürüşdü surət.

Görüb neçin qaçmadın?
Yamar suyun keçmədin?
Mallarını seçmədin
Yesin səni ər qurd.

İşıqlı ulduz doğanda
Uzanıb baxıram
Durmadan hey oxuyub
Dadlı səslə quş ötər.

Gəldi mənə tat
Dedim indi yat
Quşa olub ət
Səni dilər ac qurd.

Üzük məni qumitti
Saqınt məni yumitti
Könlüm anqar əmitti
Yüzüm mənim sarğarur.

Türlü çiçək yanıldı
Barcın yəzim gərildi
Uçmaq yeri görüldü
Tumluq yenə gəlgisiz.

İtil suyu axa turur
Qaya dibi qaxa durur
Balıq tilim baxa turur
Gölün təki quşanır.

Öpkəm gəlib oğradım
Arslan layı kökrədim
Alplar başın toğradım
İmdi məni kim tutar?

Yığlab üdzü artadım
Bağrım başın qartladım
Kaçmış qutuğ irtədim
Yağmır kimi qan saçar.

Görklük tonuq özünə
Tatlı aşıq azına
Tutğıl qonuq ağırlıq
Yaysın savunq buduna.

Kaçan görsə anı Türk
Budun anqa aydaçı:
Bunqartedi ululuq
Bundan naru keslinir.

Qoydu bulud yağmurun
Gəlib tutar ağ torun
Qırka qoydu ol qarın
Axın axar enqrəşir.

Sevgi məni coşdurdu
Kədər məndə toplandı
Könlüm ona meyl etdi
Üzüm mənim varalır.

Dürlü çiçək yanıldı
İpək döşək sərildi
Uçmaq (cənnət) yeri görüldü
Qış bir də gəlməyəcək.

İdil (Volqa) suyu axar durur
Qaya dibin qaxa (döyər) durur
Bol balıqlar baxar durur
Gölcük təki daşar.

Öfkəm gəlib uğradım
Arslan kimi kükrədim
Alplar başın doğradım
İndi məni kim tutar?

Ağlayıb arxasınca pozuldum
Bağrım başın dəldim
Qaçmış qutumu (səadətimi) aradım
(Gözüm) yağmur kimi qan saçar.

Görklü (gözəl) donun özünə
Dadlı aşı başqasına
Qonağı ağırla (əzizlə)
Yaysın sözünü (şöhrətini) buduna (xalqa).

Haçan görsə onu Türk
Xalq belə deyər:
Bunlardadır ululuq
Bundan başqasında yox.

Qoydu bulud yağmurun
Gəlib tutar ağ toran
Çöllərə qar yağdırdı
Axın axar inləşir.

# YUSİF BALASAQUNLU

*Türk xalqlarının ortaq ədəbi sərvətlərindən olan "Qutadğu bilik" ədəbiyyat tariximizdə xüsusi yer tutur. Bu əsər vaxt etibarı ilə türk dilində yazılmış, həm də türklərin İslamı qəbul etmələrindən sonra əruz vəznində yazılmış bu gün bizə məlum olan ilk poemadır. XI əsr şairi Yusif Balasaqunlu böyük dilçi, lüğətçi alim Mahmud Qaşqarlının müasiri və yerlisidir. Poemanın adını "Səadət biliyi", "Bəxtiyarlıq sənəti", "Xoşbəxtliyə aparan elm" kimi çevirmək olar. "Qut" səadət, xoşbəxtlik deməkdir. Yusif Balasaqunlu 1015-1018-ci illər arasında Doğu Türküstanın Balasaqun şəhərində dünyaya gəlib. 1068-ci ildə Qaşqar şəhərinə köçüb. Orada 18 ay ərzində bu əsər üzərində işləyib və 1069-cu ildə "Qutadğu biliy"i Qaraxanlılar dövlətinin — Məşriqin və Çinin hökmdarı Tabğaç Buğra xaqana ərmağan etmişdir. Minnətdarlıq əlaməti olaraq xaqan Yusif Balasaqunluya Ulu Xas Hacib (saray naziri, saray işlərinin rəhbəri) vəzifəsini vermişdir.*

*Ərəb və tacik (fars) dillərində belə əsərlərin mövcudluğunu, türk dilində isə "Qutadğu biliy"in ilk örnək olduğunu qeyd edən müəllif əsərinin dilini xaqaniyyə adlandırırdı. Mütəxəssislərin fikrincə "Qutadğu biliy"in dili türk dillərinin cənub-qərb qrupuna, yəni Oğuz qrupuna yaxındır. 13200 misradan, 6520 beytdən ibarət, məsnəvi şəklində yazılmış poemanın içində rübai formasından da istifadə olunur. "Qutadğu biliy"in vəzni əruzun kəsik (qısa) mütəqarib bəhri kimi müəyyənləşdirilir. Poemanın Azəri türkcəsinə poetik tərcüməsini etmiş unudulmaz şairimiz Xəlil Rza Ulutürk belə hesab edir ki, "Qutadğu bilik"də həm onbirlik hecaya, həm də əruza uyar bol-bol misallar gətirmək olar.*

*Əsərin giriş hissəsi nəsrlə yazılmışdır.*

## “QUTADĞU BİLİK” POEMASINDAN PARÇALAR

### Müqəddimədən

| **Orijinal mətn:** | **Tərcümə:** |
| --- | --- |
| Bu kitab yavlak əziz turur. Çin hükəmalarının emsalleri birlə bezenmiş, Maçin ülemalarının əsərləri birlə arəstə qılınmış turur. | Bu kitab çox əziz kitabdır. Çin hükəmalarının hikmətləri ilə bəzənmiş, Maçin üləmalarının əsərləri ilə arəstə qılınmışdır. (yəni bəzədilmiş, süslənmişdir). |
| Bu kitabnı oxuklu, bu beytlərini məlum qılıqlı kitabdan yaxşı, əzizrak turur. | Bu kitabı oxuyan, bu beytlərdən məlumat alanlar kitabdan (da) yaxşı, əzizdir. |
| Çinü Maçin alimləri və həkimləri qamuğ ittifaq boldular kim Məşriq vilayətində, qamuğ Türkistan ellərində Buğra xan dilincə, türk lüğətincə bu kitabdan yaxşıraq hərgiz kim erse təsnif qılmadı. | Çinü Maçin alimləri və həkimləri hamsı ittifaq oldular (yəni bu fikrə şərik oldular) ki, Məşriq vilayətində, cəmi Türküstan ellərində Buğra xan dilində, türk lüğətində bu kitabdan yaxşısını heç kim yazmayıb. |
| Bu kitabda qayu padşahqa ya qayu iqlimgə ersə qayət üzlüyündən, nihayətdin keçə görklüklügündən ol ellərin hakimləri, alimləri qəbul qılıb təgmə biri bir türlük ad ləqəb urdular. | Bu kitab hansı padşaha, hansı iqlimə çatsa qayət dəyərli (olduğundan), nəhayətsiz gözəlliyindən o ellərin hakimləri, alimləri (onu) qəbul qılıb hər biri bir dürlü ad ləqəb vurdular (verdilər). |
| Çinliklər “Ədəbül-mülük” atadılar, Maçin məlikinin hükəmaları “Ayinü-l-məmləkə” dedilər, məşriqliqlər “Zinətül-ümməra”dib (deyib) aydılar, iranlıqlar “Şahnameyi-türki” atamışlar, bəziləri ma “Pəndnaməyi mülük” demişlər, turanlıqlar “Qutadğu bilik” dib (deyib) aymışlar. | Çinlilər “Ədəbül-mülük” adlandırdılar, Maçin məlikinin hükəmaları “Ayinül-məmləkət” dedilər, məşriqlilər “Zünətül-ümməra” deyiblər, iranlılar “Şahnameyi-türki” adlandırmışlar, bəziləri də “Pəndnameyi-mülük” demişlər. Turanlılar “Qutadğu bilik” demişlər. |

### *MÜQƏDDİMƏNİN ARDININ TƏRCÜMƏSİ*

*(**Kamil Vəli Nərimanoğlunun** və **Ramiz Əsgərin** çevirməsində)*

*Bu kitabı təsnif edən Balasaqun şəhərində doğulmuş dindar və mömin bir şəxsdir. Amma bu kitabı Qaşqar elində tamamlayıb, Tabğaç Buğra xan hüzuruna çıxarmışdır. Məlik Buğra xan da onu ağırlayıb – əzizləyib öz Xas hacibliyini ona vermək lütfündə bulunmuşdur. Onun üçün də Yusif Ulu Xas Hacib adı və sanı dünyaya yayılmışdır.*

*Bu əziz kitab dörd ulu və ağır təməl üstündə bina tutmuşdur. Birincisi Ədalət, ikincisi Dövlət, üçüncüsü Ağıl, dördüncüsü isə Qənaətdir. Müəllif bunların hərəsinə türkcə birər ad vermişdir. Ədalətə Gündoğdu Elik*[1] *adını verərək, onu padşah mərtəbəsində tutmuşdur. Dövlətə Aydoldu adını verib, vəzir məqamına qoymuşdur. Ağılı Öydülmüş adlandırıb, vəzirin oğlu və Qənaətə Odqurmuş adını verib, vəzirin qardaşı hesab etmişdir. Müəllif öz fikirlərini onlar arasında sual-cavab şəklində ifadə etmişdir ki, oxuyanın könlü açılıb müəllifi xeyir-dua ilə yad etsin.*

## "Qutadğu bilik" poemasının beytlərindən bəzilərinin orijinalı və sətri tərcümələri

| Orijinal: | Tərcümə: |
|---|---|
| Ərəbcə, tacikcə kitablar öküş<br>Bizim dilimizcə bu yumki ukuş | Ərəbcə, tacikcə kitablar çoxdur<br>Bizim dilimizdə hikmətli kitab ancaq budur |
| Bu türkcə qoşuqlar düzəltdim sənə.<br>Okurda unutma dua qıl mənə | Bu türkcə qoşuqları sənin üçün düzdüm.<br>Oxuyanda unutma, dua qıl mənə |
| Keyik təki gördüm bu türkcə sözük onı<br>akru tutdum yakurdum ara. | Keyik təki gördüm bu türkcə sözü<br>Onu yavaşca tutdum, yaxınlaşdırdım. |

## БAҺAP

| | |
|---|---|
| Doğardan əsə gəldi öndün yeli | Doğardan (Şərqdən) əsib gəldi bahar yeli |
| Açun itgükə açdı uçmaq yolu. | Dünyanı bəzəyərək açdı cənnət yolunu. |
| Yağız yer yıpar doldu kafir gedib | Qara yer mişk ilə doldu kafir getcək |
| Bəzənmək dilər dünya görkün itib. | Bəzənmək dilər dünya gözəlliyini göstərərək. |
| İrincik qışıq sürdü yazki əsin | Əzablı qışı süpürüb apardı yaz əsintisi |
| Yaruk yaz yenə qurdu dövlət yayın. | Parlaq yaz yenə qurdu səadət yayın. |
| Qurumuş ağaclar donandı yaşıl | Qurumuş ağaclar yaşın donun geyindi |
| Bəzəndi yipün al, sarı, göy, qızıl. | Bəzəndi al, sarı, göy, qızıl rənglə. |

[1] Elik — "El" sözündəndir

## “QUTADĞU BİLİK”DƏN

(Poetik çevirmə)

Biliklə ucalır insan binadan
Öz başını yeyir biliksiz adam.
Mən söz bolluğunda məna görmədim,
Çoxsözlü natiqi sevə bilmədim.
Uzun danışmaqdan əl çək, uzaqlaş,
Min söz dügümünü bircə sözlə aç!
Kişi söz gücünə hökmdar olur,
Söz qədri bilməyən bir gün xar olur.
Dilini saxla ki, batmasın başın,
Sözünü kəsə de, düşünsün naşı.
Biliksiz insanlar daim kordu, kor
Bilik dəryasından bir az pay götür.
İnsan ölüb gedir, fəqət söz qalır,
Söz ölüm üstündə qələbə çalır.
Yarağın, dayağın, dilmancındı dil,
Hər şəxsi tanıdan öz sözüdür, bil.
Kişini dünyada ucaldan da söz,
Xar edən, alçaldan, qocaldan da söz.
Ağız qapısında söz olur arslan,
Səni parçalayar cilovlamasan.
Dilindən başına bəlalar gələn
Ər kişi, bu şeri əzbərlə öyrən:
— Dilim çox ağrıtdı başımı susdum,
Başım kəsilməmiş dilimi kəsdim.
Dilini saxla ki, sınmasın dişin,
Sözünü saxla ki, sağ qalsın başın.
Yamandır el dili, qılınclar səni,
Yalquzaq adamlar yeyər ətini.
Düşünüb danışar başı olanlar,
Başın dildən uca bir məqamı var.
İstəsən həmişə ağ olsun üzün
Ağzından qaçırma bişməmiş sözün.
İki şey insanın həyat güzgüsü:
Bir gözəl rəftarı, bir də ər sözü.
İnsan ölüb getdi, uyğuya daldı,
Dünyada söz adlı övladı qaldı.
Ölümsüz, əbədi qalmaq istəsən,
Sözündən, özündən yardım istə sən.
Mən sənə tutmuşam, oğlum, üzümü,

Dinlə öyüdümü, eşit sözümü.
Qızıl, gümüş qalsa məndən yadigar,
Sanma ki, sözümə bərabər olar.
Həyatda ən böyük amalım ancaq—
Bilik sayəsində qalxıb ucalmaq.
Bilikdir hər zaman dayağın sənin,
Zülmət gecələrdə çırağın sənin.
Biliklə, ədəblə yüksəlir insan,
Bu qoşa qanadla hörmət taparsan.

## ÖYDÜLMÜŞ ELİYƏ ÖYÜD VERİR

Bütün diləklərə tanrı versin can,
Elik cavab umdu aqil dostundan.
Bu qıpçaq səhrası cahanla yaşıd,
Çoxunu soldurdu, özü yamyaşıl.
Sənin tək çox bəyi sevdi,apardı,
İndi səni gözlər ölüm çapan.
Bağlama könlünü sədaqətsizə,
O, vəfa qılmayıb hələ heç kəsə.
Dünyanı cüt əllə tutanlar hanı?
Qaldımı onların bircə nişanı?
Bəylik mərtəbəsi sənindir hələ,
Bu azca ömrünü mənalı xərclə.
Fikirləş, ey sübhün huşyar adamı:
Dünya bir kişiyə vəfa qıldımı?

Poetik çevirmə **Xəlil Rza Ulutürkündür.**

# ƏHMƏD YƏSƏVİ

*Əhməd Yəsəvi XI əsrin məşhur mütəfəkkir şairi, ortaq türk ədəbiyyatında ilk mütəsəvvüflərdən, türk dilində sufizm ədəbiyyatının ilk yaradıcılarındandır. Əhməd Yəsəvi Batı Türküstanın Çimkənd şəhərinin yaxınlığındakı Sayram qəsəbəsində dünyaya gəlmişdir.*

*Əhməd Yəsəvinin əsas əsəri sayılan "Divani–hikmət" əslində müəllifdən əsrlərcə sonra Yəsəvi dərvişləri tərəfindən tərtib edilmişdir. Odur ki, divanın əlimizdə olan mətnlərinin dili də XI əsrin deyil, daha sonrakı yüzilliklərin dil xüsusiyyətlərinə uyğundur. "Divani-hikmət" qafiyə sistemi və vəzni baxımından qoşmalara bənzəyən dördlüklərdən və əruz vəznində yazılmış qəzəllərdən ibarətdir. 1983-cü ildə Ankarada Kemal Eraslanın hazırladığı "Divani-hikmətdən seçmələr" kitabından bəzi örnəkləri antologiyamıza daxil edərkən mətni yalnız fonetik baxımdan çağdaş Azəri türkcəsinə uyğunlaşdırmışıq (məsələn, bolmaq — olmaq, bardı — vardı" və s.).*

## HİKMƏTLƏR

I

Ömrüm axır olanda nə qılım mən, xudaya?
Can alıcı gələndə nə qılım mən, xudaya?
Can vermənin vəhmindən, Əzazilin zəhmindən,
Şəfqət olmasa səndən nə qılım mən, xudaya?
Can vermək işi düşvar, asan qılgil, ya cəbbar
Səndən özgə yox qəmxar, nə qılım mən, xudaya?
Canım cüda olanda, tənim burda qalanda,
Taxta üzrə alanda, nə qılım mən, xudaya?
Aciz olub yatanda, fəriştələr girəndə
"Mən rəbbik" dib[1] soranda, nə qılım mən, xudaya?
İltib[2] gira qoyanda, yeddi qədəm dönəndə,

[1] Dib — deyib
[2] İltib — gətirib

Sorucular girəndə, nə qılım mən, xudaya?
"Mən rəbbük" dib duranda, qara gündür uş anda,
"Rəbbin kimdir?" deyəndə, nə qılım mən, xudaya?
Qul Xacə Əhməd sən bəndə, nəfs əlində şərməndə,
Məşhər günü olanda, nə qılım mən, xudaya?

II

Bişək bilin bu dünya varca eldən ötəri,
İnanmagil malına bir gün qoldan gedəri.
Ata, ana, qarındaş, kaya[1] getdi fikir qıl,
Dörd ayaqlı çubin at bir gün sənə yetəri.
Dünya üçün qəm yemə, haqdan özgəni demə,
Kişi malını yemə, Sirat üzrə tutarı.
Əhli-əyal, qarındaş, heç kim olmadı yoldaş,
Mərdanə ol qərib baş ömrün yel tək ötəri.
Qul Xacə Əhməd taət qıl, ömrün bilməm neçə il,
Əslin bilsən - abü-gil yenə gilə gedəri.

III

Vəhdət humi[2] açıldı meyxanəyə girsəm mən,
Bir cam içib ol meydən məsti-heyran olsam mən.
Uş ol meyin məzəsi iç bağrımı qan qıldı
Bağır qanın ağızıb canan sarı varsam mən.
Saqi sundu hər nəfəs keyfiyyətin şərabın
Sərməst olub uş ol dəm nalə-fəryad vursam mən.
İnsaniyyət yaxasın şövq atəşi yandırdı
Vəhdaniyyət dəryasın uş ol dəmdə sorsam mən.
Ol dəryanın mevcindən dəymə qəvvas dür almaz
Candan keçib dür üçün bəhr dibinə cumsam mən.
Xacə Əhmədi humində məhəbbətin şərabı
Aşiqlərə ol meydan muradınca versəm mən.

IV

Ey dostlarım, ölsəm mən bilməm ki, halım nə olur
Gora girib yatsam mən bilməm ki, halım nə olur.
İltib lahidə qoysalar, arxaya baxmıb dönsələr,
Soru sualım sorsalar, bilməm ki, halım nə olur.
Girsə qarış atlı ilan, dolansa tənə ol zaman,
Qalmaz bütün bir üstüxan, bilməm ki, halım nə olur.
Cümlə yığılıb muri-mar, ətrafımda nəşlər vurar,
Müşkül irür bəs karü-bar, bilməm ki, halım nə olur.

---
[1] Kaya — hara
[2] Hum — küp

Heç gəlmədi məndən savab, orda nə verərəm cavab,
Gər qılsalar yüz min əzab, bilməm ki, halım nə olur.
Olsa qiyamətin günü, hazır olur varcaları
Qıldığın əməllər hanı, bilməm ki, halım nə olur.
Ey Qul Əhməd, sən bu gün qılgil ibadət düni-gün
Deməgil ömrümdür uzun, bilməm ki, halım nə olur.

V

Neçə illik mehribanım can aytadır[1] dostlarım,
Bu vicudum şəhrini fani qıladır dostlarım.
Bu qəfəsin tutisi pərvəz etədir uçmağa
Bir qaranqu şöləsiz yerdə varadır dostlarım.
Ey mənim yaranlarım, hümmət tutun imanıma
Düşmənim imanıma zəhmət verədir dostlarım.
İşbu can bizlər ilə bir neçə illər var idi
Haqq taala hökmü ilə əzm etədir dostlarım.
Bu mənim əzalarım canım ilə şadman idi
Can çıxanda küll əzam həm titrəşidir dostlarım.
Əmri-haqqa varca xalqı aləmin oldu riza
Ol həqiqət bəndələr daim rizadır dostlarım.
Qul Xacə Əhməd tutisi pərvaz etədir uçmağa
Neyləsin miskin kim ol hökmi-xudadır dostlarım.

## DÖRDLÜKLƏR

Harda görsən könlü sınıq mərhəm olgil,
Oylə məzlum yolda qalsa həmdəm olgil,
Ruzi-məşhər dərgahına mərhəm olgil,
Mavü-mənlik[2] xəlayiqdən keçdim muna.

Qul Xacə Əhməd söylədiyi haqqın yadi,
Eşitməyən dostlarına qalsın pəndi.
Qürbətlənib öz şərhinə qayıdıb gəldi,
Türküstanda məzar olub qaldım muna.

Otuz birdə Xızır babam mey içirdi,
Vicudumun əzasını pək qaçırdı,
Sevda qıldım yazıklarım haq keçirdi,
Ondan sonra haqq yoluna saldı dostlar.

---

[1] Aytadır — dedilər

[2] Mavü-mənlik — mən və sən

Otuz iki yaşda yetdi haqdan fərman,
Bəndəliyə qəbul qıldım qılma arman.
Can verdikdə verdim sənə nuri-iman,
Qərib canım şadman olub güldü, dostlar.

Xaliqimdən xəbər yetdi şakir oldum,
Hər kim söysə, bəlkə təpsə sabir oldum,
Bu aləmdə yuxlamayıb hazır oldum,
Hayü həvəs mavü-mənlik getdi, dostlar.

Otuz üçdə saqi olub mey üləşdim,
Cami-şərab ələ alıb doya içdim,
Ləşkər düzüb şeytan ilə çox vuruşdum,
Bihəmdüllah iki nəfsim öldü, dostlar.

Otuz altı yaşda oldum sahib-kamal,
Haq Mustafa görsətdilər mənə camal,
Ol səbəbdən gözüm yaşlı, qamətim dal,
Eşq xəncəri ürək bağrım dəldi, dostlar.

Otuz səkkiz yaşa girdim ömrüm ötdü,
Ağlayımmı ölər vaxtım yavuq yetdi,
Əcəl gəlib peymanəsin mənə tutdu,
Bilməz qaldım, ömrüm axır oldu, dostlar.

Saçi – saqqal xub ağardı, könlüm qara,
Ruzi-məhşər rəhm etməsə halım təbah,
Sənə ayan əməlsizəm çoxdur günah,
Cümlə mələk günahlarım bildi dostlar.

Qul Xacə Əhməd qırxa girdin nəfsini qır,
Burda yığlab[1] axirətdə olgil arıq[2],
Posti-iman şəriətdir məğzi-tarik[3],
Tarik girən haqdan uluş aldı dostlar.

Eşq davasın mənə qılma yalan aşiq,
Aşiq olsan bağrın içrə göz qanı yox,
Məhəbbətin şövqi ilə can verməsə,
Zaya keçər ömrü onun yalanı yox.

Zahid olma, abid olma, aşiq ol,
Möhnət çəkib eşq yolunda sadiq ol,
Nəfsi təpib dərgahına layiq ol,
Eşqsizlərin həm canı yox, imanı yox.

---

[1] Yığlab — ağlayıb
[2] Arıq — arı, təmiz, pak
[3] Tarik — təriqət

Eşq sevdası kimə düşsə rüsva qılar,
Pərtöv salıb haq özünə şeyda qılar,
Məcnun sifət ağlın alıb Leyla qılar,
Allah haqqı bu sözlərin yalanı yox.

Qul Xacə Əhməd candan keçib yola gir,
Ondan sonra ərənlərin yolun sor,
Allah dibən[1] yolunda canın ver,
Bu yolda can verməsən imkanı yox.

[1] Dibən - deyibən

# XI - XIII ƏSRLƏRDƏ FARS DİLİNDƏ YAZAN TÜRK ŞAİRLƏRİ

## QƏTRAN TƏBRİZİ

(1012—1088)

### QƏZƏL

Hardasan, ey könlümə dinclik verən can, hardasan?
Çox çağırdım, gəlmədin, ey dərdə dərman, hardasan?

Firqətə dözmək çətin, vəslinlə kəsdim ülfəti,
Şadlığı, şeriyyəti məhv etdi hicran, hardasan?

Hər zaman könlüm sorar: neyçün susub əyləşmisən?
Bir qəmər hicrində könlüm qaldı nalan, hardasan?

Daşla sınsaydı qolu vəslin, tapardım mumiya,
Hicr ilən sınmış qolum, qıl çarə, Loğman, hardasan?

Bir çırağ imiş vüsal, düşdü qəfil tufanlara
Nurumu zülmətmi uddu, ey çirağban, hardasan?

Hicrinin, ya vəslinin xeyri nədir, mənası nə?
Bir qılınc çəkmiş zaman, vəsli tutur qan, hardasan?

Firqətin bir tanrı hökmü... Sən özün tanrım mənim!
Tanrı hökmündən nə cür mən qurtarım can, hardasan?

## ƏBÜL-ÜLA GƏNCƏVİ

(XII əsr)

### QİTƏ

İllərcə gizlədim onu əğyardan müdam,
Verdim o şuxə gözlərim üstündə yer fəqət.
Ol şux baxışlı göz yaşımın sadə tifli tək,
Gözdən yüyürdü, üz-gözümə çıxdı aqibət.

### XAQANİ HAQQINDA

Məni zəmanənin doğdu anası,
Dünyada yüksəklik, hünər ustası.

Arandan çıxmışam, altmış yaşım var,
On altı il etdim Şirvanda qərar.

Zəif bir qocayam, şahı vəsf edən,
Demirəm Keyxosrov, Keyqubadam mən.

Sual etsən məndən, ey Əfzələddin,
Özün doğrusunu eylərsən yəqin.

And olsun o əziz canına, səndən —
Xeyli narazıyam, düzünü bilsən...

Mən sənin ustadın, həm də qaynatan.
Sən mənim övladım, göz işığımsan.

Sən məni özünə seçərkən ustad,
Verdim qızımı da, olasan damad.

Sənin təliminə bel bağlamışdım,
Sənin şairlikdə dilini açdım.

Səni o xaqana özüm göstərdim,
"Xaqani" adını sənə mən verdim.

Nədəndir od kimi üstümə coşmaq?
Nə sən odsan, susan, nə mən yel, torpaq!

## XAQANİ ŞİRVANİ
(1126—1199)



### "HƏBSİYYƏ"DƏN

Xaqani qürbətə basalı ayaq,
Olmuş tək qapılı bir evdə dustaq.

Nə evin içində rahət olur can,
Nə də var bayıra çıxmağa imkan.

Üzü divaradır, sanki hörümçək
Girmiş daş altına bir qarışqa tək.

Qıfıldır keşikçi ona bayırdan,
Daxildə çəftədir ona pasiban.

Nəfəsi alovdur, göz yaşı — Ceyhun,
Qəlbi — od kürəsi, ahı — od, onun.

Salınmış dörd yanı bağlı bir yerə,
Açılır qapısı geniş göylərə.

Sükut qıfılını ağzına vurub,
Ümidini haqqa bağlayıb durub.

Nə qədər bu ümid qonaqdır bura,
Qapını açmayın yad duyğulara.

Xaqani, xoş həyat fikrindən əl çək!
Dünyada tapılmaz dərdsiz bir ürək.

Dörd əsas üstündə dayanmış cahan,
O dörddən birisi sayılır ərkan.

Sən də öz evində dörd cəhət axtar,
Çünki hər təməli dörd səbəb qurar.

Şadlığın şərtisə üç şeydədir, bax:
Məkandır, zamandır, bir də dost, — ancaq.

Dördüncü şərtini görən olmamış,
Çünki yoxdan xəbər verən olmamış.

## QƏZƏLLƏR

Hanı bir yel apara könlü gülüstanə tərəf,
Tutaraq bəlkə yaxamdan çəkə cananə tərəf?

Ürəyim düşdü iki dərd-bəla ortasına,
Gah gedər kakilə, gah zülfi-pərişanə tərəf.

Can çətinliklə çıxır, başımın üstə tez gəl,
Gözlərin tez aparır canımı müjganə tərəf.

Yusifi cəzb elədi, bil ki, Züleyxa yuxusu,
Çəkdi Kənandan onu Misrə, o samanə tərəf.

Xəbər et nazlı kamandarə ki, öz şəstilə,
Çəkə bu qəlbimi bir ləhzədə peykanə tərəf.

Mən susuz qalmışam, əfsus, pərəstarım yox—
Ki, çəkələblərimi cahi-zənəxdanə tərəf.

O xumar gözləri heç meylə ayılmaz, əsla,
Bir cam aşiq qanı içsə, əl atar canə tərəf.

Biz onun xəncərinə hazır olan qurbanıq,
Kaş ki, bir ləhzə baxa biz kimi qurbanə tərəf.

Ağlayarsa belə bir nalə ilə Xaqani,
Qorxuram gözyaşı çəksin onu tufanə tərəf.

* * *

Canım nə qədər var, mənə canan, sən olarsan,
Candan da əziz olsa bir insan, sən olarsan.

Sən indiyədək qəlbim üçün qəlb idin, ey yar,
Bundan sora da canım üçün can sən olarsan.

Hər yarəm əgər olsa, onun məlhəmi sənsən,
Hər dərdim olarsa, ona dərman sən olarsan.

Könlün necə istərsə, elə ver mənə fərman,
Ömrüm nə qədər var, mənə soltan sən olarsan.

Eylərsən əgər şərhini iman ilə küfrün,—
Baş hərflə sərlövhəyi-divan sən olarsan.

Xaqani nədir? Gəlsən əgər ey gözü şəhla!
Əlbəttə ki, Xaqaniyə xaqan sən olarsan.

* * *

Getdikcə bu eşqin mərəzi pürxətər oldu,
Dərman elədikcə ona, döndü betər oldu.

Eşqin odu yandırdı mənim canımı, ey vay!..
Bu vaqeədən cümlə – cahan baxəbər oldu.

Həsrətdə qalıb, vəslə ümid eyləmişəm mən,
Zülmətdə qalıb, istəyim hər an qəmər oldu.

Sənsiz, gözəlim, hicrə dözüb zəhr içərdim,
Gəlcək yanıma zəhr dönüb bal, şəkər oldu.

Gördüm səni, hər dərdü ələm getdi, dağıldı,
Əhvalıma bax, sanki gecəydi, səhər oldu.

Xaqani, sevin, indi yarın rəhmə gəlibdir,
Bundan sonra könlün, deyəsən, bəxtəvər oldu.

* * *

Məhəbbət bir bəladır ki, yoxdur onun dərmanı,
Aşiq canı tərk etsə də, ata bilməz cananı.

Məhəbbətin zəncirinə bağlanandan, hər gecə—
Salar zülfü halqasına qəlbimdəki halqanı.

Dedi: — Bütün ömrü qoysan, yetişərsən vəslimə,
Məmnun etdi məni, amma tutmadı bu peymanı.

İndi necə bel bağlayım o dildarın əhdinə?
Ömür gödək, fələyinsə yoxdur bizə ehsanı.

* * *

Ey aydan, pəridən gözəl nazənin,
Məcnuna dönürəm eşqindən sənin.

Yaraşmaz zülm etmək nazlı mələyə,
Gəl mənə lütf eylə, ey nazlı gəlin.

Nə gözəl gecədir, bəs vəslin hanı?
Səni bax gözləyir dərdli Xaqani.

Gəl sənə söyləyim dərdimi bir-bir,
Gəlməsən yandırram bütün cahanı.

Xaqani öpdükcə şirin ləbindən,
Hərarət içində qızışır bədən.

Yəqin ki, dodağın alovludur, yar,
Yoxsa bu hərarət haradan, nədən?

Farscadan tərcümə edəni **M. Soltan**

## MƏHSƏTİ GƏNCƏVİ
(XII əsr)

### RÜBAİLƏR



Hər iki dünyanın kərimi sənsən,
Qocaya, cavana kömək edənsən!
Sənin rəhmətinə əminik, allah,
Könlümüz şad olur sənin feyzindən.

Məni kam almağa qoymadı zaman,
Gücü çatan qədər elədi divan.
Deyəsən əhd etmiş, dolandıqca hey —
Məni də özüylə hərlətsin dövran.

Xidmətdən qovulmuş bir kəsdir ürək,
Adın-sanın yoxsa, həyatdan əl çək.
Bu dünya elə bir karvansaradır —
Ki, qara pula da dəyməzmiş, gerçək.

Xalqın başında gər olsan da bir tac,
Ağladar səni də bir gün ehtiyac.
Xalqın dərdinə qal, ona həmdəm ol,
Sən o gündən qorx ki, olasan möhtac.

Nədən səni belə yandırdılar, şam,
Yoldan çıxartdılar burda bir axşam?
Sən özün dilə gəl, neyləsin, əgər —
Yaranmışsa ancaq yanmaqçün adam?!

Olursa Misir, Rum, Çin sənin, ancaq —
Bil ki, bütün dünya sənin olacaq.
Kefini kök saxla, çünki son qismət,
On arşın kəfəndir, üç arşın torpaq!

Qəminin eşqilə cahana gəldim,
Canımı eşqinə qurbana gəldim.
Bu könlüm qəminin məkanıdır, yar!
Qəmini çəkdikcə mən cana gəldim.

Saçların ətrafa xoş ətir saçar,
Səhər yeli onu vurub dağıdar —
Qolunu boynumda görsə bir zahid, —
Heç ola bilərmi, o bir də dindar?!

Gül yola baxırdı, rəngi solmuşdu,
Bülbülün eşqiylə gözü dolmuşdu.
Bayaq bəzəndiyi yaşıl paltarı—
İndi parçalayıb dəli olmuşdu.

Yetməzmi, qəribə verdin işgəncə,
Cəfanın hüdudu olmazmı, səncə!?
Demişdin: Gəncədə kamə yetərsən,
İndi bu mən, bu sən, bax, bu da Gəncə!..

Arvadla kişini bağlayar kəbin,
Bu işə yol verir şəriət, ayin.
Mənimsə kəbinim bir rübaidir,
Varmı bu kəbinə yol verən bir din?

Toxunma könlünə biçarə gülün,
İncitmə qəlbini avarə gülün.
Səbanın eşqiylə olmuşdur, ey dost,
O qanlı köynəyi sədparə gülün.

Vüsalınla dolu gecələr getdi,
Kirpiyimdən düşən incilər getdi.
Ürək rahatlığım, munisim, hər şey,
Sən getdin, səninlə bərabər getdi.

Sən qəssabsan, mənsə qurbanınam, bax,
Dözərəm çatsa da sümüyə bıçaq.
Adətdir, satırsan kəsdiyini sən,
Məni öldürsən də, gəl, satma ancaq!

Gözəl, bax, bir mənəm, bir sən, nə xoş hal.
Nuş edək şərabı coşsun cah-calal.
Gecə yar zülfü tək uzansın, fələk!
Sübhün açarını sən quyuya sal!

Könlümə yar oldu bu gecə dilbər
Yalqız gecələrdən şikayət eylər.
Ey gecə, kədərim olsan da, getmə.
Səadət də olsan gəlmə, ey səhər!

Dün kaşı kuzəmi daşlara çaldım.
Sərxoşdum, bilmədim əlimdən saldım.
Kuzə dilə gəlib dedi ki: mən də
Sənin kimi idim, bu günə qaldım.

Çevirəni Nigar Rəfibəyli

# NİZAMİ GƏNCƏVİ



*Dahi Azərbaycan şairi Nizami 1141-ci ildə Gəncədə doğulmuş, bütün ömrünü bu şəhərdə yaşamış və 1209-cu ildə burada dəfn edilmişdir. Nizami beş məsnəvidən ("Sirlər xəzinəsi", "Leyli və Məcnun", "Xosrov və Şirin", "Yeddi gözəl", "İsgəndərnamə") ibarət "Xəmsə"nin, lirik qəzəllərin və başqa əsərlərin müəllifidir. Əsərlərini fars dilində yazsa da, Nizamidə türklük hissi çox güclüdür, türk folklorundan alınma motivlər yaradıcılığında mühüm yer tutur, türk sözlərindən bol-bol istifadə edir. Antologiyamızda Nizaminin bir neçə qəzəlini çağdaş Azərbaycan şairlərinin tərcümələrində veririk.*

Vəslin həvəsi ömrümü son anə yetirdi,
Hicran qəminin xəncərini qanə yetirdi.

Karvansaradır qəmli könül eşq yolunda,
Bu dərd yatağı karvanı karvanə yetirdi.

Ömrün gəmisi ruzigarın dalğalarında,
Tufansız ötüb gör necə ümmanə yetirdi.

Tordan qurtaran quş ki, qayıtmaz tora bir də,
Keçmiş ömrü kim yenidən canə yetirdi?

Bilsən niyə biz bilməmişik qədrini vəslin!
Çünki, bizi bəxt, qəflətən ehsanə yetirdi.

Tərcümə edən **Ə. Vahid**

***

Aşiqəm, əmrini ver aşiqi-nalanə, gülüm,
Yanına ya gəlim əql ilə, ya divanə, gülüm?

Sevirəm qəlbilə canım kimi cananımı mən,
Ölərəm, ya yetərəm sən kimi canana, gülüm.

Sənə dost olmağıma cümlə şəhər düşmən olub,
Məni əfv eylə, baxıb bir belə düşmənə, gülüm.

Harda görsəm səni, zülfündən öpüb yalvararam,
Aşiqəm, aşiqə yoxdur yazı, divan, a gülüm!

Sənsizəm, səndən uzaq kimsəni düşsün deməərəm,
Yetməyir əl sənə, yox səbr də hicranə gülüm.

Tərcümə edən **C. Xəndan**

***

Hüsnün gözəl ayətləri, ey sevgili canan!
Olmuş bütün aləmdə sənin şəninə şayan.

Gəl eylə inayət, mənə ver busə ləbindən,
Çünki gözəlin busəsidir aşiqə ehsan.

Sordum ki, "könül hardadır", aldım bu cavabı:
"Heç sorma, tapılmaz onu axtarsa da insan".

Rəhm eylə deyib, sel kimi göz yaşımı tökdüm,
Kim, qanım ilə əl yuma, ey afəti-dövran!

İnsafın əgər varsa, açıq de, bu Nizami,
Sənlə necə rəftar eləsin, ey məhi-təban?

Gəl söylə, cavabın nə olar sorğu zamanı,
Əhvalımı səndən soruşarsa Qızıl Arslan?

**Tərcümə edən M. Dilbazi**

***

Gözüm aydın, gözümə surəti-canan görünür,
Mişk-ənbər saçaraq ətrlə əfşan görünür.

Allaha şükr edirəm, ey gözümün nuri, bu gün
Yar gəlib göz önünə, sərvi-xuraman görünür.

Ayrılıq zəhrini daddım, acı da olsa, vüsal
İki dünyayə dəyər öylə ki, hicran görünür.

Səni bir dəfə görənlər güvənir eşqimizə,
Nə üçün gözlərin, ey dil, belə giryan görünür?

Eşqini canım ilə bəslədi birlikdə könül,
Onsuz, ey sevdiciyim, can evi viran görünür.

Ey sənəm, vəslin ilə, öylə ki, şad oldu könül,
Yırtdı qəm köynəyini, gül kimi xəndan görünür.

Şadlığından alışıb yandı Nizami, dedi ki:
"Gözüm aydın, gözümə surəti-canan görünür".

**Tərcümə edən C. Xəndan**

***

Hər gecəm oldu kədər, qüssə, fəlakət sənsiz,
Hər nəfəs çəkdim, hədər getdi o saət sənsiz!

Sənin ol cəlb eləyən vəslinə and içdim, inan,
Hicrinə yandı canım, yox daha taqət sənsiz!

Başqa bir yarı necə axtarım, ey nazlı mələk,
Bilirəm, sən də dedin: "Yox yara hacət sənsiz!"

Sən mənim qəlbimə hakim, sənə qul oldu könül,
Sən əzizsən, mən ucuz, bir heçəm, afət sənsiz!

Nə gözüm var arayım mən səni, bəxtim də ki, yox
Nə də bir qaçmağa var məndə cəsarət, sənsiz!

Sən Nizamidən əgər arxayın olsan da, gülüm,
Gecə-gündüz arayıb, olmadı rahət sənsiz!

Tərcümə edən **C. Xəndan**

***

Yenə tövbə evimi eşq xərab etmədədir,
Aşiq iftarını sevda meyi-nab etmədədir.

Könlümə bir mələyin sevgisi od saldı, adı
Günü də, Zöhrəni də göydə sərab etmədədir.

Onun eşq atəşi hər qəlbə girər, amma nədən
Tək mənim qəlbimi atəşdə kəbab etmədədir?

Gözlərin baxdı mənə, söylədi: "Səbr et, səninəm",
Doğrusu, səbr edərəm, ömr şitab etmədədir.

Ahu gözlükləri yatmış zaman ovlar ovçu,
Ömür röyada şikar olmağa tab etmədədir.

Məsləhətdir, məni qovmaqdan isə, versin əzab,
Yar bunu yaxşı düşünmüşdür, əzab etmədədir.

Gər Nizamini xəta isə həlak etdirmək,
Aşiqəm, yar məni öldürsə, səvab etmədədir.

Tərcümə edən **C. Xəndan**

***

Gül camalın gülə dedi: — Dur, pərdə sal üzündən,
Güllər zünnar bağlamışdır yanağından, üzündən.

Görürəm ki, qan ötmüşdür niqabını qönçənin,
Xəcalətdən bürünüb ki, görməyəsən bəlkə sən.

Qulac-qulac saçlarının açılanda mətai,
Bənövşələr keçmək üçün yük bağladı bilirsən.

O ərğəvan camalının bir işarə etməsi
Yasəməni lal eylədi, süsən qaldı sözündən.

Əgər dava edirsənsə, gülə söylə hökmünü,
Çünki nərgiz xumar olmuş, yuxu yağır gözündən.

Nizamilə çox əlləşdi bülbül etsin rəqabət,
Bu qəzəli eşidəndə susdu, getdi özündən.

Tərcümə edən **C. Xəndan**

***

Könlüm sitəminlə canə yetdi,
Ahım odu asimanə yetdi.

Ayrılmaram ölməyincə səndən,
Qəm xəncəri qəlbə, qanə yetdi.

Eşqi necə gizlədim cahanda,
Şurim o biri cahanə yetdi.

Karvan hələ çatmamış, yolunda
Köç növbəti gəldi, canə yetdi.

"Gözlə, gələrəm, — dedin, — Nizami!"
Tez gəl ki, zaman o anə yetdi.

***

Gecə xəlvətcə bizə sevgili yar gəlmiş idi
Üzü aydan da gözəl nazlı nigar gəlmiş idi.

Tər axıb gül yanağından, bulud örtmüşdü Ayı,
Onu düşmənmi qovub, könlü qubar gəlmiş idi?

Ona mən göz yetirib, xəlvəti baxdım, baxdım,
Ovçunun ovlağına körpə şikar gəlmiş idi.

Uyuyub hər ikimiz, rahat olub, bir yatdıq,
Bəxtimin bağçasına güllü bahar gəlmiş idi.

Dedi: "Getmək dəmidir, söylə nə istərsən, yar?"
Bir öpüş istədim ondan... Yeri var, gəlmiş idi.

Ağlayıb getdi o yar, göz yaşı yandırdı məni,
Odlara yandı dilim, sanki şərar gəlmiş idi.

"Ey Nizami!" dedi... Birdən ayılıb, gördüm o yox,
Demə, röyada bizə çeşmi-xumar gəlmiş idi.

**Tərcümə edən C. Xəndan**

# MEVLANA CƏLALƏDDİN RUMİ

(1207—1273)



*Şərqin böyük şairlərindən biri, vəhdəti-vücud (panteizm) fəlsəfəsinin görkəmli nümayəndəsi Cəlaləddin Rumi indiki Əfqanıstanın Bəlx şəhərində anadan olmuşdur. Cəlaləddinin atası Bəhaəddin Vələd 1214—1217-ci illər arasında Anadoluya köçür və Mevlana bütün ömrünü o vaxt Səlcuqların paytaxtı olan Konya şəhərində keçirir. Orada da dəfn edilmişdir. Mevlana C. Rumi 38 yaşında olarkən 60 yaşlı islam piri, dərviş Şəmsəddin (Şəms) Təbrizi ilə tanış olur. Bu tanışlıq Cəlaləddinin dünyagörüşünə dərin təsir göstərir, fikir dünyasını kökündən dəyişdirir. Şəmsə qeyri-adi bir məhəbbətlə bağlanmış Cəlaləddin onu tanrı səviyyəsində ilahiləşdirir. Bir gün Şəms sirli şəkildə qeyb olarkən, Cəlaləddin sarsılmış və müəlliminə olan məhəbbətini, onun itməsindən doğan kədər və həsrətini bədii əsərlərində — məsnəvilərində, rübai və qəzəllərində ifadə etmişdir. Nizami, Xaqani kimi türk oğlu olan Rumi şerlərini fars dilində yazmışdır, türk dilində yalnız bir neçə şeri və farsca—türkcə mülamməsi qalmışdır. Antologiyamıza Mevlanın türkcə şerlərini və farsca yazdığı əsərlərdən bəzi örnəklərin tərcüməsini daxil edirik. Tərcümələr Türkiyə şair və araşdırıcılarından A. Qədirin, H. Rifatın, M.N. Gəncosmanın, F. Xalıçının, M. Öndərin çevirmələri əsasında hazırlanmışdır.*

Yenə gəl, yenə gəl.
Nə olursan ol,
İstər kafir ol, istər atəşə tapın,
istər bütə,
istər yüz kərə tövbə etmiş ol,
istər yüz kərə pozmuş ol tövbəni
Umudsuzluq qapısı deyil bu qapı
Necəsənsə öylə gəl.

## RÜBAİLƏR

Mən məndə deyil, səndə də həm sən, həm mən
Mən həm məniməm, həm də sənin, sən də mənim
Bir oylə qərib hala bu gün gəldim ki
Sən mənmisən, bilmirəm, mənmi sənəm.

Yolumuz, məzhəbimiz üzrə gedən bir kimsə
Bizi yüz canlı, canın hamısın ağ üzlü görür.
Bir qədəh şərbət içən olsa bizim məşrəbdən
Nəşəsindən gecəmiz gözünə gündüz görünür.

Yolumuz uğradı canan ilə gül baxçasına
Qönçələrdən birinə getdi gözüm istəmədən.
Üzümə baxdı da canan dedi ki: Eşq olsun!
Gülə baxmaq yaraşarmı yanağım hazır ikən.

O pırıl-pırıl yanan şamdandakı mum deyil
Bir damlacıq su deyil, torpaq deyil, qum deyil.
Gəl özünü hirsinin pərdəsində gizləmə
O səndəki gözəllik oylə bir udum deyil.

Sevgilim bir köşədən özünü göstərmək ilə
Bu gecə ay nurilə tamam oldu, tamam.
Səcdə fərz oldu Onun ismini təkrar edərək
Bu gecə badə kimi yuxu haram oldu, haram.

Bir baxışla çalır o, könlünü hər bir görənin
Verəməzlər Ona, əlbəttə, təbiblər də əlac.
Görsələr çünki Onun gül üzünü bir kərrə
O təbiblər də olur başqa təbibə möhtac.

Olduğum yerlərə uğrayammam qorxumdan
Qısqanarlar sənə aşiqlik edənlər birdən.
Gecə-gündüz yaşayan könlüm içində sənsən
Səni görmək dilədikdə baxıram könlümə mən.

Ən möhtəşəm sevda o ki, var görünməz
Həqiqətdə olan cahan var görünməz.
Bir əsmək ilə rüzgar toz-torpaq görünür
Qırılır cümlə budaqlar, rüzgar görünməz.

Yoxluqla qovuş, varlığı, dünyanı burax
Vüslətsə yolun axirəti üqbayi burax.
Tanrıysa muradın, düşünüb durma dərin
Dünyanı unut, maddəyi, mənayi burax.

Məst ikən bir gün varıb ustadıma
Söylədim: "Varlıq nədir, yoxluq nədir?"
"Boylə der: xalqın əzasından uzaq
Var və yox insan üçün bir pərdədir".

Sevgilim təkmil cahandan gizlidir,
Duyğudan, hər türlü zənndən gizlidir,
Aşikar könlümdədir bir ay kimi
Can və təndir, tən və candan gizlidir.

Gizli sirrlərini söyləmədə cahanın
O yanıq ney, o yanıq ney, yanıq ney
Ney nədir? O, busəsi gözəl cananın
Öpdüyü şey, öpdüyü şey, öpdüyü şey.

## SÖYLƏ DƏ, SÖYLƏ

Ey ərlərin başı, söylə də, söylə
Ey meydan padşahı, söylə də, söylə
Ey ölümsüz ay, ey saqilər sultanı
Ey canımın canı, söylə də, söylə.

El aləmə qibləsən
Şama işıq şöləsən
Bir bitməz hekayəsən, söylə də, söylə.
Sən abi-həyat,
Sən şəkərdə dad,
Sən sevgilinin sirlərini bilən
Sən hər zaman gülən, söylə də, söylə.

Qəm sənə gərək deyil,
Öfgəli ürək deyil,
Al əlinə rübabı,
Burax döyüş-qovğanı,
İmanına and olsun,
Könlümüz nəşə dolsun
Söylə də, söylə.

## BU GECƏ UYUMA

Qonağam mən bu gecə sənə,
Ey can, ey canımın canı,
Ey gül, ey gözəllər sultanı,
Nə olur, bu gecə uyuma.

Könlümü alıb apardın.
Canı da al apar, amma
Sakın, bu gecə uyuma:

Sənsiz iki dünya zindan mənə
Yumma gözlərini dur,
Sakın, uyuma:
Qədir Gecəmiz bu gecə.

## GƏL, ARTIQ

Nə ağlım qaldı mənim, nə dinim,
Nə qərarım qaldı mənim, nə səbrim
gəl, nə olar, gəl, artıq.

Nə könlümün dərdin sor mənə,
Nə saralan üzümü sor mənə,
Nə içimin atəşini sor mənə,
gəl gözünlə gör, gəl, artıq

Bir vaxtlar bir aynaydım,
Üzündən izlər toplamadaydım,
İndi bürüşdüm, indi saraldım
gəl gör məni, gəl, artıq.

Dərə kimi axıram sağa-sola,
Ayrılıq hər yanımda pusquda.
Səhər vaxtı yalvararam, yaxaram
rüzgarların hüzurunda,
gəl, nə olar, gəl, artıq.

Ey aşiqlər peyğəmbəri,
könül atəşində yanmışam mən,
boğulmuşam göz yaşında.
Get sor Allahı sevərsən:
Nə tədbir göstərir sevgili?
Nə çarə yazar mənə?

Ey Təbrizli Şəms,
dinim eşqdir mənim.
Sənin üzünü gördüm, görəli
Mənim dinim sənin üzündə ovunur, ey sevgili.
Gəl, nə olur artıq, gəl.
"Gəl" deməkdən qurtar məni.

## TƏBRİZƏ SALAM

Qulağını ver, dinlə
bax nə deyir:
Bu məhəllədə bizim xalqımızdan bir rind qeyd oldu—deyir

Derkən ansızın biri yolda izini buldu—deyir
Bəlirlərini görün işdə—deyir
Bax, al qanlar içində bir əlbisə—deyir
Nə zamandır onu aradıq, yandıq, yaxıldıq
Nə zamandır onu arayanlar hər yanda
nə üst gördülər, nə baş.
Aşiqlərin qanı zatən heç əksilmir, unudulmur.
Aşiqlərin qanı necədirsə oylə qalır
oylə təzə və isti.

Bu əsgi bir qan davasıdır demə, sakın
Atma qulaq ardına sən bu sözü
Qan bir kərə axdımı, qaralır, quruyur, amma
aşiqlərin qanı durmayacaq,
könüllərdən daima axacaq.

Ya o yox olunca sən çıx ortaya
ya da o qeyb olan könlü geri ver.
Ey könül,
o şəkər kimi könüldən bir parçacıq iz bulsan
Şükür et halına.
Bütün aləm dənizin bir damlasında əriyib getmiş, amma
bir milçək o şəkərdən sanki nə qədər yeyər.

Bir gün sən də boylə öldürülürsən,
Sonsuzluğa erəcək, diri qalacaqsan, diri.
Boylə bir şahidin canından
Salam Təbrizə.

## MÜLƏMMƏ[1]

Mahəst nəmidanəm Xurşid ruhət ya nə
Bu ayrılıq oduna necə gedərəm yanə.

Mürdəm zi firaqi tu mürdəm ki həmə danənd
Eşq odu nihan olmaz yanar düşücək canə.

Sevdayi ruhi Leyli şud hasili ma xeyli
Məcnun bigi və veyli oldum yenə divanə.

Səd tir zənəd dil an Türki kəman-əbru
Fitnəli ala gözlər çün uyqudan oyanə.

Ey Şah Şücaətdin Şəms-ül Həqqi Təbrizi
Rəhmətdən əgər nola bir qətrə bizə danə.

---

[1] Müləmmə — hər misrası, yaxud beyti başqa-başqa dillərdə yazılmış şer formasıdır. C. Ruminin bu müləmməsi fars və türk dillərində yazılmış misralardan ibarətdir.

## TÜRKCƏ ŞERLƏRİNDƏN

Gələsən bunda sənə mən qərəzim yox, eşidirsən
Qalasan anda yavuzdur gələyin qanda qalırsan
Çələbidir qamu dirlik çələbə gəl, nə gezirsən
Çələbi qulların istər, çələbini nə sanırsan
Nə ağızdır, nə ağızdır çələb ağzından çığırmaq
Qulağın aç, qulağın aç, ola kim anda dəyərsən.

Essun varisə ey qafil
Aldanmagil zinhar mala.
Şol nəsnəyə ki sən qoyub
Gedirsən ol geru qala.

Zəhmətin görübdün
Dilərsən dünya malını.
Anlar qılar anı xərac
Edib səni anmaya rahi bula.

Yoxsul isən səbr eyləgil,
Gər bay isən xeyir eyləgil,
Hər bir halə şükür eyləgil
Haq döndürür haldan halə.

Dünya onun, axrət onun
Nemət onun, möhnət onun
Tamu onun, cənnət onun.

Haqqa mənə nə mal gərək,
Diləyim eyi hal gərək,
Nə qül gərək, nə qal gərək
Kəndisini bilən qula.

Mən bir bican, ey İllah
Yavlaq çox eylədim günah.
Yazıqlarımdan ah, ah
Nə şərh edəm gəlməz dilə.

Ey Şəms, dilə haqdan haqı
Biz faniyiz, oldur baqi.
Qamular anın müştaqi
Ta xud ki ol kimin ola.

# XIII — XIV ƏSRLƏR AZƏRBAYCAN VƏ ANADOLU ŞAİRLƏRİ

## QUL ƏLİ

(XIII əsr)

### "QİSSEYİ-YUSİF"dən

Əziz Yusif tamam on bir yaşar idi,
Yəqub puçı uyluqında uyar idi,
Uyur ikən bir əcayib uyğu gördü,
Təvilini atasından sorar indi.
Doğarı gun dolunu ay, on bir ulduz,
Duşum içrə səcdə qıldı mənə sansız.
Uş bu duşnu boylə gördüm heç gumansız,
Aya ata, mənə təvil qılğıl indi.
Bu duşumun təvilini qılu vergil,
Aqibəti nə bulasan, bilü vergil,
Bu duşuma körklü təvil olu vergil,
Bu duş içrə edgü saqınc sayğıl indi.
Məşhur durur ayatında ol Cəbbardan,
Bir cuhud var, adı isə onun Bustan.
Sual sordu həm ol cuhud həq Rəsuldan
Dürüst cavab, həm səhih söz istər indi.
Rəsul aydır: Əvvəl ulduz Bəyran idi.
Ol ikinci ulduz adı Təryan idi.
Həm üçüncü ulduz adı Rüyyan idi.
Dördüncüsü, ulduz adı Kənan idi.
Beşincisi, ulduz adı Qabit idi.
Altıncısı, ulduz adı Sabit idi.
Yeddincisi, ulduz adı Əmud idi.
Səkkizinci ulduz adı Səhih idi.
Doqquzuncu ulduz adı Sınığ idi.
Onuncu həm ulduz adı Qanığ idi.
On birinci ulduz adı Sonuğ idi.
Cümləsini səhih bəyan qıldı indi.

## “DASTANİ ƏHMƏD HƏRAMİ”dən
(XIII əsr)

Bu dastanı bu gün bünyad edəlim,
Yəqin qüdrətlərin biz yad edəlim.
Gəlin, ey məni bəhrini seyr edənlər,
Bu dərya gövhərindən xeyr edənlər
Məanidə qılı iki biçənlər,
Dilindən daima gövhər saçanlar.
Gəlin, barı bu gün söhbət qılalım,
Məani kanının dürrün bulalım.
Onun birliyini zikr eyləyə dil,
Xatırda qalmaya zərrəcə müşkil.
Zira kim dilləri söylədən oldur,
Onun hikmətləri qullara boldur,
Onun hikmətlərinə əql irişməz.
İşinə kimsənə hərgiz qarışmaz.
Onun keyfiyyəti bulunmadı heç,
Məkanı qandadır bilinmədi heç.
Nə zahirdir o kim gözdən iralmaz,
Nə batindir o kim hərgiz görülməz.
Onun əvvəlinin önü bulunmaz,
Onun axırının sonu bulunmaz.
Nə dilim var onu şərh eyləyəm mən,
Nə bilim var ki, şərhini söyləyəm mən.
Onun dil zikrini etmək gərəkdir,
Onun doğru yolun getmək gərəkdir.
Üzüm qara, sözüm qısa, suçum bol,
Belim əyri, yolum doğru, boyum sol.
Şaşı baxdım, cüda düşdüm gər ondan,
Mənim halım necə olusər ondan.
Qova-qova könül dəryaya irdi,
Ömür keçdi, saqqalü-saç ağardı.
Əbəs yerlərdə xərc etdim yaşım mən,
Yeridir daşlara döysəm başım mən.
Həmin vardır ümidimiz səfadan,
Məgər mədət irişə Mustafadan.
Ümidimiz iki aləmdə oldur,
Onun şəfqətləri qullara boldur.
Salam olsun onun yaranlarına,

Müdam rəhmət irişsin canlarına.
Əbubəkr, Ömər, Osman, Əlidir,
Eyi dirlikdir bunlar vəlidir.
Bunlar tutmadılar kibri kinayət,
Bunlar bildi nədir dini dinayət.
Səfa xatirlər içində kin olmaz,
Kin olduğu könüllərdə din olmaz.

## SULTAN VƏLƏD

(1227—1312)

*Sultan Vələd Mevlana Cəlaləddin Ruminin oğludur. Fars dilində bir divanı, üç məsnəvisi vardır. Sultan Vələdin türkcə yazdığı sətrlər şerimizin ilk dəyərli örnəklərindəndir.*

Sənin yüzün günəşdir, yoxsa aydır
Canım aldı gözün dəxi nə eydir
Mənim iki gözüm bilgil canımsan
məni cansız qoyasan sən bu keydir.
Gözümdən çıxma kim bu ev sənindir
Mənim gözüm sənə yaxşı saraydır
Tamaşa çün bəri gəl kim görəsən
Necə gözüm yaşı irmağu çaydır
Vələd yoxsuldu sənsiz bu cahanda
Səni buldu, bu gözdən bəyü baydır.
Kəndözünü unut, anı bilgil
Kəndözünü yavu qıl, anı bilgil
Nə balıqlar var ol dəniz içrə
Gər sənə Tanrı ol sudan içrə.
Dəniz içrə balıqları görəsən
Ol balıqlar ilə belə durasan
Ölməyi ol dənizdə görməyəsən
Görəsən nə ki varsa sormayasan
Anda əlsiz-ayaqsız içməkdir
Ol çəməndə qanadsız uçmaqdır
Yemişü yarpaq anda söylərlər
İrlayuban budaqda oynarlar
"Zikr"dən doğdu andakı quşlar
Dükəli anda yaylayıb qışlar.

# İZZƏDDİN HƏSƏNOĞLU

(XIII əsr)

*İzzəddin Həsənoğlu doğma Azərbaycan türkcəsində şerləri hifz olunmuş ilk şairlərimizdəndir. Azəri türkcəsində yazılmış və bu gün əlimizdə olan üç şerində Həsənoğlu, farsca şerlərində Puri-Həsən təxəllüsünü işlətmişdir. Həsənoğlunun "Ayırdı könlümü bir xoş qəmər yüz, canfəza dilbər"mətləli qəzəli o qədər kamildir ki, Həsənoğlunun özünün də, o əsrdə yaşamış başqa şairlərimizin də artıq ana dilində yüksək bədii səviyyədə şerlər yaratdıqlarına şübhə qalmır. Təsadüfi deyildir ki, XIV əsrin ikinci yarısında yaşamış məşhur özbək şairi Seyfi Sarayı Həsənoğlunun bu qəzəlinə:*

Tapılmaz hüsn mülkündə sənə tən bir qəmər bənzər
Nə bənzər? Mənzəri şahid. Nə şahid? Şahidi dilbər.
Bu gün Yusif cəmalını qılıbdır həqq sənə bəxşiş
Nə bəxşiş? Bəxşişi dövlət. Nə dövlət? Dövləti məfxar.
Bu hüsnün şövqi zövqini könül tutiləri tapdı,
Nə tapdı? Tapdı xoş ləzzət. Nə ləzzət? Ləzzəti şəkkər —

*kimi beytləri olan nəzirə yazmışdır. Həmin şerə Türkiyə şairi Əhməd Dai də nəzirə yazıb.*

***

Ayırdı könlümü bir xoş qəmər yüz, canfəza dilbər,
Nə dilbər? Dilbəri-şahid. Nə şahid? Şahidi-sərvər.

Mən ölsəm sən büti-şəngül sürahi, eyləmə, qül-qül,
Nə qül-qül? Qül-qüli-badə. Nə badə? Badeyi-əhmər.

Başımdan getmədi hərgiz səninlə içdiyim badə,
Nə badə? Badeyi-məsti. Nə məsti? Məstiyi-sağər.

Şəha, şirin sözün qılır Misrdə bir zaman kasid,
Nə kasid? Kasidi-qiymət. Nə qiymət? Qiyməti-şəkkər.

Tutuşmayınca dər atəş bulunmaz xisləti-ənbər,
Nə ənbər? Ənbəri-suziş. Nə suziş? Suzişi-məcmər.

Əzəldən cam içində yazıldı surəti-məni,
Nə məni? Məniyi-surət. Nə surət? Surəti-dəftər.

Həsənoğlu sənə gərçi duaçıdır, vəli sadiq,
Nə sadiq? Sadiqi-bəndə. Nə bəndə? Bəndeyi-çakər.

***

Necəsən, gəl, ey yüzü ağım bənim?
Sən əritdin odlara yağım bənim.

And içərəm səndən artıq sevməyim,
Sənin ilə xoş keçər çağım bənim.

Hüsn içində sana manənd olmaya,
Əsli yuca, könlü alçağım bənim.

Al əlimi irəyim məqsudimə,
Qoyma yürəkdə yana dağım bənim.

Sən rəqibə sirrini faş eylədin,
Anun ilə oldu şımtağım bənim.

Qışladım qapında itlərin ilə,
Oldu kuyin üşdə yaylağım bənim.

Bən ölücək yoluna gömün bəni,
Baqa dursun yarə torpağım bənim.

Torpağımda bitə həsrətlə ağac,
Qıla zari cümlə yarpağım bənim.

Bu Həsənoğlu sənin bəndəndürür
Anı rədd etmə, üzü ağım bənim.

***

Əcəb bilsəm bəni şeyda qılan kim?
Bana bu eşq oduna peyda qılan kim?

Əcəblərəm, əcəb qaldım ilahi!
İman əhlin tutub tərsə qılan kim?

Qamışdan şəkkərü, daşdan cəvahir
Ağacdan daneyi xurma qılan kim?

Tənim yetmiş iki dürlü damardır,
Kimin irmaq, kimin dərya qılan kim?

Qoy bu tədbiri, gəl təqdiri gözlə,
Bu gün ki vədeyi fərda qılan kim?

Bu natun fərrişi hər dəm bu fərraş,
Bu ərşin rəngini mina qılan kim?

Həsənoğlu, bu bir qətrə mənidən
Anın xub surətini ziba qılan kim?

## YUNUS İMRƏ
(1238—1320)



*Yunus İmrə türk dünyasının dahi sənətkarlarından biri, zaman etibarilə Oğuz dillərinin ilk böyük şairidir. Anadoluda doğulmuşdur. Azərbaycan və Türkiyə ədəbiyyatları bir axarda tədris olunan vaxtlarda — 1928-ci ildə — görkəmli yazıçımız Abdulla Şaiq "Ədəbiyyatdan iş kitabı"nda yazırdı: "Yunus İmrə Sakarya ətrafındakı kəndlərdən birində yetişmiş bir türkmən kəndlisidir. O, burada rəncbərliklə keçinən çox fəqir bir adam idi. Tapdıq İmrə namında bir pir dərvişə intisab edərək illərlə onun qapısında çalışmış, xidmətini görmüşdür". Türk ədəbiyyatında ilk mütəsəvvüflərdən biridir. Sufizm fəlsəfəsini sadə xalq dilində, əsasən heca vəznində yazdığı qoşmalarda, gəraylılarda, ilahilərdə, eləcə də əruz vəznində yaratdığı qəzəl və məsnəvilərdə ifadə etmiş, şerimizi yüksək bədii səviyyəyə qaldırmış, özündən sonra yaranan Türkiyə, Azərbaycan və Türkmən ədəbiyyatlarına güclü təsir göstərmişdir.*

*XVI əsrdə yaşamış məşhur Azərbaycan şairi Dirili Qurbani qoşmasında Yunusun da adını çəkir:*

*Biz də qonaq olduq karslı Osmana,*
*Yunus tək lap daldıq qəri-ümmana,*
*Qurbani der: dönsün belə zamana,*
*Göydəki ulduzlar ayə dönübdür.*

*Yunus İmrənin ömrüylə ilgili bir çox rəvayətlər və əfsanələr mövcuddur. Hətta məzarı belə 9 yerdə göstərilir. Yunus İmrənin əsərlərini Azərbaycan oxucularına çatdıran şair Məmməd Aslan qeyd edir ki, son zamanlar Azərbaycanın Qax rayonu ərazisində dərviş Yunus İmrəyə ünvanlanmış bir məzar da aşkar olunub.*

Mən yürürəm yana-yana,
Eşq boyadı məni qana,
Nə aqiləm, nə divanə,
Gəl gör mənə eşq neylədi!

Gah əsərəm yellər kimi,
Gah tozaram yollar kimi,
Gah axaram sellər kimi,
Gəl gör mənə eşq neylədi!

Axar sular tək çağlaram,
Dərdli ürəyim dağlaram,
Şeyxim anıban ağlaram,
Gəl gör mənə eşq neylədi!

Yarəb, ya əlim al, qaldır məni,
Ya vəslinə erdir məni,
Çox ağlatdın, güldür məni,
Gəl gör mənə eşq neylədi!

Mən yürürəm eldən elə,
Dost soraram dildən – dilə,
Qürbətdə halım kim bilə,
Gəl gör mənə eşq neylədi!

Qürbət elində yürürəm,
Dostu duşumda görürəm,
Oyanır məlul oluram...
Gəl gör mənə eşq neylədi!

Bənzim sarı, gözlərim yaş,
Bağrım yarə, ciyərim daş,
Halım bilən dərdli qardaş
Gəl gör mənə eşq neylədi!

Eşqin məni məst eylədi,
Aldı könlüm, xəstə eylədi,
Öldürməyə qəsd eylədi...
Gəl gör mənə eşq neylədi!

Mən Yunusi-biçarəyəm,
Eşq əlindən avarəyəm,
Başdan ayağa yarəyəm,
Gəl gör mənə eşq neylədi!

## İLAHİLƏR

Daşdın yenə dəli könül,
Sular kimi çağlarmısan?
Axdın yenə qanlı yaşım
Yollarımı bağlarmısan?

Nedim? Əlim ermez yara,
Bulunmaz dərdimə çara,
Oldum elimdən avara,
Məni burda əylərmisən?

Mən torpaq oldum yoluna,
Sən aşiqi közərdirsən.
Bu qarşıma köks gərən
Daş bağırlı dağlarmısan?

Hərami kimi yoluma
Ərquru enən qarlı dağ
Mən yarımdan ayrı düşdüm
Sən yolumu bağlarmısan?

Qarlı dağların başında
Salxım-salxım olan bulud!
Saçın yolub mənim üçün
Yaşın-yaşın ağlarmısan?

Əsirdi Yunusun canı,
Yoldayam, ellərim hanı?
Yunus duşda gördü səni,
Xəstəmisən, sağlarmısan?

***

Şol cənnətin irmaqları
Axar Allah deyə – deyə.
Çıxmış islam bülbülləri
Ötər Allah deyə-deyə.

Salınır Tuba dalları,
Quran oxur həm dilləri,
Cənnət bağının gülləri,
Qoxar Allah deyə-deyə.

Kimlər yeyib, kimlər içər,
Həm mələklər rəhmət saçar,
İdris Nəbi hüllə biçər,
Tikər Allah deyə-deyə.

Həp nurdandır dirəkləri,
Gümüşdəndir yarpaqları,
Uzandıqca budaqları,
Bitər Allah deyə-deyə.

Aydan arıdır üzləri,
Şəkərdən dadlı sözləri,
Cənnətdə huri qızları,
Gəzər Allah deyə-deyə.

Açıldı göylər qapısı,
Rəhmətlə doldu hamısı,
Səkkiz cənnətin qapısı,
Açılır Allah deyə-deyə.

Haqqa aşiq olan kişi
Axar gözlərinin yaşı.
Nurla dolar içi, dışı
Söylər Allah deyə-deyə.

Yunus İmrə, var yarına,
Qoyma bu günü yarına,
Yarın Allah didarına
Varam Allah deyə-deyə.

***

Canım qurban olsun sənin yoluna
Adı gözəl, kəndi gözəl Məhəmməd.
Şəfaət eylə sən kəmtər quluna
Adı gözəl, kəndi gözəl Məhəmməd.

Mömin olanların çoxdur cəfası
Axirətdə olur zövqi-səfası
On səkkiz min aləmin Mustafası
Adı gözəl, kəndi gözəl Məhəmməd.

Yeddi qat göyləri seyran eyliyən
Kürsünün üstündə çövlan eyliyən
Mirasında ümmətini diləyən
Adı gözəl, kəndi gözəl Məhəmməd.

Ol çarıyar onun göyçək yarıdır
Onu sevən günahlardan biridir
On səkkiz min aləmin sərvəridir
Adı gözəl, kəndi gözəl Məhəmməd.

Sən haq peyğəmbərsən şəksiz, gümansız,
Sənə uymayanlar gedər imansız,
Aşıq Yunus neylər dünyanı sənsiz
Adı gözəl, kəndi gözəl Məhəmməd.

***

Yar ürəyim, yar,
Gör ki, nələr var!
Bu xalq içində
Bizə gülər var.

Qoy gülən gülsün,
Haq bizim olsun,
Qafil nə bilsin
Haqqı sevər var.

Bu yol uzaqdır,
Mənzili çoxdur,
Keçidi yoxdur,
Dərin sular var.

Girdik bu yola,
Eşq ilə belə,
Qürbətlik elə
Bizi salar var.

Hər kim mərdanə,
Gəlsin meydanə,
Qalmasın canə
Kimdə hünər var.

Yunus! Sən burda
Meydan istəmə,
Meydan içində
Mərdanələr var!

***

Dağlar ilə, daşlar ilə
Çağırıram, Mevlam səni...
Səhərlərdə quşlar ilə
Çağırıram, Mevlam səni...

Su dibində mahi ilə,
Səhralarda ahu ilə,
Abdal olub "ya hu" ilə
Çağırıram, Mevlam səni...

Göy üzündə İsa ilə,
Tur dağında Musa ilə,
Əlimdəki əsa ilə
Çağırıram, Mevlam səni...

Dərdi öküş Eyyub ilə,
Gözü yaşlı Yaqub ilə
Ol Məhəmməd məhbub ilə
Çağırıram, Mevlam səni...

Həmdü şükrü lillah ilə,
Vəsfi küll hüvəllah ilə,
Açıq baş, yalın ayaq ilə.,
Çağırıram, Mevlam səni...

Yunus oxur dillər ilə,
O qumru, bülbüllər ilə,
Haqqı sevən qullar ilə,
Çağırıram, Mevlam səni...

***

Muradıma, məqsuduma irməzəm,
Hayıf mənə, yazıq mənə, vay mənə!
Qadir Mevlam, cəmalını görməzəm,
Hayıf mənə, yazıq mənə, vay mənə.

Daima üsyandır həp mənim işim,
Necə olur qəbirdə o qərib başım?
Duadan unutmam eşim, yoldaşım!
Hayıf mənə, yazıq mənə, vay mənə.

Asi qulam, dəftərinə bax! — dersə,
Üzün qaraları gör nə çox! — dersə,
Yerim, göyüm arasından çıx! — dersə,
Hayıf mənə, yazıq mənə, vay mənə.

Oxumayıb dəftərimi şaşırsam,
Məhşər yerlərində dərdə düşərsəm,
Mömin qullarından ayrı düşərsəm
Hayıf mənə, yazıq mənə, vay mənə.

Dərviş Yunus! Ərafata vararsam,
Üzüm qaraların orda görərsəm,
Dəftərimi sol əlimə alarsam,
Hayıf mənə, yazıq mənə, vay mənə.

***

Fəraqın bağrımı dağlar,
Nə bilsin dərdimi sağlar?
Səni görmüyəli, dostum,
Gözlərim qanı-yaş ağlar.

Axar yaşım selə bənzər,
Ömür keçər yelə bənzər,
Gülər üzün gülə bənzər
Ya nə bilsin onu sağlar?

Gülün bülbül olur yarı
Onunçün qılmada zarı.
Gülüstandır onun yeri
Məqam olmaz ona bağlar?

Bala yağı nedər bülbül?
De ona qarşı gülsün gül.
Aşıq yükünü öylə bil
Çəkəmədi uca dağlar.

Aşiq eşq yükünü çəkər,
Ucalardan uca çıxar.
Görür, dost üzünə baxar
Könül məşuquna bağlar.

Dərviş Yunus cuşa gəldi,
Məşuqa təvəccüh qıldı.
Könüldə sevdiyin buldu
Onun ilə könül əylər.

## BÜLBÜL

Sən bura qəribmi gəldin,
Neçin ağlarsan, bülbül, hey?
Yorulub izmi yanıldın,
Neçin ağlarsan, bülbül, hey!

Qarlı dağlarımı aşdın?
Dərin irmaqlarmı keçdin?
Yarından ayrımı düşdün?
Neçin ağlarsan, bülbül, hey!

Hey, nə yavuz inilərsən,
Mənim dərdim yenilərsən,
Dostu görməkmi dilərsən,
Neçin ağlarsan, bülbül, hey!

Qədrin bilinməzmi oldu,
Xətrin sorulmazmı oldu,
Ol gül görülməzmi oldu,
Neçin ağlarsan, bülbül, hey!

Qalan, şəhrinmi yıxıldı?
Namu arınmı yox oldu?
Qürbətdə yarınmı qaldı?
Neçin ağlarsan, bülbül, hey!

Gülüstanlarda yaylarsan,
Tazə gülləri qoxlarsan,
Yavlaq zarılıq eylərsən,
Neçin ağlarsan, bülbül, hey!

Qanadın aça bilirsən,
Açıban uça bilirsən,
Hicablar keçə bilirsən,
Neçin ağlarsan, bülbül, hey!

Uyqudan gözüm oyandı,
Oyandı qana boyandı,

Yandı bu ürəyim, yandı,
Neçin ağlarsan, bülbül, hey!

Noldu bu Yunusa, noldu,
Eşqin dəryasına daldı.
Yenə baharıstan oldu.
Neçin ağlarsan, bülbül, hey!

## İÇƏRİ

Sevərəm mən səni candan içəri
Yolum etməz bu ərkandan içəri.
Haraya baxar isəm dopdolusan
Səni harda qoyam məndən içəri.

O bir dilbərdürür yoxdur nişanı
Nişan olurmu nişandan içəri?
Məni məndə demə, məndə deyiləm
Bir mən vardır məndə, məndən içəri.

Məni məndən alana irməz əlim
Qədəm kim basa sultandan içəri.
Təcəllidən nəsib irdi kiminə
Kiminin məqsudu bundan içəri.

Kimə didar günündən şölə dəysə,
Onun şöləsi var gündən içəri.
Sənin eşqin məni məndən alıbdır
Nə şirin dərd bu, dərmandan içəri.

Şəriət, təriqət yoldur varana
Həqiqət, mərifət ondan içəri.
Süleyman quş dilin bilir dedilər
Süleyman var Süleymandan içəri.

Unutdum din dəyanət qaldı məndən
Bu nə məzhəbdürür dindən içəri.
Dinin tərk edənin küfürdür işi
Bu nə küfürdür imandan içəri.

Miskin Yunus gözü tuş oldu sənə
Ki qaldı qapıda ondan içəri.

***

Eşqin aldı məndən məni
Mənə səni gərək, səni.
Mən yanaram dünü günü
Mənə səni gərək, səni.

Nə varlığa sevinirəm
Nə yoxluğa yerinirəm
Eşqin ilə ovunuram
Mənə səni gərək, səni.

Eşqin aşiqlər öldürür
Eşq dənizinə daldırır
Təcəlli ilə doldurur
Mənə səni gərək, səni.

Eşqin şərabından içəm
Məcnun olub dağa düşəm
Sənsən dünü gün əndişəm
Mənə səni gərək, səni.

Sufilərə söhbət gərək
Zahidlərə cənnət gərək
Məcnunlara Leyla gərək
Mənə səni gərək, səni.

Əgər məni öldürələr,
Külüm göyə sovuralar,
Torpağım ordan çağırar
Mənə səni gərək, səni.

Yunusdurur mənim adım
Günü günü artar dərdim.
İki cahanda məqsudum
Mənə səni gərək, səni.

***

Bir nəzərdə qalmayalım
Gəl dosta gedəlim, könül.
Həsrət ilə ölməyəlim
Gəl dosta gedəlim, könül.

Gəl gedəlim can durmadan
Surət tərkini urmadan
Araya düşmən girmədən
Gəl dosta gedəlim, könül.

Tərk edəlim elü şəri
Dost üçün qılalım zarı
Ələ gətirəlim yarı
Gəl dosta gedəlim, könül.

Qılavuz olgil sən mənə
Yönələlim dostdan yana

Baxmayalım öndən sona
Gəl dosta gedəlim, könül.

Ölüm xəbəri gəlmədən
Əcəl yaxamız almadan
Əzrayıl həmlə qılmadan
Gəl dosta gedəlim, könül.

Gerçək İrəmə varalım
Haqqın xəbərin soralım
Yunus İmrəni alalım
Gəl dosta gedəlim, könül.

***

Mən dərvişəm deyənə
Bir ün edəsim gəlir.
Tanıyıban şimdidən
Varıb yetəsim gəlir.

Sırat qıldan incədir
Qılıncdan kəskincədir
Varıb anın üstünə
Evlər yapasım gəlir.

Altında qaya vardır
İçi nar ilə purdur
Varuban o kölgədə
Bir az yatasım gəlir.

Tən eyləmin hocalar
Xatiriniz xoş olsun.
Varuban ol tamuda
Bir az yanasım gəlir.

Andan cənnətə varam
Cənnətdə haqqı görəm
Huri ilə qılmanı
Bir-bir qucasım gəlir.

Dərviş Yunus bu sözü
Əyri-üyrü söyləmə
Səni siğəyə çəkər
Bir Molla Qasım gəlir.

## DOLAB[1]

Çevrilirsən, dolanırsan
Dolab, neçin inləyirsən?
Çizginirəm, dolanıram,
Dərdim vardır, inləyirəm.

Mənim adım dərdli dolab
Suyum çıxar yalab-yalab.
Boylə əmr eyləmiş Calab[2]
Dərdim vardır, inləyirəm.

Suyu alçaqdan ölçərəm
Yaş yerinə qan saçaram.
Qayğılı könül açaram
Dərdim vardır inləyirəm.

Dağdan kəsdilər bizənim
Pozuldu dürlü düzənim.
Mən bir usanmaz ozanım
Dərdim vardır, inləyirəm.

Dağdan endirdilər məni,
Yaprağım, budağım hanı?
İnləyirəm dünü-günü
Dərdim vardır, inləyirəm.

Qurdular məni daşqına,
Dün gün dönərəm eşqinə.
Yaradan Mevlam eşqinə
Dərdim vardır, inləyirəm.

Yunus İmrəm sən dəlisən
Həm dəlisən, həm dolusan.
Sən də bir Allah qulusan,
Dərdim vardır, inləyirəm.

***

Gəldi keçdi ömrüm mənim
Ol yel əsib keçmiş kimi
Hələ mənə boylə gəldi
Bir göz yumub açmış kimi.

İşbu sözə haq tanıqdır
Bu can köküsə qonaqdır
Bir gün olar uça gedər
Qəfəsdən quş uçmuş kimi.

---

[1] Dolab — dolamaçarx
[2] Calab — Əzrayıl

Miskin adəm oğlanını
Bənzətmişlər əkinçiyə
Kimi bitər, kimi yetər
Yerə toxum saçmış kimi.

Bu dünyada bir nəsnəyə
Yanar içim, göynər gözüm
İgid ikən ölənlərə
Köynəyini biçmiş kimi.

Bir xəstəyə vardın isə
Bir içim su verdin isə
Yarın orda qarşı gələr
Haq şərabın içmiş kimi.

Yunus İmrə bu dünyada
İki kişi qalar derlər
Məgər Xızır İlyas ola
Abi - həyat içmiş kimi.

***

Biz dünyadan gedər olduq
Qalanlara səlam olsun.
Bizim üçün xeyir dua
Qılanlara səlam olsun.

Əcəl bükə belimizi
Söylətməyə dilimizi
Xəstə ikən halımızı
Soranlara səlam olsun.

Tənim ortaya açıla
Yaxasız kömlək biçilə
Bizi bir asan vəch ilə
Yuyanlara səlam olsun.

Sal verilən qəsdimizə
Gedər olduq dostumuza
Namaz üçün üstümüzə
Duranlara səlam olsun.

Dərviş Yunus söylər sözü
Yaş dolmuşdur iki gözü
Bilməyən nə bilsin bizi
Bilənlərə səlam olsun.

## AŞİQ PAŞA
(1272—1333)

*Aşiq Paşa Anadoluda Qırşəhərdə doğulmuş və orada da vəfat etmişdir. Bütün əsərlərini türk dilində yazmışdır. Təsəvvüf fəlsəfəsini yaymaq, dərvişliyi öyrətmək məqsədilə yazdığı "Qəribnamə"si on iki min beytdən ibarətdir. Əruzla yazılmış bu əsər didaktik mahiyyətdədir. Əsərində türk dilinin əhəmiyyətini xüsusi olaraq vurğulayır. Aşiq Paşa Yunus İmrənin təsiri altında bəzən heca və bəzən də əruzla ilahilər və qəzəllər yazmışdır.*

### « QƏRİBNAMƏ »dən

Qamu dildə var idi zəbti üsul
Bunlara düşmüş idi cümlə ükul.
Türk dilinə kimsələr baxmaz idi
Türklərə hərgiz könül axmaz idi.
Türk dəxi bilməz idi bu yolları
İncə yolu, ol ulu mənzilləri
Bu Qəribnamə əgər gəldi dilə
Kim bu dil əhli dəxi məni bilə.
Yol içində bir-birini verməyə.
Dilə baxıb məniyi xor görməyə.
Ta ki məhrum qalmaya Türklər dəxi
Türk dilində anlayalar ol Həqqi.
Məniyi bir dildə sanmın siz həman,
Cümlə dillər anı söylər bigüman.
Cümlə dildə söylənən ol sözdürür
Cümlə gözlərdən görən ol gözdürür.

### QƏZƏLLƏR

Ey padişah, ey padişah çün mən məni verdim sana
Gəncü-xəzinəm qamusu sənsən mənim öndən sona.

Əvvəl dəxi bu əqli-can səninlə idi əsli qan
Axır geri sənsən məkan, üş varıram səndən yana.

Səndən sənə varır yolum, səndən sənə söylər dilim
İllah sənə irməz elim bu hikmətə qaldım dana.

Bu hikməti kim nə bilər, bilsə dəxi gəlməz dilə
Bu ah ilə, bu zar ilə gözüm yaşı necə dinə.

Dursam səninlə duraram, baxsam səninlə baxaram
Hər hancarı kim yürürəm könlüm yüzü səndən yana.

Sənsən mənə canu-cahan, sənsən mənə gəncü-nihan
Səndədir issivü-ziyan, nə iş gəlir məndən mənə.

Söz söyləyən dilim də sən, hökm eyləyən içim də sən
Alıverən əlim də sən, cümlə işim öndən sənə.

***

Nazənin bu ömrümüz bir göz yumub açmış kimi
Gəldi keçdi duyamadıq bir quş qonub uçmuş kimi.

Necə keçdi bilmədik bu ruzigar öndən sona
Eylə tut ki, indi bizə bu yel əsib keçmiş kimi.

Neçələr gəldi bu mülkə getdivü köçdü giru
Oylə kim bir qəriban bir dəm qonub köçmüş kimi.

İşbu dünyaya gələnlər bircə dəm əylənmədilər
Xanimanın tökdü getdi yağılardan qaçmış kimi.

Sinlərə var kim, biləsən bu xəlayiq netdiyini
Sanasan kim bir əkindir Əzrayıl biçmiş kimi.

Bəxtlidir ol kişi kim dünyada adı qala
Ölmədi, diridürür abi-həyat içmiş kimi.

Bu ömür sərmayəsin olmaz yerə xərc eylədin
Şoylə kim, bir key dəli nəqdin suya saçmış kimi.

Ey Aşiq, sən ömrünü haqq eşqinə sərf eylədin
Ta irərsən həsrətə bir göz yumub açmış kimi.

***

Məndənmi mənə bu ələm?
Eşqdənmi yoxsa dərdi qəm?
Bunca bala, cövrü sitəm
Bilsəm nədəndir, bilməzəm.

Canan olursa gər nihan,
Qalmaya canda zərrə can.
Bula bu sözü mən əyan
Bilsəm nədəndir, bilməzəm.

Eşqin ürəkdə yarəsi,
Bəs olmuşam avarəsi.
Ya Rəbb bu dərdin çarəsi
Bilsəm nədəndir, bilməzəm.

Daim diləfkar olduğum,
Şuridəvü zar olduğum,
Talibi didar olduğum,
Bilsəm nədəndir, bilməzəm.

Aşiqdə bu heyrət nədir?
Məşuqdakı şövkət nədir?
Dərviş buna hikmət nədir?
Bilsəm nədəndir, bilməzəm.

***

Dilim bülbül oldu ötər,
Ahım cana qılır əsər,
Dürlü-dürlü yemiş bitər
Məmur oldu bustanımız.

Keçənlər netdi neylədi?
Hər birisi bir ad qoydu.
Leyli ilə Məcnun kimi
Söylənilir dastanımız.

Eşq ilə başım xoşdur,
Hara varsam yoldaşdır,
İl on iki ay sərxoşdur
Eşqidən içdi canımız.

Müti olduq eşq halında
Baxmadıq dünya malına.
Girdik ərənlər yoluna
Dürüst oldu imanımız.

Nə kaşadır, nə gözəldir
Meyilimiz xub üzədir.
Daima solmaz, təzədir
Bu bizim gülüstanımız.

Kim bildi dərman əcələ
Görsə gərək hər ki gələ.
Biz dəxi gedəriz ol yola
Mənzildədir karvanımız.

Aşiq Paşam necə, necə?
Dovlət onun, ol göz aça.
Bizdən daha gələ keçə
Bu yalançı devranımız.

***

Söylər isəm bu dərdi mən
Sirrim cahana faş olur.
Sakit olub oturursam,
Sağmaz ürəyim baş olur.

Seyrim daim səndən sana
Seyranlaram səndən yana.
Sultandurur eşqin mana
Süvarü həm yoldaş olur.

Sən dinmə Aşiq ol erür
Sayrunu sağı ol görür.
Sərkəşləri yoldan sürür
Sakitlərə fərraş olur.

***

Hər kim mənə əğyar isə
Haq tanrı yar olsun ona.
Hər hancarı varır isə
Bağü bahar olsun ona.

Mənə ağu sunan kişi
Şəhdi şəkər olsun işi.
Qolay gələ müşgül işi
Əli erər olsun ona.

Acı dirliyim istəyən
Dadlı dirilsin dünyada.
Kim ölümüm istər isə
Min il ömür olsun ona.

Hər kim dilər mən xar olam,
Düşmən əlində zar olam,
Dostları şadü, düşməni-
Dost, məşuq, yar olsun ona.

Ardımca daşlar atanı
Haq taxta qaldırsın onu.
Önümə quyu qazanı
Güllər nisar olsun ona.

Hər kim dilər isə mənim
Ol dostumdan ayrılmağım
Gözlərindən hicab getsin
Dizar əyan olsun ona.

Bu Müxlis oğlu Paşanın
Güldüyün istəməyənin
Ağladığın istəyənin
Gözüm pinar olsun ona.

***

Yer üzünü gəzən kişi
Sənin kimi bilməyisər.
Səni sevən sevday olub
Kəndözünə gəlmiyəsər.

Səni sevən nedər işi
Dün gün axar gözü yaşı.
Paşam, səni görən kişi
Neçin əqli olmayisər?

Dərdin sənin cana rahat
Sənin sözün qəndi-nabat.
Vəslin sənin abi-həyat
İçən onu ölməyisər.

Kim ki səndən cüda olub,
Həsrətindən şeyda olub,
Dərdin onda peyda olub
Rəngi nasıl solmayisər?

Aşiq yürür şuri ilə
Əylənəməz huri ilə
Müxlis eşqi nuri ilə
Əsrükdür xud bilməyisər.

## QAZİ BÜRHANƏDDİN
(1344—1398)

*Görkəmli şair və dövlət xadimi Qazi Bürhanəddin Oğuzların Salur boyundandır. Əsl adı Əhməddir. Qeysəriyyə şəhərində dünyaya gəlmiş, sonralar Sivasın naibi olmuşdur. Ağqoyunlu nəslindən Qara Yoluq Osman bəylə döyüşdə öldürülmüşdür. Qazi Bürhanəddinin türkcə Divanı qəzəllərdən, tuyuğlardan və rübailərdən ibarətdir. Elmi əsərləri, fars və ərəb dillərində şerləri də var.*

### TUYUĞLAR

Yaxşı anladım cahanda vayə yox,
Yardan özgə bu xumarum, ayə, yox,
İki aləmdə ümid sərvər dürür,
Andan ayru daxı hiç sərmayə yox.

Görmədüm sən tək lətif, nazük cəvan,
Tapuna olsun fəda canü səhan,
Qətrəcə lütfün bizə irər bolsa,
Qətrə tək ola qatumda bin ümman.

Gözlərün dərdlülərün dərmanıdur,
Canu dil ol ikinün qurbanıdur,
Canuma sevmək səni irağ işdürür,
Netsə olur, ol çələb fərmanıdur.

Necə ki, gögdə günəş seyranıdur,
Bu cahan ərənlərün meydanıdur,
Yevü nedürgil, alu bağıqlaqıl,
Hər zaman bir yigidün dövranıdur.

Canı göz ovutmağa xumar imiş
Qaşı könül yıxmağa memar imiş
Dilədim halım ki, gözünə deyim
Türfə budur, gözləri bimar imiş.

Könlüm tək görmədim bir çin könül
Qamu könül könlümə purçin könül
Dolaşıb zülfünə itirmiş özün
Ey könül, qarə könül, misgin könül

Ərənlər öz yolunda ər tək gərək,
Meydanda erkək kişi nər tək gərək
Yaxşı, yaman, qatı, yumşaq olsa xoş
Sərvərəm deyən kişi erkək gərək.

Həqq əzəldə nə yazmış isə bolur,
Göz nə ki görcək isə görür.
İki aləmdə həqqə sığınmışıq
Toxtamış nə ola, ya axsaq Teymur.

## RÜBAİLƏR

Dedim ki, ləbin! Dedi: Nə şirin söylər.
Dedim ki, belin! Dedi: Nə narın söylər.
Dedim ki, canım cümlə fədadır saçına
Dedi ki, bu miskin hələ varın söylər.

Ol göz ki, yüzün görməyə göz demə ana.
Şol yüz ki, tozun silməyə, yüz demə ana.
Şol söz ki, içində, sənəma, vəsfin yox,
Sən badi-həva tut anı, söz demə ana.

Həmişə aşıq könlü büryan olar.
Hər nəfəs qərib gözü giryan olar.
Sufilərin diləyi mehrab, namaz
Ər kişinin arzusu meydan olar.

Dedi ki, neçin gözünü pürnəm görürəm?
Ya könlünü neyşə mən pürğəm görürəm?
Dedim: Sənəma! Anınçün ki, ləbini
Daim görməzəm, vəli dəm-dəm görürəm.

## QƏZƏLLƏR

Yar bizim ilə yenə gör ki, nə al eylədi,
Ta ki, yaşım qan ola, yanağın al eylədi.

Ağızını görəli dirligim oldu güman,
Belini göstərəli bini xəyal eylədi.

Canımı aldı gözü, könlüm apardı üzü,
Şəhdü-şəkər tək sözü, əqlimi lal eylədi.

Hicrinə doyiməzəm, vəslinə iriməzəm,
Şol sənəmin ki, üzü bədri hilal eylədi.

Hüsnü ki, həq lütfüdür, bizə həram edibən,
Gözləri aşiq qanın neyşə həlal eylədi.

Yel dəxi avarədür tolaşalı zülfünə,
Yeridir ol ana çün qeyrilə qal eylədi.

Gərçi kəbab eylədi eşqi oduna canı,
Ağızının yarını bizə zülal eylədi.

***

Nazlıcasan, nazəninsən, bilməzəm cananəsən,
Canımızsan, canımızsan, bilirəm cananəsən.

Sərvi boyundur, qiyamət qorxuram bundan qopa,
Fitnədir xüftə gözün, üşənürəm oyanasan.

Can ləbinin qanına dilər-ki, qana, qana qan,
Necə sən qanlı ürəyimin qanına qanasan.

Qulluğa canım yasanır, necə zülfün yasanır,
Zülfünün bəndində məni sən usana sanasan.

Can ilə könül apardı əql, acıdı eşq der,
Asisindən bixəbərdir yana-yana yanasan.

## DEHQANİ

(XIII əsr Anadolu şairi)

Əcəb bu dərdimin dərmanı yoxmu?
Ya bu səbr etməyin oranı yoxmu?

Yanaram mumlayın başdan ayağa
Nədir bu yanmağın payanı yoxmu?

Gülər düşmən mənim ağlamağıma
Əcəb, şol kafirin imanı yoxmu?

Dəlibdir ciyərimi qəmzən oxu
Ara, ürəkdə gər peykanı yoxmu?

Su kimi qanımı torpağa qardın
Nə sanırsan qəribin qanı yoxmu?

Cəmali-hüsnünə məğrur olursan
Kəmali-hüsnünün nöqsanı yoxmu?

Bəyim, Dehqaniyə ölməzdən öndə
Tapuna irməyin imkanı yoxmu?

## ƏHMƏD DAİ

(XIV əsr)

### QƏZƏL

Şükranə sənin yoluna min can ola bir gün,
Kim həsrətinə irməyə imkan ola bir gün.

Eşqin yoluna ox kimi can doğruluq eylər,
Ta qaşlarının yayına qurban ola bir gün.

Ol zülfi-pərişan mənə görsən nələr eylər,
Deməz mənə kim könlü pərişan ola bir gün.

Əğyarı sürüb könlüm evin xəlvət edindim,
Ta kim gələ ol yar ona mehman ola bir gün.

Ey bülbülü dilxəstə, məlul olma qəfəsdə,
Kim mənzilin ol bağü gülüstan ola bir gün.

Həm badi-səba irə bəşarət verə güldən,
Həm qönçə dəxi gül kimi xəndan ola bir gün.

Hicran sonucu vəslə dönüb şad ola Dai,
Bu qəmdən onun dərdinə dərman ola bir gün.

## FƏZLULLAH NƏİMİ

(1339-1393)

*Fəzlullah Nəimi sufi mütəfəkkir və şair, hürufilik təriqətinin banisidir. "Cavidannamə" və bir sıra başqa elmi əsərlərin müəllifidir. Dahi Azərbaycan şairi İmadəddin Nəsimiyə böyük təsiri olub. Aşağıda verdiyimiz türkcə iki qəzəlin Nəimi tərəfindən yazıldığı ehtimal olunur.*

Gəl bənim cani-əzizim, qəddi-dalım, əlvida
Gəl boyunca görəyim, əylənmə canım, əlvida.

Bu imiş təqdir, barı ver ləbindən bir konar
Bəlkə qismət olmaya bir də vüsalım, əlvida.

Gunə-gunə ol rəqibin könlünü şad eylədin,
Hər görəndə ruyi-dildən istədi, dad eylədin.
Neylədim ki, söhbətindən bəndəni yad eylədin?
Atəşi-suzanə yaxdın pərrü balım, əlvida.

Bu Nəimi dərdməndin çəkdiyi bin dərdi qəm
Vəsfə gəlməz ey üzü gül, şərhə acizdir qələm.
Qılmadın bir dəm kərəm kim, eşq ucundan lacərəm
Yarın ol məhşərdə dinlə ərzi-halım, əlvida.

***

Necə əfqan etməyim kim, mehribanım bunda yox
Könlümün əyləncəsi, ruhi-rəvanım bunda yox.

Xari-qəmdə qaldın ey dil, həsrəti əfkar ilə
Rüxləri gül, kaküli ənbərəfşanım bunda yox.

Həmnişin eyi əfəndim dilfərabın var ikən
Bağİ-hüsnündə açılmış meyvə barın var ikən

Xoş idin əvvəl bana, şuxi cəhanım yar ikən
Şimdi ağlarsam nola, qaşı kəmanım bunda yox.

Ey gözüm, sən var ikən halım pərişan oldu hey
Çarəsiz şeyda Nəimin kanı əfqan oldu hey.

Gəl, qədəm bas bəzmə kim, dərdim fəravan oldu hey
Məclisə rövnəq verən şirin zəbanım bunda yox.

## HACI BAYRAM VƏLİ
(1352—1429)

### NOLDU BU KÖNLÜM, NOLDU BU KÖNLÜM

Noldu bu könlüm, noldu bu könlüm
Dərdi qəm ilə doldu bu könlüm.
Yandı bu könlüm, yandı bu könlüm
Yanmada dərman buldu bu könlüm.

Yan, ey könül, yan, yan, ey könül, yan
Yanmadan oldu dərdinə dərman.
Pərvanə kimi, pərvanə kimi
Şəminə eşqin yandı bu könlüm.

Gərçi ki, yandı gerçəyə yandı
Renginə eşqin cümlə boyandı.
Kəndində buldu, kəndində buldu
Mətlubunu xoş buldu bu könlüm.

El fəkru fəxri, el fəkru fəxri
Demədimi ol aləmlər fəxri
Fəxrini fəkrin, fəxrini fəkrin
Məhvi fənada buldu bu könlüm.

Bayramam indi, Bayramam indi
Bayram edərsən yar ilə indi
Həmdü-sənalar, həmdü-sənalar
Yar ilə bayram qıldı bu könlüm.

## ŞAH QASIM ƏNVAR
(1356—1434)

Ol yari əziz ilə ki, can adinədir,
Məscid sarı bardım ki, bu gün adınadır,
Məndən camaat sordu ki, şeyxa de nədir?
Dedim: Nə sorarsız ki, heç adı nədir?

***

Sabahın olsun mübarək,
Çələbi bizi unutma.
Səlam ilə can verdik
Çələbi, bizi unutma.

Aşiq olduğum bilirsən,
Canıma cəfa qılırsan,
Hali-zarımı sevirsən
Çələbi, bizi unutma.

Oda yaxsan xanım sən
Yerə töksən qanım sən
Çələbi, dilim, canımsan
Çələbi, bizi unutma.

## İMADƏDDİN NƏSİMİ

(1369—1417)



*Dahi Azərbaycan şairi və mütəfəkkiri İmadəddin Nəsimi Şamaxı şəhərində anadan olmuş, Suriyanın Hələb şəhərində işgəncəli şəkildə edam edilmişdir. Əsl adı Seyid Əlidir. Nəsimi əsası Fəzlullah Nəimi tərəfindən qoyulan Hürufilik təriqətinə mənsub idi və poeziyası vasitəsilə bu təriqəti yaymaq üçün Şərqin bir çox ölkələrini gəzmişdi. Nəsiminin türkcə divanı lirik və fəlsəfi qəzəllərdən, məsnəvilərdən, müstəzadlardan, müləmmə, rübai, tuyuq və qitələrdən ibarətdir. Əsasən əruz vəznində yazan Nəsiminin heca vəznində şerləri də var. X əsrdə Bağdadda dara çəkilmiş Həllac Mənsur Hüseyninin şərəfinə ilk şerlərini Hüseyni təxəllüsülə yazan Nəsimi əsərlərində vəhdəti-vücud (panteizm) fəlsəfəsini təbliğ edir, "Ənəlhəq" — "Mənəm allah" düsturunu təkrar edirdi. Nəsiminin Azərbaycan, Türkiyə və Türkmən şerinə böyük təsiri olmuşdur. Fars və ərəb dillərində də qiymətli əsərlər yaratmışdır.*

### QƏZƏLLƏR

Məndə sığar iki cahan, mən bu cahana sığmazam!
Göhvəri-laməkan mənəm, kövnü məkana sığmazam!

Ərş ilə fərşü kafü nun, məndə bulundu cümlə çun,
Kəs sözünü və əbsəm ol, şərhü bəyanə sığmazam.

Kövnü məkandır ayətim, zatinədir bidayətim,
Sən bu nişanla bil məni, bil ki, nişanə sığmazam.

Kimsə gümanı zənnilə olmadı həqqilə biliş,
Həqqi bilən bilir ki, mən zənnü gümanə sığmazam.

Surətə baxü məniyi surət içində tanı kim,
Cismilə can mənəm, vəli, cismilə canə sığmazam.

Həm sədəfəm, həm inciyəm, həşrü sirat əsənciyəm,
Bunca qüməşü rəxt ilə mən bu dükanə sığmazam.

Gənci-nihan mənəm, mən uş, eyni-əyan mənəm, mən uş
Gövhəri-kan mənəm, mən uş, bəhrəvü kanə sığmazam.

Gərçi-mühiti-əzəməm, adım Adəmdir, adəməm,
Tur ilə kün-fəkan mənəm, mən bu məkanə sığmazam.

Can ilə həm cahan mənəm, dəhrilə həm zaman mənəm,
Gör bu lətifəyi ki, mən, dəhrü zəmanə sığmazam.

Əncüm ilə fələk mənəm, vəhy ilə həm mələk mənəm,
Çək dilini və əbsəm ol, mən bu lisanə sığmazam.

Zərrə mənəm, günəş mənəm, çar ilə pəncü şeş mənəm,
Surəti gör bəyanilə, çünki bəyanə sığmazam.

Zatiləyəm sifat ilə, gülşəkərəm nəbat ilə,
Qədriləyəm bərat ilə, püstə dəhanə sığmazam.

Şəhd ilə həm şəkər mənəm, şəms mənəm, qəmər mənəm,
Ruhi-rəvan bağışlaram, ruhi-rəvanə sığmazam.

Tir mənəm, kəman mənəm, pir mənəm, cavan mənəm,
Dövləti-cavidan mənəm, ayinədanə sığmazam.

Gərçi bu gün Nəsimiyəm, haşimiyəm, qüreyşiyəm,
Məndən uludur ayətim, ayətə, şanə sığmazam.

***

Mən mülki-cəhan, cəhan mənəm, mən
Mən həqqə məkan, məkan mənəm, mən.

Mən ərşilə fərşü kafü nunəm,
Mən şərhü bəyan, bəyan mənəm, mən.

Mən kövnü məkanü "kün-fəkan"əm
Bilgil ki, nişan, nişan mənəm, mən.

Mən surəti-mənidə həqəm, həq,
Mən həqqi-əyan, əyan mənəm, mən.

Bir gövhəri əqdəməm-əzəldən,
Ey gövhərə kan, kan mənəm, mən.

Mən atəşi-eşqi-nuri-həqqəm,
Musayə zəban, zəban mənəm, mən.

Mən cümlə cəhani-kainatəm,
Mən dərhi-zəman, zəman mənəm, mən.

Mən ayəti-müshəfü kitabəm,
Ey nöqtədəhan, dəhan mənəm, mən.

***

Dünü gün müntəzirəm mən ki, bu pərgar nədir?
Künbədi-çərxi-fələk, gərdişi-dəvvar nədir?

Bu doquz-çərxi-müələq nədən oldu tərtib,
Fələk altında dönən kövkəbi-səyyarə nədir?

Museyi Tur nədir, Şibliyü Mənsur nədir?
Əcdaha olan ağac, riştə ilə dar nədir?

Fələyin əsli nədəndir, mələyin nəsli nədən,
Adəmin surətinə bunca tələbkar nədir?

Kəbəvü deyr nədir, qeyr nədir, seyr nədir,
Məscidi bütkədəvü xirqəvü zünnar nədir?

Elmi Quranü hədisü xəbəri vəz ilə dərs
Cümlə bir məni imiş, bunca bu təkrar nədir?

Kim ki, pərvanə sifət eşqə yaxılmaz, nə bilir,
Ol nə bilsin özünü bilmədi kim, nar nədir?

Odu su, torpağı yel adı nədəndir, adəm,
Ana səcdə nə üçün, iblisə inkar nədir?

Günəşin qürsü nədən yer üzünə şölə verir.
Ya bu bir məşələdə nur nədir, nar nədir?

Kim ki, bilməz özünü, bilməyə pirlər sözünü,
Kəndisin anlamayan bilmədi hər kar nədir?

Ayü gün əxtəri əncüm nədən oldu izhar,
Şöleyi şəmsü-qəmər, pərtövi-ənvar nədir?

Gəlgil ey dust, qamu müddəilər korluğuna,
Sana asan qılayım bunca bu düşvar nədir?

Kim ki, pərvanəsifət eşqə yaxılmaz nə bilir,
Surəti-şəmidə bu pərtövi-ənvar nədir?

Tərk evində sən əgər hərçü Nəsimi olasan,
Bir gün ola deyəsən, cübbəvü dəstar nədir?

***

Gətir, gətir, gətir ol kaseyi rəvanpərvər,
Götür, götür, götür ol çəngi, bir nəva göstər.

Verim, verim, verim öz canımı mən ol yarə,
Öpüm, öpüm, öpüm ol ləli şəhdilə şəkkər.

Ləbin, ləbin, ləbinizdən əqiq ləlilə mat,
Dişin, dişin, dişinizdən bəhanəsiz gövhər.

Sözün, sözün, sözünüzdən utandı qəndü nəbat,
Üzün, üzün, üzünüzdən tutulu şəmsü qəmər.

Məni, məni, məni qəmzə oxilə öldürdü!
Sənin, sənin, sənin ol cadu gözlərin yeksər.

Saçın, saçın, saçınızdan Xətayi müşk xəcil,
Qaşın, qaşın, qaşınızdan bu kirpiyinlə cigər.

Yəqin, yəqin, yəqinindən Nəsimiyə bilgil,
Həbib, həbib, bu həbibdir ki, dildə şol söylər.

***

Canımı yandırdı şövqün, ey nigarım, qandasan,
Gözlərim nuri, iki aləmdə varım, qandasan?

Bağrımı qan eylədi acı fırağın, gəl iriş,
Ey ləbi vəslət şərabi-xoşguvarım, qandasan?

Firqətin xari məni gör kim, nə məcruh eylədi,
Ey gözü nərgiz həbibim, gülüzarım, qandasan?

Səbrimi yağmaladı şövqün, qərarım qalmadı,
Ey mənim aramım, ey səbrü qərarım, qandasan?

Eylədi eşqin məni qalxan məlamət tirinə,
Ey gözü qaşı yeləkli, şəhriyarım, qandasan?

Ta üzün şəmindən ayruq düşmüşəm pərvanə tək,
Yanərəm leylü nahar, ey nurü narım, qandasan?

Səndən ayrı könlümün yoxdur vəfalı yarı, dost,
Ey cəfasız, hüsni-kamil, yadigarım, qandasan?

Dəldi hicranın oxu eşqində yanən bağrımı,
Surətü mənidə, ey çapük süvarım, qandasan?

***

Yüz min cəfa qılsan mənə,
Mən səndən üz döndərmənəm.
Canım ola qurban sənə
Mən səndən üz döndərmənəm!

Sevdim səni mən can ilə,
Qul olmuşam qurban ilə,
Qoy and içim Furqan ilə
Mən səndən üz döndərmənəm!

İsamısan, Musamısan?!
Ya Yusifi-Kənanmısan?
Vallah ki, canım canısan
Mən səndən üz döndərmənəm!

Ey Nəsimi, aşiqmisən?
Həq yoluna sadiqmisən?
Közyərməyə layiqmisən?
Mən səndən üz döndərmənəm!

***

Aləmdə bugün sənciləyin yar kimin var,
Gər var desən, yox deməzəm, var, kimin var?
Dildari-məcazi bulunur aşiqə yüz min,
Bənzər sənə təhqiqdə dildar kimin var?
Tatarə saçın tozunu tüccar ilə göndər,
Ta kim bilələr nafeyi-tatar kimin var?
Eşqin qəminə eyləmişəm könlümü məxzən,
Bir mənciləyin məxzəni-əsrar kimin var?
İsbat edirəm daim "Ənəlhəqq"imi həqdən,
Bir mənciləyin aşiqi-bərdar kimin var?
Can ilə cahan yarə fəda qıldı Nəsimi,
Onun kimi bir yari-vəfadar kimin var?

***

Düşdü yenə dəli könül gözlərinin xəyalinə,
Kim nə bilir bu könlümün fikri nədir, xəyali nə?
Al ilə ala gözlərin aldadı aldı könlümü,
Alını gör nə al edər kimsə irişməz alinə!
Qiymətini dodağının dəgmə xəsisə sorma kim,
Mən bilirəm ki, can ilə susamışam zülalinə.
Gözlərinə əsir olan könlümün halını bilir,
Kim ki, bu halə düşmədi qoy var kəndi halinə.
Sirrini şol qara bənin yanaği şərh edər, vəli,
Can nola gər fəda ola yanağınavü xalinə.
Dadlı sözündən utanır, abi-həyat məhv olur,
Gül və şəkər nə nəsnədir, kim irişə məqalinə.
Hüsnü cəmalü surətin məclisi bərkəmalıdır,
Şərhü bəyanü vəsf ilə əql irməz kəmalinə.
Üzünü, qaşını, görən qarşubə-qarşu gözbəgöz
Sanma ki, baxa ol göyün bədrinə, ya hilalinə.
Ay ilə gün sücud edər, surətini göricəgəz,
Bu nə cəmalü hüsn olur, səllü əla cəmalinə!
Buldu Nəsimi çün səni, keçdi qamüdən ey sənəm,
Qoydu həririü ətləsi, girdi əbavü şalinə.

***

Sən mənə yar ol ki, könlüm bir dəxi yar istəməz!
Könlümün dildarı sənsən, özgə dildar istəməz!

Cənnəti-ədnin tamaşası üzün gülzarıdır,
Kim ki, şol gülzarı buldu, özgə gülzar istəməz.

Ta əbəd hirman imiş həqdən nəsibi, hər kim ol,
Səndən, ey dilbər, iki aləmdə didar istəməz.

Könlümün məqsudu sənsən, hacəti həqdən budur,
Hacətindən ayrı könlüm nəsnə, zinhar, istəməz.

Gəl ki, sənsiz könlüm, ey canü cahanın hasili,
Kün-fəkanın hasilindən oldu bizar, istəməz.

Sorma, ey dilbər, mənə kim, hacətin məndən nədir,
Çünki məşuqindən ayrı aşiqi-zar istəməz.

Kim ki zülfünün xəyalın bağladı könlündə, ol
Rahibi-deyr oldu, ondan özgə zünnar istəməz.

Çün ənəlhəq darını mənsur olandan istəyin,
Olmayan Mənsur ənəlhəq ləysə-fid-dar, istəməz.

İstərəm aləmdə yarın sirrini faş eyləyim,
Müddəinin ĉanı yanar ğəmdən, əğyar istəməz.

Üzünü bipərdə görmək istərəm daim, vəli,
Minkirin görməz gözü, çün kəşfi-əsrar istəməz.

İstədi həqdən Nəsimi vəslini, buldu murad,
Maliki-didarın oldu, gəncü dinar istəməz.

***

Ləbinə əhli-nəzər can dedilər, gerçəkmiş,
Ağzına nöqteyi-pünhan dedilər, gerçəkmiş.

Ləlini xətti ilə sormuşam ərvahə, onu
Xızrilə çeşməyi-heyvan dedilər, gerçəkmiş.

Adəmin surətinə səcdə qılanlar ki, səni
Gördülər, surəti-rəhman dedilər, gerçəkmiş.

Dedilər qamətinə sidrə kəmal əhli, vəli,
Xəlq onu sandı ki, yalan dedilər, gerçəkmiş

Surətin münkirinə elm ilə iman əhli,
Ona kim, div ilə şeytan dedilər, gerçəkmiş.

Cənnətin əhli ki, üzün bağın, ey cənnətü hur,
Rövzeyi-xüld ilə rizvan dedilər, gerçəkmiş.

Qələmin sirrini həqdən bilən ol taifə kim,
Ənbərin xəttinə reyhan dedilər, gerçəkmiş.

Möcüzat əhli ki, yazısı ilə surətinə,
"Lövhi-məhfuz" ilə Quran dedilər, gerçəkmiş,

Ey Nəsimi, ki nəzər əhli vücudun evinə-
Laməkan gəncinə viran dedilər, gerçəkmiş.

***

Üzünü məndən nihan etmək dilərsən, etməgil,
Gözlərim yaşın rəvan etmək dilərsən, etməgil.

Canımı vəslin şərabından ayırdın, ey sənəm,
Eynimi gövhərfəşan etmək dilərsən, etməgil.

Qaşların qövsində müjkanın xədəngin gizləyib,
Gözləri məstanə, qan etmək dilərsən, etməgil.

Qoymuşam eşqində mən kövnü məkanın varini,
Can nədir kim, qəsdi-can etmək dilərsən, etməgil.

Yandırarsan könlümü eşqində, məlum oldu kim,
Anı rüsvayi-cahan etmək dilərsən, etməgil.

Hər qəzanın oxuna qıldın nişanə sən məni,
Ol nişanı binişan etmək dilərsən, etməgil.

Bərgi-nəsrin üzrə müşkin zülfünü sən dağıdıb,
Aşiqi bixaniman etmək dilərsən, etməgil.

Bürqəi üzündən açarsan, məgər naməhrəmə,
Gizli əsrarı əyan etmək dilərsən, etməgil.

Çünki eşqin məskənidir könlümün viranəsi,
Hər nəyə onu məkan etmək dilərsən, etməgil.

Doğruyam eşqində ox tək, gözlərin tanıqdürür,
Qəddimi niçün kəman etmək dilərsən, etməgil.

Çün yəqin bildi Nəsimi ağzının var olduğun,
Ol yəqini sən güman etmək dilərsən, etməgil.

***

Ey gülüm, ey sünbülüm, ey munisim, ey ənbərim,
Ey mənim noğlum, meyim, həbbim, nəbatım, şəkkərim.

Ey həbibim, ey təbibim, ey bütüm, ey həmdəmim,
Ey rəfiqim, ey şəfiqim, ey nədimü dilbərim.

Ey baharım, ey nigarım, ey şikarım, şahidim,
Ey hərifim, ey zərifim, ey şərifim, sərvərim.

Ey gülüstanım, gülüm, sərvi-güləndamım mənim,
Sağərim, şəmim, şəbistanım, məlayik peykərim.

Ey rəyahim, rahətim, ruhi-rəvanım lütfilə,
Sərəfrazım, sərkəşim, şuxü səadət əxtərim.

Ey mənim xurşidü mahim, ey çirağım, fanusum,
Şux çeşmim, lütfi-şahım, ey mübarək peykərim.

Eşqin aldı əqlü huşum, könlümü yəğmalədi,
Söylə axir, ey Nəsimi, canü dildən çakərim.

***

Dilbəra, mən səndən ayru ömrü canı neylərəm?
Tacü təxtü mülkü malü xanimani neylərəm?

İstərəm vəsli-camalın, ta qılam dərdə dəva,
Mən sənin bimarınnam, özgə dəvanı neylərəm?

Ey müsəlmanlar, bilin ki, yar ilə xoşdur cahan,
Çünki yardan ayru düşdüm, bu cahanı neylərəm?

Çox dualar qılmışam mən xaliqin dərgahinə,
Çün muradım hasil olmaz, mən duanı neylərəm?

Dilbər aydır, ey Nəsimi, səbr elə, qılma fəğan,
Şimdi əfqan etməsəm, dəxi fəğanı neylərəm?

***

Gə, gə, gə, gəl ki, sevirəm sə, sə, sə, sən məhi-Çini,
Za, za, za, zar oluban mən çə, çə, çə çən, çənd nişini.

Dü, dü, dü, dür təki dilər, ve, ve, ve, verdi sana həq,
Sə, sə, sə, səvsə gərəkdir di, di, di, dişləri sini.

Sö, sö, sö, sözlərin elə şə, şə, şə, şəkkəri kəsad,
Gö, gö, gö, gözlərin elər se, se, se, sehri mübini.

A, a, a, al ki, yeridir kö, kö, kö, könlümü mənim,
Sa, sa, sa, sal ki, yeridir zü, zü, zü, zülfünə çini.

Qa, qa, qa, qalmışam axır a, a, a, ahilə sayur,
No, no, no, nola ki, sorsan za, za, za, zari-həzini.

Yü, yü, yü, yüzünü gördüm a, a, a, ayə sataşdım,
Ne, ne, ne, necə ürəkdir qa, qa, qa, qalmaya çəni.

Xə, xə, xə, xəstə Nəsimi sö, sö, sö, söyləyən oldum,
Ne, ne, ne, neylərəm axır dü, dü, dü, dürri-səmini.

***

Dil bazarçısı yalandır, varmazam bazarinə
Gerçək olmaz əyri dil, inanmazam iqrarinə

Sadiq oldur dilini könlü ilə bir eyləyə
Əyri dildən nəsnə gəlməz, durmuşam inkarinə

Varı möhnətdir cahanın, nə umarsan, ey könül
Lənət olsun bu cahana, həm cahanın varinə

Dilbəri oldu kimin kim, fani dünya aqibət
Keçdi ömrü doymadı, irişmədi dildarinə

Təxtə çıxmaq istəməz Mənsur olan, ya minbərə
Hər ki, Mənsur oldu, çıxdı şahi-eşqin darinə

Dünyanın nazü nəimi cifədir, yəni nəcis,
Ey könül tahirsən axır sunma əl murdarinə

Həq bilir işini, səbr et, fariq ol, qüssə yemə,
Vəqti yetsin bu cahanın qoy və qatlan karinə

Hiç gül olmaz tikənsiz, hiç şadi qüssəsiz,
Dərmə gülündən anın, çün güli dəyməz xarinə

Çün Nəsiminin qəmindən Fəzli-həq vaqifdürür,
Qəm deyil gər kimsə olmaz müttəla əsrarinə.

***

Dünya duracaq yer deyil, ey can, səfər eylə
Aldanma anın alına, andan həzər eylə.

Bir halə qərar eyləməz əyyam, keçər ömr
Ey əhli-nəzər, baxma bu halə, nəzər eylə.

Payəndə deyil dövləti, ey xacə, cahanın,
Əsbabinə aldanma, gəl andan güzər eylə.

Gər aşiq isən sidq ilə şol dilbər üçün gəl
Can ilə cahan ortaya qoy, tərki-sər eylə.

Düşdü saçının zülmətinə gönlüm, ilahi,
Şol hali pərişanə bu şami səhər eylə.

Çün hüsnünə xətm oldu bu gün dövri-məlahət,
Ey fitnələrin xatəmi, şəqqül-qəmər eylə.

Gər Museyi-İmran kimi şol narə sataşdı,
Gəl, tabişini göstərü şərhi-şəcər eylə.

Şol püstə dəhanın xəbərin bildi Nəsimi
Şirinlərə şol tüngi-şəkərdən xəbər eylə.

## RÜBAİLƏR

Fəzli həqdir vaqifi əsrarımız
Fəzli həqdəndir qamu ənvarımız
Fəzl həq göstərmiş idi karımız
Fəzli həqdir, Fəzli həq memarımız.

Ey özündən bixəbər qafil oyan
Həqqə gəl kim həq deyil batil, oyan
Olma fani aləmə mayil, oyan
Mərifətdən nəsnə qıl hasil, oyan.

Həq-təala Adəm oğlu özüdür
Otuz iki həq kəlamı sözüdür
Cümlə aləm bil ki, Allah özüdür
Adəm ol candır ki, günəş özüdür.

Ay ilə günəş üzün heyranıdır
Mişk ilə ənbər saçın tərxanıdır
Çün Nəsimi əyyamın sultanıdır
Dövr anın, dövran anın dövranıdır.

## QİTƏ

Bax şu dilbərin oynuna,
Günahın almış boynuna,
Səhərdən aşiq qoynuna
Girən dilbərin quluyam.

***

Cana, sən candan nə kim, gəlsə cigərlər ağrımaz
Həq bilir, bir zərrə nəştərdən damarlar ağrımaz
Şəha, mehrindənmidir, ya aşinalıqdanmıdır
Cismimi sər ta qədəm min gəz yararlar ağrımaz
Zahidin əfsanəsindən soydular nahaq məni
Həq bilir səndən şəha, sahib nəzərlər ağrımaz
Şişəmi çün daşə çaldım, həqqi izhar eylədim
Çeşmi-əhval ağrıdan arif bəsərlər ağrımaz
Zahidin bir barmağın kəssən dönər həqdən qaçar,
Gör bu gerçək aşiqi sər-pa soyarlar ağrımaz
Cəhli-namərdin qaçan meydan günündə yeri var
Ər bilir meydan qədrin kim, qədərlər ağrımaz
Soyun, ey murdar sallaxlar, Nəsiminin tənini,
Bunca namərdi görün bir ər qıyarlar ağrımaz.

# ƏBDÜLQADİR MARAĞAİ

(1353—1435)

*Görkəmli musiqişünas alim Əbdülqadir Marağai ədəbi yaradıcılıqla da məşğul olmuşdur. Onun türkcə yazdığı şer örnəklərindən bu gün əlimizdə olanları – Teymurləngə həsr olunmuş dördlüyü, qəzəlini və bəzi tədqiqatçıların ona aid etdikləri xalq mahnısının mətnini antologiyamıza daxil edirik.*

## TEYMURLƏNGƏ

Məşriqü Məğrib müsəxxərdir sənə,
Dövləti-nüsrət müqərrərdir sənə,
Fəthü nüsrət daima biləndədir
Dövlətin həqdən müqərrərdir sənə.

## QƏZƏL

Bənzəyir cənnətə yazi-növbahar
Xassə ba ruyi xoşi gülizar.

Yar ilə zövqi səfa qıl dər çəmən
Çünki olubdur çəmən çün ruyi-yar.

Çün şahim girsə qəmində eyş üçün
Gül ayağına saçar ağca nisar.

Devlə eylər bülbüli dastan-səra
El qəhərlər sərvi-bostani-çinar.

Mövsimi-eyş tərəbdir sultanım
Cani xoş kim qıldı işrət ixtiyar.

Zülfi-safi ki olmuş tövbəkar
Anın üçün saqiya cami mey ar.

Çünki gördün şəhni Əbdülqadirə
Bəxti yarın oldu, sənsən bəxtiyar.

## XALQ MAHNISI

Sorma məndən kim, nə bolmuş ya nədir
Atəşi-eşqin canımda yanədir.
Vardı dil, bilmən ki, hansı yanədir
Ömr keçdi, yenə hacət ya nədir.

Ya ilahi, sən bilirsən halimi,
Yavuz işdən qısa tutgil əlimi.
Əməlim çox, günahım kop, qorxaram
Son nəfəsdə ayırma imanımı.

# XIV-XVI ƏSRLƏR CAĞATAY ŞAİRLƏRİ

## LÜTFİ

(1366/67—1465)

Surətini kim ki gördü qıldı cana can fəda,
Surətinə xud qılır olub fəriştə iqtida.

Necəkim zülfündə var küfrü zəlalət zülməti,
Rövşən ol ay tək üzündə vardır ol nuri xüda.

İntəha yoxmu desəm hüsnünə, aydır gözlərin,
Hardasan, mən xud bəlanı qıldım indi ibtida.

Sehr işin Kəşmir eli qəmzəndən öyrənsə gərək,
Kim cahan içrə bulubdur ol bu fəndə müqtəda.

Ta dedin ləlin zəkatı mən fəqirə olsa sərf,
Şükrünün indi onu şirin gərək qılsam əda.

Sənsizin qılmam təhəmmül nola qılsam qılma eyb,
Gər bu yük yüklənsə təkkə gələr ondan yüz səda.

İtlərinin mənsəbin Lütfiyə təyin eylə kim,
Dövlətində qılsa sultanlıq nə olar bir gəda.

## SƏKKAKİ

(XIV-XV əsrlər)

### ULUĞBƏYİN MƏDHİ

(Bir hissə)

Cahandan getdi təşvişlər, sevinc gəldi, aman gəldi,
Xəlayiq, eyş edin, qalxın, süruri-cavidan gəldi.

Ulus bilməzdi ellikcə tənində canı var, ya yox,
Bihəmdüllah, onun fəzli bilə[1] bu cismə can gəldi.

Bu məvkib gərdi[2] sürməsi tapılmazdı, ölürsək də,
Görün gözlə, xuda verdi, nə xoş bir ərməğan gəldi.

Dikəlsin bəylərin başı, göyə dəysin ələmlər[3] tək,
Ki, onlar təkyə[4] qıldı, ah bu qutluğ asitan[5] gəldi.

Cahandan Əhrimən getdi, müsəxxər oldu insü can,
El Oş[6] əxtini, Süleymani zaman gəldi.

Qədirləndi qızıl taxtın, özün atdı göyə tacın,
Ədalət bağı səbz oldu, çün ol Nuşirəvan gəldi.

Gərək can bülbülü dün-gün nəvadən qalmasın bir dəm,
Çü dosta güllü yaz, düşmən muradinə xəzan gəldi.

Rəiyyət — qoç, qoyun. Sultan — ona çoban və ya qurddur,
Gəbərsin qurd, sevinsin qoç, çü Musa tək çoban gəldi.

Bu gündən sonra qalmazlar rəiyyətlər riayətdən,
Ulus qeydi çəkən başçı atadan mehriban gəldi.

Könül güldü, işıqlandı, kədər qalmadı bir zərrə,
Qaranlıqlar keçib getdi, günəşli, nurlu dan gəldi.

Sevinsin xosrovi-ali[7] gühər sultan Uluğbəy kim,
Şahənşah Şahirux[8] bəy tək şəhi xosrov nişan gəldi.

Bu şahın ləşkəri hansı vilayət sarı əzm etsə,
Fələkdən hər zaman ol dəm nidayi-əlaman gəldi.

Alıb bunlar qılınc, nizə, girəndə qanlı qovğayə,
Əlindən gəlmədi iş düşmənin, yalnız fəğan gəldi.
Bu ordu başçısı varsa, aparsa ordunu hərbə,
Sanarsan ki, deyil ordu, dəmirçi, gürz, sinan gəldi.

Şahənşaha, sənin adın şəhi-kişvəraçan idi,
Al indi aləmi, göydən ləğəb: dünyatutan gəldi.

Qoyun, dovşan kimi düşmən görüb bəxtini, təxtini
Qolun bağladı qarşında zəifü natəvan gəldi.

Girib tülküsifət düşmən yuvadə öldü aclıqdan,
Nə qılsın? Üstünə heybət ilə şiri-jəyan gəldi.

---

[1] Fəzli bilə — fəzli ilə.
[2] Məvkib gərdi — məvkib tozu. Şahın yanında gedən atsız, yaxud atlı döyüşçülər bölüyünə "məvkib" deyilir. Onların ayağından qopan tozu Səkkaki göz sürməsinə bənzədir.
[3] Ələm — bayraq.
[4] Təkyə — səcdə.
[5] Qutluğ asitan — müqəddəs astana.
[6] Oş — şəhər adı.
[7] Xosrovi-ali — ulu şah.
[8] Şahrux Mirzə — Mavəraünnəhr hökmdarı Əmir Teymurun oğlu və Mirzə Uluğbəyin atası.

Əbəs sevdayə düşməklə iş açdı başına düşmən,
Axır gör kim bu sevdadən ona min bir ziyan gəldi.

Əya, şaha, mələksiyrət, sənin vəsfin sözüm içrə,
Deyim qoy ağlıma bir də yeni bir dasitan gəldi.

Qapın torpağı məlhəmdir cərahətli, zəif canə,
Şəfalıq məlhəmi buldu, busati-pərniyan[1] gəldi.

Kimin təqsiri var, gördü gəlir Nuşirəvani-ədl.
Hamının qəlbinə bir-bir şərif zati-zişan[2] gəldi.

Bu dünyadan nə sultanlar gəlib getdi. Sənin tək bir
Fələk dillənsə, söz tapsa, cavab versin: haçan gəldi?

## HÜSEYN BAYQARA
(1438—1506)

*Əmir Teymurun nəslindən olan Hüseyn Bayqara Herat şəhərində anadan olmuşdur. 1469-cu ilin martında Herat taxtına çıxıb padşah olur. Həmin ilin martında dahi özbək şairi Əlişir Nəvaini Səmərqənddən Herata, sarayının katibi sifətilə dəvət edir. Şer, sənət hamisi olan Hüseyn Bayqara özü də istedadlı şair idi. Dostu Ə. Nəvai "Məcalisun nəfais" əsərinin axırında Bayqaranın poeziyasını yüksək qiymətləndirərək onun qəzəllərindən nümunələr verir. Bütün Türk dünyasının dahisi olan Əlişir Nəvaidən başqa onun sələfləri və müasirlərindən Lütfinin, Səkkakinin və Bayqaranın əsərlərindən örnəklər verməklə oxucumuza orta əsrlərin Cağatay — özbək şairlərinin bu dövrün Türkiyə və Azərbaycan şairlərinə nə qədər yaxın olduqlarını bir daha göstərmək istəyirik.*

Ey sənin cadu gözün sərfitneyi axir zaman,
Ləblərindir xəstə könlümə həyatı cavidan.

Ey günəş üzlü sənəm, halım görüb rəhm eylə kim,
Etdi hər gün hər nəfəs hicrində fəryadu fəğan.

El arasında neçə sirrimi pünhan saxladım,
Bu sarı üz aşkara eylədi sirri nəhan.

Gər xəyalın olsa mehman könlüm evində müdam,
Ağlayan üz sona hər dəm gözlərim gövhər fəşan.

Dedim ey can, dərdimə vəslin ilə bir çarə qıl,
Gülüb aydır: ey Hüseyni, tutma məndən bu güman.

---
[1] Pərniyan — ipəkdən toxunan güllü, zərif parça, matah.
[2] Zişan — şanlı.

## ƏLİŞİR NƏVAİ
(1441—1501)



*Türk dünyasının ən böyük şair və mütəfəkkirlərindən olan Nəvai Herat şəhərində dünyaya gəlmiş və orada da vəfat etmişdir. Özü də Əmir Teymur nəslindən olan Əlişirin məktəb yoldaşı Hüseyn Bayqara taxta çıxarkən dərhal Nəvaini sarayına yüksək vəzifəyə dəvət etmiş və Nəvai ömrü boyu şair kimi də, dövlət xadimi kimi də böyük nüfuz sahibi olmuşdur. Dostu şair Ə. Caminin məsləhəti ilə Nizami Gəncəvi mövzularında beş məsnəvidən ibarət "Xəmsə" yaratmışdır ("Heyrət ül əbrar", "Fərhad və Şirin", "Leyli və Məcnun", "Yeddi səyyarə", "Səddi İsgəndər"). "Xəmsə"dən başqa, Nəvainin çağatay türkcəsində dörd divanı, farsca divanı və başqa əsərləri var. Türk dilini fars diliylə müqayisə edən və türk dilinə üstünlük verən Nəvai bu müqayisəni "Mühakimat ül-lüğəteyn" adlı elmi araşdırmasında aparmışdır. Əlamətdar haldır ki, Azərbaycan ədəbiyyatının tarixinə aid iki cildlik kitabında Firudin bəy Köçərli Nəvaidən də geniş bəhs edir. F. Köçərli yazır: "Bu şair əslən cığatay türklərindən isə də, Azərbaycan şüərası arasında artıq hörmət və şöhrət kəsb etmişdir və onlara Nəvainin təsiri artıq dərəcədə olubdur". Firudin bəyin nümunə kimi gətirdiyi Nəvai qəzəlini biz də olduğu kimi — yəni orijinalın dilində antologiyamıza daxil edirik. Nəvainin bir neçə başqa qəzəlini isə Azəri türkcəsinə Nigar Rəfibəyli və Xəlil Rza Ulutürk uyğunlaşdırıblar.*

Könüllər naləsi zülfün kəməndin nagəhan görgəc,
İrür andaq ki, quşlar qıçqırışğaylar yılan görgəc.
Könül çakin gözümdə əşki-rəngin elgə faş etdi,
Balıq zəxmini fəhm eylərlər el dəryada qan görgəc.
Boyalğan qan ara can pərdəsi getgəc qəmi-hicrin,
Gönül bağida bərgidər ki, al olmuş xəzan görgəc.

İrür çün aləm içrə can fani, yaxşı ad baqi,
Bəs, el kamın rəva eylə özünü kamiran görgəc.

Nəvai, xürdə nəzmini andaq eylədin təhrir,
Ki, sacğay xürdə başın üzrə şahi-xərdədən görgəc.

## QƏZƏLLƏR

Canım üzülür hicr ilə canan gərəkdir,
Könlüm alışır dərd ilə dərman gərəkdir.

Bu qəm gecəsi aşiqi-pərvanəyəm ancaq,
Başımda mənim şəmi şəbistan gərəkdir.

Qəmzən xoş olur gönlümə, ey işvəli dilbər,
Ah, oxlarına bir neçə peykan gərəkdir.

Eşqin gecə-gündüz məni yandırdı içərdən,
Eşq əhli, Nəvai yana pünhan gərəkdir.

* * *

Yar getdi gönüldə onun bir nazı qalıbdır,
Ancaq ki, qulağım dolu avazı qalıbdır.

Göz evini göz yaşları yıxdı bu gün, ey dil,
Yerində onun qəmli xərabası qalıbdır.

Gönlüm quşu sünbül saçının toruna düşmüş,
Bülbül kimi hər gül sarı avazı qalıbdır.

Gül fəsli o quş hansı yana meyl eləmiş ki,
Bağ içrə fəqət sərvi-sərəfrazı qalıbdır.

Gəl qəm yemə sən yar sitəmindən ki, Nəvai
Ömrün çoxu sevdaya keçib, azı qalıbdır.

* * *

Hansı bir çöhrə ki, meyl etsin ona xəstə könül,
Hansı bir zülf ki, olsun ona vabəstə könül.

Qüssə dırnağı ilə yaralayıb hər tərəfin,
Nəqş edər əymə qaşın şəklini qəlb üstə könül.

Qan demə gül yanağın şövqünə, gül, lalə dərər.
Dərd bağından tutur lalə, gülü dəstə könül.

Könül azad deyilsə, qəm yemə, şeyx saqın,
Çünki azadəliyi görmədi heç kəsdə könül.

Zülmdən canə gəlib atsa Nəvai eşqi,
Yalvarıb söyləyəcək atma gəl ahəstə, könül.

Çevirəni: Nigar Rəfibəyli

* * *

Laləzarmı, yoxsa ahimdən cahanğa düşdü od?
Al şəfəqmi, ya ürəkdən asimanğa düşdü od?!

Dedilər el xanimanın yandırar ol gülyanaq,
Bu söz eşitcək məni — bixanimanğa düşdü od.

Gözlərin bir çınqı atdı... döndü səbrim boz külə,
İldırım şaqqıldadı... bir karivanğa düşdü od.

Oxların könlümgə dəycək, yandı həm göz, həm bədən.
Quru ney tez odlanar, çün neysitanğa düşdü od.

Sovurub gül xanimanımnı burulğanlar təkin?
Ya fələk bidadidən sərvi-rəvanğa düşdü od?

Yandım, öldüm ki... üz açdın, xəlqə atəşlər saçıb,
Yurda od saldın, vəli mən natəvanğa düşdü od.

Ey Nəvai, bil ki, ahlar çəkmişəm biixtiyar,
Kim desə, yandı meşə, Mazəndəranğa düşdü od.

* * *

Hər kimin ki, bir mələksima pərivəş yarı var,
Nə pəridən ehtiyacı, nə mələkdən arı var.

Yox təəccüb, sarmaşırsa hər gecə tər qönçəyə,
Qönçə tək hər sübh olub xəndan nişat izharı var.

Ağ sinən, təlin xəyalilə mən oldum az qala
Bir hörümçək ki, onun can riştəsindən tarı var.

Yox əcəb, gül həsrətilə zar ola bülbül əgər,
Cisminə hey sancılan yüz-yüz tikanı, xarı var.

Sünbüli zülfi əgər aşuftədir, eyb etmə kim,
Gül üzündə qoşa yatmış nazənin bimarı var.

Məst olub, bixud olub qoy çıxmasın meyxanədən,
Çün mənim tək dövr əlindən dərdi var, azarı var.

Ey Nəvai, yar üzər olsa məhəbbət riştəsin,
Gəlməz olsa ol sənin sarı, sən anın sarı var!

* * *

Nə diriyəm, nə ölü, ancaq sənin bimarinəm,
Heç deyə bilməm də, gəl, hicrində hicranzərinəm.

Nöqteyi ağzın qəmindən saçmışam ah oxları,
Tökürəm göz yaşları, sərkəştənəm, pərgarinəm.

Dostlarım, könlüm hədisi tanrıma aid degil,
Axı, ol divaneyi-sərgəştənin bezariyəm.

Köynəyindən Yusifin ətrin alanlar can tapar,
Ey əzizim, mən də, bil, ol köynəyin tairiyəm.

Bir günəş hicrində tün tək ruzigarım qarədir,
Yox əcəb, gər tün kimi ağlar gözüm hey dəmbədəm.

Meydə əfyun var ki, ey saqi, bu əski dəhr ara
Dəliyəm gah qüssədən, gah bir dəmin huşyariyəm.

Nə üçün el qarğışından biz olaq aşuftə hal,
Hər nə kim el der: Nəvai yüz dəfə ondan da kəm...

* * *

Aşiq oldum, bilmədim yar özgələrlə yar imiş,
Allah, allah, eşq ara hansı bəlalar var imiş!

Bir əlifdən gör neçə aşiq yıxılmış, xəstədir.
Qəddinə vurğun könüllər hasili-azar imiş.

Sancılıb el bağrına kiprik ucun qanım tökür,
Sən demə qanım tökən tər kipriyin bir xar imiş.

Sandım sarğın ilə qan fışqıran min yarəmi,
Anladım: sarğın sənin ağ bir kəfəndən tar imiş.

Dan yerində mən şüa... sən kölgə saldın üstümə,
Kölgə yox, canım alan nazəndə bir dildar imiş.

Qaşların bir cüt qılınc... baxdım, yaman qorxdum, inan,
Sən demə, ölsəm də can ol tiğə minnətdar imiş.

Ey Nəvai, aşiq olma, sən gözəllərdən çəkin,
Göz ki, gördü, can ki, yandı, üzmək əl düşvar imiş.

* * *

Gül çağı hər gülgə bir bülbül coşub dastan düzüb,
Tazə qanlı dağ ilə könlüm quşu əfqan düzüb.

Mən bir ağ gül həsrətindən sübh açılmış gül kimi,
On ləçək, on beş ləçək hey dişləyib canım üzüb.

Hicrin ahı ruhumu həm endirir, həm qaldırır,
Yel qopur, tufan gəlir, qönçəm küsür, ağzın büzüb.

Mən zəifəm, mən yıxıldım, ayağın öpməkdəyəm,
Sərv tək qarşımda qəddinin xəyalın durğuzub.

Sən dirildib öldürürsən gündə yüz yol bülbülü,
Ey tikanə yandaşan[1] gül, kim sənin əhdin pozub?

Dəhr pirinin əlindən istərəm mey xıltı mən,
Razıyam xıltı içim, zahid ridasından süzüb.

Ey Nəvai, ömr ötür yel tək... darıxma, şad yaşa!
Yelə yetməkmi olar? Yellər önündə kim dözüb?

---

[1] Yandaşan — yanaşan.

* * *

Mən cahandan doymuşam, doymaz mənim qanımdan el,
Mən canımdan üzdüm əl, çəkməz əlin canımdan el.

Tay-tuşum rüsvay olub, rüsvay odu lav-lav yanar,
Rast gələn yoldan çıxar, ötməz mənim yanımdan el.

Toz basıb üz-gözləri, yox tanıyan bir-birini,
Halımı sorsa, girib çıxsa bu viranımdan el.

Kəbəmin hər daşına, ey Xızr, mən can sürtərəm,
Axışar, tutsa xəbər Kəbəmdən, ünvanımdan el.

Ey Nəvai, tutmasınlar eyb əgər divanəyəm,
Oxusun qoy ol pəri vəsfin bu divanımdan el.

* * *

Keçdi ömrüm nəqdi qəflət içrə nadanlıqda, heyf.
Qalan ömrüm qəmlər ilə, min peşimanlıqda, heyf.

Canıma vermə əziyyət, sən riyazət qılma çox,
Gəncliyin asan sovuşdu, yandın asanlıqla, heyf.

Bağladım peymanədən peyman fəğan ki, əqlü din
Oldu bu peymanədən ol süst peymanlığda, heyf.

Ey müsəlmanlar, bilin ki, ötdü ömrüm hasili
Nəfsi kafir fitnəsindən namüsəlmanlıqda, heyf.

Heyf kim, nəf eyləməz, üzsəm də əl peymanədən,
Desəm öz əhvalımı bu tövr heyranlıqda, heyf.

Elə işlər gör ki, heç vədə peşiman olma sən,
Nə qədər işdə xəta qıldım peşimanlıqda, heyf.

Çox sözüm bəlkə yalandır, bir sözüm sərrast, dürüst,
Yalana qurban gedib ömr oldu qurbanlıqda, heyf.

Bir qədər yüngül gəlir siqlətdə sultandan gəda,
Heyf kim, çox-çox gəda olmuş da sultanlıqda, heyf.

Ey Nəvai, vaqifəm rüzgara mən, əsrara mən:
Keçdi ömrüm nəqd qəflət içrə nadanlıqda, heyf!

Çevirəni: **Xəlil Rza Ulutürk**

## BABUR ŞAH
(1483—1530)

*Zahirəddin Babur şah görkəmli dövlət xadimi və ədib, Hindistanda yaranmış Böyük Moğollar imperiyasının banisi, eyni zamanda Orta Asiya türk ədəbiyyatının Nəvaidən sonra ən böyük simasıdır. Nəsrlə yazılmış "Baburnamə" əsərindən başqa Nəvai üslubunda şerləri də var.*

### QƏZƏL

Canımdan özgə yari vəfadar tapmadım
Gönlümdən özgə məhrəmi əsrar tapmadım.

Canımdan özgə canına dil-əfkar görmədim
Gönlüm kimi gönlünə giriftar görmədim.

Naçar firqət ilə huy etmişəm nedim,
Çün vəslinə özümi səzavər tapmadım.

Barı varıb eşiyinə binövbət, ey könül,
Necə ki varıb eşiyinə bar tapmadım.

Babur özünü öyrədə gör yarsız ki mən,
İstər cahanı bunca qalıb yar tapmadım.

### YAZ FƏSLİ...

Yaz fəsli yar vəsli, dostların söhbəti,
Şer bəhsi, eşq dərdi, badənin keyfiyyəti,
Yaz fəsli çaxır içməyin özgə halı var.
Kimə bu nəşə müyəssər olsa vardır dövləti
Dostların söhbətində nə xoş olar bəhsi-şer
Ta bilinə hər kişinin təbi ilə haləti.
Gər bu üç işi müvafiq tapsan ol üç vəqt ilə,
Bundan artıq olmaya Babur-cahanın işrəti.

# XV - XVI ƏSRLƏR AZƏRBAYCAN ŞAİRLƏRİ

## CAHANŞAH HƏQİQİ
(1397—1467)

*Qaraqoyunlu hökmdarı, dövlət xadimi və şair Cahanşah Güney Azərbaycanın Xoy şəhərində dünyaya gəlmişdir. Qaraqoyunlular dövlətinin banisi Qara Yusifin üçüncü oğludur. Həqiqi təxəllüsü ilə türk və fars dillərində qəzəllər, məsnəvi və rübailər yazmışdır.*

### QƏZƏLLƏR

Yarəb, nə nur imiş ki, məni yaxdı narına,
Yarəb, nə zat imiş ki, məni çəkdi darına?
Sübhi-əzəldə qıldı müəttər dimağımı,
Ta əsdi dan yeli saçının mişkbarına.
Kəhli-bəsiri-didə qılan xaki-payini,
Gər bir güzər irişsəm anın kuhsarına.
Xalivü çeşmü qəmzəsi aşüftə könlümü
Çəkdi kəməndi-zülfünə, saldı şikarına.
Bağrım qanın gözümdən axıtdı qəmi-ruxi,
Simin əlini qıldı anınla nigarına.
Dövründə ləlin meyi əsrütti ta əbəd,
Şol badədən ki, kimsə irişməz xumarına.
Bağrımın işvə birlə qılır yara qəmzəsi,
Yarəb, nə işvədir ki, qılır qəmzə yarına?
Yarından ayrı yandı Həqiqi fəraq ilə,
Gəlgil təfərrüc eylə anın ahü zarına.

***

Ağzını qönçeyi-xəndan dedilər, gerçəkmiş,
Xəti-ruxsarını reyhan dedilər, gerçəkmiş.

Lövhi-məhfuzini ta gördü kəlam əhli sənin,
Ayəti-vəchini Quran dedilər, gerçəkmiş.

Zövqi-eşqin ki, qəmi dünyavü üqbayə dəyər,
Bu könül təxtinə sultan dedilər, gerçəkmiş.

Ənbərəfşan saçını küfrə münasib qılıban,
Dürci-yaqutuna mərcan dedilər, gerçəkmiş.

Əhli-təqva ki, sücud eylədi vəchində sənin,
Sacidi-surəti-rəhman dedilər, gerçəkmiş.
Ey Həqiqi, çu sənə nəqli-kəlam oldu müin,
Nəfsinin şərhini bürhan dedilər, gerçəkmiş.

## HAMİDİ

(? — təqr. 1485/86)

*Görkəmli Azərbaycan şairidir. Öz vətənində mükəmməl mədrəsə təhsili aldıqdan sonra Fateh dövründə, 1455/56-cı illərdə, Türkiyəyə getmişdir. Fars və Azərbaycan dilində yazdığı şerləri ilə sarayın diqqətini cəlb etmişdir. İstanbulda ölmüşdür.*

### QƏZƏLLƏR

Neçün ey məh, cənnəti-kuyində bar olmaz bana,
Neçün əvvəlki kimi hiç etibar olmaz bana?

Dərdi-hicrində bana yar olmadı səbrü qərar,
Sən bana yar olmayınca kimsə yar olmaz bana.

Bən qaçan görsəm səni kəndümi əsla bilməzəm,
Bəxtiyar olduğumçün ixtiyar olmaz bana.

Eşqüvün yolunda Mənsurəm vəli napayidar
Ey driğa kim, bu dövlət payidar olmaz bana.

Gər nigar etsən əli qanımdan andan dönməzəm,
Deməsünlər kim məgər mehri-nigar olmaz bana.

Hamidi gərçi qəbul olsa dəhanın vəsfini,
Bundan özgə bu cahanda hiç kar olmaz bana.

* * *

Necə dil səbr edə hicran içində,
Necə dil qəm çəkə dövran içində?

Necə axa gözümdən qanlı yaşlar,
Necə bir üzə könlüm qan içində?

Necə bir şölələnsin bərqi-ahim
Gecələr künbədi-gərdan içində?

Necə bir ol pəriru firqətində
Necə qur naləvü əfğan içində.

Dəxi vəxt olmadı kol şahi-xuban,
Bəni yad eyləyə yaran içində.

Dəxi vəxt olmadı kim xeymeyi-eyş
Quralım laləvü reyhan içində.

Gül, ey mey, Hamidi könlün sevindir
Ki, bəslər dərdi-eşqi can içində.

* * *

Rahət olmadı dil, ey rahəti-can, sən gedəli,
Qönçəvəş könlümə dar oldu cahan, sən gedəli.

Sünbüli-zülfün ilə gül yüzünü yad edərəm
Gecə-gündüz qılaram ahü fəğan, sən gedəli.

Görəli ləl kimi ləblərini mərdumi-çeşm,
Axıdır dərdilə su yerinə qan, sən gedəli.

Abi-çeşmimdə xəyali-qədri-siminbərini,
İstərəm dəmbədəm ey sərvü rəvan, sən gedəli.

Dəhənin şövqi ilə Hamidiyi-süxtənin,
Getdi səbri-dilü can oldu rəvan, sən gedəli.

* * *

Ay yüzün ayineyi-surəti-candır, bilirəm,
Anda nəqşi-rüxi-dildar əyandır, bilirəm.

Ol əyan nur ki, məthulidur əhli-nəzərin,
Dil hər zərrənin içində nəhandır, bilirəm.

Bu ki, aram edəməz seyrü silkundə fələk
Qərəzi tərbiyəti-hüsni-bəyandır, bilirəm.

Ol kim alur dilü səbrü xirədi qarət edər
Məzhəri-surəti-zibayi filandır, bilirəm.

Ol şəkərləb götürər Hamidiyi meygədəyə
Göstərən ola bana Mehdi zamandır, bilirəm.

* * *

Varalım ol sənəmi-gülüzarə yalvaralım,
Bəlayi-firqət əlindən nigarə yalvaralım.

Niyazü həsrətilə qapusuna yüz sürəlim,
Şifiə edüb səki-kuyini yarə yalvaralım.

Müsaid olsa əgər ruzigar bizim ilə
Orada baş açubən ruzigarə yalvaralım.

Könül, bütün günü əyyami-qəmdə sabir idin
Bu gün kim oldu könül parə-parə, yalvaralım.

Bu dərdi-hicrə ki, həq ruzi qıldı bizə bu gün
Əgərçi hiç edəməziz bir çarə yalvaralım.

Gər istəsən ki yenə Hamidi kimi görəsən
Xəttü rüxi dinü gün girdkarə yalvaralım.

## KİŞVƏRİ
(XV əsr)

### QƏZƏLLƏR

Ey saçı sünbül, yüzü lalə, gözü ahubərə,
Boldu sənsiz ruzigarım tirəvü, bəxtim qərə.

Xətti səbzindir Xızır, ləli-ləbin abi-həyat,
Arizin xurşidi tabanü, dəhanın pür zərə.

Daneyi-xalın ilə gül yüzünü gərsəm əgər,
Xirməni-xurşidi bir co, baği-rizvan bir tərə.

Küsdü məndən ol bəlayi-can, gedib, ey dustlar,
Can verir mən sədəqə kim bu bəlayi qaytara.

Zuri-zər birlə müyəssər bolsa ləlin şərbəti,
Bolğay idi çeşmeyi-heyvan nəsib İsgəndərə.

Kişvəri şeri Nəvai şeridən əksik iməs,
Bəxtinə düşsəydi bir Sultan Hüseyni Bayqara.

* * *

Ey pəri, sənsiz pərişan ruzigarəm doğrusu,
Sən gedəndən bərlü bisəbri qərarəm doğrusu.

Yüz qəmim vardur, vəli bir ğəmküsarım yoxdurur,
Bidilü bidilbərü biğəmküsarəm doğrusu.

Naseha, görsən məni rüsva, məlamət qılma kim,
Tilbəlik canımdadır, biixtiyarəm doğrusu.

Zər vərəq birlə bəzənmiş yüzünü gördüm bu gün,
Vermədim canı yüzündən, şərmisarəm doğrusu.

Mey gətür saqi, məni qurtar namazü rövzədən
Kim, mən ol zöhdü riyadən tövbəkarəm doğrusu.

Ölmüşəm hicrindən cana, vəslidən can ver mana
Kim, məni-bidil sana can birlə yarəm doğrusu.

Xəlq deyir kim, Kişvəri bir aşiqi-məhrum irür,
Hər nə kim, derlər mana, yüz onca varəm doğrusu.

## HƏBİBİYƏ

Nə mən nalənə həmdəmdir Həbibi,
Nə mən bimarə müşfiq bir təbibi.
Nə mən məhcurə vəslindən nəsibi
Həbibi, va Həbibi, va Həbibi.

Əgər görsən, səba, ol bivəfanı,
O şol biganeyi-naşinanı,
Degil: unutmagil mən binəvanı
Həbibi, va Həbibi, va Həbibi.

## HƏBİBİ

(təqr. 1470/75—1520?)

*Məşhur Azərbaycan şairi, böyük Füzulinin ustadlarından sayılan Həbibi Göyçayın Bərgüşad kəndində dünyaya gəlmişdir. Uşaq yaşlarında quzu otaran Həbibi sərrast, iti cavablarıyla Ağqoyunlu hökmdarı Sultan Yəqubun məmurlarından birinin diqqətini çəkmiş və beləliklə sultan sarayına düşmüşdür. Ağqoyunluların süqutundan sonra Şah İsmayılın dəvətiylə Səfəvilər sarayına gəlir və burada "Məlik üş-şüəra" rütbəsi qazanır.*

### QƏZƏLLƏR

Dərdi-eşqə hər ki, ol dəmsaz ola,
Ol gərək labüd ki, əhli-raz ola.

Aşiqi-sadiq odur məşuqunun,
Yolunda can tərk edə, sərbaz ola.

Dəmdə min gəz qal edərsə aşiqi,
Qəmzəsi məşuqunun xud az ola.

Aşiqa, cevri cəfavü dərdü qəm,
Zövqi şadi, hüsnü xülqü naz ola.

Hər məzəllət ki, irişə məşuqdən,
Aşiqə xud ol qamu ezaz ola.

Aşiq anda necə tövbə kim,
Abü səbzə, şahidü mey saz ola.

İrişəməz şol hümanın zülfünə,
Mürğu dil gər şahinü şahbaz ola.

Ey Həbibi, xoşdurur cami-şərab,
Xassə kim, məhbubi xoş avaz ola.

* * *

Qamu cevri ki, cana, cana etdin,
Qamusun xub key mərdanə etdin.

Gözün qan ağladuğu, ey pəriru
Ki, hər dəm zülmünü insana etdin.

Əlinə tiğ verdin iki məstin,
Bu rəsmü adəti türkanə etdin.

Şu məst etdiklərin mehrab içində
Görən der: məscidi meyxanə etdin.

Şu can deyridə yaxdın iki şəmi,
Cahanı yeksər atəşxanə etdin.

Çü zənciri saçına şanə urdun,
Tökəli aqili divanə etdin.

Cəmalın şəminə yanmağa hər dəm
Qamu can mürğini pərvanə etdin.

Həbibi, qulağına söylə yarın,
Sözünü çünki sən dürdanə etdin.

* * *

Gər səninçün qılmasam çak, ey büti-nazikbədən,
Gorum olsun şol qəba, əgnimdə pirahən-kəfən.

Çıxmaya sevdayi-zülfün başdan, ey məh, gər yuz il.
Üstüxani-kəlləm içrə tutsa əqrəblər vətən.

Gərçi şad olman dəxi, ey dil, bundan böylə kim,
Çün mənə həmdəm olan sənsən, nə sən olgil, nə mən.

Düşdi şəbnəm bağə, gəl, ta gül nisar etsün sana,
Səbzənin hər bərginə bir dür ki, tapşurmuş çəmən,

Ey könül, eşq əhlinə hər dəm gülərdin şad olub,
Mən deməzmidim ki, danla ağlıyasıdır gülən?

Necə diklənsün Həbibi, sənsiz, ey əndamı gül,
Kim batar cisminə təndə hər tük olmuş bir tikən.

## ŞAH İSMAYIL XƏTAİ
(1487—1524)



*Şah İsmayıl Xətai Azərbaycanın böyük şairi və dövlət xadimidir. Səfəvi şeyxləri sülaləsindən olan İsmayıl Şeyx Heydərin oğludur. Ərdəbildə anadan olmuşdur. Səfəvilər dövlətinin yaradıcısı və ilk hökmdarıdır. Xətai təxəllüsüylə şerlər yazmışdır. Əruz vəznində yaratdığı qəzəllərlə, qəsidələrlə, rübailərlə yanaşı, xalq şeri üslubunda, heca vəznində yazdığı qoşmalar, nəfəslər, bayatılar, varsağılar poeziya tariximizdə önəmli yer tutur. Nəsimi ilə Füzuli arasında şerimizin mühüm mərhələsi kimi xüsusi əhəmiyyətə malikdir. Xətainin "Dəhnamə" və "Nəsihətnamə" kimi məsnəviləri də məşhurdur.*

*Maraqlıdır ki, şair – şahın rəqibi Osmanlı Sultan Səlim fars dilində şer yazırdı. Şah İsmayılın isə fars və ərəb dillərində şerləri olsa da, əsərlərinin əksəriyyəti doğma türk dilindədir. Xətainin türkcə "Divan"ına daxil olan istər dini, istər siyasi məzmunlu şerlər, istərsə də zərif məhəbbət lirikası Şərq ədəbiyyatına böyük təsir göstərib. Füzuli gənc yaşlarında yazdığı "Bəngü Badə" əsərini Şah İsmayıla ithaf edib. Anadoluda yaşayan, özəlliklə qızılbaşlara yaxın olan şairlərə də Xətainin həm şair, həm hökmdar, həm də təriqət mürşidi kimi təsiri böyük olub.*

Allah-allah, deyin, ğazilər,
Ğazilər, deyin, şah mənəm.
Qarşu gəlin, səcdə qılın,
Ğazilər, deyin, şah mənəm.

Uçmaqda tuti quşuyam,
Ağır ləşkər ər başıyam,
Mən sufilər yoldaşıyam,
Ğazilər, deyin, şah mənəm.

Nə yerdə əkərsən bitərəm,
Xanda çağırsan yetərəm,
Sufilər, əlin tutaram,
Ğazilər, deyin, şah mənəm.

Mənsur ilə darda idim,
Xəlil ilə narda idim,
Musa ilə Turda idim,
Ğazilər, deyin, şah mənəm.

Qırmızı taclı, boz atlı,
Ağır ləşkər nisbətli,
Yusif peyğəmbər sifətli,
Ğazilər, deyin, şah mənəm.

Xətaiyəm al atlıyam,
Sözü şəkərdən datlıyam,
Murtəza Əli zatlıyam,
Ğazilər, deyin, şah mənəm.

## QƏZƏLLƏR

Diyari-eşqə sultanəm, dila mən də zəmanimdə,
Vəzirimdir ğəmü ğüssə oturmuş iki yanimdə.

Fərağü atəşü dərdü ələmlər bağrımı yaxdı,
İliklər qarə su oldu, əridi üstixanimdə.

Mən ol canbazi-sərbazəm, fələk fövqindədir darim,
Neçə Həllac Mənsuri yürütdüm risimanimdə.

Mən ol şəhbazi-kuhsarəm, baş əymərn qülleyi-Qafə,
Neçə ənqa kimi yavru uçurdum aşiyanimdə.

Həmən əl arxası yerdə, cahanın padişahidir,
Xətai həp keçən sərdən, qədəm qoyan nişanimdə.

* * *

Mənim yolumda yektalər gərəkdir,
Dini, imanı yəğmalar gərəkdir.

Mənimtək gövhəri nadan nə bilsin,
Məni bilməyə danalar gərəkdir.

Nə bilsin məni hər bir başı gözli
Könül gözündə binalər gərəkdir.

Mən olman dəymə fikr ilən müyəssər,
Mənə bir incə sövdalar gərəkdir.

Mənəm sultan Xətai Heydər oğlu,
Mənim yolumda qovğalar gərəkdir.

* * *

Yer yox ikən, gög yox ikən, ta əzəldən var idim,
Gövhərin yekdanəsindən iləri pərgar idim.

Gövhəri ab eylədim, tutdu cahanı sərbəsər,
Yeri, gögi, ərşü kürsi yarədən səttar idim.

Gah Hüseynilən belə pustimi soydu qadilər,
Gah o Mənsur donuna, girdim "ənəlhəq"dar idim.

Girdim Adəm cisminə, kimsənə bilməz sirrimi,
Mən bu Beytullah içində ta əzəldən var idim.

On səkkiz min aləmə mən gərdiş ilə gəlmişəm,
Ol səbəbdən həqq ilə sirdar idim, sərdar idim.

Dünyasından mən onun sirrin bilirdim, ol mənim,
Dəryanın altındakı sac qızdıran ənnar idim.

Mən Xətaiyəm, həqi həq tanımışam bigüman,
Onun üçün ol yaratdı, mən ona dərkar idim.

* * *

Ey könül, sidqilə hər kim şah ilə yoldaş ola,
Yüz gərək döndərməyə hər necə kim, yol daş ola.

Yolu gər daş ola, gər yay ola, gər oxü qılınc,
Mürşidindən dönənin mənidə ismi laş ola.

Qul gərək tanıda öz doğruluğun həq yoluna,
Etiqaddan azmaya gər bayü gər qəllaş ola.

Ey könül, cəhd eylə gəl, doğru yola gör şahı sən,
Aqibət qəlbi çıxar hər kimsə kim, qəllaş ola.

Ey Xətai, sidqilə bu şah əyağinə gələn,
Aqibət bir gün gümansız xəlq içində baş ola.

* * *

Qızıl gül, bağü bustanım, nə dersən?
Fəda olsun sənə canım, nə dersən?

Qərarü səbrü aramım tükəndi,
Kəsildi, külli fərmanım, nə dersən?

Əridi iliyim, qaldı sümiyim,
Bu təni tərk edər canım, nə dersən?

Qamu dərdlilərə dərman bulundu,
Dəvasız dərdə dərmanım, nə dersən?

Qamunun küfr ilə imanı vardır,
Mənim küfr ilə imanım, nə dersən?

Sənin məqsudun oldur kim, ölüm mən,
Həlal olsun sənə qanım, nə dersən?

Əgər yatsam min il torpaq içində,
Dürüstdür əhdü peymanım, nə dersən?

Xətai can ilə çün səni sevdi,
Sevən ölsünmi, sultanım, nə dersən?!

* * *

Dodağın qənd imiş, bal anda neylər?
Nə nazik xətt imiş, xal anda neylər?
Əlifə nisbət etdim qəddü dalın,
Əlif üstə, əlif, dal anda neylər?
O zahid geydiyi sufü sütürlat,
Fəqirin geydiyi şal anda neylər?
Kimi kim, mali-mülki gənci yoxdur,
Geniç mülk olmayan mal, anda neylər?
Xətai qal evindən halə yetdi,
Bu bir hal evidir, qal anda neylər?

* * *

Ey könül, yar vəslini qoyma ki, yar əldən gedər,
Sən bu işdə qılma təqsir, ixtiyar əldən gedər.
İlbəil, saətbəsaət xoş keçir gün yarilə,
Həftəhəftə, günbəgün ol ruzigar əldən gedər.
İşrətü zövqü səfayə ey könül, şad ol müdam,
Eyş nihan olur görünməz, aşikar əldən gedər.
Aşinayi tərk edübən, yadə can verme könül,
Yad ilə biliş olunca aşna, yar əldən gedər.
Ey Xətai, qoyma yarın damənin əldən müdam,
Kim ki, işin süst dutar, hər nə ki var əldən gedər.

* * *

Cana, ğəmində gözlərimə su gəlür, gedər,
Seyl oldu, daşdı, şimdi bəhər su gəlür, gedər.
Vəsl olmaz isə yüzünü görmək mənə müdam,
Kuyindən, ey sənəm, mənə bir bu gəlür, gedər.
Bixab qaldı kövkəbə nisbət bu gözlərim,
Hər gecə özgə gözlərə yuxu gəlür, gedər.
Ta görmədi gözüm səni, ey sərvboylu yar,
Sənsiz həmişə gözlərimə cu gəlür, gedər.
Miskin Xətai görmədi çeşmin kimi sənin,
Səhra içində munca ki, ahu gəlür, gedər.

* * *

Ol sənəm kim gecə-gündüz can anun heyranıdır,
Əqlü fəhm andan bərü eşq ilə sərgərdanıdır.
Dilbərim, yarım, əzizim, qəmküsarım, munisim,
Can şikarım, suvlu yarım, canımın cananıdır.

Dün səba gəldı mənə xoş-xoş müənbər buy ilə
Ğaliya, ol məhliqanın zülfi-müşkəfşanıdır.

Ey könül, hicrin ğəmindən çox şikayət qılma kim
Aşiqə cövri, cəfası lütf ilə ehsanıdır.

Bu Xətai şerinə eyb etmə, ey nakəs həsud,
Cümlə üşşaq əhlinə həmdəm, anın divanıdır!

* * *

Ey müsəlmanlar, bu gün ol yari-pünhan ayrılır,
Uçdu ruhim, getdi əqlim, gövdədən can ayrılır.

Ayrılır ol yari-sərdarım, gedir, qoymuş məni,
Səd həzarın dadü bidad, bədəndən can ayrılır.

Ey könül, fəryadü nalə vaxtıdır, eylə fəğan,
Şimdi şəhrindən sənin ol şahi-sultan ayrılır.

Zar qıl bülbül kimi, çak et yaxanı gül kimi,
Şol əzəldən yari-həmdəm, əhdü peyman ayrılır.

Gözlərim, hər dəmdə mövc eylə ki, firqətdir bu gün,
Tək sədəflər dürri kim, şol gövhəri-kan ayrılır.

Dust vida eylər mənimlən, ağlaram mən zar-zar,
Gözlərimdən hər zaman gör Bəhri-Ümman ayrılır

Ey Xətai, tanrı sorsun bu şikəstə könlümu,
Zərd olubdur arizin, andan məgər qan ayrılır?

## QOŞMALAR

Bu gün elə almaz oldum mən sazım,
Ərşə dirək-dirək çıxar avazım,
Dörd şey vardır bir qarındaşa lazım,
Bir elim, bir kəlam, bir nəfəs, bir saz.

Gözəl,əlim çıxsa, çıxsa salınsa,
Bədir aylar kimi doğsa, dolunsa,
Dörd şey vardır bir qarındaşa lazım,
Bir xeyir, bir şər, bir ibadət, bir niyaz.

Yaz olunca çayır-çəmən üstünə,
Ərməğan sunarlar dostu-dostuna,
Dörd şey vardır ovçu almış dəstinə,
Bir şahin, bir doğan, bir əspir, bir baz.

Cahil olan söylər, sözünü bilməz,
Meydana gəlincə özünü bilməz,
Dörd şey vardır cənnət yüzünü görməz,
Bir münkir, münafiq, bir Yezid, qanmaz.

Şah Xətaim aydır: sən qulun nedər,
Gözəl dünyasını tərk edər gedər,
Dörd şey vardır ildən-ilə dövr edər.
Bir aydır,bir gündür, bir qışdır, bir yaz.

* * *

İçmişəm bir dolu, olmuşam ayıq,
Düşmüşəm dağlara, olmuşam keyik,
Sənə derəm, sənə, sürməli keyik,
Qaçma məndən, qaçma avçı deyiləm.

Avçı deyiləm ki, düşəm izinə,
Qaça-qaça qanlar endi dizinə,
Sürmələr hey çəkdin qonur gözünə,
Qaçma məndən, qaçma avçı deyiləm.

Sənə derəm — sənə, keyik ərənlər,
Bizə sevda, sənə dalğa verənlər,
Dilərəm mövladan yenməz vuranlar,
Qaçma məndən, qaçma avçı deyiləm.

Eyder, Şah Xətaim uçan qaçandan,
Zərrəcə qorxmarıq bu datlı candan,
Gedib dəvac olma atana mandan,
Qaçma məndən, qaçma avçı deyiləm.

## GƏRAYLI

Gövhərin keçməyən yerdə,
Satma, qardaş, kərəm eylə,
Ləl daşını çay daşına,
Qatma, qardaş, kərəm eylə.

Gördün bir yerdə aşina,
Hər nə dersən özbaşına.
Yol daşını yol quşuna
Atma, qardaş, kərəm eylə.

Gördünsə bir yerdə rəqib,
Neylərsən yüzünə baxıb,
Münkiri qatara çəkib,
Getmə, qardaş, kərəm eylə...

Xətaim çağırır, ərə!
Dünya böylə gəlmiş zirə,
Arif, oxun əbəs yerə,
Tutma, qardaş, kərəm eylə.

## VARSAĞI

Qaibdən dəlil göründün,
Dədəm, xoş gəldin, xoş gəldin!
Bizi sevib sevindirdin,
Dədəm, xoş gəldin, xoş gəldin!

İki can idik birləşdik,
Məhəbbət qapısın aşdıq,
Şükür didara irişdik,
Dədəm, xoş gəldin, xoş gəldin!

Üstümüzə yol uğratdın,
Gövhər aldın, gövhər satdın,
Ərliyini isbat etdin,
Dədəm, xoş gəldin, xoş gəldin!

Bir ağacda güllər bitər,
Dalında bülbüllər ötər,
Şahıma bərgüzar gedər,
Dədəm, xoş gəldin, xoş gəldin!

Boylə, Şah Xətaim, boylə,
Pirim dəstur versin söylə,
Şaha məndən niyaz eylə,
Dədəm, xoş gəldin, xoş gəldin!

## BAYATILAR

Xətaiyəm xəttarəm,
Həq sirrinə səttarəm,
Həkimlərin dərmanı,
Təbiblərə əttarəm.

Xətaiyəm bir haləm,
Əlif üstündə daləm,
Sufiyəm təriqətdə,
Həqiqətdə abdaləm.

Xətaiyəm, ver cəvablən,
Qırmızı gül gülablən,
Səndən can əsirgəməm,
Zira kim, bir hesablən.

Xətai işin düşər,
Gəlib, gedişin düşər,
Dişləmə çiy löqməni,
Yerinə dişin düşər.

## BAHARIN GƏLDİYİN NƏDƏN BİLƏYİM...

Baharın gəldiyin nədən biləyim,
Gül dikəndə bitər, bülbül daldadır.
Əyyubun tənində iki qurd qaldı,
Biri ipək sarar, biri baldadır.

Könlünə gətirmə şəkk ilə güman,
Seyid Nəsimiyə de, ol oldu şan.
Tanrı ilə minbir kəlam söyləşən,
Əli Mədinədə, Musa Turdadır.

Şəriət yolunu Məhəmməd açdı,
Təriqət gülünü Şah Əli seçdi.
Şu dünyadan neçə yüz min ər keçdi,
Onlar ittifaqda, Mehdi yoldadır.

Adəmin, Hatəmin zat-i Fəzlullah,
Əşyayi qərq etmiş bu bir sirrullah.
Şahənşahi-qütbi-aləm zillullah,
Qüdrət-i nəzəri mömin quldadır.

Şah Xətai aydır: sirrini yayma,
Qıla gör namazın qəzayə qoyma,
Şu yalan dünyada heç sağam deymə,
Tənin tənaşirdə, sirrin saldadır.

## DƏHNAMƏ
## (bir parça)

### BAHARİYYƏ

Qış getdi, yenə bahar gəldi,
Gül bitdivü laləzar gəldi.
Quşlar qamusu fəğanə düşdü,
Eşq odu yenə bu canə düşdü.
Yer geydi qəbayi-xizrpuşan,
Cümlə dilə gəldi ləbxamuşan.
Sərvin yenə tutdu damənin su,
Sərv üstə oxudu faxtə gu-gu.
Qönçə dəhəni çəməndə xəndan,
Gülməkdən ənar açıldı dəndan.
Bülbül oxudu süfati-hicran,
Dəryada dür oldu əbri-neysan.

Durna uçuban həvayə düşdü,
Laçın oluban ovayə düşdü.
Alma ağacı dibindən sayə,
Tən eylər idi buluda, ayə...
Yaşın yerə tökdü əbri-neysan.
Bülbüllər oxudu səd həzaran.
Mey bəslədi jalə hər vərəqdə,
Turac kitab oxur təbəqdə.
Qum-qum dər idi ağacda qumri,
Məst oldu bənəfşə içdi xəmri.
Şax üstə qabaqlar aslı halı,
Qu gərdənindən verir misalı.
Quş beççələri ünü yuvadən,
Məktəb ünü tək gəlir həvadən.
Boyandı zəmin həzar rəngə,
Övraqi-şəcər də təngə-təngə.
Neylufər açıldı suya girdi,
Pirahənini başına bürdi.
Çinar əlini çü rəqsə açdı,
Gül xırda zərin şabaşə saçdı.
Çaylar bulandı, yıxdı arxın,
Bağlar ağacı göyərtdi şaxın.
Yaprağı ağaclar üstə lərzan,
Kimisi çü tir, kimisi peykan.
Şəh tuti oxur şəkər kəlamın,
Qənd ilə pür etdi bəndü damın.
Döndü vətəninə cümlə quşlar,
Gəldi yuvasına qırlaquşlar.

# DİRİLİ QURBANİ

(? — ?)

*XVI əsrdə yaşayıb-yaratmış Qurbani indiki Cəbrayıl rayonunun Dirili kəndində anadan olmuşdur. O, bizə məlum olan ən qədim Azərbaycan şair-aşıqlarındandır. Şah İsmayıl Xətainin müasiri olan Qurbaninin adına sonralar bir xalq dastanı da qoşulmuşdur.*

## QOŞMALAR



Başına döndüyüm ay gözəl pəri,
Adətdir, dərərlər yaz bənövşəni!
Ağ nazik əlinlə bir dəstə bağla,
Tər buxaq altına düz bənövşəni.

Tanrı səni xoş camala yetirmiş,
Səni görən aşıq əqlin itirmiş,
Mələklərmi dərmiş, göydən gətirmiş,
Heyif ki, dəriblər az bənövşəni.

Başına döndüyüm, bağa gəl, bağa,
O gözəl hüsnündən bağa nur yağa,
Dəstə-dəstə dərib taxar buxağa,
Bənövşə qız iylər, qız bənövşəni.

Səhər olcaq şeyda bülbül oxuşdu,
Hökm olundu, süleymanlar yerişdi,
Sərt qış gəldi, gülün vaxtı sovuşdu,
Daha iyləmərik biz bənövşəni.

Qurbani der: könlüm bundan sayrıdı,
Nə etmişəm yarım məndən ayrıdı?
Ayrılıqmı çəkib boynu əyridi,
Heç yerdə görmədim düz bənövşəni.

* * *

Sallana-sallana gedən Salatın!
Gəl belə sallanma, söz dəyər sənə.
Al-yaşıl geyinib qarşıda durma
Yayın bəd nəzərdən, göz dəyər sənə.

Getmə, getmə, görüm kimin yarısan,
Hansı bəxtəvərin vəfadarısan?
Kölgədə bəslənmiş quzey qarısan,
Səhərin yelləri tez dəyər sənə!

Qurbani der: heç kəs yarın öyməsin,
Düymələ yaxanın çarpaz düyməsin,
Dəstələ, zülflərin yerə dəyməsin,
Yollar qubarlanar, toz dəyər sənə!

* * *

Qəm yemə bu qədər divanə könlüm,
Həmişə ruzigar belə dar olmaz.
On bir ay çəkəsən zimistan qəhrin,
Necə güldür çövrəsində xar olmaz?!

Hər bir adam öz yerində oturmaz,
Əqlin zayə verməz, fəhmin itirməz.
İgidlər könlünə şikvə gətirməz,
Necə dağdır quzeyində qar olmaz.

Siyah zülfü daraq ilə dara gör,
Öz könlünü öz dərdinə dara gör,
Qurbani der: bir neçəsin dərə gör,
Özgə bağda belə heyva, nar olmaz.

Sənsən Qurbaninin gül üzlü yarı,
Qalsa qurbət eldə artar azarı,
Sağ olsun dünyada vəfalı yarı
Bir mən ölməyilən dünya tar olmaz.

* * *

Mürşidi-kamilim, şeyx oğlu şahim!
Bir ərzim var qulluğuna şah, mənim.
Əziz başın üçün oxu yazğımu,
Agah ol halımdan gahbəgah, mənim!

Dərin-dərin dəryaları boyladı,
Xəncər alıb qara bağrım teylədi.
Oğlu ölmüş vəzir qəza eylədi,
Getməz dimağımdan dudi-ah, mənim.

Şair olan dərsi alır pirindən,
Baş açmadım səg rəqibin sirrindən.
Qolu bağlı keçdim Xudafərindən,
Üzüm gülməz, heç açılmaz ah, mənim.

Qurbani der: bahar olur, gəlir yaz,
Göllərdə üzüşür ördək ilə qaz.
Sərim təvəlladır, üzüm payəndaz,
Yoxdur, bundan qeyri bir mətah, mənim.

* * *

Ay ariflər, bu dünyanın yüzündə
Tazəcə açılan güllər sevinsin.
Bir əyri çalmalı, xumar gözlünün,
Zülfünü dağıdan yellər sevinsin.

Gəlsin bahar fəsli, açılsın yazlar,
Göllərə tökülsün ağ qular, qazlar.
Bəyzadə oğlanlar, xanzadə qızlar,
Yar ilən danışan dillər sevinsin.

Qurbaniyəm mən sevərəm narıncı,
Yar-yar deyib oldum belə zarıncı.
Almanı, heyvanı, narı, turuncu
Bu dördünü dərən əllər sevinsin.

* * *

Nə ola bir şadlıq xəbəri gələ,
Yüklənə barxanam ellərə doğru.
Naşı ovçu bərə bəklər əylənər,
Marallar sayrışar yollara doğru.

Səhərdən yüklənir nazlımın köçü
Cənnətülməvadır qoynunun içi.
Əbrişim telləri, mürəssə saçı,
Hərdəm səda qılar bellərə doğru.

Sevdiyimin gürcü imiş atası,
Əskik olmaz qoç igidin xatası.
Qaşı kaman, sinəm onun butası,
Qatı yay çəkilər qollara doğru.

Tağçalarda qurudulur barama,
Naşı təbib məlhəm eylər yarama.
Dedim pərim, zülflərini darama,
Könül gəştə çıxar xallara doğru.

Qurbani der: naləm yandırar daşı,
Üstümə gəlməsin təbibi-naşı.
Ümmana dönəndə gözümün yaşı,
Axanda tökülər sellərə doğru.

* * *

Dedim, könül, sevmə xublar xubunu,
Onun hər muyunda yüz min qal olu.
Nagah səni dərdə giriftar eylər,
Qaşı fitnə, qəmzəsində al olu.

Ulu divanlarda çəkilir adım,
Ərşə bülənd oldu dadü-fəryadım.
Başım üstə qanım içən cəlladım,
Sağ əlində əlif qəddim dal olu.

Camalı Yusifin — İbn Yaqubun,
Aləmə şəms olan hüsnü həbibin,
Ala gözlü, şirin sözlü məhbubun
Zənəxdanı dürr şöləli xal oldu.

Qəmər nə yandırıb, günəş nə yaxar,
Könlüm nə titrəşib ümmana axar.
Qurbani der: hər kim şaha kəc baxar,
Onun kamalında tez zaval olu.

* * *

Hicran gecələri qayğu çəkməkdən
Əlif qəddim əyri yayə dönübdü.
Bədəsilin eşidən tək sözlərin,
Yəqin etdim, ömrüm zayə dönübdü.

Uçuşur durnalar, səkir teyhular,
Namərd adam qalibliyin arzular.
Bulandı dəryəlar, həm daşdı sular,
Qaynaqsız bulaqlar çayə dönübdü.

Biz də qonaq olduq Qarslı Osmana,
Yunis tək lap daldıq qəri-ümmana.
Qurbani der: dönsün belə zamana,
Göydəki ulduzlar ayə dönübdü.

* * *

Dağlar sənin ilə həmdəm olmada
Əsirgərsən indi qarı da məndən.
Səg rəqibin o tənəli sözləri,
Axır ayrı salar yarı da məndən.

Bu ilməyin, bu köynəyin, bu ağın,
Əzəl başdan bağbanıydım bu bağın.
Sinəm üstə çarpaz düyün bu dağın
Bağban əsirgəyər narı da məndən.

Bu dünya dediyin bir boş ələkdi,
Haqqın min bir adı onda gərəkdi.
Qurbani der: bu nə çərxi-fələkdi?
Zülümlə ayrırlar yarı da məndən.

* * *

Ey nazənin, bu gen, geniş dünyada
Namusu əğyarə satmaq nədəndi?
Gər adına deyilmişsə şahibaz
Söylə görüm onu atmaq nədəndi?

Eylərəm hər yerdə sənin sorağın,
Gündən-günə artar bil iştiyağın.
Öz əlinlə yandırdığın çırağın
Şöleyi-fəraqla yıxmaq nədəndi?

Hifz eyləsin tanrı səni bəladan,
Tapsın canın sihhət ey gül şəfadan.
Hər ikimiz vəslə yetək duadan,
Hicranın oduna yanmaq nədəndi?

Nə gözəldir sənin şirin sözlərin,
Zail etdi məni ala gözlərin.
Ey sevdiyim, qaydasıdı qızların,
Gahi-gahi bu söz atmaq nədəndi?

Sənə əyandır ey dilbər, sevdiyim!
Qurbanidir, bir şey dilər, sevdiyim!
Ay üzünü görmək istər, sevdiyim!
Söylə görüm, bəs yaşınmaq nədəndi?

* * *

Dedim: dilbər, getmə bir dəm danışaq,
Dedi: sözün yoxdur, bəhanədir bu!
Dedim: bir nəzər qıl aşiq halına,
Dedi: əcəb dəli, divanədir bu!

Dedim: ey vay, halım yaman olubdur,
Dedi: qəmdən belim kaman olubdur.
Dedim: vallah, sinəm meydan olubdur.
Dedi: mən bilmənəm, xəzanədir bu!

Dedim: qoy gözümə qıvrım tellərin,
Dedi: lazım deyil vəhşi güllərin.
Dedim: sən bizimsən, biz də ellərin,
Dedi: çəkin burdan, biganədir bu!

Dedim: sənə aşıq olan can budur,
Dedi: sənin eşqin axar bir sudur.
Dedim: cavan ömrüm çürüyüb gedir,
Dedi: əbəs sözdür, əfsanədir bu!

Dedim: mən Qurbanam yarın adına,
Dedi: elə sənsən düşən yadına.
Dedim: mən ha yandım eşqin oduna,
Dedi: şəmə yanan pərvanədir bu!

* * *

Başına döndüyüm, ay pərizadə,
Can içində cana vermərəm səni.
Neynərəm bostanı, neynərəm bağı,
Yüz bağü bostana vermərəm səni.

Dağlarda maralsan, çöllərdə ceyran,
Ordubad, Naxçıvan boyuna heyran.
Tamaşaya gələr cəmi Gülüstan,
Külli Dağıstana vermərəm səni.

Qurbani der: can içində can gələ,
Yaş yerinə gözlərimdən qan gələ,
Camalın görməyə Süleyman gələ,
Təxti-Süleymana vermərəm səni.

## TƏCNİS

Gözəl adam, gəl allahı sevərsən
Daldalanma bir də görkəz yara üz.
Yastana gör yarın astanasında,
Qulluq eylə, xidmət eylə yara yüz.

Sağdan vurdu, soldan çıxdı sağ əlim,
Sağ qoşundu, sol ləşkərdi, sağ ələm.
Nagümanam mən bu dərddən sağalam,
Təbib birdir, dərd min birdir, yara yüz.

Qurbani der: munda gəldim yar üçün,
Kəs, kəs kabab doğra bağrım yar üçün.
Yar odur ki, yardan sonra yar üçün
Zülf dağıda, yaxa yırta, yara üz.

# MƏHƏMMƏD FÜZULİ
(1494—1556)



*Şərqin ən böyük şairlərindən biri, Türk dünyasının iftixarı, dahi lirik Məhəmməd Füzuli Kərbəla şəhərində dünyaya gəlmiş və burada da vəfat etmiş, İmam Hüseyn türbəsinin bir hücrəsində dəfn edilmişdir. Füzuli Oğuzların Qüzey və Güney Azərbaycanda, Anadoluda, İraqda ta qədimlərdən bəri məskun olduqları və Dədə Qorqudun da mənsub olduğu Bayat boyundandır. Bir çox araşdırıcıların fikrincə, şairin atası Süleyman İraqa Azərbaycandan köç etmişdir. M. Füzuli İslam Şərqinin üç əsas dilində — türk, fars və ərəb dillərində ölməz əsərlər yaratmışdır. Ancaq şah əsərləri — "Leyli və Məcnun" məsnəvisi, türkcə "Divan"ı doğma ana dilindədir, bu dilin bədii imkanlarının təsdiqi və inkişaf etməsi yolunda misilsiz xidmət göstərmiş örnəklərdir.*

*Füzulinin nəzm və nəsrlə yazdığı lirik, fəlsəfi,dini, alleqorik, hətta satirik əsərləri vardır. "Bəngü Badə", "Səhhət və mərəz", "Ənis ül – qəlb", "Söhbət ül-əsmar", "Yeddi cam", "Rindü Zahid" "Hədiqət üs-süəda", "Mətlə ül-etiqad", "Şikayətnamə", həmçinin Ə. Camidən türkçəyə çevirdiyi "Hədisi-ərbəin" mənzuməsi, Füzulinin ən müxtəlif janrlarda, üç dildə yaratdığı ölməz əsərləri, Azərbaycanın, Türkiyənin, İraq türkmənlərinin milli sərvəti, ümumiyyətlə, Türk dünyasının və Şərq xalqlarının dünyanın mədəniyyət xəzinəsinə qiymətli töhfəsidir. Haqlı olaraq iddia olunur ki, heç bir şair Azərbaycan və Türkiyə ədəbiyyatına Füzuli qədər təsir göstərməyib.*

*Yalnız şerimizi deyil, rəssamlıqda miniatür sənətimizi, musiqidə muğam aləmini Füzulisiz təsəvvür etmək olmaz. 1908-ci ildə Şərqin ilk operasını — "Leyli və Məcnun" muğam operasını yaradan böyük Azəri bəstəkarı Üzeyir Hacıbəyli də məhz Füzulinin bu məşhur əsərinə müraciət etmişdir.*

## QƏZƏLLƏR

Məni candan usandırdı, cəfadan yar usanmazmı?
Fələklər yandı ahimdən, muradım şəmi yanmazmı?

Qamu bimarinə canan, dəvayi-dərd edər ehsan,
Neçün qılmaz mənə dərman, məni bimar sanmazmı?

Qəmim pünhan tutardım mən, dedilər yarə qıl rövşən,
Desəm ol bivəfa bilmən, inanarmı, inanmazmı?

Şəbi-hicran yanar canım, tökər qan çeşmi-giryanım,
Oyadar xəlqi əfğanım, qara bəxtim oyanmazmı?

Güli-rüxsarinə qarşu gözümdən qanlı axar su,
Həbibim, fəsli-güldür bu, axar sular bulanmazmı?

Deyildim mən sənə mail, sən etdin əqlimi zail,
Mənə tən eyləyən qafil, səni görcək utanmazmı?

Füzuli rindü şeydadır, həmişə xəlqə rüsvadır,
Sorun kim, bu nə sevdadır, bu sevdadən usanmazmı?

***

Ah eylədiyim sərvi-xuramanın üçündür,
Qan ağladığım qönçeyi-xəndanın üçündür.

Sərgəştəliyim kakili-mişkinin ucundan
Aşüftəliyim zülfi-pərişanın üçündür.

Bimar tənim nərgisi-məstin ələmindən,
Xunin ciyərim ləli-dürəfşanın üçündür.

Yaxdım tənimi vəsl günü şəmtək, əmma
Bil kim, bu tədarük şəbi-hicranın üçündür.

Qurtarmağa yəğmayi-qəmindən dilü canı,
Səyim nəzəri-nərgisi-fəttanın üçündür.

Can ver, könül, ol qəmzəyə kim, bunca zamanlar,
Can içrə səni bəslədiyim anın üçündür.

Vaiz bizə dün duzəxi vəsf etdi, Füzuli,
Ol vəsf sənin külbeyi-əhzanın üçündür.

***

Aşiq oldum yenə bir tazə güli-rənayə
Ki, salır al ilə hər dəm məni yüz qovğayə.

Müşt urub, qalibi-fərsudəmi gəh həbs qılır,
Gah sərasiməvü üryan buraxır səhrayə.

Üzümün qani ilə sinəmi al etdim kim,
Aləti-sənət ola ol büti-bipərvayə.

Bu nə işdir ki, bizi iynə kimi incəldib,
Salır iplik kimi hərdəm bir uzun sevdayə.

Ayağın bağlamış avarələrin sənət ilə
Yox nihayət səri-kuyində gəzən şeydayə.

Ləxt-ləxt olmuş ikən, qəmzə dirəfşini çəkib,
Çarəsiz olmadı bir gün məni-qəmfərsayə.

Yaxa çak edəni başmaq kimi salır ayağa,
Ey Füzuli, bax onun etdiyi istiğnayə.

***

Dəhənin dərdimə dərman dedilər cananın,
Bildilər dərdimi, yoxdur dedilər dərmanın.

Olsa məhbublərin eşqi cəhənnəm səbəbi,
Huri qılmanı qılar kəndisinə rizvanın.

Keçdi meyxanədən el, məsti-meyi-eşqin olub,
Nə mələksən ki, xərab etdin evin şeytanın?

Vurmazam sihhət üçün mərhəm oxun yarəsinə,
İstərəm çıxmaya zövqi-ələmi-peykanın.

Nə bilir oxumayan müshəfi-hüsnün şərhin,
Yerə göydən nə üçün endiyini Quranın.

Yerdən, ey dil, göyə qovmuşdu sirişkin mələki,
Onda həm qoymayacaqdır oları əfğanın.

Ey Füzuli, olubam ğərqeyi-girdabi-cünun,
Gör nə qəhrin çəkirəm dönə-dönə dövranın.

***

Nalədəndir ney kimi avazeyi eşqim bülənd,
Nalə tərkin qılmazam ney tək kəsilsəm bənd-bənd.

Qıl mədəd, ey bəxt, vermə kami-dil mümkün deyil,
Böylə kim, ol dilrubə bidərddir, mən dərdmənd.

Dağlərdir odlu könlümdə qarası qopmamış,
Ya sabati-eşq üçün od üzrə bir neçə sipənd.

Açılır könlüm gəhi kim, giryeyi-təlxim görüb,
Açar ol gülrux təbəssüm birlə ləli-nuşxənd.

Xaki-rahindən məni qaldıra bilməz sayə tək,
Qılsa gərdun afitabın hər şüaın bir kəmənd.

Cam tut der, saqiyi-gülçöhrə, zahid, tərki-cam
Ey könül, fikr eylə gör kim, qansıdır tutmalı pənd.

Ey Füzuli, surəti-fəqrin qəbuli-dustdur,
Hiç dərvişi sənin tək görmədim sultanpəsənd.

***

Məndə Məcnundan füzun aşiqlik istedadı var.
Aşiqi-sadiq mənəm, Məcnunun ancaq adı var,

Nola qan tökməkdə mahir olsa çeşmim mərdümü,
Nütfeyi-qabildürür, qəmzən kimi ustadı var.

Qıl təfaxür kim, sənin həm var mənim tək aşiqin,
Leylinin Məcnunu, Şirinin əgər Fərhadı var.

Əhli-təmkinəm, məni bənzətmə, ey gül, bülbülə,
Dərdə yox səbri onun, hər ləhzə min fəryadı var.

Öylə bədhaləm ki, əhvalım görəndə şad olur,
Hər kimin kim, dövr cövründən dili-naşadı var.

Gəzmə, ey könlüm quşu, qafil fəzayi-eşqdə,
Kim, bu səhranın güzərgahında çox səyyadı var.

Ey Füzuli, eşq mənin qılma nasehdən qəbul,
Əql tədbiridir ol, sanma ki, bir bünyadı var.

***

Pənbeyi-daği-cünun içrə nihandır bədənim,
Diri olduqca libasım budur, ölsəm, kəfənim.

Canı canan diləmiş, verməmək olmaz, ey dil!
Nə niza eyləyəlim, ol nə sənindir, nə mənim.

Daş dələr ahim oxu, şəhdi-ləbin şövqindən,
Nola zənbur evinə bənzəsə beytülhəzənim.

Tövqi-zənciri-cünun daireyi-dövlətdir,
Nə rəva kim, məni ondan çıxara zəfi-tənim.

Eşq sərgəştəsiyəm, seyli-sirişk içrə yerim,
Bir hübabəm ki, həvadən doludur pirəhənim.

Bülbüli-qəmzədəyəm, bağü baharım sənsən,
Dəhənü qəddü rüxün, qönçəvü sərvü səmənim.

Edəmən tərk Füzuli, səri-kuyin yarın,
Vətənimdir, vətənimdir, vətənimdir, vətənim!

***

Tutuşdu qəm oduna şad gördüyün könlüm,
Müqəyyəd oldu ol azad gördüyün könlüm.

Diyari-hicrdə seyli-sitəmdən oldu xərab,
Fəzayi-eşqdə abad gördüyün könlüm.

Nə gördü badədə bilmən ki, oldu badəpərəst,
Müridi məşrəbü zöhhad gördüyün könlüm.

Fəraqın odunu gördükcə mum tək əridi,
Səbatü səbrdə fulad gördüyün könlüm.

Gətirdi əcz, görüb eşq müşkül olduğunu,
Qamu hünərlərə ustad gördüyün könlüm.

Deyildi böylə mükəddər, bir əhli-işrət idi,
Bu qanlar içməyə mötad gördüyün könlüm.

Füzuli eylədi ahəngi-eyşxaneyi-Rum
Əsiri-möhnəti - Bağdad gördüyün könlüm.

***

Yar hali-dilimi zar bilibdir, bilirəm,
Dili-zarımda nə kim var, bilibdir, bilirəm.

Yari əğyar bilibdir ki, mənə yar olmaz,
Mən dəxi onu ki, əğyar bilibdir, bilirəm.

Zülfünü əhli-vəfa seydinə dam eyləyəli,
Məni ol damə giriftar bilibdir, bilirəm.

Mən nə hacət ki, qılam şərh ona dərdi-dilimi,
Qamu dərdi-dilimi yar bilibdir, bilirəm.

Yar həmsöhbətim olmazsa, Füzuli, nə əcəb,
Özünə söhbətimi ar bilibdir, bilirəm.

***

Hasilim yox səri-kuyində bəladən ğeyri,
Ğərəzim yox rəhi-eşqində fənadən ğeyri.

Neyi-bəzmi-ğəməm, ey ah, nə bulsan yelə ver,
Oda yanmış quru cismimdə həvadən ğeyri.

Pərdə çək çöhrəmə hicran günü, ey qanlı sirişk!
Ki, gözüm görməyə ol mahliqadan ğeyri.

Yetdi bikəsliyim ol ğayətə kim, çevrəmdə
Kimsə yox cizginə, girdabi-bəladən ğeyri.

Nə yanar kimsə mənə atəşi-dildən özgə,
Nə açar kimsə qapım badi-səbadan ğeyri.

Pozma ey movc gözüm yaşı hübabın ki, bu seyl
Qoymadı hiç imarət bu binadən ğeyri.

Bəzmi-eşq içrə, Füzuli, necə ah eyləməyim,
Nə təməttö bulunur neydə sədadən ğeyri?

***

Mənim tək hiç kim zarü pərişan olmasın, yarəb!
Əsiri-dərdi-eşqü daği-hicran olmasın, yarəb!

Dəmadəm cövrlərdir çəkdiyim birəhm bütlərdən,
Bu kafərlər əsiri bir müsəlman olmasın, yarəb!

Görüb əndişeyn-qətlimdə ol mahi, budur virdim
Ki, bu əndişədən ol məh peşiman olmasın, yarəb!

Çıxarmaq etsələr təndən çəkib peykanın ol sərvin
Çıxan olsun dili-məcruh, peykan olmasın, yarəb!

Cəfavü cövr ilə mötadəm, onlarsız nolur halım,
Cəfasinə hədü cövrinə payan olmasın, yarəb!

Demən kim ədli yox, ya zülmü çox hər hal ilə olsa,
Könül təxtinə ondan ğeyri sultan olmasın, yarəb!

Füzuli buldu gənci-afiyət meyxanə küncündə,
Mübarək mülkdür, ol mülk viran olmasın, yarəb!

***

Ey xoş ol məst ki, bilməz ğəmi-aləm nə imiş,
Nə çəkər aləm üçün ğəm, nə bilir ğəm nə imiş.

Bir pəri silsileyi-eşqinə düşdüm nagah,
Şimdi bildim səbəbi-xilqəti Adəm nə imiş.

Vaiz ovsafi-cəhənnəm deyər, ey əhli-vərə,
Var onun məclisinə, bil ki, cəhənnəm nə imiş.

Oxu köksümdən ötüb, qalmış imiş peykanı,
Ah, bildim səbəbi-ahi-dəmadəm nə imiş.

Ey Füzuli, məzeyi-saqiyü səhba bildin,
Tövbə qıl, ta biləsən zərqü riya həm nə imiş.

***

Könüldə min ğəmim vardır ki, pünhan eyləmək olmaz,
Bu həm bir ğəm ki, el tənindən əfğan eyləmək olmaz.

Nə müşkül dərd olursa, bulunur aləmdə dərmanı,
Nə müşkül dərd imiş eşqin ki, dərman eyləmək olmaz.

Fəna mülkünə çox əzm etmə, ey dil, çəkmə zəhmət kim,
Bu tədbir ilə dəfi – dərdi-hicran eyləmək olmaz.
Saqın könlüm yıxarsan, pənddən dəm vurma, ey naseh.
Həvayi-nəfs ilə bir mülki viran eyləmək olmaz!

Dəhanın üzrə ləlin istəmiş dil, dəfi müşküldür,
Görünməz hiç cürmü, yox yerə qan eyləmək olmaz.

Dualar eylərəm, məndən yana bir dəm güzar etməz,
Nə çarə, sehrilə sərvi xuraman eyləmək olmaz.

Füzuli, aləmi-qeyd içrəsən, dəm vurma eşqindən,
Kəmali-cəhl ilə dəvayi-irfan eyləmək olmaz.

***

Xəlqə ağzın sirrini hərdəm qılır izhar söz.
Bu nə sirdir kim, olur hər ləhzə yoxdan var söz?

Artıran söz qədrini sidqilə qədrin artırır,
Kim nə miqdar olsa, əhlin eylər ol miqdar söz.

Ver sözə ehya ki, tutduqda səni xabi-əcəl,
Edə hər saət səni ol uyqudan bidar söz.

Bir nigari-ənbərinxətdir könüllər almağa,
Göstərir hərdəm niqabi-ğeybdən rüxsar söz.

Xazini-gəncineyi-əsrardır hərdəm çəkər
Rişteyi-izharə min-min gövhəri-əsrar söz.

Olmayan ğəvvasi-bəhri-mərifət arif degil
Kim, sədəf tərkibi-təndir, ləlöi-şəhvar-söz.

Gər çox istərsən, Füzuli, izzətin, az et sözü
Kim, çox olmaqdan qılıbdır çox əzizi xar söz.

## MÜRƏBBE

Pərişan halin oldum, sormadın hali-pərişanım,
Qəmindən dərdə düşdüm, qılmadın tədbiri-dərmanım.
Nə dersən, ruzigarım böyləmi keçsin, gözəl xanım!
Gözüm, canım, əfəndim, sevdiyim, dövlətli sultanım!

Əsiri-dami-eşqin olalı, səndən vəfa görmən,
Səni hər qanda görsəm, əhli-dərdə aşina görmən,
Vəfavü aşinalıq tərkini səndən rəva görmən,
Gözüm, canım, əfəndim, sevdiyim, dövlətli sultanım.

Dəyər, hərdəm vəfasız çərx yayından mənə bir ox,
Kimə şərh eyləyim kim, möhnətü ənduhü dərdim çox,
Sənə qaldı mürüvvət, səndən özgə hiç kimsəm yox,
Gözüm, canım, əfəndim, sevdiyim, dövlətli sultanım!

Gözümdən dəmbədəm bağrım əzib yaşım kimi getmə!
Səni tərk etməzəm çün mən, məni sən dəxi tərk etmə!
İkən həm zalım, mən kimi məzlumu incitmə!
Gözüm, canım, əfəndim, sevdiyim, dövlətli sultanım!

Qatı könlün nədən bu zülm ilə bidadə rağibdir,
Gözəllər nisbəti olmaz cəfa, səndən nə vacibdir.
Sənin tək nazəninə, nazənin işlər münasibdir,
Gözüm, canım, əfəndim, sevdiyim, dövlətli sultanım!

Nəzər qılmazsan əhli-dərd gözdən axıdan seylə,
Yamanlıqdır işin üşşaq ilə, yaxşımıdır böylə?

Gəl, allahı sevirsən aşiqə cövr etmə, lütf eylə,
Gözüm, canım, əfəndim, sevdiyim, dövlətli sultanım!

Füzuli şiveyi-ehsanın istər, bir gədayindir,
Dirildikcə sənin kuyin yolunda xaki-payindir,
Gərək öldür, gərək qoy, hökm-hökmün, rəy-rəyindir,
Gözüm, canım, əfəndim, sevdiyim, dövlətli sultanım!

## "LEYLİ VƏ MƏCNUN" POEMASINDAN ŞERLƏR

### QƏZƏLİ - LEYLİ

Fələk ayırdı məni cövr ilə cananımdan,
Həzər etməzmi əcəb naləvü əfğanımdan?

Oda yandırmasa gər şölə ilə nöh fələki,
Nə bitər atəşi-ahi-dili-suzanımdan?

Ğəmi-pünhan məni öldürdü, bu həm bir ğəm kim,
Gülrüxüm olmadı agah ğəmi-pünhanımdan.

Ah idi həmnəfəsim, ah ki, ol həm axır
Çıxdı ikrah qılıb külbeyi-əhzanımdan.

Mən, nə hacət ki, qılam daği-nihanım şərhin,
Aqibət zahir olur çaki-giribanımdan.

Həq bilir, yar deyil canü dilimdən ğaib,
Nola gər ğaib isə dideyi-giryanımdan.

Can əgər çıxsa tənimdən əsəri-mehri ilə,
Əsəri-mehrini sanman ki, çıxar canımdan.

Lütf edib sən məgər, ey bad, bu gündən böylə,
Verəsən bir xəbər ol sərvi-xuramanımdan.

Ey Füzuli, ğəmi-hicr ilə pərişandır hal,
Kimsə agah deyil hali-pərişanımdan.

### QƏZƏLİ-MƏCNUN

Ey, xoş ol günlər ki, mən həmraz idim canan ilə,
Neməti-vəslin görüb, nazın çəkərdim can ilə.

Görməmişdi gülşəni-eyşim xəzani-təfriqə,
Olmamışdı tirə əyyamım şəbi-hicran ilə.

Məhvəşimdən, dustlar, dövran cüda istər məni,
Düşmənimdir, hiç bilmən netmişəm dövran ilə.

Yetsə gər aşiqlərin əflakə əfğanı, nə sud,
Yetmək olmaz mahvəşlər vəslinə əfğan ilə.

Yaşarıb saxlardım əldən daği-hicranın, əgər
Etmək olsaydı müdara dideyi-giryan ilə.

Zövqdən dibaçə bağlandı kitabi-ömrümə,
Qoymadı dövran keçə övqatım ol ünvan ilə.

Ey Füzuli, əxtəri-bəxtim müsaid olmadı
Kim, olam bir dəm müqarin ol məhi-taban ilə.

### QƏZƏLİ-USTAD

Can vermə ğəmi-eşqə ki, eşq afəti-candır,
Eşq afəti-can olduğu məşhuri-cahandır!

Sud istəmə sevdayi-ğəmi-eşqdə hərgiz
Kim, hasili-sevdayi-ğəmi eşq ziyandır!

Hər əbruyi-xəm qətlinə bir xəncəri-xunriz,
Hər zülfi-siyəh qəsdinə bir əfi ilandır!

Yaxşı görünür surəti məhvəşlərin, əmma
Yaxşı nəzər etdikdə, — sərəncamı yamandır!

Eşq içrə əzab olduğun ondan bilirəm kim,
Hər kimsə ki, aşiqdir, işi ahü fəğandır!

Yad etmə qara gözlülərin mərdümi-çeşmin,
Mərdüm deyib aldanma kim, içdikləri qandır!

Gər dersə Füzuli ki, "gözəllərdə vəfa var",
Aldanma ki, şair sözü, əlbəttə, yalandır.

### QƏZƏL MƏCNUN DİLPƏZİRİNDİR

Ya rəb, bəlayi-eşq ilə qıl aşina məni!
Bir dəm bəlayi-eşqdən etmə cüda məni!

Az eyləmə inayətini əhli-dərddən,
Yəni ki, çox bəlalərə qıl mübtəla məni!

Olduqca mən götürmə bəladan iradətim,
Mən istərəm bəlanı, çü istər bəla məni!

Təmkinimi bəlayi-məhəbbətdə qılma süst,
Ta dust tən edib deməyə bivəfa məni!

Getdikcə hüsnün eylə ziyadə nigarımın,
Gəldikcə dərdinə betər et mübtəla məni!

Mən qandanü mülaziməti-etibarü cah,
Qıl qabili-səadəti-fəqrü-fəna məni!

Öylə zəif qıl tənimi firqətində kim,
Vəslinə mümkün ola yetirmək səba məni!

Nəxvət qılıb nəsib Füzuli kimi mənə,
Ya rəb, müqəyyəd eyləmə mütləq mana məni!

## BU QƏZƏL LEYLİYİ-DİLPƏZİRİNDİR

Eşq daminə giriftar olalı zar olubam,
Nə bəladır ki, ona böylə giriftar olubam?

Dil deməkdən kəsilib, tən hərəkətdən, vəh kim,
Künci-ğəmxanəyə bir surəti-divar olubam.

Qüdrətim yox ki, qılam kimsəyə şərhi-ğəmi-dil,
Öylə kim, arizeyi-hicr ilə bimar olubam.

Həzərim tənədən ol ğayətə etmişdir kim,
Yarə əğyar olub, əğyarım ilə yar olubam.

Deməzəm dəxi: "Sənə aşiqəm", ey gül! Zira
Sənə aşiqliyim izhar edəli xar olubam.

Əqlü səbrü dilü din getdi bihəmdillah kim,
Səfəri-sahili-dəryayə səbükbar olubam.

Yox, Füzuli, xəbərim mütləq özümdən, bəs kim,
Valehi-nəqşi-xəyali-rüxi-dildar olubam.

## BU QƏZƏL MƏCNUNİ-ZARİNDİR

Vəfa hər kimsədən kim, istədim, ondan cəfa gördüm,
Kimi kim, bivəfa dünyada gördüm, bivəfa gördüm.

Kimə kim, dərdimi izhar qıldım isteyib dərman,
Özümdən həm bətər bir dərdə onu mübtəla gördüm.

Mükəddər xatirimdən qılmadı bir kimsə ğəm dəfin,
Səfadən dəm uran həmdəmləri əhli-riya gördüm.

Əgər su damənin tutdum, rəvan döndərdi üz məndən
Və gər güzgudən umdum sidq, əksi-müddəa gördüm.

Ayaq basdım dəri-ümmidə, sərgardanlıq əl verdi,
Hünər səriştəsin tutdum, əlimdə əjdaha gördüm.

Mənə göstərdi gərdun, tirə bəxtim kövbəkin yüz gəz,
Məni-bədbəxt ona hərgah kim, baxdım, qara gördüm.

Füzuli, eyb qılma üz çevirsəm əhli-aləmdən,
Nədən kim, hər kimə üz tutdum, ondan yüz bəla gördüm.

## BU QƏZƏL LEYLİ DİLİNDƏNDİR

Yar rəhm etdi məgər naləvü əfğanimizə
Ki, qədəm basdı bu gün külbeyi-əhzanimizə?

Əşk baranı məgər qıldı əsər kim, nagah
Bitdi bir şaxi-küli-tazə gülüstanimizə?

Bizə ah atəşinin yandığı ondan bilinir
Ki, çirağ eylədi rövşən şəbi-hicranimizə.

Bu vüsalə yuxu əhvali deməк mümkün idi,
Əgər olsaydı yuxu dideyi-giryanimizə.

Bir xəyal ola məgər gördüyümüz, yoxsa nigar,
Mütləqa xatirə gəlməz ki, gələ yanimizə.

Yar mehmanımız oldu, gəlin, ey canü könül,
Qılalım sərf nəmiz var isə mehmanimizə!

Dilbərin canə imiş qəsdi, Füzuli, gəl kim,
Can verib dilbərə, minnət qoyalım canimizə.

## BU QƏZƏL MƏCNUN DİLİNDƏNDİR

Küfri-zülfün salalı rəxnələr imanimizə,
Kafər ağlar bizim əhvali-pərişanimizə.

Səni görmək mütəəzzir görünür böylə ki, əşk
Sənə baxdıqda dolar dideyi-giryanimizə.

Cövrü çox eyləmə kim, olmaya nagəh tükənə,
Az edib cövrü cəfalar qılıban canimizə.

Əskik olmaz ğəmimiz bunca ki, bizdən ğəm alıb,
Hər gələn ğəmli gedər, şad gəlib yanimizə.

Var hər həlqeyi-zəncirimizin bir ağzı,
Müttəsil verməyə ifşa ğəmi-pünhanimizə.

Ğəmi-əyyam, Füzuli, bizə bidad etdi,
Gəlmişiz əcz ilə dad etməyə sultanimizə.

## MÜRƏBBE

Ğeyr ilə hər dəm nədir seyri-gülüstan etdiyin?
Bəzm edib, xəlvət qılıb, yüz lütfü ehsan etdiyin?
Əhd bünyadın mürüvvətdirmi viran etdiyin?!
Qanı, ey zalım, bizimlə əhdü peyman etdiyin?!

Ləhzə-ləhzə müddəilər pəndini guş eylədin,
Qanə-qanə ğeyr cami-şövqünü nuş eylədin,
Varə-varə əhdü peymani fəramuş eylədin,
Qanı, ey zalım, bizimlə əhdü peyman etdiyin?!

Ğeyrə salıb mehrini bizdən sovutdun aqibət,
Tərki-mehr etdin, təriqi-zülm tutdun aqibət,
Əhdlər, peymanlar etmişdik, unutdun aqibət,
Qanı, ey zalım, bizimlə əhdü peyman etdiyin?!

Cürmümüz noldu ki, bizdən eylədin bizarlıq?
Biz qəmin çəkdik, sən etdin özgəyə ğəmxarlıq.
Sizdə adət bumudur? Böylə olurmu yarlıq?
Qanı, ey zalım, bizimlə əhdü peyman etdiyin?!

Çərx tək bədmehrlik rəsmini bünyad eylədin,
Yaxşı adın var ikən, döndün yaman ad eylədin,
Dönə-dönə bizi ğəmnak, özgəni şad eylədin,
Qanı, ey zalım, bizimlə əhdü peyman etdiyin?!

Könlümüz minbəd zülfünçün pərişan olmasın,
Bağrımız ləlin həvasilə dəxi qan olmasın,
Bivəfasən! Çeşmimiz yadinlə giryan olmasın,
Qanı, ey zalım, bizimlə əhdü peyman etdiyin?!

Vədeyi-vəsl ilə aldın səbrimiz, aramımız,
Olmadı bir gün vüsalından müyəssər kamımız.
Keçdi hicr ilə, Füzulidən betər əyyamımız,
Qanı, ey zalım, bizimlə əhdü peyman etdiyin?!

## BU MÜRƏBBE LEYLİ DİLİNDƏNDİR

Giriban oldu rüsvalıq əlilə çak damən həm,
Mənə rüsvalığımda dustlar tən etdi, düşmən həm.
Rəhi-eşq içrə can qıldım giriftari-bəla, tən həm,
Bu yetməzmi ki, bir dərd artırırsan dərdimə sən həm?

Əgər tutsam ğəmim eldən nihan, səbrü qərarim yox,
Və gər şərhi-ğəmi-pünhanım etsəm, ğəmküsarim yox,
Əsiri-bəndi-zindanəm, əlimdə ixtiyarim yox,
Bu yetməzmi ki, bir dərd artırırsan dərdimə sən həm?

Olubdur əşki-xunab ilə gülgun-çöhreyi-zərdim,
Yanıbdır atəşi-hicranə cani-dərdpərvərdim,
Cəfayi-çərxi-kəcrəftar əlindən var min dərdim,
Bu yetməzmi ki, bir dərd artırırsan dərdimə sən həm?

Gəhi şövqi-visalü gəh bəlayi-hicr ilə zarəm,
Özüm həm bilməzəm dərdim nədir, mən necə bimarəm,
Ğəmi-eşq içrə bir dərmani yox dərdə giriftarəm,
Bu yetməzmi ki, bir dərd artırırsan dərdimə sən həm?

Cüda səndən bəlavü dərdi-hicran ilə tutdum xu,
Qılır hər dəm mənə bidad dərd ayru, bəla ayru,
Bəlavü dərdə düşdüm ruziganm böylə, halım bu,
Bu yetməzmi ki, bir dərd artırırsan dərdimə sən həm?

Təbibi-eşqə çün izhar qıldım dərdi-pünhani,
Məni – bimarə mütləq olmadı bir səhhət imkani,
Əzəldən var min dərdim ki, yoxdur hiç dərmani,
Bu yetməzmi ki, bir dərd artırırsan dərdimə sən həm?

Füzuli, hər zaman bir tən ilə bağrım qılırsan qan!
Əcəb bilməzmisən kim, eşqdən keçmək deyil asan?
Bilirsən düşmüşəm bir dərdə kim, yoxdur ona dərman,
Bu yetməzmi ki, bir dərd artırırsan dərdimə sən həm?

## QƏZƏL

Aşiq oldur kim, qılır canın fəda cananına,
Meyli-canan etməsin hər kim ki, qıymaz canına,

Canını canana verməkdir kəmali aşiqin,
Verməyən can etiraf etmək gərək nöqsanına.

Vəsl əyyamı verib canana can rahət bulan,
Yeydir ondan kim, salır canın ğəmi-hicranına.

Eşq rəsmin aşiq öyrənmək gərək pərvanədən
Kim, yanar gördükdə şəmin atəşi-suzanına.

Qanı ol eşq içrə kim, bənzər fənasi aşiqin
Feyzi-cavid ilə Xizrin çeşmeyi-heyvanına?

Eşq dərdinin dəvasi qabili-dərman deyil,
Tərki-can derlər bu dərdin mötəbər dərmanına.

Hiç kim canan üçün can verməyə laf etməsin
Kim, gəlibdir bu sifət ancaq Füzuli şanına.

## BU QƏZƏL MƏCNUN DİLİNDƏNDİR

Öylə sərməstəm ki, idrak etməzəm dünya nədir,
Mən kiməm, saqi olan kimdir, meyü səhba nədir.

Kərçi canandan dili-şeydam üçün kam istərəm,
Sorsa canan bilməzəm kami-dili-şeyda nədir.

Vəsldən çün aşiqi müstəğni eylər bir vüsal,
Aşiqə məşuqdən hərdəm bu istiğna nədir?

Hikməti-dünyavü mafihə bilən arif deyil,
Arif oldur bilməyə dünyavü mafihə nədir.

Ahü fəryadın, Füzuli, incidibdir aləmi,
Gər bəlayi-eşq ilə xoşnud isən, qovğa nədir?

## BU QƏZƏL LEYLİ DİLİNDƏNDİR

Ey qılan şeyda məni, məndən bu istiğna nədir?
Nişə sormazsan ki, əhvali-dili-şeyda nədir?

Gər mənə xəlq içrə pərva qılmadın, məzursan,
Böylə tənhalıqda qılmazsan mənə pərva, nədir?

Səhldir gər bilməyib halım, tərəhhüm qılmamaq,
Halımı bilmək, tərəhhüm qılmamaq əmma nədir?

Gül təmannasında derlər bülbülün qovğaların,
Çün gülü gördükdə qılmaz meyl, bu qovğa nədir?

Ol pəri mütləq məni-rüsvaya qılmaz iltifat,
Ey Füzuli, bilməzəm cürmi-məni-rüsva nədir?

## BU QƏZƏL MƏCNUN DİLİNDƏNDİR

Biz cahan məmurəsin mənidə viran bilmişiz,
Afiyət gəncin bu viran içrə pünhan bilmişiz.

Gər özün dana bilir təqlid ilə surətpərəst,
Aləmi-təhqiqdə biz onu nadan bilmişiz.

Bixəbərlər şərbəti-rahət bilirlər badəyi,
Biz həkimi-vəqtiz, onu tökmüşüz, qan bilmişiz.

Bilmişiz kim, mülki-aləm kimsəyə qılmaz vəfa,
Ol zamandan kim, onu mülki-Süleyman bilmişiz.

Ayrı bilmişsən, Füzuli, məscidi meyxanədən,
Səhv imiş ol kim, səni biz əhli-irfan bilmişiz.

## QƏZƏL

Yandı canım hicr ilə, vəsli-rüxi-yar istərəm,
Dərdməndi-firqətəm, dərmani-didar istərəm.

Bülbüli-zarəm, deyil bihudə əfğan etdiyim,
Qalmışam nalan qəfəs qeydində, gülzar istərəm.

Dəhr bazarında kasiddir mətai-himmətim,
Bu mətai satmağa bir özgə bazar istərəm.

Fani olmaq istərəm, yəni bəlayi-dəhrdən
Rahəti-cismi-zəifü cani-əfkar istərəm.

Nola gər qılsam şəbi-hicran təmənnayi-əcəl,
Neyləyim, çoxdur qəmim, dəfinə ğəmxar istərəm.

Çün bəqa bəzmindədir dildar, mən həm durmazam,
Bu fəna deyrində bəzmi-vəsli-dildar istərəm.

Ey Füzuli, istəməz kimsə rizasilə fəna,
Mən ki, bundan özgə bilmən çarə, naçar istərəm.

# FƏZLİ

(XVI əsr)

***M. Füzulinin oğludur.***

## QƏZƏL

Səbrim tükəndi, möhnətə qatlana bilməzəm
Su başdan aşdı, eşq oduna yanə bilməzəm.

Sən sərv boylu dilbəri tərk etməzəm əgər,
Ömrüm budağı cövr ilə utana bilməzəm.

Yarın başına ay ilə gün peykə çevrilir
Ol şəmə məndən özgə pərvanə bilməzəm.

Aləm bilir ki, şol sənəmi sevmişəm, rəqib,
Başım gedərsə mən bu işi danə bilməzəm.

Vergil bu Fəzli kamına, fərdayə qoymagil,
Yoxdur vəfası ömrümün, inana bilməzəm.

## MÜSTƏZAD

Ey sərvi-səhi, sən gələli seyr ilə bağə
Sər çəkmədi ər-ər,
Çox alinəsəblər özünü saldı əyağə,
Qul oldu sənubər.

Sünbül özünü zülfünə bənzətdi nigarın
Gördü ki, xətadır,
Dağlarda bitər yüzi qara, başi aşağə,
Qayqulu, mükəddər.
Şol xalın içün zülfünə çoxlar dolaşıbdır,
Ancaq məni bilmən,
Bir danə pərvanə içün gör neçə quş düşdü duzağə,
Ram oldu müsəxxər.
Ey ruzi-qiyamət gününə münkir olanlar,
Dilbər gedər oldu.
Eşitməmisən suri-rəvani çalındı qulağə,
Qopdu mənə məşhər.
Ey nuri-təcəlla günəşi pərdə yüzündən,
Bir gecə götürsən,
Pərvanə kimi özü yanə şəmü çirağə,
Göylərdəki əxtər.
Sən tək pərinin mənzili viranə gərəkdir,
Ya çeşmələr üstü.
Könlüm təki viranə, gözüm təki bulağə,
Gəl hey pəri peykər.
Bir badə şərab istədim ol safi ləbindən,
Sərxoşdumu bilmən,
Çeşmin məni öldürməyə yapışdı biçağə,
Çəkdi mənə xəncər.
Zülfün sarıdan könlümə sevda yeli əsdi,
Reyhanmıdı bilmən,
Xansı çiçəyin qoxusudur doldu dimağə,
Can oldu müəttər.
Dünyadan əgər Fəzli gözü sayğulu getsə,
Yüzin həvəsindən,
Rəhmət yağışı torpağının üstünə yağə,
Qəbri ola ənvər.

## QOŞMA

Dünyadə gözəllər dəvasın qılan
Degil, ona necə yar olmaq gərək?
Xülqi-xoyi mələk, surəti insan
Şəkər sözlü, şirinkar olmaq gərək.

Sürahi gərdənli, ləbləri qönçə,
Sədr vaseh ola, ol beli incə.

Miyanə boy ola, dalsı kənəkcə
Ol püstə dəhanı dar olmaq gərək.

Qırmızısı qırmızı, ağa tay ola,
Ol qarası qara, qaşı yay ola,
Gül yanağı bədirlənmiş ay ola,
Sinəsində qoşa nar olmaq gərək.

Gözləri nərgis tək şöləvar ola,
Müjkanları çöhrəsində xar ola,
Alıcı tərlantək səbükbar ola,
Mərifətdən xəbərdar olmaq gərək.

On beş yaşlı ola, miyanə boylu,
Çox lağər olmaya, qucağa dolu,
Qolu uzun, ağ əlləri hənalı
Sinəsi həm tazə qar olmaq gərək.

Xoş ona kim, ola bir belə yarı,
Heç kimin yox, mən tək olubdur zarı.
Fəzliya, sən çağır ulu cabbarı,
Sənə məhşər günü yar olmaq gərək.

## RUHİ BAĞDADİ

(?—1605)

Sanman bizi kim şireyi ənqur ilə məstiz
Biz əhli xərabatdanız, məsti ələstiz.

Tər damən olanlar bizi aludə sanır, leyk
Biz maili busə ləbi cami kefi dəstiz.

Sədrin gözədib neyləyəlim bəzmi cahanın,
Payi-humi-meydir yerimiz, badə pərəstiz.

Mail deyilik kimsənin azarına amma,
Xatir-şikəni zahidi peymanə şikəstiz.

Ərbabi qərəz bizdən iraq olduğu yeydir,
Düşməz yerə zira oxumuz, sahibi şəstiz.

Bu aləmi fanidə nə muri nə gədayiz
Alalara alalanuruz, pəst ilə pəstiz.

Həmkaseyi ərbabi diliz, ərbədəmiz yox
Meyxanədəyiz, gərçi vəli eşq ilə məstiz.

Biz məsti-meyi-meykədeyi aləmi-canız
Sərxalqayi cəmiyyəti peymanə kəşanız.

* * *

Biəməl elmlə ancaq keçinən cahildir,
Kim ki, xətti rüxi-cananı oxur kamildir.

Oxumaqla kişi kamilmi olur? La vallah!
"Mən ərəf" sirrinə hər kimi ki irür-kamildir.

Kimi batində edər seyr, kimi zahirdə,
Kiminin mənzili dərya, kiminin sahildir.

Mərifət ola gərəkdir kişidə, ey Ruhi,
Cahilin başı göyə irsə, yenə cahildir.

## MƏHƏMMƏD ƏMANİ
(1536—1610)

### BAYATILAR

Bağça barın arzular,
Aşiq yarın arzular,
Hər nə kim dünyada var
Öz miqdarın arzular.
Məhəbbət meydanidə
Mənsur darın arzular.

Cananım tək can az var,
Aramızda min raz var,
Onda ərkü-naz varsa,
Məndə əczü niyaz var.
Həzrət et, könül quşu,
Kəmində şahbaz var.

Yüzün göz rövşənidir,
Zülfün can cövşənidir.
Xəyalın ilən könlüm
Məhəbbət kövşənidir.

### GƏRAYLILAR

Fələk rəğminə bir nəzər
Görsəm üzün cananımın,
Qalmaz dərdü ğəmdən əsər,
Görsəm üzün cananımın.

Həddin ötdü intizarı,
Qalmadı könlüm qərarı,
Canü dil olsun nisarı,
Görsəm üzün cananımın.

Edibdir ənduhi-hicran —
Gərçi könlümü pərişan,
Hər müşkülüm olur asan,
Görsəm üzün cananımın.

Topu meydandan qopardım,
Yıxılanımı yapardım,
Könül istəyi tapardım,
Görsəm üzün cananımın.

Dəvasız dərdin dəvasın,
Binəva könlüm nəvasın,
Tapam canım müddəasın,
Görsəm üzün cananımın.

Dövləti-vəslinə fürsət —
Tapıban məhv olsa firqət,
Əmani, çəkməzdim həsrət,
Görsəm üzün cananımın.

***

Fürsət olacaq hər dəmdə
Qənimətdir səfa sürmək.
Könül əylənməsə qəmdə,
Qənimətdir səfa sürmək.

Suri-yarı həmraz edib,
Müğənnilər dəmsaz edib.
Mütrüblər həmavaz edib,
Qənimətdir səfa sürmək.

Söhbət olcaq əzmi-cəzmə,
Əcnəbini qoyma bəzmə.
Keyfiyyətsiz bir dəm gəzmə,
Qənimətdir səfa sürmək.

Yenə gəldi bahar fəsli,
Eyş etməkdir onun əsli.
Müyəssərin olsa vəsli,
Qənimətdir səfa sürmək.

Dürüst olicağiz yəqin,
Taparsan könül istəyin.
Seyr eylə məhəbbət bağin,
Qənimətdir səfa sürmək.

Eşq bimarının timarı
Kam ilə görməkdir yarı.
Asan edər hər düşvarı,
Qənimətdir səfa sürmək.

Eşq oduna yanan sönməz,
Gedən günlər geri dönməz.

Ömrün quşu uşdu qonmaz,
Qənimətdir səfa sürmək.

Dünyanın yoxdu vəfası,
Zahir deyil müddəası.
Hər bəqanın var fənası,
Qənimətdir səfa sürmək.

Varlığını saygil fani,
Məhəbbət məqamın tani.
Əhli-hal ilə, Əmani,
Qənimətdir səfa sürmək.

## RÜBAİLƏR

Sənsiz nəfəsi səbrü qərarım yoxdur,
Nəzzarədən özgə intizarım yoxdur.
Bitablıqımda ixtiyarım yoxdur,
Təşrif gətir ki, qəmküsarım yoxdur.

Nə lütf idi nagəhan ki, bünyad etdin,
Bir namə bilə Əmanidən yad etdin.
Hicr içrə pozuq könlünü abad etdin,
Əlqissə ki, qəmdən onu azad etdin.

Dövran məni etgüncə cüda canandan,
Ey kaş, iraq salaydı cismim candan.
Görkən sitəmi dəli könül hicrandan,
Nə şərh edim, ötübdürür imkandan.

Yüz şükr ki, gəldik, yenə kaşənimizə,
Yetdik şərəfi-vüsali-cananəmizə.
Hərçənd qılırsa naz ol fərzanə,
Minnətlər irir bu dili-divanəmizə.

# XV – XVI ƏSRLƏR TÜRKİYƏ ŞAİRLƏRİ

## MEHRİ XATUN
(1460—1506)

### QƏZƏLLƏR

Sən qılmadığın dərdimə dərmanı unutma
Bən həsrət ilə verdiyim ol canı unutma.

Lütfünlə imarət qılacaq müddəi könlüm
Cevrinlə yıxılmış dili viranı unutma.

Qıldıqca həmayil qolunu boynuna əğyar,
Zülfün kimi bən gönlü pərişanı unutma.

Bir kərrə qədəm basmağa cana, yüzün üzrə,
Əhd etmiş idin, gəl bəri, peymanı unutma.

Min il ki, fələk cevr edə aşiq, sana, cana,
Gətirməyə bir Mehri kimi anı unutma.

* * *

Neyləyim biçarə könlüm bir dəm olmaz yarsız
Əpsəm olmam nitəkim cəhd eylərəm bu arsız.

Bən dilimdə namını vird etdim, amma dilbərim,
Bir dəm anmaz adım, olmaz bir nəfəs əğyarsız.

Vəslini iqrar edib saldı bəni sevdalara
Döndü inkar eylədi bu dini yox iqrarsız.

Ey təbibi-can, mədət, bimarınam, öldüm, mədət
Dedi xoşdur aşiq öldürmək bana timarsız.

Görmədim bir xub kim, yanında olmaya rəqib,
Bu cahan bağında hiç gül olmaz imiş xarsız.

Xubların mehrini Mehri ölürüz tərk etməriz
Kim nə der isə desin biz olamazız yarsız.

## QAYĞISIZ ABDAL
(XV əsr)

### TƏKƏRLƏMƏ

Cümlə qablun bağalar
Qanatlanmış uçmağa.
Kərtənkələ dərilmiş
Kirim suyun keçməyə.

Bir birə bir put duzu
Yüklənib gedər yola.
Gah at olur yorğalar
Gah quş olur uçmağa.

Bir qarınca dəvənin
Təpmiş, oyluğun əzmiş.
Bir budunu götürmüş
Büryan edib yeməyə.

Kələbək ox yay almış,
Şikara çıxmış dağa.
Keyikləri ürkütmüş
Dönüb istər qaçmağa.

İbicik buğday əkmiş
Manizanın çayına.
Sivri sinək dərilmiş
İrqat olub biçməyə.

Ərgəninin köprüsü
Qurumuş susuzluqdan.
Ədirnə minarəsi
Əyilmiş su içməyə.

Balıqçı köprü yapmış
İstiranca suyuna.
Yuxlu-yuxlu ördəklər
Gəlmiş ondan keçməyə.

Donuz düyün eyləmiş
Qızcığazın evərə.

Meymun maqas gətirmiş
Xələtlərin biçməyə.

İnək hamama girmiş
Buğa dəlləklik edər.
Su sığırı soyunmuş
Nöbət bəklər yunmağa.

Leylək qoduk doğurmuş
Zurna çalar ovada.
Balıq qavağa çıxmış
Zift turşusun qurmağa.

Ey bu Qayğısız Abdal
Bunca yalan söylədin,
Ya bunca yalan ilə,
Girərmisən uçmağa?

## DİLƏK

Mevlam! Budur diləyim səndən yalvarmaq ilə,
Canü könüldəndürür, laf degildir lağ ilə.

Əvvəla yüz min somun, həm yüz əlli min pidə,
Həm yüz altmış min çörək bunca qətmər yağ ilə.

Ancaq yetər min donuz, min də əniyi ola,
Əlli min su sığırı altmış min malağ ilə.

Min öküz, on min inək, xərdəlli yəxni ola,
Paçasını edələr sirkə sarımsağ ilə.

Min qoyunun yəxnisi, min dəxi çəpiş keçi,
Əlli min büryan quzu, altmış min oğlağ ilə.

Tavuq, ördək bihesab, ənciləyin qaz dəxi,
Kimisi bütün kabab, kim qovrulmuş yağ ilə.

Bildirçinlə göyərçin tabağ-tabağ yürüsün,
Turac ilə kəkliyi daşıyalar ağ ilə.

Əlli min qazan pilov, ol qədər də zərdələr,
Yağlı keşkək min qazan çevrilmiş çomağ ilə.

Nazik-nazik şorbalar, nazik kiftə qıymalar
Qırx min qazan paluzə min şahi yamağ ilə.

Əlli min sini böyrək, ol qədər də paxlava
Bəmya, zülbə bihesab, yürüyə tabağ ilə.

Qazilər halvasını gətirələr min sini,
Min bunca halva çini, yeyəlim barmağ ilə.

Əlli min batman kiraz,qırx min batman zərdəli,
Min bunca alma, armud, illa üzüm bağ ilə.

## QAZ

Bir qaz aldım mən qarıdan,
Boynu da uzun borudan,
Qırx abdal qanın qurudan,
Qırx gün oldu qaynadıram qaynamaz.

Səkkizimiz odun çəkər,
Doqquzumuz atəş yaxar,
Qaz qaldırmış başın baxar,
Qırx gün oldu qaynadıram qaynamaz.

Qaza verdik bir çox axça
Əti kəmigindən pəkcə,
Nə qazan qaldı nə kəpcə,
Qırx gün oldu qaynadıram qaynamaz.

Qaz deyilmiş bə bu azmış,
Qırx il Qaf dağını gəzmiş.
Qanadın quyruğun düzmüş,
Qırx gün oldu qaynadıram qaynamaz.

Qazı qoyduq biz ocağa,
Uçdu getdi bir bucağa,
— Bu nə haldır, hacı ağa?
Qırx gün oldu qaynadıram qaynamaz.

Qazımın qanadı səlki,
Dişi qoyun əmmiş tülki,
Nuh Nəbidən qalmış bəlki,
Qırx gün oldu qaynadıram qaynamaz.

Qazımın qanadı sarı,
Gəmiyi ətindən arı
Sağlıq ilə satma, qarı
Qırx gün oldu qaynadıram qaynamaz.

Qazımın qanadı ala,
Var, yürü, get gülə-gülə,
Başımıza qatma bəla,
Qırx gün oldu qaynadıram qaynamaz.

Suyuna biz saldıq bulqur,
Bulqur Allah deyə qalxır,
Bə yaranlar bu nə haldır:
Qırx gün oldu qaynadıram qaynamaz.

Qayğısız Abdal! Nedəlim,
Əhd ilə vəfa güdəlim,
Qaldır postu biz gedəlim
Qırx gün oldu qaynadıram qaynamaz.

## ƏŞRƏFOĞLU
(XV əsr)

### İLAHİ

Eşqin odu ciyərimi,
Yaxa gəldi, yaxa gedər.
Qərib başım bu sevdayi
Çəkə gəldi, çəkə gedər.

Firqət kar etdi canıma,
Gəlsin aşiqlər yanıma.
Eşq zəncirin dost boynuma
Taxa gəldi, taxa gedər.

Bülbül edər zarü əfqan,
Eşq oduna yandı bu can.
Mənim könülcüyüm haman
Haqdan gəldi haqqa gedər.

Ariflər durur sözünə,
Qeyri görünməz gözünə.
Əşrəfoğlu yar üzünə
Baxa gəldi, baxa gedər.

## DƏDƏ ÖMƏR RÖVŞƏNİ
(XV əsr)

Hər nə kim almaq dilərsən, al ilə gəl məndən al,
Aldanıram mən sənə, sən hər necə edərsən al.

İstəsən qoynuma girmək, gəl soyun qoynuma gir,
Boynuma sarılmaq istərsən, qolun boynuma sal.

Ləblərindən sən mənə bir busə etmişdin əta,
Gər pərişan oldun isə verdiyin gəl yenə al.

Bir gəz öpdüm mən səni, gəl sən məni yüz min gəz öp,
Tək varıb, bizdən şikayət edib, etmə qeylü qal

Qeylü-qal əhli nə bilsin əhli-halın sözünü,
Əhli- halın bilməyə sözün gərəkdir əhli-hal.

## İBRAHİM TƏNNURİ
(XV əsr)

Cana cəfa, ya qıl vəfa,
Qəhrin də xoş, lütfün də xoş.
Ya dərd göndər, yaxud dəva,
Qəhrin də xoş, lütfün də xoş.

Xoşdur mənə səndən gələn,
Ya xələtü, yaxud kəfən.
Ya tazə gül, yaxud tikən,
Qəhrin də xoş, lütfün də xoş.

Gər bağı, gər bostan ola,
Gər bəndü, gər zindan ola,
Gər vəsli, gər hicran ola,
Qəhrin də xoş, lütfün də xoş.

Ağladırsan zarı-zarı,
Verirsən cənnəti huri.

Layiq görür isən narı,
Qəhrin də xoş, lütfün də xoş.

Gərək ağlat, gərək güldür,
Gərək dirgür, gərək öldür,
Bu Aşiq həp sənə quldur,
Qəhrin də xoş, lütfün də xoş.

## BAXŞI
(XVI əsr)

### DASTAN

Sultan Səlim culusunda
Sala! Dedi də yürüdü.
Gedəlim Misirə doğru,
Yola! Dedi də yürüdü.

Şamlı çıxıb qaçar köydən
Sofi bəri gəlməz Xoydan,
Mərd var isə iştə meydan,
Gələ! Dedi də yürüdü.

Nəsnə yox imiş ərində
Xəlifə donmuş yerində,
Narar Yusifin şəhrində
Kölə?... dedi də yürüdü.

Almaq gərək kuh Qafı
Krım varmı ola dəxi
Xorasanda isə Şahi
Bula! Dedi də yürüdü.

Baxşı aydır: Mehdi budur,
Yücəmizə ərdir, Qadir!
Qılavuzu İlyas – Xızır,
Yola! Dedi də yürüdü.

## NİZAMOĞLU SEYİD SEYFULLAH
(XVI əsr)

### İLAHİ

Mevlam, ver eşqini mənə,
Heyranın olayım sənin!
Bülbül kimi cəmalına
Nalanın olayım sənin...

Yandır məni, yandır məni!
Eşq meyinə qandır məni!
Sərxoş edib döndür məni,
Məstanən olayım sənin!

Mənsurəm eşqin darinə
Məzhar olub didarına
Şəmi cəmalın narinə
Suzanın olayım sənin.

Al, məndə mənlik qalmasın,
Kimsələr halım bilməsin,
Namü nişanım olmasın,
Pünhanın olayım sənin.

Bu can quşun sana uçur
Eşq meyindən mənə içir
Bu tacü xirqədən keçir
Üryanın olayım sənin.

Vəsl eylə yari yarinə,
Qoyma bu günü yarına.
Yax məni eşqin narinə
Büryanın olayım sənin.

Seyid Nizamoğlu xocam,
Ayırma kəndidən yücəm!
Əgər gündüz, əgər gecəm
Mehmanın olayım sənin.

## QUL NƏSİMİ
(XVI əsr)

Mən itirdim, mən araram, yar mənimdir, kimə nə?
Gah gedərəm öz bağıma, gül dərərəm, kimə nə?

Gah gedərəm mədrəsəyə, dərs oxuram haqq üçün,
Gah gedərəm meyxanəyə dəm çəkərəm, kimə nə?

Sofilər haram demişlər bu eşqin şərabını
Mən doldurar, mən içərəm, şərab mənim, kimə nə?

Mən məlamət xirqəsini kəndim geydim əynimə
Arü namus şişəsini daşa çaldım, kimə nə?

Sofilər səcdə edərlər məscidin mehrabına
Yar eşiyi səcdəgahım, üz sürərəm kimə nə?

Gah çıxaram göy üzünə, hökmdaram kaf-bə-kaf
Gah enərəm yür üzünə, yar sevərəm, kimə nə?

Dedilər ki: Ya Nəsimi, yarın ilə xoşmusan?
Xoş olayım, olmayayım, yar mənimdir, kimə nə?

## PİR SULTAN ABDAL
(XVI əsr)

*Pir Sultan Abdal Türkiyənin ən məşhur təsəvvüf şairlərindəndir. Qızılbaş və bektaşi əqidələrinə tapınan Pir Sultan Abdal aşıq şeri biçimlərində yadda qalan, gözəl şerlər yazırdı. Şerlərindən Sivasın Banas kəndində doğulduğu aydınlaşır. Pir Sultanın həyatı əfsanələrə və rəvayətlərə qida vermiş, haqqında şifahi və yazılı ədəbiyyatın bir çox maraqlı örnəkləri yaranmışdır. Araşdırıcılar Pir Sultan Abdalın Türkiyədə Qızılbaş üsyanında iştirak etdiyi üçün Xızır Paşa tərəfindən 1560-1570-ci illər arasında Sivasda asıldığını müəyyənləşdirmişlər. Qızılbaşlara, Səfəvi şahlarına rəğbəti bir çox şerlərində, o sıradan məşhur "Açılın qapılar, şaha gedəlim" şerində ifadə olunmuşdur.*

Xızır Paşa bizi bərdar etmədən
Açılın qapılar, şaha gedəlim!
Siyasət günləri gəlib yetmədən
Açılın qapılar, şaha gedəlim!

Gönül çıxmaq istər şahın köşkünə,
Can boyanmaq istər Əli mişginə,
Pirim Əli on iki imam eşqinə
Açılın qapılar, şaha gedəlim!

Hər nerəyə getsəm yolum dumandır
Bizi boylə qılan əhdü peymandır,
Zəncir boynum sıxdı, halım yamandır
Açılın qapılar, şaha gedəlim!

Yaz selləri kimi axar çağlaram,
Xəncər alıb ciyərləri dağlaram,
Qərib qaldım bu arada ağlaram
Açılın qapılar, şaha gedəlim!

Pir Sultan Abdal der: mürvətli şahim!
Yaram sızlar, baş oldu ciyərgahım.
Ərşə dirək-dirək olmuşdur ahım
Açılın qapılar, şaha gedəlim!

* * *

Bu il bu dağların qarı ərimәz
Əsər badi səba yel pozuq-pozuq.
Türkmən qalxıb yaylasına yürüməz
Yıxılmış əşirət el pozuq-pozuq.

Qızıl İrmaq kimi çağladım, axdım,
Əl vurdum sinəmin bəndini yıxdım,
Gül üzlü ceyranın bağına çıxdım,
Girdim baxçasına gül pozuq-pozuq.

Əlim tutmaz güllərini dərməyə,
Dilim tutmaz xəstə halın sormağa,
Dört cavabın mənasını verməyə,
Sazım düzən tutmaz tel pozuq-pozuq.

Pir Sultanam, yaradıldım qul deyə,
Zalım paşa əlindənmi öl deyə,
Dostum məni ismarlamış gəl deyə,
Gedəcəyəm, amma yol pozuq-pozuq.

## NƏ DERSƏN?

Bülbül olsam varsam gəlsəm,
Haqqın divanına dursam,
Mən bir yanıl alma olsam,
Dalında bitsəm nə dersən?

Sən bir yanıl alma olsan,
Dalımda bitməyə gəlsən,
Mən bir gümüş çövmən olsam,
Çəksəm endirsəm nə dersən?

Sən bir gümüş çövmən olsan,
Çəkib endirməyə gəlsən,
Mən bir ovuc darı olsam,
Yerə sarılsam nə dersən?

Sən bir ovuc darı olsan,
Yerə saçılmağa gəlsən,
Mən bir gözəl kəklik olsam,
Bir-bir toplasam nə dersən?

Sən bir gözəl kəklik olsan,
Bir-bir toplamağa gəlsən,
Mən bir yavru şahin olsam,
Qapsam qaldırsam nə dersən?

Sən bir yavru şahin olsan,
Qapıb qaldırmağa gəlsən,
Mən bir sulu səpgən olsam,
Qanadın qırsam nə dersən?

Sən bir sulu səpgən olsan,
Qanadım qırmağa gəlsən,
Mən bir dəli poyraz olsam,
Təpsəm dağıtsam nə dersən?

Sən bir dəli poyraz olsan,
Təpib dağıtmağa gəlsən,
Mən bir ulu xəstə olsam,
Yoluna yatsam nə dersən?

Sən bir ulu xəstə olsan,
Yoluma yatmağa gəlsən,
Mən bir Əzrayıl olsam,
Canını alsam nə dersən?

Sən bir Əzrayıl olsan,
Canımı almağa gəlsən,

Mən bir cənnətlik qul olsam,
Cənnətə girsəm nə dersən?

Sən bir cənnətlik qul olsan,
Cənnətə girməyə gəlsən,
Pir Sultan ustadın bilsən,
Beləcə girsək nə dersən?

* * *

Yürü belə Xızır Paşa
Sənin də çərxin qırılar.
Güvəndiyin padişahın
O da bir gün devrilər.

Nəmrud kimi Ənqa nə oldu?
Bir sinək həvalə oldu.
Davamız məşhərə qaldı
Yarın bu səndən sorular.

Şahı sevmək suçmu bana?
Kəm bildirdin məni Xana.
Can üçün yalvarmam sana
Şahinşah mənə darılar.

Hafizi Peyğəmbərəm xas,
Gəl Yezid, Hüseynimi kəs.
Mənsurəm, məni dara as
Mən ölüncə el durular.

Mən Musayam, sən Firoun,
İqrarsız şeytani-ləin.
Üçüncü ölməm bu, xain
Pir Sultan ölər dirilər.

## BİR GÜN

Gəlin yeyəlim, içəlim
Bu gözəllik keçər bir gün.
Aləm yaran-yaran olmuş
Əlim sirrin açar bir gün.

Yeyib-yedirən bir aləm
Əksik etməz Bari Xudam
Göy əkin misalı adəm
Onu əkər biçər bir gün.

Yeyib yedirməsi xoşdur
Daban qəhbə, ürək daşdır
Can dedikləri bir quşdur
Quş qəfəsdən uçar bir gün.

Ağaclarda yaşıl yarpaq
Basdığımız qara torpaq
Yer altında kəfən yırtmaq
Başımızdan keçər bir gün.

Pir Sultanam, döşümüzdə
Uzaq deyil qarşımızda
Bayquş məzar daşımızda
Dərdli-dərdli ötər bir gün.

## GƏL BƏRİ

Açıldı cənnət qapısı
Ləli gövhərdir yapısı.
Qıldan incədir körpüsü
Keçə bilirsən, gəl bəri!

Mən xocama qul olmuşam,
Ustaddan öyüt almışam,
Mən qanadım bağlamışam,
Çözə bilirsən, gəl bəri!

Pir Sultanam Heydər həmən
Dağları bürüdü duman.
İşdə İncil, işdə Quran
Seçə bilirsən, gəl bəri!

## MƏNİ

Alçaqda, yüksəkdə yatan ərənlər
Yetişin imdada, aldı dərd məni.
Başım alıb hankı yerə gedəyim
Getdiyim yerlərdə buldu dərd məni.

Oturub mənimlə ibadət qıldı,
Yalan söylədi də üzümə güldü,
Yalın qılınc olub üstümə gəldi,
Çaldı bölük-bölük, böldü dörd məni.

Üstümüzdən gələn boran qış kimi
Yavru şahin pəncəsində quş kimi

Səhərdə, sabahda gələn duş kimi
Çığırda-bağırda aldı dərd məni.

Abdal Pir Sultanam, könlüm xəstədir,
Kimsəyə deyəməm, könlüm yasdadır,
Bilməm dəli oldu, bilməm ustadır,
Böylə bir sevdaya saldı dərd məni.

## SAYDILAR BİZİ

Uyur idik uyardılar
Diriyə saydılar bizi.
Qoyun olduq səs anladıq
Sürüyə saydılar bizi.

Sürülüb qəssaba getdik,
Qənarədə məkan tutduq,
Didar dəftərinə yetdik,
Ölüyə saydılar bizi.

Halımızı hal eylədik,
Yolumuzu yol eylədik,
Hər çiçəkdən bal eylədik,
Arıya saydılar bizi.

Eşq dəftərinə yazıldıq,
Pir divanına düzüldük,
Bal olduq şərbət əzildik,
Doluya saydılar bizi.

Pir Sultanam, Heydər burda
Çox kəramət var insanda.
O cahanda, bu cahanda
Əliyə saydılar bizi.

## QUL HÜSEYN
(XVI əsr)

Ey şahin baxışlım, bülbül avazlım,
Bir əli qədəhlim, bir əli sazlım,
İşdə mən gedirəm, qal, ahu gözlüm,
Nə sən məni unut, nə də mən səni.

Yolda hərami çox, əngəl arada
Unutma sevdiyim dəmdə, sırada.
Gəlib gedər, amma gönül burada
Nə sən məni unut, nə də mən səni.

Ta əzəli əzəl sevən sevəndə,
Bu iki cahanda köni – məkanda,
Nizam başlarında ulu divanda,
Nə sən məni unut, nə də mən səni.

Hüseyinəm, aydır: gül bənzim soluq
Sərimizdə yazılmışdır ayrılıq.
Vallahi sevdiyim könüldə birlik
Nə sən məni unut, nə də mən səni.

## ƏZMİ BABA
(XVI əsr)

### YERİ, GÖYÜ, İNSÜ CİNNİ YARATDIN

Yeri, göyü, insü cinni yaratdın
Sən ey memar başı, eyvançımısan?
Eyni günü çərxi bürcü var etdin
Ey məkan sahibi, rəhsançımısan?

Dənizləri yaratdın sən qapaqsız
Suları yürütdün əlsiz-ayaqsız
Yerləri təməlsiz, göyü dayaqsız
Durdurursan əcəb, iskançımısan?

Tulladırsan qanadsızca quşları
Kürəkləmi yapdın sən bu dağları?
Nə yapıb da öldürürsən sağları
Can verib alırsan, sən cançımısan?

Səkkiz cənnət yapdın sən Adəm üçün
Adın böyük, bağışla onun suçun.
Adəmi cənnətdən çıxardın neçin
Buğda nəyinə lazım, xırmançımısan?

Bir ikən min etdin kəndin adını
Görmədim sən kimi iş ustadını.
Yaşardırsan, qurudursan odunu
Sən baxçıvanmısan, ormançımısan?

Cəbrilə pərdə altında söylərdin
Enib Beytullaha kəndin dinlərdin
Bu atəşli cəhənnəmi neylərdin
Hamamınmı var, ya külxançımısan?

Bu qışlara bədəl bu yazı yapdın
Əvvəl bahara qarşı güzi yapdın
Mizanı iki göz tərəzi yapdın
Baqqalmısan, yoxsa dükançımısan?

Qazanlarda qətranların qaynarmış
Yer altında balıqların oynarmış
On bu dünya qədər əcdarhan varmış
Şərbətmi satarsan, ilançımısan?

Yüz min cəhənnəmin olsa qorxmam birindən
Rəhman ismi nazil deyilmi səndən?
Qaffar-üz-zünubam demədinmi sən
Əhf et günahımı, yalançımısan?

Məni əhf eyləsən düşərmi şandan
Nə azalar, nə əksilər xəznəndən
Şahlar belə keçər boylə üsyandan
Əhf etsən olmazmı, nöqsançımısan?

Şanına düşərmi nöqsan görürsən
Hər könüldə oturursan, yürürsən
Bunca canı alıb yenə verirsən
Götürüb gətirən karvançımısan?

Bilirsən, mən qulam, sən sultanımsan
Qəlbdə zikrim, dildə tərcümanımsan
Sən mənim canımda can mehmanımsan
Könlümün yarısan, yabançımısan?

Məni dəli eylər kəndin söylərsən
İçərdən Əzmini bazar eylərsən
Ucalardan uca seyran söylərsən
İşin seyran, kəndin seyrançımısan?

## TƏSLİM ABDAL
(XVI əsr)

### DÖRD DİVAR İÇİNDƏ OLSA MƏKANIM

Dörd divar içində olsa məkanım
Taşrasından əsən yel mənə neylər?
Yanımdakı sudan qorxu çəkərəm
Uzaqda çağlayan sel mənə neylər?

Dünyada gerçəklər qatara uydu
Eşq ilə məhəbbət iqrarın bəndi
Pirimdən almışam xeyir gülbəndi
Mən haqdan qorxaram, el mənə neylər?

Təslim Abdal edər gözlər qanlı yaş
Aradım bulmadım bir sevdasız baş.
Hər kəsin əməli kəndinə yoldaş
Haramzada olan qul mənə neylər?

## BAQİ
(1526—1600)

*Türkiyə divan ədəbiyyatının böyük nümayəndələrindən olan Baqinin əsl adı Mahmud Əbdülbaqidir. İstanbulda doğulmuşdur. Qəzəl və qəsidələri ilə tanınmışdır. Qanuni Sultan Süleymanın ölümünə yazdığı mərsiyyə məşhur şerlərindəndir.*

Xoş gəldi mənə meygədənin abü-havası
Billah gözəl yerdə yapılmış yıxılası.

Ziba yaraşır hiləti naz ol boyu sərvə
İki qolumu etsəm ona bel dolaması.

Diqqətlər ilə seyr edəriz yarı sərapa
Görməzmi idik biz də əgər olsa vəfası.

Dünya dəyər ol mahiliqa dilbəri qərrə
Yusifdə dəxi yoxdur onun hüsnü bəhası.

Məddah olalı çeşmi-qəzalanına Baqi
Öyrəndi qəzəl tərzini Rumun şüərası.

* * *

Növbahar oldu gəlin bəzmi gülüstan edəlim
Açalım qönçeyi qəlbi güli – xəndan edəlim.

Qoymayıb lakə kimi əldən ayağı bir dəm
Məst olub qönçə sifət çaki-giriban edəlim.

Oxusun vəsf ruhiyar ilə Baqi şerin
Bülbülü gülşəni-məclisdə qəzəlxan edəlim.

# "KOROĞLU" DASTANI

(XVI-XVII əsrlər)



*"Koroğlu" dastanı türk xalqlarının ən möhtəşəm folklor abidələrindəndir. Koroğlunun adı Sibirdən Balkanlara qədər türk xalqlarının yaşadığı torpaqlarda məşhurdur. Azərbaycanlılar, Türkiyə türkləri, özbəklər, qazaxlar, qaraqalpaqlarla yanaşı, Koroğlu türk olmayan xalqların şifahi ədəbiyyatına da daxil olmuşdur. İlk mənşəyi etibarilə türk dastanı olan "Koroğlu", məsələn, taciklərdə "Qurqulu" adıyla məşhurdur. Dastanın müxtəlif versiyalarından bir-birinə daha yaxın olanları Oğuz dil qrupuna daxil olan azərilərin, Türkiyə türklərinin və türkmənlərin yaratdıqlarıdır. Bu üç versiyanın bir-birinə çox yaxın olması həm dillərin demək olar ki, cüzi fərqlərlə eyniliyindən, həm də cərəyan edən hadisələrin məkan baxımından eyni regiona aid olmasından irəli gəlir. Bir çox rus və dünya şərqşünaslarının və folklorşünasların fikrincə "Koroğlu" dastanının mənşəyi ən çox Azərbaycanla bağlıdır, amma Anadolu və türkmən variantlarında bu ölkələrin ərazilərilə sıx əlaqə də açıq-aydın görünür. Koroğlunun şəxsiyyətini də, onun başçılıq etdiyi hərəkatı da həm orta əsr salnaməçiləri, həm də müasir tarixçilər XVI əsrin sonu – XVII əsrin əvvəllərində Azərbaycan, Qafqaz və İran ərazisində geniş yayılmış Cəlairilər üsyanları ilə bağlayırlar.*

*Dastanın yalnız üç oğuz xalqına – azərbaycanlılara, Anadolu türklərinə və türkmənlərə aid olan variantlarını müqayisə etsək, birinci ikisinin bir-birinə daha yaxın olduğu, türkmən variantının isə onlardan daha çox fərqləndiyini görərik. Bu fərq elə dastanın adından və bu adın izahından başlanır. Azərbaycan və Anadolu variantlarında Rövşənin adı atasının gözlərinin çıxarılması ilə əlaqələndirilirsə, türkmən variantında Rövşəni qəbirdə tapırlar və adı da ona görə* ***Goroğludur.***

*Hər üç versiyada şerlərin məzmunu və forması bir-birinə çox yaxındır. Amma fərqlər də var. Hər üç variantdan bir-birinin təkrarı olmayan şer örnəklərini seçir və bütünlükdə XVI-XVII əsrlərin oğuz şeri — Azərbaycan, Türkiyə və türkmən şeri haqqında təsəvvür yaradacağını nəzərə alaraq geniş şəkildə təqdim edirik.*

## AZƏRBAYCAN VARİANTINDAN ŞERLƏR

Salam verdim, salam almaz,
Görüm kəssin salam səni.
Pulsuz, axçasız aşığam
Pulum yoxdur alam səni.

Güllü bağlarda gəzərsən,
Cahıllar bağrın əzərsən,
Yuxa kağıza bənzərsən,
Tutmaz qələm yazam səni.

Xəzinəm yox ağzın açam,
Dövlətim yox, tökəm, saçam,
Əlac budu alam, qaçam,
Çənlibelə salam səni.

Hansı dağların qarısan?
Hansı bağların barısan?
Nigar, Koroğlu yarısan,
Bilsin küllü aləm səni.

***

Qəm, qüssəm başımdan aşıb,
Mən tək dərddə qalan yoxdu.
Ah çəkməkdən bağrım bişib,
Bircə yada salan yoxdu.

Necə baxım ev-eşiyə,
Yaralı könlüm üşüyə,
Toz bürümüş boş beşiyə
Şirin layla çalan yoxdu.

Çənlibeldə qar görünür,
Güllər mənə xar görünür,
Günüm ahu-zar görünür
Bir qaydıma qalan yoxdu.

Sənə deyim ər Koroğlu,
Kəsirsən dağlarda yolu.

Bir çarə söylə, nə olu?
Dərdə çarə qılan yoxdu.

Dəlilər sapa düzülər,
Əlim-əlindən üzülər,
Bağman ölsə, bağ pozular,
Mən tək gülü solan yoxdu.

Çənlibeli güllər bəzər,
Güllər saralsa kim üzər?
Hər quş balasıynan gəzər,
Niyə sənin balan yoxdu?

Koroğlusan, hay salarsan,
Paşalardan bac alarsan,
Neçə şəhərlər talarsan,
Sən tək şəhri talan yoxdu.

Nə dərd olsa, məni tapar,
Sonsuzluq bir yanım çapar.
Yarılğan uçar, toz qopar,
Görərsən ki, qalan yoxdu.

Nigarı dərdə gətirən,
Cəsədin qəbrə yetirən,
Koroğlu namın götürən,
Yurdunda son olan yoxdu.

***

Göydən gedən beş durnalar,
Bizim ellər yerindəmi?
Bir-birindən xoş durnalar,
Bizim ellər yerindəmi?

Söhbət olurdu sazınan,
Ördək olurdu qazınan,
Neçə incəbel qızınan
Tuti dillər yerindəmi?

Sevib-seçib bəyəndiyim,
Sədasına oyandığım,
Arxasında dayandığım
Mərd dəlilər yerindəmi?

Bəzirgana sataşdığım,
Qumaşına bulaşdığım,
Dönüb boyundan aşdığım
Çənlibellər yerindəmi?

Hərdən işvə, qəmzə satan,
Mənimlə ixtilat qatan,
Gələndə at başı tutan
Şux gözəllər yerindəmi?

Çalxalanıb döyündüyüm,
Arxa verib söyündüyüm,
Qovğa günü öyündüyüm
Nər dəlilər yerindəmi?

Koroğlu heç deməz yalan,
İndi olub bağrı talan.
Dəmirçioğlu, Dəli Hasan,
İgid ərlər yerindəmi?

***

Nigar xanım sənə deyim
Bu gələn Eyvaz, bu gələn.
Əynindədir polad geyim,
Bu gələn Eyvaz, bu gələn.

Eyvazım on beş yaşında,
Qüdrət qələmi qaşında,
Durna teli var başında,
Bu gələn Eyvaz, bu gələn.

Meydanda igidlər mərdi,
Qabaqda ər oğlu ərdi,
Dava günü qızmış nərdi,
Bu gələn Eyvaz, bu gələn.

Misri qılınc dəstindədi,
Ərəb atın üstündədi,
Şirin canın qəstindədi,
Bu gələn Eyvaz, bu gələn.

Cəmi dəlilərin xası,
Meydanda var mərd davası,
Koroğlunun qoç balası
Bu gələn Eyvaz, bu gələn.

***

Dəlilərim, bu gün dava günüdü,
Müxənnət ölkəsi talanmaq gərək.
Qoç igidlər yarasından bəllənər,
Şərbət tək qanına qalanmaq gərək.

Mərd igidlər nərə çəksin davada,
Şahin kimi şikar tutsun yuvada.
Misri qılınc cövlan vursun havada
Bağırsaq cəmdəyə dolanmaq gərək.

Koroğlu içəndə düşman qanını,
Mərd meydanda nərəsindən tanını.
Qırın vəzirini, tutun xanını
Leş-leşin üstünə qalanmaq gərək.

***

Hoydu dəlilərim, hoydu,
Yeriyin meydan üstünə.
Havadakı şahin kimi
Tökülün al qan üstünə.

Qoyun bədöylər kişnəsin,
Misri qılınclar işləsin.
Kimi tənab qılınclasın,
Kiminiz düşman üstünə.

Koroğlu çəkər haşanı,
Bəylər edər tamaşanı.
Mən özüm Aslan paşanı,
Hərəniz bir xan üstünə.

***

Canım Həmzə, gözüm Həmzə,
Həmzə, incitmə Qıratı.
Budu sənə sözüm Həmzə,
Həmzə, incitmə Qıratı.

Qıratdı mənim dirəyim,
Əriyər qalmaz ürəyim.
Sən olasan duz-çörəyim
Həmzə, incitmə Qıratı.

Qırat mənim iki gözüm,
Belə dərdə necə dözüm?
Həmzə, sənə budu sözüm,
Oğul, incitmə Qıratı.

Eşidər paşalar, bəylər,
Şadlıq xəbərini söylər.
Koroğlu iltimas eylər
Bala, incitmə Qıratı.

***

Həmzə, atı yaxşı saxla
At igidin qardaşıdı.
Gündə muğayat ol, yoxla
At igidin qardaşıdı.

Yay olanda dağa yollat,
Yaz olanda ifçin nallat.
Qış olanda məxmər çullat
At igidin qardaşıdı.

Atı sevib bəslə körpə,
Hayqıranda çıxsın sarpa.
Hər yeyəndə qırx tas arpa
At igidin qardaşıdı.

Məclis qurdum çoxlarınan,
Dava etdim oxlarınan,
Qara polad mıxlarınan,
At igidin qardaşıdı.

Sərin-sərin yu suyunan
Quyruğun bağla muyunan.
Qoç Koroğlu çox öyünən
At igidin qardaşıdı.

***

Çünki oldun dəyirmançı,
Çağır gəlsin dən, Koroğlu.
Verdin Qırı, aldın Dürü,
Döy başına, yan, Koroğlu.

Qırat əldən getdi barı
Canda qaldı intizarı.
Üyüd arpa, buğda, darı
Al şahadın sən, Koroğlu.

Uca dağları döşlətdin,
Ağır alaylar boşlatdın.
Yüz il lotuluq işlətdin
Axır oldun xam, Koroğlu.

Qırat burdan getdi büyün
Sinəmə vurdu dağ, düyün.
Gedim dəllərə nə deyim?
Öl burada, qal Koroğlu.

***

Ala gözlü Nigar xanım,
Üzün məndən niyə döndü?
Sənə qurban şirin canım,
Üzün məndən niyə döndü?

Qoyun otlar quzu ilə,
Ayağının tozu ilə,
Xan Eyvazın sözü ilə
Üzün məndən niyə döndü?

İgidin yatmasın baxtı,
Yana çevrilməsin taxtı.
Koroğlunun məlul vaxtı
Üzün məndən niyə döndü?

***

Mindim Qıratın belinə,
Kaş ki, düşman yüz olaydı.
Çəkəndə misri qılıncı
Dərə, təpə düz olaydı.

Atı minmişəm gəzməyə,
Düşman bağrını əzməyə.
Tuna çayını üzməyə
Qırat bir qəvvas olaydı.

Verin yeddi illik xəracı,
Paşalar gətirsin bacı.
Koroğlu çəkib qılıncı
Düşmən üzbəüz olaydı.

***

Mənə qara deyən gözəl,
Qaşların qara deyilmi?
Tökülübdü dal gərdənə
Saçların qara deyilmi?

Çənlibeldə qurdum binə,
Bənzəyirsən aya, günə.
Ağ üzündə dənə-dənə
Xalların qara deyilmi?

Koroğlu mayıldı sizə,
Qulaq verin saza, sözə.
Siyah sürmə ala gözə
Çəkibsən, qara deyilmi?

***

Ürəyimi eləyib qan
Ağlama Nigar, ağlama...
Olum gözlərinə qurban
Ağlama Nigar, ağlama.

İgid olan cəfa çəkər,
Dost yolunda qanın tökər.
Ağlamağın bağrım sökər
Ağlama Nigar, ağlama...

Qəmli könül dəmə gəlməz,
Dərdi olan ağlar, gülməz.
Qorxaqlar ər dərdi bilməz
Ağlama Nigar, ağlama.

Dəlilərim gələr cuşa,
Müxənnət eylər tamaşa.
Qan qusacaq Xəlil paşa
Ağlama Nigar, ağlama.

Meydanda nərə çəkərəm,
Göydən od-alov tökərəm.
Dağlar, qayalar, sökərəm
Ağlama Nigar, ağlama.

Koroğluyam ər götürrəm,
Mən Bayazıda yetirrəm.
Eyvazı alar, gətirrəm
Ağlama Nigar, ağlama.

***

Qarşı yatan qarlı dağlar,
Dağlar, səndə qanım qaldı.
Əlim çatmaz, ünüm yetməz
Dal budaqda narım qaldı.

Məni tutan Bolu bəydi,
Ağır zəncir boynum əydi.
Hamı bir-birindən yeydi
İgid dəlilərim qaldı.

Məni tutdu qəm əcəli,
Öldürər, verməz macalı.
Göz qaralı, baş gicəli
Sinəmdə dağlarım qaldı.

Canım Qırat, gözüm Qırat,
Səni minən alar murad.
Ağcaquzu, bir də Dürat
Bağlı bədöylərim qaldı.

Yaxşıdı igidin varı,
Namusu, qeyrəti, arı.
Hanı Koroğlunun yarı?
Nigar kimi yarım qaldı...

***

Uzaq-uzaq dağ başında
Tala-tala qar görünür.
Nə dəlilər, nə Çənlibel
Nə alagöz yar görünür.

Ətrafım tir, kaman, oxdu,
Dəlilər yanımda yoxdu.
Mən yalqızam, düşman çoxdu
Qaçmaq mənə ar görünür.

Divanə könlüm şad olmaz,
Laçın könlüm ovsun almaz.
Baxıram Eyvaz görünməz
Dünya mənə dar görünür.

Bu sinəm yaralı düşdü,
Dağların maralı düşdü.
Yar məndən aralı düşdü
Tərlan uçmaz, sar görünür.

Koroğlunun məlul çağı,
Durulmaz keyfi, damağı.
Bar gətirib gürcü bağı
Dal budaqda nar görünür.

***

Titrəyir əllərim, tor görür gözüm,
Mənmi qocalmışam, ya zəmanəmi?
Dolaşmır dəhanda söhbətim, sözüm,
Mənmi qocalmışam, ya zəmanəmi?

Tutulur məclisdə igidin yası,
Kor ömür qılıncı, polad libası.
Gəlib bic əyyamı, namərd dünyası
Mənmi qocalmışam, ya zəmanəmi?

Belə zaman hara, qoç igid hara?
Mərdləri çəkirlər namərdlər dara,
Baş əyir laçınlar, tərlanlar sara
Mənmi qocalmışam, ya zəmanəmi?

Axır əcəl gəldi, yetdi hay, yaray,
Çəkdiyim qovğalar bitdi hay, haray.
Tüfəng çıxdı, mərdlik getdi hay, haray
Mənmi qocalmışam, ya zəmanəmi?

Koroğluyam, Qırat üstə gəzərdim,
Müxənnətlər başın vurub əzərdim.
Nərələr çəkərdim, səflər pozardım
Mənmi qocalmışam, ya zəmanəmi?

## "KOROĞLU" DASTANINA DAXİL OLMAYAN, KOROĞLUNUN ADI İLƏ BAĞLI XVII ƏSRƏ AİD ŞER

Qalxan deyər: mən əlayam,
Qaçan iyidə bəlayam.
Mərd igidə xub qalayam
Bircə qolu qatıncadır.
Cida deyər: mən nökərəm,
Cübbəvi çovşan sökərəm.
Bıldır-bıldır qan tökərəm
Qanı yerə batıncadır.
Qılınc deyər: mən hünərəm,
Şığıyıb göydən enərəm.
Düşməni iki bölərəm
Qara polad soyuncadır.
Tüfəng deyər: mən axaram,
Mərd iyidi tez yıxaram,
Gizlənibən atıncadır.
Tapanca der: mən azaram,
Bəylər belində gəzərəm.
Mərd iyidi tez üzərəm
Mənə barmaq dəyincədir.
Koroğlu der: mən dəliyəm,
Həm dəliyəm, həm doluyam.
Mərd iyidin mərd quluyam
Bu meydanda oluncadır.

## TÜRKİYƏ VARİANTINDAN ŞERLƏR

Haman Mevla ilə sana dayandım
Arxam sənsən, qalam sənsən, dağlar hey!
Yoxdur səndən qeyri qolum-qanadım
Arxam sənsən, qalam sənsən, dağlar hey!

Sənə derəm, sənə hey ulu yaylam
Məgər başım alam elindən gedəm
Oxum, yayım, səndən, səndəndir cidam
Arxam sənsən, qalam sənsən, dağlar hey!

Uca-uca təpəsindən yol aşan
Getməz oldu könlümüzdən əndişən
Mürüvətsiz bəydən yeydir dörd köşən
Arxam sənsən, qalam sənsən, dağlar hey!

Həp sınadım Osmanlının alını
Bulamadım hərgiz könlüm alanı
Anıcağız sevdiyimin halını
Arxam sənsən, qalam sənsən, dağlar hey!

Koroğlu der: təpələrdən baxaram,
Gözlərimdən qanlı yaşlar tökərəm,
Bunca illər həsrətini çəkərəm,
Arxam sənsən, qalam sənsən, dağlar hey!

***

Kimisi pinar başında,
Kimisi yolun dışında,
Al geyən on beş yaşında
İllah mavili, mavili...

Kimisi dağlarda gəzər,
Kimisi incisin düzər,
Al geyən bağrımı əzər,
İllah mavili, mavili...

Kimisi odun devşirir,
Kimsi qəhvəsin bişirir,
Ağ geyən ağlım şaşırır
İllah mavili, mavili...

Koroğlum der ki, nolacaq,
Təqdir yerini ğulacaq,
Mavilim qəlbim alacaq
İllah mavili, mavili...

***

Yel kimi uçarsan, qanadmı taxdın?
Hey doruca donlu, yaman Qıratım.
Məni həsrətlərə nasıl da yaxdın
Hey doruca donlum, bənli Qıratım.

Kəklik səkişlisən, ceyran baxışlım,
Su kimi qaynarsan irmaq axışlım,
Nə dadlı kişnərsən incidən dişlim
Hey doruca donlu, bənli Qıratım.

Qulağın kiriştə, bəklədin yolum,
Şaşırmam mən qeyri sağ ilə solum.
Bizi olsa-olsa ayırar ölüm,
Hey doruca donlu, bənli Qıratım.

Min bir küheylana səni dəyişməm,
Məni tanımana mən əsla şaşmam,
Koroğlu, bir daha hiyləyə düşməm,
Hey doruca donlu, bənli Qıratım.

***

A qız məndən ağ köksünü örtərsən,
Tənhalarda ağ gərdənin açarsan,
A qız məndən nə kəm gördün qaçarsan?
Aman Selma, insaf eylə, de mənə!

Aman dilbər, mələkmisən, nurmusan?
Aman dilbər, cənnətdəki hurimisən?
Söylə mənə, sonunadək yarmısan?
Aman Selma, insaf eylə, de mənə!

Koroğludur Çamlıbelin aslanı,
Şəkər ilə, qaymaqla bəslər səni.
Səndən istər bir pəhləvan oğlanı
Aman Selma, insaf eylə, de mənə!

S e l m a :

Türk qızıyam, soyum, sopum bəllidir,
Gözüm ala, saçım siyah tellidir.
Türk qızının dili Tuti dilidir
Bunu sən bil, mənə inan, Koroğlu!

Bizim eldə əhdə vəfa edilir,
Kəm söylənməz, doğru yolda gedilir.
Fəzilətdə namus yolu güdülür
Məraq etmə, mənə inan, Koroğlu!

***

Məndən salam olsun Bolu bəyinə
Göndərsin Eyvazı görəsim gəldi.
Məhəbbəti düşdü könlüm evinə
Göndərsin Eyvazı görəsim gəldi.

Yəhərləyib Qıratıma minmədən,
Alayları bölük-bölük bölmədən,
Bolu şəhrin atəşlərə yaxmadan
Göndərsin Eyvazı görəsim gəldi.

Mən də Koroğluyam, yolum salasan,
İgidə arzu etdirəm sılasın.
Dəprətmədən dəmir yayın cidasın
Oğlum Eyvaz, səni görəsim gəldi.

***

Bayquş ötsün Çamlıbeldə
Öldürdülər xan Eyvazı.
Durmam artıq mən bu eldə
Dəfn etdilər gül Eyvazı.

Səmadan çakıldı dirək,
Buna dayanarmı ürək?
Yerdə insan, göydə mələk
Qıl ziyarət xan Eyvazı.

Aman Tuna, Eyvaz noldu?
Bir kafirə qurban oldu.
Ciyər şişdə büryan oldu
Al getdilər xan Eyvazı.

***

İgid-igidi öldürməz,
Üzünü qanla soldurmaz.
İgid düşkünə saldırmaz
Mən sənə nasıl qıyaram?

Qız qardaşın gözlər səni,
Anacığın özlər səni,
Saracaqdır qızlar səni,
Mən sənə nasıl qıyaram?

Bir dilbərə könül bağlı,
Qılıncımız əldə zağlı.
Varsın desin bizə dağlı
Mən sənə nasıl qıyaram?

Al atımız küheylandır,
Yürüyüşü bir ceyrandır.
Koroğlu der: pək yamandır
Mən sənə nasıl qıyaram?

***

Ordunu çəkdin üstümə
Bolu sən mənim, sən mənim.
Nə düşdün canım qəsdinə
Bolu sən mənim, sən mənim?

Hay etdin də haya təpdin,
Huy etdin də huya təpdin,
Başımı da suya təpdin
Bolu sən mənim, sən mənim.

Koroğlum der: nələr etdin,
Dadlı canıma qəsd etdin.
Qollarıma kəmənd atdın
Bolu sən mənim, sən mənim.

***

Ovucuna pul qoyaram,
Gözlərinə mil qoyaram,
Xanımların dul qoyaram
Bolu mən sənin, mən sənin.

Qıratımı zıpladaram,
Dərə-təpə hopladaram.
Vurub gözün partladaram
Bolu mən sənin, mən sənin.

Koroğlu der: asdıraram,
Arvadınla küsdürərəm.
Ətəyini kəsdirərəm
Bolu mən sənin, mən sənin.

***

Bolu paşa heç gəlirmi yadına
Hanı məni tutan günün necoldu?
Rəngin uçdu, üzün döndü qadına,
Mərd oğlunu tutan günün necoldu?

Göydə ulduz xidmət edər aylara,
Yoxsul olan cəfa çəkər bəylərə.
Təpə üstü asar idin çaylara
Qurd oğlunu tutan günün necoldu?

Koroğlum çağırır Yaradan səni,
Yaradan öldürməz, qurtarar məni.
Qorxma ey Bolu bəy, öldürməm səni
Qoca qurdu tutan günün necoldu?

***

Öylə bir igid istərəm
Ölsəm ölə mənim ilə.
Qürbət elin yabanında
Qalsam, qala mənim ilə.

Öyücü, bəylər, öyücü
Tək başa ordu qovucu
Düşmana əyri qılıcı
Çalsam, çala mənim ilə.

İsabalam kəndin tanı,
Sən çağır xanı, sultanı,
Koroğlu xalq qəhrəmanı
Bulsam, bula mənim ilə.

***

Havada uçan boz quşlar
Yelin qədrini nə bilir?
Kəndi qədrini bilməyən
Elin qədrini nə bilir.

Cüt qoşub toxum əkməyən,
Süfrəsin yerə tökməyən,
Elin qəhrini çəkməyən,
Malın qədrini nə bilir?

Koroğlu sözün söyləsin,
Kələşlər könül əyləsin,
Qarğalar bağı neyləsin
Gülün qədrini nə bilir?

***

Yeni bildim Qırat getdi
Alış, tutuş, yan, Koroğlu.
Ürəyinin başı tutdu
Qaldın sən yayan, Koroğlu.

Ürəyimi aldı sancı,
Qıratımın pulu inci.
Yeni oldum dəyirmançı
İndi gəlir "dən", Koroğlu.

Havada buludlar soldu,
Dürü at yoruldu qaldı.
Keloğlan Qıratı aldı,
Gün kimi ayan, Koroğlu.

***

Könül gəzmək istər qürbət elləri
Yadıma düşmüşdür vətən, əfəndim.
Anladayım başa gələn halları
Məni Məcnun edər canan, əfəndim.

Bulunmaz dərdimə dünyada çara,
Anamdan doğalı geyindim qara.
Çamlıbel yurdunda almışam yara,
Dedilər Tiflisdə dərman, əfəndim.

Koroğlu içimdə tükənməz sızı,
Yaradan yaxdıqca yaxıyor bizi.
Sizin hökmdarın bir gözəl qızı
Məni candan edər Zeycan, əfəndim.

***

Sevdiyim dar gündə gəldin yetişdin
Dilərsən yanında qalayım, gözəl.
Gündən – günə yaralarım sızılar
İstərsən səninçün öləyim, gözəl.

Çox çəkdim həsrətlə qəmin dağını,
Tərk elədim mən də dost otağını.
İtirirsəm bu gəncliyin çağını,
Çiçək kimi indi solayım, gözəl.

Koroğlu der: mənim şirin sözlərim
Al qanın əlindən doldu gözlərim.
Əgər tutar isə iki dizlərim
Həp sənin yanında olayım, gözəl.

## TÜRKMƏN VARİANTINDAN ŞERLƏR

Qəflətdə yatırdım gəldi ərənlər
"Dur qafil yerindən, oyan" dedilər.
Gözüm açıb gördüm cümlə cahanı
Ol duranlar "Şahimərdan!" dedilər.

Qəflətdə yatırdım, açdım gözümü,
Ərənlər payına sürtdüm üzümü.
Oxutdular-haq söylədim sözümü
"Yetmiş bir kəlməni ayan" dedilər.

Ərənlər cəm olub bazar etdilər,
Münaqiblər ondan həzər etdilər.
Pirim Şahimərdan nəzər etdilər
Qırx camı doldurub "için" dedilər.

Ərənlər cəm olub burdan köçdülər,
Sırat körpüsündən bir-bir keçdilər.
Kövsər saqisindən şərab içdilər
İçən şəbbazlara soltan dedilər.

Goroğlu bəy aydar: kəminə, bəndə,
Pirim Şahimərdan! Dəstgirim səndə.
Beş vəqt namazı qıldığın gündə
"Axirət yoldaşın iman" dedilər.

***

Qəflətdə yatırdım, gəldi bir pəri,
Eşq oduna məni heyran elədi.
Ol pərinin sevdasına düşmüşəm
Eşq oduna məni heyran eylədi.

Qalpaq geyib, zər qübbələr taxıbdır,
Şirin canım eşq oduna yaxıbdır.
Laçın kimi qıya-qıya baxıbdır
Eşq oduna məni heyran eylədi.

Laçın kimi qıya-qıya qarayıb,
Siyah zülfü dal gərdənə darayıb.
Ağ üzündə qoşa-qoşa xal qoyub
Eşq oduna məni heyran eylədi.

Ağ ağalar, ağlım alıb bir pəri,
Əyninə geyibdir sim ilən zəri.
Başına sancıbdır telli nüqdəri
Eşq oduna məni heyran eylədi.

Goroğlu bəy aydar şirin sözünü,
Canım aldı nərgiz qara gözünü.
Sürmə edinsəm basıb gedən izini
Adı Ağayunus, dildar eylədi.

***

Səni deyib gəldim Çandıbelimdən
Yor gedəli bizin ilə pərizad.
Əslim bəyan etsəm - türkmən elindən
Yor gedəli bizin ilə pərizad.

Camalın görənlər cana nuş olar,
Pirsiz aşıqların yolu daş olar,
Çöldə gəzsəm, Xıdır pirim duş olar
Yor gedəli bizin ilə pərizad.

Çöl yerlərdə gördüm pirim qüdrətin,
Tərif etsəm qoç igidin hümmətin,
Yalançıda əyəm verən dövlətin
Sür, gedəli bizin ilə pərizad.

Qoç igidin ömrü olsun ziyadə
Səni, məni haq yetirsin murada.
Goroğlu bəy, bu beş günlük dünyada
Bir-birinin qədir bilin, pərizad

***

Bədəvin əsli behiştdən
Bərəkallah, Qırat sənə!
Nəxəlin altın-gümüşdən
Bərəkallah, Qırat sənə!

Hayqırırsan göyə baxıb,
Dörd ayağın yerə dikib,
Dəryayi Nillərdən çıxıb
Bərəkallah, Qırat sənə!

Şəbsin uruflar gəzərsən,
Ceyran qaçsa, tez alarsan,
Gəlin-qız tək süzülərsən
Bərəkallah, Qırat sənə!

Goroğlu gəldi cahana
Sən yetir məni məkana.
Vermənəm Rum – İsfahana
Bərəkallah can at, sənə!

***

Mərd olan iki söyləməz
Qoç igid hardan gəlirsən?
Dostundan sirrin gizləməz
Bəy oğul, hardan gəlirsən?

Boyun dağlar çinarı tək,
Üzün alma ənarı tək,
Türkmən, özbək sərdarı tək
Qoç igid, hardan gəlirsən?

Qırat minib, hər yan baxıb,
Sirli nizə, qatar taxıb,
Nağara vurub, təbil çalıb
Qoç igid, hardan gəlirsən?

Əvəz can deyərlər adıma,
Aləmlər yanar oduma.
Haq yetirsin muradına
Qoç igid, hardan gəlirsən?

***

Göydən uçan top cığalı durnalar,
Ərzurum dağında qarı gördünmü?
Qafillikdə sevda salan sərimə
Fələk ayrı salan yarı gördünmü?

Vuruşda Qıratım düşər dilimə,
Şəmşiri, cidanı alsam əlimə.
Zərəfşan kakili düşər belinə
Ağ üzündə zülfi-tarın gördünmü?

Əvəz canım Buldur qəssab oğludur,
Cənnətin açılan tazə gülüdür.
Qırxımızın qazan edən günüdür
Keplə bəylər, Əvəz canı gördünmü?

Badi - səba yel tək olub əsəli,
Qeyrət edin, qanım başı kəsəli,
İki avara bir bəyini basalı,
Keplə qullar, Əvəz canı gördünmü?

Savaşa girənlər al şərab içər,
Meydana girəndə boz köpük saçar,
Əvəz deyib Goroğlu sərindən keçər
Keplə bəylər, Əvəz canı gördünmü?

***

Qərib bülbül, bikəs bülbül,
Sən orda yığla, mən burda.
Qəriblikdə qalan bülbül,
Sən orda ağla, mən burda.

Qərib bülbül, olma naşı,
Axdırma gözündən yaşı.
Qərib könlümün yoldaşı,
Sən orda ağla, mən burda.

Qərib bülbül, bəxti qara
Nə çəkirsən ahü-nalə?
Səni asdırmaram dara,
Sən orda ağla, mən burda.

Goroğlu aydar halalı,
Gül getdi qədrin biləli.
Əvəz can həmdəm olalı
Sən orda ağla, mən burda.

***

Ay yaranlar, musurmanlar
Namərd mərd oldu, mərd oldu.
Nə əcaib zamanalar
Keçdi, yurd oldu, yurd oldu.

Hanı bəylər, hanı xanlar,
Bu dünyaya gələn canlar.
Taxt üstündə Süleymanlar
Uçdu, yurd oldu, yurd oldu.

Pərimin ala gözləri,
Mahi-təbandır üzləri.
Çobanın tənə sözləri
Cana dərd oldu, dərd oldu.

Goroğlu aydar: mən həzərəm,
Atı donumnan bəzərəm.
Mən necə miskin gəzərəm
Adım qurd oldu, qurd oldu.

# QAQAUZ FOLKLORUNDAN KOROĞLUYA AİD BİR ÖRNƏK

*Başqa türk xalqlarının arasında yayqın olan folklor örnəkləri— Nəsrəddin lətifələri,"Aşıq Qərib", "Əsli–Kərəm","Arzu–Qəmbər" dastanları dilləri Oğuz qrupuna aid olan qaqauzların da ağız ədəbiyyatında önəmli yer tutur. Qaqauzlar arasında Koroğlunun igidlikləri ilə bağlı mahnılar da məşhurdur. Qaqauz folkloruna görə, Koroğlu İzmirin kəndlərindəndir, dostu Ayvazla bərabər dövlətliləri qarət edib aldıqlarını kasıblara paylayır. Sonralar Koroğlu Anadoludan Dobrudcaya keçmiş, mübarizəsini orada davam etdirmiş, nəhayət, yenidən Anadoluya qayıdaraq vəfat etmişdir. Aşağıda qaqauz "Koroğlu"sundan kiçik bir şeri qaqauz dilinin özəlliklərini saxlayaraq təqdim edirik.*

Mən bir Koroğluydum, daada (dağda) gəzərdim,
Çalıya, çırpıya kəllə düzərdim,
Əsən luzgardan (ruzigardan) izlər seçərdim,
Kimsəm yoxdu Balkanda, yalnız gəzərdim,
Dəmir topuzlan kəllə əzərdim,
Mən edi (yeddi) daaya (dağa) hökm edərdim,
Keçəndən bacını istərdim.

# XVII ƏSR TÜRKİYƏ ŞAİRLƏRİ

## NƏFİ

(1572—1636)

*Nəfi Ərzurumun Həsənqalasında doğulmuşdur. İctimai mövzularda kəskin satirik şerləriylə məşhurdur. Həcv ustasıdır. Sultan IV Murad uzun müddət Nəfini himayə etmişdir, ancaq həcv yazmamağı sultana söz verməsinə baxmayaraq, vəzir Bayram Paşanı həcv etdiyinə görə boğdurularaq cəsədi dənizə atılmışdır. Biri türk, biri fars dillərində iki divanı var.*

### QİTƏ

Qəhbə həcvinə tənəzzülmü edərəm, amma
Bir qəza ilə bu da təbimə seçpan düşdü.
İqtiza eylədi bir qəhbəyə bir qitə demək
Bir alay fahişəyə qeyrəti ərkan düşdü.

### BAQİ ÜÇÜN

Dedilər Zatiyə bir qaç qanmaz
Baqiyi-zar oğurlar sözünü.
Dedi ol bülbülü gülzari süxən:
Bəslə qarğanı çıxarsın gözünü.

### ŞEYXÜLİSLAM YƏHYA ÜÇÜN

Bizə kafir demiş müfti əfəndi
Tutalım mən deyəm ona: müsəlman.
Varıldıqda yarın ruzi-cəzaya
İkimiz də çıxarıq onda yalan.

## GÜRCÜ MƏHMƏD PAŞA ÜÇÜN

Gürcü xınzırı, a səksuni müəzzəm, a köpək!
Harda sən, harda nigahbaneyi aləm, a köpək!
Vay o dövlətə kim ola mürəbbisi onun
Bir sənin kimi dəni, cəhl-mücəssəm, a köpək!
Nə günə qaldı, mədət, dövləti Ali Osman...
Nə yazıq, hey, nə müsibət, nə bu matəm, a köpək!
Sən qədər düşməni-dövlətmi olur, ay xınzır?
Nə durur səltənətin sahibi, bilsəm, a köpək!
Ədd olunsa əgər əsbabi nizami dövlət,
Səni qətl eyləməlidir cümlədən əqdəm, a köpək!
Haq götürdü Ərəbi, getdi hələ dünyadən
Kim götürsə, əqabincə səni bilməm, a köpək!
Çakiçağ etmiş ikən tiği-zəbanımla səni
Harda buldun o qədər yarəyə məlhəm, a köpək!
Kafirəm gər səni həcv etdiyimə nadim isəm,
Xalq hüzurunda ya səndən utanarsam, a köpək!
Etiqadımca qəza eylədim inşaallah,
Haq bilir yox yerə mən kimsəni söyməm, a köpək!
Həşr edərək sağ qalırsam da sənə şətm edərəm
Haq sözü söyləmədən heç usanmam, a köpək!

## TAMAŞVARLI QAZİ AŞIQ HƏSƏN
(?—?)

Bilməm sərxoşmudur uyqudan qalxmış
Daramış zülfünü gərdənə tökmüş
Bəyaz əllərinə al xına yaxmış
Dedim öpüşəlim, dedi ki, yox-yox.

Dedim səlvi nədir, dedi boyumdur
Dedim ki, gözəllik, dedi soyumdur
Dedim bu cilvələr, dedi huyumdur
Dedim qonuşalım, dedi ki yox-yox.

Dedim ölüm yoxmu, dedi eynimdə
Dedim öz vəbalım, dedi boynumda
Dedim turuncların, dedi qoynumda
Dedim qoxlaşalım, dedi ki yox-yox.

Dedim yanaqların, dedi gülümdür
Dedim kakilin, dedi sünbülümdür
Dedim Qərib Həsən, dedi qulumdur
Dedim sarmaşalım, dedi ki, yox-yox.

## QUL MƏHMƏD
(?—?)

Bəhey ala gözlü canım
Qul olmağa gəldim sənə.
Könül taxtında sültanım
Qul olmağa gəldim sənə.

Nə yerdəyiz, nə göydəyiz,
Dünü günü firqətdəyiz,
Əlim ermez həsrətdəyiz
Qul olmağa gəldim sənə.

Evlərinin önü yoldur
Kərəm qıl, aşiqin güldür.
Gərək ağlat, gərək öldür
Qul olmağa gəldim sənə.

Qoynunda turuncu gizli,
Dadlı dili şirin sözlü,
Şahin kimi qara gözlü
Qul olmağa gəldim sənə.

Kərəm eylə məndən qaçma,
Saqın yadlar ilə yatma,
Qəmzən oxun mənə atma,
Qul olmağa gəldim sənə.

Məhəmməd aydır: qulunam,
Başı açıq bir dəlinəm,
Ta əzəldən mühübbinəm
Qul olmağa gəldim sənə

## QAYIQÇI QUL MUSTAFA
(?—1646)

### GÖZƏL OLURSAN

Bə yavrum altun qədəhdən
İçdikcə gözəl olursan.
Badənin rəngi üzünə
Düşdükcə gözəl olursan.

Boyun səlvidən çəmandır,
Aşiqə cevrin yamandır.
A yavrum, bilməm nədəndir
Qucduqca gözəl olursan.

Padişahsan, bil kəndini,
Əsirgə dərdiməndini.
Aşiqə köksün bəndini
Açdıqca gözəl olursan.

Mustafa der: halıma bax,
Aşıqlar çağırar əlhaq.
Sənə doludan zərər yox
Düşdükcə gözəl olursan.

### NAZLANA-NAZLANA

Sevdasını başımızda
Görür nazlana-nazlana.
Sülün kimi qarşımızda
Yürür nazlana-nazlana.

Gözümdən axan qan kimi,
Gözəllərə sultan kimi,
Xublar üstündə xan kimi
Durur nazlana-nazlana.

Ləbindən axar zülalı,
Gülə bənzər ruxi alı.
Mən quluna bir şaftalı
Verir nazlana-nazlana.

Aşiqi məst edər sözün,
Min qan edər ala gözün,

Kakiliylə al mah üzün
Bürür nazlana-nazlana.

Mustafa mədh edər səni,
Tərk edib də getmə məni.
Taxıb boynuma zülfünü
Sürür nazlana-nazlana.

## TÜRKÜ

Haçan mənə meylin yox idi dilbər?
Tənhalardan baxıb gülməsənəydin.
Məhəbbətdir gözəllərin nişanı,
Əzəlidən iqrar verməsənəydin.

Hanı mənim ilə yeyib içdiyin?
Yeyib, içib ağ köksünü açdığın?
İndən sonra fayda verməz qaçdığın
Soyunub qoynuma girməsənəydin.

Etmiş siyah zülfü mah üzə pərdə,
Sən uğratdın məni min dürlü dərdə.
Mən kəndi halımda gəzdiyim yerdə
Arayıb bərgüzar verməsənəydin.

Qul Mustafam der: canadır qəsdin,
Çox ağlatdın məni gözləri məstim.
Gözəli sevərlər, darıxma, dostum
Danılırdın gözəl olmasanaydın.

## İNDİ

Əgər sorarsan halımdan,
Bir cansız ölüyəm indi.
Aldadıb könlüm alandan
Divanə, dəliyəm indi.

Gecələr girər duşuma,
Başım erişməz yaşıma.
Buyruq deyiləm başıma
Bir bəyin quluyam indi.

Mən çəkdiyim kimlər çəkər,
Gözlərim qanlı yaş tökər.
Bulanıq-bulanıq axan
Dağların seliyəm indi.

Mən yarə netdim, neylədim?
Eşqin dəryasın boyladım.

Üzümü turab eylədim
Keçənin yoluyam indi.

Qul Mustafa aydır: coşdum,
Eşqin dəryasına düşdüm.
Çox şükür yarə buluşdum
Aləmdə uluyam indi.

## QUL HÜMMƏT
(?—?)

Səyyah oldum bu aləmi gəzərəm
Bir dost bulamadım gün axşam oldu.
Kəndi əfkarımca oxur yazaram
Bir dost bulamadım, gün axşam oldu.

İki əlim getməz oldu üzümdən
Ah etdikcə yaşlar gəlir gözümdən.
Qüsurumu gördüm kəndi özümdən
Bir dost bulamadım, gün axşam oldu.

Pozuq bu dünyanın təməli, pozuq
Tükəndi dənələr qalmadı azıq.
Yazıqdır, bu keçən ömrə yazıq
Bir dost bulamadım, gün axşam oldu.

Qul Hümmət istədim ümmana dalam
Gedənlər gəlmədi bir xəbər alam.
Abdal oldum, şal geyindim bir zaman
Bir dost bulamadım, gün axşam oldu.

## QULOĞLU
(?—?)

### QOŞMA

Şövqimi artırır axşamın dəmi
Sevdiyim mənimlə olduğu zaman.
Dəf olur da gedər könlümün qəmi
Gəlib də yanıma güldüyü zaman.

Söylədikcə ləzzət vardır sözündə-
Düni gün xəyalı iki gözümdə.
Tanrının əmriylə yarın üzündə
Ağ güllər açılır güldüyü zaman.

Eşqinin dumanı başımı bürür
Divanə könlümü gah ələ alır.
Sanıram vücudum cənnətə girir
Yar məni qoynuna aldığı zaman.

Eşqin atəşiylə vücudum yandı
Bir əslizadədir, huridir kəndi.
Sanıram ki, göydən bir mələk endi
Qolların boynuma saldığı zaman.

Quloğluyam, boz bulanıq axaram,
Həsrət oduna cismü can yaxaram,
Nə rizqimə, nə malıma baxaram,
Yar eşqi qəlbimə dolduğu zaman.

## ƏLVİDA

Sultan Murad eydir: indi zəmanə
Mənə də qalmadı, bəylər, əlvida.
Büküldü qamətim, döndü kamanə
Gəzib seyr etdiyim ellər, əlvida.

Ardımca süzülü gələn mələklər,
Tərsinə dövr etdi çərxi-fələklər,
Yeniçəri, Sipahilər, Solaklar
Önümcə yürüyən qullar, əlvida.

Qəzaya getməyə bəylər düzülsün
Qullarımın esamisi yazılsın.
Tabutum düzülsün, qəbrim qazılsın
Varıb seyr etdiyim çöllər, əlvida.

Əcəlim yetişdi, ulduzum endi,
Dostlarım ağladı, düşmanım güldü.
Yapılan qədirqam dəryada qaldı
Bu Maltaya gedən yollar, əlvida.

Quloğlu, dostların üzü ağ olsun
Düşmən olanların bağrı dağ olsun.
Sultan İbrahim xan indi sağ olsun
Hərbən fəth etdiyim ellər, əlvida.

## GERÇƏK İMİŞ

Aləmdə doğru dost yox imiş
Dedikləri gerçək imiş.
Qulunu saxlayan haqdır
Dedikləri gerçək imiş.

Bulut asimana axar,
Yerlərə rəhmətlər yağar.
Gün doğmadan nələr doğar
Dedikləri gerçək imiş.

Əgər insan, əgər mələk,
Yalvarıram gerçək dilək,
Bivəfadır çərxi fələk
Dedikləri gerçək imiş.

Quloğlu der: ömür keçər,
Qalmasın aləmdə naçər.
Dünya! Sənə qonan köçər-
Dedikləri gerçək imiş.

# AŞİQ

(?—?)

## ULU-ULU KARVAN KEÇMİŞ

Ulu-ulu karvan keçmiş
Yollar kimi inləyərəm.
Qarlı-qarlı dağlar aşan
Sellər kimi inləyərəm.

Ucasından ər hayqırmaz,
Sığın keyiki böyüməz.
Quş uçmaz, qulan yüyürməz
Dağlar kimi inləyərəm.

Canım qanlığa düşmüş,
Ciyərim qaynayıb daşmış,
Xocasından ayrı düşmüş
Qullar kimi inləyərəm.

Xəyalın məndən dolundu,
Ah ilə bağrım dəlindi,

İçindən bəyi alındı
Ellər kimi inləyərəm.

Yapıdan düşmüş, pozulmuş,
Top tüfəng vurmuş, əzilmiş,
Kilsələrdə xaç yazılmış
Daşlar kimi inləyərəm.

Miskin Aşıq bilməz nedər,
Övliya qeyrətin güdər.
Sübhə təkin təsbeh edər
Dillər kimi inləyərəm.

## KATİBİ
(?— 1650)

### TÜRKÜ

Durun, durun sizdən xəbər sorayım
Aşiqlərin könlü sizdə nə gəzər?
Çünki sarılmağa könlünüz yoxdur
Ağ gərdəndə ciftə bənlər nə gəzər?

İgidlər məclisində qılınclar parlar
Yardımçımız olsun ərənlər, pirlər.
Cümlə mələkləri göydədir-derlər
Ya bir mələk bu yerlərdə nə gəzər?

Yandı ciyərciyim nari-firqətdən
Qadir Mevlam, qurtar məni bu dərddən.
Sən heç qorxmazmısan ovçudan, qurddan?
Ya bir ceyran bu dağlarda nə gəzər?

Katibi der: Könlümüzdə yer tuta
Yeyəlim, içəlim ömrümüz arta.
İgid olan kimsə izini örtə
İzin örtməz igid qarda nə gəzər?

### DAĞLAR

Əvvəl baharda açılır
Qönçə-qönçə gülün, dağlar.
Can ilə sərdən keçilir
İçildikcə mülün, dağlar.

Araya-araya buldum
Sənə endim, aram qıldım.
Ziyarət etməyə gəldim
Məmləkətin, elin dağlar.

Gözüm ulduzlara baxar,
Önümüzdə duman çökər,
Cuşi-xuruş edib axar
Bozbulanıq selin dağlar.

Qönçədir güllərin, solmaz,
Yarından ayrılan gülməz,
Katibi der: təbir olmaz,
Açılmaz sünbülün dağlar.

## VARDIR

Dəli könül, məlul olub qəm yemə
Ağlamanın əlbət gülməsi vardır.
Əduya intiqam qalırmı boylə?
Hər kəs etdiyini bulması vardır.

Haqq üçün ibadət edən sadiqlər
Mərtəbəsin bulur bağrı yanıqlar.
Bivəfa dilbəri sevən aşiqlər
Gahi boylə məlul olması vardır.

Bu eşq dedikləri bir yoldur incə
Bülbülə cövr edər bir güli-qönçə.
Bir gözəlin kəndi könlü olunca,
Tənhaca odaya gəlməsi vardır.

Bu bir əski sözdür söylənir əzəl:
"Dilbər axça istər, dinləməz qəzəl".
Zənnimcə, bir aşiq bulsa bir gözəl,
Zügürdü fəryada salması vardır.

Katibi, səbr eylə, ötəsi yaxın,
Hərcayı gözətməz duz-əkmək haqqın.
Bivəfa dilbərə aldanma, saqın
Həmən bir üzünə gülməsi vardır.

## QÜRBƏT ELƏ DÜŞDÜ YOLUM

Qürbət elə düşdü yolum
Ağlayır, gəzər, yürürəm.
Əfkar ilə dəli könlüm
Dağlayıb gəzər, yürürəm.

Oldum işimdən avarə
Yaxaram sinəmi narə.
Könlümü zülfü-dildarə
Bağlayıb gəzər, yürürəm.

Dağlar başı oldu yurdum
Gündən günə artar dərdim.
Mən qara gözlümü gördüm
Sızlayıb gəzər, yürürəm.

Anladamam məlalımı,
Göz görməsin maralımı.
Haldan bilənə halımı
Söyləyib gəzər, yürürəm.

Katibi içəldən camı
Məst olub keçər əyyamı.
Şaşqın sel kimi müdamı
Çağlayıb gəzər, yürürəm.

## ÖKSÜZ AŞIQ

(?—?)

### TUNANIN (DUNAYIN)

Misalı cənnətdir əvvəl baharı
Açılır qırmızı gülü Tunanın.
Ötər bülbülləri leylü naharı
Əsər badi səba yeli Tunanın.

Əlaman dağından bəri keçmişdir,
Engürüs elindən yollar açmışdır,
Analar ağlatmış, qanlar içmişdir,
Söyləməyə yoxdur dili Tunanın.

Turaba qərq olmuş, yerdədir üzü,
Arzulayıb axar Qara dənizi.
Cəmrələr düşüncə sökülür buzu
Ovalara çıxar seli Tunanın.

Öksüz Aşıq bunu boylə dedimi,
İndi ovalara basdı qədəmi.
Salamlamış Estorqanla Budanı
Belqrada uğrar yolu Tunanın.

## QOŞMA

Ala gözlərinə qurban olduğum
Əcəlim gəlmədən öldürmə məni.
Gizlicə, oğrunca səni sevərəm
Sirrimi faş etmə, bildirmə məni.

Səni mənə verən o uca Qəni,
Alarlar əlimdən, qorxuram, səni.
Boynumu büküb də öldürsən məni
Üstümə düşmanım güldürmə məni.

Ölüm dedikləri gəlməz eynimə
Dola ağ qolların, dola boynuma.
Soyunub əynini girsən qoynuma,
Sabah oldu deyə qaldırma məni.

Öksüz Aşıq bunu boylə söylədi,
Yenə eşqin dəryasını boyladı.
Sənin eşqin məni Məcnun eylədi
Tərk edib dağlara saldırma məni.

## TÜRKÜ

Gül budanmış dal-dal olmuş
Bənövşəsi yol-yol olmuş,
Siyah zülfün tel-tel olmuş
Biz bu yerlərdən gedəli
Qürbət ellərə düşəli.

Gül bənövşəyə qarışmış
Küskün olanlar barışmış
Tazə fidanlar erişmiş
Biz bu yerlərdən gedəli
Qürbət ellərə düşəli.

Öksüz Aşıq der bu sözü
Haqqa çevrilmişdir üzü
Öldü zənn etdilər bizi
Biz bu yerlərdən gedəli
Qürbət ellərə düşəli.

## QARACAOĞLAN
(1606?—1679?)

*Türk xalqlarının ən gözəl şairlərindən olan Qaracaoğlan Güney Anadoluda dünyaya gəlmiş, bu yerlərdə məskunlaşan türkmən əşirətlərinə mənsub olmuşdur. Anadolunun çeşidli yerlərini gəzib dolaşan və daim xalq içində olan Qaracaoğlan haqqında müxtəlif rəvayətlər mövcuddur. Araşdırıcılar haqlı olaraq qeyd edirlər ki, Yunus İmrə kimi Qaracaoğlan şerinin də qaynağı xalq ədəbiyyatıdır, ancaq Yunus İmrə yaradıcılığında mistik bir ruh hakim olduğu halda Qaracaoğlanın qoşmalarında, varsağılarında, türkülərində, səmavilərində təbiət duyğusu daha çox sezilir. Şerlərini sadə, saf, təmiz türk dilində yaradan Qaracaoğlanın həm əfsanəvi şəxsiyyətinin, həm də yaradıcılığının xalq arasında geniş yayılması nəticəsində hətta ondan sonra yaranmış və ona mənsub olmayan şerləri də bəzən ona aid edirlər. Hər halda şairin özünə aid olan, yaxud onun böyük təsiri altında olan şairlərin və aşıqların Qaracaoğlan "möhürlü" əsərləri Türkiyə, Azərbaycan və türkmən ədəbiyyatının ən parlaq səhifələrindəndir.*

### ZİYADƏ

Ala gözlərini sevdiyim dilbər
Mən gözəl görmədim səndən ziyadə.
Bilməm hurimisən göylərdən enən
Bu gün gözəlliyin dündən ziyadə.

Doğan aylar kimi doğar, görünər,
Qırmızılar geyib çıxar, sallanar,
Ah etdikcə qara bağrım yanlar,
Səni sevən yoxdur məndən ziyadə.

Qaracaoğlan der ki, bu sözüm haqdır,
Aləmi seyr etdim bənzərin yoxdur.
Sinəmə vurduğun bir qanlı oxdur,
Daha cövrün varmı bundan ziyadə?

## BƏNÖVŞƏ

Qadir Mevlam səni öymüş yaratmış
Çiçəklər içində birdir bənövşə.
Bitərsən güllərin xarı içində
Qorxaram üzünə batar, bənövşə.

Yaz gələndə həvəslənib bitərsən,
Güz gəlincə başın alıb gedərsən,
Yavru, neçün boynun əyri tutarsan,
Sənin dərdin məndən betər bənövşə.

Baxmazmısan Qaracaoğlan halına?
Qərib bülbül qonmuş gülün dalına.
Qədrin bilməyənlər alır əlinə
Onun üçün əyri bitər bənövşə.

## QOŞMA

Sabahdan uğradım mən bir gözələ
Ala gözlərinə sürmələr çəkmiş.
Daramış zülfünü tökmüş bir yana
Salı vermiş incə belin üstünə.

Bir xoş, bir xoş durur əda naz kimi,
Arxasında saçı tel-tel saz kimi,
Xas baxça içində top nərgiz kimi,
Qaralarmı geydin alın üstünə?

Alma-alma yanaqları al kimi,
Boynu uzar, gedər, sərvi dal kimi,
Səhərdə açılan qönçə gül kimi,
Sandım qan damlamış qarın üstünə.

Çıxa-çıxa çıxdım yoluna vardım,
Verdiyi çevrəni qoluma sardım.
Uğrunda ölümü gözümə aldım
Divanına durdum yolun üstünə.

Çəkiverdim gücü gücün içinə,
Al qərənfil taxmış sünbül saçına.
Ömrümü qoymuşam fərman bacına
Yarım sultan olmuş elin üstünə.

## VARSAĞI

Yürü behey Bulqar dağı,
Səndən uca dağ olmamı?
Sən yaylanın gözəlisən
Yanaqların ağ olmamı?

Bulqar dağı iki çatal
Arasında güllər bitər.
Bir iyidə bir yar yetər
İki sevən dəl(i) olmamı?

Bulqar dağı parə-parə
Kim al geyər, kimi qarə.
Salam eylən nazlı yarə
Ayrılanlar bir olmamı?

Hanı xanlar, hanı xanlar,
Qəfəsdə bəslənən canlar.
Sevib-sevib ayrılanlar
Yanıb-yanıb kül olmamı?

Qaracaoğlan səni gördüm,
Duşunu xeyirə yozdum,
Bu gün gözəllərə sordum,
Gözəllərə qul olmamı?

## NƏDƏNDİR

Nədəndir de, kömür gözlüm, nədəndir?
Bu mənim gecələr uyumadığım.
Çətin derlər ayrılığın dərdini,
Ayrılıq dərdinə doyamadığım.

Dostun bağçasına yad əllər dolmuş,
Gülünü toplarkən fidanın qırmış,
Burda bir kötünün qoynuna girmiş
O mənim sevməyə qıyamadığım.

Kömür gözlüm, səni sevdim saqındım,
Endim xas bağçaya güllər soğundum,
Bilmiyorum nərələrdə toxundum,
Bir bəlli xəbərin alamadığım.

Qaracaoğlan der ki, yandım da öldüm
Hər dəliliyi mən kəndimə buldum.
Dolanıb ki, qəvil yerinə gəldim
Qəvil yerlərində bulamadığım.

## PƏRİŞAN

Çıxdım ucasına seyran eylədim
Gördüm ağ ququlu göllər pərişan.
Bir firqət gəldi də durdum ağladım
Öpüb qoxladığım güllər pərişan.

Xəyal-məyal oldu qarşımda dağlar
Eşindən ayrılan ah çəkər ağlar.
Tökülmüş yarpaqlar, pozulmuş bağlar
Bülbülün qonduğu dağlar pərişan.

Qaracaoğlan der: mən toyladamadım,
Ərəb ata minib boyladamadım,
Küsdürdüm dilbəri söylədəmədim,
Dilbəri küsdürən dillər pərişan.

## VAR

İzin ver, hey ağam mən də gedəyim
Ah çəkib də, arxam sıra ağlar var.
Baxaram, baxaram yarım görünməz
Aramızda yıxılası dağlar var.

Coşqun sular kimi axıb durulma,
Quru xəzəl kimi əsib sovrulma,
Nerdə gözəl görsən ona çevrilmə,
Bizim eldə cana qıyar bəylər var.

Qarşıdan qarşıya yanar bir işıq,
Bunu söyləyənin dilləri aşiq.
Bir buğda bənizli, zülfü dolaşıq
Getmə, deyə məni yolda əylər var.

Qaracaoğlan der ki, kəndim öyəlim,
Qaşlar alıb qara bağrım dələyim,
Gözəl sevmə - derlər, nasıl sevməyim?
Qaşlar arasında ciftə bənlər var.

## NEDƏYİM?

Birəm-birəm devşirirlər odunu,
Biləm dedim, biləmədim adını,
Ərzurum yanaqlı kürdlər qadını
Bir qız mənə əmi dedi nedəyim?

Bizim ellər Urum olur, uc olur,
Sızıldaşır boz qurdları ac olur,
Bir igidə əmi demək güc olur,
Bir qız mənə əmi dedi nedəyim?

Qaracaoğlan der ki, nedib, nedərəm,
Axan sulanınan belə gedərəm,
Saqqal, səni naqtabınan yolaram,
Bir qız mənə əmi dedi nedəyim?

## NƏ BİLİR?

Nuhun gəmisinə böhtan edərlər
Yelkən açıb yel qədrini nə bilir?
O Süleyman quş dilini bilirdi,
Hər Süleyman dil qədrini nə bilir?

Ərəb atlarında olur firqalar,
Kimi sərxoş yürür, kimi yırğalar,
Kübrəliyə enib qonan qarğalar
Xas baxçada gül qədrini nə bilir?

Dünya mənim deyə zənginlik satan,
Halal əkməyinə haramlar qatan,
Sonradan sonraya bəyliyə yetən,
Zalım olar, el qədrini nə bilir?

Qaracaoğlan der də, belim büküldü,
Ağzımın içində dişim töküldü,
Nuh Nəbinin həddəsindən çəkildi,
Saz çalmayan tel qədrini nə bilir?

## EDƏRLƏR

Ala gözlü, bənli dilbər,
Usul söylə, söz edərlər.
Könül suyum axıtdılar
Gözlərimi buz edərlər.

Durnalar qatarla yürür,
Yaylanı, ümmanı bürür,
Cümlə dalımı soldurur,
İlk yazımı küz edərlər.

Qaracaoğlan der sınadım,
İçdim meyi eşqi qandım,
Hər gözəli yardır sandım,
Bir yaramı yüz edərlər.

## TÜRKÜLƏR

Ala gözlü nazlı dilbər,
Qoyma məni ər yerinə.
Altın kəmərin olayım
Dola məni bel yerinə.

Heçinə, könlüm, heçinə
İgidə ölüm keçinə.
Al məni zülfün ucuna
Sallanayım tel yerinə.

Gəl, qız, qarşımda dursana,
Bir mənim halım sorsana,
Zülfündən bir tel versənə,
Qoxlayayım gül yerinə.

Qaracaoğlan der nolayım,
Qolun boynuma dolayım.
Nazlı yar, kölən olayım
Qəbul eylə qul yerinə.

***

— Suya gedən allı gəlin,
Neçin boylə salınırsan?
Gəlin, bir su ver içəyim,
Gəlin, kimin gəlinisən?

— Su deyildir sənin dərdin,
Görmək isə, yetər, gördün.
Oğlan, burda çoxca durdun
Ağam gələr, döyülərsən.

— Döyülürsəm, döyüləyim,
Söyülürsəm, söyüləyim.
Gəlin, sənə qul olayım,
Ölərəm, qanlım olarsan.

— Yaylalara keçmədinmi?
Soyuq sular içmədinmi?
Gözəl görüb keçmədinmi?
Məni görüb dəlirirsən.

— Dürlü yaylanı aşınca,
Soyuq suları içincə,
Qocalıb vaxtın keçincə,
Daşlar alır, döyünürsən.

— Evlərinin önü solğan
Ağamı görərsən, qorxan.
Telli pərşəmlisən, oğlan
Nə dedim ki, danılırsan?

— Qaracaoğlan sənə vurğun,
Döşlərin almadan dolğun,
Sevindirdin məni, bir gün
İnşallah cənnət görərsən.

***

Göy üzündə tütən olsam,
Yer üzündə bitən olsam,
Al bənəkli kətan olsam,
Yar boynuna sarsa məni.

Yar qolunda burma olsam,
Yedikləri xurma olsam,
Alçım-alçım sürmə olsam,
Yar qaşına sürsə məni.

Qaracaoğlan, uşaq olsam,
Yar belinə quşaq olsam,
Bir atlasdan döşək olsam,
Yar altına sərsə məni...

***

Ala gözlərini sevdiyim dilbər,
Göstər camalını, görməyə gəldim.
Şaftalını dərdə dərman dedilər
Gerçəkmi sevdiyim, sormağa gəldim.

Gündüz xəyallarım, gecə duşlarım,
Oyandıqca ağlamağa başlarım.
Sevdiyim, üstündə uçan quşların
Tutub qanadların qırmağa gəldim.

Sənin aşiqlərin gülməz dedilər,
Ağlayıb yaşını silməz dedilər,
Səni bir kəz saran ölməz dedilər,
Gerçəkmi, əfəndim, sarmağa gəldim.

Mail oldum sənin incə belinə,
Canım qurban olsun dadlı dilinə.
Aşiq olub sənin hüsnün bağına
Qırmızı güllərin dərməyə gəldim.

Qaracaoğlan der ki, könül oğrusu,
Göydə mələk, yerdə hüma yavrusu,
Mən sənə söylədim, sözün doğrusu
Soyunub qoynuna girməyə gəldim.

## KƏRƏM EYLƏ

Ala gözlərini sevdiyim dilbər,
Gəl bizim elləri gəz, kərəm eylə.
Neçə qulların var, gəzər qələmlə
Al məni dəftərə yaz, kərəm eylə.

İraqdır yolların, dolandım, gəldim,
Dadlıdır dillərin əyləndim qaldım,
Babalın boynuma, işdə mən öldüm,
Məzarım köksünə qaz, kərəm eylə.

Qaracaoğlan der ki, bir mahnı söylə
Əzəldən qalmışdır bu qanun boylə.
Edicək bir eyilik, vaxt ikən eylə
Ömür keçər, aman qız, kərəm eylə.

## MƏNİ

Ala gözlü yarım yaxıb yandırma
Car çəkib aləmə bildirmə məni.
Açıb ağ gərdənin durma qarşımda
Əcəlimdən əvvəl öldürmə məni.

Qoy dolanıb dursun qolun boynumda
Heç ölüm qorxusu yoxdur eynimdə.
Bir gecəlik mehman olsam qoynunda
Sabah oldu deyə qaldırma məni.

Dolandım dağları, bu yerə düşdüm,
Yar, sənin dərdindən odlara düşdüm.
Çarəsi bulunmaz dərdlərə düşdüm
Yetər, alov-alov yandırma məni.

Qaracaoğlan, çox ağladım, gülmədim,
Aradım, dərdimə dərman bulmadım,
Bunca gündür bir minnətə gəlmədim,
Kərəm eylə, məhzun göndərmə məni.

## GƏLDİ

Ala gözlərini sevdiyim dilbər,
Səni görməyəli görəsim gəldi.
Altın kəmər sıxmış incə belini
Usul boylarını sarasım gəldi.

Kiçiciksən gözəl, etmə bu nazı
Ciyərimə basdın atəşi, közü.
Başına düzmüsən gülü, nərgizi
Üzümü üzünə sürəsim gəldi.

Aladır gözlərin, siyahdır qaşın
Aradım cahanı, bulunmaz eşin.
Yaylanın qarından bəyazdır döşün
Yıxılıb üstünə öləsim gəldi.

Qaracaoğlan der ki: bilirəm səni
Eylədim yolunda qurban bu canı.
Qoynunda bəslənən heyvanı, narı
Çözüb düymələrin dərəsim gəldi.

## GÖZƏL, NƏ GÖZƏL OLMUŞSAN

Gözəl, nə gözəl olmuşsan
Görülməyi, görülməyi.
Siyah zülfün halqalanmış
Hörülməyi, hörülməyi...

Məndilim yudum arıtdım
Gülün dalında qurutdum.
Adın nə idi unutdum
Sorulmayı, sorulmayı.

Səyirtdim ardından yetdim
Əyildim üzündən öpdüm.
Adın bilirdim, unutdum
Çağırmayı, çağırmayı.

Mənim yarım mənə küsmüş,
Zülfünü gərdənə tökmüş,
Məhəbbəti məndən kəsmiş,
Sevilməyi, sevilməyi

Çağır, Qaracaoğlan, çağır,
Daş düşdüyü yerdə ağır.
İgid sevdiyindən soğur
Sarılmayı, sarılmayı.

## ÖLÜM, ARDIMA DÜŞÜB DƏ YORULMA

Ölüm, ardıma düşüb də yorulma
Var get ölüm, bir zaman da yenə gəl!
Aqibət alarsan, qoymazsan məni
Var get ölüm, bir zaman da yenə gəl!

Boylə bir vaxıtlar yeyib içərkən,
Yeyib içib, yaylalarda gəzərkən.,
Yeməmi gəldin mən səndən qaçarkən?
Var get ölüm, bir zaman da yenə gəl!

Çıxıb boz qurdlarla ulaşamadım,
Yalan dünya sənə çıxışamadım,
Eşimlə, dostumla buluşamadım,
Var get ölüm, bir zaman da yenə gəl!

Qaracaoğlan der ki, dərdim pək betər
Baxçada bülbüllər şaqıyıb ötər.
Anamı, atamı dün aldın, yetər
Var get ölüm, bir zaman da yenə gəl!

## AŞIQ ÖMƏR
(1630 — 1707)

### QOŞMA

Sabahdan uğradım mən bir gözələ
Gözəl ağlatmadı, güldürdü məni.
Ummaz idim ondan mən bu kərəmi
Ağ köksü üstünə qondurdu məni.

Üç gözəllə gəldi burdan yuxarı
Daramış zülfünü, vermiş tumarı.
Yarın ləblərindən zəmzəm pinarı
Verdi də ağzıma, qandırdı məni.

Burda bir dilbərin mübtəlasıyam
Üç gün ağıllıyam, üç gün dəliyəm.
Dostun baxçasında qönçə gülüyəm
Soğdu al yanağa, soldurdu məni.

Ömər məcbur bülbül kimi ötməyə,
Dostun baxçasında fəryad etməyə.
Yönümü döndərdim qoyub getməyə
Sarıldı boynuma döndərdü məni.

### XƏBƏRİN VARMI

Ala gözlü nazlı dilbər
Halından xəbərin varmı?
Səni məndən ayırdılar
Zülümdən xəbərin varmı?

Bu gün dersən, yarın dersən
Əğyara yardım edərsən.
Ayrılığa zülüm dersən
Ölümdən xəbərin varmı?

Ala gözlərin süzülmüş
Ləbindən şəkər əzilmiş.
Əbrişim quşan çözülmüş
Belindən xəbərin varmı?

Ömər edər gülüşmüşlər
Aşiqlərin yanılmışlar.
Bağçanda gülün dərmişlər
Bağından xəbərin varmı?

## SORSANA

Qurulalı nələr çəkmiş
Yalan dünyaya sorsana.
Necə min dürlü qan etmiş
Axan dəryaya sorsana.

Bilinməz nə əcəb aldır,
Könül bir sərxoş misaldır.
Aşiqlik nə müşkül haldır,
Çəkən şeydaya sorsana.

Bu dərdin çarəsin bilməm
Axar çeşmim yaşın silməm.
Olaydın yar ilə bir dəm
Çəkib tənhaya sorsana.

Kəlamı naz ilə söylər
Qərib könlüm alıb neylər?
Neçin cövrü cəfa eylər?
Mələk simaya sorsana.

Cahanda bulmadım bir yar
Ruzi-şəb eylərəm əfkar.
Der ki, Ömər, cümləmiz var
Edən Mevlaya sorsana.

## KİMİNSƏN SƏN?

Sallanıb seyran yerinə
Çıxan dilbər, kiminsən sən?
Siyah zülfün mah üzünə
Tökən dilbər, kiminsən sən?

Baxdım gözünə, qaşına,
Bənzətdim hüma quşuna.
Məni hicran atəşinə
Yaxan dilbər, kiminsən sən?

Payinə üz sürən qullar
Dəmadəm mədhin edərlər.
Al yanaq üstünə güllər
Taxan dilbər, kiminsən sən?

Seyrana gedər bostana
Bülbül qonar gülüstana.
Bizə məstanə-məstanə
Baxan dilbər, kiminsən sən?

Aşıq Ömər, seyrə varma,
Varıb divanına durma.
Ala gözə siyah sürmə
Çəkən dilbər, kiminsən sən?

## BƏNZƏR

Bu qarşıdan gələn dilbər
Boyu sərvi dala bənzər.
Yanında bir qızla belə
Qönçə açmış gülə bənzər.

Gəlinin gözləri məndə,
Qız cəfalar etməz dosta.
Gəlin şərbət kimi tasda,
Qız tabaqda bala bənzər.

Gəlin qıza bulur suçu.
Qızın gəlinə yetər gücü.
Gəlinin əbrişim saçı,
Qızın sırma telə bənzər.

Daşlar olsun yapınızda.
Mişgi-ənbər qoxunuzda.
Aşıq Ömər qapınızda
Bir azadsız qula bənzər

## QISQANIRAM

Gəl ey dilbər, qan eyləmə
Səni qandan qısqanıram.
Doğan aydan, əsən yeldən
Səni Gündən qısqanıram.

Təbibim! hirs ilə baxma,
Mən qulun xatirin yıxma.
Yanağına güllər taxma
Səni güldən qısqanıram.

Halım bilən haldaşım var,
Yola gedər yoldaşım var,
Beş yaşında qardaşım var,
Səni ondan qısqanıram.

Ömər deyər: mən də gəldim,
Tazələndi əski dərdim.
Sən bir quzu, mən bir qurdam
Səni məndən qısqanıram.

## DEDİM-DEDİ

Dedim: Dilbər, yanaqların qızarmış
Dedi: çiçək taxdım, gül yarasıdır,
Dedim: danə-danə olmuş bənlərin
Dedi: zülfüm dəydi, tel yarasıdır.

Dedim: Dilbər, sənə yazıldı qanım
Dedi: neçin dersən, mənim sultanım?
Dedim: kimlər sarmış incə miyanın?
Dedi: kəndim sardım, qol yarasıdır.

Dedim: bu Ömərin ağlını aldın
Dedi: sevdiyinə peşmanmı oldun?
Dedim: Dilbər, neçin saralıb soldun?
Dedi: həp çəkdiyim dil yarasıdır.

## SEVDİYİM

Sallana-sallana nerdən gəlirsən?
Nədir məsləhətin, işin sevdiyim?
Qaldır niqabını görüm üzünü
Ağzının içində dişin sevdiyim.

Ağacın çürüyü özündən olur,
İyidin kötüsü sözündən olur,
El üçün ağlayan gözündən olur,
Ağlama, ey gözün yaşın sevdiyim.

Dan ulduzu kimi parladın, çıxdın
Vücudum şəhrini odlara yaxdın.
Cənnəti-əladan yenimi çıxdın?
Al vəlvəli yaşıl başın sevdiyim.

Sən qərib Ömərin nazlı yarısan
Etdiklərindən də peşman olarsan.
Dünya sənə qalmaz, bir gün ölərsən
Məzarın üstündə daşın sevdiyim.

## QƏZƏL

Ey çərxi sitəmkar dili - nalana toxunma
Hicr aləmidir, etdiyim əfqana toxunma.

Ey badi-səba uğrar isən yarə salam et
Tel qırma fəqət, zülfi-pərişana toxunma.

Ey badə, əgər yarım içərsə səni mənsiz,
Ver nəşə, fəqət nərgizi-məstanə toxunma.

Vermərn sənə can, çək məndən əlin ey məlakül-mövt.
Cananıma nəzr eylədiyim cana toxunma.

# QAZAQ ABDAL
(? — ?)

## DAŞLAMA

Ormanda böyüyən adam azğını
Çarşıda, bazarda insan bəyənməz.
Mədrəsə qaçqını, süfrə pozğunu
Salam verməyə dərvişan bəyənməz.

Elin qapısında qaravaş olan,
Burunu fırtıqlı, gözü yaş olan,
Bayramdan bayrama bir təraş olan,
Bərbərə gəlib də dükkan bəyənməz.

Aləmə daş atar yanına varsan,
Səni yanıldır bir məsələ sorsan.
Bir cim çıxmaz əgər qarnını yarsan,
Camiyə gələr də ərkan bəyənməz.

Bir çubuğu vardır qayət kiçicik
Ağlınca kəndinə keyf gətirəcək.
Qırıx çanağı yox, ayran içəcək
Qəhvəyə gəlib də fincan bəyənməz.

Yaz olunca yayla-yayla köçənlər,
Toppuz qorxusundan şəhrə qaçanlar,
Meşə yarpağını qırıb içənlər,
Rumel Yenicəsi duxan bəyənməz.

Əslində, nəslində geyməmiş xara
İş gəlməz əlindən, getməz bir kara.
Sandığı köynəksiz duran məkkara
Bədəstana gələr, qaftan bəyənməz.

Qazaq Abdal söylər bu dürlü sözü
Yoğurt ayran ilə hal olmuş özü.
Köydən şəhərə gəlsə bir türkün qızı
İnci, yaqut istər, mərcan bəyənməz.

## GƏDAYİ

(? — ?)

### QOŞMA

Alay-alay olub gələn gözəllər,
Gəlin, keçin, gedin yollarınızdan.
Hər biriz aləmə padişahsınız
Neçin qaçarsınız qullarınızdan?

Gözə yasaq yoxdur, biz də baxalım,
Önünüzdən sular kimi axalım,
Bir gülciyəz verin, biz də qoxalım,
Bir gül ehsan edin güllərinizdən.

Seyrana çıxmışlar onlar bir uca
Boyları uzun həm belləri incə.
Yalvara-yalvara könül alınca
Çözərlər quşağı bellərinizdən.

Gözüm heyran olar baxsam ovaya,
Buyurun, gedəlim bizim obaya.
Sualınız varsa bu mən Gədaya
Bir xəbər duyayım dillərinizdən.

## YUSİF NABİ
(1642—1712)

*Yusif Nabi Urfa (Ruha) şəhərində doğulmuşdur. Şair özü bu barədə yazır:*

Vətənim şəhri-dilarayi Rəha
Vəqti-təhrir müqirrim Şəhba.

*Şəhba — Hələb şəhəridir ki, Nabi bir müddət burada da yaşamışdır. Ömrünün böyük hissəsini isə İstanbulda keçirmiş və orada da vəfat etmişdir. Nabi təbii, Türkiyə ədəbiyyatının nümayəndəsi hesab olunur. Ancaq Firidun bəy Köçərli məşhur "Azərbaycan ədəbiyyatı" kitabına Yusif Nabini də daxil etmiş və onun haqqında yazmışdır ki, Füzulidən "sonra Azərbaycan şüəra və üdəbasına şüərayi-sələfdən artıq nüfuzu olanı Yusif Nabi olubdur." Firidun bəy Yusif Nabinin şerlərindən "Türk şüərası" adlı bir parçanı da gətirir:*

Türkidə Nəfi ilə Baqiyə bax
Qeyr divanları da qıl mülhəq.
Onların şeri mətndir, amma
Qeyrisində dəxi var çox məna.

### QƏZƏLLƏR

Verməzdi kimsə kimsəyə nan minnət olmasa,
Bir məsləhət görülməz idi rüşvət olmasa.

Xəlqin miyanəsində bulunmazdı ittihad,
Məşriblərində vasiteyi-xissət olmasa.

Kəndi vücuduna böylə qılmazdı məalı xəlq,
Qəsdi-nümayişi-şərəfü şövkət olmasa.

Yox biqərəz müamilə əhli-zəmanədə,
Kimsə ibadət etməz idi cənnət olmasa.

Təhsili-elmin üstünə təcrih edərmi nas?
Təhsili-məal vasiteyi-rifət olmasa.

Etməz zühur ərsədə bir kimsədən kərəm,
Zimanində qəsdi-daireyi-şöhrət olmasa.

Baxmazdı kimsə ayineyi-safə, Nabiya,
Xudbinlik əlaqəsinə alət olmasa.

***

Bəzmi səfaya sağəri səhba gələr gedər,
Guya ki, cəzrü mət ilə dərya gələr gedər.

Açıldığın xəbər verir əğyarə gül kimi,
Daim bizə nəsimi-səbükpa gələr gedər.

Sultanı qəm nişimən edəldən dərunumu?
Səhrayi qəlbə ləşkəri-sevda gələr gedər.

Bir gün deməz o şux ki, aya, müradı nə,
Çoxdan bu kuyə Nabiyi şeyda gələr gedər.

***

Yarı açdım, "açıl, ey qönçə dəhanım" deyərək,
Bəzmə gəldi, gəl, ey sərvi-rəvanım deyərək.

Payinə bari bu təqrib ilə düşsəm yarın,
Qalmadı ah, mədət, tabi-təvanım deyərək.

Ah, bir kərrə miyanını alıb ağuşa,
Sinəmə çəksəm o simintəni canım deyərək.

Yar söylətdi mənə bu qəzəli, ey Nabi,
Söyləyə-söyləyə ey tazə-zəbanım deyərək.

## QİTƏ

Xalqın əmvalın alıb sonra təsəlli verмək
Fülsi-mahibi soyub, yağda bişirmək kimidir.
Qüsfəndanın deyib qət tariki-nəfəsin
Bacasından üfürüb sonra şişirmək kimidir.

# XVII ƏSR AZƏRBAYCAN ŞAİRLƏRİ

## AŞIQ ABBAS TUFARQANLI

(? — ?)

*Şerlərində "Qul", "Şikəstə", "Bikəs" təxəllüslərini işlədən Abbas Tufarqanlı XVI əsrin sonları — XVII əsrin əvvəllərində Güney Azərbaycanda yaşayıb yaratmış görkəmli şair-aşıqlardandır. Onun adıyla bağlı "Abbas—Gülgəz" dastanı da folklorumuzun qiymətli örnəklərindəndir.*

### QOŞMALAR

Qədəm qoyub yar yanına gələndə,
Elə gəl, elə get yol inciməsin.
Şəkər ləblərindən mənə busə ver,
Dodaq tərpənməsin, dil inciməsin.

Dərildi bostanlar, boş qaldı tağlar,
Könül istədiyin verməsən, ağlar.
Ağ sinən üstündən darayı bağlar
Heykəl arasından sal, inciməsin.

Bülbül fəqan eylər gül həvəsindən,
Qoşa nar asılıb yar sinəsindən.
Elə gəl, elə get bağ-bərəsindən
Bülbüllər hürküşüb gül inciməsin.

Gözəllər içində sən qızıl güllər,
Dolansın başına şeyda bülbüllər.
Əsmə səba yeli, titrəmə çöllər,
Cığalar tərpənib tel inciməsin.

Abbas deyər: ağlayanlar güləndə,
Nazlı yar soruşub halım biləndə,
Mərhəmət eyləyib bizə gələndə
Dola gərdəninə qol, inciməsin.

***

Nə gülürsən mənim kimi gülüncə
Sən mənə gülüncə, dərdə gül, Pəri!
Alişan otaqda, gülşən bağçada
Süsəni, sünbülü dər də, gül, Pəri!

Səninlə gəzərdik Təbrizdə bağı,
Sinəmə çəkirsən dağ üstdən dağı,
Bəndə saldın mənim kimi dustağı
Çox məni qoyubsan darda, gül, Pəri!

Abbas gətirildi dar ayağına,
Xına tək yaxıllam yar ayağına,
Yoxsulu çəkərlər var ayağına,
İndi mənim kimi mərdə gül, Pəri!

***

Ay həzərat, bir zamana gəlibdi
Ala qarğa şux tərlanı bəyənməz.
Oğullar atanı, qızlar ananı,
Gəlinlər də qaynananı bəyənməz.

Adam var ki, getməyəsən işinə,
Adam var ki, dolanasan başına.
Adam var ki, ayran tapmır aşına,
Dindirəsən, yağlı nanı bəyənməz.

Adam var dağları gəzər sərsəri,
Adam var geyinir pustinən dəri.
Adam var mərfətdən yoxdur xəbəri,
Adam var sultanı, xanı bəyənməz.

Adam var dolanar səhranı, düzü,
Adam var döşürər güli-nərgizi.
Adam var geyməyə tapammaz bezi,
Adam var al geyər, şalı bəyənməz.

Adam var çox işlər eylər irada,
Adam var ki, yetə bilməz murada.
Adam var ki, çörək tapmaz dünyada
Adam var yağ yeyər, balı bəyənməz.

Adam var ki, adamların naxşıdı,
Adam var ki, anlamazdı, naşıdı.
Adam var ki, heyvan ondan yaxşıdı
Dindirərsən, heç insanı bəyənməz.

Adam var dəstinə verəsən güllər,
Adam var gözünə çəkəsən millər.
Tufarqanlı Abbas, başına küllər-
Nə günə qalmısan, qarı bəyənməz.

***

Qurban olum səni çəkən nəqqaşa
Yetirdin dəstimi damana, Gülgəz!
Qüdrət qələm çalmış o qələm qaşa
Bənzər əbruların kamana, Gülgəz!

Gəl verək əl-ələ, çıxaq bu bağa,
Gül-gülə sarmaşır, budaq-budağa.
Üz-üzə dayayaq, dodaq dodağa
Ağ sinən sinəmə dayana, Gülgəz!

Üzəngini basım, Gülgəzim, atdan,
Sən məni qurtardın alovdan, oddan.
Abbasın sevdiyi! Xabi-qəflətdən
Silkinib çıxsana bu yana, Gülgəz!

***

Başına döndüyüm, ay Gülgəz Pəri,
Çəkərəm hicranı dərd ayağından.
Elin töhmətindən, fələk cəbrindən
Düşmüşəm çöllərə dərd ayağından.

Pərim, sənin üzün görən tər salar,
Öldürsələr meyli dönməz tərsalar,
Hicrandan məşq alar, qəmdən dərs alar,
Sən mənə dərs verdin dərd ayağından.

Qabaq aydır, zülf bulutdur, üz gündür,
Sənsiz mənim bir saatım yüz gündür,
Heç demirsən Qul Abbasım üzgündür,
Qəm başından tutar, dərd ayağından.

***

Bir gözəlsən şövqün düşüb cahana,
Yoxdur sənin kimi gözəl, göz ala.
　Mən aşiqəm cahana,
　Canım qurban Cahana,
　Haqqın əziz bəndəsi,
　Xoş gəlmisən cahana.
Yaradan yaradıb salmış cahana,
Yoxdur sənin kimi gözəl, göz ala.

Bağbansan bağa bax, bağ işini gör,
Bağ bəslə, bağ becər, bağ işini gör:
    Aşıq, bax, işini gör,
    Bağa bax, işini gör,
    Nə yatmısan kamil ovçu,
    Maralın baxışını gör.
Hələ sən tərlanın baxışını gör,
İstəyir canımı gözəl göz ala.

Abbas deyər: Mən qurbanam sənə yar,
Uzun boylu, tuti dilli sənə yar.
    Mən aşıq sənə yar,
    Sənəd verdim sənə yar,
    Qərib aşıq qürbət eldə
    Canım aldın sən əyyar.
Dolandım dünyanı neçə sənə yar,
Görmədim sən kimi gözəl, göz ala.

***

Özündən kiçiyi işə buyurma
Sözün yerə düşər heç miqdar olmaz.
Hər nə ki, kar görsən, öz əlinlə gör
İnsan öz işində cəfakar olmaz.

Özündən böyüyün saxla yolunu,
Düşən yerdə soruş ərzi-halını.
Amanat, amanat qonşu malını
Qonşu yox istəyən, özü var olmaz.

Soruşun, Qul Abbas, halın necədir?
Gündüzlərim ay qaranlıq gecədir.
Sərv ağacı hər ağacdan ucadır
Əsli qıtdı, budağında bar olmaz.

***

Başına döndüyüm, alagöz Pəri,
Gahdan ağla, gahdan yada sal məni.
Qara bağrım şan-şan oldu, dəlindi
Gahdan ağla, gahdan yada sal məni.

Bağban idim, bağım təğayir oldu,
Gözüm gördü, ağlım təğayir oldu,
Xoryat əli dəydi, təğayir oldu
Gahdan ağla, gahdan yada sal məni.

Mən sənə can dedim, sən də mənə can,
Alış eşq oduna, mənim kimi yan.
Adım Aşıq Abbas, yerim Tufarqan
Gahdan ağla, gahdan yada sal məni.

***

Qadasın aldığım, nədən məlulsan?
Əgər lal isənsə, dil sənə qurban.
Gümüş neştər ilə tökdün qanımı
Nazik əllərinlə sil, sənə qurban.

Mal gedər otlayar dağın içində,
Piltə şölə verər yağın içində.
Bağbanı dindirdim bağın içində
Dedi süsən, sünbül, gül sənə qurban.

Başına döndüyüm gözləri xəndan,
Turunclar baş verib çıxır yaxandan.
Dedim: gözəl, bir busə ver o xaldan
Acıqlandı, dedi, al, sənə qurban!

***

Səhər-səhər sərçeşmələr başında
Gün kimi dağlara yayılan Pərim!
Hər kəs məndən sənə yaman qandırsa,
Ya əqrəb dişləsin, ya ilan, Pərim!

Qovma dərgahından şirin nökəri,
Geymərəm hər şalı, hər qələmkəri.
Hicran xəstəsiyəm, yeməm şəkəri
Qoynundakı nara qayılam, Pərim!

Götür sürməni çək qaşına gəlsin,
Çal əyri çalmanı başına gəlsin,
Abbasın sözləri xoşuna gəlsin,
Hurilər qızından sayılan Pərim!

***

Başına döndüyüm alagöz Pəri,
Tanrı səni məndən ayrı salmasın.
Haq götürsün bu qarını aradan
Nişanası bu dünyada qalmasın.

Gedəni gəlməsin, yatanı ölsün,
Köz-köz olsun, qabıq qoysun, soyulsun.
Hər yanına altmış piltə qoyulsun
Nə yığıb yerini salan olmasın.

Ciyərin doğrasın bir almaz bıçaq,
Yeddi il yan yerdə uzansın naçaq.
Qohumu-qardaşı düşsünlər qaçaq
Əhvalını xəbər alan olmasın.

Sən pozmusan yazıq Abbas halını,
Mən sənə neylədim, tanrı zalımı?
Çəkim ciyərinə mən çəngəlimi
Cənazənə yaxın gələn olmasın.

***

Başına döndüyüm, qurban olduğum,
Qoyma, dəli Becan yarım apardı.
Alışıb oduna büryan olduğum
Qoyma, dəli Becan yarım apardı.

Şah Abbas hökmüylə naməni yazır,
Qurub kəcavəni, olubdur hazır.
İsfəhandan gəldi bu zalım vəzir
Qoyma, dəli Becan yarım apardı.

Mən Abbasam, heç vaxt söyləməm yalan,
Elimə, ölkəmə saldılar talan.
Xoca, dəli Becan, Allahverdi xan
Qoyma, dəli Becan yarım apardı.

## GƏRAYLILAR

Nə ağlarsan, nə sızlarsan,
Bir dərdi beş olan könlüm?
Axırda zünnar bağlarsan
Qəmə yoldaş olan könlüm.

Bir yar gəlir obasından,
Alım dərdü-bəlasından.
Çərxi-fələk badəsindən
İçib sərxoş olan könlüm.

Abbas ağlar arsız-arsız,
Dünya olub etibarsız.
Deyirdin dözərəm yarsız,
Döz, bağrı daş olan könlüm.

***

Durum dolanım başına,
Ala gözlü yar, gedirəm.
Ölsəm, boyuna sadağa
Qalsam, intizar gedirəm.

Mərd ilə eylə ülfəti,
Çəkmə namərddən minnəti.
Bülbül, qızılgül həsrəti
Qışı, yazı zar, gedirəm.

Abbas deyər, gül bəhsidi,
Bundan artıq dərd hansıdı?
Ayrılığın vədəsidi
Gəl, könlümü al, gedirəm.

***

Duman, gəl get bu dağlardan,
Bahar gəldi, qar əylənməz.
Bu dünya bir bivəfadı
Gözəldə ilqar əylənməz.

Gözəlin qaşı qaradı,
Bayqunun meyli haradı?
Bu dünya karvansaradı:
Hər gələn qonar, əylənməz.

Abbas deyər hac olanda,
Kəbəyə merac olanda,
Doğru yoldan kəc olanda
Namus gedər, ar əylənməz.

***

Budu gəldi bahar fəsli,
Dağların lalə vaxtıdı.
Açılıbdı qızıl güllər,
Bülbülün bala vaxtıdı.

Bülbüllər dolandı bağı,
Bir xəlvət eylə otağı.
Sənə qurban olum, saqi,
Mey ver, piyalə vaxtıdı.

Mən Abbasam, boyu bəstə,
Dərdindən olmuşam xəstə.
Al başımı dizin üstə
Çal yataq, layla vaxtıdı.

***

Duman, gəl get bu dağlardan,
Dağlar təzə bar eyləsin.
Nə gözlərim səni görsün
Nə könlüm qubar eyləsin.

Haşa, sevdiciyim haşa,
Deyilənlər gəldi başa,
Bir yandan özün tut daşa
Bir yandan el car eyləsin.

Abbas ağlar zarı-zarı,
Getməz könlünün qubarı.
İlqarından dönən yarı
Xudam tezbazar eyləsin.

***

Gecə-gündüz qan ağlaram
Artıbdı fərağım mənim.
Başımı alıb gedərəm
Tutduqca ayağım mənim.

Fələk salıb işim ləngə,
Düşmüşəm qovğaya, cəngə.
Aşaram Hində, Firəngə,
Alınmaz sorağım mənim.

Abbas qürbət elə varsa,
Namərd olar dala qalsa,
Deyilənlər gerçək olsa,
Sönübdü çırağım mənim.

# MƏSİHİ
(1575—1655)

## "VƏRQA VƏ GÜLŞA" POEMASINDAN QƏZƏL

Ey fələk, netdim həmişə gözləyib azarımı,
Dil evin ğarət qılıb pozdun rüxi-bazarımı.

Dəhr içində tiri-bidadə məni qıldın hədəf,
Zülm ilə bu dün ara əldən çıxardın yarımı.

Noldu cürmüm əxtəri-bəxtim vəbalın gözləyib,
Lütf ilə qıldın təvana taleyi-əğyarımı.

Bünyeyi-iqbalıma min qəhr ilə saldın şikəst,
Eylədin faiq durub iqbalıma idbarımı.

Dəsti-zülm ilə məni əğyara qıldın zirdəst,
Vüsəti-mərdanəlikdə təng edib həncarımı.

Paybusi-yarə yetsən qoyma əldən, zinhar,
Ey səba, lütf ilə dutgil daməni-dildarımı.

Qoy hücumunda Məsihi tək mənim halımı gör
Söyləgil əğyardan pünhan ona əsrarımı.

## SAİB TƏBRİZİ
(1601—1676)

*Füzuli ədəbi məktəbinin görkəmli davamçılarından biri də Məhəmmədəli Saib Təbrizidir. Azərbaycan türkcəsində və fars dilində zəngin ədəbi irsi olan Saibin adı bütün Yaxın Şərqdə məşhurdur.*

### QƏZƏLLƏR

Bu gözəl gün də keçər, dərd keçər, qəm də keçər,
Həyatın şadlığı da, hətta bu matəm də keçər.

Belə rahət yuxu da, mənasız ömrün günü də,
Səni heyran eləyən hər nə var aləmdə keçər.

Nə veribdir sıxılan qəlbimizə boş səhra?
Ürəyin nalələri zildə, ya da bəmdə keçər.

Bil ki, ayla günəşi əks eləmir eşq seli,
Paranın hökmü dinarla yenə dirhəmlə keçər.

Bir adam yoxdu ki, yansın belə qəlbin halına
Bir dinarçın o başından, desən hər dəmdə keçər.
Bu necə gözdü ki, bir işvə ilə baxsa əgər,
Ahular qərq olar o işvəli aləmdə, keçər.

Saibin qəlbinə də təsir edər əhli-həsəd
Aynaya dəysə nəfəs tar da olar, nəm də keçər.

Farsçadan çevirəni: **Balaş Azəroğlu**

***

Aşiq qanını vəsməli qaşın nihan içər,
Cövhərli tiğ qınari peyvəstə qan içər.

Etdikcə qan könülləri ol ləli-atəşin,
Abi-həyat tək qara zülfün rəvan içər.

Ta bir piyalə verdi, kəbab etdi bağrımı,
Hər kim onun əlindən içər badə, qan içər.

İllər yaşar Xızr kimi hər kim ki, gecələr,
Gül üzlü yar ilən meyi çün ərvəğan içər.

Adəm nədir ki, içməsin ol verdiyin şərab,
Versən əgər firiştə meyi bigüman içər.

Saqi, mənimlə şişeyi-peymanə neyləsin,
Dəryanı bir nəfəsdə bu ruyi-rəvan içər.

Tezraq çəkər nədamətə bədməstlik yolu,
Hər kim ki, yaxşı içsə şərabı - yaman içər.

Saib, mən ki, onun sözün yerə salmadım,
Bilməm neçin mənim qanımı asiman içər.

***

Tutulmuş könlümü cam ilə şadan eyləmək olmaz,
Əl ilən püstənin ağzını xəndan eyləmək olmaz.

Nə sözdür bu ki, olsun sahibnəzər zühhad,
Qara torpağı hərgiz abi-heyvan eyləmək olmaz.

Bulut qılan kimi cövlan urar da ildırım tiği,
Könül pərdələrində eşqi pünhan eyləmək olmaz.

Qılınc gər içsə aləm qanının sirablıq bilməz,
Səni üşşaq qətlindən peşiman eyləmək olmaz.

Mənim göz yaşımı çıxgil fələklərdən tamaşa qıl,
Hübabi qəsrlər içində tufan eyləmək olmaz.

Məni-Məcnuni aqil eyləmək mümkün deyil, naseh,
Söz ilən müşgi-nabi, qan ki, bir qan eyləmək olmaz.

Xətadan keçdi ceyran qanını müşk eylədi Saib,
Deme, üsyanı taət, küfri iman eyləmək olmaz.

## ŞAH ABBAS SANİ
(1633—1666)

Üç vəfalı kimsə olmuş həmdəmim,
Gah firqət, gah möhnət, gah qəm.
Gecə-gündüz həm ənisü məhrəmim,
Gah firqət, gah möhnət, gah qəm.

Verdi dövran cami-hicran saqi tək,
Saldı həsrət ürəyimə taqi tək,
Çevrəm alır gahi bigə yağı tək,
Gah firqət, gah möhnət, gah qəm.

Deyə bilməm kimsəyə dərdim tamam,
Yar mənə sərkəşü, əğyarə ram.
Könlümə ola mənim hər sübh, şam,
Gah firqət, gah möhnət, gah qəm

## MURTAZA QULUXAN ZƏFƏR

(?—?)

*Murtaza Quluxan Zəfər Səfəvi hökmdarı və Azərbaycan şairi İkinci Şah Abbasın (Şah Abbas Saninin) dövründə yaşamış və onun sarayında vəzirlik rütbəsinə yüksəlmişdir. Azərbaycan ədəbiyyatının önəmli nümayəndələrindən olan bu şair nə yazıq ki, az tanınmış və ədəbiyyat tarixlərimizə daxil edilməmişdir. Onun haqqında bu qısa məlumatı və bir şerini doktor Cavad Heyətin "Azərbaycan ədəbiyyatına bir baxış" kitabından götürmüşük. Şer Şah Abbas Saninin, yenə də Cavad Heyətin kitabından aldığımız şerilə səsləşir.*

Üç bəlalı kimsə olmuş həmdəmim,
Gah hicran, gah hərman, gah məlal.
Gecə-gündüzdür ənisü məhrəmim,
Gah hicran, gah hərman, gah məlal.

Deyə bilməm kimsəyə halım tamam,
Yarı bədxu bir dəm olmaz bizə ram.
Ağladırlar bu fəqiri sübhü şam
Gah hicran, gah hərman, gah məlal.

Saqiya, gəl dövrə salgil sağəri,
Şayəd ola könlümün rövşəngəri.
Qoymadılar bəzmimə sən dilbəri
Gah hicran, gah hərman, gah məlal.

Vəslə yektirgil məni, ey üzü gül,
Əskik etmə bəzmimizdən cami-gül,
Oda yaxdı cismi-zarım, oldu kül
Gah hicran, gah hərman, gah məlal.

Olmuşam Məcnun tək yardən iraq,
Canıma kar eylədi suzü fəraq,
Məni istəyibən edərlər soraq
Gah hicran, gah hərman, gah məlal.

Bir qulundur boynu bağlı bu Zəfər,
Dost kuyinə onu yetir bixətər.
Etdi işim günbəgün yoməl betər
Gah hicran, gah hərman, gah məlal.

## QÖVSİ TƏBRİZİ
(?—?)

*Qövsi Təbrizi XVII əsrin sonu — XVIII əsrin əvvəllərində yaşamış böyük Azərbaycan şairlərindəndir.*

### QƏZƏLLƏR

Cismi-zarımdan mənim hicran nə istər bilmənəm.
Bu sınıq gəştidən ol tufan nə istər bilmənəm.

Məndə yox hiç arizu, könlüm yaman bitabdır,
Zəxm yoxdur sinədə, peykan nə istər bilmənəm.

Çeşmi-xunxarın sənin cismimdə çün qan qoymadı,
Qanı dolmuş dideyi-giryan nə istər bilmənəm.

Kasə-kasə qan verir, şükr eyləyib nuş eylərəm,
Dəxi məndən gərdişi-dövran nə istər bilmənəm.

Hər nə var aləmdə bir-birdən betər sərgəştədir,
Qətrəümman axtarır, ümman nə istər bilmənəm.

Lalə istər dağına mərhəm nəsimi-sübhdən,
Ağız açmış qönçeyi-xəndan nə istər bilmənəm.

Aşiqin zənciri tari-zülfə kakildən gərək,
Rişteyi-zünnaridən Sənan nə istər bilmənəm.

Can çü canan malıdır, bəs dəxi məndən, dustlar,
Can nə istər bilmənəm, canan nə istər bilmənəm.

Gövhəri-qəltan gözü taci-büləndəxtərdədir,
Qətreyi-gümnam sərgərdan nə istər bilmənəm.

Qaşi yayından onun yarəb, bu hamı qürbilə,
Navəki-bərgəşteyi-müjgan nə istər bilmənəm.

Ey dəmadəm eyləyən təklifi-məscid Qövsiyə
Aşiqi-bitabdə iman nə istər bilmənəm.

***

Dilim fəğan iləvü, didə qan ilən doludur,
Könül səhifəsi şərhü bəyan ilən doludur.

Vurubdur ağzına min qifli-ahənin qeyrət,
Hənuz səqfi-fələk əl-əman ilən doludur.

Haray kim, nə dilim var, nə bir dil anlayanım,
Əgərçi ney kimi cismim fəğan ilən doludur.

Əgərki könlümə zahirdə dəymək asandır,
Bu çöl kəmingəhi şirin-jiyan ilən doludur.

Sınıq səbudə su tutmaz qərar, mey durmaz,
Şikəstə könlümə məhvəm ki, qan ilən doludur.

Xumarilən öldürdü məni saqiyi-birəhm,
Səbuyi-badeyi-gülrəng can ilən doludur.

Bu bir piyalədə yarəb, nə sehr edib saqi-
Ki, üstü badə ilən, altı qan ilən doludur.

Sən öz yamanlarını yaxşı et, nə hasil kim,
Zəmanə yaxşı ilən, ya yaman ilən doludur.

Bəsirət əhli dəlil istəməz ki, kövnü məkan
Nişan ilən doludur, binişan ilən doludur.

Yuvada qönçələnir əndəlib bəs ki, çəmən,
Nəvayi-Qövsiyi-atəşzəban ilən doludur.

***

Həmişə şam kimi sərfi-piçü tab oldum,
Zəmanə hər kimi yandırdı — mən kəbab oldum.

Könüldən ötrü gözəl ömrümü təbah etdim,
Bu bir xərabə üçün xaniman xərab oldum.

Əgərçi xəlq deyər, gün çıxar, görər aləm
Mənə göz açmadı heç kim gər afitab oldum.

Oda düşən od olur, bəxti-vajiguni görün
Ki, mən bu odlar içində əridim ab oldum.

Yaxamdan əl götür ey dil, nə aşinalıqdır
Ki, mən sənin oduna yandımü kəbab oldum.

Necə görüm sənin ilə bərabər əğyarı,
Gözüm, sən ayinə aldın ələ, mən ab oldum.

Bu iztirab ilə hicran hekayətin Qövsi,
Demə, demə ki, sənin halına kəbab oldum.

***

Bülbül mənim əfqanıma qatlanmadı uçdu,
Yarım gecə qönçə yuxudan durdu və köçdü.

Mən tak tikib mey yerinə xuni-dil içdim,
Sözdür bu ki: "Hər kimsə nə əkdi, onu biçdi".

Hicran gecəsi gəldi yenə başıma, ey vay,
Hərçənd yaman keçdi günüm, şükr ki, keçdi.

Qurtulmadı, yarəb, ciyərim qanı, nə sirdir
Hərçənd ki, göz tökdü ayağə könül içdi.

Vəsfi-ruxi-gülrəngin onun başladı Qövsi,
Gülzaridə bülbül yenə gül dəftərin açdı.

***

Mən istəmənəm dərdimi canana desinlər,
Əhvalımı ol zülfi-pərişanə desinlər.

Ol Leyliyə qurban oluram mən təhi-dildən,
Qoy bir neçə bitəh mənə divanə desinlər.

Pərvanə yaxar var-yoxunu bir oda yetsə,
Razı deyiləm kim, mənə pərvanə desinlər.

Onlar ki, deyirlər bu nə fəryadü fəğandır,
Barı bu sözü ol güli-xəndanə desinlər.

Dillər tökərəm bülbülü pərvanəyə Qövsi,
Ta bir gün olar, halımı cananə desinlər.

***

Mən məst idim, ol məstlə axır belə düşdüm,
Qıl fikrimi saqi ki, yaman müşkülə düşdüm.

Pərvanəvü bülbül kimi bitab degildim,
Bilməm neçin oddan-oda, dildən-dilə düşdüm.

Qüdsilərilə aləmi-əqdəsdə gəzərkən
Yarəb, neyləmişdim ki, bu abü gilə düşdüm.

Nacinslərin söhbətini məndən eşit kim,
Mən bir neçə gün, bir neçə huşyar ilə düşdüm.

Ol kuyi dedin tərk eləyim tərki-sər etdim,
Çün öz gücüm ilə belə durdum, belə düşdüm.

Məcnun olub ol Leyliyi - aləm tələbində,
Evdən-evə, çöldən-çölə, eldən-elə düşdüm.

Sordu ki, mənim dərdimə, Qövsi, necə düşdün?
Baş qoydum ayağına ki, saqi, belə düşdüm.

## SƏN BİLİRSƏN

Könlümdəki muradım,
Ey yar, sən bilirsən.
Hər dil ki, bilmənəm mən,
Dildar, sən bilirsən.

Mən sanma meypərəstəm,
Saqidən ötrü məstəm,
Mən bir binayi-pəstəm
Memar-sən, bilirsən.

Qəmzən atanda bir ox,
Qaşın yayın çəkər çox.

Könlümdə tab gər yox,
Gər var, sən bilirsən.

Gəlməz fəğan əlimdən,
Üzr istə qatilimdən,
Ona mənim dilimdən
Yalvar, sən bilirsən.

Gər könlümü alırsan,
Gər yüz çin öldürürsən,
Dildar, sən bilirsən,
Qəmxar, sən bilirsən.

Qövsi sənin xərabın,
İçmiş sənin şərabın,
Olmuş sənin kəbabın,
Xunxar, sən bilirsən.

## SƏNDƏN ÖTRÜ

Ömürlər xuni-dil içdim,
Gülüzarım, səndən ötrü.
Axırı dağlara düşdüm
Taləzarım, səndən ötrü.

Sinəmi oxlar dəlibdir,
Qanlı peykanlar qalıbdır,
Canımı qəmlər alıbdır,
Qəmküsarım, səndən ötrü.

Aşiq olan keçər eldən,
Başü candan, xanüməndən,
Damənin tək getdi əldən
İxtiyarım, səndən ötrü.

Gözlərim qan ilən doldu,
Bilmənəm könlümə noldu,
Kakilin tək qarə oldu
Ruzigarım, səndən ötrü.

Qövsi ilə həmdəm oldum,
Həmdəmi-dərdi-qəm oldum,
Xarü zari-aləm oldum
Nazlı yarım, səndən ötrü.

## SARI AŞIQ
(? — ?)

*Əsasən bayatı ustası kimi tanınan Sarı Aşıq XVII əsrdə yaşamış, Yaxşı adlı qızı sevmiş, itirmiş və sevgilisinin yanında, üzü qibləyə deyil, üzü Yaxşının məzarına tərəf dəfn olunmasını məşhur bayatısında vəsiyyət etmişdir. Sarı Aşığın qəbri Həkəri çayının yaxınlığındakı qəbiristanlıqdadır.*

### QOŞMALAR

Şikar edib tutdum bir şahi tərlan,
Sən etdin ağlımı zail, a Yaxşı!
Səni sevən keçər canü sərindən,
Olar camalına mail, a Yaxşı!

Məhəbbəti olan istər sazını,
Mən çəkərəm hər dəm sənin nazını.
Şəmsü Qəmər kimi görkəz üzünü,
Gün təki aləmə yayıl, a Yaxşı!

Qaşların bir oxdu, kirpiyin almaz,
Haramdan oxlasan, oram sağalmaz.
Gedər bu gözəllik sənə də qalmaz,
Əgərçi sərxoşsan, ayıl a Yaxşı!

Məni sənə aşiq etdi yaradan,
Səyrağıbı haqq götürsün aradan.
İstəyirsən xəbər tutgil Sarıdan,
Yollarında mənəm sail a Yaxşı!

***

Əyibdi qəddimi qaşların tağı,
Qəsd eləyib şirin cana gözlərin.
Bu qədər şux baxıb aşiq öldürmə,
Heyifdi batmasın qana gözlərin.

Camalın şöləsi günəşdən əla,
Səni görən necə olmaz mübtəla?
Qəmzeyi-cəlladın, xəndəngin bəla,
Rəhm eyləməz heç insana gözlərin.

Gözəllikdə sənsən bu gün yeganə,
Canım qurban olsun sən tək canane.
Yıxar Aşiq evin, elər viranə
Dolananda hər bir yana gözlərin.

## BAYATILAR

Aşıq vətən yaxşıdı,
Köynək kətan yaxşıdı.
Qəriblik cənnət olsa,
Yenə vətən yaxşıdı.

Aşıq Qarabağlıdı,
Xalın qara bağlıdı.
Nə gedən var, nə gələn,
Yollar qara bağlıdı.

Aşıq, qaralı qoyma,
Ovçu, maralı qoyma.
Oxun sinəmdə qaldı
Öldür, yaralı qoyma.

Aşıq Yaxşıdan, Yaxşı,
Xalın yaxşıdan, yaxşı.
Sərraf baxdı, bəyəndi,
Dedi, yaxşıdı, Yaxşı.

Aşıq yaramı bağlar,
Təbib yaramı bağlar.
Könül istər, əl çatmaz
Kəsib aramı dağlar.

Aşıq kəncəli dağlar,
Dibi yoncalı dağlar.
Yarından ayrı düşən
Haçax dincəli, dağlar?

Aşıq günlər uzunu,
Tel sünbüllər uzunu.
Çəkərəm yar həsrətin
Aylar, illər uzunu.

Aşıq min aya gələ,
Qurban Minaya gələ.
Sənsiz qərarım gəlməz,
Göydən min ayə gələ.

Aşıq naşı əlindən,
Ağlar naşı əlindən.
Yastıq şikayət elər,
Gözüm yaşı əlindən.

Aşıq süzgün gözlərin,
Qəmdən üzgün gözlərin.
Yaxşıdan doya bilməz,
Baxsa yüz gün gözlərin.

Aşıq hər aya çatar,
Müşkül hər aya çatar.
Can çıxdı, canan gəlməz,
Haray haraya çatar?

Aşığam aralandım,
Ox dəydi yaralandım.
Mən səndən ayrılmazdım.
Zülm ilə aralandım.

Aşığam arxa bəsdi,
Dəhnədən arxa bəsdi.
Zərrəcə üzün görsəm
Arxa-baarxa bəsdi.

Mən aşıq həkim dərdi,
Doğrayım, töküm dərdi.
Nə anam var, nə bacım,
Kiminən çəkim dərdi.

Mən aşıq çəkənə ver,
Doldurub çəkənə ver,
Bu dərdi çəkənmərəm
Aparıb çəkənə ver.

Mən aşığam baxtı kəm,
Taleyi kəm, baxtı kəm.
Mən fələyə neylədim?
Fələk mənə baxdı kəm.

Mən aşığam yüz qandı,
Əlli qandı, yüz qandı.
Ev yıxmaq bir qandısa,
Könül yıxmaq yüz qandı.

Mən aşığam gündə sən,
Kölgədə sən, gündə sən.
Can alan bir gün olar.
Canım aldın gündə sən.

Mən aşığam oyanmır,
Yar qəflətdən oyanmır.
İkimiz də oddayıx,
Mən yanıram, o yanmır.

Mən aşığam sarı qız,
Sarı köynək, sarı qız.
Sinəm tabutun olsun,
Saçın ilə sarı, qız.

Bağında qora dəydi,
Yeməyə qora dəydi.
Kəsərəm dilim, səni
Nə dedin, yarə dəydi.

Qarşıda qəm oyanı,
El yatar, qəm oyanı.
Dəryalar oya bilməz,
Ürəkdə qəm oyanı.

Qarşıda, dağda nə var,
Ayıl gör dağda nə var.
Kül başına, a Məcnun,
Leylisiz dağda nə var?

Qarşıda, daşda nə var,
Su gəldi, daşda nə var?
Aşığı göz öldürər,
Kirpikdə, qaşda nə var?

Qarşıda dərdi-nalam,
Artıbdı dərdi-nalam.
İstərəm dərd bilməzin
Əlindən dərdin alam.

Qarşıda gül azardan,
Yol gedər Güləzardan.
Xarın ölsün, a bülbül,
Qurtarsın gül azardan.

Qarşıda öz əcalı,
Sonalar üzə calı.
Canansız ölməz aşıq,
Yetişsə yüz əcalı.

Mən Aşıq yüz yerdə üz.
Sona tək yüz yerdə üz.
Kirpiklər kölgə salıb
Yanlıb yüz yerdə üz.

Mən Aşığam üzü şur,
Sonam göldə üzüşür.
Milçək, qanad tərpətmə
Tel tərpənər, üz üşür.

Zülfün suda mar kimi,
Oynar su damar kimi.
Sızıldatdın Aşığı
Yağa su damar kimi.

Mən Aşığam qanlı gül,
Qanlı çiçək, qanlı gül.
Yeyib bülbül bağrını
Çıxıb ağzı qanlı gül.

Aşıq Qaramanlıdı,
Xalın qaramanlıdı.
Yarın soyuq üzündən
Yenə qar amanlıdı.

Aşığı tərsinə qoy,
Tər təni tər sinə qoy.
Yaxşını qibləsinə,
Aşığı tərsinə qoy.

Mən Aşığam gül əllər,
Ağ biləklər, gül əllər,
Dəryaca ağlın ola
Yoxsul olsan güləllər.

Aşıq yaza nə qaldı?
Halın yazana qaldı.
Qələmdə nə günah var
İnsaf yazana qaldı.

Aşıq yaralar məni,
Zülfün yaralar məni.
Sənsiz yerə girmərəm
Döşək yaralar məni.

Gözəllik soy iləndi,
Şahmar da soy ilandı.
Nəsimi tək yolunda
Bu Aşıq soyulandı.

Mənzurumuz yenə sən,
Səfa gəldin yenə sən.
Fikrim, zikrim, xəyalım
Sən, sən, sən, sən - yenə sən

Bu gələn kim? Sənəmdi,
Kim mənim kimsənəmdi?
Nə kimin kimsəsiyəm,
Nə kimsə kimsənəmdi.

Mən aşığam sarı gül,
Yarı qönçə, yarı gül.
Gec açıldın, tez soldun
Açmayaydın barı, gül.

Yox Aşıq, sən əm, sən əm,
Xoş gəldin Sənəm, Sənəm.
Dedim: ləbin kim əmsin?
Dedi yar: sən əm, sən əm.

## GÜLŞAD
(?—?)

*XVI-XVII əsrlərdə yaşayıb yaratmış Azərbaycan şairəsidir. Şeri Əzizə xanım Cəfərzadənin tərtib etdiyi "Azərbaycanın aşıq və şair qadınları" kitabından götürülmüşdür.*

Göydən ötən bölgü-bölgü durnalar,
Bizdən salam olsun Əcəm elinə.
Yaşıl geymiş sarı telli durnalar,
Bizdən salam olsun Əcəm elinə.

Bizi apardılar tatar xanına
Fitvanı verdilər yesir qanına.
Bir namə göndərdim Məşhəd kanına
Bizdən salam olsun Əcəm elinə.

Bizi göndərdilər Şahiseridən,
Rum ölkəsi varid oldu yesirdən.
Ol Şamü Hələb, şəhri Misirdən
Bizdən salam olsun Əcəm elinə.

Beş qız idik bir arada, bu yerdə,
Ya İlahi, dərman elə bu dərdə!
Canım durna, hər vətəndə, hər eldə
Bizdən salam olsun Əcəm elinə.

Axan çaylar yesirlərin yaşıdır,
Ahu-naləm göydə mələk eşidir.
Canım durna, çərxi-fələk işidir
Bizdən salam olsun Əcəm elinə.

Budur gəldi yesirlərin karvanı,
Çağırıram, ya mövlana, ya qəni!
Qara geydi Əcəm pirü cavanı,
Bizdən salam olsun Əcəm elinə.

Bizi ayırdılar ata-anadan,
Ya rəbbim, sən qurtar bu qəmxanadan!
İstanbul şəhrindən, Qostantinadan
Bizdən salam olsun Əcəm elinə.

Bu sözü söyləyən yanar özündən,
Yaş yerinə qan tökülər gözündən.
Məlik, gəl qan bu Gülşadın sözündən
Bizdən salam olsun Əcəm elinə.

# DASTANLARDAN ŞERLƏR

## "TAHİR — ZÖHRƏ" DASTANINDAN

*"Tahir — Zöhrə" dastanı çox qədim astral köklərə malik olan və Anadolu, Azərbaycan, Orta Asiya türkləri arasında geniş yayılmış məhəbbət dastanıdır.*

### BÜLBÜL

Səhərin gülşən çağında
Nə gezirsən bağı, bülbül!
Oxudun, ağlım apardın,
Oldun mənə yağı, bülbül!

Bülbül sənin işin qandı,
Aşıqlar oduna yandı.
Nədən hər yerin əlvandı,
Köksün altı san, bülbül!

Bülbül, sən dala səkərsən,
Göz yaşın gilə tökərsən,
On bir ay cəfa çəkərsən
Bir ayı da zarı, bülbül!

Bülbül, geyibsən al yaşıl,
Qolların boynumdan aşır.
Ağlamaq mənə yaraşır,
Qoy ağlayım barı, bülbül!

Bülbül, sən məni qandırdın,
Gülşən bağın dolandırdın.
Axır oduna yandırdın
Yazıq xan Tahiri, bülbül!

Bülbül, səni kim uçurtdu,
Kim daldan dala qaçırtdı?
Kim sənə badə içirtdi,
Kimlər oldu saqi, bülbül?

Gecələr yarı keçəndə,
Bülbül yuvadan uçanda,
Zöhrə yar badə içəndə
Mən olaydım saqi, bülbül!

Sevdim gözəllər xasından,
Bu ellərin sonasından.
Getmir Tahir sinəsindən
Zöhrə yarın dağı, bülbül!

## NƏRGİZ

Budur gəldi bahar fəsli,
Açılıbdır lala, Nərgiz!
Ağız süddü, dodaq qaymaq,
Dilin batıb bala, Nərgiz!

Gedərsən Çinə, Maçinə,
Mişk, əmbər səpdin saçına.
Bənzəyirsən ağ laçına,
Hey cumarsan gölə, Nərgiz!

Kəsibsən aşiqin yolun,
Qırıbsan qanadın, qolun.
Tuti kimi ötür dilin,
Dönübsən bülbülə, Nərgiz!

Alayıbsan, alayıbsan,
El-obanı talayıbsan.
İpək şəddə dolayıbsan,
Şal üstündə belə, Nərgiz!

Ha deyirəm: xanım, xanım,
Od tutdu cəsədim, canım.
Töhmət altda çıxdı canım,
Rəhmin gəlsin qula, Nərgiz!

Uca-uca dağlar qaldı,
Gülü solmuş bağlar qaldı,
Zöhrə yarım ağlar qaldı,
Dur, sal məni yola, Nərgiz!

## YADIMA DÜŞDÜ

Qızlar, gəlin sizə halım söyləyim,
O keçən günlərim yadıma düşdü.
Tahirin yanında məktəbxanada
O dərs oxuduğum yadıma düşdü.

Səhər-səhər Tahir evə gələrdi,
Şirin-şirin söhbət açıb gülərdi.
Ürəyimi alıb eynim silərdi,
Gülüb danışdığım yadıma düşdü.

Mən Zöhrəyəm, beli incə, boy bəstə,
Zülfü dal gərdəndə çin, dəstə-dəstə.
Yerini salardım mən sinəm üstə,
Əyləndiyim günlər yadıma düşdü.

## SEL MƏNƏ NEYLƏR

Başına döndüyüm alagöz xanım,
Qoy aparsın görüm, sel mənə neylər?
Sənə qurban olsun bu şirin canım,
Qoy aparsın görüm, sel mənə neylər?

Əmib-əmib ləblərindən qandığım,
Pərvanə tək şam oduna yandığım,
Müşəmbələ, at dəryaya sandığım
Qoy aparsın görüm, sel mənə neylər?

Əlbət belə imiş qəzanın işi,
Gecə-gündüz mən eylərəm təşvişi.
Yusifi quyudan çıxaran kişi,
Qoy aparsın görüm, sel mənə neylər?

Mən Tahirəm, sözü deyim mərdana,
Şikayətim vardı Qadir sübhana.
Qoy sandığa, tulla məni ümmana,
Qoy aparsın görüm, sel mənə neylər?

## GEDƏRSƏN

Qanlı dərya nə axarsan selabda,
Axıb, axıb nə məkana gedərsən?
Qoymagilən sandıq qala girdabda,
Götür apar hər bir yana gedərsən.

Payız olur, bağlar tökər xəzəli,
Boynun sınsın, sevməyəydin əzəli.
Yaxşı olar Şəki, Şirvan gözəli
Ya Şəkiyə, ya Şirvana gedərsən.

Ağlaram gözümdən tökərəm qanı,
Fəryadıma yetiş xanların xanı.
Göz yaşım kaş qurudaydı dəryanı
Götür apar, Həştərxana gedərsən.

Yazıq canım Tahir Mirzə qəmində,
Heç olmadım söhbətində, dəmində,
Nə çalxalanırsan gedən gəmində
Bağışlarsan Süleymana gedərsən.

Zöhrə necə dözsün bu ahu-vaya?
Cavan ikən qəddin dönübdü yaya.
Qoyuban sandığa atdılar çaya
Dalğalanıb sən hər yana gedərsən.

## "ƏSLİ - KƏRƏM" DASTANINDAN

*Şerlər "Əsli - Kərəm" dastanının (XVII əsr) bir-birindən cüzi fərqlənən Azərbaycan və Anadolu variantlarından götürülmüşdür.*

### RÜSVAY EYLƏMƏ

Nə gəzirsən məlul-məlul bu yerdə?
Aman Kərəm, məni rüsvay eyləmə!
Səni mənə qismət eyləyib Xuda,
Aman Kərəm, məni rüsvay eyləmə!

Heç olurmu bu yerlərdə belə iş?
Keşiş babam duyub eyləyər təftiş.
Öpdün də, qucdun da, artıq var, sovuş,
Aman Kərəm, məni rüsvay eyləmə!

Doymamışam şəkər kimi dilindən,
Qorxum yoxdu mənim əsla ölümdən.
Sarılıbsan incə miyan belimdən
Aman Kərəm, məni rüsvay eyləmə!

Ağam Kərəm, paşam Kərəm, xan Kərəm!
Alış Kərəm, tutuş Kərəm, yan Kərəm!
Əsli olsun sənə qurban, can Kərəm!
Aman Kərəm, məni rüsvay eyləmə!

### SƏRV AĞACI, SƏNİN MARALIN HANI?

Dur, sərv, dur, səndən xəbər sorayım,
Sərv ağacı, sənin maralın hanı?
Gözümnən axıtma qanlı yaşları,
Sərv ağacı, sənin maralın hanı?

Alçaqlı-ucalı qarşıda dağlar
Könlüm intizardı, gözüm qan ağlar.
Xəstənin halını nə bilər sağlar?
Sərv ağacı, sənin maralın hanı?

Doğru söyləməsən qəddin əyilsin,
Qarğaram Mevladan belin bükülsün.
Bir ah çəkim yarpaqların tökülsün,
Sərv ağacı, sənin maralın hanı?

Kərəm deyər: göz yaşları tökərəm,
Viran bağda bülbül olub ötərəm,
Əsli xan yolunda başdan keçərəm,
Sərv ağacı, sənin maralın hanı?

## SİZİN OLSUN

Məndən küsən nazlı-nazlı bacılar,
Mən kənardan keçim, yol sizin olsun!
Yrəyimdə çoxdu qəmlər, acılar,
Ağular mənimki, bal sizin olsun!

Mən yolçuyam, yollar keçib gedirəm,
Eşqin qatarını çəkib gedirəm.
Yanıqlıyam, su ver , içib gedirəm,
Bir cam verin içim, dol sizin olsun!

Sinəm düyünlüdü, ciyərim qara,
Əslisiz qalmışam qəmgin, avara.
Baş götürüb getdim çölə, diyara,
Viranələr mənim, el sizin olsun!

Mey içib məst olmaq yaraşmaz bizə,
Yarı gərək tapam mən gəzə-gəzə.
Bir qonça gülüm var, təzə, tər-təzə
Yengidən açılan gül sizin olsun!

Dərdli Kərəm deyər: gözəlim Əsli,
Gözlərim yaşlıdı, ürəyim paslı.
Ondan ayrılalı yaslıyam, yaslı,
Mən qara geyinim, al sizin olsun!

## BƏNZƏMƏZ

Seyr eylədim Gürcüstanın elini,
Elləri var - bizim elə bənzəməz.

Barlı baxçaları, qarlı dağları,
Gülləri var - bizim gülə bənzəməz.

Alimləri yazı yazar - mənadı
Gülləri var - min bir dərdə davadı.
Gözəlləri, məhbubları əladı,
Malları var - bizim mala bənzəməz.

Başlarına keçə papaq qoyarlar,
Çağıranda "modi, modi" deyərlər.
Gəlin, qızlar al yaşılı geyərlər
Dilləri var - bizim dilə bənzəməz.

Coşğun-coşğun çaylarını keçmişəm,
Sərin-sərin sularını içmişəm,
Kərəm deyər: dilbərlərin seçmişəm,
Halları var - bizim hala bənzəməz.

## DƏRD MƏNİ

Aman fələk, kömək eylə bu gündə,
Nagah yerdə gəldi aldı dərd məni.
Gecə-gündüz oda yandım, alışdım
Tutdu, yolum-yolum yoldu dərd məni.

Qürbət eldə uca dağlar aşalı,
Ah etdikcə qara bağrım deşəli,
Mən Əslimdən ayrı düşdüm. Düşəli
Dəlik-dəlik etdi, dəldi dərd məni.

Fələk mənim ilə inad eylədi,
"Qəm ilə hicrandı töhfən" - söylədi,
Kəskin qılıcıyla bağrım teylədi,
Bölük-bölük etdi, böldü dörd məni.

Gecə-gündüz kəsməz gözümün yaşı,
Saldı qanlı fələk başıma daşı.
Ərzurum dağında keçirdim qışı,
Axır çöldən-çölə saldı dərd məni.

Bilməm xəyalmıdı, yoxsa duş kimi,
Gəldi keçdi boran kimi, qış kimi,
Dərdli Kərəm, yuvasında quş kimi
Tutdu, yolum-yolum yoldu dərd məni.

## DAĞLAR

Qarşı duran qarlı dağlar
Dağlar bizim dağlarmola?
Ağ birçəkli qoca anam
"Oğul" deyib ağlarmola?

Məkkədən gələn hacılar,
Ürəyimdə var acılar.
Evimizdə cüt bacılar
"Qardaş" deyib ağlarmola?

Fələk nədi mənim xatam?
Nə məlulam, nə də şadam.
Ağ saqqallı qoca atam
"Kərəm" deyib ağlarmola?

## ƏRZURUMUN GƏDİYİNƏ VARANDA

Ərzurumun gədiyinə varanda
Onda gördüm burum-burum qar gəlir.
Lələ dedi: gəl, bu yoldan qayıdaq
Dedim dönmək namusuma ar gəlir.

Əzəldən mayılam o ala gözə,
Darayıb zülfünü töküb gül üzə.
Xocalar yük tutub çıxdılar düzə
Elə bildim karvan ilə yar gəlir.

Kərəməm, qürbətə saldım yolumu,
Tərk elədim namusumu, arımı.
Boran, alma əldən nazlı yarımı,
Gen dünya başıma yenə dar gəlir.

## ALTI QIZLAR

Altı qızın biri Banı,
Altı qızlar, altı qızlar.
Bizə məhəbbətin hanı?
Altı qızlar, altı qızlar.

Altı qızın biri İnci,
Gözəllikdə lap birinci.
Qoynunda iki turuncu
Altı qızlar, altı qızlar.

Altı qızın biri Püstə,
Dərdindən olmuşam xəstə.
Qoy qədəmin sinəm üstə
Altı qızlar, altı qızlar.

Altı qızın biri Ceyran,
Oldum gözlərinə heyran.
Sizlə kaş sürəydim dövran
Altı qızlar, altı qızlar.

Altı qızın biri Xədcə,
Qəddi əlif, beli incə.
Gözəl görməmişəm səncə
Altı qızlar, altı qızlar.

Altı qızın biri Bəsdi,
Gözləri canımın qəsdi.
Bu dərdlər Kərəmə bəsdi
Altı qızlar, altı qızlar.

## YAXAN DÜYMƏLƏ, DÜYMƏLƏ...

Sallanıban gələn dilbər,
Yaxan düymələ, düymələ...
Məni dərdə salan dilbər,
Yaxan düymələ, düymələ.

Al geyib yaşıl bürünər,
Zülfləri yana hörülər,
Yel vurar, məmən görünər
Yaxan düymələ, düymələ.

Yaxan çarpaz ilişməsin,
Heç kim dinib danışmasın,
Yadlar görüb gülüşməsin
Yaxan düymələ, düymələ.

Köynəyinin gülü yaşıl,
Süsən sünbülə dolaşır.
Gözəllik sənə yaraşır
Yaxan düymələ, düymələ.

Əyninə geyinib şilə,
Bizi tutub şirin dilə.
Zər kəmər çək incə belə
Yaxan düymələ, düymələ.

Kəlağayın ucu sarı,
Açılır könlüm qubarı.
Söylə görüm kimin yarı?
Yaxan düymələ, düymələ.

Kərəm sənə nələr demiş,
Dilin, dodağını yemiş.
Kətan köynək, bəndi gümüş,
Yaxan düymələ, düymələ.

## YOX

Qürbət eldə qərib-qərib ağlaram,
Müşkül halım bildirən yox, bilən yox.
Gecə-gündüz fəqan qılıb yanaram,
Ağlayan yox, güldürən yox, gülən yox.

Tərk eylədim mən atamı, anamı,
Gölümdən uçurdum telli sonamı.
Xəncər alıb dərd oylağı sinəmi
Teyləyən yox, dəldirən yox, dələn yox.

Dərdli sinəm düyünlərəm, dağlaram,
Ağ geymərəm, qaraları bağlaram.
Dərd əlindən ah çəkərəm, ağlaram
Gözüm yaşın silən yoxdur, silən yox.

Kərəməm, yetmədim mən Əsli xana,
Pay bildim ölümü bu yazıq cana.
Gecə-gündüz qafilə işlər hər yana
Üz çevirib bu viranə gələn yox.

## YANIRAM

Gəl Əslim, gəl, gəl ağlama,
Yanıram, Əslim, yanıram!..
Ciyərim odla dağlama,
Yanıram, Əslim, yanıram!..

Bir atəş düşdü canıma,
Anam yox gəlsin yanıma.
Ellər ağlasın halıma,
Yanıram, Əslim, yanıram!..

Çəkdicəyim dərdlə ələm,
Mənnən ibrət alsın aləm,

Belə çalınıbdı qələm,
Yanıram, Əslim, yanıram!..

Kərəməm, söylənir adım,
Ərşə çıxıbdı fəryadım,
Əlimnən getdi muradım,
Yanıram, Əslim, yanıram!..

## BU DƏRDƏ

Baxın qızlar mənim müşkül halıma,
Yandı Kərəm, saldı məni bu dərdə.
Əydi qamətimi, bükdü belimi,
Yandı Kərəm, saldı məni bu dərdə.

Bizə haqdan bir inayət olurmu?
Macəramız xoş rəvayət olurmu?
Məhşərdə görüşmək qismət olurmu?
Yandı Kərəm, saldı məni bu dərdə.

İtirmişəm bu meydanın mərdini,
Bülbül udub, xar alıbdı yurdunu.
Necə çəkim bu ayrılıq dərdini?
Yandı Kərəm, saldı məni bu dərdə.

Mən Əsliyəm, itirmişəm mərdimi,
Bülbül uçub, xar alıbdı yurdumu,
Açın məzarını, görüm üzünü,
Yandı Kərəm, saldı məni bu dərdə.

## *DASTANIN ANADOLU VARİANTINDAN*

Şakı bülbül, şakı, bahar erişdi,
Şakıyıb ötmənin zamanı gəldi.
Qırmızı gül budağına erişdi,
Qoparıb qoxmanın zamanı gəldi.

Mənim sevdiciyim gəlir naz ilə,
Bağrımı dəliyor sitəm, söz ilə,
Qırmızı badələr ciftə saz ilə,
Çağırıb içmənin zamanı gəldi.

Mənim sevdiciyim incə bellidir,
Qəmzəsində siyah ciftə bənlidir,
İçində eşqi olan bəllidir
Aşiq, eşq qılmanın zamanı gəldi.

Öksüz Kərəm bunu boylə söylədi,
Endi eşqin dəryasını boyladı,
Səlvi boylu bizi abdal eylədi
Sarılıb yatmanın zamanı gəldi.

## NECƏ EDƏYİM KÖNÜL, SƏNDƏN

Necə edəyim könül, səndən?
Mən dönərəm, könül dönməz.
Bir yavruya düşdü könül
Mən dönərəm, könül dönməz.

Kəklik kimi səkişindən,
Əlvan qəlvan naxışından,
Bir hərami baxışından,
Mən dönərəm, könül dönməz.

Qaş oynadırsa gözündən,
Məni istərsə özündən,
Əsli bir kafir qızından
Mən dönərəm, könül dönməz.

Yoluna qoymuşam canı,
Didəmdən axıtdım qanı.
Kərəm sevdi Əsli xanı,
Mən dönərəm, könül dönməz.

## "AŞIQ QƏRİB" DASTANINDAN

*"Aşıq Qərib" dastanı (XVII əsr) Azərbaycanda, Anadoluda və "Şahsənəm və Qərib" adıyla Türkmənistanda çox məşhurdur. Örnək verdiyimiz şerləri dastanın bir-birindən cüzi fərqlənən hər üç variantından götürmüşük.*

Məni oda salan gözəl sənəmi
Sevsəm öldürərlər, sevməsəm ölləm.
Ürəyimi yaxan gizli dərdimi
Desəm öldürərlər, deməsəm ölləm.

Qurban olum yarın qəddi boyuna,
Görən kimsə valeh olur muyuna?
Hərdən xəlvət gəlib onun kuyuna
Varsam öldürərlər, varmasam ölləm.

Gəlin qulaq verin yarın oynuna,
Altun, cövhər heykəl salıb boynuna.
Mən Qəribəm, Şahsənəmin qoynuna
Girsəm öldürərlər, girməsəm ölləm.

### TƏBRİZİN

Ay ağalar, gəlin sizə söyləyim
Açılar baharda gülü Təbrizin.
Toyda, bayramlarda atlaz geyərlər
Kəsilməz yaşılı, alı Təbrizin.

Təbrizin ətrafı dağdır, meşədir,
İçində oturan bəydir, paşadır.
Səkkiz min məhəllə, beş min küçədir.
Çarşısı, bazarı, yolu Təbrizin.

Pəhlivanlar qisvət geyir, yağlanır,
Cümlə bəzirganlar burda əylənir.
Üç yüz altmış yükü birdən yüklənir
Əldən-ələ gəzər malı Təbrizin.

## HƏLƏB ŞƏHRİ

Şükür olsun yaradana
Sənə gəldim, Hələb şəhri.
Ayrı düşdüm vətənimdən
Sənə gəldim, Hələb şəhri.

Ayrıldım qonça gülümdən,
Köksü sarı bülbülümdən,
Bir kəkilli sünbülümdən
Sənə gəldim, Hələb şəhri.

Ayrıldım nazlı yarımdan,
Üzüm gülməz ah-zarımdan.
Ayrılıban həmtayımdan
Sənə gəldim, Hələb şəhri.

## TİFLİS

Min qovğalar çəkdi başım
Axır çatdım sənə, Tiflis.
Baxım sənə qoy doyunca
Axır çatdım sənə, Tiflis.

Siyah saçları darandı,
Canım həsrətində yandı.
Sinəmin qəsri göründü
Axır çatdım sənə, Tiflis.

Aşıq Qərib gəldi elə,
Gəzər bağı gülə-gülə.
Gəldiyimi yara söylə
Şükür gəldim sənə, Tiflis

## *DASTANIN ANADOLU VARİANTINDAN*

## QOLUNA BAĞLADIM TELİ

Qərib:

Qoluna bağladım teli,
Qonuşurdun yetmiş dili.
Unutdunmu sazım məni?
Qonuş sazım mənim ilə.

Saz:

Vəsfi-halımdan bilmədin,
Sən gedəli mən gülmədim,
Yeddi il xəbər almadım
Qonuşamam sənin ilə.

Qərib:

Qoluna bağladım pərdə,
Sən uğratdın məni dərdə.
Yeddi ildi Qərib nerdə?
Qonuş sazım mənim ilə.

Saz:

Sinəm divara yaslandı,
Qolumda tellər paslandı,
"Qərib ölmüşdür" səsləndi
Qonuşamam sənin ilə.

Qərib:

Qərib qurbandır soyuna,
Sənəmin səlvi boyuna,
Gedək Sənəmin toyuna
Qonuş sazım mənim ilə.

Saz:

Qar quşandı könül dağı,
Çürüdü sinəmin bağı,
Sinəmin dəstində ağı
Qonuşamam sənin ilə.

## QÜRBƏT ELDƏ BAŞ YASTIĞA GƏLƏNDƏ

Qürbət eldə baş yastığa gələndə,
Qayət yaman olur işi qəribin.
Gələn olmaz, gedən olmaz yanına
Siyah torpağıyla daşı qəribin.

Yazıq oldu bu Qəribin halına
Doymaq olmaz ləzzətinə, dadına.
Hər gəldikcə yaraların yadına
Durmaz əsla çeşmi yaşı qəribin.

Qürbət elə qərib gedən bilinməz,
Ağlayınca çeşmi yaşı silinməz,

Qərib, nədir halın? - deyə sorulmaz.
Bulunmaz yaranı, eşi qəribin.

Gülməz hara getsə qəribin üzü,
Kirlidir yaxası, yaşlıdır gözü.
Açmaz bir yol kimsəyə gizli sözü,
Məhəbbətdir bir sirdaşı qəribin.

Qürbət eldə mən Qəribə kim baxsın?
Anam yoxdur. gəlib göz yaşı töksün.
Sənəm yoxdur məzarıma daş tiksin
Bir çalıdır məzar daşı qəribin.

## *DASTANIN TÜRKMƏN VARİANTINDAN*

Ey yaranlar, musurmanlar
Nə oldu, yarım gəlmədi?
Doğan qardaş, mehribanlar
Nə oldu, yarım gəlmədi?

Gələrəm deyib vəd etdi,
Gələr vədəsindən ötdü.
Ertədən çaş vaxta yetdi,
Nə oldu, yarım gəlmədi?

Qızıl güllər dəstə oldu,
Dəstələr bibəstə oldu.
Məgər Sənəm xəstə oldu,
Nə oldu, yarım gəlmədi?

Ya birinin pəndin aldı,
Ya bir qeyri ilən oldu,
Ya bir yavuz dərdə qaldı,
Nə oldu, yarım gəlmədi?

Bu dərdlər necə dərd oldu?
Yandı ürəyim zərd oldu.
Gözüm yolunda dörd oldu,
Nə oldu, yarım gəlmədi?

Dərdli qul istər təbibin,
Heç kişi bilməz nəsibin,
Sənəm ağlatdı Qəribin
Nə oldu, Sənəm gəlmədi?

## BAHAR OLDU

Bahar oldu, gül açıldı
Mənim gülüm açılmazmı?
Bülbülün qanı saçıldı
Mənim qanım saçılmazmı?

Xəbərim yox, bahar oldu,
Çəmənlər lalězar oldu.
Qəribimdən xəbər gəldi
Gələn yollar açılmazmı?

Dövlətlidən dövlət getdi,
Növbət rəqiblərə yetdi,
Saqi əcəl meyin tutdu,
Kəfən donum biçilməzmi?

# BAŞQA AZƏRBAYCAN DASTANLARINDAN

## "ŞAH İSMAYIL" DASTANINDAN

Aldı Ərəb Zəngi:

Yenə qafil bir ov çıxdı qarşıma,
Hürküb ovçusundan, baş verib gedər!
Qorxusundan dodaqları çatlayar,
Ağlayıb, gözündən yaş verib gedər!

Aldı Şah İsmayıl:

Qəndəhardan gəldim murad almağa,
Yol ver, ərəb, yol ver, incitmə məni!
Mən gəlmədim bu diyarda qalmağa,
Yol ver, ərəb, yol ver, incitmə məni!

Aldı Ərəb Zəngi:

Çoxları adlayıb o yandan bəri,
İyidlər əlimdən çəkiblər zarı.
Kəllədən minara, leşdən hasarı,
Buraya gələnlər baş verib gedər!

Aldı Şah İsmayıl:

Qaradır qaşların, Kəbə meracı,
Çəkərəm, yıxaram hasarı, bürcü.
Kəsərəm başını, yoxdu əlacı,
Yol ver, ərəb, yol ver, incitmə məni!

Aldı Ərəb Zəngi:

Oğlan, mey içmisən, yoxsa da bəngi?
Qorxudan saralıb üzünün rəngi.
Hələ eşitmədin Ərəb Zəngi?
Çox sənin kimilər baş verib gedər!

Aldı Şah İsmayıl:

Bir sən bax qaynağıma, coşuma,
Əl vura bilməzsən tərlan quşuma.
Bax Şah İsmayılın tər savaşına,
Yol ver, ərəb, yol ver, incitmə məni!

## "NOVRUZ - QƏNDAB" DASTANINDAN

Gecə ayaz, gündüz bulud,
Qaldım dəryada, dəryada!
Ana, köynəyimi qurud,
Qaldım dəryada, dəryada!

Bu dəryada balıq çoxdu,
İnsanatda ölüm haqdı.
Beş arşın kəfənim yoxdu,
Qaldım dəryada, dəryada!

Novruz ağlar yana-yana,
Balıqlar oldu divana.
Yandı bağrım, döndü qana,
Qaldım dəryada, dəryada!

## "ŞAHZADƏ ƏBÜLFƏZ" DASTANINDAN

Aç şəhla gözünü, yuxudan oyan,
Pozğun əhvalına qurban olduğum!
Məni məcnun edib çöllərə qoyan,
Mələk surətinə qurban olduğum!

Kəsdirmişəm nazbalışın yanını,
Sanamışam kirpiklərin sanını,
Nə tapmısan bu yuxunun kamını?
Oyan, gözlərinə qurban olduğum!

Nifsi-şəbdə yatmışıdım, oyandım,
Eşqin atəşinə alışdım, yandım,
Məhəbbət yolunda möhkəm dayandım,
Gəzən yerlərinə qurban olduğum.

Eşqindən olmuşam dəli-divana,
Yanmışam odunda misli-pərvana.
Kimdir səni bulaşdıran al qana?
Sərv qamətinə qurban olduğum.

Rəna qurban olsun qara telinə,
Bu gül camalına, miskin halına.
Qönçə dəhanına, şirin dilinə,
Ahu baxışına qurban olduğum!

## "ŞƏHRİYAR VƏ SƏNUBƏR" DASTANINDAN

Dedi Şəhriyar:

Şükr olsun allaha yetdim murada,
Məni dərdə salan yarım budur, bu!
Mevlam tofiq verib tutdum damənin,
Kəssələr dəstimi qoymam, budur, bu!

Dedi Sənubər:

Kəm ağılsan ağlın gedib sənin də,
Kimə dersən mənim yarım budur, bu?
Buyurram cəllada tökülər qanın,
Dəxi demə mənim butam budur, bu!

Dedi Şəhriyar:

Vallah xanım, mən ölümdən qorxmanam,
Töksələr qanımı heç qarıxmanam.
Səndən qeyri özgə yara baxmanam,
Badə verən deyib yarım budur, bu!

Dedi Sənubər:

Buyurram qullara, çəkərlər darə,
Vətənə avarə oldun, biçarə.

Düşərsən ah-zarə, çox intizarə,
Tövbə eylə, demə yarım budur, bu!

Dedi Şəhriyar:

Çəkdir məni darə zülfü zünnarə,
Vətəndən avarə yetişdim yarə.
Sən çeşmi-xummarə, tazə dildarə
Baş qoyum kənarə yarım budur, bu!

Dedi Sənubər:

Get bu yerdən, vallah, babam bilməsin,
Xişmə gəlib sənə qəzəb qılmasın.
Rəqiblərin səni burda görməsin,
Bir də demə mənim yarım budur, bu!

Dedi Şəhriyar:

Çox vaxt vardır atan gəlib söyləmiş,
Ərzə yazıb halı məlum eyləmiş,
Gərək oğlun gələ vədə eyləmiş,
Baban iqrar edən yarım budur, bu!

Dedi Sənubər:

Doğrudur, hörmətdə vacibdir ata,
Gərəkdir o məndən bir riza tuta.
Mən kəniz deyiləm, o məni sata
Oğlan, bir də demə yarım budur, bu!

Dedi Şəhriyar:

Vallah, mən bilirəm, içibsən badə,
Sənin eşqin məndən dəxi ziyadə.
Şəhriyaram, billah fani dünyadə
Nə cəfa versələr, yarım budur, bu!

Dedi Sənubər:

Yaxşı tanıyıbsan, tapıbsan məni,
Möhkəm tut dəstindən, qoyma daməni.
Sənubər təcrübə edirdi səni,
Sözün doğru, doğru yarın budur, bu!

Dedi Sənubər:

Başına dolanım, qurbanın olum,
Ala gözlü Şəhriyarım incinmə.
Kəsilibdir səbrim, vallah qərarım
Həddən aşıb intizarım, incinmə.

Dedi Şəhriyar:

Çox nadanlar dəli deyib güldülər,
Həkim, təbib mənə cəfa verdilər.
Ata-ana hal pərişan oldular
Gündün-günə artdı zarım incinmə.

Dedi Sənubər:

Şərareyi-eşqə qalmadı tabım,
Həram oldu yemək, kəsildi xabım.
Hökm oldu bağlansın əlim-ayağım,
Yetişdi bu yerə karım, incinmə.

Dedi Şəhriyar:

İstərdim bir həkim, dərdimənd ola,
Əhvalım söyləyəm, bir çarə qıla.
O əsnada usta Sadıq gəldi elə
Ərz elədim ruzigarım, incinmə.

Dedi Sənubər:

Ağlardım sübhü şam, leylü nəharı,
Könül həsrət çəkər, görə dildarı.
Sənubər göz gördü o Şəhriyarı,
Kəsilibdir ahu-zarım, incinmə.

# XVIII ƏSR TÜRKİYƏ ŞAİRLƏRİ

## NƏDİM
(?—1730)



*Orta çağ Türkiyə ədəbiyyatının görkəmli nümayəndələrindən biri olan Nədimin əsl adı Əhmədədir. İstanbulda yaşamışdır. Nədim türk şeri tarixində böyük xidmətlər göstərmişdir. "L a l ə" dövrünün şairi kimi tanınan Nədim qəzəllərini və özəlliklə heca vəznində yazdığı şerlərini sadə bir dildə yaratmış, xalq ifadələrindən, İstanbul şivəsindən geniş istifadə etmişdir. Cümləni bir beytdə bitirməyib ikinci beytə keçirməsi də Nədimin türk şerinə gətirdiyi yeniliklərdəndir. Nədim öz zəmanəsində həqiqi qiymətini almamışdır. Onun böyüklüyünü yalnız Tənzimat dövründən sonra anlamağa başlamışlar. Nədim daha çox eşq mövzusunda yazmışdır. XX əsr şairlərindən bir çoxunda, ilk öncə də Yəhya Kamal Bayatlıda Nədimin təsiri hiss olunur.*

### QƏZƏLLƏR

Məsti-nazım, kim böyütdü böylə bipərva səni
Kim yetişdirdi bu günə sərvdən bala səni?

Buyidən xoş, rəngdən pakizədir nazik tənin,
Bəsləmiş qoynunda guya kim güli-rəna səni.

Güllü ziba geydin amma qorxuram azar edər,
Nazəninin sayei-kari-gülü ziba səni.

Bir əlində gül, bir əldə cam gəldin, saqiya!
Hankisin alam-gülü, yaxud ki, camı, ya səni?

Sandım olmuş çəsdə bir fəvvareyi abi-həyat,
Boylə göstərdi mənə ol qəddi-müstəsna səni.

Saf ikən ayineyi əndamindən sinəm, dirig!
Alamam bir kərrəcik ağuşa sər-taba səni.

Mən dedikcə "Boylə kim qıldı Nədimi natəvan?"
Göstərir ənguşt ilə məclisdəki mina səni...

***

Çoxdan, ey saqi, gəlib sinəmdə mehman olmadın,
Dərdimə dəstindəki sağərlə dərman olmadın.

Mahsan, mehdən gözəlsən bəlkə, amma neyləyim,
Ah, bir şəb bürçi ağuşumda taban olmadın.

Gəldi mülki-hüsnünə xətti-siyah müshəf bədəst,
Sən dəxi ey kafiri-nəhvət müsəlman olmadın.

Xeyli dəmdir kim, belin qucmağa qəsd etdikcə mən
Naz ilə məndən yenə mənə girizan olmadın.

Handa buldun boylə dilkeş nəzmi-heyranım, Nədim
Cami-mey nuş etmədin, həmbəzmi canan olmadın.

***

Mən kimsəyə açılmaz idim damənin olsam,
Kim görürdü sinəni pirahənin olsam?

Daim arayan olsa, cavanım, səni məndə:
Bir qönçə gül olsan da sənin gülşənin olsam.

Döyülməyə, söyülməyə, qovulmağa, billah,
Həp razıyam, amma ki, əfəndim, sənin olsam.

Şəm olmaz isəm bəzminə bu suz ilə barı
Dərgahına bir məşəleyi-rövşənin olsam.

Çeşmanının öyrənsəm o kafircə nigahın
Bir ləhzə Nədimi nigahi-pürfənin olsam.

***

Həddədən keçmiş nəzakət, yalü bal olmuş sana
Mey süzülmüş şişədən, ruxsari al olmuş sana.

Buyi-gül təqdir olunmuş, nazın işlənmiş ucu,
Biri olmuş huy, birisi dəstimal olmuş sana.

Ol büti-tərsa sənə "mey nuş edərmisən?" demiş
Əlaman, ey dil, nə müşkültər sual olmuş sana.

Sən nə camın məstisən, aya kimin heyranısan?
Kəndin aldırdın, könül noldun, nə hal olmuş sana?

Yox bu şəhr içrə sənin vəsf etdiyin dilbər, Nədim,
Bir pəri-surət görünmüş, bir xəyal olmuş sana.

## ŞƏRQİ

Yenə oldum əsiri, ah! bir şuxi-sitəmkarın
Ki dilbər sevməmiş, bilməz bəlasın aşiqi-zarın.
Nə kafirliklərin gördüm mən ol zülfi-siyahkarın
O əbrunun, o zalım qəmzənin, ol çeşmi-məkkarın!

O tifli-nazı gördüm, ruyünə xurşid əsər etmiş
Xəbərdar olmamışdım, sonra bildim neyləmiş, netmiş.
Məgər zalım qaçıb tənhaca Sədabadadək getmiş
Tamaşa eyləmiş alayını şevkətli Xunkarın.

Gəzərmiş qəsrin ətrafında yer-yer tazə mahrular
Mükəhhal gözlü, şirin sözlü, Leyla üzlü ahular.
Həmən alqış sədasın andırırmış çağlıyan sular:
Edərlərmiş duasın padişahi-madələtkarın.

Gözəlsən, bibədəlsən, şuxsan, aşuftəsən, cana
Söz olmaz hüsnünə, gəlməz nəzirin aləmə, haqqa.
Sənin hər cövrinə min can ilə səbr eylərəm, amma
Məni pək öldürür, ey bivəfa ellərlə bazarın.

Bu gün bir məhrəmi-əsrar yari-nüktəpiradan
Eşitdim kim sayıb üşşaqını, ey şuxi-simintən!
"Nədimi-zarə bənzər aşiqim yoxdur" demişsən sən
Əfəndim, iştə vardır: mən əsirin, mən giriftarın...

## SİNƏMİ DƏLDİ BU GÜN

Sinəmi dəldi bu gün bir afəti-çarparəli
Gül yanaqlı, gülgümü kərrakəli, mor haləli.
Ciftə bənli, sim gərdənli, günəş ruxsarəli
Gül yanaqlı, gülgümü kərrakəli, mor haləli.

Bir cavan kaşı sarıqsarmış, əfəndim, başına,
Sürmə çəkmiş, ətrişahilar sürünmüş qaşına.
Şimdi girmiş dəxi təhminimdə on beş yaşına
Gül yanaqlı, gülgümü kərrakəli, mor haləli.

Şəhnişinlər zinəti, ağuşlar pirayəsi
Dəxi bir ildir yanından ayrılalı dayəsi.
Sevdiyim, könlüm süruri, ömrümün sərmayəsi
Gül yanaqlı, gülgümü kərrakəli, mor haləli.

Şivəsi, nazı, ədası, xandəsi pək bibədəl
Gərdəni püskürmə bənli, gözləri qayət gözəl.
Sırma kakil, sim gərdən, zülf tel-tel, incə bel
Gül yanaqlı gülgümü kərrakəli, mor haləli.

Ol pəri ruyin cəfayi-çeşmi-cəlladın deməm,
Dərdi-eşqiylə Nədimin ahü fəryadın deməm,
Tərzi-təvrin söyləsəm mane deyil, adın deməm
Gül yanaqlı, gülgümü kərrakəli, mor haləli.

## SƏDABADA

Bir səfa bəhs edəlim gəl bu dili-naşada
Gedəlim, sərvi-rəvanım yürü Sədabada.
İştə üç ciftə qayıq iskələdə amadə,
Gedəlim, sərvi-rəvanım, yürü Sədabada.

Güləlim, oynayalım, kam alalım dünyadan,
Meyi təsnim içəlim çeşmeyi-Nevpeydadan.
Görəlim, abi-həyat axdığın əcdərhadan
Gedəlim, sərvi-rəvanım, yürü Sədabada.

Gah varıb hovz kənarında xuraman olalım,
Gəh gəlib Qəsr Cinan seyrinə heyran olalım,
Gahi şərqi oxuyub, gahi qəzəlxan olalım,
Gedəlim, sərvi-rəvanım, yürü Sədabada.

İzn alıb cümə namazına deyə madərdən,
Bir gün oğurluyalım çərxi-sitəmpərvərdən.
Dolaşıb iskələyə doğru nihan yollardan
Gedəlim, sərvi-rəvanım, yürü Sədabada.

Bir sənü bir mənü, bir müqbiri-pakizə-əda
İznin olursa əgər bir də Nədimi-şeyda.
Qeyri yaranı bugünlük edib, ey şux, fəda
Gedəlim, sərvi-rəvanım, yürü Sədabada.

## QOŞMA

Sevdiyim camalın çünkü görəməm
Çıxmasın xəyalın dili-şeydadən.
Haqqı-payə çünki üzlər sürəməm
Alayım peymanın badi-səbadan

Kəbud çeşmi-birəhm etdi nigahın,
Aşiqlərin göyə çıxardı ahın.
Sordum gərdənindən zülfi-siyahın,
Bir cavab vermədi ağdan-qaradan.

Sevdiyim bəndənə düşərsə xidmət,
Qapında qul olmaq - canıma minnət.

Görə idim səndə buyi-məhəbbət
İstədiyim budur sən bivəfadan.

Nədima, hüsnünə olmuşdur aşiq,
Oylə bir aşiq ki, qəvlində sadiq.
Kərəmə nə qədər deyilsə layiq
Ar etməz əfəndim, şahlar gədadan...

## LEVNİ
(?—1732)

### TƏKƏRLƏMƏ

Çiçəyə arı, arıya əsəl,
Abdala boru, boruya qəzəl,
Şairə türkü, türküyə gözəl,
Gözələ gərdan - nə gözəl uymuş!

Qovuğa sarıq, sarığa sünbül,
Köçəyə yanaq, yanağa kakil,
Bağçaya güllük, güllüyə bülbül,
Bülbülə əfqan - nə gözəl uymuş!

Kədiyə fare, fareyə qovuq,
Məclisə kəlam, kəlama doruq,
Xəstəyə şorba, şorbaya qoruq,
Qoruğa havan-nə gözəl uymuş!

Yeməyə sahan, sahana qalay,
Fəqirə kübar, kübara saray,
Xunkara vəzir, vəzirə alay,
Alaya qaftan - nə gözəl uymuş!

Qapıya kilid, kilidə miftah,
Dərvişə xirqə, xirqəyə külah,
Qəhvəyə yaran, yarana məddah,
Məddaha yalan-nə gözəl uymuş!

Yayana atlı, atlıya qoşu,
Dallıya quşaq, quşağa poşu,
Söhbətə halva, halvaya turşu
Turşuya soğan - nə gözəl uymuş!

Yağlıya naxış, naxışa ipək,
Ustada hünər, hünərə əmək,
Levniyə gözəl, gözələ döşək
Döşəyə yorğan - nə gözəl uymuş!

## MUSTAFA CÖVHƏRİ

(?—1720)

### GÖR

Qara gözlü yarım mən gedər oldum
Saqınıb zülfünü yoldurmağı gör.
Ağlama sevdiyim, yenə gələrəm
Həsrətlə ağlını aldırmağı gör.

Sən mənim açılmış qönçə gülümsən
Sağ qalır gəlirsəm-yenə mənimsən.
Gündüz xəyalımsan, gecə duşumsan
Gülünə yad bülbül qondurmağı gör.

Qara gözlü yarım mənə yanıb da,
Gələni, keçəni mənəm sanıb da,
Ağlaya-ağlaya qəhərlənib də,
Gül bənizin, saqın, soldurmağı gör.

Cövhəri də der ki, saqın açılma
Yanılıb da dildən bir söz qaçırma.
Ellərin yanında köksün keçirmə
Düşmanı kəndinə güldürməyi gör.

### QUĞU

Gəzərkən bu yerə uğradı yolum,
Bu yerlərdə boylə gözəl olurmu?
Quğum, səni uçurmuşlar gölündən
Bu göllərdə boylə quğu olurmu?

Quğum sənin qaşın, gözün qaradır,
Görün qadir Mevlam nələr yaradır.
Ağ gərdəndə siyah bənlər sıradır
Ağ quğuda siyah bənlər olurmu?

Quğum getdi, viran qaldı göllǝri,
Söylǝrmi ol ǝfǝndimin dillǝri?
Balıqdanmı aldın sǝn bu tellǝri
Ağ quğuda boylǝ tellǝr olurmu?

Cövhǝri der, bu quğunun qǝsdi nǝ?
Xına vurmuş ǝllǝrinin üstünǝ.
Qurban oldum gözlǝrinin mǝstinǝ
Ağ quğuda boylǝ gözlǝr olurmu?

## DAĞLARA GƏL!

Başına bir yal gǝlǝrsǝ,
Dağlara gǝl, dağlara gǝl!
Sǝni saxlar, vermǝz ǝlǝ,
Dağlara gǝl, dağlara gǝl!

Bu canım eşqǝ düşǝli,
Eşq odu ilǝ bişǝli,
Yaşıl dağlar bǝnövşǝli
Dağlara gǝl, dağlara gǝl!

Rǝqibǝ miqdarın bildir,
Yanına cavanlar uydur.
Zǝmanǝ dostundan yeydir
Dağlara gǝl, dağlara gǝl!

Cövhǝri düşmüş dillǝrǝ,
Diyari-qürbǝt ellǝrǝ,
Billahı, vermǝm ǝllǝrǝ
Dağlara gǝl, dağlara gǝl!

## GƏLSİN

Mǝni kimsǝ ǝyliyǝmǝz
Mǝnim könlüm alan gǝlsin.
Tǝbiblǝr bilmǝz ǝlacım
Mǝni dǝrdǝ salan gǝlsin.

Mailǝm sǝlvi boyuna,
Mǝlǝk qarışmış soyuna,
Soyunub üryan qoynuna
Sinǝsinǝ saran gǝlsin.

Qaşları yay, kirpiyi ox,
Ona mail olanlar çox.
Bu cahanda aqranı yox
O qaşları kaman gəlsin.

Cövhərini kimsə bilməz,
Aşiqin ağladan gülməz,
İsmini söyləmək olmaz,
Filan qızı filan gəlsin...

## QOŞMA

Burda bir dilbərə könül düşürdüm
Yanaqları bənzər nar danəsinə.
Divanəsi olub ağlım şaşırdım
Asılaydım zülfün hər danəsinə.

Yarı görsəm ağlım olur sərsəri,
Sırma gümüşünə bənzər hər yeri
Dünyaya gətirən boylə dilbəri
Afərin doğuran mərd anasına.

Halım ərz etməyə tənhayı bulsam,
Dövlətli kəndimə bir çarə bulsam,
Ol gilas dodağın ağzıma alsam,
Bərk tutub sarılsam gərdanəsinə.

Cövhəri der: eşq qatarın yedərkən,
Gördüm sevdiyimi seyran edərkən,
Gözəllər şahının mədhin edərkən
Nəzər qıl tökdüyüm tər danəsinə.

## QƏRİB DURNA, BİZİ SƏNDƏN SORANA

Qərib durna, bizi səndən sorana
Şimdi bir yavruya quldur deyərsən.
Eşqin zəncirini taxmış boynuna
Dövr içində Məcnun oldur deyərsən.

Gecə-gündüz ağlar, heç bir dəm gülməz
Unutmuş eşini, dostunu bilməz.
Sevmiş bir gözəli artıq vaz gəlməz
Aşiq olmaq müşkül haldır deyərsən.

Tərk eyləmiş eşi ilə dostunu,
Abdal olmuş eynə almış postunu.
Gələn keçən çeynər oldu üstünü
Ayaqlar altında yoldur deyərsən.

O zalım əngəllər yolumu bağlar,
Yarımın həsrəti ciyərim dağlar.
Abi-rəvan olmuş durmayıb çağlar
Ol axan yaşları seldir deyərsən.

Cövhəri der: bilməm mən nə olduğum,
Qürbət ellərində durub qaldığım,
Əcəbləməm bəyim indi solduğum,
Bülbülün məkanı güldür deyərsən.

## OLDU

Hey ağalar, zaman azdı
Düşmüşə el üşər oldu.
Küllükdə sürünən eşşək
Cins atla yarışar oldu.

Evlərinin önü yazı,
Yayılar durnası, qazı,
Yaşına yetmədən quzu
Qoç ilə vuruşar oldu.

Cövhəri der: eylər xəta,
Qatırlar basqındır ata,
Olar-olmaz məsləhətə
Cocuqlar qarışar oldu.

# İBRAHİM HAQQI

(1703—1772)

## NEYLƏRSƏ GÖZƏL EYLƏR

Haqq şeyləri xeyr eylər
Zənnətmə ki, qeyr eylər
Arif onu seyr eylər
Allah, görəlim neylər?
Neylərsə gözəl eylər.

Haqın olucaq işlər,
Boşdur qəmi təşvişlər,
Ol hikmətini işlər,
Allah görəlim neylər?
Neylərsə gözəl eylər.

Heç kimsəyə xor baxma,
İncitmə, könül yıxma,
Sən nəfsinə yan çıxma,
Allah görəlim neylər?
Neylərsə gözəl eylər.

Hər dildə onun adı,
Hər canda onun yadı,
Hər quladır imdadı,
Mevla görəlim neylər?
Neylərsə gözəl eylər.

Naçar olacaq yerdə,
Nagah açılır pərdə,
Dərman edər ol dərdə,
Mevla görəlim neylər?
Neylərsə gözəl eylər.

Hər sözdə nəsihət var,
Hər şeydə nə zinət var,
Hər işdə qənimət var,
Mevla görəlim neylər?
Neylərsə gözəl eylər.

Bil əlsineyi xalqı,
Ağlama haq ey Haqqı,
Öyrən ədəbi xülqü,
Allah görəlim neylər?
Neylərsə gözəl eylər.

## ŞEYX QALİB
(1757 — 1799)

### QƏZƏL

Bağlanıb zülfünə pozdum əhdi də, peymanı da
Çeşmani gördüm, unutdum dərdi də, dərmanı da.

Ey xoş ol məsti-məhəbbət kim xumari-eşqdən
Bir qədəh meylə dəyişmiş küfrü də, imanı da.

Mərdi-biqayda bəlakeşliktədir arami-dil
Yoxsa çoxdan tərk edərdim canı da, cananı da.

Bəndeyi piri xərabatam ki, yoxdur siqləti
Zahidi zərrakın olsun elmi də, irfanı da.

Atəşi-cansuzi-dil-fiki-dəhani-dirüba
Aşiqin məlumudur peydası da, pünhanı da.

Çünki dərd əhlinə həp biganələrdir çarə nə
Sən dəxi yad etmə Qalib, səbri də, samanı da.

# XVIII ƏSR AZƏRBAYCAN ŞAİRLƏRİ

## NİŞAT ŞİRVANİ

(?—?)

### MÜRƏBBE

Hər təbibə söylədim dərdim, dəvasın görmədim,
Möhnətü dərdü qəmin heç intəhasın görmədim.
Bu cəhanın bir həqiqi aşinasın görmədim,
Hər kimin çəkdim cəfasın, bir vəfasın görmədim.

Cövrünü çəkdim əbəs hər nakəsü bədtinətin,
Payimalı oldum axır gərdişi-kəmfürsətin,
Həm rəfiqü həmdəmin, yarın, həmi həmsöhbətin,
Hər kimin çəkdim cəfasın, bir vəfasın görmədim.

Verdi hər dəm könlümü tufana çeşmi-pürnəmim,
Əskik olmaqdan, mənim gündən - günə artır qəmim,
Olmadı dünyada hərgiz bir müvafiq həmdəmim,
Hər kimin çəkdim cəfasın, bir vəfasın görmədim.

Bəxt isə dönmüş, əgər iqbal isə olmuş yaman,
Möhnətü qəm çəkmək ilən öldüm axır mən, aman,
Qövmü, qardaşı, rəfiqi bir-bir etdim imtahan
Hər kimin çəkdim cəfasın, bir vəfasın görmədim.

Ey Nişat, oldum qəmi-hicr ilə sərgərdan, haray,
Dönmədi rəyimlə hərgiz gərdişi-dövran, haray,
Ya Əmirilmöminin, Heydər, şahi-mərdan, haray
Hər kimin çəkdim cəfasın, bir vəfasın görmədim.

## QƏZƏL

Saqın ey qönçə dəhan, gül kimi xəndan gəzmə,
Dağıdıb zülfi-pərişan, pərişan gəzmə.

Gəzmə qurbanın olum, qədrini bilməzlər ilə,
Qorxuram hüsnünə nagah yetə nöqsan, gəzmə.

Əzizim, istər isən şöhreyi-şəhr olmayasan,
Seyri-bazar edib əğyar ilə meydan gəzmə.

El yaman, yaxşı deyər, gəzmə bu kafərlər ilə,
Sənə yüz kərrə dedim, gəzmə, müsəlman, gəzmə.

Ey Nişat, sən səri-kuyində müqim ol yarın,
Kəşti-bağ eyləmə, gəl bağ ilə bostan gəzmə.

# XƏSTƏ QASIM

(təqr. 1684—təqr. 1760)

*Xəstə Qasım, ehtimala görə, Güney Azərbaycanın Tikmədaş kəndindəndir.*

## GƏRAYLILAR

Ay həzərat, ay camaat,
Dağa qar düşdü, qar düşdü.
Özüm qaldım qürbət eldə,
Yada yar düşdü, yar düşdü.

Gedin deyin anasına,
Sığal versin sonasına.
Yar sinənin arasına
Bir cüt nar düşdü, nar düşdü.

Xəstə Qasımı qəm basdı,
Yar bizi zülfündən asdı.
Şeyda bülbül güldən küsdü
Gülə xar düşdü, xar düşdü.

***

Gəl bir səndən xəbər alım
Süleymandan qalan dünya.
Əzəli gül kimi açıb
Axırında solan dünya.

De görüm nəyə talıbsan?
Dərsini kimdən alıbsan?
Neçə min yol boşalıbsan?
Neçə min yol dolan dünya.

Xəstə Qasım qalıb naçar,
Bu sirri bəs kimlər açar?
Gələn qonar, qonan köçər,
Hey salarsan talan dünya.

## QOŞMALAR

Dəli könlüm, məndən sənə əmanət:
Demə: bu dünyada qalım yaxşıdır.
Bir gün olar qohum, qardaş yad olar,
Demə: ulusum var, elim yaxşıdır.

Bir məclisə varsan, özünü öymə,
Şeytana bac verib kimsəyə söymə,
Qüvvətli olsan da, yoxsulu döymə
Demə ki, zorluyam, qolum yaxşıdır.

Xəstə Qasım, kimə qılsın dadını?
Canı çıxsın, özü çəksin odunu.
Yaxşı igid yaman etməz adını
Çünki yaman addan ölüm yaxşıdır.

***

Yeri gözəl, yeri, sənə qarğaram:
Ölənətək işin ahu-zar olsun.
Siyah zülfün dal gərdəndə sərasər
Halqa-halqa, çin-bəçindən mar olsun.

Gözəllər içində giryan olasan,
Yanasan odlara, büryan olasan,
Vəfalı yarlara qurban olasan,
Onlara baxanda sənə ar olsun.

Mən qurbanam yaxşıların muyuna,
Hündür qamətinə, gözəl boyuna,
Sənin soyun dönsün sonsuz soyuna,
Gül açmasın bağçanızda, xar olsun.

Ay qız, bir kəs bilməz sənin sirrini,
Qiyamətdə yandırsınlar dərini.
Yatan vaxtda şahmar vursun ərini,
Naləsindən qulaqların kar olsun.

Xəstə Qasım dost yolunda qalanda,
Əl uzadıb qol boynuna salanda,
Kefin durulanda, könlün olanda
Bizə gələn ayaqların var olsun.

***

Bir nazənin sevdim məktəbxanada,
Haqq kəlamın dil əzbərdən oxurdu.
Əlinə almışdı eşqin kitabın
Mənim dərsim dil əzbərdən oxurdu.

Mən tanıram öz yarımı nəfəsdən,
Ol səbəbdən könlüm düşməz həvəsdən.
Tavuz kimi səda verər qəfəsdən
Bülbül kimi xoş dəftərdən oxurdu.

Xəstə Qasım kömək dilər mövladan,
Naz – qəmzəsi aşıqları aldadan.
Həya eylər, hicab eylər molladan,
Gah yavaşdan, gah hündürdən oxurdu.

***

Neçə qəhrəmanlar gəldi dünyaya,
Köç vaxtı yetişdi, tez oldu getdi.
Rüstəmin zərbindən titrədi dağlar,
Düşdü dastanlara söz oldu getdi.

Hakimlik eylədi, çox uzun vaxtı,
Bütün kainata Süleyman baxdı.
Tərsinə döndü şah Cəmşidin taxtı,
Firudinin dərdi yüz oldu getdi.

Necoldu Keykavus, hanı Keyqubad?
Hansı bu dünyadan almışdı murad?
Allahlıq eylədi Fironla Şəddad,
Nəmrudun qalası düz oldu, getdi.

İsgəndər Daranı taxtından saldı,
Cahana şah gəldi, sonu nə oldu?
Yarı yolda öldü, Misirdə qaldı,
Qasım kimi yandı, köz oldu getdi.

# MOLLA VƏLİ VİDADİ

(1709 — 1809)



*XVIII əsr Azərbaycan şerinin görkəmli nümayəndələrindən olan Vidadi Şəmkirdə doğulmuşdur. Yaşca özündən cavan olan böyük müasiri və dostu Molla Pənah Vaqiflə bərabər Vidadinin şerimizin sadə xalq dilinə yaxınlaşmasında, realist boyalarla zənginləşməsində önəmli xidmətləri var. Aşıq şeri biçimlərindən məharətlə istifadə edən Vidadinin əruz vəznində də bir sıra qiymətli qəzəlləri, müxəmməsləri, müstəzad və müsəddəsləri var.*

## QOŞMALAR

Dəli könül gəl əylənmə qürbətdə,
Bir gün olur vətən deyib ağlarsan.
Yadlar ilə ömür çürür həsrətdə,
Bir gün olur vətən deyib ağlarsan.

Yaxşı gündə yarü yoldaş çox olur,
Yaman gündə heç bulunmaz, yox olur.
Yad ellərin tənə sözü ox olur,
Bir gün olur vətən deyib ağlarsan.

Mən görmüşəm bu qürbətin dadını,
Yanıb-yanıb çox çəkmişəm odunu.
Qəmlənirsən hər görəndə şadını,
Bir gün olur vətən deyib ağlarsan.

Oxuduqca qəmgin şeri-qəzəli,
Köhnə yaraların bir-bir təzəli.
Yada düşər keçən günün əzəli,
Bir gün olur vətən deyib ağlarsan.

Yada düşər bağçaların, bağların,
Ala qarlı, boz dumanlı dağların.
Qocalırsan, keçər cavan çağların,
Bir gün olur vətən deyib ağlarsan.

Keçən günü bir-bir xəyal eylərsən,
Dolar qəm könlünə məlal eylərsən,

Gələndən-gedəndən sual eylərsən
Bir gün olur vətən deyib ağlarsan.

Hər məzara düşər olsa güzarın,
Yada düşər ata-ana məzarın.
Vidadi xəstə tək artar azarın,
Bir gün olur vətən deyib ağlarsan.

***

Ey həmdəmim, səni qana qərq eylər,
Gəl tərpətmə yaralanmış könlümü.
Ayrı düşmüş vətənindən, elindən
Həmdərdindən aralanmış könlümü.

Gönül verdik hər bivəfa yadlara,
Hayıf oldu ömür getdi badlara.
Fələk saldı dürlü-dürlü odlara
Şan-şan olmuş, paralanmış könlümü.

Qanlı yaşım gündən-günə bollandı,
Axdı, axdı sinəm üstə göllendi.
Yenə mindi qəm səməndin yollandı
Heç bilmədim bərələnmiş könlümü.

Gözüm yaşı gündən-günə fərq etsə,
Eyb etməyin məni qana qərq etsə.
Rövşən etməz yüz min günəş bərq etsə.
Bu möhnətdə qaralanmış könlümü.

Vidadi xəstəyəm çeşmim mərdümü,
Tərk elədim vətənimi, yurdumu.
Çox təbibə şərh eylədim dərdimi
Heç görmədim çaralanmış könlümü.

***

Qatar-qatar olub qalxıb havaya,
Nə çıxıbsız asimana durnalar!
Qərib-qərib, qəmgin-qəmgin ötərsiz,
Üz tutubsuz nə məkana, durnalar?

Təsbih kimi qatarınız düzərsiz,
Havalanıb ərş üzündə süzərsiz,
Gah olur ki, danə-xuriş gəzərsiz,
Gah düşərsiz pərişana, durnalar!

Ərz eləyim, bu, sözümün sağıdır,
Yollarınız haramıdır, yağıdır.
Şahin-şonqar sürbənizi dağıdır,
Boyanarsız qızıl qana, durnalar!

Əzəl başdan Bəsrə, Bağdad eliniz,
Bəylər üçün ərməğandır teliniz.
Oxuduqca şirin-şirin diliniz,
Bağrım olur şana-şana, durnalar.

Bir baş çəkin dərdiməndin halına,
Ərzə yazsın, qələm alsın əlinə.
Vidadi xəstədən Bağdad elinə,
Siz yetirin bir nişanə, durnalar!

***

Ey məni qınayan, ağlama, deyib,
Ağlar yarı gedən bəs ağlamazmı?
İllər ilən həmdəmindən ayrılıb,
Xoş nigarı gedən bəs ağlamazmı?

Olmaya yanında yarı, cananı,
Puça çıxıb gedə ömri-cavanı,
Günbəgün əksilib şövkəti, şanı
İxtiyarı gedən bəs ağlamazmı?

Bəxt çönüb, çünki zəmanə dönüb,
Şadü xürrəm işi fəğanə dönüb,
Ömrünün gülzarı xəzanə dönüb,
Novbaharı gedən bəs ağlamazmı?

Ərz elərəm sən xasların xasına,
Səbr eləyim mən bu dərdin hasına,
Göz yollarda, can gedincə ta sinə
İntizarı gedən bəs ağlamazmı?

Vidadi xəstəni gəl indi tanı,
Hanı o sən görən şəklü nişanı?
Rəngü rüyi,cismi, taqəti, canı,
Külli-varı gedən bəs ağlamazmı?

***

Ay ağalar, bir nigarın oduna,
Dəli könül yanə-yanə düşübdür.
Mən ki, düşüb bu hal ilə yanaram,
Nə səməndər, nə pərvanə düşübdür.

Açılıb cənnət tək camalın gülü,
Ötər çevrəsində şeyda bülbülü.
Bu gülşənin yasəməni, sünbülü
Nə bir bağa, nə bostanə düşübdür.

Ləli-ləbi bənzər gövhər kanına,
Düzülüb gövhər tək dür dəhanına.
Siyəh tellər ağ buxağın yanına,
Xırda xallar zənəxdanə düşübdür.

Könül dost kuyinə etdikcə güzər,
Qanlı qəmzəsindən etməzmi həzər?
Çıxdı gözüm birdən eylədi nəzər,
Gör necə kəsilməz qanə düşübdür.

Qaşı, gözü durub qanın almağa,
Zülf tökülmüş din, imanın almağa.
Vidadi xəstənin canın almağa
Xət bir yana, xal bir yanə düşübdür.

## QƏZƏLLƏR

Hər səhər bad əsər, arizi-canənə dəyər,
Toxunur sərvə gəhi, gah gülüstanə dəyər.

Olmasa qabil əgər dəhr cəfa verməz ona,
Təm biləzzət olanda necə dəndanə dəyər.

Şəm gər yansa savadi-şəb üçün heyf olmaz,
Şöləsi çünki onun arizi-cananə dəyər.

Söhbəti-nakəsü namərd həmin söhbət imiş,
Tut ki, bir mərd ətəyin dövləti-xaqanə dəyər.

Sən ki, bir mərdin ucundan nə bəla çəkdin isə,
Vəsli-didari onun rəhməti-qüfranə dəyər.

Mən ki, meydani-bəla içrə sərim top edərəm,
Ta düşər əldən-ələ axırı çövkanə dəyər.

O nə qəmdir oda bir mərdin ucundan yanasan,
Verəsən canını bir canə ki, min canə dəyər.

Canımı atəşi-qürbətdə belə yandırıram,
Necə şəmə dolanıb hər gecə pərvanə dəyər.

Nə qədər olsa qoca gərçi Vidadi xəstə,
Yenə Vaqif kimi, əlbəttə, yüz oğlanə dəyər.

***

Söylə canənə, səba, halım pərişan oldu, gəl!
Çıxdı can, sud etmədi hər necə dərman oldu, gəl!

Qasidi-bisidqə addanma, yetir, hal özgədir,
Türfə şivənlər qopub üstümdə əfğan oldu, gəl!

Enmədən sinə vücudum, doldu qəbrim qan ilə,
Gördüyün nazik bədən xak ilə yeksan oldu, gəl!

Rəkti-tərdən incinən tən həmdəm olmuş marilə,
Üz tutub qarıncalar yollara karvan oldu, gəl!

Gördüyün zahir ələm tək şənü şövkət sahibi
İndi pəjmürdə düşüb torpağa, pünhan oldu, gəl!

Neçələr giryan olubdur bu Vidadi xəstə tək,
Didələr giryan olub çaki-giriban oldu, gəl!

## MÜSƏDDƏSLƏR

Gəl çəkmə cahan qeydini sən, can belə qalmaz,
Qan ağlama çox, dideyi-giryan belə qalmaz,
Gül vaxtı keçər, seyri-gülüstan belə qalmaz,
Hər ləhzə, könül, xürrəmü xəndan belə qalmaz,
Bir cam yetir, saqi, bu dövran belə qalmaz,
Tən bir gün olur xak ilə yeksan, belə qalmaz.

Əzbəs bu camal ilə ki, canan ola fani,
Bu şivə ilə qəddi-xuraman ola fani,
Bu gərdəni-xoş, zülfü-pərişan ola fani,
Bu əhsəni-surətdəki, insan ola fani,
Bir cam yetir, saqi, bu dövran belə qalmaz.
Tən bir gün olur xak ilə yeksan, belə qalmaz.

Sultani-cahan olsa, gedər, canə inanma,
Bir gün pozulur, şövkətü divanə inanma,
Çün baqi-deyil, mülki-Süleymanə inanma,
Gər aqil isən, gərdişi-dövranə inanma,
Bir cam yetir, saqi, bu dövran belə qalmaz,
Tən bir gün olur xak ilə yeksan, belə qalmaz.

Yüz mövsümi-xoş xürrəm olub illər açılsa,
Yüz lalə bitib susənü sünbüllər açılsa,
Yüz bağı-cahan tazələnib güllər açılsa,
Könlüm ki, açılmaz neçə müşküllər açılsa,
Bir cam yetir, saqi, bu dövran belə qalmaz,
Tən bir gün olur xak ilə yeksan, belə qalmaz.

Ah, aldı məni dərdi-fəraqü qəmi-həsrət,
Sərməstü xərab etdi yenə badeyi-heyrat,
Bir mehrü vəfa etməli yox kim ola rəğbət,
Fövt eyləmə, gəl var ikən əldə dəmi-fürsət,
Bir cam yetir, saqi, bu dövran, belə qalmaz,
Tən bir gün olur xak ilə yeksan, belə qalmaz.

Fikr etsən əgər dəhrin işi bəhri-bəladır,
Bir dürri-girənmayəsi min canə bahadır,
Hər nəqşi bir ayineyi-isbati-xudadır,
Məqsudi-dü aləm yenə təhsili-rizadır,
Bir cam yetir, saqi, bu dövran, belə qalmaz,
Tən bir gün olur xak ilə yeksan, belə qalmaz.

***

Xəstə düşdüm, gələn yoxdur üstümə,
Qərib öldüm, bikəs öldüm, yad öldüm,
Xəbər olsun yaranıma, dostuma,
Qərib öldüm, bikəs öldüm, yad öldüm.
Ey sevdiyim, səndən qeyri kimim var,
Gəl üstümə, aman öldüm, dad öldüm.

Xırdacalar yığıldılar yanıma,
Fikr elədim odlar düşdü canıma,
Başdan belə yazılıbdır şanıma,
Qərib öldüm, bikəs öldüm, yad öldüm.
Ey sevdiyim, səndən qeyri kimim var,
Gəl üstümə, aman öldüm, dad öldüm.

Dərdim çoxdur, birin doğru sanan yox,
Məgər burda qəm hərfini qanan yox?
Bir ah çəkib cigərindən yanan yox,
Qərib öldüm, bikəs öldüm, yad öldüm.
Ey sevdiyim, səndən qeyri kimim var,
Gəl üstümə, aman öldüm, dad öldüm.

Ağla, didəm, qanlı yaşın sel olsun,
Söyləməyə gizli dərdin dil olsun,
Kimim vardır qohum-qardaş, el olsun,
Qərib öldüm, bikəs öldüm, yad öldüm.
Ey sevdiyim, səndən qeyri kimim var,
Gəl üstümə, aman öldüm, dad öldüm.

Vidadiyəm, təbib dərdim bağlamaz,
Sinəm başın düyünləməz, dağlamaz,
Yad yığılar, sərin baxar, ağlamaz.
Qərib öldüm, bikəs öldüm, yad öldüm.
Ey sevdiyim, səndən qeyri kimim var,
Gəl üstümə, aman öldüm, dad öldüm.

## MOLLA PƏNAH VAQİF
(1717 — 1797)



*Vaqif Azərbaycan ədəbiyyatının ən böyük klassiklərindəndir. Şerimizin yeni mərhələsi onun adıyla bağlıdır. Həm heca vəznində xalq şeri üslubunda, həm də əruz vəznində "divan ədəbiyyatı" səpkisində mükəmməl əsərlər yaradan Vaqifin yaradıcılığında real həyatdan alınmış boyalar, canlı müşahidələr, adi insani hisslərin əlvanlığı çox parlaq şəkildə əks olunmuşdur. Yaradıcılığında bədbin, qəmgin motivlər üstünlük təşkil edən müasiri və dostu Vidadidən fərqli olaraq, Vaqif poeziyasına daha çox nikbin ruh hakimdir. Bununla belə, o, ədəbiyyatımızın ən faciəvi şerlərindən olan "Görmədim" müxəmməsinin də müəllifidir. Qarabağ xanı İbrahim Cavanşirin vəziri olmuş Vaqif Şuşanı alan Qacar tərəfindən məhbəsə atılmış və ölümə məhkum edilmişdir. Qacara sui-qəsd Vaqifi xilas etmişdirsə də, sonralar onun həyatı faciəvi sonluqla bitmiş, oğluyla bərabər edam olunmuşdur.*

### QOŞMALAR

Bir zaman havada qanad saxlayın,
Sözüm vardır mənim sizə, durnalar!
Qatarlaşıb nə diyardan gəlirsiz?
Bir xəbər veriniz bizə, durnalar!

Sizə müştaq durur Bağdad elləri,
Gözləyə-gözləyə qalıb yolları,
Asta qanad çalın, qəfil telləri
Heyifdir, salarsız düzə, durnalar!

Xeyli vaxtdır yarın fərağındayam,
Pərvanə tək hüsnün çırağındayam,
Bir ala gözlünün sorağındayam,
Görünürmü, görün, gözə, durnalar!

Mən sevmişəm ala gözün sürməsin,
Bədnəzər kəsibən, ziyan verməsin,
Saqın gəzin, laçın gözü görməsin,
Qorxuram səfnizi poza, durnalar!

Nazənin-nazənin edərsiz avaz,
Ruhlar tazələnir, olur sərəfraz,
Vaqifin də könlü çox edər pərvaz
Hərdəm sizin ilə gəzə, durnalar!

***

Xublar arığından yarımaq olmaz,
İgidin həmdəmi gərək çağ ola.
Bəstə boylu gərək, mina gərdənli,
Zülfü siyah, var əndamı ağ ola.

Səhər dura sürmə çəkə gözünə,
Birçəklərin həlqə qoya üzünə.
Cilvələnə, sığal verə özünə,
İşi, gücü gülüb-oynamaq ola.

Döşün açıb, əl dəyəndə yaxıya,
Ağ gülün bağrına peykan toxuya,
Bədənindən müşkü ənbər qoxuya,
Zülfü gərdənində bir qucaq ola.

Bir mayabud gərək, baldırı yoğun,
Sərasər ət basa dizin, topuğun,
Əl dəyəndə dura buğun-babuğun
Titrəyə, quyruqdan çox yumşaq ola.

Həyası üzündə, əqli başında,
Öldürə Vaqifi gözü qaşında.
Ya on üç, ya on dörd, on beş yaşında,
Nə ondan böyükrək, nə uşaq ola.

***

Xumar gözlərini sevəndən bəri,
Dəxi özgəsinə uymanam, gəlin!
Xoryat ilə belə can-can olmusan,
Məgər ki, mən onu duymanam, gəlin!

Cəfridar sürməni çəkibdir gözə,
Havalanıb dəxi endirməz bizə,
Mən ha billəm, qanın qaynar tüksüzə,
Mən tutduğum əldən qoymanam, gəlin!

Başına döndüyüm, suların yolu,
Gedəndə boş gedər, gələndə dolu.
Məmələrin üstdən çatının zolu, —
Sən qıysan, mən sənə qıymanam, gəlin!

Başına döndüyüm, telli, toqqalı,
Qaşların canımı haq-nahaq alı,
Ağarıbdır, qırxmaq olmaz saqqalı
Vallah, üzün üstə qoymanam, gəlin!

Taxtına çıxmanam, taxtın ucadır,
Qoynuna girmənəm, yarı gecədir,
Deməginən Molla Pənah qocadır
Səni tamam yesəm doymanam, gəlin!

***

Xeyli vaxtdır ayrılmışıq yar ilən,
Gördük, amma tanışmadıq, ayrıldıq.
Qaldı canda gizli-gizli dərdimiz,
Bircə kəlmə danışmadıq, ayrıldıq.

Qərib-qərib durduq biganələr tək,
Soyuq-soyuq baxdıq divanələr tək.
Dönmədik başına pərvanələr tək,
Eşq oduna yanışmadıq, ayrıldıq.

Yarım saat bir arada qalmadıq,
Eşq atəşin canımıza salmadıq,
Yalvarıban yarın könlün almadıq,
Elə getdi, barışmadıq, ayrıldıq.

O zaman ki, aşnalığı tərk etdik,
Cüda düşdük, xeyli ciyər bərkitdik.
Aralıqdan könül quşun ürkütdük,
Bir-birilə qonuşmadıq, ayrıldıq.

Vaqif sevdi bir iqrarsız bivəfa,
Bada getdi tamam çəkdiyi cəfa,
Görüşübən eyləmədik xoş səfa,
Qucaqlaşıb sarışmadıq, ayrıldıq.

***

Duruban eşqilə güzar eylədim,
Bir pərinin oldum mehman evində.
Zərrəcə görmədim hörmət, izzətin,
Qaldım elə, peşman-peşman evində.

Ta ki, məni gördü ol qəlbi qara,
Çəkdi yaşmağını o gül rüxsara,
Döndərdi üzünü, tutdu divara,
Sanasan ki, yoxdur insan evində.

Dodağı şəkərdir, göftarı şərbət,
Nə fayda, eyləməz şirin məhəbbət.
Məxləsi ki, yoxdur onda bir ləzzət,
Boldur elə acı qəlyan evində.

Keçmə o dilbərin sən otağından,
Tər bönövşə qoxar hər bucağından.
Sanki bir guşədir cənnət bağından,
Açılıbdır güli-əlvan evində.

Vaqif, bir kimsə ki, bizdən yaşına,
Yəqin bil ki, bizlən olmaz aşina.
Gəldiyimiz heç gəlmədi xoşuna,
Tapdım mən halını ürfan evində.

***

Boyun surahıdır, bədənin büllur,
Gərdənin çəkilmiş minadan, Pəri!
Sən ha bir sonasan, cüda düşübsən
Bir bölük yaşılbaş sonadan, Pəri!

İxtilatın şirin, sözün məzəli,
Şəkər gülüşündən canlar təzəli,
Ellər yaraşığı, ölkə gözəli,
Nə gözəl doğubsan anadan, Pəri!

Üz yanında tökülübdür tel nazik,
Sinə meydan, zülf pərişan, bel nazik,
Ağız nazik, dodaq nazik, dil nazik,
Ağ əllərin əlvan hənadan, Pəri!

Avçısı olmuşam sən tək maralın,
Xəyalımdan çıxmaz hərgiz xəyalın,
Ənliyi, kirşanı neylər camalın,
Sən elə gözəlsən binadan, Pəri!

Günəş təki hər çıxanda səhərdən
Alırsan Vaqifin əqlini sərdən.
Duaçınam, salma məni nəzərdən,
Əksik olmayasan sənadan, Pəri!

***

Bulud zülflü, ay qabaqlı gözəlin,
Duruban başına dolanmaq gərək.
Bir evdə ki, belə gözəl olmaya,
O ev bərbad olub talanmaq gərək.

Əndamı ağ gərək, sinəsi mərmər,
Siyah zülfü qamətinə bərabər,
Qoynu içi guya müşklə ənbər,
Basdığı torpağı yalanmaq gərək.

Sərxoş durub sarayından baxanda,
Ağ gərdənə həmayillər taxanda,
Gözə sürmə, qaşa vəsmə yaxanda
Canım eşq oduna qalanmaq gərək.

Çıxa sarayından canlar alan tək,
Xişmə gələ cəh-cəh qəhri olan tək,
Şahmar zülfü dal gərdəndə ilan tək,
Hərdəm tərpənəndə bulanmaq gərək.

Vaqif, sənin işin müdam ah olsun,
Səg rəqibin ömrü qoy kütah olsun.
Həmdəmsiz kimsənə əgər şah olsun,
Gədadır o kimsə, dilənmək gərək.

***

Bir əndamı nəsrin, dodağı qönçə,
Bir qaməti gülbün yara aşiqəm.
Olsa yüz üzü gül, girməz eynimə,
Mən ancaq bir gülüzara aşiqəm.

Gecələr sübhədək eylərəm nalə,
Hərgiz düşməz könlüm özgə xəyalə.
Bir gərdəni mina, ağzı piyalə,
Bir ləhcəsi şirinkara aşiqəm.

Bir buxağı turunc, sinəsi meydan,
Bir sözü cəvahir, mirvari dəndan,
Bir maral baxışlı, kirpiyi peykan,
Bir qaşları zülfüqara aşiqəm.

Bir güləndə ləblərindən bal axan,
Bir bəzənib sərxoş tovus tək çıxan,
Bir niqab altından pünhani baxan,
Bir əcayib xoşgöftara aşiqəm.

Vaqifəm, bədəndən canım dağılır,
Məcnun kimi xanimanım dağılır,
Görməyəndə din-imanım dağılır,
Gecə-gündüz mən didara aşiqəm.

***

Sevdiyim, ləblərin yaquta bənzər,
Sərasər dişlərin dürdanədəndir.
Sədəf dəhanından çıxan sözlərin
Hər biri bir qeyri xəzanədəndir.

Nədəndir sözümə cavab verməmək?
Həm camal gizləyib, üz göstərməmək.
Gecələr gözlərim xabı görməmək,
Ol siyah nərgisi-məstanədəndir.

Mən ha səni nuri-ilahi sannam,
Camalının şöləsinə dolannam,
Atəşinə mərdü mərdanə yannam,
Bu xasiyyət mənə pərvanədəndir.

Bir namə yazmışam can üzə-üzə,
Badi-səba, apar sən o gül üzə,
Soruşsa yar ki, bu kimdəndir bizə?
Söyləgilən: — Sizin divanədəndir.

Xumar-xumar baxmaq göz qaydasıdır,
Lalə tək qızarmaq üz qaydasıdır,
Pərişanlıq zülfün öz qaydasıdır,
Nə badi-səbadan, nə şanədəndir.

Müştaqdır üzünə gözü Vaqifin,
Yolunda payəndaz üzü Vaqifin,
Sənsən fikri, zikri, sözü Vaqifin,
Qeyri söz yanında əfsanədəndir.

***

Bayram oldu, heç bilmirəm neyləyim,
Bizim evdə dolu çuval da yoxdur.
Dügiylə yağ hamı çoxdan tükənmiş,
Ət heç ələ düşməz, motal da yoxdur.

Allaha bizmişik naşükür bəndə,
Bir söz desəm dəxi qoymazlar kəndə.
Xalq batıbdır noğla, şəkərə, qəndə,
Bizim evdə axta zoğal da yoxdur.

Bizim bu dünyada nə malımız var,
Nə də evdə sahibcamalımız var.
Vaqif, öyünmə ki, kamalımız var,
Allaha şükür ki, kamal da yoxdur.

***

Kür qırağının əcəb seyrangahı var,
Yaşılbaş sonası, hayıf ki, yoxdur!
Ucu tər cığalı siyah tellərin
Hərdən tamaşası, hayıf ki, yoxdur!

Qış günü qışlağı Qıraqbasanın,
Gözüdür Aranın, cümlə-cahanın,
Belə gözəl yerin, gözəl məkanın
Bir gözəl obası, hayıf ki, yoxdur!

Çoxdur ağ bədənli, büllur buxaqlı,
Lalə zənaxdanlı, qönçə dodaqlı.
Amma şirin dilli, açıq qabaqlı,
Könül aşinası, hayıf ki, yoxdur!

Havasından torpağının, yerinin,
Dadızmaz dəhanın, ləbi-şirinin,
Pəri çoxdur, nə fayda heç birinin
Adamlıq ədası, hayıf ki, yoxdur!

Ucu əşrəfili, bulut kimi saç,
Dal gərdəndə hər hörüyü bir qulac,
Kəlağayı əlvan, qəsabə qıyqac,
Altında cunası, hayıf ki, yoxdur!

Zər haşiyə al nimtənə üstündə,
Xallar üz yanında, çənə üstündə,
Buxağın altında, sinə üstündə,
Zülfün burulması, hayıf ki, yoxdur!

Laçın təki başda ala tomağa,
Yaşmağı tutmağa dişə, dodağa,
Cəllad kimi durub qabaq-qabağa
Baxıb can alması, hayıf ki, yoxdur!

Çünki yorğunuyam mən bu yolların,
Qaydasını billəm hər üsulların,
Gümüş biləklərin, bəyaz qolların,
Sarı kəhrəbası, hayıf ki, yoxdur!

Ayna tutub hərdəm camal görməsi,
Zülfə, zənəxdana sığal verməsi,
Səhər ala gözün siyah sürməsi,
Əlinin hənası, hayıf ki, yoxdur!

Vaqif haqdan dilər lütfü kərəmlər,
Belə yerdə qalan, vallah vərəmlər.
Yenə yada düşər bizim sənəmlər,
Getməyin binası, hayıf ki, yoxdur!

***

Səhər-səhər həsrət ilən gəzirdim,
Cüt qoşa nar gördüm iki sinədə.
Birisi qız idi, birisi gəlin,
Can qurban eylərəm ikisinə də.

Gəlin bulaqda əl–üzünü yuyur,
Qız deyir: gəl gedək, həriflər duyur,
Belə gözəl sevən əldənmi qoyur,
Can qurban eylərəm ikisinə də.

Gəlnin dodağıdır Təbrizin məti,
Əlli-altmış tümən qızın qiyməti,
Belə gözəl sevən neylər cənnəti,
Can qurban eylərəm ikisinə də.

Gəlinin yaxası polad iynəli,
Qızın yaxasıdır çarpaz düyməli.
İkisi də bir-birindən öyməli,
Can qurban eylərəm ikisinə də.

Kababım olaydı, közüm olaydı,
Yar yanında ötkün sözüm olaydı,
Vaqif deyir: iki gözüm olaydı,
Baxaydım bunların ikisinə də.

***

Hər yetən gözələ gözəl demənəm,
Gözəldə bir qeyri əlamət olur:
Zülf bir yana düşər, gərdən bir yana,
Özün bilməz, bir özgə babət olur.

Oynayanda pərvaz edər nimtənə,
Zülf dağılar, üzdə dönər xərmənə,
Sərəndazın ucu düşər gərdənə,
Açılsa bel-buxun, qiyamət olur.

Müjgan oxun atar, yay qaşın çəkər,
Dələr bağrım başın, ürəyim sökər,
Sözü duzlu olur, dodağı şəkər,
Hekayəti şirin hekayət olur.

Gərdəninə müşkin tellər düzülür,
Hər qıya baxanda canlar üzülür,
Sürmələnmiş siyah gözlər süzülür,
Oturub durmağı qiyamət olur.

Gözəl olan belə alişan gəzər,
Niqab çəkər, zülfü pərişan gəzər,
Səhər seyrə çıxar, gülüşan gəzər,
Sevməyində tamam hərarət olur.

Vaqif qurban olsun qoşa tağına,
Zülfü üz yanında, üzü ağına,
Belə gözəl düşə ay qabağına,
Tamaşa eyləyən bitaqət olur.

***

Ala gözlü, sərv boylu dilbərim,
Həsrətin çəkdiyim canan, bəri bax!
Gecə-gündüz fikrim-zikrim, əzbərim,
Üzüldü taqətim, aman, bəri bax!

Kim dözər mənim tək belə firqətə,
Rəncü məşəqqətə, bari-möhnətə,
Haçandır düşmüşəm tari-zülmətə,
Çəkilsin üstümdən duman, bəri bax!

Payibəndəm, qəmi-eşqə giriftar,
Hicran atəşindən can oldu bimar,
Razi-dilim edə bilməm aşikar,
Çəkərəm dərdini pünhan, bəri bax!

Günbəgün könlümün artır qubarı,
Pərişandır, tapmaz o qəmküsarı,
Ölsün, itkin olsun belə əğyarı,
Gəzməsin arada yaman, bəri bax!

Çox çəkir hicrini Vaqifi-xəstə
Leylü nahar, şamü səhər peyvəstə,
Ey yanağı lalə, ləbləri püstə,
Ağzı nabat, şəkkər zəban, bəri bax!

***

Bir-birinə həmdəm iki növcavan,
Biri güldür, biri gülgəz yanaqlı,
Biri tər sinəli, ayna əndamlı,
Biri nar məməli, nəsrin buxaqlı.

Biri laçın gözlü, tərlan qəmzəli,
Biri qırğı başlı, sona cilvəli,
Biri şəkkər sözlü, şirin kəlməli,
Biri qənd ağızlı, qaymaq dodaqlı.

Biri sərasər ağ, həm siyah telli,
Biri buğdayıdır, amma şəkilli,
Biri xoş qılıqlı, mələk misilli,
Biri sərv boylu, şümşad budaqlı.
Biri bəstə boylu, narınc örtüklü,
Biri şux baxışlı, xəncər kirpikli,
Biri dar gərdənli, süzgün sümüklü,
Biri uzun qaşlı, həm gen qabaqlı.

Axır cana yetirərsiz Vaqifi,
Ağlayıban götürərsiz Vaqifi,
Bir gün olur, itirərsiz Vaqifi,
O qədər gəzərsiz əli çıraqlı.

## QƏZƏLLƏR

Kim ki, sevdayi-səri-zülfü-pərişanə düşər,
Gah zindanə, gəhi çahi-zənəxdanə düşər.

Afəti-dəhr dəyər ol kəsə kim, kamildir,
Mah hər gün ki, kəmalə yetə, nöqsanə düşər.

Mərd igidlər özünə məhbəsi meydan bilir,
Sanma kim, nakəsü namərd bu meydanə düşər.

Eybdən saf çıxar, pakü mübərra görünür,
Hər tila kim, küreyi-atəşi-suzanə düşər.

Piçü tabə düşənin işi, bəli, üzdə olur,
Zülf bu vəchlə rüxsareyi-tabanə düşər.

Hər yaman yer ki, olur — yaxşıların mənzilidir,
Ləl daş içrə, xəzinə dəxi viranə düşər.
Şəmi-qəm şadlıq əyyamına xoş ziyvərdir,
Necə kim, xali-siyəh arizi-cananə düşər.

Ey Vidadi, qəmi-zindanə giriftar olmaq,
Bir sənə, bir mənə, bir Yusifi-Kənanə düşər.

Eşqə düşmək sənə düşməz, qocalıbsan belə dur,
Belə işlər yenə Vaqif kimi oğlanə düşər.

***

Mehribanlıq görməyib bir məhliqadən küsmüşəm,
Gündə yüz al eyləyən qəlbi qəradən küsmüşəm.

Şəninə dedim şirin söz, bir şey ondan dadmadım,
Bu səbəbdən ağzı şəkkər dilrübadən küsmüşəm.

Bir qədəh mey istədim, sındırdı könlüm şişəsin,
Daş bağırlı saqiyi-sahib-cəfadan küsmüşəm.

Çün "uman yerdən küsərlər" bir məsəldir xalq ara,
Küsdüyüm bica deyildir, aşinadən küsmüşəm.

Gördüm əvvəl ki, binasın yarlıq etmək deyil,
Vaqifa! Əsli budur, mən bu binadan küsmüşəm.

***

Ey Vidadi, gərdişi-devrani-kəcrəftarə bax!
Ruzigarə qıl tamaşa, karə bax, kirdarə bax!

Əhli-zülmü necə bərbad eylədi bir ləhzədə,
Hökmü adil padişahi-qadirü qəhharə bax!

Sübh söndü şəb ki, xəlqə qiblə idi bir çırağ,
Gecəki iqbalı gör, gündüzdəki idbarə bax!

Taci-zərdən ta ki, ayrıldı dimaği-pürqürur,
Payimal oldu təpiklərdə səri-sərdarə bax!

Mən fəqirə əmr qılmışdı siyasət etməyə,
Saxlayan məzlumu zalimdən o dəm qəffarə bax!

Qurtaran əndişədən ahəngəri-biçarəni,
Şah üçün ol midbəri təbdil olan mismarə bax!

İbrət et ağa Məhəmməd xandan, ey kəmtər gəda,
Ta həyatın var ikən nə şahə, nə xunxarə bax!

Baş götür bu əhli-dünyadan ayaq tutduqca qaç,
Nə qıza, nə oğula, nə dusta, nə yarə bax!

Vaqifa, göz yum, cahanın baxma xübü ziştinə,
Üz çevir ali-əbayə, Əhmədi-Muxtarə bax!

## MÜSTƏZAD

Sən qönçə kimi hər bir edən dəmdə yaşınmaq,
Artar bizə yüz mərtəbə odlarına yanmaq.
Mən aşiqəm, ey gül sənə, olmaz bunu danmaq,
Ölən günədək eyləməzəm səndən usanmaq,
Daxi nə yaşınmaq, nə bürünmək, nə utanmaq?
Bəsdir bu dayanmaq!

Allaha şükür, lalə yanağında eyib yox,
Dişində, dəhanində, dodağında eyib yox...
Bir zərrəcə zülfündə, buxağında eyib yox,

Qaşında, gözündə, qabağında eyib yox,
Daxi nə yaşınmaq, nə bürünmək, nə utanmaq?
Bəsdir bu dayanmaq!

Mən ha sənin ol məh üzünü görmüşəm yüz yol,
Ox kirpiyini, şux gözünü görmüşəm yüz yol,
Həm yoldaşını, həm özünü görmüşəm yüz yol,
Şəkkər kimi şirin sözünü görmüşəm yüz yol,
Daxi nə yaşınmaq, nə bürünmək, nə utanmaq?
Bəsdir bu dayanmaq!

Mən xud deyilən bədnəzər, ey gözləri şəhla,
Məndən üzünü yaşırısan sən elə bica.
Qoysan, eləyim üzünə doyunca tamaşa,
Öldürdün axır, məndə ki, can qalmadı əsla,
Dəxi nə yaşınmaq, nə burünmək, nə utanmaq?
Bəsdir bu dayanmaq!

Qeyridən əgər ki, edəsən sən bu hicabı,
Billəm ki, sözündür vəli məqbulu hesabı,
Yoxsa, məni görcək, üzünə çəkmə niqabı,
Gəl, tanrı üçün, Vaqifə çox vermə əzabı,
Daxi nə yaşınmaq, nə bürünmək, nə utanmaq?
Bəsdir bu dayanmaq!

## MÜXƏMMƏS

Mən cahan mülkündə, mütləq, doğru halət görmədim,
Hər nə gördüm, əyri gördüm, özgə babət görmədim,
Aşinalar ixtilatında sədaqət görmədim,
Biətü iqrarü imanü dəyanət görmədim,
Bivəfadan lacərəm təhsili-hacət görmədim.

Xah sultan, xah dərvişü gəda bilittifaq,
Özlərin qılmış giriftari-qəmü dərdü fəraq,
Cifeyi-dünyayədir hər ehtiyacü iştiyaq,
Munca kim, etdim tamaşa, sözlərə asdım qulaq,
Gizbü böhtandan səvayı bir hekayət görmədim.

Hər sədavü səs ki, dünyaya dolub əksər əqəl,
Cümlə məkrü alü fənnü fitnədir, cəngü cədəl,
Dirhəmü dinar üçündür hər şeyə yapışsa əl,
Müqtədilərdə itaət, müqtədalərdə əməl,
Bəndələrdə simü, bəylərdə ədalət görmədim.

Xəlqi-aləm bir əcəb düstur tutmuş hər zaman,
Hansı qəmli könlü kim, sən edər olsan şadiman,
O sənə, əlbəttə ki, bədguluq eylər, bigüman,
Hər kəsə hər kəs ki, etsə yaxşılıq, olur yaman,
Bulmadım bir dost ki, ondan bir ədavət görmədim.

Alimü cahil, müridü mürşidü şagirdü pir,
Nəfsi-əmmarə əlindən sərbəsər olmuş əsir,
Həqqi batil eyləmişlər, işlənir cürmi-kəbir,
Şeyxlər şəyyad, abidlər abusən qəmtərir,
Hiç kəsdə həqqə layiq bir ibadət görmədim.

Hər kişi hər şey ki, sevdi, onu behtər istədi,
Kimi təxti, kimi taci, kimi əfsər istədi,
Padişahlar dəmbədəm təsxiri-kişvər istədi,
Eşqə həm çox kimsə düşdü vəsli-dilbər istədi,
Heç birində aqibət, bir zövqü rahət görmədim.

Mən özüm çox kuzəkarı kimyagər eylədim,
Sikkələndirdim qübari-tirəni zər eylədim,
Qara daşı döndərib yaquti-əhmər eylədim,
Daneyi-xərmöhrəni dürrə bərabər eylədim,
Qədrü qiymət istəyib, qeyr əz xəsarət görmədim.

Eyləyən viranə Cəmşidi-Cəmin eyvanını,
Yola salmış, bil ki, bəzmi-işrətin çəndanını,
Kim qalıbdır ki, onun qəm tökməyibdir qanını,
Dönə-dönə imtahan etdim fələk dövranını,
Onda mən bərəkslikdən özgə adət görmədim.

Gün kimi bir şəxsə gündə xeyr versən səd həzar,
Zərrəcə etməz ədayi-şükri-nemət aşikar,
Qalmayıbdır qeyrətü şərmü həya, namusü ar,
Dedilər ki, etibarü etiqad aləmdə var,
Ondan ötrü mən də çox gəzdim, nəhayət, görmədim.

Müxtəsər kim, belə dünyadan gərək etmək həzər,
Ondan ötrü kim, deyildir öz yerində xeyrü şər,
Alilər xaki-məzəllətdə, dənilər mötəbər,
Sahibi-zərdə kərəm yoxdur, kərəm əhlində zər,
İşlənən işlərdə ehkamü ləyaqət görmədim.

Dövlətü iqbalü malın axırın gördüm tamam,
Həşmətü cahü cəlalın axırın gördüm tamam,
Zülfü ruyü xəttü xalın axırın gördüm tamam,
Həmdəmi-sahibcəmalın axırın gördüm tamam,
Başədək bir hüsnü surət, qəddü qamət görmədim.

Ya imam-əl-insü vəlcinnü şahənşahi-ümur,
Getdi din əldən, bu gündən böylə sən eylə zühur,
Qoyma kim, şeytani-məlun eyləyə imanə zur,
Şöleyi-hüsnünlə bəxş et tazədən dünyaya nur,
Kim, şəriət məşəlində istiqamət görmədim.

Baş ağardı, ruzigarım oldu gün-gündən siyah,
Etmədim, səd heyf kim, bir mahi-rüxsarə nigah,
Qədr bilməz həmdəm ilə eylədim ömrü təbah,
Vaqifə, ya rəbbanə, öz lütfünü eylə pənah,
Səndən özgə kimsədə lütfü inayət görmədim.

## VAQİF İLƏ VİDADİNİN DEYİŞMƏSİ

Vaqif

Ey Vidadi, sənin bu puç dünyada,
Nə dərdin var ki, zar-zar ağlarsan?
Ağlamalı günün axirətdədir,
Hələ indi səndə nə var, ağlarsan!

Vidadi

Vaqif, nə çox yan-baş ayaq atarsan,
Mənə dersin: "Nə bu qədər ağlarsan!.."
Sənin də başında məhəbbət beyni
Əgər olsa, eylər əsər, ağlarsan!

Vaqif

Ta cəsədin cida olmayıb candan
Bil özünü artıq sultandan, xandan.
Habelə ayrılıq nədir ki, ondan
Bu qədər çəkibsən azar, ağlarsan!

Vidadi

Ağlamaq ki, vardır məhəbbətdəndir,
Şikəstə xatirlik mərhəmətdəndir,
Əsl bunlar cümlə mürüvvətdəndir.
Olsa üreyində, bədtər ağlarsan!

Vaqif

Kimdir indi bu dövrdə ol adəm,
Pərisi yanında heç olmayan kəm,
Qaralarsan bulut kimi dəmadəm,
Ağ yağış tək yaşın yağar, ağlarsan!

V i d a d i

Billəm çox uşaqsan, ürəyin toxdur,
Ləhvü ləəb ilə həvəsin çoxdur,
Qocalıq əsəri könlündə yoxdur,
Hələ sonra ağlın kəsər, ağlarsan!

V a q i f

Toy bayramdır bu dünyanın əzabı,
Ağlı olan ona gətirər tabı,
Sən təki oğlana deyil hesabı,
Hər şeydən eyləyib qubar, ağlarsan!

V i d a d i

Oğlan, sən uşaqsan, cavansan hələ,
Yenicə cisminə düşüb vəlvələ,
Təzəcə dəyənək alıbsan ələ,
Qayım tut ki, nagah düşər, ağlarsan!

V a q i f

Keçən işdən mərd igidlər pozulmaz,
Atalar deyibdir tökülən dolmaz,
Qatıq üçün qışda ağlamaq olmaz,
İnşallah, gələr bahar, ağlarsan!

V i d a d i

Dövlətindən yetdik nanü nəməyə,
Düşdük indi cadü qatıq yeməyə.
Söz ki, çoxdur, yeri yoxdur deməyə,
Əgər bilsən, ey bixəbər, ağlarsan!

V a q i f

Nə qədər dirisən, ölü deyilsən,
Qocalıban yaylar kimi əyilsən,
Padşahsan, əgər özünü bilsən,
Neçin olub candan bezar, ağlarsan!

V i d a d i

Elə ki, taxıldı burnuna çeşmək,
Qocalıq əl verib, dəxi nə şişmək?
Uşaqlar içinə düşər gülüşmək,
Sənin də acığın tutar, ağlarsan!

Vaqif

Yavuz çox qocalan bayatı sevər,
Gah öyünü,tək-tək özündən deyər,
Sən də yetişibsən o həddə məgər,
Beyninə bayatı uyar, ağlarsan!

Vidadi

Külli-Qarabağın abi-həyatı
Nərmü nazik bayatıdır, bayatı;
Oxunar məclisdə xoş kəlimatı,
Ox kimi bağrını dələr, ağlarsan!

Vaqif

Müxəmməs deməyin seyrəklənibdir,
Bayatıda zehnin zirəklənibdir,
Qocalıbsan, qəlbin köyrəklənibdir,
İşdən-gücdən olub bikar, ağlarsan!

Vidadi

Gəl, danışma müxəmməsdən, qəzəldən,
Şeri-həqiqətdən, mədhi gözəldən,
Sənin ki, halını billəm əzəldən,
Elə deyib canan, dilbər, ağlarsan!

Vaqif

Yetmişdə ki, belə nəm gələ gözə,
Kəsməyə arasın, baxmaya sözə,
O zaman ki, yaşın yetişər yüzə,
Gör ki, onda nə bişümar ağlarsan!

Vidadi

Sarı Çobanoğlu gəlsin yanına,
Axund, deyib canın qatsın canına,
Xanın şövkətinə, sənin şanına,
O, yaxşı müxəmməs düzər, ağlarsan!

## AŞIQ VALEH
(1722 — 1822)

### DİLBƏR

Durum dolanım başına,
Aşığından küsən dilbər!
Üzüm sürtüm ayağına,
Nə mən dinim, nə sən, dilbər!

İtirmişəm maralımı,
Bir sinəsi yaralımı,
Gündüz səbrü qəranmı,
Gecə yuxum kəsən dilbər!

Bu nə adətdi insanda,
İxtiyar qoymadı canda,
Bu zülm olmaz müsəlmanda,
Kafərmisən, nəsən, dilbər!

Görmədim mən sən tək yağı,
Sinəmə çəkmisən dağı,
Qara geyim mən, sən ağı,
Görən desin usan, dilbər!

Valeh əzəldən bəy idi,
Qaşların qəddini əydi,
Mən nə dedim sənə dəydi?
Bu mən dilbər, bu sən, dilbər!

## MƏZUN
(? — ?)

*Əsl adı Məhzun olan Məzun təxəllüslü XVIII əsr şairi İranda yaşayan, dili dilimizdən olan Qaşqay türklərindəndir. Qaşqay türklərinin Yusif Əli bəy, İsa Qasım və Hüseyn adlı şairləri sırasında Məzun ən görkəmli yer tutur.*

## VAR İMİŞ

Mən gəlmədim burda çəkəm bari-qəm,
Qəm var imiş, bu qəmxana var imiş.
Mən içməkdə götürmərəm cami-Cəm
Mey var imiş, bu meyxanə var imiş.

Gözəl gözləri məst imiş xun-riz
Ərguvan ləbləri, dili şəkər-riz.
Möhnət çəkmiş oğlan, məhəbbətli qız
Rəxil ata, zalım ana var imiş.

Dedi o ki, qoydu eşqin binasın,
Məşuq yandırası, aşiq yanası.
Qızılgül cəfası, bülbül nalası
Şam var imiş, bu pərvanə var imiş.

Kimin dərdi çoxdur, kimin dərdi az
Kimi dil-pərişan, kimi dil-nəvaz.
Məcnun məst aşiqdir, Leyli məsti-naz
Dağ var imiş, bu divanə var imiş.

Cahanı yandıran cahan afərin,
Əzəldən buyurmuş bu rəsm, bu ayin,
Fərhada Bisütun, Xosrova Şirin
Bu dastanü bu əfsanə var imiş.

İşvə ki rəxnə saldı imana,
O tiri-qəmzə ki kar etdi cəna,
Nə bir Məzun döşü, oldu nişana.
Tir var imiş, bu nişana var imiş.

## OLMASAYDI

Olmazdı hüsnün cilvəsi,
Eşqi-əzəl olmasaydı.
Ucalmazdı eşqin səsi
Rəna gözəl olmasaydı.

Əcəb aləmdir bihuşluq,
Məşuqinəm badənuşluq,
Rəsm olmazdı aşiqkeslik
Hənalı əl olmasaydı.

Çıxmazdı Fərhad tütünü,
Sevməzdi eşqin odunu.
Doğramazdı Bisütunu
Şirin əvvəl olmasaydı.

Bülbül çıxmazdı gülzardan,
Kam almazdı ahu zardan,
Heç yar ayrılmazdı yardan
Əgər əcəl olmasaydı.

Aşiq olan gərək yana,
Yana, can verə canana,
Əbəs yanmazdı pərvanə
Şəmi-məşəl olmasaydı.

Gəl, görək cünun düzünü,
Eşidək Məcnun sözünü.
Kim nə tanırdı Məzunu
Şerü qəzəl olmasaydı.

## YADIMA DÜŞDÜ

Dün gecə yuxuda mahi-ruyundan,
Ləb-ləbə qoymuşduq göft kuyundan,
Ruhum tazələndi ənbər buyundan
Şuxi mişkin-nəfəs yadıma düşdü.

O türki-Çini ki, bilərdim məndən,
O şəhdi-ləbi ki, əmərdim qənddən,
Xab içində əlimdəydi dolu cam
Bir türki-meypərəst yadıma düşdü.

Bu gün seyrə çıxdı havalı laçın
Gedəm alım gözlərinin bir maçın,
O zülfü-Çini ki, düzməyi çin-çin
Mən edərdim həvəs, yadıma düşdü.

Məhzun etdi bu deyiş təbirin dərk,
Dirəxti-işrətim tökdü barı bərg,
İnnən belə yuxum olur xabi-mərg
Öz əcəlim əbəs yadıma düşdü.

## TELİMXAN

(1741? — 1819)

*Telimxan Tehran yaxınlığında Azəri türklərinin məskunlaşdığı Səva vilayətində yaşayıb yaratmışdır. Heca vəznində, xalq şeri üslubunda gözəl əsərlər yaratmış Telimxan nə yazıq ki, ədəbiyyat tarixlərimizə daxil edilməmiş və az qala unudulan şairlərimizdəndir. Güney Azərbaycanın dəyərli araşdırıcılarından olan mərhum Əli Kəmali uzun illərin zəhməti bahasına Telimxanın şerlərini toplaya bilmişdir.*

*Ə. Kəmali onu da qeyd edir ki, Telimxan Molla Pənah Vaqifin bəzi şerlərinə bir sıra nəzirələr və cavablar yazmışdır. Aşağıda Telimxanın şerlərini və bəzi şerlərindən parçaları veririk.*

Ay ağalar, sizə tərif eyləyim,
Rüsxət alıb Alışandan gəlirəm.
Ağız davat, göz mürəkkəb, dil qələm
Altmış pillə nərdivandan gəlirəm.

Oturmuşam, öz halıma ağlaram,
Dərd bilənin ciyərini dağlaram.
Gəzərəm ölkəni, çəmin bağlaram,
Möhtəsiməm, asimandan gəlirəm.

***

Qəm əmdim, dərdlərə olmuşam bəndə,
Rəncurəm, qalmışam möhnət evində,
Ya Həzrəti-İlyas, ya Xızr zində,
Müşküldə qalmışam, qılma fəramuş.

***

Ərkani-cangaşə əyaq qoyanlar,
Gərəkdir ki, hər yetəni ağsada.
Aşıq deyər ağsada,
Ağ geyirdi ağ sada
Əğyar! Sənə rəvadır
Didəndən qan axsa da.

***

Geyinəndə başdan-başa bir al sən,
"Telimə" edibsən fitnə bir al sən,
Kafidir ağuşa məni bir al sən,
Yetirər məqsədə bir alma məni.

## OLDU

Xırdalıqda yandım nari-həsrətə,
Yediyim zəhr, içdiyim su qan oldu.
Qürbət əli tutdu giribanımı,
Əzrailə təqəbbülüm can oldu.

Bürcü-nəshə düşdü taleyi-bəxtim,
Yenə fələk zülmü nümayan oldu,
Zövrəqi taleyim bəhri-ələmdə,
Təlatümi-qəm də binişan oldu.

Çox sızıldar, yaralarım duzludu,
Riyamıdır? Dövran iki üzlüdü,
Dərdi-dilim ürəyimdə gizlidi,
Sirr deməyə nə bir müsəlman oldu.

Soldu gül, pozuldu gülşəni-aləm,
Şeyda bülbül nalə çəkir dəmadəm,
Fanusu-ixfayə çünki girdi şəm,
Gör necə pərvanə sərgərdan oldu.

***

Sənin kimi xalü xəttə,
Sərə çəkmiş ipək şəddə,
Deyərlər vardı cənnətdə,
Əlbəttə, yalan deyərlər.

Hər görənə edən adın,
Söylə sən əsli-bünyadın,
Gəl, izhar etgilən adın
Mənə Telimxan deyərlər.

***

Ətəyinin səngine başım qoydum
Məhbusunam, sal boynuma min bağı.
Eşqin dəftərinin hesabdarları
Gətiribdir gərdənimə min bağı.

Könül sevməz hər bir gözəli çindən,
Gətirsələr yüz min gözəli Çindən.
Səni sevdim yüz min gözəl içindən,
Bülbül gəzər bir gül üçün min bağı.

Şikar gələr bərəsindən yar aşmaz,
Kamil olan öz həddindən yar aşmaz,
Bir könülə iki sevgi yaraşmaz
Bağban sala əlbət olar min bağı.

Zindəganlıq tosinini minəsən,
Sən bu salı yetirəsən minə, sən;
Yar sədrinə düymə düzdür, mina sən
Gül cameyə nəsib eylə min bağı.

Əndəlib tək müttəqid ol gülə sən,
Teliməm şayəd şad ola güləsən,
Mətləbini təşbeh elə gülə sən
Nə zərurdur dolanasan min bağı.

***

Fürukeş olubdur əsil yiyələri
Bəd əsillər meydan dilər , hu dilər.
Himar palanını salıbdır yerə
Zin-puşunu bəgrəs dilər, nov dilər.

Mayalar əsriyib mənsux olub nər,
Meydanı boş görüb mübariz istər.
Kəmali rəşadət itib əslu fər
Çaxır içən keçi qurd ovu dilər.

Sədri-məclis olub anlamazından
Nə umarsız bu həyasız dünyadan?
Bədöv getdi-nəzər edib arpadan,
Himar hər şam beş Təbrizi cov dilər.

Kamal odu uca dağdan aşıbdır,
Yol bələdi doğru yoldan çaşıbdır,
Şonqar, laçın şikargahdan düşübdür,
Çalağan miri-şikar olub ov dilər.

Telimxanı namərd sözü dağladı,
Novkişilər özlərin mərd çağladı.
Nərü şirlər əsdi, kəsdi ağladı
Tülkü gəlib qılıncına dov dilər.

***

Qəsri münəqqəşdən ey mahi-təban
Baxma mayıl-mayıl, öldürdün məni.
Apardın əqlimi, cünun eylədin
Əcəb aləmlərə güldürdün məni.

Sona tək döşəndin çəmənə, çaya,
Tağı-beytüllaha qaşların paya,
Qanlı müjkanların gəzlədin yaya,
Vurdun, dəlik-dəlik dəldirdin məni.

Ləbin mübahisə eylər ləlilən,
Müjganın bağrıma vurdun əlinnən,
Könlümün pasını bir sığal ilən,
Dedim, lütf eylədin, sildirdin məni.

Qorxuram bu şikəst cismim budansın,
Xof eləməz ya öldürsün, ya dansın.
Ver ləblərin, Telim əmsin, dadansın,
Bir almaz tifl idim, aldırdın məni.

## VÜCUDNAMƏ[1]

Atadan gəldim anaya
Bircə qətrə qanə döndüm.
Doqquz ay seyran eylədim
Canlandım insanə döndüm.

Ol dəm ki, gəldim dünyayə,
Ağız açdım əmdim mayə.
Bədirləndim, döndüm ayə
Bir mahi-tabanə döndüm.

İki yaşımda əmdim şir,
Danışıq öyrəndim bir-bir.
Hökmüm rəvan, oldum əmir
Bir tifli-nadanə döndüm.

Altıda məktəbə düşdüm,
Yeddidə məktəbdən qaçdım.
On beşimdə yeyib coşdum
Dəryayi-ümmanə döndüm.

---

[1] "Vücudnamə" xalq şerimizdə qoşma tərzində yazılmış, insan həyatını doğumundan ölümünə qədər təsvir edən poetik janrdır.

İyirmidə oldum çəri,
Tapdım məzhəbi-Cəfəri.
Yıxdım Qalayi-Heybəri
Əliyi-Ümranə döndüm.

Otuzumda oldum dəli,
Çağıranda dedim: "bəli".
Çağırdım sidqinən "Əli"
Rüstəmi-dastana döndüm.

Yaşadım qırxa yetişdim,
Qırxlar cəminə qarışdım.
Bəylər ilən yedim, içdim
Sultan idim xana döndüm.

O gün ki, əlliyə çatdım,
Günbəgün mən dala ötdüm.
Zəri-zivərimi satdım
Mətasız dükkanə döndüm.

Altmışda durub oturdum,
Ömrü yetmişə yetirdim.
Huşum havasın itirdim
Bir piri-nalanə döndüm.

Yetmiş yaşa köç eylədim,
Cavan ömrüm puç eylədim,
İki qıçım üç eylədim
Cərgeyi-piranə döndüm.

Səksəndə çox halım yaman,
Gözlərimi tutdu duman.
Olmadı dərdimə dərman
Dərdi-bidərmanə döndüm.

Doxsan yaşda düşdüm zara,
Olmadı dərdimə çara.
Əzimət etdim məzara
Yaxşı müsəlmana döndüm.

Yüz yaşımda mindim ata,
Kim baxar qəbzə,barata?
Didar qaldı qiyamata
Xak ilə yeksanə döndüm.

İnkir, Münkir dövrəm aldı,
Məni sualata saldı.
Əli harayıma gəldi
Xoşhalü xəndanə döndüm.

Şahi-mərdan nəhib etdi,
İnkir, Münkir fərar etdi.
Qıli-siratdan keçirtdi
Mən əhli-rizvanə döndüm.

Ağam Əli seyrə gəldi,
Behişt güllərindən dərdi,
Kövsərin suyundan verdi,
Pir idim, cavanə döndüm.

Mömin pişişi çullandım,
Yedim, içdim, mən sulandım.
Behiştdə gəzdim, dolandım
Türkmən Telimxanə döndüm.

***

Sərasər bəxtimi al eləyibdir
Geyibdir qəddinə yar alacanı.

Aşıq yar ala canı
Geymiş yar alacanı.

Gəncinə müstəfid edir şahmarın
Salıbdır sədrinə yar ala canı.
Verdim canım yar ləbini yarıya
Könül, gərək yar yarınnan yarıya.

Aşıq deyər yarıma
Məlhəm eylə yaraya.
Ləblərin zəkatını
Ehsan elə yarına.

Əcəl gəlsə, riza olsa yarıya
Məgər ki ortadan yar ala canı.
Dost deyibdir bizə gəlməz şəbnişin
Dedim, bəlkə gedib edim şəbnişin.

Aşıq deyər şəbnişin
Dost görünməz şəbnişin
Bir vəfalı yar ilən
Yaxşı olur şəbnişin.

Vurar bizi əqrəb kimi şəbnişin
Fikri budur məndən yar ala canı.
Türki dilimə bərabər deyil,
Cəm olsalar tamamən yaranlar.

## TELİMXANDAN BAYAT CƏFƏRƏ

Məndən salam olsun Bayat Cəfərə,
Əvvəl həqiqətdən xəbər istərəm.
O kimdi, əmr oldu bir bağ düzəltdi?
Kim ona səfər qıldı, istərəm.

Nə dəfdərdir hərgiz övraq olunmaz?
O nə evdir heç qapısı bulunmaz?
O nə sazdır gündən günə çalınmaz?
Nə məkanda tutub qərar, istərəm.

Kimlər idi cəbr əlindən getdilər?
Neçə müddət qar içində yatdılar?
Nə heyvandır bəs olara qatdılar?
Nə zamanda oldu bidar, istərəm.

O kimlərdi laməkanə getdilər?
O kimdir ki, ona bələd qatdılar?
Nə mələkdir boynuna tövq atdılar?
Kimlər oldu onla fərar, istərəm.

Nə bədəndir nəfəsi yox, var dili?
O nə bağdır içində beş bülbülü?
O nədir çəhl sütunda üç gülü?
Telim kimlərdir didar, istərəm.

## BAYAT CƏFƏRİN TELİMXANA CAVABI

Məndən salam olsun türkmən Telimə
Haqqı şəriətdən gəl, xəbər verim:
Əmr oldu İbrahim düzəltdi Kəbə
Külli şiə üçün gülzarı nəim.

Haq bir dəfdər tutub, dəxi tutulmaz,
Xızr evidir heç qapısı bilinməz.
Sur sazıdır gündə - gündə çalınmaz
Laməkanda qərar tutub ol Kərim.

Əshabi-kəhf zülm əlindən getdilər,
Neçə müddət kəhf içində yatdılar.
Adı getmir kəlb olara qatdılar
Oları oyatdı sübhani-əzim.

Mustafadır laməkana getdilər,
Cəbrayıldır ona bələd qatdılar.

Sədəyə gəlmədi tövq uzatdılar
Qaçdı fərar etdi şeytani-ləim.

O qələmdir nəfəsi yox, var dili,
Beş vaxtda namazdır bağı, bülbülü,
Qırx səkkiz həftəmiz üç bayram güli
Bayat Cəfər Allah yolunda sərim.

## SEYFİXAN
(? — ?)

Uzun illər həsrətini çəkdiyim
Soruş indi, dərdim indi, bil indi.
Məni yardan ayrı salan şeyrəqib
Duam indi, sənam indi, bil indi.

Məcnunsifət səhraları gəzəyim,
Özüm öz dərdimə dəva yazayım,
Bahar olsun buxağına düzəyim
Süsən indi, sünbül indi, gül indi.

Avaz büLənd, göftar ləziz, ləbi bal,
Nazik miyan, əbru kaman, hindi xal,
Bidamağam, bir busə ver, könlüm al,
Həmayil tək sal gərdənə qol indi.

Yanmadım, fələk səni yanma,
Aləmi yandırdım ahu-zanma,
Badi-səba, de bivəfa yanıma
Seyfixan öldü, insafa gəl indi.

# XVIII ƏSR TÜRKMƏN ƏDƏBİYYATI

## ƏNDƏLİB

(? — ?)

*XVII əsrin sonu — XVIII əsrin əvvəllərində yaşamış türkmən şairi Əndəlibin "Nəsimi", "Sədi Vəqqas" və "Oğuznamə" adlı poemaları vardır.*

### «OĞUZNAMƏ»

(parçalar)

Qədim əyyam Keyumərsin zamanı
Türk evladı içrə durdu bir xaqan.
Baxıb devran, fələk verdi amanı
Moğol evladı içrə oldu soltan.
Qara xan oğlu ola, kim adı Oğuz
Olub şahlıqda manəndi Süleyman.
Zaman əhvalı erdi adildən düz
Əbdülxan dağından ol qıldı seyran.
Birinci seyrində vardı Xətayə
Barışda qarşı durdu İt Barak xan.
Önün tutdu ki, deyir: "Keçmə bu çayı!"
Vuruş qəsdinə doğruldu Oğuz xan.
Hamana hərbə təyyar oldu xeyli
Zəmin cümbüş edib, dağları lərzən
Yetişməkdən təxir oldu eli
Gülə-gülə başladılar zari-giryan.
Tamam həmlə qıldı hiylə ilən
Mükəmməl səf çəkdi İt Barak xan.
Xəta lərzana gəldi eli ilən
Vuruş meydanı oldu laləzar qan.
Oş ol tərtibdə yetmiş gün vuruşdu
Ki ondan sonra acizləndi Oğuz xan.
Tamam çarə ilən arda yörüşdü

Təbil-bazi küşt çalında hər yan.
Dəniz aralığı boşluq yerində
Varib əsgər hesabın aldı Oğuz xan.
Yüz ersal çərinin heç birində
Tapılmaz oldu, Xanın könlü viran.
Gəl, ey sən, Əndəlib iş bu kəlamı
Hekayət qıl bu bizə dirri-qəltan.
Sənə el yetirir xeyri, salamı
Duayi-fatihə edəcək candan.

## ABDULLA ŞABƏNDƏ
(? —?)

### SEVƏR YARIM MƏNLİ

Qaşına çəkibsən sürmə
Bu gün sevər yarım Mənli.
Ağ yanaqda burma-burma
Siyah zülfün tarım Mənli.

Gözə gəlməz dünya malı,
Pərişandır aşiq halı,
Xəzan vurdu sən gedəli
Soldu baxça - barım, Mənli.

Sənsən mənim Bəlx, Ürgəncim,
Səndən özgə yox güvəncim,
Qoynun içi gizli gəncim
Qızıl alma, narım Mənli.

Seyrə çıxıb zülfün darıb,
Ağ üzündə roymal sarıb,
Şabəndənin halın sorub
Gəl, ey vəfadarım Mənli.

### BEZAR OLDUM

Ağa bəylər, eşit sözüm,
Mən dünyadan bezar oldum.
Telmirədir iki gözüm,
Yalançıdan bezar oldum.

Bir baxmadı göz yaşıma,
Yar yiyə olsun leşimə.
Nə günlər gəldi başıma,
Şirin candan bezar oldum.

Gözüm açıb cəfa görüb,
Bir neçə vaxt işrət sürüb,
Dəli həm divanə olub,
Bu canımdan bezar oldum.

Xəlil olub gəzdim göldə,
Qətra yaş qalmadı gözdə.
Dura bilməm ulu eldə,
Eli-gündən bezar oldum.

Daim Məcnun çöldə gəzdi,
Fərhad Bistun dağın qazdı,
Xəlil təni-nara dözdü,
Bu tənimdən bezar oldum.

Nələr gördüm bu cahanda,
Arman qaldı şirin canda.
Şükür eyləgil Şabəndə
Bu canından bezar oldum.

## SAYATLA XƏMRA

(Dastanın türkmən variantından şerlər)

1

Ey yaranlar, musurmanlar,
Yar qırmızı geyinibdir.
Ağ üzündə qoşa xallar
Xal qırmızı geyinibdir.

Qurban olum qələm qaşa,
Yar cığasın sancar başa.
Sinəsində qoşa-qoşa
Nar qırmızı geyinibdir.

Baxışı var ceyran kimi,
Rəftarı var maral kimi,
Zülfləri var şahmar kimi
Mar qırmızı geyinibdir.

Yarım gələr gülə-gülə,
Gülüşü bənzər bülbülə.
Yanında qırx kəniz belə
Var, qırmızı geyinibdir.

Gəl, Sayat gedəlim bağa,
Yarım, bax sinəmdə dağa.
Xəmranın canın almağa
Yar qırmızı geyinibdir.

2

Gül üzlü sevdiyim sənə deyirəm
Qalmışam mən qayğı-qəmlər içində.
Bu qərib canıma olmasan həmdəm
Çeşmi-giribanım nəmlər içində.

Saqinin qolundan badə sunaram,
Ölməyincə səndən haçan dönərəm.
Gecələr tutuşub,gündüz yanaram
Səni görsəm naməhrəmlər içində.

Həqiqət eşq yolun tut indi Xəmra,
Aşiqlik şərbətin iç indi Xəmra,
Bivəfa dünyadan köç indi Xəmra,
Sən ah çəkib bu həmdəmlər içində.

## AZADİ
(1700 — 1760)

*Azadi böyük türkmən şairi Məxtumqulu Fəraqinin atasıdır.*

Padişah zülm eyləsə bilgil bunu
Daş edəcək cümlə canlar könlünü.
Mehri olmaz yaş kişinin kişiyə
Rəhmi olmaz yaşulının kiçiyə.
Titrər ermiş varca heyvan canları
Quruyurmuş bu damarda qanları.
Dedi şah Mahmud bunlara: ey Muhan,
Xalq-ara zülm edici şahi-cahan
Ağlı kəmdir bu kişidən, ağlı kəm.
Zülüm öz kökün qazar, eylər adəm
Padişah kim işi zülm etmək olur

Biağıldır, axır öz kökün salır.
Cövrü-zülmü padişahi-zalımın
Ox olub öz canına dəyər bilin.
Der Səmərqənd zalımı məşhur idi
Gecə-gündüz işi zülmi-zor idi.
Taxt üzrə yatmış idi ol rəvan
Sinəsindən dəydi ox, etdi fəğan.
Cəm olub zalım önünə gəldilər
İş bu işə çox tamaşa qıldılar.
Tanrıya can verdi ol zalım bu hal
Şübhəsiz, qaldı onun mülki zaval.
Ol kişinin sinəsindən bir oxu
Çəkdilər, çıxardılar Tanrı haqqı.
Gördülər bir xətt yazılı orda var:
"Olma zalım, ibrət algil, zinhar."
Haq sitəmkar bağrına vurdu oxu
Cümlə məzlum ahıdır kim, gəl oxu...
Yaxmadın bir kimsə, yaxdın özünü
Tutdun öz özün ilə öz sözünü.
Hər kişi kim od yaxar, özü bişər
Qazsa kim çuxur, ona özü düşər.
Özgəni yaxmaq — özün yaxmaq olur
Çomaq vursa, özünə toxmaq olur.
Özün vurmaqdır kişi vurmaq haman
Ağıl yiyəsi bu sözə tutmaz güman.

# MƏXTUMQULU FƏRAQİ
(1733 — 1782)



*Məxtumqulu Fəraqi türkmən ədəbiyyatının ən böyük nümayəndəsidir, şöhrəti Türkmənistanın sərhədlərini aşmış, bütün türk dünyasında, Şərq aləmində tanınmış şair-filosofdur. Əhməd Yəsəvinin və Yunus İmrənin təsirini duymuş Məxtumqulu türkmənlərin yalnız ədəbiyyatında deyil, ictimai və milli şüurunda da misilsiz yer tutan sənətkardır. Xalqın milli özünüdərki üçün Məxtumqulunun məşhur "Türkmənin" rədifli şeri çox əhəmiyyətlidir. Başqa bir şerində böyük şair türkmən tirlərinin, qəbilə və tayfalarının birliyi, vahidliyi ideyasını qələmə alır:*

Türkmənlər bağlasaq bir ipə beli,
Qurudar Qulzümi, dəryayi-Nili.
Təkə, yomud, köklən, yazır, əlili —
Bir dövlətə qulluq etsək beşimiz.

*Türkmən ədəbiyyatına, dilinə etdiyi böyük xidmətlərin müqabilində Məxtumqulu özünü türkmənlərin "söylər dili" adlandırmaqda tamamilə haqlı idi. Molla Pənah Vaqif və Molla Vəli Vidadi, Qaracaoğlan və Telimxan kimi Məxtumqulu Fəraqi də Türk Oğuz şerinin sadə ana dilində yüksəlməsi, cilalanması, ən dərin fikirləri anlaşıqlı bir şəkildə ifadə edə bilməsi üçün əvəzsiz tarixi xidmət göstərmişdir.*

## TÜRKMƏNİN

Ceyhun ilə Bəhri Xəzər arası
Çöl üstündən əsər yeli türkmənin.
Gül qönçəsi, qara gözüm qarası
Qara dağdan enər seli türkmənin.

Haq sılamış vardır onun sayəsi
Çırpınır çölündə nəri, mayası.
Rəngbərəng gül açar yaşıl yaylası
Qərq olmuş reyhana çölü türkmənin.

Al-yaşıl bürünüb çıxar pərisi,
Kükrəyib bərq vurar ənbərin iysi.
Bəy, törə, ağsaqqal yurdun yiyəsi
Kürən tutar gözəl eli türkmənin.

Ol mərdin oğludur, mərddir pədəri,
Koroğlu qardaşı, sərxoşdur səri.
Dağda, düzdə qovsa səyyadlar... diri
Ala bilməz yolbars oğlu türkmənin.

Könüllər, ürəklər bir olub başla,
Dartsa yığın ərir torpaqlar, daşlar.
Bir süfrədə təyyar qılınsa aşlar,
Qalxacaqdır ol iqbalı türkmənin.

Könül havalanır ata çıxanda,
Dağlar lələ dönər qıya baxanda,
Bal gətirər coşub dərya axanda
Bənd tutdurmaz gəlsə seli türkmənin.

Qafil qalmaz, döyüş günü xar olmaz,
Qarğışa, nəzərə giriftar olmaz,
Bülbüldən ayrılıb solub saralmaz
Daim ənbər saçar gülü türkmənin.

Tirələr qardaşdır, uruq yarıdar,
İqballar tərs gəlməz, haqqın nurudur.
Mərdlər ata çıxsa savaş sarıdır,
Yad üstünə yürər yolu türkmənin.

Sərxoş olub çıxar, ciyər dağlanmaz,
Daşları sındırar, yolu bağlanmaz,
Gözüm qeyrə düşməz, könül əylənməz
Məxtumqulu — söylər dili türkmənin.

## NEYLƏYİM

Könül istər — gəzsəm dünya-aləmi,
Qanadım yox, uça bilmən neyləyim?
Oxuram, görürəm varca kəlamı
Mənasını seçə bilməm neyləyim?

Çoxlar orda qəvvas olub üzərlər,
Mənə zahir, xalqdan pünhan gəzərlər,
Gül badədə gülgün şərab əzərlər,
Əl uzadıb içə bilmən neyləyim?

Ev daşından şərab iysin nuş qıldım,
Getdi ağlım, özünbilməz cuş qıldım,
Mey məst oldum, bağlı qapı tuş gəldim
Rüsxət olmaz, aça bilmən neyləyim?

Yeddi yolum, dağ hansıdır, düz hansı?
Anmaz könlüm — mahnı hansı, söz hansı?
Fəhm eyləməz yol hansıdır, iz hansı?
Ümid üzüb qaça bilmən neyləyim?

Məxtumqulu bu dünyanın namusun,
Yığıb, dürüb yelə verdim hamısın.
Fikir dəryasına ağlım gəmisin
Batırmışam, çıxa bilmən neyləyim?

## ATAMIN

Altmış yaşda, novruz günü, bu ili
Durdu əcəl, yolun pusdu atamın.
Bu dünyanın işi beləymiş, bəli
Ömrünün tanapın kəsdi atamın.

Ağır dövlətlərə könül qoymadı,
Bu cahanın işrətini sevmədi,
Əski şaldan artıq libas geymədi,
Axirət eviydi qəsdi atamın.

Derdi: dünya durmaz, ömrə baqi yox,
Gündüz oruc, gecə olsa yuxu yox,
Münkir bilməz, müxlislərin şəkki yox
Peyğəmbər dostudur dostu atamın.

Görməsəm söyləməm zəndən, təhmindən,
Məqsədinə yetər haq yola gedən.
Yarısı mələkdən, yarısı cindən
Turbədarsız olmaz üstü atamın.

Nöhə derlər üç yüz ərən yarışdı,
Çiltəndə atama nəzərim düşdü.
Necə varsam həftənlərə qarışdı
Bunlar imiş çin peyvəsti atamın.

Məxtumqulu gizli sirrin var içdə,
Kamil tapsan qıl qulluğun sərişdə.
Məhşər günü əlbət girər behiştə
Hər kim candan olsa dostu atamın.

## ARMANIM QALDI

Zübeydə, naçaram, dinlə
Qəlbimdə armanım qaldı.
Gözlərimdən axtırdım qan
Zəminə bax: qanım qaldı.

Bülbüləm çəkmişəm zarı
Sovuldu eşqin bazarı.
Vuruldu hicran xancarı
Ağlar Mənli xanım qaldı.

Ötən günlərim duş olub,
Gəzdim elimdən dış olub,
Baxın, cəsədim boş qalıb
Lahidd içrə canım qaldı.

Günbə-gündən dərdim artıb,
Gəzmədim cahanı yortub,
Zəhmət çəkib, azar dartıb,
Düzdüyüm dastanım qaldı.

Zalım fələk, qəhbə fələk,
Çox canları qıldın həlak.
Lalə, zəmin, asman, mələk,
Bax, mahi-tabanım qaldı.

Məxtumqulu, qara üzün,
Dinləməzlər zarın, sözün,
Zübeydəm yaşlasın gözün
Yiyəsiz dükanım qaldı.

## NƏLƏR GÖRÜNÜR

Seyr edəlim bu cahanı
Cahanda nələr görünər.
İsgəndər, Cəmşid saldıran
Böyük binalar görünər.

Yaradan var etdi yoxdan
Dağlar dünya sürər çoxdan.

Sorsan, xəbər verər Nuhdan
Çeşməli çaylar görünər.

Çağlar, yalan dünya, çağlar,
Nə gülən qalar, nə ağlar.
Qar, yağmurlar bürcü bağlar
Kəmərli dağlar görünər.

Nə vətən qalar, nə çətən,
Sənəmlər seyr edib ötən,
Tuti, bülbül məskən tutan
Havalı dağlar görünər.

Məxtumqulu, kim var ölməz?
Əcəl doymaz, zəmin dolmaz,
Asman enməz, yer çevrilməz,
Gün yürür, aylar görünər.

## ƏR YANINDA BƏLLİDİR

Yaxşılığı pis bilməz,
Ər yanında bəllidir.
Görər gözün qiyməti
Kor yanında bəllidir.

Dəli könül dayancı,
Yoxdur dünya inancı,
Sağ qulağın güvənci
Kar yanında bəllidir.

İstər pirsən, istər yaş,
Qılma sirrin xalqa faş.
Sirr saxlayan məhək daş
Zər yanında bəllidir.

Olsa qəmdən xilasım,
Yaza dönsə qış fəslim,
Məxtumqulu, ixlasım,
Yar yanında bəllidir.

## SEL QALMAZ

Altmış başlı, ala qarlı dağlardan
Duman köçər, yağmur yağar, sel qalmaz.
Şeyda bülbül məskən tutan bağlardan
Xəzan vurar, yarpaq solar, gül qalmaz.

Hər kim içsə ol şərbətdən, ol camdan,
Ürək yanar, heç söz gəlməz zəbandan.
Gələn keçər bu yalançı cahandan
Xoca, seyid, bəy, padşah, qul qalmaz.

Məxtumqulu, bu cahanda kim olar?
Ol məkana gedən gəlməz güm olar.
Görər gözün, görklü gövdən qum olar.
Dodaq gedər, dişlər düşər, dil qalmaz.

## AĞLARAM

Ey yaranlar, ömrümdən
Keçdi deyib ağlaram.
Getdi ağlım yerindən
Qaçdı deyib ağlaram.

Gedən dönməz yolundan,
Düşməz yaman felindən,
Dəyanət xalq əlindən,
Uçdu deyib ağlaram.

Görün fələyin oynun
Üzər alimin boynun.
Neçə canlar yer qoynun (a)
Köçdü deyib ağlaram.

Məxtumqulu der mərdə
Dünya bənddir, tən—nərdə.
Bu başım saysız dərdə
Düşdü deyib ağlaram.

## AR İLƏ

Dırnağı dəmirdən talançı dünya,
İşin nədir namus ilə, ar ilə?
Cövri-cəfası çox yalançı dünya,
Qoymazsan gəzməyə yarı yar ilə.

Məhəbbət vecindən yar bir "gəl" — desə,
Mətləbin istəyib məndən al desə,
Bir gün durdun, bir gecə həm qal desə,
Qədəm qoysan ayaq yerinə sər ilə.

Leyli üçün nə cəbr etdin Məcnuna?
Zalım, insaf eylə bu nahaq qana.
Gündə qırx at bəzib (bəzəyib) verdin Haruna
İsa keçinmişdi yekə xər ilə.

Məxtumqulu aydar: işin talandır,
Bu növbət çoxlardan keçib qalandır,
İrtibatın yoxdur, sözün yalandır,
Dost qoymadın, yeksan etdin yer ilə.

## ÇALDI GETDİ

Bu dünya oyunbazdır
Çalğısını çaldı getdi.
Gümrah edib neçəsin
Yoldaş deyib aldı getdi.

Aqil: fikr et hər zaman
Yüz köçən var, yüz qonan.
Taxti-aqmandan uçan
Süleyman öldü getdi.

Ya mürüvvətli şahım,
Ümidim, qibləgahım.
Çox ağlayıb İbrahim
Neyini aldı getdi.

Ciyərin dağlar-dağlar,
Zünnarın bağlar-bağlar,
Neçələr ağlar-ağlar,
Neçələr güldü getdi.

Neçələr gülə dönmüş,
Gül yanıb külə dönmüş,
Neçələr quma dönmüş,
Neçələr soldu getdi.

Qalarsan yerdə bağlı,
Bir bəlli yurda bağlı.
Beyhudə, adəm oğlu
Yığdığın qaldı getdi.

Axmaqlıq ilə özüm
Bilmədim dedim sözüm.
Məxtumqulu der: gözüm
Qan yaşa doldu getdi.

## CAN İÇİNDƏ

Dəli gönül neylərsən, gəldin cahan içində?
Tən torpaqdır, əylənməz cövhəri-can içində.
Qaldın dünya qəmində, ürəyin qan içində,

Abad deyib əl vurdun dibi viran içində,
Rüstəm quma qarılıb qaldı yeksan içində,
Sən onların yanında qalmazsan san içində.

Ey yaranlar, ol dünyaya varan var da, gələn yox,
Ölü-diri halından xəbər-ətər bilən yox,
Çərxi-fələk əlindən ağlayan var, gülən yox,
Ağıl edin qardaşlar, köhnələrdən qalan yox,
"Yalançının vəfası yoxdur" desəm yalan yox,
Dünyaya bel bağlayan qaldı ziyan içində.

Dünya deyib yüyürsən ta içində dəm vardır,
Dəm içindən çıxınca başında min qəm vardır,
Qəm altında yatıbsan, nə ona məlhəm vardır,
Doymaz gözün dolmağa bircə ovuc qum vardır.
Ey yaranlar, adəmzad, səndən qafil kim vardır?
Qurda, quşa nəzər qıl, külli-fərman içində.

Məxtumqulu, aldadır qəhbə fələk bəzənib,
Könlünü mail qılma ona qarşı düzənib.
Necə rahat yatarsan əl-ayağın uzadıb?
Əcəl durub keşikdə oxun yayın gizlədib,
Məhşər günü varı ver imanını qazanıb,
Quru gəldin, boş getmə, axır zaman içində.

## YAYLAQLARI VAR

Səfər edib varsaq Nuxa mülkünə,
Könül istəyən tək yaylaqları var.
Seyran etsək qönçəsinə, gülünə
Baxçasında bülbül oynaqları var.

Yeri sazdır, xəstə olan sağalar,
Arıq, müflis, qərib olan onalar.
Sərçəmən ağacı belə dənələr
Əcəb quş salmalı ovlaqları var.

Meydanı doludur şəkər qamışdan,
Dilək etməz hərgiz qardaş qardaşdan.
Üstü yapıqlıdır gümüş kərpicdən
Hər kimin özüyçün suvlaqları var.

Baş qoşmandır arıq, ağsaq, şah ilə,
Oturub dükanda sarı yay ilə,
Şirvan qalasıdır, onu kim bilə,
Hər bürcündə altın bayraqları var.

Məxtumqulu sazdır, söhbətdir işin,
Əcəldən qeyridən olmaz təşvişin.
Bayların, fəqirin, əhli dərvişin
Uzun yollar yoran ayaqları var.

## BİLMƏDİM

Fələk mənə qəm badəsin verəli
Vüsal hansı, hicran hansı, bilmədim.
Baq işinə tən vermişəm, görəli
Arzu hansı, arman hansı, bilmədim.

Bəndə olsan gözlə haqqın rizasın,
Cəbr eyləsə çəkəvergil cəzasın.
Əcəl bir gün atar tiri-qəzasın
Kiriş hansı, kaman hansı, bilmədim.

Arif olsan qulaq qoygil sözümə,
Bir sürətəm bu gün baxmam özümə.
Dünya dibi yek görünər gözümə
Devir hansı, dövran hansı, bilmədim.

Az ömrümü çox sevdaya satıb mən,
Özüm bilmən ol dəryaya atıb mən,
Nə ümmandır, nə talabdır, yatıb mən,
Zəmin hansı, zaman hansı, bilmədim.

Hər kim girsə ol talaba, ümmana,
Başın alıb çıxa bilməz bir yana.
Qədəm qoydum ol səhrayi-meydana
Can hansıdır, cahan hansı, bilmədim.

Bu dünyanı asmandakı rəng bildim,
İsti-isti asılışdım, son bildim,
İndi onun varın, yoxun dən bildim,
Sud hansıdır, ziyan hansı, bilmədim.

Məxtumqulu yolun önü, ardı var,
Çəkər yükün hər kişinin mərdi var,
Ürəyimdə pünhan eşqin dərdi var,
Dərd hansıdır, dərman hansı, bilmədim.

## DAĞLAR, HEY!

Qismət olmaz gedəm uzaq yollara
Nəsib qoymaz, gedər yolum bağlar, hey!
Heyran, Məcnun olub çıxam çöllərə
Varım məskən tutam sizi, dağlar, hey!

Oyun ilə oğlanlığın dəmindən,
Ötüb gəldim kamilliyin çəmindən,
Könlüm lərzan oldu dünya qəmindən,
Tutdu sinəm çarpaz-çarpaz dağlar, hey!

Qayıda-qayıda oğlanlığın rayından,
Yetim gəldim kamilliyin payından,
Batdı başım, çıxa bilsəm layından,
Yada düşər önki keçən çağlar, hey!

Cahillikdə çar (çahar) tərəfə atışan,
Bilməzlikdə hər işlərə qatışan,
Aciz qalıb qocalığa yetişən,
Dərd edinib öz-özündən ağlar, hey!

Məni anla Məxtumqulun sözündən,
Fikrə düşər, qan yaş axar gözündən,
Hər bir zatlar təğyir tapar özündən,
Ya Rəbb! Yıxılmazmı böyük dağlar, hey!

## DÜNYA, HEY!

Su üzündə gəzən neçə gəmini
Bir gün batırarsan salı, dünya, hey!
Adəm oğlu varmaz olsa izindən,
Burda deyib aldarsan malı, dünya, hey!

Kimsə bilməz haçan tükənər dəmin,
Qəbir olar bir gün basan qədəmin.
Dövran gərdişində qafil adamın,
Üstündən salarsan yolu, dünya, hey!

Aramın yox, qərarın yox, dinməzsən,
Gecə-gündüz qan içərsən qanmazsan,
Axır nə bəlan var, sonun sanmazsan,
Yıxılan, yumrulan, lolı dünya, hey!

Aylanar, qış keçər, yaz, tomus, güz həm,
Tab gətirməz ona dağ, dəniz, düz həm,
Axırı keçərik üstündən biz həm,
Qarıyıb qalarsan xali, dünya, hey!

Məxtumqulu, dünya sirrin duymazsan,
Bir gün gördüyümüz ertə qoymazsan,
Neçə vaxtdan bəri yeyib doymazsan,
Ağlını aldıran dəli dünya, hey!

## GEDİCİ OLMA

Gəl gönül mən sənə nəsihət qılım
Vətəni tərk edib gedici olma.
Özündən əysik bir qeyri namərdin
Xidmətində qulluq edici olma.

Xidmət qılsan olsun bir əsilzadə,
Ata-babasından bəylik, bəyzadə,
Əgər hərçənd olsa ac həm üftadə,
Yanından bir zaman gedici olma.

Axmayan qalmazdır bir axın arıq,
Bir təndə adam ki, simiz nə arıq,
Bir üzü çirikdir, bir üzü çarıq,
Çirik deyib qatı söz aydıcı olma.

Çağrılan yerə var, otur da durma,
Çağrılmadıq yerə varma, görünmə,
Utanmaz adam tək sülənib yörmə,
Buyrulmayan işi edici olma.

Göydən nəm düşməsə yer ot gətirməz,
Yığılsa min qayğı bir iş bitirməz,
Ər igid könlünə qayğı gətirməz,
Namərdin oğlu tək qaçıcı olma.

Səxti-dil ürəyi hərgiz boş olmaz,
Hər necə qınansa könlü xoş olmaz,
Bir-birinə iki yaxşı tuş olmaz,
Yaxşını yamana satıcı olma.

Mən dedim bir neçə pəndi-nəsihət,
Bilməm nəsihətdir, yoxsa fəsihət,
Fəsihət bilməgil varsa nəsihət,
Yalançı sözləri aydıcı olma.

Məxtumqulu, kövnündədir çox arman,
Tapmadı dərdinə aqibət dərman,
Yetişər bir güni haqdan bu fərman,
Qəflət döşəyində yatıcı olma.

## XƏBƏR VER — BOYLƏDİR

(Məxtumqulu ilə Durdı şairin deyişməsi)

Məxtumqulu:

O nədir ki, yaşıl-qızıl bürünər?
O nədir ki, ayağı yox, sürünər?

O nədir ki, dəryalarda görünər?
Şair isən ondan bizə xəbər ver.

Durdı şair:

Ol əkindir yaşıl-qızıl bürünər
O ilandır, ayağı yox sürünər
O balıqdır, dəryalarda görünər
Bizdən salam olsun, cavab boylədir.

Məxtumqulu:

— O nədir ki, yaxası var, yanı yox?
O nədir ki, qanadı var, qanı yox?
O nədir ki, adam udur canı yox?
Şair isən ondan bizə xəbər ver.

Durdı şair:

— O kəfəndir, yaxası var, yanı yox
Kəpənəkdir, qanadı var, qanı yox
Qara yerdir, adam udar, canı yox
Bizdən salam olsun, cavab boylədir.

Məxtumqulu:

— O nədir ki, darvazasız qaladır?
O nədir ki, pəncərəsiz binadır?
O nədir ki, bir-birindən aladır?
Şair isən ondan bizə xəbər ver.

Durdı şair:

— Ol gönüldür-darvazasız qaladır
Ol qəbirdir — pəncərəsiz binadır
Ol ay-gündür bir-birindən aladır
Bizdən salam olsun, cavab boylədir.

Məxtumqulu:

— O nədir ki, yemədilər doydular?
O nədir ki, ulu günə qoydular?
Ol kim idi, dabanından soydular?
Şair isən, ondan bizə xəbər ver.

Durdı şair:

— O didardır, yemədilər doydular
Ol namazdır, qiyamətə qoydular

Nəsimini dabanından soydular
Bizdən salam olsun, cavab boylədir.

Məxtumqulu:

— O nədir ki, torpaq üstə sürünməz?
O nədir ki, adamlara görünməz?
O nədir ki, heç bir dona bürünməz?
Şair isən, ondan bizə xəbər ver.

Durdı şair:

— Ərənlərdir, zəlil olub sürünməz
Ol bəladır, gəlsə gözə görünməz
Yalan sözlər heç bir dona bürünməz
Bizdən salam olsun, cavab boylədir.

## ŞEYDAYİ
(? — ?)

### GÜLƏN VARMI

Ey yaranlar, musurmanlar
Yığlamayıb gülən varmı?
Yalançı, fani dünyada
Gedən qaydıb gələn varmı?

Fələk, kimləri şad etdin?
Kimi qəmdən azad etdin?
Bir neçələrni mat etdin,
Səndən razı olan varmı?

Kimsə vəfa toxmun əkər,
Kimsə əcəl zəhmin çəkər,
Kimi qəmdən azad edər,
Saralmayıb solan varmı?

Bu dünya iki fəraqdır,
Biri qara, biri ağdır,
Mənzil iki, yol iraqdır,
Onun fikrin qılan varmı?

Şeydayi der: gələr, keçər,
Bu güzara qonan köçər,
İgidlik çırağı keçər,
Bu sözümdə yalan varmı?

## GƏLİN

Yalan dünyanın behişti
Qızıl güldən tazə gəlin.
Ağ üzlərin bənzər aya
Yayxanışın qaza, gəlin.

Vara bilmənəm yanına,
Sənin mənzil məkanına.
Savab et şirin canına
Rəhm eyləgil bizə, gəlin.

Görməyə gözlərim zardır,
Qoynunuz fəsli-bahardır,
Sevib ayrılmağım ardır,
Sən bənzərsən yaza, gəlin.

Tamaşalı toy olanda,
Qız, cavanlar yığılanda,
Qızlara nəzər salanda
Sən düşərsən gözə, gəlin.

Şeydayi der: söz olmasa,
Baxçada gülüm solmasa,
Ziyadə qürur olmasa
Vermərn yüz min qıza, gəlin.

## MƏĞRURİ
(? — ?)

Qafil adam məğrur olma faniyə,
Tutdum-tutdum desən qaçar bu dünya.
Rəhmi yoxdur, zülmü çoxdur adama,
Gecə-gündüz qanın içər bu dünya.

Nəsihətim budur, deyəm sizlərə,
İxlas ilə qulaq tutun sözlərə.
Əvvəl aldab xoş söz verər bizlərə,
Bir gün daşımıza keçər bu dünya.

Bir bazigar aldab ayırmaz gözdən,
Gəl indi rayindən qayıd ver təzdən.
Başından ayağa beş qara bezdən,
Bir gün sənə bir don biçər bu dünya.

Gəzdin indi qara bağrın qan edib,
Nə yığarsan dərdi-sərin kan edib,
Bir qapıdan girdim dersən can edib
Yenə bir qapını açar bu dünya.

Məğruri der: kimsəni şah eyləyib,
Kimin dərviş, kimin gəda eyləyib,
Aldab udar bizi gümrah eyləyib,
Qardaşlığa boylə naçar bu dünya.

## QURDOĞLU
(XVIII-XIX əsrlər)

### GÖRMƏDİM

Səni deyib sevər dostum yad oldu
Dünya sənin heç vəfanı görmədim.
Dostum qəmgin, düşmanlarım şad oldu
Dünya, sənin heç vəfanı görmədim.

Hər kimsənin sənə nəzəri düşdü,
Bağrı kabab olub örtəndi, bişdi.
Ertən gəlib qonan öylədə qaçdı
Dünya, sənin heç vəfanı görmədim.

Heç kimsənin sənlə işi bitmədi,
Könlü sevən yarı əli tutmadı,
Qarışqa mal yığdı, alıb getmədi
Dünya, sənin heç vəfanı görmədim.

Əvvəl al bəzənib qəmzə satarsan,
Hər kimsə dost olsa hərzə baxarsan.
Can çəkənin qayta canın çəkərsən
Dünya, sənin heç vəfanı görmədim.

Zorun yaman Rüstəm Zalın zorundan,
Aşnanı ayırdın biri-birindən.
Güvəndin ayırıb yarı yarından
Dünya, sənin heç vəfanı görmədim.

Qurdoğlu der: bivəfasan sən, dünya,
Sənə gəlib lərzanədir tən, dünya,
Səndən hərgiz razı olmam mən, dünya,
Dünya, sənin heç vəfanı görmədim.

# XIX ƏSRİN BİRİNCİ YARISI AZƏRBAYCAN ƏDƏBİYYATI

## CAVAD XAN HAQQINDA ŞERLƏRDƏN ÖRNƏKLƏR

*Ziyadoğlu Cavad xan müstəqil Gəncənin sonuncu hökmdarıdır. XIX əsrdə Rusiya Qafqazı istila etdiyi zaman çar generalı Sisianov Cavad xana hikkəli məktublar yazır, şəhərin təslim olunmasını tələb edirdi. Bu hədələrə layiqli cavab verən Cavad xan yazırdı ki, sizin qoşunlar Gəncəyə yalnız mənim meyidimin üstündən keçib girə bilərlər. Belə də oldu. Cavad xan da, oğlu Hüseynqulu ağa da Gəncənin qala divarları üstündə əli qılıncla istilaçılara müqavimət göstərərək, 1804-cü il yanvarın 3-də şəhid oldular. Qafqazda çar müstəmləkəçilərinə qarşı müqavimətin ilk qəhrəmanlarından və ilk qurbanlarından olan Cavad xanın adı xalqın dilində dastana çevrildi, onun igidliyi haqqında nəğmələr qoşuldu, şerlər yazıldı. Belə əsərlərdən biri "Şair" təxəllüslü Əbdürrəhman ağa Dilbaz oğlunun Cavad xana həsr etdiyi müxəmməsdir. O dövrün "Aciz" təxəllüslü şairi də bu hadisələri qələmə alıb. Cavad xanın qeyrəti, hünəri və faciəli taleyi xalq yaradıcılığının da mövzularından olmuşdur. Aşıq Həsənin bu yanıqlı misraları Gəncənin acı taleyini əks etdirir:*

Bayraqları bürc üstündə qurdular,
Uşaq-böyük hamısını qırdılar.
O zaman ki, Cavad xanı vurdular,
Sanasan qırıldı beli Gəncənin.

*Mirzə Yusif Qarabaği də "Tarixi-Safi" adlı əsərində Cavad xanın qətli barədə el arasında yayılmış şerlərdən nümunələr verir. Bu nümunələrdən biri Azəri türkcəsindədir:*

Səmtində öldürən çoxdur,
Gələnə heç sözüm yoxdur.
Müxənnəs var isə qaldır

Yüz min rus gəlsə vur öldür.
Dildən dilə söylənəcək
Cavad xan bir xan olacaq
Aləmdə dastan olacaq.

*Mirzə Yusif Qarabağinin gətirdiyi ikinci örnək Türkiyə türkcəsiylə - osmanlıcadır:*

Sərəsgərdir Əmin paşa
Hökmün keçər dağa-daşa...
Həp əsir olduq gavur elində.
Döyüşə çıxdı çarxçı,
Kimi seyid, kimi hacı.
Mollalar sizə duaçı
Həp əsir olduq gavur elində...

*Araşdırıcı Sadıq Şükürov "Gəncəli Cavad xanın hekayəti" adlı kitabında Cavad xanla bağlı el rəvayətlərini, dastanları toplamış, olaylarla əlaqədar şer örnəkləri də vermişdir. Məhməd Daşqının dilindən Gəncəyə aid bu gəraylı gətirilir:*

Çaylar təkin daşqın oldum,
Daşa-daşa Daşqın oldum,
Çıldırmışam camalından
Vallah, dönüb şaşqın oldum.
Saxla məni, aman Allah!

Qürbətləri çox dolaşdım,
Çox dərələr, dağlar yordum,
Gəncəyə tay tapammadım
Saxla məni, aman Allah!

Qorxan deyiləm ölümdən,
Didərgin düşdüm elimdən,
Çox bəla gəldi dilimdən,
Başımdan qorxan deyiləm
Saxla məni, aman Allah!

Ölüm hamı üçün yeydir,
Heç vaxt ondan qaçmaq olmaz.
Göyçə də mənə köydür
Gəncədə ölmək istərəm.
Saxla məni orda, Allah!
Saxla məni orda, Allah!

*Aşağıda Acizin şerindən və Əbdürrəhman ağa Dilbaz oğlu Şairin müxəmməsindən gətirdiyimiz örnəklər Firudin bəy Köçərlinin "Azərbaycan ədəbiyyatı" kitabındandır.*

## ACİZİN ŞERİNDƏN

Nə oldu ləşkəri-şahə ki, yeksər tarümar oldu?
Deyən bu ləşkərə gər zəxmi-çeşmi ruzigar oldu.
Hanı İran üçün qeyrət, bu yolda baş verən kimdir,
Bilinə daməni-himmət kim cannisar oldu?
Zərü zuri məgər İran şahının rusdan azdır?
Bu yolda baş verən hansı əmirin-namidar oldu?
Desinlər bir belə pərxaşü cəngü giru dar içrə
Kim öldü, kim qırıldı, kim bu yolda zəxmdar oldu?
Qalan meydan içində bir neçə tabin olub binam,
Qaçan sərtibü sərhəngü sərani-namidar oldu.
Gərək ölmək, nə dönmək, sər verib sərdarlıq almaq,
Buna iqrar edən yox, hansı düşmənlər şikar oldu?
Güni ki, Gəncədən sındı, sipahi-cəngcü qaçdı,
Haman gün onlara rudi-Ərəs darül-qərar oldu.
Çəkib gər Gəncədə rəncə sipahü şah, şahzadə
Xətibin qanı ilən xaki-Gəncə laləzar oldu.
Nə təqsiri görək sultani-İranın cahan içrə,
Zərü simi töküb, xələt verib, düşməndə xar oldu.

## ƏBDÜRRƏHMAN AĞA DİLBAZ OĞLU ŞAİR

(?—?)

### MÜXƏMMƏS

Bir rəvayət söylə, ey dil, çərxi-kəcrəftardən,
Ta əbəd ruzi-əzəl bədmehrü bədkirdardən,
Çərxi-zalim, dəhri-dun, sahibxəta, biardən -
Kim, Yezidin izzətin gör şahi-diləfkardən,
Gör Cavad xan macərasın möhnəti-məkkardən.

Böylədir dövran, əzəl insanə al eylər cahan,
Bir zaman xürrəm qılır, bir dəm məlal eylər cahan,
Şah ola, istər gəda, aşüftəhal eylər cahan,
Aqibət bir gün gedər himmət, halal eylər cahan,
Naxudanı qərq edər ol kəştiyi-pürbardən.

Hər zaman dövran salıbdır canı canandan cüda,
Adəmi Həvvadan ayrı, bağİ-rizvandan cüda,
Xatəmi saldı fələk cahi-Süleymandan cüda,
Ah kim, düşdü bu gün dövran Cavad xandan cüda,
Əskik olmaz zari-bülbül, söhbəti-gül xardən.

Şahnamə şərh edən [yox] ol Cavad xan vəsfini,
Mədəni-cudü səxavət, ədli-divan vəsfini,
Bilmiş Əflatun səharin əhli-meydan vəsfini,
Hikməti-Loğmandan artıq dərdə dərman vəsfini,
Bir müxəmməs nəzm ilə inşa qılım əşardən.

Gəncə şəhərində Cavad xan kim, nə əyyam var idi,
Sahibi-lütfü ədalət, sadiqül-iqrar idi,
Hər işin felində mahir, aqilü huşyar idi,
Müxtəsər, aləmara pürimtəhan sərdar idi,
Gör nələr çəkdi qəzadən, dövri-bədətvardən.

Düşdü davası əzəldən ol Şəki, Şirvan ilə,
İbrahim xan ittifaq oldu ol Ümmə xan ilə,
Gəldi ləşkər üstünə ol cümlə Dağıstan ilə,
Onlar ilə qıldı dava sərbəsər meydan ilə,
Çəkmədən hərgiz zərər bir fitneyi-əğyardən.

Bir də ondan sonra gəldi valiyi-Baqratyan,[1]
Yığdı Gürcüstan tamamən ləşkər ta vadiyan,
Neçə illər qıldı dava, çəkmədi ondan ziyan,
Vali köçdü çün fənadan, etdi tərk axır cahan,
Gör nə sadir oldu Gurgin xan[2] kimi əğyardən?!

Ol Cavad xan vəsfini necə qələm şərh eyləsin?
Şərhə sığmaz, vəsfi-halın necə dillər söyləsin?
Bir belə sərdarü qazi kim görübdür böyləsin?
Düşdü davası onun kari-qəzadan, neyləsin,
Padşahi-rusi-sahibtac ilən tumardən?

Çəkdi bir il ol Cavad xan eylədi cəngü cidal,
Gah sülh etdi arada, gah qıldı rəngi-al,
Gördü kim, olmadı axır, artdı fitnə, qilü qal,
Gəlmədi imdadə, hərçənd eylədi yüz ərzi-hal,
Fətəli şah, sahibi-İran olan xunkardən.

---

[1] Gürcü şahlarının əsil və nəsəbi "Bağrat" adlı məşhur və cəsur bir Kaxet knyazından olmağa görə, onlara "baqratid" və yaxud "baqratyan" deyilir. Burada zikr olunan vali Gürcüstan padşahı İrakliyi-dövvömdən ibarətdir ki, Cavad xan ilə onun mabeynində qədimdən ədavət var imiş.

[2] Gurgin xan (Qeorgi) — İrakli şahın oğludur ki, atasının vəfatından sonra onun yerində canişin olub, bir neçə müddət padşahlıq elədi və axırda 1801-ci sənədə rus təbəiyyətini qəbul etdi.

Ol Hüseynqulu ağa kim, gəldi xanın yanına,
Layiq idi hər hünərlər şövkətinə, şanına,
İstədi qanın qata ol dəmdə xanın qanına,
Qoymadı xan göndərib, bir qeyri bürc meydanına,
Yəni, onun vəhşətin mən görməyim didardən.

Qələsin sandı Cavad xan ol zaman viranədən,
Çox çalışdı ta ölüncə dərdinə dərmanədən,
Feyzi-həqdən ta yetincə rəhməti-qüfranədən,
Çıxdı ruhu ol bədəndən, rövzeyi-rizvanədən,
Ey xoşa, buldu şəhadət vahidül-qəhhardən.

Həm Hüseynqulu ağa buldu şəhadət novcəvan,
Xəlq ara bu cümlə möhnətdən yaman oldu yaman,
Anası ahlar çəkib, şaxsey deyib eylər fəğan,
Üz tutub ol bargahə əlvida eylər aman:
Binəva düşdüm cüda fərzəndi-gülruxsardən.

Gəncəli xalqı şəhadət qıldı həqqa canfəda,
Kimi məzlum, kimi azadə qalıb əndərbəla,
Hər biri bir növ ilə yüz dərdə oldu mübtəla,
Yadına gəlməz məgər məzlumi-dəşti-Kərbəla,
Ey utanmaz çərxi-zalim Əhmədi-Muxtardən?

Min iki yüz daxi on səkkizdə tarixi-zaman -
Kim, şəhid oldu Cavad xan, çıxdı əzdari-cahan,
Çox pərişan oldu halı Gəncənin həddən yaman,
Gəl yetiş imdadə, ya həq, Mehdiyi-sahibzəman,
İnciməzmi xatirin bu dərdü ahü zardən?!

## MOLLA ABBAS ŞÖLƏ

(?—?)

Gəl, ey aləmara qəmxana Gəncə
Dönübsən məhbəsü zindanə Gəncə.
Əgərçi zahirən abad olubsan
Olubsan daxilən viranə Gəncə.
Sənin üstündə çox qanlar tökülmüş
Binayi-dəhrdə piranə Gəncə.

## AĞ AŞIQ
(1754—1860)

*Ağ Aşığın əsl adı Allahverdidir. Göyçə mahalının Şəfəq kəndində doğulmuş, orda yaşamış və orda da dəfn edilmişdir.*

### QOŞMA

Cəsədim möhnətə, narə qalandı
Yandırıb döndərib küllərə məni.
Dərdim dərya kimi coşub bulanır
Qərq edər ümmana, sellərə məni.

Əyibdi işimi qəzavü qədər,
Dolandım dünyanı tamam sərasər,
Gedər bu dərdi-qəm mənlə bərabər
Axıdar çaylara, göllərə məni.

Ağ Aşıq həsrətdi biçarə yarə,
Görəsən olarmı dərdimə çarə?
Müddətdir düşmüşəm qürbət diyarə
Fələk saldı qərib ellərə məni.

### BƏNÖVŞƏLƏR

Sən baharın qonağısan
Boynu buruq bənövşələr.
Eşq əhlilər qınağısan
Boynu buruq bənövşələr.

Məcnun Leyla xəyalında,
Kərəm Əsli sorağında,
Qurbaninin qəm bağında
Boynu buruq bənövşələr.

Ağ Aşığın bəxti kəmdi,
Fələkdən bu bir sitəmdi,
Dərdim bil səndən betərdi
Boynu buruq bənövşələr.

## AŞİQANƏ TƏSNİF

Qulac saçlı,
Qələm qaşlı,
Ağzın açdı,
Gövhər saçdı
Süsənbərim.

Şəhla gözü,
Gözəl üzü,
Şirin sözü,
İlqar düzü
Süsənbərim.

Yaşıl başlı,
Çatma qaşlı,
Şux baxışlı,
Yaraşıqlı
Süsənbərim.

Şirin avaz,
Kirpik almaz,
Aşıq sınmaz,
Yardan dönməz
Süsənbərim.

Kəklik səkər,
Boynun bükər,
Ovçun çökər,
Qanın tökər
Süsənbərim.

Sən əzəlsən,
Dil məzəsən,
Çox gözəlsən,
Bir dənəsən
Süsənbərim.

Bulaq başı,
Gözüm yaşı,
Var təlaşı,
Qəlb sirdaşı
Süsənbərim,

Telli sazım,
Xoş avazım,
Bahar yazım,
Sən murazım
Süsənbərim.

Sən halalsan,
Bir cəlalsan,
Mənə yarsan,
Bizə varsan
Süsənbərim.

Aşıq Ağdı,
Toy talağdı,
Xoş soraqdı,
Gözəl çağdı
Süsənbərim.

## BAYATILAR

Yüz yalvar,
Yüz bəlan var, yüz yalvar.
Namərddə səxa olmaz
Yüz ətəklə, yüz yalvar.

Dərdə mərdim,
Düşməsin dərdə mərdim.
Mənə dərman neyləsin?
Tifilkən dərd əmərdim.

Dərd arxalı,
Sərilmiş dər dərxalı.
Ya Rəbb varmı mənim tək
Qəm evli, dərd arxalı?

# AĞABƏYİM AĞA (AĞABACI)

(1780 — 1831)

Mən aşığam qara bax,
Qara salxım, qara bağ.
Tehran cənnətə dönsə,
Yaddan çıxmaz Qarabağ.

***

Əfsus ki, yarım gecə gəldi, gecə getdi,
Heç bilmirəm ömrüm necə gəldi, necə getdi.

# QASIM BƏY ZAKİR

(1784 — 1857)



*Qasım bəy Zakir XVIII—XIX əsrlərdə yeni inkişaf mərhələsinə yüksəlmiş Azərbaycan realist ədəbiyyatının görkəmli nümayəndələrindəndir. Heca və əruz vəznlərində ənənəvi səpgidə incə lirik şerlər yazan Zakirin yaradıcılığında satirik boyalar daha önəmlidir. Çar üsuli-idarəsinin, bürokratik sistemin min əziyyətini çəkmiş, özü və ailəsi məşəqqətli bir ömür sürmüş Zakirin müxtəlif şerlərində, məşhur müasirləri Mirzə Fətəliyə, İsmayıl bəy Qutqaşınlıya yazdığı mənzum məktublarında zəmanəsinin bir çox problemləri kəskin şəkildə qaldırılır, şairin şahidi olduğu ədalətsizliklər tənqid atəşinə tutulur.*

## QOŞMALAR

Bir saat havada qanad saxlayın,
Nizam ilə gedən qoşa durnalar!
Qatarlaşıb nə diyardan gəlirsiz
Qaqqıldaşa-qaqqıldaşa, durnalar?

Mən sevmişəm onun ala gözünü,
Nəsib ola bir dəm görəm üzünü,
Yoxsa danışırsız dilbər sözünü
Veribsiniz nə baş-başa, durnalar?

Diyari-qürbətdə müddətdi varam,
Gecə-gündüz canan deyib ağlaram,
Mən də sizin kimi qəribü-zaram,
Eyləməyin məndən haşa, durnalar!

Laçın yatağıdır bizim məkanlar,
Yavaş-yavaş gedin, səsiniz anlar,
Qorxuram toxuna ötən zamanlar
Sürbəniz dağılıb çaşa, durnalar!

Zakirəm, od tutub alışıb ciyər,
Var isə canandan sizdə bir xəbər,
Təğafül etməyin allahı sevər,
Dönməsin bağrınız daşa, durnalar!

***

Yar demişdi: gələn bayrama gələm,
Ömür başa yetdi il arasında.
Tutub səri-zülfün, dönüb başına,
Şanə tək gəzəsən tel arasında.

Qaydasıdır, qara çarqat bürünür,
Siyah zülfün ucu yernən sürünür.
Nə göyçək yaraşır, nə xoş görünür,
Mina, incə kəmər bel arasında.

Gözümün yaşına qərq oldu tənim,
Bu hal ilə işim müşküldür mənim.
Səndən ayrılandan, ey gülbədənim,
Həq bilir, qalmışam sel arasında.

Piranəsər könül hər kimə yetər,
Uşaqtəbiətdir, gördüyün istər.
Onun sözlərinə qatışma, dilbər
Dəli yola gedər el arasında.

Zakir, etibarı yoxdu dünyanın,
Aldanma xeyrinə, şərrinə anın.
Qoygilən başını bəyaz püstanın
Can ver şirin-şirin, öl arasında.

***

Sevdiyim, gələ-gör, bahar fəslidir,
Könül istər gəzə bağı səninlə.
Gecə qucaqlaşıb yataq qolboyun,
Bir də duraq səhər çağı səninlə.

Nə xoş səadətdir dodaq-dodaqda,
Məzə müqabildə, badə qabaqda.
Vermənəm aləmə xəlvət otaqda
Deyib, gülüb, danışmağı səninlə.

Xahi aqil olam, xahi divanə,
Yoxdur ehtiyacım hurü qılmanə.
Gedərəm duzəxə mərdü mərdanə,
Əsli budur sözün sağı, səninlə.

Aşiqlər bağrını şan-şan elərsən,
Gündə birin kəsib qurban elərsən:
Hər qiya baxanda yüz qan elərsən,
Müşküldür dolanmaq, yağı, səninlə!

Ləbindir Zakirin abi-həyatı,
Dirildir ölünü hər ixtilatı:
Neylərəm şəkkəri, qəndi, nəbatı,
Xoşdur mana içmək ağu səninlə.

***

Qadir allah səbəb salıb arayə,
Sevdiyim, ixtilat qatmaq çağıdı.
Dur qolboyun olaq, fürsət var ikən,
Nə qəmə, qüssəyə batmaq çağıdı?

Götür qoy bir səmtə bəzəyin, sərin,
Qorxuram dağıla zərü zivərin.
Başın qüllabəsin, belin kəmərin
Hər biri bir yana atmaq çağıdı.

Üz bürüməz yar yarını görəndə,
Bu xasiyyət nədir bilməzəm səndə?
Biganələr kimi oturma gendə,
Gəl sarmaşaq, alıb-satmaq çağıdı.

Qul xətasız olmaz, ey çeşmi xumar!
Öldürsən də sonra ixtiyarın var.
Bu gündən sabaha yoxdur etibar,
Soyun, gecə keçdi, yatmaq çağıdı.

Canım qurban qaşlarının tağına,
Pərvanə tək dolan solu sağına.
Zakir, dön başına, düş ayağına,
Nə danışıb söz uzatmaq çağıdı?!

***

Əsib badi-səba, gül pirəhənin
Çak edəndə, bəyaz sinəndən öpüm.
"Səlli əla" deyim, sürtüm üzümü,
Kəbə qəndili tək məməndən öpüm.

Gəzib-gəzib gəlib oturub gendə,
Kin, küdurət ortalıqdan gedəndə,
Təkəllümə gəlib söhbət edəndə
"Bəri bax, bəri bax" deməndən öpüm.

İşim yoxdur sultan ilə, xan ilə,
Yolunda qoymuşam başı can ilə:
Oturub bir neçə növcavan ilə
Şirin-şirin içib-yeməndən öpüm.

Müddətdi həsrətəm, eyləmə haşa,
Ay qabağa, xumar gözə, yay qaşa,
Durub pərvanə tək dolanıb başa,
Siyah zülfün tutum, çənəndən öpüm.

Kəsilib könlümün səbrü qərarı,
Al canımı qurtar barı, sən tarı.
Öldürən zamanda Zakiri-zarı,
Əl saxla bir, qanlı qəməndən öpüm.

## GƏRAYLILAR

Bəhri-bəlayə ğərq oldum,
Dişi dürdanədən ayrı.
Yanmaqda məni bilməyin
Oda pərvanədən ayrı.

Saqi, məni-namuradə
Dərdi-sər vermə ziyadə.
Hərgiz içərəmmi badə
Çeşmi məstanədən ayrı?

Xəbər alsan mürğ-canı,
Tari-mudur aşiyanı:
Bir-bir zülfi-pərişanı
Dolanır şanədən ayrı.

Sevdiyim məni dağ eylər,
Qeyr ilə ittifaq eylər,
Hər zaman seyri-bağ eylər
Məni - divanədən ayrı.

Öləndə Zakiri-xəstə
Növcavanlar dəstə-dəstə
Gəlməsin qəbrimin üstə,
Deyin, cananədən ayrı.

***

Cəfa çəkdim, bağ yetirdim,
Gülşəni xarə tapşırdım.
Bunca fikrü xəyal etdim,
Tapmadım çarə, tapşırdım.

Ölsəm qoyun, sizi tarı,
Yönümü dilbərə sarı.
Özüm öz əlimlə yarı
Bu gün əğyarə tapşırdım.

Nə qədər eylədim minnət,
Vəslinə vermədi fürsət:
Lailac olub, aqibət
Gənci şəhmarə tapşırdım.

Qaldım misali-pərvanə,
Eşq oduna yanə-yanə:
Canı göndərdim canənə,
Dili dildarə tapşırdım.

Xəstə Zakir kimi hanı
Könlü olan ğəm məkanı?
Mən öldüm, ahü əfğanı
Bülbülü-zarə tapşırdım.

## QƏZƏL

Sən orda elə zövqü səfa bağ arasında,
Mən munda yanım piltə kimi yağ arasında.

Peykanlarını sineyi-çakimdə görən der:
Bir ğönçeyi-tərdir ki, bitib bağ arasında.

Könlüm quşunu seyd elədi ğəmzəvü çeşmin,
Qorxum budu qanlar düşə ortaq arasında.

Getmişdi saçı seyrinə, dil gəlmədi, bişək,
Güm oldu şəbi-tardə sığnaq arasında.

Ol guşeyi-əbruydə çeşminmidi, yoxsa,
Yatmış iki Xütən keyiki tağ arasında?

Nasehlər edir mən məni mütribü meydən,
Əfsus ki, qaldım neçə sarsaq arasında.

Zakir, rəhi-eşqində diriğ eyləmə canı,
Ta nami-nikuyin qala üşşaq arasında.

## CANIMIZ

Çıxmadı, qurtulaq dərdü bəladan,
Gündə bir zakonu görən canımız.
Hər ayın başında bir yol dəyişən
Adətü qanuni görən canımız.

Təfavüt qalmadı gədayə, bəyə,
Barikeşlər indi keçib yedəyə.
Qənaət eyləsin bezə, qədəyə
Cameyi-gülgünü görən canımız.

Bundan isə yeydir diyari-qürbət,
Al başını, dur get əlbət, səd əlbət,
Yalavac əyaldan çəksin xəcalət
Bəzəkli xatuni görən canımız.

Yazü qış həmişə sevgili canan
Geyərdi əyninə libasi-əlvan.
Olmasınmı indi sərv tək üryan
Qaməti-mövzuni görən canımız?

Mübarəkdir bu dünyanın nizamı,
Nəhayət müşküldür öyrətmək xamı,
Yad edib ağlayın keçən əyyami,
Müəttər geysuni görən canımız.

Ac qaldıqca rəxtü xabə satacaq,
Gələ-gələ quru yerdə yatacaq.
Uzaqdan sikkəyə güllə atacaq
Min tümən altuni görən canımız.

Nə gündə yaradıb xudavənd bizi,
Bir yana apara bilmədik izi.
Gahi Avanesi, gahi Sərkisi,
Gahi də Semyoni görən canımız.

Bəy ikən adımız oldu mülkədar,
Dəxi bundan belə bizimçün nə var?
Olmazmı mükəddər sahibixtiyar
Əvəki, Ərtuni görən canımız.

Satarıq, sovarıq olub-qalanı,
Həqq bilir sözümün yoxdu yalanı.
Salsın alta indi öküz palanı
Balışi-pərquni görən canımız.

Tağar-tağar arpa, buğda əkilən,
Biçilib, döyülüb dama tökülən,
Qan axıt gözündən, ipək çəkilən
Xali tərazuni görən canımız.

Bu tövr ilə getmək müşküldür yola,
Nə sağa mümkündür qaçmaq, nə sola,
Gərək indən belə digərgun ola
Kari-digərguni görən canımız.

Aparırlar qaravula, keşiyə,
Qəht olub bir deşik, girək deşiyə.
Buriya döşəsin evə, eşiyə
Xaliyi-bahuni görən canımız.

Bu zülmü insana eyləməz insan,
Sap canə yetişdik aman, əlaman!
Bir neçə laməzhəb, adı müsəlman
Mürtədü məlunu görən canımız.

## VİLAYƏTİN MƏĞŞUŞLUĞU HAQQINDA

(Mirzə Fətəliyə məktub)

Xəbər alsan bu vilanın əhvalın, -
Bir özgədir keyfiyyəti-Qarabağ.
Həqdi, bundan əqdəm görübsən sən də,
Hanı o qaidə, o qanun səyaq?

Qarabağda nə day qaldı, nə dana,
Bu gün, sabah qaçar hərə bir yana.
Tənbih etmək ilə Xındırıstana
Xub saldı nizamə ölkəni qoçaq.

Ədalətdə yoxdur bir kəsrü kəmi,
Bundan sonra vilayətin nə qəmi.
Əlbət, dağıdarmış külli-aləmi
Ağzından süd iyi gələn iki uşaq.

Birindən şikayət edəsən əgər,
Danışmağa qoymaz, sözünü kəsər.
Qardaş malı kimi ortadan bölər -
Murovlar olublar oğruya ortaq.

Görsən tanımazsan Yarımsaqqalı,
Çıxıb əndazədən dövlətü malı.
Xandəmirov çaldı, çapdı mahalı,
O ki, tutub özün keçəl qurumsaq.

Gədə-güdə olub sahib-məsləhət,
Gündüz axşamadən danışır xəlvət.
İşlərimiz belə keçsə bir müddət,
Qədimilər olur tamam şil, axsaq.

Gündə bir gətirir zakoni-tazə,
Fikri budu xəlqi verə güdazə.

Bizdən də məhrəmdir biri knyazə,
Nə məhrəm, füzulü heyvərə, yanşaq.

Əbəs yerdə bizi verdi zəvalə,
Oğrun-oğrun bəlalərə həvalə.
O ki, olmalıydı otlu, səqqalə
Dəxi doğramasın soğan, sarımsaq.

Ömründə gəlməyib doğru dilinə,
Xaindi xiyşinə, qövmü elinə.
Əli Zülfüqarın vursun belinə
Bəlkə ölə, pis üzündən qurtulaq.

Həddən aşıb büxlü həsəd, şərarət,
Yoldaş yoldaşına eylər xəyanət.
Alimdə əməl yox, bəydə ədalət,
İşlərimiz olub saf gərdən-bucaq.

Çəkilib köksümə dağlar, düyünlər,
Kafirə olmasın nəsib bu günlər!
Qınamasın məni könlü bütünlər
Fikrim dağınıqdır, xatirim övraq.

Məqsudimiz hasil olmadı bizim,
Yeksandı hicrində gecə-gündüzüm.
Bu bədbəxtin halətindən, əzizim,
Barı o viladə olgil göz-qulaq.

Gərçi vilayətdə çox idi əhval,
Müyəssər olmadı şərh edim əlhal.
Bir parasın yazıb elədim irsal,
Bu şərt ilə nə diş bilsin, nə dodaq.

Üç ildən əfzundur iki fərzəndim
Sürülüb qürbətə, dağılıb kəndim.
Piranəsərlikdə həvadən endim,
Necə ola edəm seyri-gülüstan?

## ƏNDƏLİB QARACADAĞİ
(XVIII əsrin sonu — XIX əsrin əvvəli)

### GƏRAYLI

Zahid, bir neçə kəlmə sən,
Eşit şəhri-qiyamətdən.
Gör nə cəfalər görübdür
Könlüm bir sərvqamətdən.

Nə qəddi sərv, sənubərdir,
Yoxsa şümşadi-Azərdir,
Ya möcüzi-peyğəmbərdir,
Zahirdir çox əlamətdən.

Ya məgər xaliqi-sifat,
Xəlq etmiş bir həbbi-nəbat,
Ləbləridir abi-həyat,
Əmmək olmaz lətafətdən.

Olur mənim kimi hər ac,
Qaşların gəncinə möhtac.
Görsə bu guşəni həccac
Üz döndərər ziyarətdən.

Bax mövsümi-novbaharə,
Əzmi-seyri-gülüzarə.
Əndəlibi-bəxtiqarə
Söyləsin bu rəvayətdən.

### QOŞMALAR

Dolanım başına, olum qurbanın,
Ala gözlü yarım, indi de, danış!
Billah sənə qurban olmaqdır peşəm,
Yoxdur mənim özgə karım, de, danış!

Çəm-xəm ilən soyunmağın, yatmağın,
Hərdən gözün qıyıb, qaşın atmağın,
Şirin-şirin nazü işvə satmağın,
Əldən alıb ixtiyarım, de, danış!

Ey kani-məlahət, mədəni-hünər,
Şəmi-vəchin salıb canıma şərər.
Bəs ki, eşq atəşi olub şöləvər,
Nə səbrim var, nə qərarım, de, danış!

Zülməti-hicrində keçmişəm candan,
Dönmərəm sənin tək nuri-cahandan.
Sən mən ilə kəmlütf olan zamandan,
Qara keçir ruzigarım, de, danış!

Bir bülbül oxurdu gül budağında:
- Gərək səbr eyləmək yar fərağında.
Əndəlibəm, qışın belə çağında -
Sənsən mənim gülüzarım de, danış!

***

Mənim ərzi-halım bir təriq ilə,
Söhbət salıb nazlı yarə deyən yox.
Hicran odu saldı məni ayaqdan,
Yandı gözəl cismim narə, deyən yox.

Eşq atəşi canda çəkib zəbanə,
Aşiqliyim məşhur oldu cəhanə.
Pünhan saxlamaqdan yetişdim canə,
İndi vurub aşikarə, deyən yox.

Halım hökumətli, dövlətli, mallı,
Qabağında qullar, şəhləli, şallı,
Bir mina gərdənli, buxağı xallı,
Siyəh saçlı gülrüxsarə, deyən yox.

Ey üzü gül, boyu sərvü sənubər,
Vəsfin eyləmişəm dilimdə əzbər.
Bilməm nə səbəbdən yeganə gövhər,
Yetişmədi xiridarə, deyən yox.

Bir gülüzlü yara aşiqəm, aşiq,
Bir şiringöftara aşiqəm, aşiq.
Mən də bir nigara aşiqəm, aşiq
Əndəlib tək gülüzarə deyən yox.

***

Sarbanlarda bir gözələ tuş oldum,
Bənzər bir alıcı şahbazə, gəlin.
Qız-gəlin çox gördüm dünya üzündə,
Yetmədim sənintək mümtazə, gəlin!

Ay üzün görəndə döndüm hilalə,
Rəngim uçdu, düşdüm bir özgə halə.
Ayinə tək seyqəl vurub camalə,
Gül dəstəsi kimi tər-tazə, gəlin!

Baş bağlayıb sürmə çəkibdir gözə,
Ceyran balası tək üz qoyub düzə.
Gər yol azıb təşrif gətirsən bizə,
Başım üstə gəlləm pişvazə, gəlin!

Ey məlahət kanı, həya mədəni,
Kərəm tək oduna yandırdın məni.
Ömür sərf eyləyib tapardım səni,
Allah bəla versin qanmazə, gəlin!

Taqi-əbrulərin mehrabü mənbər,
Bu gülşəni görən Kəbədən dönər,
Qiblə dərgahına hər şamü səhər,
Məlaiklər gələr namaza, gəlin.

Yıxıbsən evimi qaşü göz ilən,
Yandırıbsan kabab bağrım köz ilən,
Mədh eylərəm səni beş bənd söz ilən,
Sallam İrəvanda avazə, gəlin!

Ağlım qaçıb səni görəndən bəri,
Səhralara düşüb olmuşam dəli,
Payızın axırı, qışın əvvəli,
Gətdin Əndəlibi pərvazə, gəlin!

## HEYDƏRİLƏR

Sanei-qüdrətdən siyəh xalların,
Arizində nə zindanə düşübdür.
Birisi həbəşdir, birisi hindu,
Bəd əməllər xoş məkanə düşübdür.
Əzizim, nə məkani,
Dehqanın nəm əkani,
Eşqinin avarəsi,
Nə yeri, nə məkani?
Aşiq ilən əvvəldən,
Yediyin nəmək hani?

Pərtəvi-cəmalın oldu münəvvər,
Təəccüb eylərəm, allahü-əkbər!
Mehri-rüxsarından xurşidi-ənvər

Bir zərrədir asimanə düşübdür.
Əzizim, asimanə,
Zülf üzdən asma yenə.
Verməz fələk hərifi
Şah-cənnət asi mənə.
Həsrətindən fəğanim
Çulğaşıb asimanə.

Qaşların fitnədir, gözlərin cadu,
Xədəngi-müjganın mənə tutdu ru.
Gəlib can almağa kafəri-bədxu
Ver nəsihət, bəd gümanə düşübdür.
Əzizim bu gümani,
Dərs oxu begu məni,
Fərağında könlümün,
Yox idi bu gümani.
Çəkməz hüsnün surətin,
Gəlsə iki yüz — Mani.

Hərami gözlərin salıbdır cəngi,
Yay qaşların müjgan olub xədəngi.
Çapdı ingilisi, rumi, firəngi
İndi fikri İrəvanə düşübdür.
Əzizim İrəvani,
Həccdən İrəvani,
Nə zülm oldu, görmədin
Aşiqə irəvani!
Az qalıb gözüm yaşı
Yıxa, gəl, İrəvani.

Şöleyi-ahimdən tutuşdu aləm,
Nə səbəbdən sənə yetmədi naləm?
Əndəlibəm, şükr eylərəm dəmadəm
Həsrət gözüm gülüstanə düşübdür.
Əzizim gülüstani,
Oxudum "Gülüstan"i.
Gülşəni-hüsnün görən
İstəməz gülüstani.
Səndə olan lətafət
Bax gör, gül üstə hani?

***

Söylə görüm, olum dilin qurbanı,
Nədən vəfa eyləmədin iqrarə?!
Vaxt ikən aşiqə etmədin xəbər,
Bəlkə eyləyəydi dərdə bir çarə.

Əzizim, dərdə çarə,
Durmuşam dərdə çarə.
Dil bilən təbib gərək
Eyləyə dərdə çarə.
Çarəsiz xəstələrə
Bulunur dərdə çarə.

## HEYRAN XANIM DÜNBÜLİ
(1790 — 1860)

### QƏZƏLLƏR

Seyr edin, gərdəni minaya baxın,
Sərimi saldı nə sevdaya baxın.

Zülfü mişkini salıb arizinə,
Gün küsuf eyləyib, ol ayə baxın.

Can alar qaşı, tökər kipriyi qan,
Mərhəba, ol oxa, ol yayə baxın.

Qəmzəsi qanlar içib məst olub
Can alan nərgizi-şəhlayə baxın.

Əksi-mey çöhrəsini al qılıb
Açılıb ol güli-həmrayə baxın.

Gör, bənövşə açılıb, ya ki, salıb
Xətti gül arizinə sayə, baxın.

Bükübən qamətimi dal eləyib
Sərv tək ol qədi-rənayə baxın.

Hicri ol mahiruhun Heyranı
Saldı Məcnun kimi səhrayə, baxın.

***

Ey sitəmkar məni rüsvayi-cahan eyləmisən
Gözümün yaşını çün Dəclə rəvan eyləmisən.

Həmnişin eyləmisən düşməni, ey mayeyi-naz
Rəşkdən canım alıb bağrımı qan eyləmisən.

Gün kimi arizinə zülfi-çəlipanı salıb
Günü gör, əbru-siyah altda nihan eyləmisən.

Nazilə, işvə ilə seyr eləyib gülzarı
Göstərib möcüzə sən sərvi-rəvan eyləmisən.

Bir canım var idi, ey şux ki, aldın o zaman,
Özgə can dəxi bu bikəsdə güman eyləmisən.

Qaşların tağı-sitəm almış ələ, kipriyin ox,
Öldürürsən məni, nahaq yerə qan eyləmisən.

Neçin ey şux niqabın götürübsən üzdən,
Ruyi-xurşidvəşi xalqa əyan eyləmisən.

Almısan ağlımı sərdən mənim, ey afəti-can
Qəddimi möhnəti-hicrində kəman eyləmisən.

Həsrəti vəslin ilə, ey mahi-mən, Heyranı
Başı yerdə, gözü yolda nigaran eyləmisən.

***

Bir namə yazım, badi-səba yarə yetirsin,
Şərhi-qəmimi ol büti-xunxarə yetirsin.

Hicran ələmi saldı ayaqdan məni-zari,
Daruyi-vüsali mənə bir çarə yetirsin.

Səbrim kəsilib, yar mənim canımı alsın,
Ya şad eləsin, vəsl ilə, didarə yetirsin.

Dünyada və üqbidə görüş mətləbə yetsin,
Hər kəs məni ol yari-vəfadarə yetirsin.

Bir yol verin ey möhnəti-hicran ki, pəyamım
Ta badi-səba ol gülü gülzarə yetirsin.

Yüz həsrət ilə bu dili-hicranə giriftar,
Əzm etdi, özün ol güli-bixarə yetirsin.

Yüz niş ilə səddi-rəh olub xari-sitəmkar,
Qoymadı özün ol gülə biçarə yetirsin.

Gəl tanrı üçün bunca sitəm eyləmə izhar,
Qoy yarə özün bu dili-avara yetirsin.

Bikəsliyimə rəhm eləsin xaliqi-biçün,
Heyranı o şəhbazə digər-barə yetirsin.

***

Ya rəb, kərəm et, ol büti-məhparə qayıtsın,
Bir rəhm eləsin bu dili-bimarə, qayıtsın.

Bu dil ki, ona mənzil idi, oldu xərabə,
Əzm etsə əgər yar, dəxi harə qayıtsın?

Şanə çəkibən çin-çin elə, sal üzə zülfün,
Qüllab kimi ucları rüxsarə qayıtsın.

Mürqi-dili-zarim genə avarə qalıbdır,
Zülfün xəmin aç, ta ki, bu avarə qayıtsın.

Gəl rəhm elə, qoy aşiqi bir yarə yetişsin,
Ərzin eləsin ol büti-xunxarə, qayıtsın.

Çün kövkəbi-bəxtim yetişib nəhs məqamə,
Bir əmr elə, ta sabitü səyyarə qayıtsın.

Əhd et, edəsən canüvi sən sidq ilə qurban,
Heyran! Yar əgər bir də bu gülzarə qayıtsın.

***

Əsiri-möhnəti-hicran mənəm, mən.
Qəribü zarü sərgərdan mənəm, mən.

O gülzari-vüsalindən uzaqda,
Çü bülbül ruzü şəb nalan mənəm, mən.

Nə mənzil, nə məkan, nə xaniman var,
Cahanda xəstəyi-dövran mənəm, mən.

Sənin hicrin ilə, ey şəsmi-taban,
Bulud tək daima giryan mənəm, mən.

Bu məclisdə olub pərvanə misli,
O nari-eşqilə suzan mənəm, mən.

Əsiri-zülfün içrə yox mənim tək,
Sədaqətlə sənə qurban mənəm, mən.

Qanıma təşnəsən sən ey sitəmkar,
Üzünə valehü Heyran mənəm, mən.

## ABASQULU AĞA BAKIXANOV
## (QÜDSİ)
(1794 — 1847)



*Abasqulu ağa Bakıxanov XIX əsr Azərbaycan ədəbiyyatının ilk maarifçilərindəndir. O, görkəmli mütəfəkkir, ensiklopedik biliklərə malik olan alim, Azərbaycan tarixinə aid "Gülüstani-İrəm" əsərinin müəllifi, nasir idi. Bakıxanov "Qüdsi" təxəllüsüylə şerlər də yazmışdır.*

### QƏZƏLLƏR

Sən orda səfa eylə dilcülər arasında,
Mən qalmışam avarə gürcülər arasında.

Dərdü qəmi-hicrandan qürbətdə pərişanəm,
Döndü cigərim qanə qeyğulər arasında.

Tərsabeçələr bihəd, mən necə dutum aram,
Can qəsdin edən zalım, cadulər arasında.

Hər canibə əzm etsəm əzbəs ki, gözəl çoxdur,
Tutisifətəm heyran güzgulər arasında.

Bir yanə əgər baxsam, qəm çəkmək olur bica,
Bunlar kimi məhtələt xoşxulər arasında.

Yüz işvəvü mehr ilə aşiqlərə meyl etmək,
Bu şəhrdə adətdir məhrulər arasında.

Əbr içrə günəş manənd pərtöv salır afaqə
Rüxsarəsi hər şuxün geysulər arasında [...]

Cuşi-xəti-müşkindən bənzər ləbi-canbəxşi,
Bir mədəni-yaqutə hindulər arasında.

Tərsa gözü kəşf eylər hər ləhzə kəramətlər,
Mehrabdə zahid tək əbrulər arasında.

Bunları görüb, Qüdsi, hər kimsə ki, aqildir,
Etməz özünü rüsva bədgulər arasında.

***

Arizu eylər könül dildar gəlsin, gəlmədi,
Zülfü kafər, gözləri xunxar gəlsin, gəlmədi.

Hər pərivəş cilveyi-hüsn eyləmiş, mən gözlədim
Dilrübalər fövcinə sərdar gəlsin, gəlmədi.

Canə gəldim bivəfalar ülfətindən, istərəm
Bir vəfa rəsmində sabit yar gəlsin, gəlmədi.

Dərdü möhnət keçdi həddən, bəs ki, çəkdim intizar,
Gözlədim ol şux gülrüxsar gəlsin, gəlmədi.

Ləhceyi-canpərvərindən şur salsın aləmə,
Əndəlibi-şaxeyi-gülzar gəlsin, gəlmədi.

İstədim, Qüdsi, deyim vəsfi-cəmalın dilbərin,
Kuşiş etdim, zinəti-göftar gəlsin, gəlmədi.

***

Əldə mey, üzdə gülüş gəldi nigarım bu gecə,
Pis nəzərdən uzaq, ol çeşmi-xumarım bu gecə.

Yar üzü meylə qızarmış, meyi etmiş üzü al,
Nə məharət eləmiş saqiyi-yarım bu gecə!

Mən bilirdim ki, kimə lütfi və ya nifrəti var,
Almasaydı əgər o səbrü qərarım bu gecə.

Üzünü yad eləyib gözlərimə axdı qanın,
Batinü zahir olub güllü baharım bu gecə.

Qaşla üz, ayla günəş misli çıxıb bir yerdə,
Nə qiyamət eyləyir laləüzarım bu gecə.

Kuyinə düşmək üçün sinəmi yırtmış könlüm,
O çəmənzarı dilər bülbüli-zarım bu gecə.

Kakilindən hələ mən bircə dügün açmamışam,
Tökülür, Qüdsi, qələmdən nəki varım bu gecə.

## MİRZƏ ŞƏFİ VAZEH
(1794 — 1852)



*XIX əsr Azərbaycan maarifçi ədəbiyyatının ilk görkəmli nümayəndələrindən biri də Vazehdir. Mirzə Şəfinin şair taleyi çox qəribə olub. Əsərlərini doğma azəri türkcəsində və fars dilində yazsa da, onun ədəbi irsi orijinalda deyil, Gəncədə ondan dərs alan alman Fridrix Bodenştedtin almancaya tərcümələrində hifz olunmuşdur. Mirzə Şəfinin şerləri məhz bu tərcümələrdən və alman nəşrlərindən sonra Avropanın müxtəlif dillərinə çevrilmiş və Azərbaycan şairinə geniş şöhrət gətirmişdir. Böyük Mirzə Fətəlinin düzgün həyat yolu seçməsində Mirzə Şəfinin müəllim kimi həlledici rolu olmuşdur. Antologiyamıza Vazehin doğma dilində yazdığı və hifz olunmuş şerlərindən ikisini və iki ayrıca beytini daxil edirik.*

### QƏZƏL

Nə qədər kim, fələyin sabitü səyyarəsi var,
Ol qədər sinədə qəmzən oxunun yarəsi var.

Deyil əflakdə kövkəb görünən çərxi-bülənd,
Oluban didə, sərapa sənə nəzzarəsi var.

Ruzigari tirə, daim ki şəbi tar keçər
Hər kimin eşqdə bir yari-sitəmkarəsi var.

Necə qan cuşə gəlib eyləməsin ahü fəqan?
Könlümün dideyi-giryan kimi fəvvarəsi var.

Ol qəzəldir ki, bu, Vazeh dedi, bir dərd əhli,
Zahirən lalə otağında qonaq-qarəsi var.

### AYRICA BEYTLƏR

Min ev yıxıb tikirsiniz bir boş minarə
Ərşə çıxıb qonaq gedin pərvərdigarə.

Hicran qəminin badeyi-gülgündür əlacı,
Vazeh, danışırlar bunu meyxanələr içrə.

## MÜXƏMMƏS

Ey nəzakət çəməni içrə xuraman Süsəni,
Xubluq kişvərinin təxtinə sultan Süsəni,
Sədəğin yayı qarşın sədqəsi qurban Süsəni,
Bir baxışla yaraşır kim, ala yüz can Süsəni,
Belə getsə, tez olur dillərə dastan, Süsəni.

Hərəkatü rəvişin qıldı səhi sərvini pəst,
Sünbülə türreyi-zülfün şikəni verdi şikəst,
Laləni dağə salıb ruyin, edib badəpərəst,
Ey könül, qaş-göz aradə nə gəzərsən belə məst?
Yoxdu vəhmin ki, ara yerdə tökə qan, Süsəni?

Ey mələk, əbr yüzün[1] gündümü, ya bədri-tamam?
Kim ki, ruyindən olur məst, ona badə həram,
Pərdəsiz cilvələnib, naz ilə ver qəddə qiyam,
Küfri-zülfün dağıdıb, məst çıxıb, eylə xüram,
Bilələr ta ki, nədir küfr ilə iman, Süsəni.

Bu qədü qamətinə ətləsü xara yaraşır,
Qaşların guşəsinə qətlimə eyma yaraşır,
Edə gər zində ləbin ləfzi Məsiha, yaraşır,
Səni hər kim ki, sevər, başına sevda yaraşır,
Ola sərgəştəvü divanəvü heyran, Süsəni.

Gün ki, hər gün ki, çıxar, dərgəhinə səcdə edər,
Sərv rəftara gəlir, qılsa qədin bağə güzər.
Qönçə gər ağzın ilə qarşu dura, boynun əyər,
Küfri-eşqin yetişib bir yerə kim, ey kafər,
Desələr Vazehə böhtandı, müsəlman, Süsəni!

# AŞIQ ALI
(1800 — 1911)

## QOŞMALAR

Ötüşdü zimistan, gəldi nobahar,
Yetirdi qərinə, sənələr getdi.
Dəli könül gündə yüz xəyal elər,
Dolandı ruzigar, havalar getdi.

[1] Yüzün—üzün

Mən sana nə deyim ey şahi-şonqar,
Ağlımı apardı bir çeşmi xumar,
Könlümə olmadı bir münasib yar,
Gəldi məlakələr, sonalar getdi.

Yazıq Alı, bu qəm səni bürüdü,
Eynim yaşı sel-sel oldu, yeridi,
Qürbət eldə yazıq canım çürüdü,
Neçə çərşənbələr, cumalar getdi.

***

Süsənli, sünbüllü, tər bənövşəli,
Yaylaq, bizim yaylaqlara bənzərsən.
İçən ölməz sənin kövsər suyundan,
Yaylaq, bizim yaylaqlara bənzərsən.

Əyricə, Verst dağı, Xankirt baxarı,
Ağ sürülər Sarıyaldan yuxarı,
Gözəllər seyr elər o yaylaqları,
Oylaq, bizim oylaqlara bənzərsən.

Aşıq Alı deyər, üç gözəl dərə,
Çiçəkli, şaqaylı, xoş gözəl dərə,
Əyricə, Verst dağı, Baş gözəl dərə,
Yaylaq, bizim yaylaqlara bənzərsən.

***

Bir nişan istədim gül üzlü yardan,
Dirsəyin göstərdi: Alısan, - dedi.
Dedim: Ay qız küsdüm, səndən əl çəkdim,
Həlbət bir yadına salısan, - dedi.

Dedim: Ay bəxtəvər, bu nə busatdı?
Dedi: Nəzər eylə, gör nə sufatdı.
Dedim: Çeşmim yaşı yeri islatdı,
Verrəm dəsmalımı silisən, - dedi.

Dedim: Ay qız, qəmdən dəftər bağlaram,
Dedi: Baxma, nişanını saxlaram.
Dedim: Həsrətindən inan ağlaram,
Qorxma yaxın vaxtda gülüsən, - dedi.

Dedim: Ay qız, nə gözəldi şamama,
Dedi: Dəymə, ömrün yetər tamama,
Dedim: Ay qız, əl uzadım məmənə,
Özünü nüfuzdan salısan, - dedi.

Dedim: Xəstələrin can dərmanısan,
Dedi: Aşıqların kərəm kanısan.
Dedim: Ay qız, mənim adım tanısan,
İrəldən bilirəm, Alısan, - dedi.

***

Havalanıb ərş üzünə qalxıbsan,
Dağların sərdarı, nər, Ağrı dağı!
Payızın, baharın olur zimistan,
Səndən əskik olmaz qar, Ağrı dağı!

Ətəyində xan atdanır, xun düşür,
Böyük adın mahallara ün düşür,
Hər dağdan irəli sənə gün düşür,
Nə vaxtı açılar dar, Ağrı dağı!

Səkkizi rizvandı, cənnətin bağı,
Neçə xanası var, neçə otağı,
Nuh gəmisi, peyğəmbərin bulağı,
Səndə çox nişana var, Ağrı dağı.

Görərdin cahanı necə sirr idi,
Tozun qalxdı İravanı bürüdü,
Axşam üstü hər tərəfə yeridi,
Batırdı ölkəni pir, Ağrı dağı.

Əvvəl səndə olub Rüstəm pəhlivan,
Gəzib şahi-mərdan nişanbanişan,
Aşıq Alı təəccübdü hər zaman,
Yarın qardı, yarın nar, Ağrı dağı.

***

Bayram oldu külli-aləm bəzəndi,
Heç mənim halımı bilən olmadı.
Dost dostu çağırdı, qohum-qardaşı,
Mən qəribi yada salan olmadı.

Ağ geydi, sallandı xublar dəstəsi,
Kəklik tək dağlara düşdü sədası,
Hicran xəstəsiyəm, qəm şikəstəsi,
Heç yanıma gedib-gələn olmadı.

Kimi dostnan gəzdi, kimi yoldaşnan,
Aşıq Alı qaldı gözü qan-yaşnan,
Analar oğulnan, bacı qardaşnan,
Heç mənim halıma qalan olmadı.

***

Gəşt eylədim bu dünyanı dolandım,
Əllini keçirdim, yüzə nə qaldı?!
Ayaq getdi, əl gətirdi, diş yedi,
Baxmaqdan savayı gözə nə qaldı?!

Ölüm haqdı, çıxmaq olmaz əmirdən,
İpək tora həlqə salma dəmirdən:
Aydı, gündü gəlib keçir ömürdən,
Tələsirik, görən yaza nə qaldı?!

Hayana baxıram: hava məxşuşdu,
Gəzdiyim oylaqlar yadıma düşdü.
Bir gün eşidərsən: Alı da köçdü,
Sındı simli sazı, təzanə qaldı.

***

Qoca dünya çoxun yola salıbdı,
Köçən köçüb, köçməyənlər köçəcək.
Qafil, içmə bu gün əcəl şərbətin,
İçən içib, içməyənlər içəcək.

Necoldu var üçün qanlar tökənlər,
Əziz canın al qumaşa bükənlər?
Unutmasın şərmi-xəta əkənlər,
Biçən biçib, biçməyənlər biçəcək.

Yazıq Alı, nə tez düşdün həvəsdən?
Sərraf olan seçər qızılı misdən.
Arif olan kəslər, yaxşını pisdən,
Seçən seçib, seçməyənlər seçəcək.

## GƏRAYLILAR

Yar yanında günahkaram,
Doğru sözüm yalan oldu.
Yürüş etdi qəm ləşkəri,
Könlüm şəhri talan oldu.

Bax bu qaşa, bax bu gözə,
Yandı bağrım, döndü közə.
Keçən sözü çəkmə üzə,
Keçən keçdi, olan oldu.

Aşıq Alı sənə qurban,
Gəl eylə dərdimə dərman.
Uçdu getdi tülək tərlan,
Sar da kəklik alan oldu.

***

Bizdən ayaq kəsən gözəl,
Dur gəl nazlana-nazlana.
Aşiqindən küsən gözəl,
Dur gəl nazlana-nazlana.

Mən sənin qədrini billəm,
Sənsiz çətin deyib gülləm.
Sən gəlməsən, özüm gəlləm,
Dur gəl nazlana-nazlana.

Aşıq söhbət-sazsız olmaz,
Gözəl gəlin nazsız olmaz,
Dost arası sözsüz olmaz,
Dur gəl nazlana-nazlana.

Boyun uca, belin incə,
De, kim sevər səni mənсə?
Sən Alıdan küsmə beca,
Dur gəl nazlana-nazlana.

## MİRZƏ İSMAYIL QASİR
(1805 — 1900)

### QƏZƏL

Qönçə görsə ləbini ağzını pünhan eylər,
Lalə tək bağrını ləlin həvəsi qan eylər.

Gülü rüxsarinə bülbüllər olubdur mail,
Gecə-gündüz bu səbəbdəndir ki, əfqan eylər.

Arizin içrə yəqin zülfünü görmüş sünbül,
Günəş içrə səri-zülfünü pərişan eylər.

Verir İsa kimi min mürdeyi-sədsaləyə can,
Hər zaman ləblərini kim, şəkərəfşan eylər.

Bu cəfapişə əlindən ciyərim qan olmuş,
Hər baxanda üzünə könlümü viran eylər.

Bu qədər cövrü cəfa çəkmisən ol mahrudan
Qasir, axırda sənin dərdinə dərman eylər.

## MƏRSİYƏ

Bu gecə Fatimənin didəsi giryan olacaq,
Ki, sabah oğlu Hüseyn, qanına qəltan olacaq.

Bu gecə nalə çəkib Əhmədi-Muxtar ağlar,
Bu gecə növhə qılıb Heydəri-Kərrar ağlar,
Bu gecə şivən edib firqeyi-əbrar ağlar,
Təşnəlikdən cigəri-ali-Əli qan olacaq.

Bu gecə kəsdi Fəratın yolunu İbn Ziyad,
Bu gecə işrət edər taifeyi-İbn Ziyad,
Bu gecə Zeynəbi-məzlumə çəkər naləvü dad,
Əhli-beyti-şəhi-din zarü pərişan olacaq.

Ümmileyla bu gecə ağlar Əliəkbər üçün,
Zülfi geysulərinə şanə çəkər zivər üçün,
Zeynəbi zivər edər, ol şəbi - peyğəmbər üçün,
Ki, səhər təşnəcigər ümmətə qurban olacaq.

Çün Səkinə bu gecə naləvü əfqanə gəlir,
Əlləteş, bəski deyib növhə qalıb canə gəlir,
Ki, gedib xeyməgəhə şahi-şəhidanə gəlir,
Yandırır, ey baba can, Əsğərin ətşan olacaq.

Bu gecə Həzrəti-Gülsum deyər, ya Əbbas,
Xatiri-itrəti-əthare düşüb xovfü həras,
Qılgilən mərhəmət ilən nəzərin zibdeyi-nas,
Tiflilər xeymədə, ləb təşneyi-suzan olacaq.

Bu gecə oldu yəqin, Fatimeyi-naşadə,
Ki, gərəkdir ola ənduhi-qəmə amadə.
Bildi ki, etməyəcək vüslət ilə damadə,
Toy hənası ələ ol təşnələbün qan olacaq.

Bu gecə riqqət ilə ağlub imami-səğəleyn,
Xeymələrdən yetişibdür fələkə şivəni-şeyn,
Dedi öz əhli-əyalinə bu növ ilə Hüseyn,
Ki, sabah Kərbübəla qan ilə tufan olacaq.

Əhli-beytə yetib ənduhi-müsibət bu gecə,
Üz verib şiələrə yüz qəmü möhnət bu gecə,
Verilib Qasirə bir cami-məhəbbət bu gecə,
Həşrədək növhəgəri-şahi-şəhidan olacaq.

# MİRZƏ FƏTƏLİ AXUNDZADƏ (SƏBUHİ)

(1812 — 1878)



*Yeni Azərbaycan ədəbiyyatının yaradıcısı, Yaxın və Orta Şərqin ilk dramaturqu, dahi sənətkar, filosof, tənqidçi, XIX əsr Türk və islam dünyasının ən böyük mütəfəkkirlərindən biri olan Mirzə Fətəli Axundzadə Azəri türkcəsində və fars dilində şerlər də yazırdı. İlk şerini fars dilində böyük rus şairi Puşkinin ölümünə "Səbuhi" təxəllüsüylə yazmışdır. Səbuhinin öz doğma ana dilində yazdığı şerlərdən ikisini təqdim edirik.*

## CƏFƏRQULU XANA

Səlam olsun məndən sərkar xana!
Mollalardan bir az edim şikayət;
Münkirdirlər əhadisə, Qurana,
Çifaidə gecdir hələ qiyamət!

Yetmişəm bunlardan qələdə cana,
Heç birisi yoxdur gələ imana;
Görməmişəm belə əsrü zamana;
Bular sarı nahəqq etdik siyahət!

İstəmənik derlər xətti-cədidi,
Əbəs yerə döymə soyuq hədidi.
Üştüri-binoxta hərgiz büdidi?
Bizlərdə nöqtəsiz olmaz kitabət!

Qəzəb etsin tanrı belə millətə!
Rəva deyil bular girə cənnətə;
Nə vacibə qail, nə də sünnətə,
Görməsinlər peyğəmbərdən şəfaət!..

Biri söylər: "Nədir bu nuni-səğir?
Lazım deyil bizə nə zəbər, nə zir!
Yazacağıq elə begiri Bəkir!
Sən ha çığır-bağır elə məlamət!"

Bir neçəsi üzdə müsəddiq olur;
Qaib olur məndən, münafiq olur.
Mirzə Əli ancaq ki, sadiq olur,
Yerdə qalan cümlə tapır zəlalət!

Bilmirəm ki, nədir bu işə çarə?!
Gəlimmi mən Qarabağa dübarə?
Olmasa gər xandan cüzi işarə,
Əlifbey sarıdan olmanam rahət!

## ZAKİRƏ MƏKTUB

Qasım bəy, eşitdim yaxın olubsan,
Xan qızına, axır nədir bu rəftar?
Edibsən xubları yüz yol imtəhan,
Eylərsən onlara yenə etibar?

Yeyib otağında şamü nəharın,
Kəsdiribsən yasdığının kənarın,
Eşidirsən şirin-şirin göftarın,
Kişi, sənin, vallah, əcəb işin var!

Dediyin qafiyə ona xoş gəlib,
Qaçan bəxtin indi sənə tuş gəlib,
Sövdalı başına təzə huş gəlib,
Təəccüb eylərəm büsyar, büsyar!

Səni pərivəşlər salıb bu halə,
Döndəriblər əlif qəddini dalə;
Çəkərdin onlardan həmişə nalə,
Nədir yenə dildə əzbər olub yar?!

Xan qızı məhvəşdir, bilir el, aləm,
Məhvəşlər atəşdir, bizik əqli kəm;
Yüz il xidmət edə oda bir adəm,
Yenə düşən dəmdə ona, bil, yanar.

Xudadan istərəm versin muradın,
Yamanlığa hərgiz çəkmərəm adın,
Yolunda zəhmətin, rənci-ziyadın,
Mən çəkdim, o etdi məni şərmsar.

Özgə cəfaların dursun kənarə,
Nə lazım hər birin salmaq şümarə.
Xeyir işinə onun mən o diyarə,
Şadü xürrəm getdim, qayıtdım bəs xar.

O qafiyən mənə çox etdi əsər,
Qalmadı könlümdə ondan bir kədər.
Növcəvandır, təkdir, iyzədi-davər,
Eyləsin ömründən onu kamkar!

Rəvadırmı çəkə bixurdü bixab,
Bəstəri-möhnətdə bu qədər əzab?!
Duayi-xeyrinə eyləyin şitab,
Siz də mənim kimi hər leylü nahar.

Belə pəriruyin, heç səni tarı,
Rəvadırmı qəmdən sola üzarı?
Həm xələfdən xali ola kənarı?
Olsun ona mövlam yavərü qəmxar!

Mənim də var gərçi bir az günahım,
Sən get hüzuruna ol üzrxahım,
Söylə ki, ey şahım, ey qibləgahım,
İncimə, gər etdim şikayət izhar!

## ƏBÜLQASIM NƏBATİ
(1812 — 1874)

*Nəbati Güney Azərbaycanın Qaradağ mahalının Üştibin qəsəbəsində ruhani ailəsində anadan olmuşdur. Təbrizdə nəşr edilmiş 7500 misralıq divanındakı şerlərin yarısı Azəri türkcəsində, yarısı farscadır. Ancaq Nəbatinin heca vəznində, xalq şeri üslubunda yazdığı qoşmaların, gəraylıların çoxusu bu divana daxil edilməmişdir. Bu əsərlər isə Nəbati yaradıcılığının ən gözəl örnəklərindəndir. Xalq poeziyası ruhunda yazdığı bəzi şerlərində Nəbati "Xan Çoban" təxəllüsündən də istifadə edib. Ehtimallara görə, XVIII əsrdə "Xan Çoban" adlı bir şair də yaşamış və onun adıyla bağlı "Xan Çoban" dastanı yaranmışdır. Nəbatinin həyatı bu dastanla səsləşir. Odur ki, adətən Xan Çobana aid edilən və bir mahnı kimi də xalq arasında çox məşhur olan "Apardı sellər Saranı" şerini də bura daxil edirik.*

### ÇARPA

Get dolanginən, xamsən hənuz,
Püxtə olmağa çox səfər gərək.
Mürği-Qaf ilə həmzəban olub,
Dövrə qalxmağa balü pər gərək [...]

Zülfü ənbərin, xalı nazənin,
Qönçətək dəhan, qaşı cansitan,
Şahi-gülrüxan, mahi-biqərin,
Nəstərən kimi simbər gərək.

Lalətək üzü al yanaq ola,
Tazə gül kimi tər-buxaq ola,
Ağ-ayaz üzü aydan ağ ola,
Qaşları ona həm süpər gərək.

Həminan ola mehrü mah ilən,
Həmzəban ola nuri nar ilən,
Zülfi bəhs edə şahmar ilən,
Gənci-sinəsi pürgühər gərək [...]

Mən qılmayın çox da zahidi,
Üzrü var onun, aşiq olmayıb,
O əbəs yerə xəlq olunmayıb,
Bağbanə bir kəllexər gərək.

Ciddü cəhd qıl, arif ol, gözüm,
Elmi-eşqdən olma binəsib,
Cum bu bəhrə bir, tap o gövhəri,
Aşiqəm deyən tərki-sər gərək.

Rah pürxətər, bəxt vajgun,
Zülfi-yar tək şəb siyahgun,
İndi qeybdən Xançobanına
Nəxli-Turdən bir şərər gərək.

Hər xəsisə gəl etmə iltica,
Olmaz özgədən hacətin rəva,
Müşkül açmağa şahi-lafəta,
Əntər öldürən şirin-nər gərək.

Bu cavahirin yoxdu qiyməti,
Açginən gözün, yaxşı seyr qıl,
Hər biri dəyər Çin xəracına,
Müftə verməræm, simü zər gərək.

Bir gözəl cavan istərəm haman
Kim, bu sözləri eyləsin rəvan,
Hardadır desin bir şəkərzəban
Kim, bu söz mənə hamı tər gərək.

Saqi, gəl məni cami-eşqdən
Bir kərəm qılıb öylə məst qıl,
Ta desinlər xəlq lal oturmağa,
Bu Nəbati tək bəxtəvər gərək.

## QƏZƏLLƏR

Eylə məstəm bilməzəm kim, mey nədir, mina nədir,
Gül nədir, bülbül nədir, sünbül nədir, səhra nədir?

Od tutub canım sərasər yandı, amma bilmədim:
Dil nədir, dilbər nədir, başımda bu sevda nədir?

Bilmədim ömrümdə hərgiz küfrü iman hansıdır,
Əhmədü Məhmud kimdir, Musiyü İsa nədir?

Şahbazi-övci-vəhdət, vahidü həyyü qədim,
Xaliqi-ərzü səma ol fərdi bihəmta nədir?

Sədri-eyvani-cəlalət, şəm-i-bəzmi-kainat,
Afitabi-ərşi-izzət-"lafəta illa" nədir?

Türrəhatı qoy kənarə, rəqsə gəl divanə var,
Gəl, xərabət içrə gör bu şurişü qövğa nədir?

Dürdi-safi gözləmək vaxtı deyil, saqi, aman,
Şişə ver, peymanə ver, sağər nədir, səhba nədir?

Dur, gözün qurbanıyam, məstanə gəl, rindanə ver,
Çox demə Cəmşiddən, İskəndərü Dara nədir?

Lövhəşəllah, kimdi bilməm eşq divanın yazan,
Aşiqü məşuq kimdir, Vamiqü Əzra nədir?

Şahidi-xəlvətnişinim etdi ruxsarın əyan,
Aşiqi-divanə, gəl gör zahirü ixfa nədir.

Yetdi ömrün axirə, sən bir, Nəbati, bilmədin,
Kimdi bu gözdən baxan, ya dildə bu guya nədir?

***

Gəldi bir şux yenə yanıma göyçək-göyçək,
Vurdu bir tiği-cəfa canıma göyçək-göyçək.

Lalə rüxsarın edib xuni-dilimdən gülgun,
Boyadı əllərini qanıma göyçək-göyçək.

Parə-parə ciyərim şişə çəkib etdi kabab,
Dikdi göz dideyi-giryanıma göyçək-göyçək.

Heyf kim, olmadı bu aşiqə bir canı yanan,
Deyə bir dərdimi cananıma göyçək-göyçək.

Pənah Allaha - deyib, qəhrü qəzəbdən yuma göz,
Edə bir ərzimi sultanıma göyçək-göyçək.

Ta ki, pərvanə kimi şövq ilə bu canı fəda
Edib ol şəmi-şəbistanıma göyçək-göyçək.

Olu, yarəb, görəsən bir gecə ol valiyi-Misr
Gələ bu külbeyi-əhzanıma göyçək-göyçək?

Var ümidim ki, qələm əhli cavan oğlandır,
Yazalar bu sözü divanıma göyçək-göyçək.

Qəm yeməz dəxi Nəbati kimi ol şahi-cahan,
Basa bir möhrünü fərmanıma göyçək-göyçək.

***

Cumdum genə qəvvas tək dəryayə, mən, dəryayə mən,
Qıldım nəzər bir lölöyi-laləyə mən, laləyə mən.

Sən sanma mən bu bəhrdə hər inci, mirvari gəzəm,
Göz dikmişəm bir gövhəri-valayə mən, valayə mən.

Getdim biyaban gəştinə, urdum təcəlla dəştinə,
Etdim tamaşa Turdə Musayə mən, Musayə mən.

Çıxdım bu ərşin üstünə, baxdım büləndü pəstinə,
Pəs onda nagəh uğradım İsayə mən, İsayə mən?

Saldım tamami-aləmi gözdən, unutdum Adəmi,
Verdim könül bir vahidi-yektayə mən, yektayə mən.

Gəzdim səmavatı tamam, hər mənzilə etdim xuram,
Qıldım güzər həm cənnəti-əlayə mən, əlayə mən.

Etdim tamaşa güllərin, həm xoşnəva bülbüllərin,
Saldım nəzər həm mənzəri-hurayə mən, hurayə mən.

Getdi sərimdən əqlü huş, bir guşədə oldum xəmuş
Düşdüm əcayib mənzili-ixfayə mən, ixfayə mən.

Nə yatmış idim, nə oyaq, nə atlı idim, nə yayaq,
Bir vaxtı gördüm gəlmişəm dünyayə mən, dünyayə mən.

Leyli deyib çəkdim aman, qan-yaş töküb etdim fəğan,
Düşdüm yenə Məcnun kimi səhrayə mən, səhrayə mən.

Fani olubdur bu bədən, dur tap, Nəbati, bir kəfən,
Bu canı qurban eylədim Leylayə mən, Leylayə mən.

***

Sərməst yıxıldım genə meyxanələr içrə,
Oldum genə rüsva neçə fərzanələr içrə.

Yaxdım oda səccadəvü dəstarü ridanı,
Bir ad elədim mən dəxi pərvanələr içrə.

Ey şuxi-pəritəl-ətü, ey sərvi-güləndam:
Gəzmə, səni tari, belə biganələr içrə.

Ol nərgisi-məstin nə füsungərdi, xudaya,
Saldı məni Məcnun kimi divanələr içrə.

Gəl ver mənə bir cam də, ey saqiyi-gülfam,
Ta məst yazım bu sözü əfsanələr içrə.

Billah, bu büti-lalərüxün yoxdu nəziri,
Baxdım neçə min surəti bütxanələr içrə.

Ol gənci-xəfidən bir əsər bilmədim axir,
Canım çürüdü heç yerə viranələr içrə.

Ey kövsər üçün ah çəkən zahidi-əbləh,
Meyxanədə gəl gör onu peymanələr içrə.

Qəvvas kimi qutə vurub bəhrə Nəbati,
Ol gövhəri istər tapa dürdanələr içrə.

***

Sənsiz, ey gül, könlümün bir dəm qərarı yoxdu, yox!
Səndən özgə neyləsin, bir qəmküsarı yoxdu, yox!

Dərdi-hicran çarəsi hərçənd bildim səbr imiş,
Neyləyim, billah, bu dəryanın kənarı yoxdu, yox!

Leyli! Leyli! - söyləyib çoxlar deyir kim, aşiqəm,
Leyk Məcnun tək onun bir dağdarı yoxdu, yox!

Hər xəzanın bir baharı onsuz olmaz, olmasın,
Bu çöl olmuş gülistanın, bir baharı yoxdu, yox!

Gülləri, bülbülləri, abü havası çox gözəl,
Heyf kimi, bu gülşənin bir gülüzarı yoxdu, yox!

Hiç eybin yox, gözəllik hamı səndə cəmdir,
Neyləyim amma ki, əhdin etibarı yoxdu, yox!

Sən nə bəslərsən bu tərlanı, Nəbati, ruzü şəb?
Mən bu dağı çox dolandım, bir şikarı yoxdu yox!

## RÜBAİLƏR

Saqi, işimiz naləvü əfğan oldu,
Zülfün kimi halımız pərişan oldu.
Qoydun yerə camı, bizdən üz döndərdin,
Bir busə dedik ver bizə sən, qan oldu.

Gəldi genə fəsli-novbahar, ey saqi,
Bəs harda qalıb o gülüzar, ey saqi?
Meyxanəyə get, gətir onu məstanə,
Vermə mənə munca iztirar, ey saqi.

Saqi, gözüm, ol ruhi-rəvanı mənə ver,
Gəl gərdişə, ol rahəti-canı mənə ver.
Qəm dəfi üçün şəhabi-saqibdir mey,
Qurbanınam, ol tiri-kamanı mənə ver.

Saqi, genə əyyami-gülüstan oldu,
Gül təxtə çıxıb, çəməndə sultan oldu.
Hər rindü gəda deyir mənəm şahi-cahan,
Hər qübbərə bir bülbüli-xoşxan oldu.

Saqi, bu gecə bəzmi-gülüstan etdin,
Bir dövr elədin ki, dövri heyran etdin,
Allah səni hifz eləsin bəd gözdən,
Daim ki, mənim dərdimə dərman etdin.

## QOŞMALAR

Səba, məndən söylə o gülüzara,
Bülbül gülüstanə gəlsin, gəlməsin?
Bu hicran düşkünü, illər xəstəsi
Qapına dərmanə gəlsin, gəlməsin?

Mən qurbanı olum ənbər tellərin,
Qönçə dodaqların, püstə dillərin,
O lalə rüxsarın, mişkin xalların
Oduna pərvanə gəlsin, gəlməsin?

Gözüm çox həsrətdir xumar gözünə,
Günəş camalına, şəkər sözünə,
Utanıram, necə deyim üzünə,
Dərdin xəstə canə gəlsin, gəlməsin?

Dolaşdır boynuma şümşad qolunu,
Qucaqlayıb qucum incə belini,
Ləli-ləbin əmim, sorum dilini,
İstər ölü canə gəlsin, gəlməsin?

Nəbati istəməz sənsiz dünyanı,
İzzəti, hörməti, şövkəti, şanı,
Bir zada qalmayıb daha gümanı,
Bu baş o meydanə gəlsin, gəlməsin?

***

Susuyubdur genə kimin qanına,
Xumar-xumar baxar hara gözlərin?
Nola bir də dolanaydım başına,
Qurbanı olaydım qara gözlərin!

Müqəvvəs qaşların etginən kaman,
Çəkginən müjgandan tari-cansitan.
Bu xəstə canımı qılginən nişan,
Qoy etsin köksümü para gözlərin.

Sənubər qamətin, ey sərv-rəftar,
Şümşadü ərəri etdi şərmsar.
Nə yalqız etmisən məni xarü zar,
Çoxların gətirib zara gözlərin.

Arizin dövründə zülfi-mişginab,
Qoymaz şəfəq salsın qürsi-afitab.
Hökm qıl götürsün sayəsin səhab,
Bu dərdə eyləsin çara gözlərin.

Üzün şətəəsi, ey şəmi-Çəkil,
Xurşidi-xavəri etdi münfəil.
Belə ki, eşq odu oldu müştəil,
Çəkdirə haqq məni dara gözlərin.

Xədəngi-xunrizin, ey şirinmənzər,
Xosrovu təxtindən etdi dərbədər.
Həlqə edib əldə zülfi-müənbər,
Nə sehr oxur yenə mara gözlərin?

Təzə gül tək açılasan səhərdən,
Müzəyyən olusan ləlü gühərdən,
Yaxşı saldın Nəbatini nəzərdən,
Əcəb mail olmuş xara gözlərin!

## GƏRAYLILAR

Bir iyid ki, dərdə düşə,
Dərd əlindən yata bilməz.
Qabağında min ov gəzə,
Heç birinə ata bilməz.

Haqq dərgahı ayaz imiş,
Camalı gün, bəyaz imiş,
Fələk nə hiyləbaz imiş,
Heç kəs onu tuta bilməz.

Xan Çobanam Arazbardan,
Bağçalarım doldu bardan,
İyid qalsa gər qatardan,
Tay-tuşuna çata bilməz.

***

Arpa çayı aşdı, daşdı,
Sel Saramı götdü, qaşdı.
Sara gözəl, qələm qaşdı,
Apardı sellər Saramı,
Bir ala gözlü balamı!

Yüz atlıydıq, çıxdıq düzə,
Bıçaq batsın yaman gözə,
Sağrı başmaq suda üzə,
Apardı sellər Saramı,
Bir ala gözlü balamı!

Arpa çayı dərin olmaz,
Axan sular sərin olmaz,
Sara kimi gəlin olmaz,
Apardı sellər Saramı,
Bir ala gözlü balamı!

Arpa çayı məni aldı,
Apardı dəryaya saldı,
Cilovdanm dalda qaldı
Apardı sellər Saramı,
Bir ala gözlü balamı!

Mən bu bağa girməmişəm,
Qonça gülün dərməmişəm,
Mən Saranı görməmişəm,
Apardı sellər Saramı,
Bir ala gözlü balamı!

Olduq əcəb günü qara,
Dərdimizə yoxdu çara,
Sara həsrət qaldı yara,
Apardı sellər Saramı,
Bir ala gözlü balamı!

Qaldı bu sinəmdə dağın,
Öldürdü məni fərağın,
Oldu qara toy otağın,
Apardı sellər Saramı,
Bir ala gözlü balamı!

Adaxlın gözlər yolunu,
Boynuna salsın qolunu,
Su aldı sağü solunu,
Apardı sellər Saramı,
Bir ala gözlü balamı!

Düyünü tökdüm qazana,
Qaynadı qaldı azana,
Əlac yox allah yazana,
Apardı sellər Saramı,
Bir ala gözlü balamı!

Arpa çayı ada gəlir,
Kor yengələr dada gəlir,
Sağrı başmaq suda gəlir,
Apardı sellər Saramı,
Bir ala gözlü balamı!

Gedin deyin Xan Çobana,
Gəlməsin bu il Muğana,
Muğan batıb nahaq qana,
Apardı sellər Saramı,
Bir ala gözlü balamı!

## TƏCNİSLƏR

O tərlan baxışın qurbanı canım,
Boy çəkib gözlərin gözlər, nə gözlər!
Amaci-sinəmi novki-müjganın
Qoyub nişanəyə gözlər, nə gözlər!

Nə qələtdir düşüb üz arasına,
Onu bilmək olmaz üz, arasına,
Əgər qəvvas isən, üz arasına,
Bir gör axır ondan gözlər, nə gözlər!

Təcəllasan, buyur Sina dağına,
Əgər görsən məni, Sinada, qına,
Qoyma rəqib baxsın sinə dağına,
Yamandır gözləri, gözlər, nə gözlər!

Yeni aydı, amma nə sövdası var,
Nöqsanına bax, gör nə sovdası var,
Heç bilmənəm başda nə sevdası var,
Ağlar, ağlar, deyər gözlər, nə gözlər!

Nəbati kül oldu, yandı Sinada,
Bu alovdan bir od düşsün sana da,
Deyəmməzəm, necə deyim sına da,
De görüm görmüsən gözlər, nə gözlər?

***

Könlüm gülzarında, qış mövsimində,
Açılıb təzə gül, di dər, ay Pəri!
Həsrət öldüm, heyif görmədim üzün,
Qaldı qiyamətə didar, ay Pəri!

Çəkin getsin, mən minmənəm yad ata,
Sevə bilməz özgə oğlun yad ata,
Bu yorğun maralı qoyma yad ata,
Özün xədənginə didər, ay Pəri!

Keçə bilməm, bu dəryalar dərindir,
Ölənə tək yerim sənin dərindir.
Dur ağacdan almaları dər, endir,
Bir-bir otaqlara didər, ay Pəri!

Xoş yaraşır bazubəndlər bu qara,
Sona tellim, sənə düşməz bu qara,
Bundan artıq dözmək olmaz bu qara,
İnsafa gəl, dur aç didar, ay Pəri!

Ömrüm başa gəldi uzun gecələr,
Bu yatmamaq vallah, məni gic elər.
Niyə bilməm Gülgəz ünü gec elər?!
Dur gəl ki, vaxt oldu di dar, ay Pəri!

Həsrət toxmun mən də əkdim dəminə,
Səni allah, atdan düşmə, de minə.
Bir düşəsən Nəbatinin dəminə,
Səni tərlan kimi didər, ay Pəri!

## XALTANLI TAĞI
(1776 — 1890)

### QOŞMALAR

Mən fələyin şərbətindən içmişəm,
Həmdəm olan, gəl halımı gör nədi.
Bu dünyada bostan olar, həm solar,
Yemiş nədi, çiçək nədi, bar nədi?

Yığılar bir yana bir beş-onumuz,
Qibləyə çevrilər bizim yönümüz.
Beşcə arşın bez olacaq donumuz,
Atlaz nədi, zərbaf nədi, zər nədi?

Çoxu zail olar, çox bel bükülər,
Beyin qaynar, sümük çatlar, tökülər.
Məşhər günü bizə bir ev tikilər —
İşıq nədi, baca nədi, dər nədi?

Tağı deyər gözlər doymaz sürmədən,
Qəbrə girər, aşıq yarın görmədən.
Altdan torpaq, dörd tərəf daş, lüt bədən —
İsti nədi, soyuq nədi, qar nədi?

***

Bir yaşından beş yaşına çatanda,
Yenicə açılmış gülə bənzərsən.
Beş yaşından on yaşına çatanda
Arıdan kəsilmiş bala bənzərsən.

On dördündə sevda enər başına,
On beşində yuva qonar döşünə.
Çünki yetdin iyirmi dörd yaşına —
Yazda boz-bulanıq selə bənzərsən.

Otuzunda kəklik kimi səkərsən,
İgidlik eyləyib qanlar tökərsən.
Qırx yaşında haramdan əl çəkərsən,
Sonası oylanmış gölə bənzərsən.

Əlli yaşda əlif qəddin bükülər,
Altmışında azı dişin tökülər.
Yetmişində qolun-qıçın bükülər,
Karvanı kəsilmiş yola bənzərsən.

Səksənində ağrı enər dizinə,
Doxsanında qubar qonar gözünə,
Tağı deyər: çünki yetdin yüzünə
Dağlar başındakı kola bənzərsən.

## AŞIQ PƏRİ

(1811 — ?)

### QOŞMALAR

Çanaqçı mülkündən səfər eylədim,
Mənə qənim oldu yollar, ağlaram.
Şəcər gəldi, vurdu, şikar eylədi,
Tökər didələrim sellər, ağlaram.

Nagahandan düşdüm belə dərdə mən,
Necə çəkim eşq üzünə pərdə mən?
Gözü yaşlı gəldim Tağavurda mən,
Pərişan olubdu tellər, ağlaram.

Bir şah əndaz şux nigarım gedibdi,
Kəsilibdi ixtiyarım, gedibdi,
Köysü dağlı bir tavarım gedibdi,
Quruyub, lal olub dillər, ağlaram.

Bir dilbər pəriyə Pəri qan ağlar,
Çəkilib sinəmə düyünlü dağlar,
Ölübdü bülbülüm, lal olub bağlar,
Saralıb, savılıb güllər, ağlaram.

***

*(Mirzəcanın vəfatı münasibətilə)*

Dünya, sənin etibarın yox imiş,
Bir xəbər ver, Mirzəcanı neylədin?!
Neçə bəylər ilə, neçə xan ilə,
Göftarı xoş, əhli-canı neylədin?!

Neçə şəhər üstə cəng edib savaş,
Cari olub sel yerinə qanlı yaş,
Fələk, etdin taci-təxtini taraş,
Nökər, naib, xanimani neylədin?!

Puç dünya, səndə bir yaranan hanı?
Günbəgün artırdı şökəti, şanı,
Tiflisin sağ əli, sərdarın canı,
Viran qoyub Dağıstanı, neylədin?!

O fələkdi, göyü, yeri dağlayan,
Əzəl şad olub, sonra ağlayan,
Sinəsində şeri, kitab bağlayan,
Sahibi-huş, göhərkanı neylədin?!

***

*(Məhəmməd bəy Aşiqə)*

Ruşən gecəsində, xoş bir saatda,
Namə gəldi bu səhrayə, sevdiyim.
Yaxşılıq yazılsa yaman dəftərə,
Nə deyərsən bu binayə, sevdiyim.

Hər qul öz yerinin bünyadı olu,
Oxuyan kəslərin savadı olu,
Dərdlinin fələkdən amadı olu,
Minnət elər bu dünyayə, sevdiyim.

Ərzi tulanidi, bu müxtəsəri,
Çoxları eşqdən olub sərsəri.
Anlayıb əhli-dil olandan bəri,
Ömr baqi getdi zayə, sevdiyim.

Ey Pəri, müxtəsər bir cavab elə,
Şayəstədi rücu edən aqilə,
Rəqiblər danışır inqilab ilə,
Qoşulmaram mən hərcayə, sevdiyim.

## AŞIQ HÜSEYN ŞƏMKİRLİ
(1811 — 1891)

### QOŞMALAR

Bir adam ki, sənlə ülfət eyləsə,
Yəqin onun əsl zatı yaxşıdı.
Namərd sənə quzuplov yedirsə,
Mərdin quru məhəbbəti yaxşıdır.

Dad, hazar çəkərəm pərkarsız sazdan,
Ver, qurtar əlindən nəzir, niyazdan,
Söyləyən qarıdan, gəzəyən qızdan,
Güləyən gəlindən lotu yaxşıdır.

Aşıq olan sözün söyləyər başdan,
Sallabaş adamdan, ürəyi daşdan,
Bədnəzər qonşudan, bədcins yoldaşdan
Qədir bilənlərin iti yaxşıdır.

Aşıq Söyün söylər kəlməni teydən,
Dərsimi almışam əlifdən, beydən,
Çörəksiz otaqdan, gözəlsiz evdən,
Çölün, biyabanın otu yaxşıdır.

***

Yarın bağçasında üç gül açılıb,
Ağ gül, qırmızı gül, bir də sarı gül.
Hər üçü də bir-birindən öyməli,
Ağ gül, qırmızı gül, bir də sarı gül.

O ağ gülün qapısından baxmalı,
Qızıl gülü al yanağa taxmalı,
Sarı gülü dəstə tutub qoxmalı,
Ağ gül, qırmızı gül, bir də sarı gül.

Ağ gülü bənzətdim göy göyərçinə,
Şəkər əzib dəhanının içinə,
Hüseyn müştaq olub gülün üçünə,
Ağ gül, qırmızı gül, bir də sarı gül.

***

Yari-vəfadarım, gəl halallaşaq,
Hökm gəlib Naxçıvana mən gedim.

Bir uzax səfərdi, gedən qayıtmaz,
Dolubdu peymanam cana, mən gedim.

Yar olan yar ilə gəzər vəfadar,
Dost, düşmən içində etmə məni xar,
Fikir çəkib olma məndən intizar,
Qaranlıxdı, ol dumana mən gedim.

İş qatma sən Aşıq Söynün işinə,
Hərcayı söz haçan gələr guşuna,
Naxçıvanda Ağkeşişin qızına,
Gədəlik eyliyim xana, mən gedim.

***

Başına döndüyüm toy adamları,
Siz də deyin, təzə gəlin oynasın.
Adını demirəm, eldən ayıbdı,
Qəmzəsi bağrımı dələn oynasın.

Bir tuba boyludu, zülfləri dəstə,
Dərdini çəkməkdən olmuşam xəstə,
İşarət eylərəm anlayan kəsdə,
Dostunun qədrini bilən oynasın.

Duman gəldi, uca dağı bürüdü,
Yar qəhri çəkməkdən canım çürüdü,
Bu məclisdə əyləşənin biridi,
Yaşmağın altından gülən oynasın.

Dostlar arasında hey ola düzlük,
Olmaya xayınlıq, həm ikiüzlük,
Hər əlində vardı, bir ala yüzlük,
Yüzlüyü əlinə alan oynasın.

Şəmkirli Söyünəm, elərəm fəğan,
Yaş yerinə didələrim tökər qan,
Həm gəlindi, həm gözəldi, həm cavan,
Məni bu dərdlərə salan oynasın.

## MÜXƏMMƏS

Lotuyam, bambılıyam, talibi-bəngəm, sənə nə?
Çox gülüb, çox danışan, çox da cəfəngəm, sənə nə?
Ataram düşmən üçün topu tüfəngəm, sənə nə?
Dərdü qəm barkeşiyəm, köhnə peşəngəm, sənə nə?

Şairəm, söz deyərəm, hamıdan başam, geri dur!
Ağzımdan od tökülür, naram, ataşam, geri dur!

Bez, qədək müştərisi, alam, qumaşam, geri dur!
İstəsən tərpədəsən, tərpənməz daşam, geri dur!
Tərpənsəm ev yıxaram, bir ağır səngəm, sənə nə?

Get atlasın yaxşısından, yaşılından da al, gətir,
Mən özüm alıb satanam, mənə sən tirmə şal gətir,
Sərrafam, tez seçərəm, gövhər ilə ləl gətir,
Girmişəm meydanına, meydanıma kəl gətir,
Dəryalar boylamışam, mən bir nəhəngəm, sənə nə?

Dünyaya tək gəlmişəm, dal ibni-Dal kimi,
Aləmə adım düşüb, ol Rüstəmi-Zal kimi,
Sözdən qala yapmışam, qələyi-Səlsal kimi,
Əridib saf etmişəm, qumriyə misal kimi,
Oxumuşam min bir dili, çox da firəngəm, sənə nə?

Şəmkirli Aşıq Söyünəm, mən burada yer eylədim,
Urmu, Salmas, Marağa, İsfahanı zar eylədim,
Gəzdim Çəçən, Çərkəzi, nə qorxdum, nə ar eylədim,
Dəmir qapı Dərbənd, Quba, Gürcüstanı xar eylədim,
Tülküsən, geridə dur, şiri-pələngəm, sənə nə?

## AŞIQ ƏLƏSGƏRLƏ DEYİŞMƏ

Aşıq Ələsgər

Hərcayının, dilbilməzin ucundan,
Dönə-dönə mən ziyana düşmüşəm.
Doymaq olmaz gözəllərin buyundan,
Pərvanə tək yana-yana düşmüşəm.

Aşıq Hüseyn

Qırxlar piri özü verib dərsimi,
Şair cərgəsində sana düşmüşəm.
Arif məclisində, alim yanında,
Neçə dəfə imtahana düşmüşəm.

Aşıq Ələsgər

Dövlətim çox oldu, qıymadım pula,
Kor oldu gözlərim, yapışdım dula,
Nə ölür, nə itir canım qurtula,
Məcnun təki biyabana düşmüşəm.

Aşıq Hüseyn

Bir zaman əlimdə zil, bəm saz oldu,
Gözəllər mənimlə üzbəüz oldu,
Suyum artıq gəldi, tozhatoz oldu,
İndi də yumşalıb una düşmüşəm.

Aşıq Ələsgər

Ələsgər keçibdi namus, arından,
Aləm yata bilməz ahu-zarımdan,
Boşasam, qorxuram oğlanlarımdan,
Boşaya bilmərəm, qana düşmüşəm.

Aşıq Hüseyn

Özüm aşıq olub gəzirəm eldə,
Qaldı həsrət gözüm əbrişim teldə,
Ələsgər danışam təşbih timsalda,
Hüseyn deyər: yaman dona düşmüşəm.

## MİRHƏMZƏ SEYYİD NİGARİ
(1815 — 1885)

*Şeyx Mirhəmzə Qarabağ mahalının Zəngəzur qəzasının Çəcimli kəndində anadan olmuşdur. Mükəmməl təhsil görmüş, uzun müddət Türkiyədə yaşamışdır. Azəri türkcəsində və fars dilində divanları var. Gəncliyində Nigar adlı bir qıza aşiq olduğundan Nigari təxəllüsünü götürmüşdür.*

### QARABAĞ

Nə əcəb dövlət imiş seyri-şikari Qarabağ
Nə gözəl nemət imiş söhbəti-yari-Qarabağ
Rəşk müşkü ənbər imiş buyi-qubari Qarabağ
Abi-heyvan imiş ənhərü bunari Qarabağ
Kövsəri-təbi imiş çayi-çinari Qarabağ
Aləmi-cənnət imiş dəri-diyari Qarabağ
İndi bildim nə imiş vəsfi-həzari Qarabağ
Yeridir kim, çəkərəm ahi və zari Qarabağ
Dağlayıbdır məni bir laləüzari - Qarabağ
Yandırıbdır məni bir nari-Nigari Qarabağ.

Gəlin, ey əhli-gönül, artıb azarım, eşidin,
Yox rəvacım, kəsilib biinəzarım, eşidin,
Pozulub rövnəqi-gülzari-baharım, eşidin,
Qalmayıbdır tükənib leyli-naharım, eşidin,
Cəm olun bir yerə azari-həzarım, eşidin,
İrişib vaxtı, qazın dari-məzarım, eşidin,
Alışıb suziş ilə mayeyi-varım, eşidin,
Yaxılıb səbr, yanıb nay-qərarım, eşidin,
Dağılın kim, tutuşub nar mənarım, eşidin,
Yeridir ərşə çıxarsa ahu-zarım, eşidin,
Dağlayıbdır məni bir laləüzari-Qarabağ
Yandırıbdır məni bir nari-Nigari Qarabağ.

Daru mehr üzrə gərək qəsdi-şirin can edəyim,
Dili-sərdarə çəkib şövqilə qurban edəyim,
Ciyəri paraləyib bağrı qızıl qan edəyim,
Dəmbədəm əşk töküb xuni-diləfşan edəyim,
Canı atəşgədiyü eşqidə suzan edəyim,
Yandırıb xaneyi-variyyəti viran edəyim,
Gecələr ta bə səhər dəmbədəm əfqan edəyim,
Güli-məqsud açıla dərdimə dərman edəyim,
Ey Nigari, nə qədər sirrimi pünhan edəyim,
Yandı canım onu bu nəzmlə şayan edəyim,
Dağlayıbdır məni bir laləüzari - Qarabağ
Yandırıbdır məni bir nari-Nigari Qarabağ.

## QƏZƏLLƏR

Ey xoş ol günlər çıxıb ərzi-cəmal eylərdi yar,
Tərlədib ruxsarı al eylərdi, al eylərdi yar.

Ah ol dəmlər, nə dəmlər kim qəzəlgu hər yana,
Kakiləfşan, mufişan rəmli-qəzal eylərdi yar.

Heyrətim zur eylədikcə vəhşigahi-eşqdə,
Ünsiyyət eylərdi könlüm, guşmal eylərdi yar.

Vəh, nə aləmdir məhəbbət aləmi kim bir məqal,
Nim təbəssüm, nim nigəh, halım sual eylərdi yar.

Badeyi-dildarlıqla aşiqi məst eyləyib,
Başqa halət göstərərdi, başqa hal eylərdi yar.

Ey xoş ol saət, nə saət, ey xoş ol halət nə hal,
Dilbərانə göftgu, Şirin məqal eylərdi yar.

Noldu, ey Miri Nigari, ol zaman kim biqərəz,
Eylədikcə min niyazü ərzi-hal eylərdi yar.

***

Anlagil eşq nədir, dinlə, nə mənadır bu!
Badeyi-lütfi-xuda, bəxşişi-mövladır bu!

İçəlim şamü səhər içrə və lakin bicam,
Camə hacətmi olur, badeyi-mənadır bu!

Hərfsiz aşiqi-şeydalərə təlim eylə,
Dərsi-əsrarı nə xoş, dərsi-dilaradır bu!

Məxfidir, eşq xəfiyyatı hüveyda eylər,
Söylərəm böylə, vəli, gör nə müəmmadır bu!

Söyləyin aləmi-əşardə şirin-şirin,
Madehi-eşqi-xuda, təbi-şəkərxadır bu!

Qasid, ey Mir Nigari, görünür xəndəzənan,
Var bir xeyr xəbər aləmə büşradır bu!

***

Eşq zor eyləsə, ey dil sana, məğlub olsan,
Söyləmə batiləm əsla, de ki, həqqəm, həqqəm.

Bu həqiqət yoludur, bunda bulunmaz batil,
Batiləm söyləmə məhza, de ki, həqqəm, həqqəm.

Söyləmə batiləm əsla, sana xamuşluğun
Xeyrdir, söyləsən əmma, de ki, həqqəm, həqqəm.

***

Dərdü möhnətin, ey sənəm, sənəm,
Eşq ilə çəkən, bir mənəm, mənəm.
Arü-varini rahi-mehrdə,
Tarümar edən bir mənəm, mənəm.

Çəkmişəm cəfa, eylə bir vəfa,
Sən də ələta can sənə fəda,
Rahi-mehrdə zari-binəva
Tarükül vətən bir mənəm, mənəm.

Yari nazənin, hüsnü-biqərin,
Şahrahdə intizarkeş,
Qəm çəkib həmin eyləyən bina
Xaneyi-həzin bir mənəm, mənəm.

Eyləgil xitab, verməgil əzab,
Üzdən al niqab, eyləgil səvab,
Təxmi-mehrini rəşki - afitab
Sinəyə əkən bir mənəm, mənəm.

Cismi - pürhəva, könlü pürnəva,
Badeyinişin, fərdi-biqəva,

Kəndi-kəndinə köftgu edib
Ağlayan, gülən, bir mənəm, mənəm.

Dəstü pafişan, cəngü tarsız,
Ahü naləzən, gülüzarısız,
Məsti-sərmədi, nəngü arsız,
Rindeyi-köhən bir mənəm, mənəm.

Eylədim dilə, eylə bir səda,
Qopdu Bisütun, oldu kim həma,
Dedi, rəhnüma, afərin mana,
Boylə kuhkən, bir mənəm, mənəm.

Ərşə vəlvələ, fərşə zəlzələ,
Saldı seyheyi-nayi-şöhrətim,
Babi - eşqdə indi sübhü şam,
Kusü təblzən bir mənəm, mənəm.

Eylədim nida, vermədi səda,
Kimsə gəlmədi, qaçdı Əhriman,
Kar-zarda şirü divgir,
Mərdi - filfikən bir mənəm, mənəm.

Ey sitəmzədə, nəfsə mübtəla,
Gəl əmanıma eylə iltica,
Dari-əmandır ziri-damənim,
Dafeül fitən bir mənəm, mənəm.

Ləfzi-canfəza, təbi - xoşəda,
Nəzmi - dilrüba, hərfi-dürnüma,
Sözü kimiya, simu-zər, gövhər
Dəmbədəm tökən bir mənəm, mənəm.

Qövlibibədəl, ləhcəsi gözəl,
Rindeyi-əzəl, nazənin qəzəl,
Söyləməz həzəl, xub göftgu
Söhbəti Həsən bir mənəm, mənəm.

Ləmeyi hüzur, eylədi zühur,
Ey Nigari, yar aldı üqdəni,
İndi xoşzəbən Turi-mehrdə
Kəlimi süxən bir mənəm, mənəm.

***

Əlhəmdülillah, fikrimdir Allah,
Fikrimdir Allah, əlhəmdülillah.

Könlümdə, dildari dilxah,
Dilxari dilxah könlümdə, vallah.

Zikrimdir Allah hər bir məhəldə,
Hər bir məhəldə zikrimdir Allah.

Tövbəti lillah əcəb riyadən,
Əcəb riyadən tövbətü-lillah.

Əstəğfirullah birahlıqdan,
Birahlıqdan əstəğfirullah.

Keçməzəm bəzmi səmadən,
Bəzmi səmadən keçməzəm, billah.

Virdimdir Allah, Seyyid Nigari,
Seyyid Nigari, virdimdir Allah.

## TAHİRƏ QÜRRƏTÜLEYN
(1819 — 1851)

*Əzizə xanım Cəfərzadənin verdiyi məlumata görə Tahirə (pak, təmiz) Qürrətüleynin (Göz bəbəyi) əsl adı bəzi mənbələrə görə Zərrintac, bəzilərinə görə Fatimə olmuşdur. Güney Azərbaycanın Qəzvin şəhərində doğulmuş, Mirzə Məhəmmədəli Babın başçılıq etdiyi babilər hərəkatına qoşulmuş, 1851-ci ildə İran şahənşahı Nəsrəddin Qacar hökuməti tərəfindən edam edilmişdir. Qadın azadlığının carçılarından olan Tahirə Qürrətüleynin şəxsiyyətini Mirzə Kazım bəy və Mirzə Fətəli Axundzadə kimi mütəfəkkirlər yüksək qiymətləndirmişlər. Doğma Azəri türkcəsini mükəmməl bilsə də, şairə əsərlərini fars dilində yazmışdır. Tahirə Qürrətüleynin bir şerini Hidayətin tərcüməsində antologiyamıza daxil edirik.*

Əgər üzbəüz dayanıb nəzər salsam mən çöhrənə,
Oxuyaram hər qəmini, şərh edərəm səni sənə.

Fərağınla gözlərimdə ürəyimin qızıl qanı
Dəclə kimi, cülgə-cülgə, çeşmə-çeşmə, yenə, yenə...

Toxunubdur məhəbbətin ürəyimin qumaşına,
Damar-damar, arğaş-arğaş bağlayıbdır səni mənə.

Sənin üzünü görməkçün yenə dönüb axtarıram,
Küçə-küçə, qapı-qapı... Yetişirəm məhəllənə.

Vərəq-vərəq, pərdə-pərdə gəzdin Tahirənin qəlbini,
Səndən özgə girə bilməz heç kəs onun ürəyinə.

## MİRZƏ MƏHƏMMƏDTAĞI QUMRİ
(1819 — 1891)

### HANI

Ey dil, oyan, göz aç, keçib ömri-cəvan hanı?
Bel bağlama cəhanə, vəfayi-cəhan hanı?
Hər qərinə dolar, boşalar, karivan keçər,
Bu karvansərayə gələn karivan hanı?
Beş gün qalıb tamam dili-azürdə getdilər,
Bir baxgilən o qafilədən bir nişan hanı?
Çox gülşəni xərab elədi ruzigardə,
Bülbül hanı, o güllər hanı, gülüstan hanı?
Çox sərv baş çəkib fələkə baği-ömrdə,
Ol baği-ömr noldu, o sərvi-rəvan hanı?
Çox nazəninləri fələk ağuşə yar edib,
Torpaq içində onları yadə salan hanı?
Hiç qoymayıbdı bir daşı daş üstə bu fələk,
Viran olmayan de görüm xaniman hanı?
Çox evləri dağıtdı bu dövrani-ruzigar,
Ali bəa kimi qapısı bağlanan hanı?
Çox toyları cəhani-fələk yasə döndərib,
Qasım tək əllərinə yaxan həna qan hanı?
Çox no ərusi çərx eləyibdi qara duvaq,
Əmma dimağı qan ilə əlvan olan hanı?
Damadlər zəmanədə çox namurad olub,
Əzası xəncər ilə susuz doğranan hanı?
Damadi-Kərbəla tək əli dəyməyib ələ,
Çöllərdə üç gecə nəşi üryan qalan hanı?
Ali Əli müsibətini nəzmə çəkməyə
Hiç zinəfəsdə taqəti-şərhi-bəyan hanı?
Ta həşr olunca hər eşidən naləsin deyər,
Bəzmi-əzada Qumriyi-şirin zəban hanı?

### MƏRSİYƏ

Mahi-məhərrəm oldu yenə göylər ağladı,
Düşdü cahanə qülqülə aləmlər ağladı.

Gəldi məhi-müsibətü əyyami-təziyə,
Bu matəməzayə görün kimlər ağladı.

Şahi-rüsül, əmiri-ərəb, xətmi-ənbiya,
Əmmaməsin alıb ələ peyğəmbər ağladı.

Döndü xəzanə gülşəni Zəhrayi-əthərin,
Dəşti-Nəcəfdə sərvəri-din Heydər ağladı.

Qətli-Hüseynə eylədi iqdam Şümri-dun,
Amma əlində rəhmə gəlib xəncər ağladı.

Başın alıb diz üstə kəfənsiz verəndə can,
Xeyrənnisə başında qara möcər ağladı.

Ğəli-cəfa ilə qolu bağlandı Zeynəbin,
Gördü bu halı şurə gəlib ləşkər ağladı.

Çəkdi Səkinə ahi-cigər suzi-sinədən,
Meydan içində nəşi-Əli Əkbər ağladı.

Oldu ərus ləşkəri-küffarə dəstgir,
Torpaqlar üstə Qasimi-gülpeykər ağladı.

Gülsum olanda zillətilə nəqayə süvar,
Əbbasi-namdar vəfapərvər ağladı.

Qumri, bu qisseyi-aləməfzanı qıl tamam,
Əldə qələm şərarə tutub, dəftər ağladı.

## QƏZƏLLƏR

Bu sevdadən keç, ey qafil, dəxi ömri-cavan keçdi,
Şəbab əyyami getdi, zövqü sövdayi-cahan keçdi.

Sərayi-ariyətdə hər gələn beş gün qalır mehman,
Rəfiqü aşina getdi, təmamən həmzəban keçdi.

Bilir bir gün deyər qədrin bilənlər, heyf dünyadə,
Qoyub nəzmi-dürəfşan Qümriyi-şirinzəban keçdi.

***

Eşitcək bu sözü təbim həzarı dilkəbab oldu,
Açıb dürci-dəhanın əql ilən hazırcavab oldu:

Məgər divanədir üşşaq eşqi-yardən keçsin,
Həvayi-vəslü sövdayi-rüxi-dildardan keçsin?

Rəvadır təşneyi-məhəbbət meydən əl çəksin!
Qoyub zövqü səfanı badeyi-gülnardan keçsin?!

Olanda fəsli-gül, tər qönçənin arayiş əyyamı,
Qoyarmı eşq şeyda bülbülü gülzardan keçsin?

Keçər nazü nəimi-cavidandan aşiqi-sadiq,
Və lakin müşkül işdir ləzzəti-didardən keçsin.

Olar keçmək Bədəxşan ləlinin alafi-əlfindən,
Çətindir aşiqə ləli-ləbi-dildardan keçsin.
Olub Qumridən ötrü rişteyi-can geysuyi-canan,
Məgər candan keçib, ol türreyi-tərrardən keçsin?!

## HACI RZA SƏRRAF TƏBRİZİ

(? — 1907)

### İMAM HÜSEYNİN DİLİNDƏN HƏZRƏT ZEYNƏBƏ SÖYLƏNMİŞ NÖVHƏ

Bu çöldə, bacı, möhnəti-hicran sənin olsun,
Ağlar göz ilə zülfi-pərişan sənin olsun.
Əhd eyləmişəm burda gərək təşnə verəm can,
Başsız bədənim isti qum üstə qala üryan,
Mənlə yata bu çöldə gərək yetmiş iki can
Şam içrə, bacı, mənzili-viran sənin olsun.

Bu dəşti-bəla olmuş əcəb bəzmi-mürəttəb,
Qəm camın ediblər meyi-möhnətlə ləbaləb,
Təqsim olunur ali-peyğəmbər, bacı, Zeynəb,
Abbas mənim, abidi-nalan sənin olsun.

Tərk eylər ədu hörmətü Quranü kitabi,
Yəğməyə gedər Fatimənin taqətü tabi,
Mən Əsğəri ağuşə alım, sən də Rübabi,
Bu şərtlə peykan mənim, əfqan sənin olsun.

Bu çöldə batar kakili-Əkbər, bacı, qanə,
Tiri-qəmə Leylanın olur cismi nişanə,
Mən ölməmişəm, gəlməgilən ahü fəqanə
Məndən sonra bu naləvü əfqan sənin olsun.

Görsən başımı Əkbər ilə nizədə həmsər,
Vur başına, gəl naləyə, salma yerə məcər,
Olmuş, bacı can, ruzi-əzəl boylə müqərrər
Bu dəşt mənim, kuhi biyaban sənin olsun.

Hər zülmü sitəm gəlsə, bacı, olma pərişan,
Peymaneyi-qəm nuş elə ta sınmaya peyman,
Cəm et başıva silsileyi-Ali Rəsuli,

Sərsilsilə qıl Abidi-bimarü məluli,
Kül üstə qoy, bacı, kəsik başımı xuli,
Tənnur mənim, sineyi-suzan sənin olsun.

Sərrafə riza lazımədir gövhəri mənə,
Nə qişr, nə tərkib, nə surət, nə həyulə,
Təhsili kəmalət eləyib qabili-inşa,
Ta ruzi-cəza rövzeyi-rizvan sənin olsun.

## HƏZRƏT ZEYNƏBİN DİLİNDƏN SÖYLƏNMİŞ NÖVHƏ

Bu diyari-Kərbəla, bu sən, xudahafiz, Hüseyn.
Karivan yolandı Şamə, mən xüdahafiz, Hüseyn.
Dəstgirəm, acizəm, zənciri-zülmə bağlıyam,
Yeddi qardaşım ölüb, qardaş, ürəkdən dağlıyam,
Mümkün olmur səs çəkəm, bircə doyunca ağlıyam,
Dövrəmi axır alıb düşmən, xüdahafiz, Hüseyn.

Gülşəni-cismində xəncər yarəsi gül-gül açıb,
Oh, o gül yarələr üstündə xoş sümbül açıb,
Şərhi-hal etməkliyə hər yarə yüz min dil açıb
Olmusan sər ta bepa gülşən, xüdahafiz, Hüseyn.
Zeynəbin ölsün Hüseyn, gər bircə sənsiz Zeynəbə
Pasibandır Şümri-zilcövşən, xudahafiz, Hüseyn.

Bax bu Sərrafın, Rza, gözdən axan göz yaşinə,
İbrət eylə sən də, göz yaşın burax özbaşinə.
Dəmbədəm Zeynəb dilincə ərz qıl qardaşına,
Bu diyari-Kərbəla, bu sən, xudahafiz, Hüseyn.

## AŞURA GECƏSİ NÖVHƏSİ

Güli-gülzari-rəsalət bu gecə,
Şümrdən istədi möhlət bu gecə.
Bir doyunca baxa Əkbər üzünə,
Eyləyə ayə təlavət bu gecə.
Zeynəbin qəlbini aram eləyib,
Ola məşğuli ibadət bu gecə.
Yatmayıb ali-Əli sübhə kimi,
Şiə yatsın necə rahət bu gecə?
Bağlanıb su öylə, ləb təşnə qalıb
İtrəti-şahi-vilayət bu gecə.

## AŞIQ ƏLƏSGƏR
(1821 — 1926)



*Aşıq Ələsgər Azərbaycan el şerinin son ən böyük nümayəndələrindən və bu şerin ən uca zirvələrini fəth edən sənətkarlardandır. Aşıq poeziyasını bol həyati müşahidələrlə zənginləşdirmiş, həm məzmun, həm forma rəngarəngliyi, həm də saf, duru xalq dilindən istifadə baxımından Aşıq Ələsgər Azərbaycan, ümumən türk şerinə misilsiz xidmətlər göstərmişdir. Aşıq Ələsgər qədim Oğuz torpağında, indi Ermənistan adlanan ölkənin Göyçə mahalında dünyaya gəlmiş, orda yaşayıb yaratmış, orda da dəfn olunmuşdur.*

### QOŞMALAR

Çərşənbə günündə, çeşmə başında,
Gözüm bir alagöz xanıma düşdü,
Atdı müjgan oxun, keçdi sinəmdən,
Nazi-qəmzələri qanıma düşdü.

İşarət eylədim dərdimi bildi,
Gördüm həm gözəldi, həm əhli-dildi,
Başını buladı, gözündən güldü,
Gülləndə qadası canıma düşdü.

Ələsgərəm, hər elmdən halıyam,
"Gözəl, sən dərdlisən, mən yaralıyam".
Dedi: "Nişanlıyam, özgə malıyam".
Sındı qol-qanadım yanıma düşdü.

***

İstər dara çəkdir, istər qul eylə,
Qoymuşam əmrinə qol, incimərəm.
Həsrətindən Məcnun oldum səhrada,
Can alansan, canım al, incimərəm.

Həsrətindən saralıban solanam,
İzn versən, yar, başına dolanam,
Əlli yol çapılam, yüz yol talanam -
Bir şey deyil dövlət, mal, incimərəm.

Ələsgərəm, yandım eşq atəşində,
Gözüm qaldı sənin qələm qaşında,
Qazdır məzarımı çeşmə başında,
Sal sinəm üstündən yol, incimərəm.

***

Bivəfanın müxənnəsin, nakəsin,
Doğru sözün, düz ilqarın görmədim.
Namərdin dünyada çox çəkdim bəhsin,
Namusun, qeyrətin, arın görmədim.

Namərdi özümə mən dost elədim,
Yolunda canıma çox qəsd elədim.
Söyüddən bağ saldım, peyvəst elədim,
Almasın, heyvasın, narın görmədim.

Nəfs aldatdı, hər yetənə xan dedim,
Bihudə kollara gülüstan dedim.
Əbəs yerə beyvəfaya can dedim,
Zəhmətin çox çəkdim, karın görmədim.

Ələsgər, elmində olma nabələd,
Doğru söylə sözün çıxmasın qələt.
Şahiddə insaf yox, bəydə ədalət,
Qızların düz ilqarın görmədim.

***

Arif olan, gəlin sizə söyləyim,
İgid sözü mərd-mərdanə yaxşıdır.
İgid gərək dediyindən dönməsin,
Biilqardan bir zənana yaxşıdı.

Qəlbi düz olanın evi hac olu,
Qonşuya kəc baxan özü ac olu,
İki arvadlılıq mardan acı olu,
Bez geydirsən bir canana yaxşıdı.

Ələsgər dostunnan badə içəndə,
Gəşt eyləyib mərd-namərdi seçəndə,
Güzaran xoş olub, gün xoş keçəndə,
Bir sən, bir yar, bir də xana yaxşıdı.

***

Bu dünyada üç şey başa bəladı,
Yaman oğul, yaman arvad, yaman at.
İstəyirsən qurtarasan əlindən,
Birin boşla, birin boşa, birin sat!

Ov keçdi bərədən ata bilməzsən,
Uçdu getdi əldən, tuta bilməzsən,
Yerisən, yüyürsən çata bilməzsən,
Görürsən ki, baxtın yatdı, sən də yat!

Qılma Ələsgəri məhrumi-didar,
Tərəhhüm et mana bir busə, ey yar!
Üç hərflə ismin elədim aşkar,
Biri "kaf"dı, biri "lam"dı, biri "sat".

***

Bahar fəsli, yaz ayları gələndə,
Süsənli, sünbüllü, laləli dağlar.
Yoxsulu, ərbabı, şahı, gədanı,
Tutmaz bir-birindən aralı dağlar.

Xəstə üçün təpəsində qar olur,
Hər cür çiçək açır, taləzar olur,
Çeşməsindən abi-həyat car olur,
Dağıdır möhnəti, məlalı dağlar.

Yazın bir ayıdı çox yaxşı çağın,
Kəsilməz çeşmədən gözəl yığnağın.
Axtarma motalın, yağın, qaymağın,
Zənbur çiçəyindən bal alı, dağlar!

Yayın əvvəlində dönürsən xana,
Son ayda bənzərsən yetkin bostana.
Payızın zəhməri qoyur virana,
Dağıdır üstündən cəlalı, dağlar!

Gahdan çiskin tökər, gah duman eylər,
Gah gəlib gedəni peşiman eylər,
Gahdan qeyzə gələr, nahaq qan eylər,
Dinşəməz haramı, halalı dağlar.

Ağ xalat bürünər, zərnişan geyməz,
Heç kəsi dindirib keyfinə dəyməz,
Sərdara söz deməz, şaha baş əyməz,
Qüdrətdən səngərli, qalalı dağlar.

Keçər ellər, düşər səndən aralı,
Firqətindən gül, nərgizin saralı.
Ələsgər Məcnuntək yardan yaralı,
Gəzər səndə dərdli, nalalı, dağlar!..

***

Axşam, sabah, çeşmə, sənin başın da
Bilirsənmi necə canlar dolanır?..
Billur buxaq, alma yanaq, ay qabaq,
Şahmar zülfü pərişanlar dolanır.

Afərin xudanın haqqı-sayına,
Camalları bənzər bayram ayına.
Belə gözəllərin xaki-payına
Mənim kimi çox qurbanlar dolanır.

Gördüm gözəlliyin bizə bildirir,
Qaş oynadıb, xəstə könlüm güldürür.
İşvəyi-naz ilə adam öldürür,
Qəmzəsində nahaq qanlar dolanır.

Məni qoca gördü, ürbəndin aşdı,
Ala gözlərinə gözüm sataşdı.
Huş başımdan getdi, xəyalım çaşdı,
Mürği-ruhum asimanlar dolanır.

Adım Ələsgərdi, Göyçə — mahalım,
Dolanım başına, qadanı alım!
Hüsnün şöləsinə xəstə xəyalım
Pərvanədi, şəmistanlar dolanır.

***

Cilvələnib nə qarşımda durubsan,
Anam sana qurban, ay sarı köynək!
Mələksən, çıxıbsan cənnət bağından,
Heç kəs olmaz sana tay, sarı köynək!

Doymaq olmur işvəsindən, nazından,
Fərə kəklik kimi xoş avazından.
Yel vurdu ürbəndi atdı üzündən,
Elə bildim doğub ay, sarı köynək!

Gözəlsən, tərifin düşüb mahala,
Zər kəmər yaraşır qaməti-dala.
Ləb qonça, diş inci, yanaqlar lala,
Çəkilib qaşların yay, sarı köynək.

Gərdənə yaraşır qızıl hamayıl,
Görənin ağlını edibdi zayıl.
Həsrətin çəkənlər olubdu sayıl,
Yığır qapılardan pay, sarı köynək!

Tuti dilli, sərv boylu Salatın!
Budu mərhəmətin, bu səltənətin.
Göndər gəlsin Ələsgərin xələtin,
Eyləmə əməyin zay, sarı köynək!..

***

Ala gözlüm, səndən ayrı düşəli,
Hicranın qəmiylə kef eyləmişəm.
Günüm ahnan, vaynan keçib dünyada,
Dərd alıb, qəm satıb, nəf eyləmişəm.

Səndən ayrı danışmıram, gülmürəm,
Canımdan bezmişəm, ölə bilmirəm.
Nə müddətdi qulluğuna gəlmirəm,
Bağışla taxsırım, səhv eyləmişəm.

Həsrət qoyma gözü gözə, amandı!
Yandı bağrım, döndü közə, amandı!
Keçən sözü çəkmə üzə, amandı!
Hədyan danışmışam, laf eyləmişəm.

Nə insafdı gülə həmdəm xar ola,
Tülək tərlan oylağında sar ola,
Ələsgər istəyir bir bazar ola,
Seçmişəm gövhəri, saf eyləmişəm.

***

Könlüm qaranquş tək uçub qoynuna,
Gəzir hər yamacı, hər yalı, yaylaq!
Ruhum təzələnir, məst olur ürək,
Görəndə bu çağı, bu halı yaylaq!

Kəkotu, qırxbuğum, qaymaqçiçəyi,
Bənövşə, qantəpər, qızlar örpəyi.
Qoyun mələşməsi, çoban tütəyi,
Çəkir uzaqlara xəyalı, yaylaq!

Qırxqız, Alaqaya, Çilgöz, Narışdar,
Murov, Uzunyoxuş, Dəlidağ, Qoşqar!
Hansı oğul, deyin, sizi unudar?
Düşərmi el sizdən aralı, yaylaq?!

Çıxartsın köynəkdən Ələsgər sazı,
Genə coşa gəlsin eşqi, avazı.
Təriflәsin bu al-yaşıllı yazı,
Unutma bu böyük kamalı, yaylaq!

***

Kamil ovçu ölməyincə usanmaz,
Əldən qoymaz belə sərxoş maralı.
Eşq oduna yanan aşkara yanmaz,
Pünhan-pünhan mənim kimi saralı.

Yolunda keçmişəm şirin canımdan,
Öldürsələr, qorxum yoxdu qanımdan.
Tərk oldum vətəndən, xanımanımdan,
İnsaf deyil, gəzmə məndən aralı.

Aşıq Ələsgərəm, söylənir adım,
Budu ürəyimdə mətləb, muradım:
Sənin ərin ölsün, mənim arvadım,
Gəzək hər ikimiz yaslı-yaralı.

***

Dad sənin əlindən, a qanlı fələk!..
Könül həsrət qaldı yara dəyməmiş.
Köhnə yaram qövr elədi təzədən,
Təbib neştər vurdu, yara dəyməmiş!..

Gözüm qaldı əlif-beydə, yasində,
Yaradanım, özün yetiş ya sində,
Qaldım səməndər tək qəm dəryasında,
Yandı balü pərim nara dəyməmiş.

Ələsgər, üsyanın çıxıbdı sandan,
Öldürsən zənburu əl çəkməz şandan.
Hərcayıdan, müxənnəsdən, nadandan,
Nə söz qaldı sənətkara dəyməmiş.

## QOŞAYARPAQ QOŞMA

Sevdiciyim, hanı gözəllər xanı?
Güzarımız sizin otağa düşdü.
Buyursan fərmanı, alarlar canı,
Püşk atdıq, can sana sadağa düşdü.

Sallan, qələm qaşlı, yanı yoldaşlı,
Qalmışam ataşlı, mən başı daşlı;
Huş başımdan çaşdı, dilim dolaşdı,
Gözlərim sataşdı, buxağa düşdü.

Ətlasdan qabalı, belində şalı,
Göhərdən bahalı, üzündə xalı,
Geydi yaşıl-alı, yaxdı mahalı,
Əyri tellər ayna qabağa düşdü.

Yeriyirdi sana, yaşılbaş sona,
Yaraşır canana ağ nazik cuna;
Tellərində şana, əlində xına,
Yəmən, yaqut, əhmər dodağa düşdü.

Çox çəkmişəm cəfa, gəl bir insafa,
And olsun müshafa, olmam bivəfa,
Gəlmişəm təvafa, verəsən şəfa,
Ələsgər xəstədi, ocağa düşdü.

## GƏRAYLILAR

Ala gözlü, nazlı dilbər,
Elindən xəbərin varmı?
Dörd yanındır bağça, söyüd,
Gülündən xəbərin varmı?

O zaman ki, gəldim sizə,
Mayil oldum ala gözə.
Zibilin çıxıbdı dizə,
Külündən xəbərin varmı?

O vədə ki, gəlin oldun,
Qabırğası qalın oldun.
Qaynanaya zalım oldun,
Dilindən xəbərin varmı?

Daha düşübsən hənəkdən,
Suyun qurtarıb sənəkdən.
Məmən çıxıbdı köynəkdən,
Tulundan xəbərin varmı?

Ələsgəmən eylər dava,
Ariflər baxsın hesava.
Cehizindi dəlik tava,
Malından xəbərin varmı?

***

Qədəm qoyub asta-asta
Sən bu diyara xoş gəldin!
Süzdürüb ala gözləri,
Qaşları qara, xoş gəldin!

Oğrun durub qıya baxdın,
Müjkanın sinəmə çaxdın.
Cismimi yandırıb yaxdın,
Salıban nara, xoş gəldin!

Qaynayıb, peymanam dolub,
Gül rəngim saralıb, solub.
Həsrətin çəkməkdən olub
Sinəm sədpara, xoş gəldin!

Dostun vəfasını gördüm,
Seçib sevdim, könül verdim.
Təzələndi köhnə dərdim,
Dərdimə çara, xoş gəldin!

Sinəmdi eşqin dəftəri,
Sənsən dilimin əzbəri.
Yazıq Aşıq Ələsgəri
Çəkməyə dara xoş gəldin!

***

Ay qız, sənin nə vədəndi
Kəsilib qısa tellərin?
Kəlağayı əlvan, qıyqacı
Üstündən basa tellərin.

Yanaqların güldü, solmaz,
Oxlasan, yaram sağalmaz.
Qaşın cəllad, gözün almaz,
Bağrımı kəsə tellərin.

Şəkər sözü, şirin dili,
Gümüş bilək, nazik əli,
Axşam, sabah səhər yeli
Dəyəndə əsə tellərin.

Vəsfinə sözlər yaraşır,
Qolların boynuma aşır.
Kəhlik kimi qaqqıldaşır,
Gəlibdi səsə tellərin.

Bağban ağlar bar ucundan,
Alma, heyva, nar ucundan,
Ələsgər tək yar ucundan
Batıbdı yasa tellərin.

***

Pəncərədən qəfil baxdım,
Qarşıdan bir sona keçdi.
Bir ox atdı, qaş oynatdı,
Müjganları qana keçdi.

Ala gözlərini gördüm,
Təzələndi köhnə dərdim.
Yolunda can qurban verdim,
Baxmadı qurbana, keçdi.

Sərv boylu mələkzada,
Camalından içdim bada.
Ələsgəri saldı oda,
Qoydu yana-yana, keçdi.

## TƏCNİS

Könül, sən ki, düşdün eşqin bəhrinə,
Narın çalxan, narın silkin, narın üz!
Dost səni bağına bağban eyləsə,
Almasın dər, gülün iylə, narın üz!

Tikdirmisən qəsr, eyvan, oda sən,
O sevdiyin, o nökərin, o da sən!
Qıya baxdın, məni saldın oda sən,
İnsaf elə, gəl könlümün narın üz!

Aşıq olan sözün deməz tərsinə,
Tər gəzən dünyada gedər tər sinə;
Tər sinəyə qismət olsun tər sinə,
Qoy söykənsin narın üzə narın üz!

Ürüsxət ver sözüm deyim Qaymağa,
Yuyar qəssal qəddim, bükər qayım ağa;
Ləzzət verər bal qatanda qaymağa,
Onlardan da şirin olar narın üz.

Gəl sınıq könlümü sarı, dur gedək!
Tərlansan, ovlatma sarı, dur gedək!
Ələsgərəm, bizə sarı dur gedək!
Bir dərdimi eyləyibsən, Narın, yüz!

## CIĞALI TƏCNİS

Arif olan, bir od düşüb canıma,
Əridib döndərir a yağa məni.
Yox aşıq, ayağa,
Yetiş dada, ay ağa!
İllər xəstəsi canım,
Yar gəldi, qalx ayağa!
Ağa olan qulun salmaz ayağa,
Pirim, özün salma ayağa məni!

Kamil ovçu ovun gərək sinayə,[1]
Oxu dərsin, əzəl başdan "sin" ayə.
Yox aşıq, sinayə,
Tər damlayan sinayə,
Xəstənin gözü düşmüş
Yetkin nar, tər sinayə.
Ömr azaldı, vədə yetdi Sinayə,[2]
Bir gün də bükərlər ay ağa məni.

Mənim yarım yaşıl geyib, inci, dür,
Gümüş kəmər incə beli incidir.
Yox aşıq, incidir,
İnci, mərcan, inci, dür.
Yaman övlad, bəd qonşu
Qohum, qardaş incidir.
Xəstə düşdüm, bu dərd məni incidir,
Tut dəstimdən, qaldır ayağa məni.

Ələsgərəm, dada gəldi, budu, yar,
Bayquların məskənidi bu diyar.
Yox aşıq, bu diyar,
Dərs oxuyan bu[3] duyar.
Canım sadağa verrəm,
Qəbuldusa, budu, yar!
Al xancalı bağrım başın, budu, yar.[4]
El içində salma ayağa məni!

---

[1] Sınaya.
[2] Sina.
[3] Ətir.
[4] Budur, yar!

## AYAQLI TƏCNİS

Götürüb sazımı, girrəm meydana,
Gəl eyləyək bəhs.
Əyər sən toxunsan, mən də toxunnam,
Şəriətdə halal — qisasa qisas,
Qoy ucalsın səs.

Bir xoş günü əvəz min ayə, billəm,
Çəkilib qamətin minayə, billəm,
Pirimdən dərs aldım, min ayə billəm,
Bir sözünə min söz deyim dəsbədəs.
Dur yerində pəs.

Ovsunçuyam, ovsun sallam hi mara,
Bənna isən, tərkin axtar, him ara.
Səmin diraz, ləhcən bənzər himara,
Aləmə bəllidir bu nitqü nəfəs.
Misali-hədəs.
Mən dərdliyəm, mən ağlaram, budağlar,[1]
Eşq ucundan sinəmdədi bu dağlar;
Bir tərlanam, oylağımdı bu dağlar,
Sənsən səgi-lağər, şikarın məkəs,
Hökmüm kəsakəs!..

Aşıq gərək bu meydanda bir qala,[2]
Eşq odunu bir ətəklə, bir qala!
Ələsgərdi Xeybər kimi bir qala,
Bacara bilməzsən, dur yerində pəs,
Danışma əbəs!

## DODAQDƏYMƏZ TƏCNİS

Qeyz eyləyər, çən çəkilər dağlara,
Qəhrindən selləri ay elər qıj-qıj.
Qarşı gəlsə həsrət çəkən yar yara,
Ağlı çaşar, qəlbi ay elər qıj-qıj.

Şin şəhər axtarar, şəcərə dəyər,
Şeytan şər eyləyər, şəc ara dəyər;
Daşar çaylar, qalxar şəcərə dəyər,
Hərlənər daşları, ay elər qıj-qıj.

[1] Bu da ağlar.
[2] Tək qala.

Aşıq çaşsa, dildə qara qarğalar,[1]
Dağlar sinəsində qara qar qalar;[2]
Gəştə çıxsa ərşə qara qarğalar,
Çalar qanadların, ay elər qıj-qıj.

Ələsgərin əli, yetsənə nara!..
Nə həsrət çək, nə ah elə, nə nara!
Nə insandı səngi salar nə ara,
Qaynadar dərya tək, ay elər qıj-qıj?!

## DİLDÖNMƏZ

Axı biya, biya, bigu,
Bigu, biqof, dağa bax-bax!..
Həyyü həqqü hakim sənsən,
Həyyə bax, bu bağa bax-bax!..

Gözüm sağı, səhər çağı
Geyək ağı, gəzək bağı;
Könül sevdi bu damağı,
Qaymağa, həm yağa bax-bax!..

Əziz ayə, müsəhhayə,
Salsın sayə, bu məvayə;
Səbəb sənsən bu sevdayə,
Böyük ağa, sağa bax-bax!..

[1] Aşıq çaşsa, dili qar-qar elər.
[2] Köhnə qar təzə qara qədər qalar.

# XIX ƏSRİN BİRİNCİ YARISI VƏ ORTALARINDA TÜRKİYƏ ƏDƏBİYYATI

## DADALOĞLU
(1785 — 1865?)

*Dadaloğlu Anadoluda Çuxurovada anadan olmuşdur. Toros dağlarında köçəri həyat sürən Əfşar boyuna mənsubdur. Əsl adı Vəlidir. Atası da Dadaloğlu adıyla tanınan Aşıq Musa adlı bir şair imiş. Dadaloğlunun mənsub olduğu Əfşar əşirəti Sivasa sürgün edilərkən üsyan baş vermiş və Dadaloğlunun bəzi şerlərində, özəlliklə məşhur "Bizimdir" rədifli şerində bu hadisələrə işarə edilir.*

### BİZİMDİR

Qalxdı köç eylədi Əfşar elləri,
Ağır-ağır gedən ellər bizimdir.
Ərəb atlar yaxın edər irağı,
Uca dağdan aşan yollar bizimdir.

Belimizdə qılıncımız kirmani,
Daşı dələr mizraqının dəmrəni,
Haqqımızda dövlət vermiş fərmanı,
Fərman padişahın, dağlar bizimdir.

Dadaloğlu yarın qovğa qurulur,
Ötər tüfəng, davlumbazlar vurulur,
Neçə qoç iyidlər yerə sərilir,
Ölən ölür, qalan sağlar bizimdir.

### SƏMAİ

Yenə gəldi yaz ayları,
Görəcəyəm indən bəri.

Yaz yağmuru sulu olur,
Coşar, çağlar indən bəri.

Ağaclar pürçünü açdı,
Quşlar qılavuzun seçdi,
Yolumuz qürbətə düşdü,
Qərib düşdüm indən bəri.

Ağaclar geydi donunu,
Quşlar artırdı ününü,
Qərib olan vətənini,
Anıb ağlar indən bəri.

Dadaloğlum der ki, mana,
Dərdim artar ondan yana.
Ötər bülbül yana-yana,
Gözüm çağlar indən bəri.

## TÜRKÜ

Bu yalan dünyaya gəldim, gələli,
Sevərəm Qır atı, bir də gözəli.
Dəyib on beşimə kəndim biləli,
Sevərəm Qır atı, bir də gözəli.

Atın beli qısa, boynu uzunu,
Quru surətlisi, alma gözünü,
Qızın iplik-iplik süd bəyazını,
Sevərəm Qır atı, bir də gözəli.

Atı quş tutmasın çıxdığı zaman,
Yalı qaval kimi yıxdığı zaman,
At dörd, qız on beşə yetdiyi zaman,
Sevərəm Qır atı, bir də gözəli.

Dadaloğlum hiylə yoxdur işimdə,
İyid olan iyid görər duşunda,
At dördündə, gözəl on beş yaşında,
Sevərəm Qır atı, bir də gözəli.

## GƏLİR

Yüri iyid, yürü, yoluna yürü,
Aqustosda ərir dağların qarı.
Qayət gözəl olsa iyidin yarı,
O iyid yanına nazınan gəlir.

Sənə derim, sənə, ey Xınalı daş,
Gözümdən axıtdın qanlar ilə yaş.
Göllərdə oynayan iki yaşılbaş,
Göllərin səfası qazınan gəlir.

Yürü iyid, yürü, yolundan qalma,
Hər üzə güləni dost olur sanma,
Ölümdən qorxub da sən geri qalma,
İyidin alnına yazılan gəlir.

Misis körpüsündə qolların bağlı,
Ayrılıq əlindən ciyərim dağlı,
Göysuya varınca Bayazidoğlu
Sənə gələn bəylər sözinən gəlir.

Dadaloğlum der ki, qolun bazılı,
Atım göy Qır atdır, yanım tazılı,
Gəlir qoyunları yanı quzulu,
Qarışmış sağmalı yüzinən gəlir.

## QOŞMA

Dostun baxçasından yad əl keçməsin,
Qurudur ha, nazlı dilbər, qurudur.
Sənin sevdan ürəyimdə yağ qoymaz,
Əridir ha, nazlı dilbər, əridir.

Yüksək olur ərəb atın altağı,
Eşsiz qalmaz qoç iyidin yatağı,
Qorxaram kötüyə dəyər ətəyi,
Geri dur ha, nazlı dilbər, geri dur.

Ərəb at üstündə olsa postumuz,
İqrarından döndümü ola dostumuz.
Bir gün qara torpaq örtər üstümüz,
Çürüdür ha, nazlı dilbər, çürüdür.

Der ki, Dadaloğlum mən nə yapayım,
Hanki din haq isə ona tapayım.
Əyil də bir al yanaqdan öpəyim,
Yeridir ha, nazlı dilbər, yeridir.

## ÇİÇƏK DAĞI

Alaydım da cürə sazım dizimə,
Sürmələr çəkəydim ala gözünə.
Cahan gözəl olsa - girməz gözümə,
Səndə gümanım qaldı, Çiçək dağı.

Bu qarşıki dağda yanar bir işıq,
Aldırmış sevdiyin, ağlar bir aşiq,
Bir ceyran baxışlı, zülfü dolaşıq,
Səndə gümanım qaldı, Çiçək dağı.

Dadaloğlu söylənməyir boradan,
Yıxılsın bu dağlar, qalxsın aradan.
Elbəylidən gəldim, qurtar, Yaradan,
Səndə gümanım qaldı, Çiçək dağı.

## İBRAHİM DƏRDLİ
(1772—1845)

### QOŞMA

Xaraba qul olduq bəzmi aləmdə
Abad olsaq da bir, olmasaq da bir.
Düşdük, çarə nədir, aləmdə dama
Azad olsaq da bir, olmasaq da bir.

Bir Şirin əlindən eşq meyin içdik
Haqq ilə batili fərq edib seçdik.
Valıq dağlarını gəldik də keçdik
Fərhad olsaqda bir, olmasaq da bir.

Ey Dərdli aləmdə biz şahi-diliz
Haqqdan, həqiqətdən agahı-diliz
Tarixi əsrara ervahı-diliz
İrşad olsaq da bir, olmasaq da bir.

### ŞEYTAN BUNUN NƏRƏSİNDƏ

Telli sazdır bunun adı,
Nə ayət bilər, nə qazi,
Bunu çalan anlar özü,
Şeytan bunun nərəsində?

Venedikdən gəlir teli,
Ərikdəndir bunun qolu,
Hey Allahın şaşqın qulu
Şeytan bunun nərəsində?

Abdəst alsan aldın deməz,
Namaz qılsan qıldın deməz,
Qazi kimi haram yeməz,
Şeytan bunun nərəsində?

İçindəmi, dışındamı?
Burqusunun başındamı?
Köksünün naxışındamı?
Şeytan bunun nərəsində?

Tut ağacından təknəsi,
Kirişdən bağlı pərdəsi,
Behey, insanın törəsi,
Şeytan bunun nərəsində?

Dərdli kimi sarıqsızdır,
Ayağı da çarıqsızdır,
Buynuzu yox, quyruqsuzdur,
Şeytan bunun nərəsində?

## MƏNİ

Ey saqi! Camından nədir bu əsrar?
Qıldı bir qətrəsi məstanə məni.
Şərabı ləlində nə keyfiyyət var?
Söylədir əfsanə, əfsanə məni.

Qaldır niqabını ey vəchi ənvər,
Zülmətə könlümüz olsun münəvvər.
Şərabi - ləlinin ləzzəti, dilbər
Gəzdirir meyxanə, meyxanə məni.

Aşiqin çox bəla gələr başına,
Təhəmmül gərəkdir düşman daşına,
Üzü alovuna, eşq atəşinə,
Yanmaqda seyr etsin pərvanə məni.

Baxmazlar Dərdliyə - alqındır deyə,
Həqiqət bəhrinə dalqındır - deyə,
Bir saçı Leylaya vurğundur - deyə,
Yazmışlar dəftərə divanə məni.

## AKİF PAŞA
(1787 — 1845)

Tifli nazəninim unutmam səni,
Aylar, illər deyil, keçsə də illər...
Taləkəm eylədi fəraqın məni,
Çıxarmı xatirdən o dadlı dillər?

Qıyılamaz ikən öpməyə tənin,
İndi nə haldadır nazik bədənin?
Andıqca gülşəndə qönçə dəhənin,
Yansın ahım ilə kül olsun güllər.

Təğayürlər gəlib cismi səminə,
Töküldümü siyah əbru cibinə,
Sırma saçlar yayıldımı zəminə,
Dağıldımı qoxladığım sümbüllər?

Fələyin kinəsi yerin buldumu,
Gül yanağın rəngi-ruyun soldumu,
Əcaba çürüyüb torpaq oldumu,
Öpüb oxşadığım o pambıq əllər?

## QƏZƏL

Nə üçün etmədəsən ta be-səhər ah, könül,
Səndəmi sevdin o şəb-gərd mehi var, könül.

İncizabın görülür nerdə bir afət görsən,
Görmədim sən kimi aləmdə bəla-xak, könül.

Məni səndən nə zaman eyləyəcəkdir azad,
Səni ol zülfə əsir eyləyən Allah, könül.

Bulmadım badiyeyi qəmdə rəfiqi müşfiq,
Gəl səninlə olalım biz yenə həmrah, könül.

## ZİYA PAŞA
(1825 — 1880)

### GÖRDÜM

Diyari küfrü gəzdim, beldələr, kaşanələr gördüm,
Dolaşdım mülki-İslamı, bütün viranələr gördüm.

Bulundum mən dəxi dar-üş-şəfayi Babi-alidə,
Fəlatunu bəyənməz orda çox divanələr gördüm.

Cahan namındakı bir məqtələ ama yolum düşdü,
Hökumət derlər orda bir neçə sallaxanələr gördüm.

Hüzuri — guşeyi — meyxanəni mən görmədim, getdi,
Nə məclislər, nə səhbalar, nə işrətxanələr gördüm.

Ziya, dəyməz xuman qeyrinə meyxaneyi - dəhrin,
Bu işrətgahda mən çox durmadım, amma nələr gördüm.

### TÜRKÜ

Axşam olur, günəş batar indi buradan,
Qərib-qərib qaval çalar çoban dərədən.
Pək körpəsən, əsirgəsin səni Yaradan

Gir sürüyə, qurt qapmasın, gəl quzucuğum,
Sonra yardan ayrılarsan, ah yavrucuğum.

Çünki Mevlam qul eylədi sənə özümü,
Basdığın yerlərə sürsəm üzüm, gözümü
Uyma əğyarın fəndinə, dinlə sözümü.

Gir sürüyə, qurt qapmasın, gəl quzucuğum,
Sonra yardan ayrılarsan, ah yavrucuğum.

Dağları duman bürüdü ağyar seçilməz,
Ovçu yolda duzaq qurmuş, yara keçilməz,
Vəfasızın məclisində badə içilməz.

Gir sürüyə, qurt qapmasın, gəl quzucuğum,
Sonra yardan ayrılarsan, ah yavrucuğum.

## İBRAHİM ŞİNASİ
(1826 — 1871)

### ƏRZİ-MƏHƏBBƏT

Eşi yox bir gözəli sevdi, bəyəndi könlüm,
Qısqanır kəndi gözümdən yenə kəndi könlüm.
Gahi həsrət ikən ol sinəyə sinəm qovuşur,
Sanma könlümdə olan dərdi-məhəbbət sovuşur.
Yasəməndən belə nazikdir o boy bos onda
Sarmaşıb yarı sanırsam əyilir ol anda.
Candan ülfət edəli oylə cavan dilbər ilə
İstəməm qeyrisini huri mələk olsa belə.
Məst olub nəşeyi şəhvətlə o gözlər bayılır
Sərpilincə üzünə göz yaşım amma ayılır.
Bağrım əzməzmi süzüldükcə o bayqın gözlər?
Məni imrəndirir ağzındakı dadlı sözlər.
Kəndi hüsnündən utanmış da qızarmış yanağı
Üzün örtüb qapamış saçları başdan aşağı.
Uğradım zülfü xəyalıyla qara sevdaya
Boylə Məcnun dəxi düşgünmi idi Leylaya?
Can çəkişməkdən isə canım versəm barı
Can fəda eyləmə bir işmi, sevincə yarı?
Mən şəhid olmadan eşqiylə məzarım qazayım
Daşımı gözlərimin qanlı yaşıyla yazayım.

### QİTƏLƏR

Görən saçın arasından üzün parıltısın
Sanır ki, qara buludun içində gün görmüş.
Yanında qan ilə yaş içrə qaldığım görüb el
Deməzmi kim birini su qızı suda boğmuş?

Arayıb kəndimə bir eş bula bilsəm derdim
Hələ sən yosmayı sevdim də murada yetdim.
Satın almaq dilərəm busəni canım verərək,
İndidən könlümü bax işdə sənə pay verdim.

## TÜRK QALİB
(? — 1876)

### SİVRİ SİNƏK (AĞCAQANAD)

Yaz günü insana can yoldaşıdır sivri sinək
Muzu heyvanlarının həp başıdır sivri sinək.
Gövdəmi dişləyişi həm acıdır, həm qabarır
Say ki, quyruq urunun qardaşıdır sivri sinək.
Uflaz əmmə səsi, ağzında ağu var dalasa,
Kılk uyuz dənlü nə murdar qaşıdır sivri sinək.
Heç vurulmaz, gecə əyləndirir sazlar çalaraq
Qayfələrdə qəribin haldaşıdır sivri sinək.
Düni gün dilləşərək göydə bununla Qalib
Yaz günü insana can yoldaşıdır sivri sinək.

### QƏZƏL

Bax sevdiciyim Kəzbanın on dörd yaşı vardır
Guzgunu siyah bənləri, həm də qaşı vardır.

Gərdanlığını boynuna taxmış mavi muncuq
Qan qırmızı barnakda üzüyün daşı vardır.

Xan denlü açıqdır qapısı əyan ağanın
Dünya yesə bitməz, bərəkətli aşı vardır.

Heç boylə könül dərdlisi yoxdur bu şəhərdə,
Əkmək yer evində qatı çox oynaşı vardır.

Bir top bezi sarmış qoca bir püsgül oğarmış
Qalib kirizin qübbə qədər bir başı vardır.

## ƏRZURUMLU ƏMRAH

*Ərzurumlu Əmrah Doğu Anadolu və Azərbaycanda məşhur olan bir şair, el ədəbiyyatımızın görkəmli nümayəndələrindəndir. Əmrah Ərzurumun Tənbura kəndində dünyaya gəlmişdir. Doğum ili müəyyənləşdirilməyib. Müxtəlif nəşr-*

*lərdə doğum ili 1777, 1781, 1815 və 1820-ci illər kimi göstərilir. Ölüm tarixi daha dəqiqdir. Əmrah 1860-cı ildə Niksarda vəfat etmişdir. Heca vəznində, xalq şeri biçimlərimizdə incilər yaratmış Əmrahın əruz vəznində yazdığı əsərləri — qəzəlləri, müxəmməs və mürebbeləri də var. Bəzən Ərzurumlu Əmrahla XVII əsrdə Van gölü ətrafında Ercizdə yaşamış Əmrah adlı el şairinin şerlərini dəyişik salırlar. Aşağıda verdiyimiz örnəklər Türkiyədə nəşr edilmiş müxtəlif antolojilərdə və Ərzurumlu Əmrahın öz kitabında məhz ona məxsus şerlər kimi təqdim olunur.*

## QOŞMALAR

Sabahdan uğradım mən bir fidana,
Dedim məxmurmusan? Dedi ki, yox-yox.
Ağ əlləri boğum-boğum xınalı,
Dedim: bayrammıdır? Söylədi: Yox-yox.

Dedim: İnci nədi? Dedi: Dişimdi.
Dedim: Qələm nədi? Dedi: Qaşımdı.
Dedim: On beş nədi? Dedi: Yaşımdı.
Dedim: Daha varmı? Söylədi: Yox-yox.

Dedim: Ölüm vardır. Dedi: Eynimdə.
Dedim: Zülüm vardır. Dedi: Boynumda.
Dedim: Ağ məmələr... Dedi: Qoynumda.
Dedim: Ver ağzıma. Söylədi: Yox-yox.

Dedim: Ərzurum nə? Dedi: Elimdi.
Dedim: Gedərmisən? Dedi: Yolumdu.
Dedim: Əmrah kimdir? Dedi: Qulumdu.
Dedim: Satarmısan? Söylədi: Yox-yox.

***

Dedim: Dilbər didələrin islanmış,
Dedi: Çox ağladım, sel yarasıdı.
Dedim: Dilbər yanaqların dişlənmiş,
Dedi: Zülfüm dəydi, tel yarasıdı.

Dedim: Dilbər yanaqların al olmuş,
Dedi: Mənə bu gün başqa hal olmuş.
Dedim: Dilbər yanaqların gül olmuş,
Dedi: Çiçək dəydi, gül yarasıdı.

Dedim: Əmrah ağlın başından aldın,
Dedi ki, cahanda mənimi buldun?
Dedim: Dilbər neçin saraldın, soldun?
Dedi: Çəkdiciyim dil yarasıdır.

***

Kərəm qıl ey saqi, üz verme mənə,
Könül o üzlərdən fəridi getdi.
Sevda illətindən açma söz mənə.
O illət mənə bir nar idi, getdi.

Əzəldən gül kimi olurdun xəndan,
İndi bülbül kimi qalmışam giryan.
Ya neçin ağlayım etməyim əfqan,
Yarım sədaqətli yar idi, getdi.

Gözlərinə yarın müvafiq ismi
Hüsnünə düşmüşdüm müqabik ismi.
Nə zaman oxunsa bir aşiq ismi,
Derlər ki, bir Əmrah var idi, getdi.

***

Bir nazənin mənə gəl-gəl eylədi,
Varmasam incinir, varsam incinir.
Bəyaz gərdənindən, incə belindən
Sarmasam incinir, sarsam incinir.

Qaşına çəkilmiş qüdrət qələmi,
Görməmiş dünyada dərdü ələmi.
Hər səhər, hər axşam verir salamı,
Almasam incinir, alsam incinir.

Yenə görünürlər yarın elləri,
Başımızda əsən sevda yelləri.
Yarın baxçasında qönçə gülləri,
Dərməsəm incinir, dərsəm incinir.

Nərədən nərəyə sevmişəm yarı,
Atəşi qoymayır, yandırır məni.
Aşıq Əmrah sevər belə bir canı,
Sevməsəm incinir, sevsəm incinir.

***

Bu gün dörd gözəlin seyrinə vardım,
Biri: Gəlmə - dedi, biri: Gəl - dedi.
Dedim: Aşiq olub sizə dəmadəm,
Biri: Çalma - dedi, biri: Çal - dedi.

Birisinin adı Ayşədir, Ayşə,
İkisinin adı Nərgiz, Bənövşə.
Biri dedi: Gəlin, salax atəşə,
Biri: Salma - dedi, biri: Sal - dedi.

Səfil Əmrah deyər: Burda qalayım,
Bu fəna dərdimə dərman bulayım,
Hər yanaqdan bir cüt busə alayım,
Biri: Alma - dedi, biri: Al - dedi.

***

Əvvəl bahar, yaz ayları gələndə,
Açılmış baxçada nar məmələrin.
Versən də ağzıma, əmsəm doyunca,
Bal ilə yoğrulmuş yar, məmələrin.

Açma köksün, açma, rəqib baxıyor,
Yar, sənin atəşin məni yaxıyor.
Tənin mişgi əmbər olmuş qoxuyor,
Al mənim məndilim, sar məmələrin.

Əcəl quşu gəlib başa qonanda,
Tənim çıxıb tənaşirdə yananda.
Biçarə Əmrah da bir gün öləndə,
Məzarım daşına sür məmələrin.

## GƏRAYLILAR

Tutam yar əlindən, tutam,
Çıxam dağlara, dağlara.
Olam bir yaralı bülbül,
Enəm bağlara, bağlara.

Biri bilir, mini bilməz,
Bu dünya kimsəyə qalmaz.
Yar ismini desəm olmaz,
Düşər dillərə, dillərə.

Əmrah aydır: bu günümdü,
Ərşə çıxan tütünümdü,
Yarə gedəcək günümdü,
Düşəm yollara, yollara.

***

Könül qürbət elə çıxma
Ya gəlinər, ya gəlinməz.
Hər dilbərə meyil vermə
Ya sevilər, ya sevilməz.

Yoğruqdur bizim atımız,
Yardan atlatdı zatımız.

Qürbət eldə qiymətimiz,
Ya bilinər, ya bilinməz.

Baxçamızda nar ağacı
Kimi dadlı, kimi acı,
Könüldəki dərd əlacı,
Ya bulunar, ya bulunmaz.

Dəryalarda olur bəhri,
Doldur ver içəlim zəhri.
Sinəm qürbət elin qəhri
Ya çəkilər, ya çəkilməz.

Əmrah der ki, düşdüm dilə,
Bülbül fəğan edər gülə.
Gözəl sevmək - bir sərp qala,
Ya alınar, ya alınmaz.

***

Bu qarşıkı qarlı dağlar,
Parə-parə duman indi.
Sevişməsi bir xoş, amma,
Ayrılması yaman indi.

Gülün çevrəsi xarmola?
Çəkdiyim ahu-zarmola?
Əcəb məni anarmola?
Ol qaşları kaman indi.

Arasam yarı bularam,
Yoluna sərim verərəm.
Bir gün görməsəm ölərəm,
Gör neylədi yaman indi.

Əmraham qapıya çıxar,
Çıxar da yollara baxar.
Aşiqi odlara yaxar,
Boyu uzun fidan indi.

***

Ağalar qürbətdən gəldim,
Gəldim ki, nazənin getmiş.
Bir daha saz almam ələ,
Sallanıb gəzənim getmiş.

Aynasın verin dizinə,
Sürmələr çəksin gözünə.

Siyah zülfün mah üzünə,
Darayıb düzənim getmiş.

İçmişəm əzəl şərabı,
Yenə qovuşdur Ya Rəbbi.
Dəstində eşqin kitabı,
Oxuyub yazanım getmiş.

Bir daha içmənəm badə,
Sirrimi vermənəm yadə.
Uçdu gözəl, qaldı yadə,
Göllərdə gəzənim getmiş.

Əmraham, mən də varırsam,
Düşmandan hayıf alırsam,
Vədəm yetər mən ölürsəm,
Qəbrimi qazanım getmiş.

## QƏZƏL

Ey mələk-sima bu gün dövran sənindir, sən - mənim
Gül sənin, gülşən sənin, xəndan sənindir, sən - mənim.

Var isə canında meylin, söylə qurban olduğum,
Sən gözəllər şahısan, fərman sənindir, sən - mənim.

Bunca illərdir gəzərdim həsrətinlə sərsəri,
İşdə gəldim qapına, mehman sənindir, sən - mənim.

Dərgahi - divanına üz tutub gəldim qul kimi,
Ox sənin, sinə mənim, ehsan sənindir, sən - mənim.

Neylərəm sənsiz cahanın varlığın Əmrah, mən,
Təndə canım hasili canan sənindir, sən - mənim.

## ŞAH İSMAYILA NƏZİRƏ

Şövqü eşqi əhli şövq almış dəmi peymanədən,
Onun üçün bir qədəm keçməz dəri meyxanədən.

Cəzbəsindən ney fəğan eylər, sürahi dəm çəkər,
Hər nə dəm kim, narələr zahir olur məstanədən.

Can gözüylə seyr edib eşqi - həqiqi fərq edən,
Tərk edən canu cahan şəmə yanan pərvanədən.

Çıxsa, Haq olsa tənim suzi fəraqınla sənin,
Təbi - eşqin həşrətək çıxmaz dili viranədən.

Gər məramın pəru-bal açmaqsa Əmrah kuyinə,
Necə mürğilər uçurdum mən bu qırğın lanədən.

## FÜZULİYƏ NƏZİRƏ

Saqiya sorma mənə keyfiyyəti səhba nədir,
Oylə məstəm ki, təəkkül qılmazam dünya nədir.

Xor görüb rüsvalığım tən etmə ey zahid mənə,
Fəhm edərmi məst olan şeyda nədir, rüsva nədir?

Gərçi aşiqlik qılan çoxdur bu bəzmi - eşqdə,
Leyk bilməzlər səbati - eşq nədir, sevda nədir.

Fərq edən alayi ədnayi dila, aşiq deyil,
Aşiq ol kim, bilməyə ala nədir, ədna nədir.

Çünki bildin məhv olur əşya, qalır sultani - eşq,
Bilməzəm Əmrah, sənin könlündəki dava nədir...

# BAYBURTLU ZEHNİ

(? — 1859)

## QOŞMALAR

Vardım ki, yurdundan ayaq çəkilmiş,
Yavru getmiş izsiz qalmış otağı.
Camlar şikəst olmuş, meylər tökülmüş
Saqilər məclisdən çəkmiş ayağı.

Hankı bağda bulsam mən ol maralı,
Hankı yerdə görsəm çeşmi qəzalı,
Ovçulardan qaçmış ceyran misalı
Keçmiş dağdan dağa, yoxdur durağı.

Laləni, sümbülü, gülü xar almış,
Zövqi - şövq əhlini ahu zar almış,
Süleyman taxtını sanki mar almış,
Qəmə təbdil olmuş ülfətin çağı.

Zehni dərd əlindən hər zaman ağlar,
Vardım ki, bağ ağlar, bağiban ağlar,
Sümbüllər pərişan, güllər qan ağlar,
Şeyda bülbül tərk edəli bu bağı.

***

Səba gedər isən bizim diyarə,
Mənim vəsfi-halım o yarə söylə.

Lalənin bağrında bir isə yarə
Mənimki erişdi həzarə söylə.

Bülbül bir gül üçün çəkərsə zarı,
Halını ərz edin üz - üzə barı.
Heç mən görməmişkən o şux didarı
Buraxdı bu qərib diyarə söylə.

Pərvanə pərini yaxdıysa narə,
Mən də yaxdım vücudumu yekparə.
Zehniya, Mənsuru çəkdiysə darə,
Mən əsirəm zülfü nigarə, söylə.

***

Badi səba salam söylə o yarə
Ya gəlsin, ya gedək o diyarə biz.
Katib, ərzi-halım yaz ki, canana
Ayrılalı düşdük ahu-zara biz.

Katib, ərzi halım ərşə dayandı
Can qürbətdə həsrət narına yandı.
Hər kəs sevdiyindən doydu, usandı
Nədən qaldıq boylə bəxti qarə biz?

Naməm həm oxusun, həm yar ağlasın,
Eşq oduna düşsün naçar ağlasın,
Sinəsini döysün hər bar ağlasın,
Desin ki, zülm etdik Zehni-zara biz.

## SEYRANİ
(1807 — 1866)

### QOŞMA

Bahar gəlir yenə qarşı dağlara
Mor bənövşə, lalə bitmək üçündür.
Bülbül fəğan edər, enər bağlara
Bir gül qönçəsiylə yatmaq üçündür.

Əzəldən bu dünya fanidir fani
Bu gün varıq, yahu, ya yarın hanı?
Haq bizə çox verdi əqli ezanı
Eşqə daim xidmət etmək üçündür.

Hey ağalar könül əsla tək olmaz,
Qonar, köçər heç kimsəyə yük olmaz,
Can əmanət bir kimsəyə yox olmaz,
Bu dünyaya gələn getmək üçündür.

## DAŞLAMA

Məhkemə məclisi icad olduğu
Rüşvət çeşməsinin axmaqlığından.
Qada bəla ilə aləm dolduğu
Qazların qaziyə uçmaqlığından.

Sələfin rüşvətə hüccət yazması,
Xələfin anlayıb hökm pozması,
Yıxılan binanın birdən tozması
Əsil sərmayənin torpaqlığından.

Əsil sərmayənin niyabətləri
Yetim mallarıdır ticarətləri.
Rüşvət dəvətinə icabətləri
Sidq ilə könlünün alçaqlığından.

Bülbülün eşqidir dalda ötdüyü,
Çobanın südədir qoyun güddüyü,
Torpağın Habili qəbul etdiyi,
Şübhəsiz üzünün yumşaqlığından.

Dünyadan axrətə gedib gəlməmək,
Olmasa iqtiza edər ölməmək,
Balıq başdan qoxar, bunu bilməmək,
Seyrani, qafilin axmaqlığından.

## NƏFƏS

Haq yoluna gedənlərin
Əsa olsam əllərinə
Ər pir vəsfi edənlərin
Qurban olsam dillərinə

Torunuyuz bir dədənin
Toxumuyuz bir bədənin
Münkir ilə cəng edənin
Silah olsam bellərinə

Bir ustada olsam çıraq
Bir olurdu yaxın, iraq

Yapsalar gəmiyim daraq
Yar zülfünün tellərinə

Yönüm yarə çevirsələr
Vücudumu qovursalar
Xırman kimi sovursalar
Məhəbbətin yellərinə

Seyrani, qaldır barmağın
Vaxtıdır haqqa durmağın
Dəryaya axan ırmağın
Qətrə olsam sellərinə.

## NƏ OLUR?

Bu dünyaya gələn gedər,
Görəlim bağlar nə olur?
Ölənlər borcunu ödər
Görəlim sağlar nə olur?

Altdan gəlir yaşıl başlı,
Qarğısının ucu daşlı,
Əl qamçılı, bel qılıclı,
Görəlim bəylər nə olur?

Kamal əhli özlü olur,
Hər qəbahət gizli olur,
Nə vəzirlər nazlı olur,
Görəlim tuğlar nə olur?

Qəm karvanı yük götürür,
Kamal fəzilət yetirir,
Dürlü çiçəklər bitirir,
Görəlim dağlar nə olur?

Seyrani öldü dirildi,
Suçu üzünə vuruldu,
Dərdindən yerlər yanıldı,
Görəlim göylər nə olur?

## DƏLİ BORAN
(1823 — ?)

### QOŞMA

Əvvəl bahar yaz aylan gələndə,
Axar boz-bulanıq seli Tunanın.
Bülbüllər ötüşür baxçalannda
Gülü burca-burca qoxar Tunanın.

İlk baharda dalğalanıb coşmuşam,
Analar ağladıb qanlar saçmışam,
Ataman dağından yollar açmışam,
Yolu sərhədlərə uğrar Tunanın.

Kimsə bilməz hardadır onun başı
Əysik olmaz yalısının döyüşü.
Axıtdı gözündən qan ilə yaşı
Gölləri leş ilən dolu Tunanın.

Tuna derlər yerdədir onun üzü,
Arzulayıb gedər Qara dənizi.
Cəmrələr düşüncə çözülür buzu
Dənizlə cəngi var dəli Tunanın.

Dəli Boran bunu boylə dedimi,
Bu su boylə axarmıydı qədimi?
Daşına qoymuşam qərib başımı
Yolu sərhədlərə uğrar Tunanın.

### BU DƏRDİ

Qadir Allahım, qadir
Qullara vermə bu dərdi.
Mən çəkərəm, mən bilirəm
Düşmana vermə bu dərdi.

Çəkən bilir dərdi, çəkən
Nə bilər geridən baxan?
Cuş edib də bəndi yıxan
Sellərə vermə bu dərdi.

Dəli könül, bənövşədən
Dərdlər gəlir dörd guşədən.
Yellər əsər hər meşədən
Dallara vermə bu dərdi.

Dəli Boran yaxar yaxılar,
Gül olub yerə tökülər,
Urumdan Şama çəkilər,
Ellərə vermə bu dərdi.

## AŞIQ SAİT
(1835—1911)

### TÜRKÜ

Mənim ağlım alacağın,
Mənə cəfa qılacağın,
Fəryadlara salacağın,
Bilmədim, biləmədim.

Görməyəli cananımı
Gözlərin tökər qanımı,
Bu dərdimin dərmanını
Bulamadım, bulamadım.

Həsrət bağrım yaxar oldu,
Sitəm qəlbim yıxar oldu,
Gözüm yaşı axar oldu,
Siləmədim, siləmədim.

Həsrətinlə bağrım kabab
Gözüm yaşı oldu şarab.
Dodağından şəfi cavab
Alamadım, alamadım.

Gümüş tənlim, hicrin ilə
Saiti düşürdün dilə.
Bir təsəlli bu könülə
Verəmədim, verəmədim.

# XIX ƏSRİN BİRİNCİ YARISI TÜRKMƏN ŞAİRLƏRİ

## KƏMİNƏ

(1770 — 1840)

*Kəminə türkmən xalqının böyük lirik və satirik şairlərindəndir. Əsl adı Məmmədvəlidir. Təkə boyunun Toxtamış əşirətinin Vəkil sülaləsindəndir. Kəminənin ictimai mövzularda yazdığı şerlər ondan sonra gələn türkmən şairlərinə güclü təsir göstərmişdir.*

### QƏRİBLİK

Gündə min qüssəm var yüz ələm ilə,
Dərdimin hamsından betər qəriblik.
Soranı mən oldum qayğı qəm ilə,
Gəlib düşər qatar-qatar qəriblik.

Fani dünya ziynət ilən, xərc ilən,
Ürəyim maddədir, bağrım bərc ilən,
Vədəsiz şum ölüm vergi-borc ilən,
İlbəildən qayım tutar qəriblik.

Yeməzəm, içməzəm muradım ötməz,
Bürünüb yatmağa qərarım yetməz,
Gündə min qovlasam - boylara getməz,
Köç düşüb qapımda yatar qəriblik.

Tapıbdır hər yerdə yekə ikini,
Çəkibdir belinə qayış çəkini,
Alıbdır əlinə daşlı sokunu,
Yorulmaz, təpəmdən vurar qəriblik.

İlbəildən mənim müflisim çıxar,
Qəribin üzünə kim gülüb baxar?
Yarışsam yürükdür, güləşsəm yıxar,
Oynasam, oyunda udar qəriblik.

Seyr etmədim səhralarda, çöllərdə,
Məstanə gəzmədim ulu ellərdə,
Bir bülbüldüm sayramadım güllərdə,
Çağ beynimi qatar-qatar qəriblik.

Kəminə der: gələr bir gün şum ölüm,
Kimsəyə toy-bayram, kimsəyə zülüm,
Qırılma, incimə, səbr eylə, könlüm;
Gəlibdir, bir zaman ötər qəriblik.

## GÜLLƏRƏ

Xubların işvəsi qara göz olur,
Tamaşa et bülbül ilə güllərə.
Gözəlin şivəsi şirin söz olar,
Söylə qurban olum şirin dillərə.

Al-yaşıl geyinib gümüş quranda,
İpək quşaq incə belə saranda,
Su sonası yaşılbaşı görəndə,
Laçın könlüm həvəs edər göllərə.

Ayrı düşsəm əlif qəddim yay olar,
Ayrılmasam könlüm əcəb çay olar,
Gül üzün görməsəm günüm ay olar,
Ay uzanıb gedər ildən illərə.

Kəminə qoymazlar yar ilən yarı,
Fələkdən dad edər gələnin vart.
Mənim dilim, sənin əlin hünəri,
Nüsxə olub qalsın eldən-ellərə.

## VARSAM İNANMAZ

İş salışdım bir bivəfa yar ilə,
"Yarım" deyib yanına varsam inanmaz.
Sümükdən sızdırıb etibar ilə,
Oda düşsəm, bişsəm, yansam, inanmaz.

Leyli — Məcnun kimi çöllərə çıxsam,
Arzu-Qəmbər kimi dəryada axsam,
Fərhad — Şirin deyib dağları yıxsam,
Daşların altında qalsam inanmaz.

Gör nə işlər etdi Vamiqü Əzra,
Sayatxan deyib qoydu yarını Xəmra.
Dəftərdə yazılan Yusif-Züleyxa,
Onların həmrası olsam, inanmaz.

Qərib olub Hələb, Şirvana qaçsam,
Yarım Şahsənəm deyib örtənib bişsəm,
Onlar kimi yeddi ildə qovuşsam,
İzində saralıb solsam, inanmaz.

Mən sevər yarımı ala bilmədim,
Bu rəqib tən etdi gülə bilmədim.
Nazlı yarın uğrun bilə bilmədim,
Ağlasam aldanmaz, gülsəm inanmaz.

Kəminə der: arzum yara yetirsəm,
Gönlümdəki sirrim dilə gətirsəm,
Yeməsəm, içməsəm, gözlüb otursam,
Ac qalsam, susasam, ölsəm, inanmaz.

## AĞ EDƏR

Ay ağalar! Yaman arvad,
Saqqalı çıxmadan ağ edər.
Abrı-həyan yerə tökər,
Ürək-bağrını dağ edər.

Başı çıxmaz heç bir işdən,
Amma görsən, - əyal dışdan.
Ağ iplikdən, göy ərişdən,
Saçına ipdən bağ edər.

Müdam el sözünə baxar,
Qazananın yerə tökər.
Geyim geysə yarsın yaxar,
Yaxasın yırtıb çak edər.

Əri qazanıb gətirir,
Çuvala salmaz, bitirir.
Gedir küllükdə oturur,
Der: mənə ərim lağ edər.

Baxıb alın əsli-zatın,
Yamandan al ömrün satın.
Kəminə der: pinti qadın,
Alın saçın çim yağ edər.

## HALAL GƏZƏR

Dünya bir biməşrəb yerdir,
Haram gəzər, halal gəzər.
Mal yiyəsi filan baydır,
Adam yerinə mal gəzər.

Şərieti bilsən doğru,
Ayıtmasan oldun oğru.
Qazi əyri, müfti əyri,
Əlif yerinə dal gəzər.

Qalıbdır kəlamın sözü,
Kor bəyənməz görən gözü.
Pir olar şeytanın özü,
Sofilər həm xəyal gəzər.

Səna olmaz sübhi-şamda,
Dil qiybətdə, qulaq tamda.
Kəminə der: bu əyyamda,
Savab yerinə kal gəzər.

## VARIB-GƏLƏNİN QALAR

Sağlıqda, igidlər, varıb gəlişin,
Dünya ötər, varıb gələnin qalar.
Bir dəm qənimətdir oynub gülüşün,
Axırı ağlarsan, gülənin qalar.

Fələk çərxin çəkər, çevrilər, tezdir,
Köçülənlər yurtdur, yürünən izdir.
Dünya bir xoş surət, bir gözəl qızdır,
Ələ düşməz, aşiq olanın qalar.

Kəminə der: heç yox olmaz gümanın,
Çıxarıb alarlar müztərib canın,
Tərəkə salarlar mali-məkanın,
Oğul-uşaq tamam olanın qalar.

## YANIMA

Gəldi qələm qaşlı qız,
Tayladılar yanıma.
Kirpikləri tezmə-tiz,
Keçər mənim canıma.

Mən dedim ki, "can təlaş",
Didəm axar qanlı yaş.
Baxmadı ki, bağrı daş,
Hali-pərişanıma.

Mən dedim ki: "ruyi gül,
Xidmətində bəndə - qul,
Qəhrin qoy da, səbr qıl,
Susadıysan qanıma".

Kəminə der: qul oldum,
Yana-yana kül oldum.
Bir gecə daxil oldum,
Təzə gülüstanıma.

# SEYİDNƏZƏR SEYDİ
(1775 — 1836)

## DÖNMƏNƏM, BƏYLƏR

Vətən üçün çıxdım Qırat belinə,
Ta canım çıxınca dönmənəm, bəylər.
Dikdir sərim, düşməm düşman altına,
Sel tək axsa qandan qanmanam, bəylər.

Elim üçün şirin candan keçərəm,
Düldül minib, qanad taxıb uçaram.
Namərd deyləm, Haqdan qəsəm içərəm,
Yanıb duran nar - mən, sönmənəm, bəylər.

Yesir qalmaz oğlan-uşaq ağlayıb,
Oda düşməz aşiq ürək dağlayıb.
Mən həm bu gün Mürtəzadan çağlayıb,
Qəsəm qıldım, onu danmanam, bəylər.

Tamaşa eyləyin qılan vuruşuma,
Yüz min ləşkər çıxa bilməz qarşıma.
Ər iyidəm, mərdlik ilə duruşuma,
Od vurarlar mən həm yanmanam, bəylər.

"Ər-mən" deyən çıxsın belə yürüməyə,
Ləşkər dartır Mir Heydəri vurmağa.
El-gün üçün şirin canın verməyə,
Vurdum başım, şəptdən sunmanam, bəylər.

Haq əzəldən saldı məni bu yola,
Can vermədən diri düşməzəm qola.
Tamaşa qılanlar bulanan selə,
Neçə qanlar uddum qanmanam, bəylər.

Ərdən oldum, ərlik ilə ölərəm,
Kim dostum, düşmanım fərqin bilərəm.
Savaşda ağlamam, şadam, gülərəm,
Namərd olub dünyaya enmənəm, bəylər.

Yad edərəm Koroğlunu, Zamanı,
Əli Mürtəzayi Şahi Mərdanı.
Rüstəm Zal, İsgəndər, Qacar pəhlivanı,
Orta atdım, çoxun sanmanam, bəylər.

Seydi çıxdı at yarağın bəsləyib,
Qan gördü gözlərim qəlb həvəsləyib.
Qaçmanam, ölərəm, ləşkər istəyib,
Savaş üçün çıxdım, dönmənəm, bəylər.

## GÖRÜLSÜN İNDİ

Qorxu edə-edə rüsvamız çıxdı,
Hər nə nəsib olsa, görülsün indi!
Zalım düşman axır yurdumuz yıxdı,
Çox yatdıq, yaranlar, durulsun indi!

Mevlam vermiş bizə neçə qalanı,
Qıtmanı, Şerverdi, Xalaç, Gilanı,
Başdan ayaq yığıb eldə olanı,
Zalım bəy üstünə yürülsün indi!

Qeyrət edib şirin candan keçəli,
Qılıncdan qırmızı qanlar seçəli,
Düşman ilə aramızı açalı,
Bütün ol iqrara varılsın indi!

Bir yerdə top ilə bayraq tikilsin,
Qoşun iki yandan səf-səf çəkilsin.
Kəllələr kəsilsin, qanlar tökülsün,
Arada qurd oynu qurulsun indi!

Əgər hər kim qorxu etsə canından,
Ayrılmasın əyalının yanından,
El qaçsa, ayrılar xanımanından,
Doğru durub qılınc vurulsun indi!

Ağzımız bir etsək tükəl Ersəri,
Düşman gələ bilməz dəryadan bəri.
Hər iyidin savaş olsa hünəri,
Önümüzə salıb sürülsün indi!

Yağı olsa Salur, Sarığı Təkə,
Biz burda el olmaq oxşamaz yekə.
Boylə oturunca pul çəkə-çəkə,
Bir qılınca qüvvət verilsin indi!

Seydi deyər: qaynıb, daşıb, cuş edib,
Bir beş gün gəzəli könül xoş edib.
Cərconu alarsaq basıb, boş edib,
Zalım əhli tamam qırılsın indi!

***

El birlik etmədi bizə igidlər,
Gəlin, bu vətəndən çıxıb gedəlin.
Düşmanın yalına öyrənən itlər,
Getməsə, boynuna qaxıb gedəlin!

Durdurmayın qoçaqların atını,
İtirdiniz Ersarinin adını.
İndi mevlam versə elin dadını,
"Lahavlə billah" deyib gedəlin!

Bəylərin üzünə qara çəkildi,
Onun üçün abrı yerə töküldü.
Üstümüzə əmir tuğu tikildi,
Əldən gəlsə onu yıxıb gedəlin!

Gün-gündən halımız olandır xərab,
Bir neçə axmağın ağzına qarab.
Seydi deyər: haram oldu bu Lebab,
Bir yana sel kimi axıb gedəlin!

## QAYİBNƏZƏR QAYİBİ
(? —?)

### FANİ DÜNYA, FANİ DÜNYA

Yenə könlüm qara qıldın, fani dünya, fani dünya,
Ürəyimi yara qıldın, fani dünya, fani dünya.
Şərmisarəm günahımdan, çıxar dud odlu ahımdan,
Ayırdın qüvvətli şahımdan, fani dünya, fani dünya.
Neçələr canın alıbsan, qara torpağa salıbsan,
Onlardan boylə gəlirsən, fani dünya, fani dünya.
Sənin əsla qəranın yox, qərar ilə duranın yox,
Yalançı, etibarın yox, fani dünya, fani dünya.
Neçələri turab etdin, neçələrə azar etdin,
Abadları xərab etdin, fani dünya, fani dünya.
Cəfa canlara bağlarsan, fəraq odunda dağlarsan,
Qara torpağa çağlarsan, fani dünya, fani dünya.
Kişiyə bir zaman həmra olub, şad eyləməzsən gah,
Nə möhnətxanasan boylə, fani dünya, fani dünya.
Gahi sultan, divan deməz, olub burda güvən deməz
Alır pirü cavan deməz fani dünya, fani dünya.
Neçələri cüda qıldın, zülüm ilə əda qıldın,
Alıb malın gəda qıldın, fani dünya, fani dünya.
Cahana Qayibi doymaz, onu dərdi qəmin qoymaz,
Vəfasız şövqünə uymaz, fani dünya, fani dünya.

## MURAD TALİBİ
(? —?)

### ÇATMAĞA GƏLDİM

Dilbər, sənin ilə könlüm bir edib
Canımı canına qatmağa gəldim.
Zülflərin boynuma bir zəncir edib
Başım bir araya çatmağa gəldim.

Hərf içində qəddin bənzər əlifə,
Zinhar, onu görkəzmə gəl rəqibə.

Xuda edən olsa bizə nəsibə
Şirin ləblərindən dadmağa gəldim.

Üzün tər açılan baxça gülzarı,
Bülbül təki dartdın naleyi zarı.
Mən sənin bağından alma, ənarı
Özüm dərib, alıb getməyə gəldim.

Dünyada görmədim sən tək zalımı,
Rəhmin gəlib heç sormadın halımı.
Mən sənin yolunda mülki-malımı
Varısın bir pula satmağa gəldim.

Üzün yaxşı tər açılan güllərdən,
Mən sənə bağlıyam özgə qullardan.
Arzun çəkib, yorub uzaq yollardan
Bir bəllicə sözün tutmağa gəldim.

Talibi der: bu gün gəldim şanına,
Hər gün sorsam, sən qoymazsan yanına.
Bir tərəhhüm edib salsan qoynuna
Alma, ənarını tutmağa gəldim.

## YADIMA DÜŞDÜ

Bir gecə yatırdım yüz xəyal ilə
Alma yanaqların yadıma düşdü.
Sözləşəndə şirin candan yol salam
Badam qabaqların yadıma düşdü.

Sevdiyim, bu dərdin hər zaddan yaman,
Zülfünün telləri boynumda kaman.
Söyləyəndə qətrə-qətrə bal daman
Yuxa dodaqların yadıma düşdü.

Ağzın dadlılığı misli bal kimi,
Hüsnün tər açılan tazə gül kimi,
Bir budaqda bitən dəsəmmil kimi
Qoşa məmələrin yadıma düşdü.

Bostan gülşənində baxçanın gülü,
Dağın sünbülüsən, bağın bülbülü.
Başa yastıq-təkyə edib qoymalı
Ol ağ biləklərin yadıma düşdü.

Talibi der: alma, narı əllənən,
Hüsn içində adamzada bəllənən,
Yürüyəndə min naz ilə sallanan
Şəmşad ayaqların yadıma düşdü.

## NEYLƏDİN

Etibarsız fələk, bivəfa dünya
Sənə gələn Qılınc canı neylədin?
Dostuna cəfalı rusiyah dünya
Haq Rəsul tək peyğəmbəri neylədin?

Can quşu pər vurub uçdu qəfəsdən,
Cüda düşdü mərəkədən, məclisdən,
Ayrı saldın bu gün məni Qılıcdan
Dayanağım əsrik nəri neylədin?

Xəzan vurdu bir bağın gülünü,
Cavanlıqda əcəl tutdu yolunu,
Binişan keçirdin Qılıc mərgəni
Oğulsuz, orunsuz onu neylədin?

Talibi der: sənə yazdı dastanı,
Eşin, dostun ərşə çıxdı əfqanı,
Fələk, sənə verməz zövqü dövranı
Dal qamətli Qılıc canı neylədin?

# SEYDULLA SEYDİ
(? —?)

## DÖVRAN QƏNİMƏT

Bəyan etsəm bu dünyanın oluşunu,
Bu dünyaya gəlincə dövran qənimət.
Yaxşı-yaman, varca otur-duruşunu,
Hər birindən bir az görən qənimət.

Bu dünya bilsəniz qatıdır daşdan,
Ömrünü keçirər yaz ilə qışdan.
Nəfsi daşsa ayırar ağıldan, huşdan,
Ol nəfsi-şeytanı vuran qənimət.

Gönlünü rast tutub düzəltgin özün,
Olara olmaza uzatma sözün.
Ol iki əndamın, ol iki gözün,
Bu nurlu cahanı görən qənimət.

Gördüm bu dünyada yaxşı-yamanı,
Şəriəti pozar qazisi, xanı,
Dörd pula satarlar dini, imanı,
Allahı yad edib yürən qənimət.

Zalımlar dünyanın varın alıbdır,
Bəd iş rəvac olub, xeyr iş qalıbdır,
Bilmən ki, qiyamət qolay gəlibdir,
Qərib üçün bağrın yaran qənimət.

Seydi deyər: düşman qoyman vətəndə,
Kim ölsə ad qalar burdan ötəndə,
Səksəndən son doxsan yaşa yetəndə,
Fanidən baqiyə varan qənimət.

## XƏDİCƏ

Gözü qara, qaşı qara,
Zülfləri timar Xədicə.
Ürəyimə saldın yara,
Eylədin bimar Xədicə.

Gözünə sürmə yaraşar,
Belinə tirmə yaraşar,
Saçına hörmə yaraşar,
Saçları şahmar Xədicə.

Bağında tuti qumrular,
İzində cahil cümrülər.
Köksündə qoşa yumrular,
Almamıdır, nar, Xədicə.

Seydi deyər: bu şərtlərə,
Qoyma tükənməz dərdlərə,
Gəldik qədimki yurdlara,
Sürəlim dövran Xədicə.

## ZƏLİLİ
(1800 — 1852)

*Görkəmli türkmən şairi Zəlili ilk dərslərini kənd məktəbində Məxtumquludan almışdır. Zəlilinin anası Xurma Məxtumqulunun bacısı qızıdır. Zəlili Seydulla Seydi ilə bir bölgədə yaşamış, onlar dost olmuş və şerləşmişlər.*

### YAR SƏNDƏN

Yanaqları laləm, püstə dəhanim,
Mən dönərəm könlüm dönməz yar səndən.
Ruyi gül bənövşəm, tuti süxənim,
Mən dönərəm könlüm dönməz yar səndən.

Fərhad "Şirin" deyib bunca gəzəndir,
Məcnun Leyli sitəminə dözəndir,
Deməgil: "Yar məndən əlin üzəndir",
Mən dönərəm könlüm dönməz yar səndən.

Çıxmaq olmaz Yaradanın əmrindən,
Adamzadlar törər biri-birindən,
Ölən aşıq yoxdur məşuq cəbrindən,
Mən dönərəm könlüm dönməz yar səndən.

Bu yalan cahanda sənsən dayancım,
Cövhərim, xəzinəm, mədənim, gəncim,
Məqsədim, muradım, könül güvəncim,
Mən dönərəm könlüm dönməz yar səndən.

Zəlili der: mənim Dəndü xanımsan,
Cəsədim içində şirin canımsan,
Qıymazım, dözməzim, mehribanımsan,
Mən dönərəm, könlüm dönməz yar səndən.

### ALDATDI MƏNİ

Əvvəl başda çirkin dünya
Saz ilə aldatdı məni.
Dilbər gəlinə bənzəyib,
Naz ilə aldatdı məni.

Qafil olub, qaynab daşdıq,
Şeytanın şərinə keçdik,
Çox oyunlu eşqə düşdük,
Baz ilə aldatdı məni.

Fayda dedilər ziyanı,
Görkəzib altun kiyanı.
Yox ikən sonu, payanı,
Söz ilə aldatdı məni.

Dünya ulu qıza bənzər,
Görkəzdilər onu bizə.
Rahat verməz, saldı azar,
Üz ilən aldatdı məni.

Dünya əvvəl özün öydü,
Tutam dedim üzün sövdü,
Xivəyədək yurddan qovdu,
Duz ilə aldatdı məni.

Bu məkana qonan köçdü,
Neçə çıraq yanıb keçdi,
Saysız illər gəlib keçdi,
Yaz ilə aldatdı məni.

Zəlili çəkdi cəbrini,
Görmədik yaxşı dövrünü,
Yad etdirib Gürgəni,
Boz ilə aldatdı məni.

## ZİNHARİ
(1771 — 1880)

### MƏZƏNİ BİLƏR

İnsan dünyaya gəlincə,
Əvvəl süd məzəni bilər.
Beş yaşda oynayıb gülsə,
Çarx vurub gəzəni bilər.

Yeddidə mollaya varsa,
Kəlamı alıb yürürsə,
On dördündə kitab görsə,
Xətt oxur, yazını bilər.

Adam yetsə on beşinə,
Hər xəyal gələr başına.
Yetsə on altı yaşına,
Ol qamət-azanı bilər.

Otuzunda yelib-yortar,
Qırxda könlün yaxşı dartar,
Əlli-altmışda dərdi artar,
Ondan son (sonrasını) əzanı (əzası) bilər.

Yaş varıb yetsə yetmişə,
Könlə gələr yüz əndişə,
Səksəndə yaramaz işə,
Gələcək qəzanı bilər.

Zinhari dilər imanı,
Hər kəs ölər, yox gümanı,
Adamın ayrılsa canı,
Bu dünya uzanı bilər.

## QİYAMƏT YAXIN GƏLƏNDƏ

Neçə əlamətlər olar,
Qiyamət yaxın gələndə.
Bəd işlər cahana dolar,
Qiyamət yaxın gələndə.

Ədalətin pozar xanlar,
Bağlanar xeyrat-ehsanlar,
Çox tökülər nahaq qanlar,
Qiyamət yaxın gələndə.

Ötər neçə ərlər, mərdlər,
İlbəildən artar dərdlər.
Çoxalar and ilə şərtlər,
Qiyamət yaxın gələndə.

El qururlar haram yerə,
Hər bir çökü bənzər pirə.
Səfaillər dönər şirə,
Qiyamət yaxın gələndə.

Zinhari, baxmazlar imana,
Rəvac verlibmi yamana?
Əməl etməzlər Qurana,
Qiyamət yaxın gələndə.

# XIX ƏSRİN İKİNCİ YARISI AZƏRBAYCAN ƏDƏBİYYATI

## YƏHYA BƏY DİLQƏM
(1830 — 1865)

### QOŞMALAR

Ərizə yazaram səba yelinnən,
Ərizəm canana yetişirmola?
Fələk məni tərki-vətən eyləli,
Nazlı yar əhvalım soruşurmola?

Əzəldən aşığam tuti dillərə,
Müsəlsəl saçlara, siyah tellərə,
Axdı eynim yaşı, döndü sellərə,
Yar içən sulara qarışırmola?

O qızıl gülləri dərməyən Dilqəm,
Dərib pünhan yerə sərməyən Dilqəm,
Bu dünyada yarı görməyən Dilqəm,
Yarəb, o dünyada görüşürmola?

***

Dilbər ehtiramla, mərhəmət ilə,
Yanıma gəldiyi yadıma düşdü.
Bir şirin söz ilə, qaşü-göz ilə,
Dərdimi bildiyi yadıma düşdü.

Əndəlib gülünnən, kəmər belinnən,
Ülfət qıl qulunnan, danış dilinnən,
Zülfünnən, telinnən, nazik əlinnən,
Göz yaşım sildiyi yadıma düşdü.

Dilqəm tərlanısan, uyma sar ilə,
Qızıl gül bülbülə uymaz xar ilə,
Bir şirin dil ilə, xoş göftar ilə,
Ucadan güldüyü yadıma düşdü.

## AŞIQ MUSA
(1830 — 1912)

### TELLİ SAZIN

Məclisləri abad eylər,
Nə günahı telli sazın?
Məlul könüllər şad eylər,
Nə günahı telli sazın?

Yeki şəcər, yeki dəmir,
Ara vurmur, yalan demir,
And içməyir, rüşvət yemir,
Nə günahı telli sazın?

Fikrini vermir qələmə,
Zülüm eyləmir aləmə,
Pulunu vermir sələmə,
Nə günahı telli sazın?

Yoldan çıxıb, yolun azmır,
İblis kimi ara pozmur,
Molla kimi cadu yazmır,
Nə günahı telli sazın?

Musa vəsfin söylər saza,
Ruh verir gəlinə, qıza,
Oxşamır o şeyidbaza,
Nə günahı telli sazın?

## AŞIQ BƏSDİ
(1830 — 1936)

### DÜNYA

Məleykə boyludu, şirin ləhcəli,
Əzəldən tamaşa olan bu dünya,
Qoca cadugərdi, aldadar səni
Cavanlıq donunda qalan bu dünya.

Qananı eyləyib talesiz, bəxtsiz,
Əyibdi qəddini, qocaldıb vaxtsız,
Çoxlarını qoyub eyvan-otaqsız
Varlının dərdinə qalan bu dünya.

Qəmdən pay götürdüm, nalədən qismət,
Görmədim bir ləzzət, çəkdim əziyyət,
Canda eşq atəşi, dildə məhəbbət.
Bəsdini odlara salan bu dünya.

### SƏNƏ QURBAN OLUM, ATA

Sənə qurban olum, ata
Vermə bir ağ yala məni.
Qulaq as ahı naləmə
Vermə bir ağ yala məni,
Salma qeylü-qala məni.

Gün çıxanda günlə durram,
Təndir sallam, xana qurram,
Cütə getsəm iyid yorram
Bibi, çəmə ala məni,
Salma qeylü-qala məni.

Adımı qoydular Bəsdi,
Qardaş kələyim kəsdi,
Öldürməkdi məni qəsdi
Atam bilmir bala məni,
Salıb yaman hala məni.

Qurbanam qohum-qardaşa,
Rəhm et gözdən axan yaşa,

Puç ömrü vurmadım başa
Ana, verme çala məni,
Salma qeylü - qala məni.

Yaşı keçib olub əlli,
Ağ tükü qaşından bəlli,
Acı sözlü, zəhər dilli,
Dilə tutma, xala, məni,
Ana, verme çala məni.

Oğlan, de bir nədir adın?
Bilmədim eşqinin dadın.
Allahım versin muradın.
Salma qeylü-qala məni,
Babam verir çala məni.

Bəsdi deyər: yandım, yandım,
Allah adı olsun andım,
Zəhər şərbətindən qandım
Babam saymır bala məni,
Salıb qeylü-qala məni.

## İNANMIR

Bir qəmli bülbüləm
Güllər inanmır.
Məcnunsuz Leyliyəm
Çöllər inanmır.

Göz yaşım sel olur
Göllər inanmır.
Bir qərib yolçuyam
Yollar inanmır.

Deyirəm həsrətim
Qollar inanmır.
Sözüm dastan olub
Tellər inanmır.

Aşıq Bəsdi mənəm
Ellər inanmır.
Sinnim doxsan olub
İllər inanmır.

## MƏHƏMMƏD BAĞIR XALXALİ
(1829 — 1901)

### "SƏLƏBİYYƏ" (Tülkünamə)
(Poemanın başlanğıcı)

Belə nəql eyləyib Mirzə Filani
Kəlami doğrudur, yoxdur yalani —
Ki, bir Tülkü diyari-İsfəhanda
Ki, yəni qeyrəti-mülki cahanda
Əlinə düşməyib quti-münasib,
Muradın verməyib çərxi-məlağib.
Neçün ki, salmayıb bir zad əlinə,
Keçib bir ay ki, dəyməyib ət dilinə,
Tükəndi səbri, oldu taqəti taq,
Bu vüsətlə ona təng oldu afaq.
Qaraldı gözləri, getdi qərari,
Acından getdi əldən ixtiyari.
Qalıb evdə özü ac, külfəti ac,
Xədəngi-ibtilayə oldu amac.
Günü qarə, üzülmüş çarədən əl,
Əli qoynunda qalmışdı məəttəl.
Müqəvvayə dönüb cismi-nəzari,
Gecü-gündüz edərdi ahü-zari.
Töküldü cism, qaldı misli-sayə,
Əqiqi rəngi döndü kəhrəbayə.
Uşaqlardan biri "acam" deyirdi,
Bu, yüz batman qəmü qüssə yeyirdi.
Pələng dəyseydi tovlardı, yıxardı,
Tutaydı burnunu canı çıxardı.

Bəli, heyrətdi bu çərxin qərari,
Bulunmaz işdi aləm kari - bari.
Birisinə müyəssər nazü nemət,
Birisi ac, çəkər yüz min məzəllət.
Birisi çiyriyib yağlı plovdan,
Birisi doymuyubdur nani-codan.
Birisinin yağar dövlət başından,
Birisi görməyib bir pul yaşından.
Birisi başə qoymuş taci-şahi,
Birisi baş açıq, yoxdur külahi.
Birisi nökər, birisi xan olubdur,

Birisi tabin, biri sultan olubdur.
Biri bir ləşkəri yalquzca qatdar,
Birinə "pıqq" deyibsən, bağrı çatdar.
Biri daim çalar cəngü çağanə,
Birisi ney kimi gəlmiş fəğanə.
Birinin ağzı gülməkdən yığışmaz,
Birisi dərdü möhnətdən göz açmaz.
Birinin mənzili qəsrül-kəramə,
Biri həsrət qalıb bir hisli damə.
Biri ətləs tuman geymiş, damaqlı,
Birinin bir tumanı var, yamaqlı.
Birisi bir tikə qəndə tamarzı,
Çay içməkdə biri qoymubdı arzı.
Birinin gözləri qarə, qələmqaş,
Yazıb guya qələmlə dəsti-nəqqaş.
Biri boynu qısıq, göygöz, əlavə,
Dodağı vərdənə, ağzı kəlavə.
Birinin ağzı püstə, zülfü rəstə,
Birinə vur təpik, sal abdəstə.
Biri salmış üzünə dəstə birçək,
Birinin kəlləsinə sal tüpürcək.
Biri dildarini çəkmiş qucağə,
Birisi odlanıb nari - fərağə.
Birisi kök, deyərsən pərvəridir,
Birisi bir sümükdür, bir dəridir.
Birisinin sözü mat etmiş əqli,
Birisi yazmış mənim tək tülkü nəqli.

## HACI MEHDİ ŞÜKUHİ
(1829—1896)

### QƏZƏLLƏR

Yenə, ey gözləri məftun, sənə məftunəm mən,
Zarü məhzunu digərgunü ciyərxunəm mən.

Nolu bir lütf ilə dindir məni, xoşnud öylə,
Gərçi düşnam ilə səndən, yenə məmnunəm mən,

Rəsmdir şüqqeyi-zənciri qırar divanə,
Vermişəm zülfünə dil, gör necə Məcnunəm mən.

İstərəm çox səni canımdan əziz, canın üçün,
And içəm canına nahaq yerə, məlunəm mən.

Busəi lütf qılıb, aldın əvəz can nəqdin,
Ala öz busəni, ver canımı məğbunəm mən.
Gözümün yaşı kimi tökmə əyağə meyi-nab.
Saqi can, təşneyi-ləli-ləbi-meygunəm mən.

***

Öldüm, nə deyim, dərdimi bir yara deyən yox,
Neylim ki, bu biçarəyə bir çarə deyən yox.
Ol zülfüpərişandır edən könlümü viran,
Al şanə elə zülfünü bir dara, - deyən yox.
Aşıq dilini özgə nə anlar, bir özüm tək
Yüz min dil ilə yalvara-yalvara deyən yox.
"Nə beylə çəkibsən üzə ol zülfi-siyahı?
Gəl verməgilən cənnəti küffara"-deyən yox.
Zülfün yelə vermə ki, verər ömrümü badə,
"Çox vermə həva beylə xatakara"-deyən yox.
Biçarə Şükuhi! Səni öldürdü bu zalım!
Səd ah, bu keyfiyyəti sərdara deyən yox.

## QOŞMALAR

Əbəs-əbəs çəkmə zəhmət sevdiyim,
Vermə ziynət xəttü xalə bir belə.
O gündən ki, sənə aşiq olmuşam
Yetməmişəm gül camalə bir belə.

Mən, saqican, bu sevdadan doymaram,
Gül üzünə tamaşadan doymaram,
Mən bu meydən, bu minadan doymaram,
Nə tutacaq bu piyalə? - bir belə.

Baş qoymuşdum astananın daşına,
Rəhm etmədin gözlərimin yaşına,
Məni səndən ayıranın başına,
Görüm tari bir daş sala, bir belə.

Şər, ilə mən səni qoymaram, zalım,
İstəsən molladan hökmünü alım,
Sən mənim mülkümsən, sən mənim malım,
Var əlimdə bir qəbalə, bir belə.
Məclisi-işrətin xəlvət olanda,
Rəqiblər dağılıb, fürsət olanda,
Vəslin Şükuhiyə qismət olanda,
Ona elə laməhalə, bir belə.

***

Bülbül kimi bu gülşənə gəlmişəm,
Lalə görüm, sünbül görüm, gül görüm.
Deyirlər səndə var çox işvə, xəndə.
Bircə kəlmə danış görüm, gül görüm!

Bir yol gördüm, yıxdın xanımanımı,
İtirdin aləmdə adü sanımı,
Bir də üzün göstər, gəl al canımı,
Gəlmişəm, tarıya təvəkkül, görüm.

Mən razıyam hər nə olsa müqəddər,
Zülmün Şükuhiyə xoşdur, sitəmgər!
Bu mən, bu baş, bu yol, bu sən, bu xəncər,
Zəhmət çəkib ayağa dur, gəl görüm!

## BİXUD
(1830 — 1892)

### QƏZƏL

Cövr ilə tökdü qanımı, fəryad, gözlərin,
Öldürdü aqibət məni cəllad gözlərin.

Hər yanda bir ümmid evi tikdimsə səbrdən,
Yıxdı, dağıtdı, eylədi bərbad gözlərin.

Min can alır baxanda bir oğrun nigah ilə,
Kimdən alıb bu dərsi ol ustad gözlərin?

Qalmaz Xətada, Çində ahu, edər şikar,
Bir guşə ilə baxsa o səyyad gözlərin.

Etməz əsər sənə dili-biçarə naləsi,
Qan içməyə olub dəxi mötad gözlərin.

Zülfün kəməndinə dili-misgin əsir olub,
Rəhm eyləyib nola edə azad gözlərin.

Eylə şəhid Bixudi tiri-nigah ilən,
Xunrizlikdə ta ki, qoya ad gözlərin.

## BİKƏS
(? — ?)

Hər kəsin var kimsəsi, mən Bikəsin yox bir kəsi
Kimsəsiz qaldım, mədət qıl, Kimsəsizlər Kimsəsi.

## SƏFİQULU BƏY
(? — ?)

### QƏZƏL

Tutdu qəm ləşkəri yüz könlümə hamun-hamun,
Qara baydaqlı ələmlər, ucu gülgun-gülgun.

Cigərimdən genə od parladı duzəx-duzəx,
Ürəyimdən genə qan qaynadı Ceyhun-Ceyhun.

Çağırırdım uca avaz ilə: - Leyla, Leyla!
Dağ səs verdi cavabımda ki, Məcnun, Məcnun!

Yığmışam hasili-qəm yanıma xirmən-xirmən,
Yetə bilməz mənim imkanıma Qarun, Qarun.

Bu nə viranə könüldür, Səfi, ey vay, ey vay!
Sərvlər var belə bu bağdə mövzun-mövzun.

## ƏBÜLHƏSƏN RACİ
(1831 — 1876)

### NÖVHƏ

Aləm niyə bəs olmadı viran, Əliəkbər?
Ol gün ki, səni saldılar atdan, Əliəkbər?
Bu şiələr ey kaş cəhənnəmdə yanaydı,
Zülfün təki hircə teli qanə boyanaydı,
Çərxin görüm ol gündə bu dövrü dolanaydı,
Cövri-bərini aldılar üdvan, Əliəkbər.

Bu üqdəni, bu şiələrin həll edə müşkül.
Vermüb su, kəsib təşnə sənin başıvı qatil.
Olsun o sərin su içən aşiqlərə nisgil
Verdin sən o zəxminlə susuz can, Əliəkbər.

Leyla gecələr sübhə kimi yatmadı rahət
Sən kimi cavan bəslədi ey kani-məlahət.
Axır nə rəvadır qala didarivə həsrət
Düşmən eləyə qanıva qəltan, Əliəkbər.

Məşhurdu hərçənd qəmi möhnəti-Yusif,
Kur eylədi Yəqub gözün firqəti-Yusif,
Amma ona bir vəqt yetib həzrəti-Yusif
Kim olmuş idi Misirdə sultan, Əliəkbər?

Tapdı səni bir vaxtda o Yəqubi-Mədinə,
Yıxmışdılar rəna qədivi ruyi-zəminə,
İstərdi kəsə başıvı ol ləşkəri-kinə,
Tutmuşdu sənin gözlərivi qan, Əliəkbər.

## ƏFRAD

Dur, ey cəfa ilə sərvi-qəddi şikəstə oğul,
Hava çox istidü, yatma quru yer üstə oğul.

Cəfavü çəkdim oğul, qaməti rəsa oldum,
Qəddim büküldü, əliməəcəb əsa oldum.

Əcəb mənim qoca vaxtımda dadimə yetdin,
Ki, qürbət ölkədə yalqız qoyub məni getdin.

Cahanda heç ata görməyib belə oğul ölümü,
Gözümü saldın işıqdan, xəm eylədin belimi.

Oğul ata qocalan vaxtda əlini tutar,
Şərik olur qəminə, qəm günü olur qəmxar.

## QƏZƏLLƏR

Genə bu tazə, könül mehri bir cavanə salıb,
Genə bu pir, ələ bir Yusifi-zəmanə salıb.

Xəyali-xalü ləbü xəttü zülfü rüxsarın,
Bu qış günü məni bir səhni-gülüstana salıb.

Bu piçütabilə mümkün deyil, üzülməyəcək,
Belə ki, nazilə qəmzən kəşan-kəşanə salıb.

Nigahi-çeşmin əlindən sümüklərim əridi,
Gəlib hüma quşu tək, meyl üstüxanə salıb.

De bülbülə ki, bilir suzi-eşqi pərvanə,
Özünü şəmin ayağına yanə-yanə salıb.

Tamam xalq mənə olsa qəmküsar, azdır,
Fələk bu dərdi ki, bu cismi-natəvana salıb.

Xəyali-muyi-miyanında mu tək incəldim,
Bu mətləb indi məni nükteyi-nihanə salıb.

Könüldən ötrü gözəl ömrü hiç, yox etdim,
Görün, könül məni nə dərdi-nàgahana salıb?!

Nədamətin çəkər, axırda sudimənd olmaz,
Əbəs yerə özünü Raci bu ziyanə salıb.

***

Nə qədər sən kimi bir qönçə dəhanım yox idi,
Ey pərivəş, bu qədər ahü fəğanım yox idi.

Tutiyayi-xəti, can nəqdinə alsaydım əgər,
Ey gözüm, bil ki, bu sevdadə ziyanım yox idi.

Yarə rəmz ilə hamı dərdimi bildirdim mən,
Kəşfi-raz etməyə, hərçənd, zəbanım yox idi.

Səri-kuyin mənə dünyadə əta eylədi haq,
Çünki üqbadə mənim meyli-çinanım yox idi.

Gördü bir suzilə, yandı bu gecə halıma şəm,
Çünki bir şəm kimi canıyananım yox idi.

Neməti-vəslinə səd şükr, yetişdim bircə,
Mənim öz taleimə hiç gümanım yox idi.

Raci, yazdım qala məndən bu qəzəl namü nişan,
Çünki, aləmdə mənim namü nişanım yox idi.

***

Saqi, nə olubdur, məni yadə gətirməz?
Könlüm tutulubdur, mənə bir badə gətirməz.

Rəhmə gələr axər, gətirər saqi meyi-nab,
Gül fəslidi, səd heyf, bu əsnadə gətirməz.

Zahid tapa gər taqi-qaşın səcdəsin, ey şux,
Mehrabi-ibadətlərə səccadə gətirməz.

Naqislərə təklif eləmin eşq rümuzun,
"Əbcəd" deyi, hər tifli bu, irşadə gətirməz.

Məhbus elə zülfündə könül mürğünü, yoxsa,
Divaneyi-qəm tabını qəllade gətirməz.

Hərçənd dedin, Raci, de bu beyti mükərrər:
Saqi, nə olubdur, məni bir yadə gətirməz.

***

Nə eşq olaydı, nə aşiq, nə hüsni-dilbər olaydı,
Nə ayinə, nə səfa, ey könül, nə cövhər olaydı!

Nə nazü qəmzə, nə qünçü dəlalü, nə işvə,
Nə iczü labə, nə xunabi-dideyi-tər olaydı!

Nə zülf olaydı, nə ariz, nə xal olaydı, nə xət,
Nə mişk olaydı, nə məcmər, nə udü ənbər olaydı!

Nə hüsn olaydı, nə könlüm, nə dəstə-dəstə bu zülf,
Nə şah, nə mülk, nə bu fövc-fövc ləşkər olaydı!

Nə əbruyi-xəm olaydı, nə çeşmü nə müjgan,
Nə tiğ olaydı, nə cəllad, nə də bu xəncər olaydı!

Nə rəqs olaydı, nə mütrib, nə cəng olaydı, nə tar,
Nə bəzm olaydı: nə saqi, nə mey, nə sağər olaydı!

Əzəl nə nəşə olaydı, sonra nə rənci-xumar,
Nə təbşi-vəsl, nə ənduhi-hicri-dilbər olaydı!

Nə yalvaraydı rəqibə bu payədə üşşaq,
Və nə bu mərtəbə məşuqələr sitəmgər olaydı!

Nə şur olaydı, nə bülbül, nə gül olaydı, nə xar,
Nə lütfi-badi-bəharü nə cövri-sərsər olaydı!

Nə dil olaydı, nə qamət, nə qəlb olaydı, nə ruh,
Nə şəmü şölə, nə pərvanə, nə səməndər olaydı!

Nə gül, nə ətr, nə şümşad olaydı, nə şanə,
Nə zülf olaydı, nə məşşatə, nə bu zivər olaydı!

Nə şərhə-şərhə olaydı, bu sinə tiğinlə,
Nə şərhi-dəftəri-dərdü bəla, nə müstər olaydı!..

Nə hicr olaydı, nə giryə, nə künci-qəm, nə bu ah,
Nə abü ateşü xakü həva müxəmmər olaydı!

Nə tifl olaydı, nə məktəb, nə dərs olaydı, nə elm,
Rümuzi-eşq nə dillərdə böylə əzbər olaydı!

Nə kuyi-yari qoyub xalq, edəydi meyli-behişt,
Nə şeyx olaydı, nə məscid, nə vezi-mənbər olaydı!

Nə dil olaydı, nə didə, nə əşki-xunalud,
Nə kan olaydı, nə dərya, nə ləlü gövhər olaydı!

Nə intinabü nə tövbə olaydı, nə pərhiz,
Nə şikəsti-tövbə, nə peymandən füzuntər olaydı!

Məzaqi-Raci nə şirin olaydı, nə belə təlx,
Nə hicri-zəhri-həlahil, nə fəsli-şəkkər, olaydı!

***

Məndən, səba, de ol gülə: qurbanınam sənin,
Rəhm etgilən bu bülbülə, qurbanınam sənin;

Bu eşq oduna öz gözü könlüm salıb məni,
Səndən yoxumdu heç gilə, qurbanınam sənin.

Hərçənd istərəm sənə bir özgə söz deyəm,
Bu söz genə gəlir dilə: "Qurbanınam sənin!"

Hüsnün zəkatını mənə eylə bu il əta,
Qoyma qala gələn ilə, qurbanınam sənin.

Vəslində al bu canımı asan, xilas elə,
Hicrində salma müşkülə, qurbanınam sənin.

Gəlmiş yuxarıdan aşağı, saxla izzətin,
Çox hörmət eylə kakilə, qurbanınam sənin.

Min dəfə gündə öldürəsən nazilən məni,
Yoxdur mənim sözüm belə, qurbanınam sənin.

Bari edib bəhanə, acıqlanma Raciyə,
Al canını, gülə-gülə, qurbanınam sənin.

## MİR MÖHSÜN NƏVVAB
(1833 — 1919)



*Şuşada, sənətkar ailəsində anadan olmuşdur. Mükəmməl təhsil alıb. Rus, türk, ərəb və fars dillərini bilirmiş. "Məclisi - fəramuşan" şer məclisinin fəal üzvlərindən olub. "Təzkireyi-Nəvvab", "Qarabağ şairləri", "Nəsihətnamə", "Firdovsiyə nəzirə" və s. əsərlərin müəllifidir. Rəssam kimi də tanınır. Musiqiyə aid əsərləri var. Klassik ədəbiyyatın müxtəlif janrlarında əsərlər yazıb. Fars dilində də əsərləri məlumdur. Şuşada vəfat etmişdir.*

Ey bivəfa, qoyubsan əcəb qalə tək məni,
Hicran odun əhatə edib halətək məni.

Bilməm, nə etmişəm sənə zalim, nə zülmdür,
Etdin kəbab atəşi-cüvvalətək məni.

Allah rizası etməginən xar eşqdə,
Aşiqlər içrə dağlama sən lalətək məni.

Bir ləhzə gər üzülsə əlim qürbi-vəslidən,
Eylə yəqin ki, yandıru səd salətək məni.

Nəvvabı zarü zərd edib oxşatdı qəmlərin
Divari-qəmdə nəqş olan əşkalətək məni.

### SULTAN HƏMİDƏ

Nərədə qalıb həzrəti xeyrül bəşər,
Hümmətinə şövq ilə etsin nəzər.
Ləşkəri yunanı necə tarü-mar
Eylədilər əsgəri fəthü zəfər.
Səngərini, tiqlərini bitamam
Topu şərərbar ilə zirü-zəbər.
Qələləri xak ilə yeksan qılıb

Vəliəhdi eylədilər dərbədər.
Qürur edən ləşkəri ədalərin
Ədəm diyarına hamu köçdülər.
Aldı səda aləmi əflakidən,
Söylədi ol dəmdə qəzavü-qədər.
Sayeyi alisi cahanə müfid
Çox yaşasın həzrəti Sultan Həmid.

## QARADAĞ XANINA

Otuz dəfə dad etmişəm sənə mən
Zahidlərə uymagilən ağa, sən.

Yüz il əyləş hüzurunda zahidin,
Görəcəksən onda dərdə dəva sən?

Dəva bilsə keçəl başına eylər,
Cənabına bulma zəhmət rəva sən.

Yüz il sənə vədə verə inanma,
Politkadır saf bilginən hava sən.

Nəvvabdan qəbul qıl nəsihət
Ta görəsən dərdlərinə səfa sən.

# MƏMO BƏY MƏMAİ
(1834 — 1918)

## QƏZƏL

Bir bikəsi-zarəm vətənimdə, vətənim yox,
Bir bülbülü-bibalü pərəm, vay, çəmənim yox.

Mən sahibi-hər məcməi, hər əncüman oldum,
Əfsus nə bir cəm, nə bir əncümənim yox.

Viranə qalıb "Məclisi-üns"üm, dağılıbdır,
Nə yar, nə qəmxar, nə bir həmsüxənim yox.

Bir guşeyi-bağ içrə qalıb bikəsü tənha,
Nə bir soran əhvalımı, nə bir gələnim yox.

Əfsus, bu məxluq hamı kurü kar olmuş,
Nə bir görənim var, nə bir dilbilənim yox.

Xunabi-ciyər caridi gözdən gecə-gündüz,
Ruxsarə axan göz yaşımı bir silənim yox.

Göz ilə qulaqdan çəkərəm zəhməti - bih edd,
Ruhani əziyyətlər üçün tabi - tənim yox

Bir yanda vətən təhlükəsi canımı almış,
Bir fəhm edənim, anlayanım, dərk edənim yox.

Ərbabi-kəmalət zamanı getdi, Məmai,
Qaldım bu bəla dəştdə, imdad edənim yox.

## BAHAR ŞİRVANİ
(1834 — 1883)

### QƏZƏLLƏR

Mey nuri cilvə eylədi cami-bülurdən,
Cami-büluri gör ki, ləbaləbdi nurdən.

Cami-büluridə məni mey yaxdı durdən,
Əlbəttə yandırar düşə gər gün bülurdən.

Xət gəlmək ilə ruyüvə hüsnün olurmu kəm,
Nöqsan yetərmi mülki - Süleymanə murdən?

Zahid sözüylə nə bütü meyxanədən keçim,
Özü görək keçirmi behişt ilə hurdən?

Ol gülüzar necə vəfadən əlim tutar?
Basmaz ayağını gözümə çün qürurdən.

Naz ilə bir xuramə gəl, əmvatə qıl güzar,
Ta mərhaba səsi gələ əhli-qüburdən.

Meyxanəyə Bahar şüur ilə meyl edər,
Zahid qüsurə meyl qılır, gər qüsurdən.

***

Derdim o məst gözlərivün çox bəlası var,
Gördüm o qara zülfü, onun də xətası var.

Hərgiz behiştə meyl eləməz, huri istəməz,
Hər aşiqin ki, sən kimi bir dilrübası var.

Derlər bəhadır ağzına can, bilməzəm neçün
Bu yox olan şeyin bu qədər çox bəhası var?!

Hər ləhzə sinəm üzrə xədəngin qoyar başın,
Səndən genə xədəngüvün artıq vəfası var.

Müjganın ilə çeşmüvi gər sorsalar nədir,
Bimar piri gör ki, əlində əsası var.

Badami gözlərindir edən xəstə könlümü,
İnnab ləblərindən o dərdin dəvası var.

Bir naz ilə xuramə gəl, ey sərv, ta görək
Hüsn içrə hansı sərvqədin iddiası var.

Yox eybi gərçi hicrin ilə ölməgin, vəli
Hüsnün görəndə ölməyin özgə səfası var.

Fəxr eylə kim, qulamınam, ey xublər şəhi,
Hansı şəhin Bahar kimi bir gədası var?

***

Hər kim ki, hicri-yar ilə düşsə dimağdən,
Heç açılırmı könlü onun seyri-bağdən?

Sordum sorağını, dedilər: qeyrə yar olub,
Ey kaş, lal olaydı dilim bu sorağdən.

Ölməkdən özgə yox mənə eşqində bir vüsul,
Pərvanə yanmağın sevər ancaq çirağdən.

Bir lalə üzlü yar çəkib dağ sinəmə,
Ya rəb, sən etmə sinəmi xali bu dağdən.

Yetdikdə gül dodağüvə mey, bilməzəm alır
Meydən dodaq nəşəni, ya mey dodağdən?

Sənsiz əgər bahar açıla, istəməz Bahar;
Nə qönçə bağdan açıla, lalə dağdən.

## SEYİD ƏZİM ŞİRVANİ
(1835 — 1888)



*Qədim Şamaxı şəhərində doğulmuş, yaşayıb-yaratmış və dəfn olunmuş Seyid Əzim Şirvani XIX əsr Azərbaycan ədəbiyyatının görkəmli simalarındandır. Seyid Əzimin poetik irsi geniş və rəngarəngdir. Mütərəqqi ideyalar təbliğ edən şerlər, didaktik mənzumələr, kəskin satirik əsərlər, həcvlər, Füzuli ruhunda aşiqanə qəzəllər, habelə dini mövzularda mərsiyələr, növhələr Seyid Əzim yaradıcılığının dəyərli örnəkləridir.*

*Seyid Əzim Şirvani çoxəsrlik Azərbaycan şerinin zəngin toplusunu, geniş əhatəli antologiyasını, müxtəlif şairlərin əsərlərindən nümunələr verən "Təzkirə"sini yaratmaqla da ədəbiyyat tariximizə müstəsna xidmət göstərmişdir. Seyid Əzim eyni zamanda görkəmli maarif xadimi, öz məktəbində böyük Azərbaycan şairi Mirzə Ələkbər Sabirə dərs vermiş müəllim olub.*

### QƏZƏLLƏR

Əmərəm ləblərini ta nəfəsim var mənim,
Tutiyəm şəkkərə, ey gül, həvəsim var mənim.

Gəldi qanımı töküb yar qurtarsın qəmdən,
Şükr lillah ki, könül, dadrəsim var mənim.

Bənd-bəndim kəsələr eyləmərəm tərki-fəğan,
Qoy nəva ney tək edim ta nəfəsim var mənim.

Mürği-bağı-mələkutəm qəfəsi-çərxə əsir,
Bu əcəb təng olan gör qəfəsim var mənim.

Bikəsəm aləm ərə, dərdü qəmindən özgə,
Nə həvadarü nə yavərü nə kəsim var mənim.

Etmişəm gərçi bu dəm aləmi-nasutü vətən,
Ey könül, boylə deyil, pişü pəsim var mənim.

Karivan getdi, könül, qafil edirsən nalə,
Dəmbədəm naləvü bəngi-cərəsim var mənim.

Mövti-cismani ilə sanma mənim ölməyimi,
Seyyida, ölmərəm, aləmdə səsim var mənim.

***

Gecə gördüm səni ey afəti-dövran yuxuda
Ki, edərdin mənə yüz lütfi-firavan yuxuda.

Görmüşəm ləlini, lazımdı tökülsün qanım,
Etibar olmaz əgərçi görələr qan yuxuda.

Zahirən abi-baqayə etcək xəstə könül,
Kim, bilibdir dəhənin sirrini pinhan yuxuda.

Nola ləlin görübən zövq ilə xəndan olsam,
Rəsmdir şad olur hər kim ola giryan yuxuda.

Var ümidim ola cəmiyyəti-vəslin məqdur,
Ki qara zülfünü göz gördü pərişan yuxuda.

Gecə gördükdə səfayi-rüxün ey Kəbəyi-hüsn,
Kaş olaydım dolanıb başına qurban yuxuda.

Seyyidi-zar görüb vəslini bidar olmuş,
Bir gədadır ki, görüb özünü sultan yuxuda.

***

Maşallah, bu gözəl kimdi ki, Şirvanə gəlib,
Ləbini mürdəyi-sədsalə görüb canə gəlib.

Həmdlər xadiqi-bimislə ki, Şirvanı genə,
Salmağa tazədən ol müğbəçə samanə gəlib.

Meydə yox ləli-ləbində olan asari-səfa,
Sanma kim, gərdişə hərgiz belə peymanə gəlib.

Vərəqi-arizi-alın görüb ol lalə rüxün,
Bağ ara bülbüli-şeyda genə əfğanə gəlib.

Demərəm adını mən, bax səri-hər beytə bu gün,
Bilisən Seyyid özün kimdi ki, Şirvanə gəlib.

***

Dolanım başına ey nazlıca yanım, bəri bax,
İşvəli, qəmzəli, çəm-xəmli nigarım, bəri bax.

İşvə ağaz qılıb səbrimi tarac etmə,
Getdi dildən dəxi aramü qərarım, bəri bax.

Xəm emiş qamətim əbrulərinin qurbanı,
Zülfi-pürtabına qurban təni-zarım, bəri bax.

Bu cəfadidə dil, ol kakili-mişkinə fəda,
Gözlərin sədəqəsi bu cismi-fikarım, bəri bax.

Can nisar etməyə amadədi Seyyid, gözəli,
Gər desən lütfilə: ey aşiqi-zarım, bəri bax!

***

Dün dolandım başına, söylədi pərvanədi bu,
Zülfün aldım əlimə, güldü ki, divanədi bu.

Həlqəyi-zülfdə gör xali-siyahın ey dil,
Birisi dami-bəladır, birisi danədi bu.

Arizi-yarıma bax, yoxdu gər əqlində qüsur,
Vaiza, vəsfi-behişt eyləmə, əfsanədi bu.

Sanma məscid kimi, bisidqü iradət gəlmə,
Ey gözüm, gözlə ədəb, guşeyi-meyxanədi bu.

Bu deyil pərdeyi-üşşaqi Nəhavəndü hicaz,
Qülğülə ərşə salan nərəyi-məstanədi bu.

Seyyida, çək gözə eyvani-tila sürməsini,
Can etib kamına kim, mənzili-cananədi bu.

***

Sənsiz ey ruhi-rəvan təndə təvanım yox idi,
Təni-zarımda təvan, cismdə canım yox idi.

Ölməyib hicrdə kim, vəslinə yetdim ey məh,
Səxt-can olduğuma böylə gümanım yox idi.

Olmasa kimsə qəmimdən mənim agəh deyibən,
Gərçi dərdim çox idi, ahu fəğanım yox idi.

Ta səhər zülfü-siyahı dəhnin yadı ilə,
Yox idi şəb ki, mənim suzi-nihanım yox idi.

Kakilin şövqi ilə Seyyidi-sərgəştə kimi,
Dolanırdım, o səri-kuydə məkanım yox idi.

***

Rəhm etmədi əhvalıma yarım belə keçdi,
Bir baxmadı ol nazlı nigarım belə keçdi.

Həngami-bahar oldu, işim beylə xəzandır,
Yarəb nə olur, çünki bəharım belə keçdi.

Gündüzdür işim nalə, gecə göz yaşı həmdəm,
Ol zülfü rüx eşqində mədarım belə keçdi.

Saldım özümü payi-səməndinə o şahın,
Lütf etmədi ol şahsüvarım belə keçdi.

Yar özgələrin məclisinin oldu çırağı,
Mən hicrdə qaldım şəbi-tarım belə keçdi.

Seyyid, o qarə gözlü mənim kəsdi qərarım,
Səhrayi-məhəbbətdə qərarım belə keçdi.

***

Qurban olum o gözlərə kim, gördü yarımı,
Yarım görən göz, əlbət alır ixtiyarımı.

Qoy bir öpüm o gözləri, kim yarımı görüb,
Qurban edim o gözlərə, mən hər nə varımı.

Nərgis gözü qalır açıla görsə bağdə,
Çeşmi-xümarü sərv-qədi-gülüzarımı.

Mərdümlük olmadı mənə çün çeşmi-yardan
Kəsdim gözümdən axın öz etibarımı.

Bimarı olmuşam mən o badami gözlərin.
Ənnab gözlərim eləsin fikri-karımı.

Şadəm ki, xak edə məni bu çərxi-kecmədar
Damani-yarimə yetirə ta qübarımı.

Seyyid, o gün olurmu genə səhri-bağdə
Xürrəm görüb şüküftə güli-növbaharımı?

***

Verməzəm könlümü bir dilbərə bundan sonra,
Olmaram aşiq o siminbərə bundan sonra.

Aldı imanımı əldən, məni bidin elədi,
Aşina olmaram ol kafərə bundan sonra.

Oxşayır mahi-fələk çünki üzari-yarə,
Baxmaram mən bu məhi-ənvərə bundan sonra.

Badənin ləli-ləbi-dilbərə çün nisbəti var,
Tökmərəm badəni mən sağərə bundan sonra.

Ənbəri - zülfünün ol qədr ziyanın deyərəm,
Kimsə rəğbət eləməz ənbərə bundan sonra.

Dəxi ol sərvi-qədin kuyinə cənnət deyibən
Gəzmərəm küçələri heyvərə bundan sonra.

Etmərəm zülfünün övsafını, şair deməsin
O pəri Seyyidi-qəmpərvərə bundan sonra.

## YATMASI GÖZƏLDİR

Dedi bir əhli-elmə bir zalim
Key olan şər sirrinə alim
Mənim üçün buyur ibadətdən
Hansı əfzəldi cümlə taətdən?
Dedi: Ey padişahi zülm şitab,

Sənə əfzəldir, hər bir işdən, xab.
Ta yatan vaxtda, ey fələkkirdar,
Görməyə xalq bir nəfəs azar.
Padşahlarda ədl əhsəndir,
Fitnənin yatmağı mühəssəndir.

## OĞLUMA

Cəfər, ey qönçeyi-gülüstanım!
Ey mənim bülbüli-xoş əlhanım!
İki yüz yetmiş üçdə, bəd həzar
Mötədil fəsl idi zəmani-bahar,
Səni haqq mən fəqirə qıldı əta,
Kəbeyi-qəlbimə yetişdi səfa.
On beş ildir ki, ey ətayi-əzim,
Sənə adab eylərəm təlim.
Yetibən əqlə sərfiraz oldun,
Dəxi məndən ki, biniyaz oldun.
Demirəm mən gedən təriq ilə get,
Əqli tut, ol gözəl rəfiq ilə get.
Sənə bürhan deyil təriqi-pədər,
Gör nə yol getdi zadeyi-Azər.
Demirəm, rus ya müsəlman ol.
Hər nə olsan, get əhli-ürfan ol,
Demirəm sünni ol və ya şiə
Tək hədəf olma tiri-təşniə.
Demirəm şeyxi ol və ya babi,
Hər nə olsan, tək olma qüllabi.
Ey gözüm nuru, ey ətayi-xuda,
Sənə Şirvanda oldu nəşv-nüma.
Lillahül-həmd xütteyi Şirvan
Saniyi-İsfəhandır bu zaman.
Gərçi viranə oldu zəlzələdən,
Çıxmayıb mərifət bu mərhələdən.
Vardır hər güşədə yüz əhli-kamal,
Hər biri əhli-elm sahibi hal.
Xassə kim abü xakinin əsəri,
Qabili tərbiyət qılır həcəri.
Rəmzi-həl yəstəvi müdəlləl imiş,
Bilməyəndən bilən kəs əfzəl imiş.
Haqq buyurmuş ki, ixtilafi-lisan
Nemətimdəndir, ey güruhi-cahan!
Kim ki, bəs bir dil eyləsə hasil,

Oldu bir nemətə o kəs vasil.
Cəhd qıl neməti-tamama yetiş,
Elm təhsil qıl məqamə yetiş.
Ey oğul, bir lisana ol rağib,
Xassə ol rus elminə talib.
Onlara ehtiyacımız çoxdur.
Bilməsək dil, əlacımız yoxdur.

## RÜBAİLƏR

Nəfti-siyahə mədənü kandır Baki,
Bəhri-Xəzər ətrafında yandır Baki,
Əhli qocalar, həddi-buluq olmazlar,
Təkmilə yetişməyən cavanədir Baki.

Təbrizdə təbdən ciyərim qan oldu,
Yandı bədənim atəşi suzan oldu,
Təblərzəyə düşdüm, nə təbib etdi əlac,
Nə kimsənədən dərdimə dərman oldu.

Gəldim, gördüm ki, bağdə yarım yox,
Getdim, bildim ki, onda dildarım yox,
Öldüm, demədim sirri-dəhanın o gülün,
Var yar, vəli, məhrəmi-əsrarı yox.

Ey badi-səba, kuyinə yarın güzər et,
Bir qeyr kəs olmasın yanında, nəzər et,
Can verməkmi həsrəti-ləlindən onun,
Canıma təqrib ilə söz sal, xəbər et.

Görsəydim əgər yarımı billəm nə deyərdim,
Tapsaydım o dildarımı, billəm nə deyərdim,
Gördükdə o şirindəhənin arizi-alın,
Dil çaşmasa, göftarımı billəm nə deyərdim.

Ey Şeyx Nizami, ey nizamı dağılan,
Ey Gəncədə izzü ehtişamı dağılan,
Olmuşmu səninlə mən kimi aləmdə,
Beyti, evi, məktəbi, kəlamı dağılan?

# XURŞİD BANU NATƏVAN
(1832 — 1897)



*Xan qızı adıyla da tanınan Xurşid Banu Natəvan Azərbaycanın qadın şairləri arasında xüsusi yer tutur. Sonuncu müstəqil Qarabağ xanı İbrahim xan Cavanşirin nəslindən olan Mehdiqulu xanın qızı Xurşid Banu mədəniyyət tariximizə yalnız şairə kimi deyil, həm də incə rəssam kimi, "Məclisi-üns" ədəbi məclisinin rəhbəri kimi daxil olub. Natəvanın həzin lirikasında sevimli oğlu Mir Abbasın vaxtsız ölümündən sonra kədərli, faciəvi motivlər daha da güclənmişdir. Azərbaycanın ədəbi aləmində böyük nüfuz sahibi olan Natəvan doğma şəhəri Şuşada sadə xalqın qayğısına qalmağıyla, bir sıra xeyirxah işləriylə, o sıradan şəhərə su çəkdirməsi ilə də dərin hörmət qazanmışdır.*

## QƏRƏNFİL

Səni kimdir sevən bica, qərənfil?
Sənə mən aşiqi-şeyda, qərənfil!

Səni gülşən ərə aşuftə gördüm,
Yəqin bildim tutub sevda, qərənfil!

Belə pəjmürdə hal ilə durubsan,
Düşər güllər ərə qovğa, qərənfil!

Driğa kim, vəfasızdır bu gülşən,
Gedər bu tələti-ziba, qərənfil!

Üzündən pərdeyi-nazın kənar et!
Unutma aşiqi, haşa qərənfil!

## QƏZƏLLƏR

Əgərçi xoşdu mənə ətri, həm səfası gülün,
Cəfası çoxdu, nə hasil ki, yox vəfası gülün.

Cəfayi-xarı görüb köçdü bağdən bülbül,
Görən kim oldu bir gülşəndə aşinası gülün?

Xəzanə meyl elədi, almadı vəfa nəzərə,
Yetişdi bülbülə çox-çox qəmü cəfası gülün.

Tökər sirişk əvəzində gözüm üzə al qan,
Olubdu çünkü könül zarü mübtəlası gülün.

Yazılsa nöqtəbənöqtə, deyilsə hərfbəhərf,
Qurtarmaz həşrə qədər halü macərası gülün.

Üzari-alinə baxdıqca qan olur dillər,
İlahi, həddən aşır möhnətü bəlası gülün.

Xəta yoluna düşüb bülbülə cəfa qıldı,
Xətaya saldı özün aqibət xətası gülün.

Cahanda zərrə qədər olmaz, ey könül, xəndan
Ki, xuni-bülbül əgər olmasa ğəzası gülün.

Tutardı xuni-cigərdən olaydı gər sirab
Günəş tək hər tərəfi, Natəvan, ziyası-gülün.

***

Nə mən olaydım, ilahi, nə də bu aləm olaydı!
Nə də bu aləm ərə dil müqəyyədi-qəm olaydı!

Nə hicr atəşinə odlaşıb yanaydı dilim ki,
Nə eşqin içrə könül böylə şadü xürrəm olaydı!

Nə sərv qəddin olaydı, nə həsrətinlə gözüm kur,
Nə ruzigari-məraqində, qamətim xəm olaydı!

Nə bəhr olaydı, nə ümman, nə böylə göz yaşı cari,
Nə gül üzündə, ilahi, bu növi şəbnəm olaydı!

Nə gül olaydı, nə gülzarü gülşənin dəxi seyri,
Nə xari-mehnəti-bülbül, səninlə möhkəm olaydı!

Nə Misir olaydı, nə Kənan, nə həzrəti Yəqub,
Nə xar olub qəmi-hicranda, qərqi-matəm olaydı!

Nə çah olaydı, nə zindan, nə karivan güzəri,
Nə Yusifi bu bəladə görən bir adəm olaydı!

Nə bəzm olaydı, nə bazari-Yusif əhvalı,
Nə rəhgüzərdə Züleyxa onunla həmdəm olaydı!

Nə ah olaydı, nə əfsus, nə parə-parə könül,
Nə Natəvanın həvası bu növi dərhəm olaydı!

***

Qoyubdur intizarında, neçin gəlməz, neçin gəlməz?
Həmişə ahü zarında, neçin gəlməz, neçin gəlməz?

Üzüldüm karivanımdan, əl üzdüm xanimanımdan,
Fələk incir fəğanımdan, neçin gəlməz, neçin gəlməz?

Gedibdir qafiləsalar, olubdur gözlərim xunbar,
Nə bir yarü nə bir qəmxar, neçin gəlməz, neçin gəlməz?

Könüldə ahüzarım var, nə səbrü, nə qərarım var,
Deməz bir dilfikarım var, neçin gəlməz, neçin gəlməz?

O zülfi-nərgisi-məstə könül çoxdandı pabəstə,
Məni hicran edib xəstə, neçin gəlməz, neçin gəlməz?

Səri-kuyin gəzər könlüm, güli-ruyin sevər könlüm,
Visalın çün dilər könlüm, neçin gəlməz, neçin gəlməz?

Alıbdır canımı hicran, olubdur gözlərim giryan,
O məhvəş, nazənin canan neçin gəlməz, neçin gəlməz?

Mənə hicran məşəqqətdir, fəraqin dərdü mehnətdir,
Nigarım xeyli müddətdir neçin gəlməz, neçin gəlməz?

Əzizim, göz yaşım qandır, işim fəryadü əfqandır,
O yarım harda mehmandır, neçin gəlməz, neçin gəlməz?

Yanar canım fəraqından, tutar könlüm sorağından
Ki, çıxsın yar otağından, neçin gəlməz, neçin gəlməz?

Əlimdə ixtiyarım yox, gedib səbrim, qərarım yox,
Yanımda gülüzarım yox, neçin gəlməz, neçin gəlməz?

Səba, ol məhliqa dilbər, alıbdır canımı yeksər,
Könül ancaq onu istər, neçin gəlməz, neçin gəlməz?

Yetibdir ərş üzə dadım, tutub dünyanı fəryadım,
Mənim ol sərvi-azadım neçin gəlməz, neçin gəlməz?

Qalıbdır Natəvan nalan, gecə-gündüz olur giryan,
Onun yox dərdinə dərman, neçin gəlməz, neçin gəlməz?

***

Yanar canım, oğul, daim sənin nari-fəraqında,
Necə pərvanələr hər dəm yanar şəmin ayağında.

Güli-ruyün həvasilə çıxar əflakə əfğanım,
Olur bülbül nəvası gül fəraqü iştiyaqında.

Sənin vəslin xəyaliylə gözü könlüm gəzər daim
Ki, çün Məcnuni-sərgəştə, gəzər Leyla sorağında.

Nəhali-qamətin zikri mənim virdi-zəbanımdır,
Dəmadəm naleyi-qumri olur sərvin budağında.

O şirin ləblərin şövqü günü gündən olur əfzun,
Əgər Fərhad tək yüz il dolansam hicr dağında.

Hərisəm bəs ki,ol şirinzəbanın zikrinə hərdəm,
Olur xoş nitqli tuti, şəkər olsa dəmağında.

Sənin hicrin odu, Abbas, dəxi, çıxmazki canımdan,
Səməndər tək yanar daim anan nari-fəraqında.

Uçub şəhbaz tək könlüm, gəzərdi vəsl bağında,
Pərü balını sındırdı fələk, bu pir çağında.

Gözümdə tardır dövran, məhü xurşidi-nurəfşan,
Məhaq içrə olub pünhan, sanasan çərx tağında.

Sirişkim birlə kim, xali deyildir qamətin gözdən,
Nə tez düşdü təravətdən o sərvin su qırağında.

Nolaydı kur olaydım, görməyəydim gül kimi cismin,
Qalıbdır tirə xak içrə, məzarın gün qabağında.

Könüldə həsrətim qaldı, məzarın heyf kim, bir dəm
Səni ta görmədim xürrəm, oğul, damad otağında.

Nədəndir intizar ilə, o şəhla göz baxar heyran,
Gözüm ol gözlərə qurban, baxar ahu sayağında.

Həmişə zarü dilməhzun, tökər gözdən sirişki-xun,
Pərişan hal ilə daim, qəmü mehnət bucağında.

Qəmi-hicran edib tüğyan, qalıbdır Natəvan suzan,
Rəvan əşki-bəsər hər yan olan gözlər bulağında.

***

Yıxıb bu könlüm evin, eyləyib viran, getmə!
Yoxumdu tabü tavan firqətə, cavan, getmə!

Fəda olum sənə mən, səndən ayrıla bilməm,
Yəqin, fəraqın edər qəddimi kəman, getmə!

Səninlə rövşən idi qəlbim, ey gözüm nuri!
Güman ki, təng ola bu canıma cahan, getmə!

Boyun bəlasın alım, sərv tək yıxılma, oğul,
Doyunca görməmişəm, getmə bir zaman, getmə!

Çıxaydı kaş gözüm, görməyəydi hicranın,
Ölüncə, bil, edərəm naləvü fəğan, getmə!

Səbahədək oturub çəkmişəm cəfalərini,
Boyum bərabərisən indi, əlaman, getmə!

Yəqinən, əl çəkəcək dostü aşinalərdən,
Dəli kimi düşəcək çöllərə anan, getmə!

Səninlə kim, açılıb qəlbimin şükufələri,
Mürüvvət eylə, əzizim, edib xəzan, getmə!

Di yumma gözlərini, qoy görüm doyunca səni,
Gözümdə cari edib əşk, həm rəvan, getmə!

Tərəhhüm eylə mənə, dərdü mehnətim çoxdur,
Qoyub bu hicri-bəla içrə Natəvan, getmə!

***

Varımdı sinədə dərdü qəmi-nəhan, ölürəm.
Fəda olum sənə, gəl eylə imtəhan, ölürəm.

Fəraqdən gecələr yatmaram səbahə kimi,
Xəyali-zülfünə bağlı gedibdi can, ölürəm.

Bəhari-hüsnün əra gör necə xəzanəm mən,
Bahar laləsi tək bağrım oldu qan, ölürəm.

Vərəq-vərəq dilü can hicrin içrə odlaşdı,
Misali-gəncəfə sədparə oldu can, ölürəm.

O xaki-payini mən aşiyanə etmiş idim,
Vətəndən ayrı düşüb, indi laməkan, ölürəm.
Dedin ki, çək əlini damənimdən, əl çəkdim,
Tərəhhüm eyləmədin axır, ey cəvan, ölürəm.

Çəkidim həsrətini, görmədim, xudahafiz!
Olubdur indi işim naləvü fəğan, ölürəm.

Fəda o qamətinə kim, qəza nə xoş çəkmiş,
Qədər büküb belimi, eyləyib kəman, ölürəm.

Fəraqdən tükənib tabü taqətim, billah,
Visalə yetməz əlim, zarü Natəvan ölürəm.

# ÜÇ ŞAİRƏNİN DEYİŞMƏSİ
(MÜŞAİRƏSİ)

*XIX əsrdə yaşamış üç şairə bir-birini qaibanə də olsa, tanımış və şerləşmişlər. Onlardan biri məşhur Qarabağ şairəsi Fatma xanım Kəminə, biri Ziba xanım Ləli Ərdəbili, biri də Qəmər bəyim Şeyda Qarabağidir.*

*Yazıçı və araşdırıcı Əzizə xanım Cəfərzadə bu üç şairənin bir-biriylə müşairə şəklində, bir-birinə cavab olaraq yazılmış "Ağam canı" ("Ağan canı") rədifli üç qəzəlini tapmış və oxuculara təqdim etmişdir. Hər üç qəzəli yazılma ardıcıllığı ilə antologiyamıza daxil edirik.*

## ZİBA XANIM LƏLİ
(? — ?)

Pərişan eylərəm zülfü-pərişanı, ağam canı
Pərişan eylərəm məcmu dünyanı, ağam canı.

Xəyali-vəslimə hər kim düşə, canından əl çəksin
Bu sevdayə düşən tərk eyləsin canı, ağam canı.

Əgər turi-təcəlli eyləsəm bu abü tabilə
Şüayi-ruyim ilə məhv edərəm dünyanı, ağam canı,

Adım Ziba, sözüm şirin-şəkər, gözlərim şəhla
Fəramuş eyləyib hüsnüm Züleyxanı, ağam canı.

Sənin tək aşiqü məşuq yox, Ləli, bu aləmdə
Qamu aşiqləri eşqin edib fani, ağam canı

## QƏMƏR BƏYİM ŞEYDA
(? — 1938)

Dağıtsam hər tərəf zülfi-səmənsanı, ağan canı,
Giriftar eylərəm sən kimi Zibanı, ağan canı.

Əgər olsan gözəllikdə bərabər mahi-tabanə,
Sənə xurşid olan ruyim olar mane, ağan canı.

Sənin tək yüz ola Ziba, mənim bir muyimə çatmaz,
Cəmalım Yusifi-Misri edib fani, ağan canı.

Məlahət gülşənində bir güləm qönçə libasında,
Açılsam gər tutar qovğa bu dünyanı, ağan canı.

Lətafət mülkünün sultaniyəm, sən kimi Zibalər,
Kənizi-mətbəximdir, et tamaşanı, ağan canı.

Ləbi şəkər, sözü şirin bu Şeyda tək hərifin var,
Əgər mümkün ola tərk et bu sevdanı, ağan canı.

## FATMA XANIM KƏMİNƏ
(1841 — 1898)

Pərişan etmişəm zülfü-pərişanı, ağan canı,
Pərişan etmək olmur hiç dünyanı, ağan canı.

Rüxün ziba, gözün şəhla, dilin şirin, sözün şəkkər,
Təbin mövzun, dodağın ləli-rümmani, ağan canı.

Soran yox, dişləyən yox, təmini bir kimsə kim bilməz,
Nədən faş eyləyirsən sirri-pünhanı, ağan canı?

Bəşər həddi deyil billah, vura dəm ləntəranidən,
Təcəllası edər həm məhv Musanı, ağan canı

Gərək ruhani olmaq, ta bizi canana bilsinlər,
Bizə layiq deyil tərifi-cismani, ağan canı.

Bu şəhri Şişədə var novcavan, noxiz oğlanlar,
Görə Məryəm buları, anmaz İsanı, ağan canı.

Olub möhtac dildarə qamusu zarü giryandır,
Buyur təşrif düzəlsin rəsmi-mehmani, ağan canı.

Gəhi şadü gəhi qəmgin könül şövqi vüsalində
Umar söhbət edə məxficə ruhani, ağam canı.

Əcəb xudrəylikdir, səndə xeyli xudpərəstlikdir,
Deyil xudnamilik məhbub ürfani, ağan canı.

Kəminə sən kimi məhbubluq lafın vura, haşa,
Verə gər buyi-zülfə rühi-reyhani, ağan canı.

## İSMAYIL BƏY NAKAM
(1839 — 1906)

### QƏZƏL

Cami-səfadə qalmayıb artıq əsər-məsər,
Mirti-dildə qət-qət olubdur kədər-mədər.

Müşkülsə də iqamət əgər kuyi-yardə,
Mümkün deyil bu büqədən, ey dil, səfər-məfər.

Təzvirdir, fəribdir axır nəticəsi,
Hər bir kəlamın olsa məali əgər-məgər.

Getmiş qərar təndə Süleymani-ruhdən,
Yoxdur hənuz hüdhüdi-dildən xəbər-məbər.

Məcnun kimi kənar olub adabi-eşqdən,
Hər Leyliveş cəmalına qılmam nəzər-məzər.

Mən aşiqəm o şahidə kim, çıxsa pərdədən,
Nabud olur süpehrdə xur-mur, qəmər-məmər.

Nakam, yandın atəşi möhnətdə, bəd əz in
Yaxmaz səni cəhimü-məhimü səqər-məqər.

## MƏXFİ
(1821—1892)

### QƏZƏLLƏR

Oğrun yenə əğyarə baxar yar içəridən,
Bu baxmağı əlhəq məni odlar içəridən.

Hicrində gözüm yaşı töküldükcə qurtarmaz,
Guya ki, bu qan çeşməsi qaynar içəridən.

Şəhdi-ləbini sormasa sönməz dili-suzan,
Əzbəst ki, yanır narə o bimar içəridən.

Könlümdə olan yarəni bir-bir görəsən ta,
Bir xəncər alıb köksümü sən yar içəridən.

Bunca tökərəm əşki, könül atəşi sönməz,
Əzbəst ki, tutub zari-könül nar içəridən.

Əğyar ilə həm bəzm ola bu laləüzanım,
Min yarə vurub köksümə dağlar içəridən.

Heyhat, vüsalın ola bu Məxfiyə qismət,
Ta çıxmaya bəzmindəki əğyar içəridən.

***

Hər kəsin kim can üçün bir mehriban cananı yox,
Elə bilsin cismi var, amma içində canı yox.

Bir könül kim xalidir aləmdə zövqi-eşqdən,
Bir xərabə mülkə bənzər kim, onun sultanı yox.

Ləblərin bir abi-heyvandır, xəttin zülmət ona
Belə zülmət içrə Xızrın çeşmeyi-heyvani yox.

Hər ay olduqda müdəvvər var bir nöqsanı leyk,
Bədrlənmiş aydır ol arizin nöqsanı yox.

Bir qəm olsa dəhrdə derlər ki, bir payanı var,
Gör nə qəmdir dərdi-hicrin kim, onun payanı yox.

Yar cövrü təndə mehman olsa xoşdur könlümə,
Tarimar olsun o evlər kim, onun mehmanı yox.

Hər vüsalın aqibət aləmdə bir hicranı var,
Talibəm mən ol vüsalə kim, onun hicranı yox.

Dərdimin tədbirini sordum Əflatundan, dedi:
Məxfi dərdin eşq dərdidir, onun dərmanı yox.

## MİRZƏ ƏLİ XAN LƏLİ
(1845 — 1907)

### İSTİDƏN ŞİKAYƏT

De görüm bir mənə, xüdavənda,
Bu bədən qurğuşundumu, ya misdi?
Kürəxana deyil bizim mənzil
Nəyə lazımdı bu qədər isti?
Bizim ev Məkkə, mən ərəb deyiləm,
Ərəbistan deyil bu, Tiflisdi.
Şəhrə od yağdırır, çölü soyudur
Bilmirəm bu necə mühəndisdi?

İstini qışda ver ki, bəndələrin
Çoxu üryani ürü müflisdi.
Birəvü mığmığavı kor milçək
Cəm olub, bir qəribə məclisdi.
Nə səbəbdən bizə müsəllət olub
Nə ki dünyadə rətbü yabisdi?
Cücülər doldurub kitab arasın
Biri molla, biri müdərrisdi.
Sokakda lehlər istidən itlər
Yıxılıblar yol üstə, bihissdi.
Gecələr peşşehak zəmzəməsi
Məclisdə baniyi müəssisdi.
Bu hava-xətti istifadə gərək
Sakinani-Şimala çox pisdi.
Nə cəhətdən görüm, bu muzilər
Gecə-gündüz bizimlə munisdi?

## MƏHƏMMƏD HİDƏCİ
(1853 — 1928)

### SƏNƏ NƏ

Danışma, zahid əgər söz eşitmədim, -sənə nə?
Mən öz xudamə günah etdim, etmədim, -sənə nə?
Xuda behişti-bərini sənə verib, -mənə nə?
Sənin gümanına, mən kamə yetmədim, -sənə nə?
Neçin səni söyərəm, getmişəm kəlisayə,
Deyildi Kəbə nəsibimdə, getmədim, -sənə nə?
Mənə əgər dedilər: Gəl qılaq dalında namaz,
Baxıb səlahimə, bu əmrə bitmədi, -sənə nə?
Dedim: Mən eyləmərəm iltifat dünyayə,
Yeritdim öz sözümü, ya yeritmədim, -sənə nə?

## ŞAHNİGAR XANIM RƏNCUR
(1850 — 1899)

### QƏZƏL

Hər kim yolunda can verdi sevdi cananı, cananı,
Vəleykin yoxdur xubların əhdü-peymanı, peymanı.

Yarıtmış həqqin həzrəti, kimsədən çəkmən minnəti,
Ləbi-ləlinin şərbəti dərdlər dərmanı, dərmanı.

Qədin şümşad ər-ərdir, yüzün qızıl güldən tərdir,
Nafeyi-müşki-tatərdir zülfün reyhanı, reyhanı.
Əbdi-şöhrətin dəmqacı Hidustandan alur bacı,
Misr şəhrinin xəracı ləlin mərcanı, mərcanı.

Rəncur, çünki sevdin, ol yar; istə vəslini ağla zar,
Kərəmli Mürşüdə yalvar, çağır sübhanı, sübhanı.

***

Nə küfrüm var, nə imanəm,
Nə dinim var, nə ədyanəm,
Fəəmma şahi-qüfranə
Ümidəm, bimanəm mən.

Nə dindarəm, nə islaməm,
Nə meynuşəm, nə pürcaməm,
Nə Bəsrə əhli, nə Şaməm,
Nə öz hindü İranəm mən.

Nə şiə, sünnüyəm pürlaf,
Çihar yarə könlüm saf,
Nə əhli-zülmi-biinsaf,
Nə mərziyə inanəm mən.

Müavi həqqinə ləni,
Edərəm müttəsil, yəni,
Bulardır küfri-biməni,
Bu əhli ilə yamanəm mən.

Nə hüsn əhli, kəmalım var,
Nə bir sahibcamalım var,
Nə mülküm var, nə malım var,
Deyirlər bir şəbanəm mən.

Nə gövtanım həqiqətdir,
Nə rahım bir təriqətdir,
Danışsam, nə bəliğətdir,
Nə bir əhli-iqanəm mən.

Nə dünya, əhli-üqbayəm,
Nə sevda, əhli-rüsvayəm,
Nə rahətdə fərəhzayəm,
Nə həqdən bigümanəm mən.

Nə bəxtim var, nə də biqəm,
Nə əladır, nə bəxtim kəm,
Nə şad oldum, nə çeşmim nəm,
Nə rüsvayi-cahanəm mən.

Nədir talib, nədir mətlub,
Nədir rağib, nədir mərğub,
Nədir cazib, nədir məczub,
Nə zənn olsa, çinanəm mən.

# MOLLA CÜMƏ

(1854—1920)

## GƏRAYLI

Bir gözələ gözüm düşdü,
Mən dönərəm könül dönməz.
Ruhum getdi, əqlim çaşdı,
Mən dönərəm, könül dönməz.

Dərdimi söylərəm başdan,
Ay qabaqdan, qələm qaşdan,
Şirin dilli bir ölmüşdən
Mən dönərəm, könül dönməz.

Molla Cümə, eylə dastan,
Mail baxan gözü məstan,
Bir vəfalı, sevən dostdan
Mən dönərəm, könül dönməz.

## QOŞMALAR

İsmi pünhan, neçin belə sınıqsan?
Zülflərin görürəm şanadan qalmış.

Sən allah, bu qədər çəkmə yanıq sən,
Tək cana nügbarsan anadan qalmış.

Tanrı qədərinə səbr eylə, dildar,
Növbətdir hərlənir, hamıya, bil, var.
Birində görünən iş deyil, dilbər,
Zülm də ta əzəl binadan qalmış.

Dost-düşmən içində gəzmə pozuq sən,
Dağlama ciyərim sızıq-sızıq sən.
Topla ver Cüməyə dərdin, yazıqsan,
Əziz yadigarsan sonadan qalmış.

***

İsmi pünhan, niyə məndən küsübsən?
Yaxşı yaman ya bir olar, ya iki.
Bu gün ölsəm hamı deyər yazıqdır,
Canı yanan ya bir olar, ya iki.

Sən şöləsən dörd yanında fanaram,
Bülbülünəm, gülşənindən kənaram.
Hər məclisdə od tutuban yanaram,
Dərdim qanan ya bir olar, ya iki.

Hilal qaşa nə layiqdir o sürmə,
Meylin qırıb üzün məndən çevirmə.
Cümə deyər, hər yetənə sirr vermə,
Dost mehriban ya bir olar, ya iki.

***

Əzəl-axır başımıza bəlasan,
Həsrətin bağrımı kəsdi, a dünya.
Duam budur; səni viran qalasan,
Məni qoydun könlü yaslı, a dünya.

Yar qoxusun dimağıma iylətdin,
Eşqə saldın, gecə-gündüz göynətdin,
Dəf çalıban meymun kimi oynatdın,
Şəqqə vurdun dəstə-dəstə, a dünya.

Ayrılıq naməsin yazdın dilimdən,
Məhəbbət tasmasın açdın belimdən,
Çəkibən, sevdigim, aldın əlimdən,
Çıxartdın kəlləmdən tüstü, a dünya.

Cahillik bəhrinə daşım atıbsan,
Kamalsızlar cərgəsinə qatıbsan,

Ar-namusun bir qəpiyə satıbsan,
Bəs degilmi, daha bəsdi, a dünya.

Axır verdim, atqaz etdin ərzəmi,
Unutdurdun sənətimi, fərzimi,
İşin qanıb çevirmişəm yüzümü,
Molla Cümə səndən küsdü, a dünya.

***

Ta ki, mənə mədh eyləmə dünyanı,
Ha bu dünya bir bekara dünyadı.
Hələ Adəm peyğəmbərdən qabağa
Bir üzü ağ, biri qara dünyadı.

Dünyaya düşənlər qismətin yeyər,
Kamillər agahdı, cahillər uyar,
Sehrkardı, işin bilənlər duyar,
Vəfasızdır, təm məkkara dünyadı.

Altun səfalıdı, mədən səfasız,
Təbib şəfalıdı, xəstə şəfasız,
İnsan vəfalıdır, dünya vəfasız,
Əlbət, yaxşı bixəbərə dünyadı.

Dəryalar bulanmaz daş düşməyinnən,
Qəvvaslar qərq olmaz su daşmağınnan,
Ariflər anlayar danışmağınnan,
Əlarifə yek işarə dünyadı.

Ağır suya girmə, keçə bilməzsən,
Yıxar səni, çıxıb qaça bilməzsən,
Qırar qanadların, uça bilməzsən,
Şahin-şonqar dönən sara dünyadı.

Ovçu-maral sözün qırağa qoyaq,
Bir məndən, bin səndən, gəl, indi deyək.
Əyri oturuban doğru söyləyək,
Söhbət qatan zəhrimara dünyadı.

Heç oxşarmı günə lampa işığı,
Qarın doymaz yalamaqla qaşığı,
Molla Cümə, sənin kimi aşığı
Kəmənd ilə çəkən dara dünyadı.

## ZEYNƏB ZƏRBƏLİ QIZI
(1860 — 1942)

### GƏRAYLILAR

Nə müddətdi yol gözlərəm,
Nə durmusan, qoç İsmayıl?
Ağam məni salıb bəstə,
Gəl qapını aç, İsmayıl!

Dağlar başı duman olar,
Əlif qəddim kaman olar,
Mənim halım yaman olar,
Tez ağarar saç, İsmayıl!

Gəl eşit Zeynəb sözünü,
Yoldan yığ yarın gözünü,
Çox da incitmə özünü,
Götür məni qaç, İsmayıl!

***

Dünya, sənə gələn olmaz.
Çalxalanar ümman dolmaz,
Dərd-azarı qanan olmaz,
Ahü zardı sözün sənin.

Pis əhvalda sorma məni,
Bu məkanda arma məni,
Yaman çağa salma məni,
Qan ağlayar gözün sənin.

Zeynəb köçər özü qalmaz,
Nitqi batar sözü qalmaz,
Torpaq üstə izi qalmaz,
Nə dönükmüş üzün sənin.

# XIX ƏSRİN İKİNCİ YARISI TÜRKİYƏ ŞAİRLƏRİ

## NAMİQ KAMAL
(1840 — 1888)



*Namiq Kamal yeni türk ədəbiyyatının ən görkəmli yaradıcılarından biri, Türkiyə ədəbiyyatına vətənsevərlik, millət təəssübü və azadlıq ideyalarını gətirən şair, nasir, dramaturq, publisist, ictimai və siyasi xadimdir. Yaradıcılığa Divan ədəbiyyatı ənənələrinin davamçısı kimi başlayan Namiq Kamal tezliklə dövrün qabaqcıl görüşlərinə sahib olur və hürriyyət carçısı kimi dövlət tərəfindən təzyiqlərə məruz qalır, mühacirət etməyə məcbur olur, vətənə qayıtdıqdan sonra isə dəfələrlə həbs və sürgün edilir. Şinasiylə tanışlığı Namiq Kamalın ədəbi və ictimai fəaliyyətinə böyük təsir göstərir. 1862-ci ildə Şinasinin çıxardığı "Təsviri əfkar" qəzetinin mühərriri olur, Şinası 1865-ci ildə Parisə qaçarkən, 1867-ci ilə qədər qəzeti idarə edir. Öz növbəsində hökumətin təqiblərindən xilas olmaq üçün Londona qaçmağa məcbur olmuş Namiq Kamaldan sonra isə qəzeti Rəcaizadə Mahmud Əkrəm buraxır. 1871-ci ilə qədər Avropada qalan Namiq Kamal Londonda Ziya Paşayla birlikdə "Hürriyyət" qəzetini, İstanbula qayıtdıqdan sonra isə "İbrət" qəzetini nəşr edir. "Vətən, yaxud Silistrə" pyesi, nəsr əsərləri və tarixi araşdırmaları, ədəbi, siyasi məqalələri və şerləri Namiq Kamalın adını Türkiyə ədəbiyyatının ən parlaq simalarından biri kimi, barışmaz mübariz kimi, əqidələri yolunda hər cür əzab-əziyyətlərə, təqiblərə və təzyiqlərə dözməyə hazır olan iradəli və dönməz şəxsiyyət kimi əbədiləşdirmiş, onu "Vətən şairi" kimi tanıtmışdır.*

## QİTƏLƏR

Namus ilə irfanə yetişməzmi mükafat,
İqbal yolu gərçi Kamalın qapanıqdır.
Çox ağ görməzsən də saçında saqqalında
Əlminnəttü lillah üzü ağ, alnı açıqdır.

Çəkmədim dünyada zənciri əsarət barını
Qeydi dünyadan mübərrayam, bilir dünya məni.
İşdə meydani - hamiyyət, qaçma, ey cəllad-zülm
Ya səni məhv eyləsin Mevla cahanda, ya məni.

Qurban deyib vücudumu mən rahi-millətə,
Tərk eylədim həyatımı fikri - həmiyyətə.
Cismim aləmdə olsa da xunum boğar səni
Verməm macal mən sənə xalqa xəyanətə.

Zalım olsa nə rütbə bipərva,
Yenə bünyadi-zülmü biz yıxarız.
Mərkəzi-xakə atsalar da bizi,
Kürreyi-ərzi partladıb çıxarız...

## HÜRRİYYƏT QƏSİDƏSİ
(Bir hissə)

Görüb ehkami əsri münhərif sidqü səlamətdən
Çəkildik izzətü iqbal ilə babi hökumətdən.
Usanmaz kəndini insan bilənlər xalqa xidmətdən
Mürüvvət-mənd olan məzluma əl çəkməz ianətdən.
Həqir olduysa millət şanına nöqsan gəlir sanma
Yerə düşməklə cövhər sakit olmaz qədri qiymətdən.
Vücudun kim xəmiri mayesi haqqı vətəndəndir
Nə qəm, rahi-vətəndə haq olursa cövrü möhnətdən.
Muini zalımın dünyada ərbabi dənaətdir
Köpəkdir zövq alan səyyadi-biinsafa xidmətdən.
Fələk, hər dürlü əsbabi-cəfasın toplasın, gəlsin
Dönərsəm-qəhbəyəm millət yolunda bir əzəmətdən.
Anılsın məsləkimdə çəkdiyim cövrü məşəqqətlər
Ki, ədna zövqü əladır vəzarətdən, sədarətdən.
Vətən, bir bivəfa nazəndeyi tənnaza dönmüş kim,
Ayırmaz sadiqani eşqini aləmi qürbətdən.
Nə əfsünkar imişsən ah, ey didari-hürriyyət
Əsiri-eşqin olduq gərçi qurtulduq əsarətdən.
Nə yari-can imişsən, ah ey ümmidi-istiqbal
Cahanı sənsən azad eyləyən min yasi - möhnətdən.

Sənindir dövrü dövlət, hökmünü dünyayə infaz et
Xuda, iqbalını hifz eyləsin hər dürlü afətdən.
Gilabi - zülmə qaldı gəzdiyim nazəndə səhralar
Oyan ey yaralı şir, oyan bu xabi-qəflətdən.

## VƏTƏN ŞƏRQİSİ

Amalımız, əfkarımız iqbalı vətəndir
Sərhəddimizə qələ bizim haqqı bədəndir
Osmanlılarız, ziynətimiz qanlı kəfəndir
Qovğada şəhadətlə bütün kam alırız biz
Osmanlılarız can veririz, nam alırız biz.
Qan ilə qılıncdır görünən bayrağımızda
Can qorxusu gəzməz ovamızda, dağımızda
Hər guşədə bir şir yatar torpağımızda
Qovğada şəhadətlə bütün kam alırız biz
Osmalılarız, can veririz, nam alırız biz.
Osmanlı adı hər duyana lərzə-rəzandır
Əcdadımızın heybəti mərufi cahandır
Fitrət dəyişir, sanma bu qan yenə o qandır
Qovğada şəhadətlə bütün kam alırız biz
Osmanlılarız can veririz, nam alırız biz.
Top partlasın atəşləri ətrafa saçılsın
Cənnət qapısı can verən ihvana açılsın
Dünyada nə bulduq ki, ölümdən də qaçılsın?
Qovğada şəhadətlə bütün kam alırız biz
Osmanlılarız can veririz, nam alırız biz.

## VƏTƏN TÜRKÜSÜ

İşdə ədu qarşıda hazır silah
Arş igidlər vətən imdadına.
Arş irəli, arş bizimdir fəlah
Arş igidlər vətən imdadına.

Cümləmizin validəmizdir vətən
Hər kəsi lütfiylə odur bəsləyən.
Basdı ədu köksünə biz sağ ikən
Arş igidlər vətən imdadına.

Şani - vətən hifzi biladu ibad
Etmədədir süngümüzə istinad.

Milləti eyləmisiniz namurad?
Arş igidlər vətən imdadına.

Rəhbərimiz qeyrəti - mərdanədir
Hər daşımız bir neçə min canədir.
Canə deyil meyl bu gün şanədir
Arş igidlər vətən imdadına.

Yarə nişandır təninə ərlərin,
Mövt isə son rütbəsidir əsgərin.
Altı da bir, üstü də birdir yerin
Arş igidlər vətən imdadına.

## VƏTƏN MƏRSİYƏSİ

Vətəni həp boyamışkən qanə
Boylə durmaqmı düşər biganə?
Yürüyün bir daha bu meydanə
Harda olsa çıxacaq bir canə
Heyflər minnət edən insanə!

Vətəni atəşə bizlər yaxdıq,
Yandı da seyrinə bizlər baxdıq,
Fəxr edib bir də nişanlar taxdıq,
Yaraşırmıydı bu heç mərdanə
Çalışıb bənzəməyə şeytanə?

Vətəni düşmana təslim etdik,
Gözgörə milləti təsmim etdik,
Sanki hər vacibi tətmim etdik,
Çəkəlim bir nəzəri imanə
Bumudur layiq olan imanə?

Vətəni düşmən əlində görmək,
Adəmi küfrə müşabihdir pək
Bundan əvvəl nə şərəfmiş ölmək!
Bu gedişlə olacaq bütxanə
Məscidü Kəbəmiz, ey divanə!

Vətəni aldığı günlər əcdad
Geri verməkmi üçündü o cihad?
Yad edin qanlarını eşq ilə yad
Gəldi torpaqları da əfqanə
Dadrəs yoxmu deyir nalanə?

Vətəni qana batırdı əğyar,
Nə çəmən qaldı, nə bülbül, nə də xar.
Yoxmu heç bəndələrində bir ar?
Vəqfi nəfs edə fədakaranə,
Qılıcın sallaya əhraranə?

Vətəni gülşən ikən qəbr etdik,
Hər kəsi ölməyə biz cəbr etdik,
Aqibət öldü vətən, səbr etdik
Boyləmi yardım olar ihvanə
Dağ - daş ağladı yanə-yanə!

## LAZIMSA

Tariki haqda canü təndən olmaq yad lazımsa,
Məni hazır bularsan hərçi bada-bad lazımsa.

Nə minnət intizarı bərkə ey ahəngəri - qeyrət
Mənim könlümdən al gəl tiğ üçün polad lazımsa.

Edən təxribi aləm inkisarı qəlbidir xalqın
Könül, yıxma cahanı eyləmək abad lazımsa.

Fənanın ən münir ayinəsi muyi - səfidindir
Sənə ağlınla pir olmaq yetər irşad lazımsa.

Bu qanuni - məşiyyət fərdi fərdə etməmiş möhtac
Sənə Allah edər hər hanki işdə dad lazımsa.

Qına gəldi cahanda şöhrətin siytin kəmalından
Kamalı gah-gah etsin bilənlər yad, lazımsa.

## QƏZƏL

Zövqü vəslinlə keçən dəmlərimi yad edəyim
Buraxın ağlıyayım halimə fəryad edəyim.

Eşq ilə ah edəyim oylə ki təsirindən
Məni min narə yaxan könlümü bərbad edəyim.

Tiğinə səcdə edib qibleyi əbruyə bədəl,
Eşqidə mən də bir ayini-növ icad edəyim.

Bunca dəmdir oluram eşq ilə guya ki məmat,
Heç deməzsən ki bu möhnətzadəni şad edəyim,

Namiqin neçin tək halına rəhm etməzsən?
Sənə asi görünüb, qeyrəmi fəryad edəyim?

## DAŞLAMA

Ədəbsizlikdə təklərik
Kimi görsək ətəklərik.
Haqdan da yardım bəklərik
Nə utanmaz köpəklərik!

Gəldik vətən qovğasına,
Düşdük rütbə yağmasına,
Daldıq dünya səfasına,
Nə utanmaz köpəklərik!

İnsanmı nəyik, seçilməz,
Bir zəhərdir ki, içilməz,
Tövrümüzdən də keçilməz,
Nə utanmaz köpəklərik!

Biz baxmadan sağa sola
Düşman girdi İstanbula.
Vətəni satdıq bir pula
Nə utanmaz köpəklərik!

Vətənin girdik qanına,
Ləkə gətirdik şanına,
Cümləmizin bok canına,
Nə utanmaz köpəklərik!

## VAVEYLA

### NÖHƏ I

Fəminin rəngi əks edib tənінə
Yeni açmış gülə misal olmuş
İnitafiylə bax nə al olmuş
Sərvi-simin səfalı gərdəninə
O lətafətlə ol nihalı rəvan
Giriyor göz yumunca röyyama
Bəzəyir eyni kəndi xülyama
Bu təsəvvür toxundu sevdama
Ah boylə gəzərmi heç canan?
Gül deyil arxasında qanlı kəfən
Sənmisən, sənmisən qərib vətən?

### NÖHƏ II

Bu gözəllikdə, heç bu cahanda
Yaraşırmıydı boynuna o kəfən?

Cisminin hər məsamı yarə ikən
Tutdun evladını qucağında
Sən gedərsənsə bizi qalır sanma
Şühədan oldu mövt ilə xəndan
Sağ qalanlar durarmu heç giryan?
Təndə yaşdan ziyadədir al qan
Söyləyən söyləsin, sən aldanma
Sən gedərsənsə bütün həlak oluruq
Qoynuna can atar da haq oluruq

NÖHƏ III

Get vətən, Kəbədə siyaha bürün!
Bir qolun Rövzeyi Nəbiyə uzat,
Birini Kərbəlada Məşhədə at!
Kainata o heyətinlə görün!
Bu tamaşaya Haq da aşiq olur.
Gözə bir aləm eləyir izhar
Ki cahandan böyük lətafəti var.
O lətafət olunsa gər inkar
Məzhəbimcə deməк müvafiq olur.
Aç vətən, köksünü İlahinə aç!
Şühədanı çıxar da ortaya saç!

## VƏTƏN MƏHZUN, MƏN MƏHZUN

Sən oldun cövrünə ey dilşikən məhzun, mən məhzun
Fələk gülsün, sevinsin indi sən məhzun, mən məhzun
Ölürsəm görmədən millətdə ümmid etdiyim feyzi
Yazılsın səngi-qəbrimdə: Vətən məhzun, mən məhzun...

## RƏCAİZADƏ MAHMUD ƏKRƏM
(1847 — 1914)



*Türkiyə ədəbiyyatında "Tənzimat" dövrünün ən məşhur şair, nasir və dramaturqlarından olan Rəcaizadə Mahmud Əkrəm eyni zamanda "Sərvəti-fünun"çuların sələflərindəndir. Böyük müasiri Namiq Kamalın yaradıcılığına nə qədər mübarizlik, döyüşkənlik ruhu hakimdirsə, Mahmud Əkrəm bir o qədər həzin lirik şairdir. Övladlarının, xüsusilə sevimli oğlu Nicatın vaxtsız ölümü şairi sarsıtmış, onun yaradıcılığında kədər, bədbinlik motivləri daha da artmışdır.*

### FƏRDAİ TƏDFİN

Lakin niyə məhv etdi ol gənci fələk bilməm
Ol gənci ki, etmişdi hər yolda Xuda məkrəm.
Əhbabı tutar sandım bir kaç keçəcək matəm
Baxdım ki gedən getmiş, dünyadakilər xürrəm
Devran yenə ol devran, aləm yenə ol aləm.

Ol zatə təhəssürlə sandım ki, zaman ağlar
Umdum ki üzü sübhün bir rəngi-həzin bağlar
Gördüm ki, günəş doğmuş, pürxəndə bütün dağlar
Bülbüllər ötər şadan, pür-nəşə sular çağlar
Aləm yenə ol aləm, devran yenə ol devran.

### AH, NİCAT!

Həsrət məni çayır-çayır yaxarkən,
Bədənimdə buzdan bir əl yürüyür.
Xəyalına çılğın-çılğın baxarkən,
Qapanası gözümü qan bürüyür.

Dağda, qırda rast gəlirsəm bir dərə
Göz yaşlarım axıdaraq çağlaram.
Yollardakı ufaq-ufaq izlərə
Səni sanıb, baxar-baxar ağlaram.

Günəş gülər, quşlar uçar havada,
Oyanırlar nazlı-nazlı çiçəklər.
Yalnızmısan o qaranlıq yuvada
Yoxmu səni bir özləyər, bir bəklər?

Can istərkən həsrət oduyla yansın
Varlıq məni əlil-əlil sürüyür.
Bu qayğıya ürək nasıl dayansın?
Bədənciyin torpaqlarda çürüyür.

Bu ayrılıq mənə yaman gəldi pək
Ruhum xəstə, qırıq qolum-qanadım
Ya gəl mənə, ya oraya məni çək
Gözüm nuru, oğlancığım, Nicatım!

## TƏRƏNNÜM

Saxlayıb qəlbi - mükəddərdə səni
Anaram ah ilə hər yerdə səni.
Buluram nəşveyi sağərdə səni
Anaram ah ilə hər yerdə səni.

Bülbülü ağlamadan quş edəməm,
Zar olan könlümü hamuş edəməm,
Səni bir ləhzə fəramuş edəməm,
Anaram ah ilə hər yerdə səni.

Hər çiçəkdən alaram nükhətini,
Hər fidanda görərəm heyətini,
Söyləyib culara keyfiyyətini,
Anaram ah ilə hər yerdə səni.

## BU YERLƏRDİR

Bu yerlərdir-əsiri eşqi canan olduğum yerlər
Bu yerlər nigahi - rəhmə şayan olduğum yerlər.

Bu yerlərdir edib dərdi - dili bimarımı təşrih
Ləbindən talib darüvü dərman olduğum yerlər.

Bu yerlərdir tutub dəstim sıxınca püxtə bilməm
Nə dürlü hissin icatıyla lərzan olduğum yerlər.

Bu yerlərdir itabi - lütfə həp birdən olub məzhər
Olurkən zarü giryan şad xəndan olduğum yerlər.

Bu yerlərdir gəzərkən əl-ələ fikri - fəraqiylə
Gedib bir guşədə tənhaca giryan olduğum yerlər.

# ƏŞRƏF
(1846 — 1912)

## QİTƏLƏR

Eyləmən ölsəm də kizb ixtiyar
Doğrunu söylər-gəzər bir şairəm.
Bir gözəl məzmun bulunca, Əşrəfa
Kəndimi həcv eyləməzsəm, kafirəm.

Çəkdiyim cövrü cəfanın səbəbindən sorma
Demə kim: - Badihava mənkəbə dəllalı budur!
Həbs ilə, nəf ilə, işgəncə ilə ömrü keçər,
İşdə Türkiyədə şair olanın halı budur!

Vükəla qəbrinə heykəl tikəlim boylə yazıb
Ki: "Bunun hali-həyatında yeri münhal idi
Sanmayın yevmi-vəfatında bilindi qədri
Sağlığında yenə bu boyləcə bir heykəl idi".

## İKİNCİ ƏBDÜLHƏMİD ÜÇÜN

Padişahım, bir dirəxtə döndü kim guya vətən
Daima bir baltadan bir dalı xali qalmayır.
Qəm deyil, amma bu mülkün boylə əldən getməsi
Get-gedə zülm etməyə əldə əhali qalmayır.

## BƏHRİYYƏ NAZİRİ ÜÇÜN

Bizdəki Naziri-bəhriyə Həsən paşanı
Boylə tərif ediyor vaqenüvisani ümam
Gələcək olduğunu bilsə idi nəslindən
Almadan həzrəti Həvvanı boşardı Adəm.

## ƏSKİ GƏMİLƏR ÜÇÜN

Zirehlilərdə nə qazan var, nə kömür var, guya
Cümləsi sahili-dəryada cəsəddir biruh.
Qalxışardı yenə dava ilə istirdada
Bizdəki təknələri görsə idi Həzrəti Nuh.

## BİR MÖMİN ÜÇÜN

Səni təfkir edər mütləq desən dünya yuvarlaqdır
Dünya dönəm, o dönməz çünki sabitdir inadında.
Sorulsa hacei dana Selanik hardadır bilməz
Bilir amma neçə tük var Cəbrayılın qanadında.

## ƏBDÜLHƏMİD ÜÇÜN

Şahi - Alihimən Namiq Kamalın bilmədi qədrini
Deyənlər nəfsini ifriti istibdada qapdırdı.
Həyatında kiçik bir xanə ehsan etmədi amma
Vəfatında onunçün möhtəşəm bir türbə yapdırdı.

## ƏBDÜLHƏMİD ÜÇÜN

Əbül Əkrəm Kamalın rixlətində həzrəti Heydər
Şərabi - kəsvəti mərhuma artırdıqca artırdı.
Qızıl Sultan onunçün türbə inşa etdi sanma
Yenə adət edər havfiylə mərmərə qapatdırdı.

## İSTİBDAD VƏ HÜRRİYYƏT ÜÇÜN

Vaxti-istibdadda söz söyləmək məmnu idi
Ağladırdı ağzını açsan hökumət ananı.
Dövri-hürriyyətdə indi dəyişdi qaidə
Söyləyirlər əvvəla, sonra s. ... ananı!

## ÖZÜ ÜÇÜN YAZDIĞI MƏZAR DAŞI YAZISI

Qəbrimi kimsə ziyarət etməsin Allah üçün,
Gəlməsin, rədd eylərəm billahi öz qardaşımı.
Gözlərim əbnayi-adəmdən o rütbəyi aldı kim
İstəməm mən fatihə, tək(i) çalmasınlar[1] daşımı.

[1] Çalmasınlar — oğurlamasınlar.

## MÜƏLLİM NACİ
(1850 — 1893)

### KÖYLÜ QIZLARIN ŞƏRQİSİ

Təpədən nasıl eniyor baxın
Bu qızın nişanlısı şanlıdır.
Yaradan nəzərdən əsirgəsin
Qoca dağ kimi dəliqanlıdır.

Fəsə bax, fəsə, nə gözəl də al!
Nə də gözəl belindəki morlu şal.
Demədim ya mən sənə bax da qal,
O qədər də baxma, ziyanlıdır.

Nə qədər qızardın, aman, aman!
Bəri gəl, bayılma, a qız haman.
Nədən oylə başına çıxdı qan?
Ürəyin də pək həyəcanlıdır.

Yapışıqlıdır, seviyor cahan
Onu mən də pək sevərim, inan.
Mənim olsa barı bu qəhrəman
Olamaz, nə çarə nişanlıdır.

Nə darıldın, Əhmədin oynaşı?
Darılırmı insana qardaşı?
Sənə bənzəyir bu dağın başı
Nə zaman baxılırsa dumanlıdır.

Somurdub oturma, darıl da get!
Bizi ixtiyara şikayət et!
Məni istəməkdə olan igid
Daha şanlıdır, daha anlıdır.

## AŞIQ ŞENLİK
(1853 — 1912)

### QOŞMALAR

Bu dünyanın səfasını sürmədən
Nə tutdun yaxamı ay ixtiyarlıq.
Əvvəlki dövranım düşər yadıma
Əl götür yaxamdan, qoy ixtiyarlıq.

Alıb verir dizlərimin yelini,
Əydin qamətimi, bükdün belimi.
Yaxın ikən iraq etdin yolumu
Günlük yolum oldu ay, ixtiyarlıq.

Dayaqsız bir addım ata bilmənəm,
Tük döşək üstündə yata bilmənəm,
Altı aylıq cocuğa yetə bilmənəm,
Etdin sabilərə tay ixtiyarlıq.

Sultan idim dağ başında mən əzəl
İndi tökülənlər könlümdən xəzəl.
Məni görüb gülər idi hər gözəl
Onu da ömrümə say, ixtiyarlıq.

Sulandı gözlərim, zay oldu işlər,
Ağız papucladı, töküldü dişlər,
Ürkməz oldu məndən yerdəki quşlar,
Çəkərəm əlindən huy, ixtiyarlıq.

Səfil Şenlik boylə bir halə gəldi,
Eşq ucundan bənzi saraldı soldu,
Evladi-əyalım tərkimi qıldı,
Axır günüm oldu zay ixtiyarlıq.

***

Nə baxarsan məlul-məlul üzümə?
Ürəyimə qoydun vərəmi, qartal.
Qanad çaldın, pərvaz etdin uçmağa
Zalım güllə kəsdi aranı, qartal.

Zəhmin ağır, yapın aslan yapısı
Görən quşlar səni titrər hamısı.

Öldürürdün ələ keçən xəbisi
Atardın qaranlıq yerəmi, qartal?

Yüksək-yüksək yığınlara çıxardın,
Uzaq-uzaq mənzillərə baxardın,
Yüz siçanı bir dəliyə soxardın,
Kəsərdi ağzını harami, qartal.

Sarıdır gözlərin, yekədir başın,
Caynaqlıdır pəncən, kəskindir dişin,
İnsafsız zülmkar zabit yoldaşın
Öldürməkdir səni məramı, qartal.

Səfil Şenlik zülm eylədi sana
Çalardın, çırpardın, batardın qana.
Dərdin həddən aşdı, gəlməz hesaba
Loğman həkim sarmaz yaranı, qartal!

## RUHSƏTİ
(1856 — 1899)

### QOŞMALAR

Sənin bu saçların, sənin bu buyun
Sənin bu bəndlərin öldürür məni.
Sənin bu ləblərin, sənin bu sözün
Sənin bu dillərin öldürür məni.

Sənin bu harcların, sənin bu huyun,
Sənin bu qaşların, sənin bu yayın,
Sənin bu duruşun, sənin bu boyun,
Sənin bu qolların öldürür məni.

Sənin sallanışın, sənin gəzişin,
Sənin kirpiklərin, sənin sezişin,
Sənin bu əsrarın, sənin sezişin,
Sənin bu yolların öldürür məni.

Sənin bu yanağın, sənin bu dilin,
Sənin zülflərin, sənin bu telin,
Sənin yaz baharın, sənin sümbülün,
Sənin bu güllərin öldürür məni.

Sənin xeyir işin, sənin şər işin,
Sənin arayışın, sənin soruşun,
Sənin Əcəm şalın, sənin sarışın,
Sənin bu bellərin öldürür məni.

Sənin bu Ruhsətin-sənin qardaşın,
Sənin mənim üçün boylə təlaşın,
Sənin bu fəryadın, sənin göz yaşın,
Sənin busələrin öldürür məni.

***

Yenə bahar gəldi, bülbül səsindən
Səda verib səsləndimi yaylalar?
Çevrə yanım lalə, sümbül bürümüş
Gəlin olub süsləndimi yaylalar?

Yediverən bağlar nasıl düzənmiş,
Sarı çiçək əlvan-əlvan bəzənmiş.
Yoxdan var eyləyən nə xoş özənmiş
Boyun əyib dostlandınmı yaylalar?

Göz yaşlarım sel olmuş da çağlayır
Kömür gözlüm qaraları bağlayır.
Bülbül gəlmiş çöl dalında ağlayır
Dəli idin usandınmı yaylalar?

Gözəl güllər boynun əymiş baxıyor,
Şeydalanmış quşlar sevda oxuyor,
Yenə bu həsrətlik məni yaxıyor,
Dərdim çəkib puslandınmı yaylalar?

Mən də sənin kimi ersəm murada,
Neyləyim ki əlimdə yox iradə.
Ruhsətiyəm qəm yüklərim kirədə
Məni görüb yaslandınmı yaylalar?

***

Kəklik kimi daşdan daşa səkərək,
Gərdan açıb gəlişini sevdiyim.
Sağa sola təqsim etmiş hörgüsün.
Onar-onar bölüşünü sevdiyim.

On altıya qərar verdim yaşını,
Yenicə sevdaya salmış başını,
El yanında yıxar gedər qaşını,
Tənhalarda gülüşünü sevdiyim.

Saraldı gül, bənzim soldu deyərək,
Həsrət qiyamətə qaldı deyərək,
"Hanı Ruhsəti də, noldu?" deyərək,
Arayıb da buluşunu sevdiyim.

## SÜMMANİ

(1862 — 1914)

### QOŞMA

Qınamayın bizi haqqı sevənlər
Yağmur yağmayınca sel oyanarmı?
Könül boş deyildir eşqə düşəli
Rüzgar əsməyincə dal oyanarmı?

Nedəyim dostlarım vəfasız yarı?
Mevlam hər quluna verməz bu karı.
Günbəgün artmaqda bülbülün zarı
Qönçəsiz gülşəndə gül oyanarmı?

Könül qönçəsini gəlib dərdilər,
Rəqiblərin muradına erdilər.
Sümmanini can evindən vurdular
Boylə yaman eşqə dil dayanarmı?

## MƏSLƏKİ

(1858 — 1930)

### GƏRAYLI

Dolana-dolana gələr
Ölüm yavaşca-yavaşca.
Qələm alıb yaz dərdimi
Gülüm, yavaşca-yavaşca.

Sevinməyir bir dəm yarım,
Sevda oldu öz diyarım.

Küz dedi keçdi baharım,
Selim yavaşca-yavaşca.

Sevdiyim bu yana baxmaz,
Qaş edib kirpiyin yıxmaz.
Qırıldı qanadım qalxmaz
Qolum yavaşca-yavaşca.

Bu dünyaya güvənilməz,
Ölməyincə qan kəsilməz.
Məsləki, artar, əksilməz
Zülüm yavaşca-yavaşca.

## QOŞMALAR

Saqi, başın üçün bir çarə yetir
Atəş adlı ürəyimdə yanğın var.
Yanaqdan, dodaqdan bir qətrə gətir
Atəş adlı ürəyimdə yanğın var.

Həsrətlik yaxıyor gülləri, xarı
Sardı qığılcımlar qürbi civarı.
Seyr eylə sönərmi könlümün narı
Mədət, mədət! Dəryalarda yanğın var.

Bir gün olar Məsləkini ararsan,
Niyə boylə sevdalını qınarsan,
Alışarsan, tutuşarsan, yanarsan,
Yaxın gəlmə üzərimə, yanğın var.

***

Könül yaylasında üç gül açılmış
Ağ, gül, qırmızı gül, hələ sarı gül.
Bir-birindən gözəl, doğmuş, ayrılmış
Ağ gül, qırmızı gül, hələ sarı gül.

Birisi olmuşdur başlar bəlası,
Biri domurlanmış atəş parası,
Birisi də cənnət bağı, laləsi
Ağ gül, qırmızı gül, hələ sarı gül.

İlk bahardır, yaylalara köçülmüş,
Yar əlindən dolu badə içilmiş,
Əlvan-əlvan olmuş, tazə açılmış,
Ağ gül, qırmızı gül, hələ sarı gül.

Aşıq isən tərkeyləmə hümməti,
Ustamdan qeyriyə etməm minnəti,
Birin Məsləkiyə verdi Ruhsəti:
Ağ gül, qırmızı gül, hələ sarı gül.

## DƏRDİÇOX
(1871 — 1936)

### QOŞMALAR

Hər gün könlüm istər səni görməyi
Qorxuram arada söz olar deyə.
Ala gözlüm sənə umud tutaram
Gözəlin iqrarı tez olar deyə.

Məni öldürəcək dərdin, ələmin,
Duyduqca dilindən dadlı kəlamın,
Göndər gələn ilə quru salamın,
Çəkinmə boşuna az olar deyə.

Heçmi xəbərin yox olan işlərdən,
Yatamıram qara-qara duşlardan.
Səni qısqanıram uçan quşlardan
Gözəlsən sevdiyim, göz olar deyə.

Cilvələnir, yar qarşımda dururdun,
Pərçimindən bərgüzarlar verirdin,
Məni görsən əlvan-əlvan yürürdün,
Görsən Dərdiçoxa naz olar deyə.

***

Sanıram qoxuşun yayla çiçəyi
Güldəmisən, güldəmisən, güldəmi?
Boyləmi olur gözəllərin qoçağı
Dildəmisən, dildəmisən, dildəmi?

Sənin ilə girə idim gərdəyə,
Oturaydım al tavanlı çardağa,
Yürüyüşün bənzər gözəl ördəyə,
Göldəmisən, göldəmisən, göldəmi?

Çəmənimsən əl dəymədən çirklənən,
İnsaf eylə əsgi dərdim yenilən,
Arımı oldun inil-inil inilən
Baldamısan, baldamısan, baldamı?

Vurma gözəl mənə daşını, vurma,
Çəkmə can alıcı gözünə sürmə,
Sandım yanaqların bir yetkin xurma,
Daldamısan, daldamısan, daldamı?

Bula idim sənin kimi yaranı,
İthaf etmən bir yol səni görəni,
Çox sallanma Sinəklinin ceyranı
Çöldəmisən, çöldəmisən, çöldəmi?

Hələ gözləyəlim, baxaq sonuna,
Qılavuz et, mən düşəyim önünə,
Gözəl, doğru söylə Dərdiçoxuna
Əldəmisən, əldəmisən, əldəmi?

# XIX ƏSRİN İKİNCİ YARISI TÜRKMƏN ŞAİRLƏRİ

## MOLLANƏFƏS
(1810 — 1862)

*Türkmən ədəbiyyatının böyük klassiklərindən biri Mollanəfəs (Mollanəpəs) vətəninə basqın edən İran şah qoşunlarına qarşı əli silahlı vuruşmuş və vuruşların birində yaralanaraq həlak olmuşdur. Əsasən lirik şair kimi tanınmışdır. "Zöhrə-Tahir", "Baba Rövşən", "Gülüstan" adlı əsərlərin müəllifidir.*

### FƏRAĞINDAN

Dilbər, yazaram vəsfin
Yandım ki, fərağından
Mən təşnəni bir qandır
Mey verib dodağından.

Yar qaməti peykərdir,
Rüxsari onun zərdir.
Aləm ki, münəvvərdir
Köksündəki ağından.

Firqət işığın yapsam,
Rəhmətdə vüsal tapsam,
Gahi üzündən öpsəm,
Gah alma yanağından.

Bağlarda qılam seyran,
Ağlımı qılıb heyran,
Zülfünü bölüb hər yan,
Şirmayi darağından.

## NAZLI YAR

Qara saçın gecə deyib yuxlaram
Gündüz imiş arzumanım, nazlı yar.
Səba-səhər vaxtı deyib çağlaram
Gözüm açsam arzumanım, nazlı yar.

Gəl, görüşsən kəramətli qolundan,
Aylanayın dəhanından, dilindən,
Qəhər etmə qolum salsam belindən
Atəşgahı sən, suzanım, nazlı yar.

Tərifin eşitdim qara gözünün,
Gədasıyam dostum, gülər üzünün,
Zibandan ayrılan hər bir sözünün,
Kəsgil başım, mən qurbanın, nazlı yar.

Nəfəs deyər: eşqim həddən aşıbdı,
Tamaşana ulu ellər yığışıbdı,
Gözüm açsam, ayım-günüm yaşıbdı,
Zindan oldu gen cahanım, nazlı yar...

## YAY İMDİ

Vüsalından qəmgin könlüm açıldı
Firqətindən əlif qəddim yay imdi.
Üzün nuru aləm-ara saçıldı
Hərgiz doğmaz özün kimi ay imdi.

Müştaqdır ruyinə bu dünya fani
Yolunda gədadır xanların xanı
Gəşt eylədim on səkkiz min cahanı
Heç tapmadım bir zülfünə tay imdi.

Səhər yeli zülfün pərişan edər,
Qəmzən oxdur, ciyər bağrım qan edər,
Görsə bizi şum rəqiblər tən edər,
Qız, eylədin öz qoynunda cay imdi.

Səndən özgə yarı gözüm görməsin,
Sənsiz zövqü Allah mənə verməsin,
Sən olmasan dünya bir dəm durmasın,
Yıxım-yumrum olsa deməm "vay" imdi.

Nəfəs der: bir yara belim bağlaram,
Arif özüm, dost-duşmanı sağlaram,
Ta ölüncə Durduhal der ağlaram,
Gözlərimdən dolub axsın çay imdi.

## MOLLANƏFƏS

Qəflət uyğusunda qaldın
Oyan indi Mollanəfəs.
Gah saralıb, gah soldun
Oyan indi Mollanəfəs.

Hicran ilə bağr dağlaşar,
"Səni görsəm" - der çağlaşar,
Sevən yarın çox ağlaşar,
Oyan indi Mollanəfəs.

Bu dünyaya dürrlər doldu
Aylar getdi, günlər qaldı.
Durgil indi, vaxt oldu
Oyan indi Mollanəfəs.

Bir yar gəldi alma-narlı,
Bülbül zənəxdan, göftarlı,
Qəflət uyğusunda zarlı,
Qaldın, oyan Mollanəfəs.

Sən çəkibsən çox fərağı
Bu dünya deyildir baqi.
Yaradıbdır hicran oxu
Dəydi, oyan Mollanəfəs.

Yad eylədin sevər yarı,
Ağ köksündə alma-narı,
Sarılmışdır zülfü-tarı,
Oyan indi Mollanəfəs.

Qara gözlər sən qəsdinə
Mahud saldı yar altına.
Ala öymə, al üstünə
Atdı, oyan Mollanəfəs.

Yetər ertə məhşər günü
Titrədər canları təni.
Yar uyğuda deyib səni
Öpdü, oyan Mollanəfəs.

Nəfəs, gəlgil sən huşuna,
Çox oyun gələr başına,
Yavaş-yavaş yar qarşına,
Duzak qurdu Mollanəfəs.

## AŞİQİ
(? — ?)

### MEHMAN TAPILMAZ

Mehmandır insanlar dünya evində
Gedər bir gün burdan, mehman tapılmaz.
Bu dəm qənimətdir, sürün dövranı
Əmanətdir təndə bu can, tapılmaz.

Ağzın açmış bu qara yer qucmağa
Qayğısız yer deyil yeyib-içməyə
Yer yoxdur əcəldən pünhan qaçmağa
Bu əcələ çarə, dərman tapılmaz.

Bəndə olub qılan heyrətin hanı?
Yaşlılar çəkərlər gənclik ah-vayı
Bir fəsildir coşqunluğun zamanı
Müdam eyşi-şadi-xəndan tapılmaz.

Bir yola baş vur da uğrun itirmə,
Olar olmaz sözü dilə gətirmə,
Aşiqi, qəm ilə ömrün ötürmə,
Yirmi yaş fəsildə məstan tapılmaz.

### KARINA DƏYMƏZ

Olacaq ər elə başdan qaladır
Adam vardır işi karına dəyməz.
Adam var yaramaz, cana bəladır
Adam vardır adam yarına (yarısına) dəyməz.

Adam var qazanar xidmətdən azuq(ə)
Adam vardır xidmətkardır, xəlayiq.
Adam vardır mənə bədöyə layiq
Adam vardır minən xərinə dəyməz.

Adam vardır bəyə, xana gərəkli,
Yeri pər döşəkli, baldan xörəkli,

Adam vardır, qanmaz, heyvan dərəkli
Onca yaşar, sürən ömrünə dəyməz.

Gözəl vardır, geysə altın yaraşır,
Görsən gözün doymaz, ürəyin coşar.
Gözəl vardır görsən zehinin çaşar
Pərizadın zülfü-tarına dəyməz.

Aşiqi der çoxdur adamın yönü
Adam vardır cana zəhərdir ünü.
Savaş günü, qeyrət günü, ar günü
Yüz namərdlər mərdin birinə dəyməz.

## KATİBİ

(təqr. 1803 — 1881)

Bizdən öncələrdən qalan söz vardır
Gördüyün ört, görmədiyin söyləmə.
Duyar görər, qulaq vardır, göz vardır
Gördüyün ört, görmədiyin söyləmə.

Nasehlərin nəsihətin anlagil,
Alimlərin gəlib elmin onlagil,
Arzum budur, mənim pəndim dinləgil,
Gördüyün ört, görmədiyin söyləmə.

Ayıblarsan, sənin eybin açarlar,
Dostun-yarın ölkə-ölkə qaçarlar,
Rəbbanə başına rəhmət saçarlar,
Gördüyün ört, görmədiyin söyləmə.

Oyun qurma xatun ilə, baş ilə,
Uğraşmagil dəni ilə, duş ilə,
Nə işin var yaxşı-yaman iş ilə,
Gördüyün ört, görmədiyin söyləmə.

Katibi sən izlə rahi-həqiqət
Qəbul etgil hər nə desə şəriət.
Sən kimdirsən, xalqa verib nəsihət?
Gördüyün ört, görmədiyin söyləmə.

## İÇSƏM ÖLDÜRƏRLƏR, İÇMƏSƏM ÖLLƏM

Eşqin meyin bu nazlının əlindən
İçsəm öldürərlər, içməsəm ölləm.
Sərvi - sənubər tək incə belindən
Qucsam öldürərlər, qucmasam ölləm.

Bilmənəm dünyada hədər işimi
Yolunda qoymuşam qərib başımı.
Həsrətindən gözdən axan yaşımı
Saçsam öldürərlər, saçmasam ölləm.

Yarı yey bilirəm şirin canımdan
Könlüm üzdüm hər dəm gülüstanımdan.
Yaranlar, yar üçün xanimanından
Keçsəm öldürərlər, keçməsəm ölləm.

Namus-arım cida oldu üzümdən
Özüm utanıram aytqan sözümdən.
Şum rəqiblər gülər görüb izimdən
Qaçsam öldürərlər, qaçmasam ölləm.

Miskin Katibi ahi-fəğan eyləyib,
Sona, şunqar kimi göldən ayrılıb,
Azan karvan kimi yoldan ayrılıb,
Köçsəm öldürərlər, köçməsəm ölləm.

## DOSTMƏMMƏD
(1815 — 1865)

### YANDIRAR

Fəsli bahar olub göyərsə düzlər
Bülbül nalə çəksə gülü yandırar.
Qara göz sərdarın yanında qızlar
Sallanıb gedəndə yolu yandırar.

Getsə yolu yandırar
Çıxsa çölü yandırar
Qaş qaxıb yumşaq sözlər
Dodaq-dili yandırar.

Öpsəm yarın dodağından, dilindən,
Qucaqlasam nazik, incə belindən,
Kasa içsəm sevər yarın əlindən,
Məni ağ üzünün xalı yandırar.

Mənim gözüm xalında
İxtiyarım əlində
Candan ümid üzmüşəm
Baş qoyub mən yolunda.

Sərim qurban gözəllərin məstinə,
Göz tikibdir can almanın qəsdinə,
Gözünə düşgən canım çıxsa dəstinə,
Səkkiz hörük saçı dalı yandırar.

Saçı sana sevdiyim
Əldə xına sevdiyim
Gəl ikimiz qoşalı
Cani-cana sevdiyim.

Aşiqin əlindən zikr edər daim
Asmana çıxıbdır mənim bu ahım.
Özgə qula nəsib etdi Xudayım
Mənim eşqim pünhan çölü yandırar.

Çıxma çölə dilbərim,
Bənzər gülə dilbərim.
Haq səni nəsib etmiş
Özgə qula dilbərim.

Dostməmməd olunca yolunda bəndə
Hər kəsin armanı qalıbdır səndə.
Sənin gözün məndə, mənimki səndə
Nazik kəmər incə beli yandırar.

İncə belli zibasan
Nə xoş gəldin suya sən
Aşiqin öldürməyə
Neçin rəva qıla sən?

## BƏYƏNMƏZ

Atasında, babasında görməyən
İndi geysə qızıl donu bəyənməz.
Qapısında qatır, eşşək olmayan
İndi minsə bədöy atı bəyənməz.

Qapısını kilim ilə yapmayan,
- Xoş gəldin-deyib mehmanına çapmayan,
Öz evində öylənliyin tapmayan,
Kişi evində yeyən nanı bəyənməz.

Aşıqam deyənə verilən kasa
Kasanı içincə düşər həvəsə.
Çöllük yerdə hər kərtənkələ
Yatıb tutan şir ilanı bəyənməz.

## ANNAQILIÇ METECİ
(1824 — 1884)

*Annaqılıçın "Meteci" təxəllüsü Möhtaci sözünün pozulmuş şəklidir.*

### POZAN VARMI?

Xəbər verin ey yaranlar
Yazılanı pozan varmı?
Sevdiyindən ayrılanlar
Firqətinə dözən varmı?

Aşiqlər qaçmaz adından
Yatmaz ellər fəryadından.
Fərhad kimi eşq odundan
Qara dağı qazan varmı?

Gahi-gahi qaynab-coşub,
Kabab kimi yanıb bişib,
Yarı ilə başın qoşub,
Həmdəm olub gəzən varmı?

Altmışdan aşan son salı
Qalmaz könlündə xəyalı.
Der Meteci mənin yalı
Yardan könül üzən varmı?

### YAZIR XANIN QIZI

Bizi görüb gülgü başlar
Gülsün Yazır xanın qızı.
Ağ qolların sala-sala
Gəlsin Yazır xanın qızı.

Dost tapılar qolda vara,
Başa ipək mahud bürə (bürüyə),
Xəncər alıb bağrım para,
Dəlsin Yazır xanın qızı.

Qayna ürəyim, qayna, coş
Ağ üzdə vardır qələm qaş.
Mənim ilə xeyri-şər iş
Qılsın Yazır xanın qızı.

Meteci der, qaynab coşdum,
Yar dərdindən yanıb bişdim,
Mən bir güclü dərdə düşdüm,
Bilsin Yazır xanın qızı.

## MİSKİNQILIÇ
(təqr. 1847 — 1906)

### BU DAĞLAR

Uzaq yerdən görünər bülən heybətli
Ümürdür, dumandır, qardır bu dağlar.
Cana rahat yüz min dürlü neməti
Haqdan gələn rəhmət-nurdur bu dağlar.

Soyuq suyu xəstələrin dərmanı
Dərdə şəfa olar, sağaldar canı.
Qüdrətin məskəni, mənzil, məkanı
Sıxılıb çağırsan, yardır bu dağlar.

Bədəsillər əsil olmaz, pak olmaz,
Yüz min yusan, zatı qara ağ olmaz,
Ölməz, itməz, heç yaşlanmaz, yox olmaz,
Qədimi-əyyamdan vardır bu dağlar.

Əcdərha, marları durur dolanır,
Əyrək qoç, ağ maral burda sulanır,
Quş salsan, kəklik, turac ovlanır
Pələngdir, qaplandır, şirdir bu dağlar.

Qəm dolub çıxanda könlüm açılır,
Çaylarından uçmaq suyu içilir,
Allahın rəhməti burda saçılır,
Dövlətdir, hörmətdir, nurdur bu dağlar.

Yaz olsa açılar min dürlü gülzar
Varıb görgil əgər olsan xiridar.
Əngur var, incir var, alma, ənar var
Bostandır bu dağlar, bardır bu dağlar.

Miskinqılıç, çıxdım düşman qəsdindən,
Dəlisindən, Məcnunundan, məstindən,
Çox cananlar ötmüş bunun üstündən,
Bu gün bizə müyəssərdir bu dağlar.

## DÖVLƏTMƏMMƏD BALQIZIL
(1854-1912)

*Dövlətməmməd Balqızıl Yomut boyunun Qızıllar aşirətindəndir. Saz çalmış, baxşılıq etmişdir.*

### BİBİNİN

Göllərin sonası, bağın bülbülü
Kirpiyi tir, qaşı yaydır Bibinin.
Qəddi ziba, üzü nurdan tökülən
Görsən camalını aydır Bibinin.

Mehman gəlsə əlli-yüz deyib basılmaz
Gövdəsi darıxıb, könlü qısılmaz.
Süfrəsi sərili, izi kəsilməz
Əzəldən iqbalı baydır Bibinin.

Pərilər peykəri, cənnətdə huri
Dünyada yaxşının yaxşıdan biri.
Oldur öldürücü zülfünün tarı
Varsam otağına caydır Bibinin.

Deyər Dövlətməmməd vardım evinə
Heyran qaldım qamətinə, boyuna.
Məxdim Şirvan derlər əsli soyuna
Qılqan işi caybacaydır Bibinin.

# “QAÇAQ NƏBİ” DASTANINDAN ŞERLƏR

*“Qaçaq Nəbi” XIX əsrdə Azərbaycanda yaranmış son böyük xalq dastanıdır. Qədim oğuz torpaqlarında, indi Ermənistan adlanan ölkənin Zəngəzur qəzasında dünyaya gəlmiş Nəbi də, onun həyat yoldaşı və silahdaşı Həcər də dastan personajları olmaqla bərabər, həm də real tarixi şəxsiyyətlərdir. XIX əsrin ikinci yarısında çar müstəmləkə məmurlarına qarşı mübarizə aparan xalq qəhrəmanlarıdır. Nəbinin, Həcərin igidlikləri dastan şəklində, el mahnıları şəklində dildən-dilə düşmüş, onların adları bütün Qafqazda, Güney Azərbaycanda və Doğu Anadoluda geniş tanınmışdır. Başqa dastanlarımız kimi bu dastanda da nəsr və şer mətnləri üzvi vəhdətdədir. Dastandakı şerlərdən bir neçəsini antologiyamıza daxil edirik.*

Qazamat istidi yata bilmirəm,
Düşmənim güclüdü, bata bilmirəm,
Ayaqda qandalaq qaça bilmirəm,
Mənim bu günümdə gələsən Nəbi,
Qazamat dalını dələsən Nəbi!

Qazamat istidi, ağrıyır başım,
Axır gecə-gündüz qanlı göz yaşım,
Olubdu daş divar mənim sirdaşım,
Mənim bu günümdə gələsən Nəbi,
Qazamat dalını dələsən Nəbi!

Mən gələndə şamamalar gül idi,
Dörd yanımı atlı düşmən bürüdü,
Yazıq canım qazamatda çürüdü,
Mənim bu günümdə gələsən Nəbi,
Zalımlar əlindən alasan Nəbi!

Yorğanım ədyaldı, döşəyim həsir,
Nəçənnik gələndə ürəyim əsir,
Silistçi dindirir, prokuror kəsir,
Mənim bu günümdə gələsən Nəbi,
Qazamat dalını dələsən Nəbi!

Nəbinin yolunu düşmən bağladı,
Həcər xanım yanım deyib ağladı,
Düşmən qazamatda məni saxladı,
Mənim bu günümdə gələsən Nəbi,
Qazamat dalını dələsən Nəbi!

Həcər xanım, sözün gəldi avaza,
Bir kimsə tapılmır dərdimi yaza,
Bir cüt iyidim qərq olubdu Araza,
Mənim bu günümdə gələsən Nəbi,
Qazamat dalını dələsən Nəbi!

Tellərim tökülüb, üzüm laladı,
Qaşlarım qaradı, gözüm aladı,
Yan-yörəm düşməndi, yerim qaladı,
Mənim bu günümdə gələsən Nəbi,
Düşmənin əlindən alasan Nəbi!

Döşəyim kərpicdi, yasdığım saman,
Yorğanım həsirdi, üşüdüm aman,
Hər tərəf hasardı, hər tərəf duman,
Mənim bu günümdə gələsən Nəbi,
Zalımlar əlindən alasan Nəbi!

Gorusun qaşında qopubdu sazaq,
Düzülüb qarovul, saldatdı, qazaq,
Nəçənnik qoymayır bir kağız yazaq,
Mənim bu günümdə gələsən Nəbi,
Yağılar əlindən alasan Nəbi!

***

Nəbinin birçəyi oyma-oymadı,
O Həcərdən, Həcər ondan doymadı,
Qırdı bəyi, xanı, birin qoymadı,
Deyirlər iyiddi o nadan Nəbi,
Tüfəngi havada oynadan Nəbi!

Qaçaq Nəbi ilə Mehdi qardaşdı,
Onların məkanı qayadı, daşdı,
İyidlər içində hamıdan başdı,
Deyirlər iyiddi o nadan Nəbi,
Tüfəngi havada oynadan Nəbi!

Nəbi mərd iyiddi, qoçaq oğlandı,
Dosta, yoldaşlara çox mehribandı,
Mənim də bu canım ona qurbandı,
Deyirlər iyiddi o nadan Nəbi,
Tüfəngi havada oynadan Nəbi!

***

Nə düşübsüz fağır xalqın canına,
Rəhminiz gəlməyir axan qanına,
Mərd-mərdanə durub gəldim yanına,
Bacarırsan, indi özün tut məni!
Bəylər üçün anam doğub qurd məni!

Mərd oğluyam, bəydən, xandan qaçağam,
Düşmənin gözünə iti bıçağam,
Yoxsul üçün ipək kimi yumşağam,
Sizin üçün anam doğub sərt məni,
Bacarırsan, indi özün tut məni!

Gəl Nəbinin yaxşı bax sən boyuna,
Evini döndərər matəm toyuna,
Sizin kimi sürü-sürü qoyuna
Anam doğub iti dişli qurd məni!
Bacarırsan, indi özün tut məni!

***

Nəbinin gözləri aladı, ala,
Qoç Nəbi olubdu düşmənə bəla,
Nəbinin məskəni uca bir qala,
Qoy sənə desinlər ay Qaçaq Nəbi!
Həcəri özündən ay qoçaq Nəbi!

Dağların başları dumandı, duman,
Nəbidən çəkirlər zalımlar aman,
Qoç Koroğlu kimi Nəbi qəhrəman,
Qoy sənə desinlər ay Qaçaq Nəbi!
Həcəri özündən ay qoçaq Nəbi!

Nəbinin bığları eşmə-eşmədi,
Papağı güllədən deşmə-deşmədi,
Nəbinin atını heç at keçmədi,
Qoy sənə desinlər ay Qaçaq Nəbi!
Həcəri özündən ay qoçaq Nəbi!

Nəbinin qaşları qaradır, qara,
Düşmən ürəyinə vurubdu yara,
Bəyləri, xanları gətirib zara,

Qoy sənə desinlər ay Qaçaq Nəbi!
Həcəri özündən ay qoçaq Nəbi!

Gün çıxıbdı günortanın yerinə,
Həcər xanım qalxıb atın belinə,
Əşrəfi, mirvari düzüb telinə,
Qoy sənə desinlər ay Qaçaq Nəbi!
Həcəri özündən ay qoçaq Nəbi!

***

Gorusun qaşında yıxılıb yatdım,
Ehtiyatı əldən kənara atdım,
Öz xəcalətimdən qan-tərə batdım,
Boz at, qurtar məni, aman günüdü!
Yoldaşların darda yaman günüdü!

Boz at, səni sər tövlədə bağlaram,
And içirəm, sənə məxmər çullaram,
Əgər məni bu davadan qurtarsan
Qızıldan, gümüşdən səni nallaram,
Boz at, qurtar məni, aman günüdü!
Yoldaşların darda yaman günüdü!

Gümüşdən döydürrəm sənin nalını,
Yüz gözələ hördürərəm yalını,
Sən gəl qoç Nəbinin pozma halını,
Boz at, qurtar məni, aman günüdü!
Yoldaşların darda qalan günüdü!

***

Ömür mənəm, bəxt mənəm,
Dərdli desən bax, mənəm.
Səndən sonra dünyaya
Bir də dönüb baxmanam.

Sənə yaralı qurban,
Bağrı qaralı qurban,
Sənin təzə yarana
Köhnə yaralı qurban.

***

Dağıtdı Urmuda düşmənlər oba,
Qara yurdu görüm qalsın xaraba,
Qoç Nəbi gedibdi ayılmaz xaba,
Darasın saçını tellər ağlasın!
Yerisin üstünə ellər ağlasın!

Gözüm dəydi taxçadakı yəhərə,
Dəydi ağır yara igid Həcərə,
Qanlı köynəyini verin Yetərə,
Darasın saçını tellər ağlasın!
Yerisin üstünə ellər ağlasın!

Qanlı yaş tökməyən gözlər olmasın,
Məclislər qurulub badə dolmasın,
Üstünə gəlməyən ellər qalmasın,
Darasın saçını tellər ağlasın!
Yerisin üstünə ellər ağlasın!

Qoç Nəbinin ellər alsın qanını,
Qırsın bəyini, şahını, xanını,
Viran qoysun yurdu-xanimanını,
Darasın saçını tellər ağlasın!
Yerisin üstünə ellər ağlasın!

Qan ağla sən əziz ellərim mənim,
Gör necə solubdu güllərim mənim,
Tutulub, lal olub dillərim mənim,
Darasın saçını tellər ağlasın!
Yerisin üstünə ellər ağlasın!

***

Ay doğum batarmola,
Ülkərə çatarmola,
Ana baladan ayrı
Dincəlib yatarmola?

Xoruz ban verən yerdə,
Yaram qan verən yerdə,
Ana gəlsin yetişsin
Oğul can verən yerdə.

***

Çəkilib sinəmə balamın dağı,
Əridi, qalmadı ürəymin yağı,
Səsimi eşidib heç gəlmir Nəbim!
Anasını yada heç salmır Nəbim!

Ah çəkməkdən halım olubdu yaman,
Zalımlar əlindən dad-aman, aman,
Əldən getdi Nəbim, dəyişdi zaman,
Səsimi eşidib heç gəlmir Nəbim!
Anasını yada heç salmır Nəbim!

Bilməm kimə gedim mən şikayətə,
Yağı düşmən salıb məni zillətə,
Baş götürüb çıxım, gedim qürbətə,
Səsimi eşidib heç gəlmir Nəbim!
Anasını yada heç salmır Nəbim!

İyid canı qismət oldu torpağa,
Ürəyim dönübdü solmuş yarpağa,
Meydan oxuyarmış şirə qurbağa,
Səsimi eşidib heç gəlmir Nəbim!
Anasını yada heç salmır Nəbim!

Gecə-gündüz Nəbi deyə mələrəm,
Haqdan mən özümə ölüm dilərəm,
Dayanmaram sənsiz, mən də gələrəm,
Səsimi eşidib dedi: gəl, ana!
Sən həmişə məni yada sal, ana!

***

Əzizim tikə-tikə,
Dağlandım tikə-tikə,
Anan saçını yolur
Kəfənin tikə-tikə.

# AZƏRBAYCAN VƏ TÜRKİYƏ ŞAİRLƏRİ

## MİRZƏ ƏLƏKBƏR SABİR

(1862 — 1911)



*Mirzə Ələkbər Sabir Tahirzadə Şamaxıda doğulmuş, yaşamış və dəfn olunmuşdur. Sabir yalnız Azərbaycan ədəbiyyatında deyil, ümumən türk və Şərq şerində tamamilə yeni səhifə açmış dahi şairdir. Şairin müasiri, dostu, əsərlərinin ilk toplayanı və naşiri Abbas Səhhət doğru deyir: "Sabir əfəndi... köhnə şerlə yeni şer arasında bir əsrlik qədər uçurum açdı ki, bir daha geri dönüb də o uçurumu atlanmağa kimsədə cürət və cəsarət qalmadı." "Sabir bir şair kimi C. Məmmədquluzadənin nəşr etdiyi "Molla Nəsrəddin" jurnalının səhifələrində yetişdi, amma ədəbiyyatımızda "Molla Nəsrəddin" ədəbi məktəbi olduğu kimi, ayrıca poeziyamızın da Sabir ədəbi məktəbi var. Antologiyamızın "Molla Nəsrəddin" şairləri bölməsində Sabir ədəbi məktəbinin nümayəndələrinin şerləri bunu əyani şəkildə təsdiqləyir. Sabir şerinin təsir dairəsi Azərbaycanın sərhədlərindən çox uzaqları da əhatə edir. İran, Türküstan xalqları, tatar şerinin yeniləşməsində Sabirin güclü təsiri olub. Yenə də Abbas Səhhətin daha bir doğru fikrini xatırladaq: "Mən... iddia edirəm ki, Sabir əfəndinin də asarı bu beş ilin müddətində İran məşrutəsinə... bir ordudan ziyadə xidmət etmişdir." Böyük Türkiyə şairi Nazim Hikmət Sabiri yüksək qiymətləndirirdi.*

*Şeri mücərrəd və şablon qəliblərdən qurtarıb çağdaş ictimai və siyasi həyatın ən kəskin problemləriylə üz-üzə qoyan, Şərqin ən ağrılı məsələlərindən söz*

*açan, əruzun bəhrlərini xalq danışıq dilinin canlı intonasiyalarıyla mum kimi yumşaldan Sabir təbii ki, yalnız "Molla Nəsrəddin" şairləri deyil, ümumən XX əsr Azəri türk şeri üçün yeni üfüqlər açmış misilsiz novator sənətkardır.*

*Mətbuatda əsasən "Hophop" təxəllüsüylə çıxış edən Sabirin ölümündən sonra "Hophopnamə"sinə toplanmış satiralarından başqa, uşaq şerləri, aşiqanə qəzəlləri, dini mövzularda növhə və mərsiyələri də var. Bu səpkili əsərlərindən bəzi örnəkləri də antologiyamıza daxil etdik.*

## NƏ YAZIM?

Şairəm, çünki vəzifəm budur əşar yazım,
Gördüyüm nikü bədi eyləyim izhar, yazım.
Günü parlaq, günüzü ağ, gecəni tar yazım,
Pisi pis, əyrini əyri, düzü həmvar yazım,
　　Niyə bəs boylə bərəldirsən, a qare, gözünü?
　　Yoxsa bu ayinədə əyri görürsən özünü?
Şerə məşğul edərək xatiri-qəmmayilimi,
Qoyuram qənşərimə kağızımı, çernilimi.
Gəlirəm yazmağa bir kəlmə, tutursan əlimi,
Qorxuram, ya nə üçün — çünki kəsirsən dilimi!
　　Ey əcəb, mən ki, sədaqət yolunu azmayıram,
　　Hələ gördüklərimin dörddə birin yazmayıram!
Hələ mən dörddə birin yazmayıram, karına bax,
Üstümə gündə söyürsən bu qədər, arına bax,
Özün insaf elə əfkarına, ətvarına bax,
İstəmirsən yazam? Öz eybli kirdarına bax!
　　Kişi, sən eybini qan, mənlə əbəs cəng eləmə!
　　Özünü, həm məni bu barədə diltəng eləmə!
Görür ərbabi-qələm qayeyi-amalınızı,—
Məndən artıq yaza bilməkdə ikən halınızı,—
Yazmır onlar dəxi on dörddə bir əfalınızı,
Özünüzsüz olara yazdıran əhvalınızı...
　　Yoxsa bu eybdən aləmdə mübərradır olar,
　　Boylə alçaq yazıdan min kərə əladır olar!
Necə mən dörddə birin yazmağa eymən deyiləm,
Qorxur on dörddə birin yazmağa həm əhli-qələm.
Sən əgər söz verəsən: "Qorxma, qıl əhvali-rəqəm",
Vəzi-halın yazılarsa zili zilü bəmi bəm,
　　Elə bir halə düşərsən ki, tükün biz-biz olar,
　　Əyninə geyməyə şey tapmasan, astar üz olar!

## NƏ İŞİM VAR

Millət necə tarac olur olsun, nə işim var!?
Düşmənlərə möhtac olur olsun, nə işim var?!
Qoy mən tox olum, özgələr ilə nədi karım,
Dünyavü cahan ac olur olsun, nə işim var?!

Səs salma, yatanlar ayılar, qoy hələ yatsın,
Yatmışları razı deyiləm kimsə oyatsın,
Tək-tək ayılan varsa da, həq dadıma çatsın,
Mən salim olum, cümlə cahan batsa da, batsın:
Millət necə tarac olur olsun, nə işim var?!
Düşmənlərə möhtac olur olsun, nə işim var?!

Salma yadıma söhbəti-tarixi-cəhani,
Əyyami-sələfdən demə söz bir də, filani,
Hal isə gətir meyl eləyim dolmanı, nani,
Müstəqbəli görmək nə gərək, ömrdü fani;
Millət necə tarac olur olsun, nə işim var?!
Düşmənlərə möhtac olur olsun, nə işim var?

Övladi-vətən qoy hələ avarə dolansın,
Çirkabi-səfalətlə əli, başı bulansın,
Dul övrət isə sailə olsun, oda yansın,
Ancaq mənim avazeyi-şənim ucalansın;
Millət necə tarac olur olsun, nə işim var?!
Düşmənlərə möhtac olur olsun, nə işim var?

Hər millət edir səfheyi-dünyadə tərəqqi,
Eylər hərə bir mənzili-məvadə tərəqqi,
Yorğan-döşəyimdə düşə gər yadə tərəqqi,
Biz də edərik aləmi-röyadə tərəqqi;
Millət necə tarac olur olsun, nə işim var?!
Düşmənlərə möhtac olur olsun, nə işim var?

## BİR MƏCLİSDƏ ON İKİ KİŞİNİN SÖHBƏTİ

Vəkil

Həqsizə həqli deyib, bir çox günaha batmışam.

Həkim

Dərdi təşxis etməyib, qövm-əqrəba ağlatmışam.

Tacir

Mən həlal ilə həramı bir-birinə qatmışam.

Rövzəxan

Ümmətin pulun alıb, mən gözlərin islatmışam.

Dərviş

Nerdə bulsam söz açıb, min-min yalan söz satmışam.

Sofi

Ruzü şəb həq-həq deyib, mən hər kəsi oynatmışam.

Molla

Gündə bir fitva verib, məxluqu çox aldatmışam.

Elm

Qətü-ümmid etmişəm, yeksər bu qövmi atmışam.

Cəhl

Ortada keyf eyləyib, mən həm mərامə çatmışam.

Şair

Bülbülə, eşqə, gülə dair yalan fırlatmışam.

Əvam

Anlamam hərgiz, cəhalət bəstərində yatmışam.

Qəzetəçi

Mən cəridəm dolmaq üçün mətləbi uzatmışam.

## TƏK SƏBİR

Ta gəlirik biz də bir az anlayaq,-
Məhzəri-irfanda vurur tək səbir.
Ya deyirik işləri sahmanlayaq,-
 Məclisi-əyanda vurur tək səbir.

İstəyirik bir iş açaq filməsəl,
Söyləşirik bir-iki il laəqəl,
Ta deyilir pul verin, aşsın əməl,-
 Ölkədə hər yanda vurur tək səbir.

Yalxı bizi eyləməyib mübtəla:
Səfheyi- Qafqazı tutub bu bəla.
Qaxda, Qazaxda, Şəkidə bərmələ,
 Şişədə, Şirvanda vurur tək səbir.

Lakin o yerlərdə gedir, durmayır,
Bir elə layiqli kələk qurmayır.
Gəncədə derlərsə vurur, vurmayır,
    Oylə ki, Səlyanda vurur tək səbir.

Andıra qalmış nə yaman səslənir!
Söz deməyə vermir aman, səslənir!
Ox atılır, sanki kaman səslənir!
    Sahəti-meydanda vurur tək səbir.

Hərzə nə şura və nə məclis bilir,
Nə düşünür yaxşı, nə bir pis bilir.
Qorxmur, utanmır, nə də bir his bilir
    Hücrədə, dükkanda vurur tək səbir...

## FƏXRİYYƏ

Hərçənd əsirani-qüyudati-zəmanız,
Hərçənd düçarani-bəliyyati-cəhanız,
Zənn etmə ki, bu əsrdə avareyi-nanız,
Əvvəl nə idiksə, yenə biz şimdi həmanız...
    Turanlılarız, adiyi-şüğli-sələfiz biz!
    Öz qövmümüzün başına əngəlkələfiz biz!

Zülmətsevər insanlarız üç-beş yaşımızdan,
Fitnə göyərir torpağımızdan, daşımızdan:
Tarac edərək, bac alırız qardaşımızdan,
Çıxmaz, çıxa bilməz də bu adət başımızdan...
    Əslafımıza çünki həqiqi xələfiz biz!
    Öz qövmümüzün başına əngəlkələfiz biz!

Ol gün gi, Məlikşah Büzürg eylədi rihlət,
Etdik iki namərd vəzirə təbəiyyət:
Qırdıq o qədər bir-birimizdən ki, nəhayət,
Düşmən qatıb əl, taxtımızı eylədi qarət...
    Öz həqqimizi gözləməyə bitərəfiz biz!
    Turanlılarız, adiyi-şüğli-sələfiz biz!

Bir vəqt olub ləşkəri-Çingizə tərəfdar,
Xarəzmləri məhv elədik qətl ilə yekbar:
Xarəzmlərin şahı fərar eylədi naçar,
Məscidləri, məktəbləri yıxdıq yerə təkrar...
    Həqqa ki, səzavari-nişanü şərəfiz biz!
    Öz dinimizin başına əngəlkələfiz biz!

Bir vəqt də dəvayi-Səlib oldu mühəyya,
Dəvadə firənglərə qalib gəlib, əmma

Dincəlməyib etdik yenə bir faciə bərpa,
Öz tiğimiz öz rişəmizi kəsdi sərapa...
Guya ki, biyabanda bitən bir ələfiz biz!
Öz qövmümüzün başına əngəlkələfiz biz!

Bir vəqt dəxi Qarəqoyun, Ağqoyun olduq,
Azərbaycana, həm də Anatoluya dolduq.
Ol qədr qırıb bir-birimizdən ki, yorulduq,
Qırdıqca yorulduq və yorulduqca qırıldıq...
Turanlılarız, adiyi-şüğli-sələfiz biz!
Öz qövmümüzün başına əngəlkələfiz biz!

Bir vəqt salıb təfriqə olduq iki qismət,
Teymur şahə bir paramız etdi himayət:
Xan İldırıma bir paramız qıldı itaət,
Qanlar saçılıb, Ankarada qopdu qiyamət...
Əhsən bizə! Həm tirzəniz, həm hədəfiz biz!
Öz qövmümüzün başına əngəlkələfiz biz!

Teymur şəhi-ləngə olub tabeyi-fərman,
Xan Toxtamışı eylədik al qanına qəltan:
Ta oldu Qızıl Ordaların dövləti talan,
Məsko şəhinə faidəbəxş oldu bu meydan...
Əlyövm uruslaşmaq ilə zişərəfiz biz!
Öz dinimizin başına əngəlkələfiz biz!

Bir vəqt Şah İsmayilü Sultani-Səlimə
Məftun olaraq eylədik islamı dünimə:
Qoyduq iki tazə adı bir dini-qədimə,
Saldı bu təşəyyə, bu təsənnün bizi bimə...
Qaldıqca bu halətlə səzayi-əsəfiz biz!
Öz dinimizin başına əngəlkələfiz biz!

Nadir bu iki xəstəliyi tutdu nəzərdə,
İstərdi əlac eyləyə bu qorxulu dərdə:
Bu məqsəd ilə əzm edərək girdi nəbərdə,
Məqtulən onun nəşini qoyduq quru yerdə...
Bir şeyi-əcibiz, nə bilim, bir tühəfiz biz!
Öz dinimizin başına əngəlkələfiz biz!

İndi yenə var tazə xəbər, yaxşı təmaşa,
İranlılıq, osmanlılıq ismi olub əhya:
Bir qitə yer üstündə qopub bir yekə dəva,
Meydan ki qızışdı olarıq məhv sərapa...
Onsuz da əgərçənd ki, yeksər tələfiz biz!
Öz qövmümüzün başına əngəlkələfiz biz!

## QORXURAM

Payi-piyadə düşürəm çöllərə, —
Xari-müğilan görürəm, qorxmuram.

Seyr edirəm bərrü biyabanları, —
Quli-biyaban görürəm, qorxmuram.

Gah oluram bəhrdə zövrəqnişin, —
Dalğalı tufan görürəm, qorxmuram.

Gah çıxıram sahilə, hər yanda min
Vəhşiyi-ğürran görürəm, qorxmuram.

Gah şəfəq tək düşürəm dağlara, —
Yanğılı vulkan görürəm, qorxmuram.

Gəh enirəm sayə tək ormanlara, —
Yırtıcı heyvan görürəm, qorxmuram.

Üz qoyuram gah neyistanlara, —
Bir sürü aslan görürəm, qorxmuram.

Məqbərəlikdə edirəm gah məkan, —
Qəbrdə xortdan görürəm, qorxmuram.

Mənzil olur gah mənə viranələr, —
Cin görürəm, can görürəm, qorxmuram.

Bu küreyi-ərzdə mən, müxtəsər,
Müxtəlif əlvan görürəm, qorxmuram.

Xarici mülkündə də hətta gəzib
Çox tühaf insan görürəm, qorxmuram.

Leyk, bu qorxmazlıq ilə, doğrusu,
Ay dadaş, vallahi, billahi, tallahi,

Harda müsəlman görürəm, qorxuram!..
Bisəbəb qorxmayıram, vəchi var:

Neyləyim axır, bu yox olmuşların
Fikrini qan-qan görürəm, qorxuram,
Qorxuram, qorxuram, qorxuram!..

## MƏN BELƏ ƏSRARI QANA BİLMİRƏM!

Mən belə əsrarı qana bilmirəm,
Qanmaz olub da dolana bilmirəm!..

Axtaxana, dağda dana böyüdü,
Mən böyük ollam haçana, bilmirəm!..

Derlər utan, heç kəsə bir söz demə,
Haq sözü derkən utana bilmirəm!..

Neyləməli, göz görür, əqlim kəsir,
Mən günəşi göydə dana bilmirəm!..
Şiddəti-seylan ilə baran tökür,
Bir koma yox, daldalana bilmirəm!..
Derlər usan, hərzəvü hədyan demə,-
Güc gətirir dərd, usana bilmirəm!..
Derlər, otur evdə, nedim, kasibəm,
Kəsb eləməzsəm, qazana bilmirəm!..
Derlər, a qanmaz, de yıxıl, öl, qurtar!
Hə, balam, doğrusu, ay dadaş, mən dəxi
Məsləhət ondan o yana bilmirəm!..

## SUAL-CAVAB

— Görmə! — Baş üstə, yumaram gözlərim.
— Dinmə! — Mütiyəm, kəsərəm sözlərim.
— Bir söz eşitmə! — qulağım bağlanm.
— Gülmə — Pəkey, şamü səhər ağlaram.
— Qanma! — Bacarmam! Məni məzur tut,

Böyləcə təklifi-məhalı unut!
Qabili-imkanmı olur qanmamaq?
Məcməri-nar içrə olub yanmamaq?
Eylə xəmuş atəşi-suzanını,
Qıl məni asudə, həm öz canını!

## DAŞ QƏLBLİ İNSANLARI NEYLƏRDİN, İLAHİ?!

Daş qəlbli insanlan neylərdin, ilahi?!
Bizdə bu soyuq qanlan neylərdin ilahi?!
Artdıqca həyasızlıq olur el mütəhəmmil,
Hər zülmə dözən canlan neylərdin, ilahi?!
Bir dövrdə kim, sidqü səfa qalmayacaqmış, —
Bilməm belə dövranlan neylərdin, ilahi?!
Məzlumlarrn göz yaşı dərya olacaqmış, —
Dəryalan, ümmanlan neylərdin, ilahi?!
Səyyadi-cəfakardə rəhm olmayacaqmış, —
Ahulan, ceyranlan neylərdin, ilahi?!
Bağın, əkinin xeyrini bəylər görəcəkmiş, —
Töxm əkməyə dehqanlan neylərdin, ilahi?!
İş rəncbərin, güc öküzün, yer özününkü, —
Bəyzadələri, xanlan neylərdin, ilahi?!

Hökm eyləyəcəkmiş bütün aləmdə cəhalət, —
Dildadeyi-irfanları neylərdin, ilahi?!

Surtuqlu müsəlmanları təkfirə qoyan bu
Döşdüklü müsəlmanları neylərdin, ilahi!?

Yaxud, buların bunca nüfuzu olacaqmış, —
Beş-üç bu süxəndanları neylərdin, ilahi?!

Qeyrətli danosbazlarımız iş bacarırkən, —
Tənbəl, dəli şeytanları neylərdin, ilahi?!

Ərlər hərə bir qız kimi oğlan sevəcəkmiş, —
Evlərdəki nisvanları neylərdin, ilahi?!

Tacirlərimiz Sonyalara bənd olacaqmış, —
Bədbəxt Tükəzbanları neylərdin, ilahi?!

Sübhanəkə, sübhanəkə, sübhanəkə, ya rəb!
Baxdıqca bu hikmətlərə heyran oluram həp!..

## ŞİKAYƏT

A kişi, bundan əzəl xəlqdə hörmət var idi,
Binəva mollalara hörmətü izzət var idi!

Ağa hər yana ki, anqır desə, xəlq anqır idi,
Yer üzündə bərəkət, nemətü dövlət var idi!

Kimin ağzıydı ki, mən ağ deyənə qarə desin?
Hər nəyə əmr eləsəm, xəlqdə taət var idi!

Hərə öz əmrinə məşğul idi başı aşağa,
Nə bu mollayə sataşmaq, nə bu söhbət var idi!

Elm hardaydı, müsəlman harada, qardaşım,
Nə tərəqqi sözü, nə söhbəti-millət var idi!

A dönüm başına, bilməm bu cavanlar nə deyir
Ki, əzəl onlara nə qüslü təharət var idi!

Hamısı kafirə bənzər o həramzadələrin,
Nə müsəlmanlığa onlarda şəbahət var idi!

Bu yatan taifəni onlar oyatdı, heyhat!..
Keçdi ol dövr ki, mollalara rahət var idi!

Müftəxorluq nə gözəl peşə idi tutmuş idim,
Nə açan üstünü kanın, nə şəmatət var idi!

Ziddimə söz deyən olsaydı edərdim təkfir,
İşimi qurdalasın kimdə nə cürət var idi?

İndi bu xırda uşaqlar da edir tənə bizə,
Fövt olub getdi o əyyam ki, fürsət var idi!

Ah, əfsus ki, keçdi o gözəl dövranım!
Rahət idim ki, bu xəlq içrə cəhalət var idi!

## ADƏMİ ADƏM EYLƏYƏN PARADIR

Adəmi adəm eyləyən paradır,
Parasız adəmin üzü qaradır!

Qoy nə əslin, nəcabətin olsun,
Nə nəcibanə halətin olsun,
Baş-ayaq eyb içində olsan da-
Tək bu aləmdə dövlətin olsun;
Adəmi adəm eyləyən paradır,
Parasız adəmin üzü qaradır!

Olmasın fəhmin, əqlin, idrakın,
Var nə qəm, ta ki, vardır əmlakın;
Atəşi-xanəsuzi-millət ikən-
Hər kəsin səcdəgahidir xakın;
Adəmi adəm eyləyən paradır,
Parasız adəmin üzü qaradır!

Olmayır, olmasın da insafın,
Dut qanın şişə içrə əsnafın,
Ta ki, var əldə beş buçuq quruşun-
Mötəbərsən gözündə əşrafın;
Adəmi adəm eyləyən paradır,
Parasız adəmin üzü qaradır!

## ƏHVALPÜRSANLIQ, YAXUD QONUŞMA

— Nə xəbər var, məşədi?
— Sağlığın!
— Az-çox da yenə?
— Qəzet almış Hacı Əhməd də...
— Pah! Oğlan, nəmənə? Sən özün gördün alanda?
— Belə nəql eylədilər!..
— Dəxi kim qaldı, xudaya, bu vilayətdə mənə?!
Bu isə pəs o ləinin də işi qullabıdır,
Dinü imanı danıb, yoldan azıbdır, babıdır!

— Dəxi bir başqa xəbər?
— Hacı Cəfərin oğlu Vəli
Qoyub uşqolaya oğlun...
— O qurumsaq da?
— Bəli!
— Sənə kim nəql eylədi bu sözü?
— Bilməm kim idi.
— Oylə isə ona da min kərə lənət deməli!..

Bu isə pəs o ləinin də işi qullabıdır.
Dinü imanı danıb, yoldan azıbdır, babıdır!

— Dəxi bir başqa xəbər yoxmu?
— Tanırsan Qəfəri?
— Nə Qəfər? Hansı Qəfər?
— Mirzə Mənafın pədəri!
— Tanıram!
— Dün o da bir şübhəli kəslə danışıb.
— Kim deyirdi?
— Yedici Xansənəm arvadın əri.
— Bu isə pəs o ləinin də işi qullabıdır,
Dinü imanı danıb, yoldan azıbdır, babıdır!

— Yenə bir başqa xəbər varmı?
— Bizim qonşu Kərim...
— A... A... A?..
— Bəli, hə... Hə!..
— O nə qayırıb, de görüm?
— "Molla Nəsrəddin" alıb, həm özü, həm oğlu oxur.
— El bütün kafir imiş ölkədə, yoxmuş xəbərim!
— Bu isə pəs ləinin də işi qullabıdır,
Dinü imanı danıb, yoldan azıbdır, babıdır!

— Mənə bir böylə xəbər çatdı: Səməd dam-daşını
Satıb, onversetə göndərmək üçün qardaşını...
— Bu xəbər doğrudur, ancaq bunu da bilməlisiz...
Özü də çəkmə geyib, saç da qoyubdur başına...
Bu isə pəs o ləinin də iş qullabıdır,
Dinü imanı danıb, yoldan azıbdır, babıdır!

— Bir belə söz də deyirlər ki, sizin Kalba Aşır
Yeni məktəbçilər ilə gecə-gündüz yanaşır?!
— Bəli, düzdür bu dəxi...
— Heyf, o dövlətdən ona!.
Dövlət azdırdı onu, dini-xudadan uzaşır...
Bu isə pəs o ləinin də işi qullabıdır,
Dinü imanı danıb, yoldan azıbdır, babıdır!

— Doğrudurmu ki, Bədəl də qoyub ağzın yabana,
Danışır bir para sözlər ki, dəyir rövzəxana?
— Bəli, qurbanın olum, lap o çıxıb məhzəbdən!
— Görməyirsənmi şişib boynu, dönüb bir qabana?!
Bu isə pəs o ləinin də işi qullabıdır,
Dinü imanı danıb, yoldan azıbdır, babıdır!

— O qurumsaq Cəbi də gözləməyir hörmətimi,
Burda-orda, belə derlər ki, edir qiybətimi...

— Bəli, hətta bu işin üstə onun arvadına söymüşəm!
— Borcun odur, - gözləmisən qeyrətimi...
Mən də hər daim ona yağdıraram lənətimi,
Başlayıb dəvətimi, ərz edib hacətimi,
Vaqfi-nifrin edərəm hər günümü, saətimi,
Deyərəm xəlqə: bu bidinin işi qullabıdır,
Siz də lənət oxuyun, çünki bu məlun babıdır!

## SƏBR EYLƏ

Bəlayi-fəqrə düşdün, razı ol, biçarə, səbr eylə!
Üzün oldisə gər külfət yanında qarə, səbr eylə!

Əsiri-qeydi-fəqr oldun, yazıq, təslimi-hirman ol!
Çalışma, bir işə getmə, fəqət məyusü nalan ol!
Qəzayə çarə yox, giryan ol, üryan ol, pərişan ol!
Səbur ol, şakir ol, yəni müsəlman ol, müsəlman ol!
Çatar öz rizqi-məqsumun, dolan avarə, səbr eylə!
Bəlayi-fəqrə düşdün, razı ol, biçarə, səbr eylə!

Məaşın ta ki, təng oldu, ənis ol dərdü möhnətlə!
Boş ol, süst ol, ümidin qət yar ol ətalətlə!
Bunu təqdirə nisbət ver, yaşa daim rəzalətlə!
Həvadə seyr edən insanə baxma çeşmi-qeyrətlə!
Burax kəsbi, unut səyi, yapışma karə, səbr eylə!
Bəlayi-fəqrə düşdün, razı ol, biçarə, səbr eylə!

Yetərkən zalimin zülmü sənə, dövri-qəzadan bil!
Çatarkən amirin zəcri, onu seyri-səmadan bil!
Özün öz əczinə bais olurkən, masəvadən bil!
Bu məşumiyyəti biganədən gör, aşinadan bil!
Əzil, pamal ol, axtarma buna bir çarə, səbr eylə!
Bəlayi-fəqrə düşdün, razı ol, biçarə, səbr eylə!

Əgər çox təngdil olsan bu işdən, qıl fəğan, ağla!
Girişmə başqa bir tədbirə, ancaq hər zaman ağla!
Bütün dünyadan əl çək, aşikar ağla, nihan ağla!
Qapansın gözlərin, fikrin, düşünmə, görmə, yan, ağla!
Tüpür namusa, baxma nəngə, gəlmə arə, səbr eylə!
Bəlayi-fəqrə düşdün, razı ol, biçarə, səbr eylə!

Fəqət bir iş də görmək istər isən, gör müsəlman tək!
Təhəmmül eylə cövri-mülkədarə, işlə heyvan tək!
Çalış, ək, biç, aparsın bəy, evin qalsın dəyirman tək!
Ayılma, haqqını qanma, xəbərdar olma insan tək!

Danılma, incimə, tab eylə hər azarə, səbr eylə!
Bəlayi-fəqr düşdün, razı ol, biçarə, səbr eylə!

Vəgər az-çox var isə qeyrətin, kafirlərə baxma!
Bir asan kəsbə məşğul olmaq ilə dindən çıxma!
Uşaqlarçın çörək çıxsın deyə, ha din evin yıxma!
Vəbalın boynuma, get fələlik et, qəlbini sıxma!
Sənə iş sahibi pul verməsə, yan narə, səbr eylə!
Bəlayi-fəqrə düşdün, razı ol, biçarə, səbr eylə!
Və yaxud gər əsər varsa canında zurü qüvvətdən,
Qolun güclü, üzün qansız, dilin xalisə rəhmətdən,
Qutar bir dəfəlik dərdü ələmdən, bari-möhnətdən,
Quduzluq iştə bir peşə, gözəl hər dürlü sənətdən:
Bas al, kəs al, vur al, yıx al, qoşul füccarə, fəxr eylə!
Məqami-hörmətə çatdın, dəxi həmvarə fəxr eylə!

Yanaş əşrarə, fəxr eylə!
Bulaş hər karə, fəxr eylə!
Tutulma nəngə, namusə,
Utanma arə, fəxr eylə!...

## DİNDİRİR ƏSR BİZİ, — DİNMƏYİRİZ

Dindirir əsr bizi, — dinməyiriz,
Açılan toplara diksinməyiriz;
Əcnəbi seyrə balonlarla çıxır,
Biz hələ avtomobil minməyiriz;
Quş kimi göydə uçar yerdəkilər,
Bizi gömmüş yerə minbərdəkilər!

## ADƏTİMİZ DAŞ İDİ DƏVA GÜNÜ

Adətimiz daş idi dəva günü,
Tullandıq əldə sapan qıjhaqıj!

Hər kəsə dəysəydi edərdi haman
Bir neçə gün ahü fəğan, ufhauf!

Mərhəm olurdu, sağalırdı yara,
Əldə qalırdı yenə can sapbasağ.

İmdi revolverdi, dönüm başına,
Nagəh olur gülləfəşan partapart!

Onda görürsən yıxılıb yanbayan
Bir neçə növrəstə cəvan laybalay!

Tüf belə dövranə ki, bədtər olur
Seyri-fələk, dövri-zəman ilbəil!

Milləti-islam qırır bir-birin,
Allah, aman, bu nə yaman qırhaqır!

Qardaşa bax, qardaşını öldürür,
Vəhşi olub əhli-cəhan sərbəsər!

Milləti gördükcə belə hərcü-mərc
Könlüm olur dopdolu qan qatbaqat.

Böylə gedərsə, Bakı əldən gedər,
Qalmaz o məvadə aman hiç, hiç!

Bari, xudaya, özün islah qıl,
Ta edələr pirü cəvan sülh, sülh!

## EYLƏ BİLİRDİM Kİ, DƏXİ SÜBH OLUB

Eylə bilirdim ki, dəxi sübh olub,
Mürği-səhər tək bir ağız banladım.
Səng şikəst eylədi balü pərim,
Banlamağın hasilini anladım.

Övci-fəzadə görərək bayquşu
Səhndə qaqqıldayıram indi mən.
Bir də məni vurma, aman, səngdil!
Rəhm elə, nıqqıldayıram indi mən.

Ay çalağanlar, məni qorxuzmayın,
Mən sizə tərk eyləmişəm lanəni!
Seyr eləyiz, övci-həvada uçuz,
Mən də gəzim səhnəçeyi-xanəni.

Ağlamayın, ağlamayın, cücələr,
Banlamaram, banlamaram bir daha!
Banlamamaqdır sizə əhdim mənim,
Söyləmirəm: anlamaram bir daha!..

## TÖMEYİ-NƏHAR

Çığırma, yat, ay ac toyuq, yuxunda çoxca darı gör!
Sus, ay yazıq, fəzadəki üqabi-canşikarı gör!

Hinində daldalanma çox, həyətdə də dolanma çox,
Yiyəndəki bıçağə bax, o tiği-abdarı gör!

Gətirdiyin yumurtadan nəticə cücə gözləmə,
Qazanda qəyqanağə bax, ocaqdakı şəranı gör!

Taxıl, taxıl deyib də çox çığırma zəngəzurlu tək
Bəyin, xanın, xanın, bəyin əlində ehtikarı gör!

Mənəm-mənəm deyənlərin inanma çox da qövlünə,
Gərəkli gündə onların qıçındakı fərarı gör!

Amandır, uyma vaizin həlavəti-kəlamına,
Əba-qəbanı qovza bax, içində zəhrmarı gör!

Bu əğniyaların üzün görüncə ehtiyacdə,
Get, ey fəqiri-binəva, kəfən bürün, məzarı gör!

Bu inteliklərin[1] sözün gətirmə heç aralığa,
Olan görmək istəsən, şərabı gör, qumarı gör!

Palitqadır hər işləri, alışları, verişləri,
Olarda bir əməl fəqət quru, boş iftixarı gör!

## FİSİNCAN

Sanma əzdikcə fələk bizləri viranlıq olur.
Un təmənnası ilə buğda dəyirmanlıq olur!

Qarışıqdır hələlik millətin istedadı, —
Ələnirsə, safı bir yan, tozu bir yanlıq olur!

Çalxalandıqca, bulandıqca zaman nehrə kimi,
Yağı yağ üstə çıxır, ayranı ayranlıq olur!

Kim ki, insanı sevər, — aşiqi-hürriyyət olur,
Bəli, hürriyyət olan yerdə də insanlıq olur!

Ey ki, dersən, ürəfa rahi-xətadə bulunur,
Elmi-məntiqcə bu söz bəhreyi-nadanlıq olur!

Ürəfa dersən özün, əhli-xəta dersən özün,
Düşünürsənmi bu sözdə necə hədyanlıq olur?

Gözünü xirələdirmi günəşi irfanın?
Haydı, xəffaşsifət, buncamı xulqanlıq olur?!

Tanırıq biz sizi artıq, demə ha, biz beləyik,
Tanılır ol kişi kim, tutduğu meydanlıq olur!

Baxmasız guşeyi-çeşm ilə fəqiranə tərəf,
Yüyürürsüz ora kim, dadlı fisincanlıq olur!..

---

[1] İntelligentlərin (ziyalıların)

## EY ALNIN AY, ÜZÜN GÜNƏŞ, EY QAŞLARIN KƏMAN

Ey alnın ay, üzün günəş, ey qaşların kəman!
Ceyran gözün, qarışqa xətin, kakilin ilan!

Alma çənən, çənəndə zənəxdan dərin quyu,
Kipriklərin qamış, dodağın bal, tənin kətan!
Boynun sürahi, boy-buxunun bir uca çinar,
Əndamın ağ gümüş, yanağın qırmızı ənar!

Xalın üzündə buğda, başında saçın qürab,
Qah, qah! Qəribə gülməlisən xaniman xərab!..

## BİR BÖLÜK BOŞBOĞAZIQ, HEYVƏRƏLİK ADƏTİMİZ

Bir bölük boşboğazıq, heyvərəlik adətimiz,
Doludur lənət ilə, qeybət ilə söhbətimiz,
Oxumaqdan payımız yox, yazıdan qismətimiz,
Bu əvamlıqla belə hər sözü təfsir edərik!
Mümkün olduqca müsəlmanları təkfir edərik!

Hər sözə çulğaşarıq, hər bir işi qurdalarıq,
Harda bir nur görürsək, ona qarşı olarıq,
Bəzinə diş qıcıdıb, bəzinə quyruq bularıq,
Bizə hər kəs çörək atsa, onu təqdir edərik!
Mümkün olduqca müsəlmanları təkfir edərik!

Deyilik naşi bu işdə, — ağarıbdır yalımız,
Bilirik dini-müsəlmanı bu gün öz malımız,
Üzüqırxıq deyilik, — bir şələdir saqqalımız,
Tərpədib xeyrə onu, aləti-təzvir edərik!
Mümkün olduqca müsəlmanları təkfir edərik!

Gedərik məscidə hər gün, qılarıq onda nəmaz,
Xüşkə möminlik edib, başlayarıq razü niyaz,
Məscid olsun,— alarıq satsa cocuqlar bizə naz,
Bu uşaqbazlığı biz zöhd ilə təstir edərik!
Mümkün olduqca müsəlmanları təkfir edərik!

Danışıb-söyləşərik hər necə ünvan olsun,
İftira, ləğv, əbəs, hərzəvü hədyan olsun,
Hər kəsə bağlayarıq hər cürə böhtan olsun,
Qoy bizim din evimiz olsa da viran, olsun,
Güc verib zikrə, cinan qəsrini təmir edərik!
Mümkün olduqca müsəlmanları təkfir edərik!

Möminik, keflənərik arzuyi-cənnət ilə,
Oxumuşlar adını yad edərik lənət ilə,
Düşmənik elm ilə, insaf ilə, hürriyyət ilə,
Biz bu əfsanələri cəhl ilə tənfir edərik!
Mümkün olduqca müsəlmanları təkfir edərik!

Ölkəni seyr edərək hər cürə insan görürük,
Ancaq öz nəfsimizi pak müsəlman görürük,
Bu xəyal ilə yatıb huriyü qılman görürük,
Xabi-sadiq deyə bu haləti təbir edərik!
Mümkün olduqca müsəlmanları təkfir edərik!

## ÇATLAYIR, XANBACI, QƏMDƏN ÜRƏYİM

Çatlayır, Xanbacı, qəmdən ürəyim,
Qavuşub lap acığımdan kürəyim!

Nola bir evdə qoyaydız qarabaş,
Verməyəydiz məni bu əbləhə, kaş!

Mən ki, damdan, bacadan baxmaz idim,
Su kimi hər tərəfə axmaz idim;

Hərzə-hərzə danışıb gülməz idim,
Ər nə şey olduğunu bilməz idim;

Oturub ac komasında atamın,
Biş-düşün hazır edirdim anamın;

Bitləyirdim nənəmin baş-yaxasın,
Yamayardım babamın çul-çuxasın;

Tez durub sübh sağardım inəyi,
Xansənəmdən diləməzdim köməyi;

Neyliyirdim bəzəyi, ya düzəyi?
Dama, divara yapardım təzəyi!

Atam əllaf, babam dülgər idi,
Qardaşım culfa, əmim kargər idi;

Xanbibim falçı, nənəm bağ toxuyan,
Bizdə, haşa, yox idi bir oxuyan.

Evimizdə var idi hər nə desən:
Qatıq, ayran ilə qaymaq, nə yesən!

Nə bilirdik nə zəhrimardı kitab?
Biz olan evdə haçan vardı kitab?

Büsbütün gül kimi insanlarıdıq,
Nə müəllim və nə dərs anlarıdıq;

Dəftərin andıra qalmış sözünü
Eşidib, görməmiş idik üzünü.

Boylə bir tərbiyəli evdə müdam
Bəslədiz mən kimi bir sərvü-xüram!

Vay o gündən ki, məni ad elədiz,
Elə bildiz də ki, dilşad elədiz;

Mən də sandım ki, dönüb bəxtəvərə, —
Gedirəm bir nəfər insanə ərə!

Nə bilim boylə də insan varmış,
Şəkli-insanda da heyvan varmış?!

Ər oxurmuş da, yazarmış da, atam!
Ər deyil, möhlik azarmış da, atam!

Ər deyil, şair imiş xanəxərab!
Fikri yazmaq, oxumaq, şüğli kitab...

Saldız axırda yaman halə məni,
Ərə verdiz də bu qəffalə məni.

Gah yazır, gah oxuyur, gah danışır,
Gündə bir hərzə kitabnan tanışır;

Gah gedir fikrə, bərəldir gözünü,
Məhv olur oylə ki, bilmir özünü;

Sübh olunca gecələr darğa kimi
Yatmayır, qır-qır edir qarğa kimi;

Gah da bir yatsa da vəqtində əgər,
Çəkməyir yuxladığı bir o qədər.

Qəflətən bir də görürsən ki, durur,
Yandırıb lampanı çılpaq oturur;

Başlayır yatdığı yerdə təzədən
Oxuyub yazmağa bir də təzədən.

Belə od olmaz, atam, boylə alo!
Od deyil, yanğı deyil, lovdur, lo!..

Gah görürsən ki, miz üstə yıxılır,
Baxıram halına qəlbim sıxılır;

Bir qarandaş, bir-iki parə kağız,
O qədər çəkmir — olur qarə kağız.

Xeyrini, şərrini qanmır bu kişi!
Yorulub bircə usanmır bu kişi!

Bizim evdə baxasan hər tərəfə —
Taxçaya, boxçaya, ya kim, irəfə —

Görəcəksən bütün işqabda kağız.
Kasada, nimçədə, boşqabda kağız,

Yığılıb dağ kimi hər yanda kitab,
Evdə, dəhlizdə, hər yanda kitab...

Deyirəm ay kişi, gəl bir özünə,
Bu nə işdir, a kül olsun gözünə!

Bu əməl etdi səni xanəxərab,
Pulların döndü bütün oldu kitab.

Oxuduqca gözünün qarəsini
Aparır, tap başının çarəsini!

Pul gedir, tabü təvanın da gedir,
Üstəlik bir quru canın da gedir.

Kəsbü karından əlin çıxdı, usan!
Ər olan yerdə görüm yox olasan!

## QOYMA, GƏLDİ!

Xandostu, amandı, qoyma, gəldi!
Didarı yamandı, qoyma, gəldi!

Vay, vay! Deyəsən bəşər deyil bu!
Bir şəklə uyan təhər deyil bu!
Allahı sevirsən, ər deyil bu!
Ərdodu, qabandı, qoyma, gəldi!
Didarı yamandı, qoyma, gəldi!

Ol gün ki, adaxladız, utandım,
Oğlandı, dediz, ərin, inandım,
Ər boylə olurmuş?! İndi qandım,
Xandostu, amandı, qoyma, gəldi!
Kirdarı yamandı, qoyma, gəldi!

Qorxdum ay aman, yarıldı bağrım,
Bir nazik ipə sarıldı bağrım,
Gup-gup döyünüb darıldı bağrım
Canım oda yandı, qoyma, gəldi!
Kirdarı yamandı, qoyma, gəldi!

Dudkeş kimi bir papaq başında,
Ağ tükləri bəllidir qaşında,
Gərçi qocadır — babam yaşında,
Amma sorağandı, qoyma, gəldi!
Kirdarı yamandı, qoyma, gəldi!

İyrənmişəm ağzının suyundan,
Qətran qoxusu gəlir buyundan,
Lap doğrusu qorxmuşam xuyundan,
Bir əfi ilandı, qoyma, gəldi!
Kirdarı yamandı, qoyma, gəldi!

## RƏHGÜZARİ-MƏXLUQATDA BİR MÖHTACİ-MƏSARİF

Ey dərbədər gəzib ürəyi qan olan çocuq!
Bir löqmə nan üçün gözü giryan olan çocuq!
Əşkilə abrusu da rizan olan çocuq!
Mətlubi nan, qazandığı hirman olan çocuq!

İnsan kimi bilinsə idi qədrü qiymətin,
Açmış olurdu məktəbi-milli camaətin,
Dərk etmək istəmir hələ bu feyzi millətin,
Qalsın nihan vədieyi-fitri-məharətin;
Ey ehtişami-milləti talan olan çocuq!
Ey dərbədar gəzib ürəyi qan olan çocuq!

Ey gövhəri-fitadə-bəgil, qal nihan hənuz,
Sərrafi-qədrdan deyil islamyan hənuz,
Məşğul xurdü xabdır ərbabi-şan hənuz,
Var ortalıqda söhbəti-dəvayi-nan hənuz,
Yox gövhəri-səadətə xahan olan çocuq!
Ey dərbədər gəzib ürəyi qan olan çocuq!

Həqli deyil o kim sənə der: var qəbahətin;
Məncə qəbahət isə olur hali millətin...
Etsəydi tərbiyət səni əhli-vilayətin,
Sailliyə qalırmıdı hərgiz də rəğbətin?!
Başsız qalıb ayaqlara üftan olan çocuq!
Ey dərbədər gəzib ürəyi qan olan çocuq!

Ey nəxleyi-vətən, əsəf olsun bu halına
Kim, bəxşi-tərbiyət edənin yox nihalına!
Bilməm nələr gəlir şu qaranlıq xəyalına...
Baxdıqca yalü balına yandım məlalına!
Ey vadiyi-səfaləti puyan olan çocuq!
Ey dərbədər gəzib ürəyi qan olan çocuq!

Olsun əsəf o millətə kim, bixəyaldır,
Yaxud, xəyalı kəndinə təksiri-maldır;
Yavrum, quzum, yatanlar ayılmaz, məhaldır,
Ancaq mənimki nalə, səninki sualdır...
Ey mən kimi tənəffürə şayan olan çocuq!
Ey dərbədər gəzib ürəyi qan olan çocuq!

## MÜXTƏLİF PARÇALAR

Tutdum orucu irəmazanda,
Qaldı iki gözlərim qazanda,
Mollam da döyür yazı yazanda...

***

Babam sünni, nənəm şiə, dürək mən,
Nə farsam mən, nə hindəm mən, türək-mən!
Muğanda-müğbeçə, məsciddə-əkbər,
Təfavüt yox... Həqiqətdə zirək mən!..

***

Fələ, özünü sən də bir insanmı sanırsan?
Pulsuz kişi, insanlığı asanmı sanırsan?
İnsan olanın cahü cəlalı gərək olsun,
İnsan olanın dövləti, mali gərək olsun,
Hümmət demirəm, evləri ali gərək olsun,
Alçaq, ufacıq daxmanı samanmı sanırsan?
Axmaq kişi, insanlığı asanmı sanırsan?...
Dövlətliyik, əlbəttə, şərafət də bizimdir,
Əmlak bizimdirsə, əyalət də bizimdir,
Divan bizim, ərbabi-hökumət də bizimdir,
Ölkə dərəbəylik deyə xan - xanmı sanırsan?
Axmaq kişi, insanlığı asanmı sanırsan?...

***

Pah atonnan, nə ağır yatdı bu oğlan, ölübə!
Nə də tərpənməyir üstündəki yorğan, ölübə!
Bu qədər qışqırığa durdu qonum-qonşu tamam,
Dəbərişməz də veribdir, deyəsən, can, ölübə!
Deməк olmaz dirilər tək yatıb, əlbət, duracaq,
Ölülər yatmağıdır, yox buna payan, ölübə!
Cumuxub canını bitlər, birələr, hiss eləmir,
Çalsa əqrəb də hənuz eyləməz əmman, ölübə!
Hansı bu doxtura ərz etdim onun illətini,
Dedi: çək bundan əlin, boşla, çoxdan ölübə!
Bunu hətta düşünüb cümlə müsəlman uşağı
Hər vilayətdə deyirlər: pay atonnan, ölübə!
Məzəli lap bu kim, bir parə urus "dama"ları
Qoşulub bunlara derlər ki, müsəlman ölübə!
Aman, ay Molla dayı, bir kitab açdır, fala bax,
Tapmasan çarəsini, sən də de ordan: ölübə!

***

Altmış illik ömrüm oldu səndə bərbad, Ərdəbil!
Bir də namərdəm əgər etsəm səni yad, Ərdəbil!

Beş deyil! on beş deyil, hər yan baxırsan, — var madam:
Ev madam, mənzil madam, balqon madam, talvar madam,
Sirk madam, qəstin madam, passaj madam, bulvar madam.

Müxtəsər, əqlim çaşıb, ey dad-bidad, Ərdəbil!
Bir də namərdəm əgər etsəm səni yad, Ərdəbil!

***

Ey vay ki, heysiyyəti-millət götürüldü!
Millətdə olan büsbütün adət götürüldü!
Yetməzdi bu kim, millətin əhrarı ayıldı,
Arif denilən bəz füsunkarı ayıldı,
Məcmuə yazan bir para biarı ayıldı,
Şair ləqəbində neçə idbarı ayıldı,
Yəni ki, bu əsrin bütün əşrarı ayıldı,
Derdim, bəcəhənnəm, elin əfkarı ayıldı,
Torpaq başına, indi də tüccarı ayıldı!

Hər bir işə əl qatdı, mürüvvət götürüldü!
Millətdə olan büsbütün adət götürüldü!

***

Oğul mənimdir əgər, oxutmuram, əl çəkin!
Eyləməyin dəngəsər, oxutmuram, əl çəkin!
Gərçi bu bədbəxt özü elmə həvəskardır,
Kəsbi-kəmal etməyə səyi dəxi vardır,
Məncə bu işlər bütün şiveyi-küffarıdır,
Dinə zərərdir, zərər, oxutmuram, əl çəkin!
Eyləməyin dəngəsər, oxutmuram, əl çəkin!
Eyləmərəm rəhm onun gözdən axan yaşına,
Baxsın özündən böyük öz qoçu qardaşına,
Ölsə də verməm riza şapqa qoya başına,
Kafir ola bir nəfər? Oxutmuram, əl çəkin!
Eyləməyin dəngəsər, oxutmuram, əl çəkin!
Bəs ki, uşaqdır hələ, yaxşı-yaman sanmayır,
Elmin əbəs olduğun anlamayır, qanmayır,
Sair uşaqlar kimi hər sözə aldanmayır,
Eyləyir ömrün hədər, oxutmuram, əl çəkin!
Eyləməyin dəngəsər, oxutmuram, əl çəkin!
Dinə zərərdir, zərər, oxutmuram, əl çəkin!

***

Nə dərs olaydı, nə məktəb, nə elmü sənət olaydı!
Nə dərsə, məktəbə, elmə filanə hacət olaydı!
Nə hiss olaydı cəvanlarda əmri-millətə qarşı.
Nə bu cəvanlar olaydı və nə bu millət olaydı!
Düşəydi daş o günə kim, qəzet-məzet sözü çıxdı,
Qəzet işin törədən nabəkarə lənət olaydı!

Nə Türkiyədə bu qanun-əsas nəşr olunaydı,
Nə biədəb yeni türklərdə bunca cürət olaydı!
Nə xortlayaydı bu şəkil ilə "Mola Nəsrəddin" ey kaş.
Nə kalba Səbzalılardı bu xovfü vəhşət olaydı!
O köhnələrin əcəb kim, utanmayıb da deyirlər:
Gərək bu əsrə görə boylə, boylə alət olaydı,
Bu bişüurların əqlinə, kəmalına bax bir!
Qadam kəmalınıza! Barı sizdə qeyrət olaydı!..

***

C ə m a ə t:

Zilli-Sultan bura say döydürüb aldıqlarını!
Söyüb aldıqlarını, söydürüb aldıqlarını!

Z i l l i - S u l t a n:

Tövbə, əttövbə, xəta rahinə getdiklərimə!
Bilib etdiklərimə, bilməyib etdiklərimə!

C ə m a ə t:

Sən ki, Avropada idin, niyə yorta-yügürə
Cumdun İranə, bu viranədə düşdün də girə?
Saldın axır öz əlinlə özünü ağzıbirə,
Vec bitirməz sənə, dönmə dəxi daşə, dəmirə,
Boş danışma, bura say qapdırıb aldıqlarını!
Çapıb aldıqlarını, çapdırıb aldıqlarını!

Z i l l i - S u l t a n:

Tövbə, əttövbə, xəta rahinə getdiklərimə!
Bilib etdiklərimə, bilməyib etdiklərimə!...

***

Lovğalaşıb a görməmiş, çox da belə fırıldama!
Tərbiyəsiz uşaq kimi boş-boşuna hırıldama!
Baş-qulağın düzəlməyib, çox da basıb guruldama!
Dinmə, danışma, yat balam, sən deyən olmayıb hələ!

Qətl elədiz Ətabəki, mən ki, bu əmri danmıram!
Var yenə min Ətabəkiz, yoxsa əməlli qanmıram?
Köhnə qapı bu tezliyə tazələşə, inanmıram!
Dinmə, danışma, yat balam, sən deyən olmayıb hələ!

Söylə mənə, vəzarəti-milliyəniz düzəldimi?
Ya uzun əl, uzun papaq qısalaşıb gödəldimi?
Ölkənizə şəməndəfer yol tapa bildi, gəldimi?
Dinmə, danışma, yat balam, sən deyən olmayıb hələ!

Arxa su dolmayıb hələ!
Köhnə idarəniz durur,
Rəngi də solmayıb hələ!..

***

Ax! necə kef çəkməli əyyám idi,
Onda ki, övladı-vətən xam idi!
Öz həqi-müşruini bilməzdi el,
Çöhreyi-hürriyyətə gülməzdi el,
Gözlərini bir kərə silməzdi el,
Qəzteyə, jurnalə əyilməzdi el,
Daim eşitdikləri övham idi,
Ax! necə kef çəkməli əyyam idi.
İndi adamlar deyəsən cindilər,
Cin nədi, şeytan kimi bidindilər,
Lap bizi ovsarladılar, mindilər,
Ay keçən əyyam, olasan indilər!
Ondaki, övladı-vətən xam idi,
Ax! necə kef çəkməli əyyam idi!

***

Kim nə deyər bizdə olan qeyrətə?
Qeyrətimiz bəllidir hər millətə!
Biz qoca qafqazlı igid ərlərik,
Cümlə hünərməndlərik,nərlərik,
İş görəcək yerdə söz əzbərlərik,
Aşiqik ancaq quru, boş söhbətə,
Kim nə deyər bizdə olan qeyrətə?
Çırmanırıq keçməyə çay gəlməmiş,
Başlayırıq qızmağa yay gəlməmiş,
Söz verərik indi — bir ay gəlməmiş,
Asta qaçıb dürtülərik xəlvətə,
Kim nə deyər bizdə olan qeyrətə?...

***

Vəz etdiyin inandı, sən amma inanmadın!
Ya liləcəb, məgər yorulub bir usanmadın?
Rüşvət həramdır-dedin, aldın, utanmadın,
Vəz etdiyin inandı, sən amma inanmadın!...

***

Ağladıqca kişi qeyrətsiz olur,
Necə ki, ağladı İran oldu...

***

“Osmanlıcadan tərcümə türkə”—bunu bilməm,
Gerçək yazıyor gəncəli, yainki hənəkdir?
Mümkün iki dil bir-birinə tərcümə , amma
“Osmanlıcadan tərcümə türkə” nə deməkdir?!

## EY ƏZİZİM, XƏLƏFİM...

(Bəhri - təvil)

Ey əzizim, xələfim, mayeyi-izzü şərəfim, ruhi-rəvan, munisi-can, tabü təvan, tazə cəvanım ki, on ildən bəridir ömri-giryanmayəmi, yalnız demirəm dinimi, imanımı, insafımı, vicdanımı, irfanımı, həm canımı da, cümlə qonum-qonşu deyil, el də bilir ki, sənə vəqf eyləyib, şamü səhər, hər nə qədər, rəncü kədər, xeyrü zərər, fitnəvü şər səndən ötər dövri-qədərdən yetişibdirsə mənə, canıma minnətlə qəbul etmişəm, ancaq atalıq həqqimin ifası üçün, mehrü məhəbbətlə, nə izzətlə, nə halətlə sənə tərbiyə, təlim edərək, sərv-qədin bəsləmişəm, canü dilimdən səni çox istəmişəm,bir para sırf axmaq olub öz gözünün nuru olan sevgili övladını tədrislə təzyi və təzyiq eləyən cahilü-gümrah atalar tək səni zindani-mədarisdə müqəyyəd eləyib, elmü məarif deyilən boş, əbəs, insanə cəfəng işlər ilə fikrini, həm əqlini, vicdanını məhdud qılıb, ruhunu incitməmişəm, zəhmətinə bitməmişəm, küçədə, bazarda öz qəsdinə iqdam edərək, hər günü bayram edərək, günləri axşam edərək, xoşladığın tək dolanıb, gəzməyinə razı olub, mən səni bir sənətə də qoymamışam, hər gecə hər yerdə qonaq qalmağını, zövqü səfa almağını, zurna, qaval çalmağını xoşlamışam, öz başına boşlamışam, həmd xudaya ki, olubsan belə qüvvətli, məhabətli, şücaətli cəvan, şiri-jəyan, bəbri-bəyan; vəqt o zəmandır dəxi bundan belə bir ad çıxarıb, iş bacarıb, ilxı qovub, mal aparıb, dəhrə qiyamət qoparıb, yolları məsdud eləyib, aləmi məhdud eləyib, hasili-məqsud eləyib, sən məni xoşnud eləyib, adəti quldur olasan, yol vurasan, el qırasan, gərçi qaçaqlıqda dutulmaq da var, əmma onu fikr eyləmə əsla ki, dutulsan, ələ düşsən də tərəhhümlüdür ərbabi-hökumət, sənə eylər hamı hörmət, olasan həbsdə rahət, çörəyin gərm, suyun saf, yerin künci-fərağət, sənə bir kimsədə cürət olamaz etsin əziyyət, nola bir gün düşə fürsət qaçasan, qurtarasan həbsdən; əlbət ki, əgər qaçmağa da olmaya imkan, işini qət edə divan, olasan əhli-pasilyan, nə qəmin var, sənə qurban ki, o yerlərdə nə çoxdur sən özün xoşladığın Sonya kimi qönçə-dəhan, sim-bədən, rəşki-çəmən, zülfi-səmən, gözləri ahuyi-xütən, göpgözəl, appağ, o ismətli, vəcahətli, səbahətli, məlahətli madamlar, birin əlbəttə alarsan, desə rus ol, nə çətin şeydir, olarsan,dəxi bir xaç da salarsan...

Bu əməldən ucalarsan,
İvan namin alarsan,
Amilyanov olarsan,
Nə qədər olsa da ömrün,
O yerlərdə qalarsan!..

## NÖVHƏ
*(ixtisarla)*

Baxdı çün Əkbərinin nizədə Leyla üzünə,
Gördü zülfü tökülüb, çün şəbi-yelda üzünə.

Gəldi şurə dedi: — Ey şəmi şəbistanım oğul,
Yetmədin kami-muradə məhi-tabanım oğul,
Həşrətək dildə qalıb çıxmadı bu canım, oğul.
Gəlməyəydi anan, ey kaş, bu dünya üzünə.

Ey səba! Bircə əs, ol zülfü-pərişanı dağıt,
Xanimani-dili-viraneyi-Leylanı dağıt,
Dili-viraneyi-Leyla kimi dünyanı dağıt,
Qoyma düşsün dəxi ol zülfü-səmənsa üzünə.

Dedilər: — Kimdi bu övrət bizi nalan eləyən?
Yoxsa Leyladu bu Məcnun kimi əfqan eləyən?
Səni, ey tazə cavan, qanına qəltan eləyən
Necə məhşərdə baxan həzrəti-Zəhra üzünə?

Sabira, hər il əza saxla Əliəkbərə sən,
Kərbəlada gedib ağla o şəhi-davərə sən,
Gəl qiyamətdə bu cəm ilə səfi-məhşərə sən
Qalma həsrət iki dünyadə bu mövla üzünə.

## QƏZƏL

İstəsən könlüm kimi zülfün pərişan olmasın, —
Ol qədər cövr et mənə ah etmək imkan olmasın!

Dərdi-eşqin qəsdi-can etdisə, mən həm şakirəm,
İstərəm cismimdə dərd olsun, dəxi can olmasın!

Qoyma əğyar eyləsin kuyində cövlan, ey pəri!
Əhrimənlər maliki-mülki-Süleyman olmasın!

Atəşin ruyində əfi tək yatıb geysulərin,
Türfə cadudur ki, mar atəşdə suzan olmasın!

Derlər, aşiqküş nigarım qətlimə amadədir,
Allah, allah, bir səbəb qıl kim, peşiman olmasın!

Mübtəlayi-dərdi-eşqəm, əl götür məndən, təbib!
Eylə bir tədbir kim, bu dərdə dərman olmasın!

Sabira, ümmidi-vəsl ilə qəmi-hicranə döz,
Hansı bir müşküldi kim, səbr ilə asan olmasın?!

## UŞAQ VƏ BUZ

Dərsə gedən bir uşaq
Çıxdı buz üstə qoçaq.

Sürüşdü birdən-birə,
Düşdü üz üstə yerə.

Durdu uşaq, neylədi?
Buza belə söylədi:

"Sən nə yamansan, a buz!
Adam yıxansan, a buz!

Az qalıb ömrün sənin,
Yaz gələr, artar qəmin:

Əriyib suya dönərsən,
Axıb çaya gedərsən!

## YAZ GÜNLƏRİ

Gəl, gəl, a yaz günləri!
İlin əziz günləri!

Dağda ərit qarları,
Bağda ərit qarları:

Çaylar daşıb sel olsun,
Taxıllar tel-tel olsun.

Ağaclar açsın çiçək,
Yarpağı ləçək-ləçək.

## SON MİSRALARI

Arizi qəmlər əlindən ürəyim şişmiş idi,
Zənn edirdim edəcəkdir ona çarə ciyərim,
Bəxti-mənhusimə bax, mən bu təmənnada ikən
Başladı şişməyə indi üzü qarə ciyərim...

İstərəm ölməyi mən, leyk qaçır məndən əcəl,
Gör nə bədbəxtəm, əcəldən də gərək naz çəkəm.

## ŞƏKİBAİ

Yar getdikcə təhəssür dili-şeydadə durar,
Ömr vardıqca həvəs aşiqi-risvadə durar!

Seyli-tən oylə təməvvüclə alıb dövrü bərim—
Bənzərəm bir qocaman dağə ki, dəryada durar!
Döysə də canımı minlərcə məlamət ləpəsi,
Zövrəqi-himmətim əvvəlki təmənnada durar!

Bisütün sinəsinə dəysə də min tişə, yenə
Cövrə təmkin edərək durduğu məvadə durar!

Nəqdi-can isə bəhayi-tələbi-yar, iştə,
Can bəkəğ aşiqi-sadiq belə sövdadə durar!

Nə qəm, uğratsa da bir gün məni ifnayə zəman,
Mən gedərsəmsə, məramım yenə dünyadə durar!

Durmuşam pişü pəsi-təndə, Sabir, necə kim,
O əliflər ki, pəsü pişi-ətənadə durar!

## ƏBDÜLHAQ HAMİD TƏRXAN
(1852 — 1937)



*Əbdülhaq Hamid XIX əsrin ikinci yarısı — XX əsrin birinci yarısında Türkiyənin ən böyük şairlərindəndir. Türkiyə ədəbiyyatına Şinasinin, Ziya Paşanın, Namiq Kamalın gətirdiyi yenilikləri davam etdirmək yoluyla gedən Ə. Hamid bu yeniləşmədə daha yüksək zirvələrə qalxmış, türk şerini həm məzmun, həm formaca zənginləşdirmişdir. Divan ədəbiyyatı ənənələrindən bəhrələnən, hətta şerlərini ərəb-fars tərkibləriylə qəlizləşdirən Hamid eyni zamanda Qərb ədəbiyyatının da bir çox dəyərlərini yaradıcı surətdə mənimsəmiş, türk poeziya və dramaturgiyasında yeni bir səhifə açmışdır. XX əsrin əvvəllərində Hamid sənəti Azərbaycan ədəbiyyatına, özəlliklə Hüseyn Cavid kimi müqtədir bir sənətkarın yaradıcılığına təsir göstərmişdir. Gənc yaşlarında itirdiyi həyat yoldaşının xatirəsinə həsr etdiyi "Məqbər" poeması şairin şah əsərlərindən, ümumtürk ədəbiyyatının poetik zirvələrindəndir.*

### ŞAİRİ ƏZƏM

Mevqi, Vyana,
Bir zərbei məkus ilə düşmüş o yana
Həp tərsinə dönmüşdür onun geydiyi şeylər
Həm bid-dəfaət!..
Onlarla yatıb qalxar imiş kəndisi söylər,
Vaxtilə bütün Pulda yapılmışsa da heyhat,
Cümləsi solmuş.
Vaxtilə siyah, indi fəqət yamyaşıl olmuş
Bir paltosu vardır.
Tək gözlüyü vardır, gecələr qəndilidir o.
Ya Rəb, nə həyat!...
Ciblər dəlik az-çox,
Lakin nə zərər var ki, — dəlikdən düşücük yox.
Bir qorxusu vardır:

Meyxanələrin saatı — tətili pək erkən...
Bir kirli paçavrayla gəzər,
Məndilidir o.
Lastikləri bir başqasınındır ki, yürürkən
Durmaz ayağında qaçar əksər...
Sərpuşu nə fəsdir, nə külahdır,nə sarıqdır,
Qalpak da deyildir,
Bir şapqamı? Haşa... O, onun kəndinə məxsus.
Bir başqa şəkildir,
Kəşkül kimi bir şey
Milliyyətini fariq olan yox, soruyorlar:
Kimdir bu əlamət, bu müsibət, nə qılıqdır,
Hürkütmiyəlim, sus...
Bir qəhqəhə, bir avava qopmaqda peya-pey...
Bəzən dəm üheyyayi - təsəddüq duruyorlar,
Zül fərqinə bir zam!..
Ancaq biri vardır, ona der: Şairi əzəm!

## BİR ŞAİR

Sənələr var ki, yazmadım bir şey,
Hadisat işləməkdə peydərpey,
Yetər insan qanıyla yazmaq üçün...
Yeyərək sanki bir köpək nəşi
Olmuşam bir bəhimədən vəhşi,
Mütrəqqib qudurmaq, azmaq üçün.

Dəvələr kimi məndə kini-adəm,
Hayyelərdən zəhərlidir xəndəm,
Oluram ağlayınca bir timasah.
Mən ki tufanı yoldaşım sanıram,
Bəhri-ümmanı göz yaşım sanıram.

Və o bəhrin içindəyəm səbbah.
Sanmayın yer qatında bir bodrum,
Açmışam göy üzündə bir uçurum,
Ki dərunundа mən varam ancaq.
Anlayan kimsə varmı xatirdə,
Mən əminəm ki, dövri-hazırda
Yazdığım şeylər anlaşılmayacaq.

Bulmuşam təsliyət bu vadidə,
Nə əsadət ki hali piridə
Şərib-ül-leyli vənnəharam mən.
Bu gün olsam da bir cahandidə
Qarlar altında növbaharam mən.

Vulkan ağzında hər bitən çiçəyəm,
İldırım yağdıran atəş böcəyəm.
Eylədim laləzar bir aqili.
Hanı ya nərədə boylə şeyhuhət
Ya şəbabətdə varmı deymumət.
Dağlıyam mən, fəqət yanardağlı.

## FƏRYAD
(Səhradan)

Məskən oldu mənə bu səhralar
Gəzərəm su-bə su təkü tənha.
Yerdə, göydə bəyəndiyim əşya
Yarımı hər nəzərdə ərz eylər.
Gecə səthi səmada surəti yab
Bəlkə də əksi-hüsnüdür mehtab!

## PER LAŞEZ[1]

Aqibət getdimi gözəl Tereza
Yolda gəzmək mahal ikən qardan?
Keçərək dəhşət ilə bulvardan
Nə çabuk vasil oldu Per Laşezə!

Ah, o bikəs vərəm şəhidəsinin
Açılan vəchi pək toxundu mənə!
Giryanak olduğun qılar ima
Hali - çeşmanı mövtü didəsinin!

Daha nəşində can təkərrürdə
Hiss olunmaqda qəlbinin sıcağı
Gül kimi pəmbə sadə bir yanağı
Ki o da anbaan təğəyyürdə!

Bənzi solmuş, tənəffüsü durmuş,
Zöhrənin bir nəzirə peykərinə
Göy üzündən liqayi bifərinə
Sanki bir sayesi bəyaz urmuş!

Densə layiq vücuduna şəffaf,
Münkəşif xaricindən əsrarı
İşdə qəlbində zahir asarı
Daha məhv olmamış ümidi zifaf!

---
[1] Per Laşez — Parisdə qəbiristanlıq.

Bistəri eşqə bənzəyir qucağı
Nə qədər nərmə-nazik o bədən!
Gözünün rəngi bəlli xaricdən,
Örtülüykən müəbbədən qapağı!

Təkü tənha içində mədfəninin
Yatıyor hod-bü hod təbah olmuş,
Döşəyi bax nasıl siyah olmuş,
Yasəməndən bəyaz olan təninin!

## BAĞİ RANİ

Gördüm tanıdım deyildi pək xoş
Xoşlanmış idim fəqət o qızdan
Layiqmi ona deyil demək xoş
Çıxmaq nə rəva bu söz ağızdan
Yadımda deyildi yada gəldi
Təmin edərəm ki, pək gözəldi.

Əhvalıma heç deyildi agah,
Hətta mənə aşina deyilkən
Söylərdi lisani-hali hər gah
Hər halına vaqifəm sənin mən
Baxdıqca alınır üzündə bir hal
Tövsifini mümkün olmaz ikmal!

Bir hal idi hüsndən gözəl o
Təsvirdə pərtövü zəkanı
Bir hüsn idi cövhərə bədəl o
Tənvirdə zülməti bəkanı
Söylər dururam içib peyapey
Hər gül kimi bir Venus nə xoş şey.

## SƏN DƏ SƏN

Sən mələksənmiş bu gerçəkmi əcəb?
Vay cəhənnəmdən xuruc etmiş qəzəb!..
Sən mələksən, mən zəbanı istərəm,
Bəlkə bir qülyabanı istərəm.
İstəməm ancaq səni mən ey mələk,
Razıyam atəşdə yansam həşrətək.
Gəlmə, get ey nurdan əcdər, geri!
Qeyb ol, ey zilli atəşpər, geri!
Dişlərin çıxsın xəyalımdan, yetər,
Beynimi surahi mar etmən yetər.

Şahə qalxıb durma, çıxma göylərə
Gəlmə, yəni bizlə məskun bir yerə.
Bulsun əzabım əzabından rəha
Könlümə zinhar ilişmə bir daha.
Get, asılma dideyi-ikrahıma
Get, sarılma boylə dudi-ahıma.
Var, sarıl şeytanlara, əcdərlərə.
Bərklərə zəncirlərə, xəncərlərə.
Axır üçün xəlq olunmuş bir cahan
Mən onun üstündə olmam kamiran.
Mən də bir dünyayi digər istərəm
Əncümü əşyayi digər istərəm.
Göy yetişməz, cayi digər istərəm
Yoxsa bir mevlayi digər istərəm!
Ya ilahi! Göy də sənsən, yer də sən!
Zat da sənsən, həmən digər də sən.
Kainatın həpsi məhzi sənliyin
Əsli sənsən, biz də zahir mənliyin.
Yar da sən, əğyar da sən, mən də sən...
Sənliyindir, həpsi sənsən, sən də sən...

## BİR SƏFİLƏNİN HƏSBİ-HALINDAN

Nə idim mən, nə təbii bir qız,
Bəlkə səhrada rəbii bir qız
Ən böyük zövqüm, ümidim, nəşəm.
Qırda seyran idi, hər gün, hər dəm.
Düşünərkən o böyük səhrada
Məni xəlq eyləyəni tənhada
Duruyorkən hərəkətsiz, səssiz,
Yerə enmiş göyə bənzərdi dəniz.
Əksi təkbir ilə dolmuş dərələr,
Səcdə eylərdi bütün meşcərələr.
Şəbi - mehtab doğar səni şəfəq,
Hər tərəf nura olur müştəqrək
Axıyormuş kimi hər suda həyat,
Üzüyormuş kimi hər məhluqat
Uçacaqmış kimi əflakə zəmin
Halidən, mazi ilə atidən əmin.
Qutlayın şövq ilə soldan, sağdan,
Bir şətarətlə enərdim dağdan.

## XALQ

Bir fərdinəm, ey böyük camaət,
Səndən diləram bu gün şəfaət.
Həsrən sənədir təşəkküratım
Sənsən hədəfi təfəkküratım
Artar sənə hər nəfəsdə deynim,
Həp səndə deyilmi valideynim?
Əcdadımız, alimiz sənindir
Evladi - əyalımız sənindir
Sənsiz hələ mən yetim olurdum.
Bi-namu-nişan adım olurdum.
Sənsiz olmazdı kimsə məşhur
Həp nadirələrdə olurdu məqnur
Mən — fərd, ölərəm, bəqa sənindir
Qəlbimdəki mahliqa sənindir.
Banisi bunun dühadır, ey xalq
Ancaq o dühayi bitənahi
Səndən çıxıyor o şəxsi-dahi.
Məxzi sənə pişvarıdır, ey xalq
Yoxdur o səfərbərin hüdudu
Hər sahədə bəklənir vürudu.
Təkrar edirəm bu fikri inşad:
Fərdiyyətidir camaətin bu
Kəmiyyətidir dəhaətin bu.
Ey Türk, sənə Türkdən oldu imdad
Qazi ki, bu gün mümasilindir
Əlbəttə, sənin mümasilindir
Gənclər, yazınız, sükut et, ey pir,
Sizdən gələcək gəlirsə həmlə
Tədbir alınırmı tək qələmlə?
Çox həmlə gərəkdir, çox da tədbir
Qazi bunu felən etdi isbat
Milliyyətə ən böyük mükafat.

## "MƏQBƏR"dən

Eyvah!.. nə yer, nə yar qaldı,
Könlüm dolu ahu-zar qaldı.
Şimdi buradaydı getdi əldən,
Getdi əbədə gəlib əzəldən
Mən getdim, o xak-zar qaldı
Bir guşədə tar-mar qaldı
Baqi o ənisi-dildən, eyvah,
Beyrutda bir məzar qaldı.

Nerdə arayım o dilrübayi?
Kimdən sorayım o binəvayi?
Bildir mənə nerdə, nerdə, ya Rəb?
Kim atdı məni bu dərdə, ya Rəb?
Derlər ki, unut o aşinayi,
Getdi tutaraq rəhi-bəqayi
Sığsınmı xəyalə bu həqiqət?
Görsünmü gözüm bu macərayi?

Sürətlə nasıl dəyişdi halım?
Almaz bunu hövsələm, xəyalım.
Bir şey görürəm məzara bənzər,
Baxdıqca alır, o yarə bənzər,
Şəklərlə güzar edər xəyalım,
Artar yenə matəmim, məlalım,
Bir sədmeyi-inqilabdır bu,
Bilməm ki, yaxınmıdır zəvalım.

Fikrim kimi nitqi - bizəbansan
Hüsnün görünür də, sən nihansan
Hüsnündə nəhiftədir vücudun,
Ruhum kimi məndədir surudun,
Sən malikeyi səfayi cansan
Əsrarı vücuda bir nişansan
Təcsiz qılınsa mən baxarkən
Bir başqa gözəldə sən əyansan.

İmkan bulamaz ya heç bu surət
İnsan bu ya gər olub da qismət
Bir başqa üzə gülər ikən mən
Zənn etmə bunu məhəbbətimdən
Bil ki, sənədir o ərzi - həsrət
Ondan səni istəməkdir əlbət.
Məluf sənin həqiqətinlə
Eylərmi gönül məcazə rəğbət.

Çıx Fatimə ləhdidən, qiyam et,
Yadımdakı halına davam et,
Getm etmə bu razı, soylə bir söz...
Mən istərəm oylə bir söz,
Güllər kimi meyli ibtisam et,
Daği-dilə çarə bul, məram et!
Bir dadlı baxışla, bir gülüşlə
Əyyami-həyatımı tamam et.

Məqbərmi, nədir bu gördüyün yer?
Ya boylə rəvamı cayi dilbər?

Bir təcrübədir bu, hiylədir bu...
Yox, məhvimə bir vəsilədir bu.
Bax, bax nə dəyişmiş ol simənbər
Gül çöhrəsi bax nə yolda məqbər
Nifrin, bu siyah bəxtə nifrin,
Fəryad bu halə ta bu məşhər.

Ya Rəb, mənə bir mələk əyan et,
Bir də məni oylə imtahan et.
Doğsun görəyim o mah yerdən
Nurun çıxa ey ilah yerdən.
Məqsudi-Həyat dər-miyan et
Fərdayi-bəşər nədir, bəyan et.
Ya fikrimi ruhuna qıl isal
Ya ruhumu xakinə rəvan et.

Öldünsə də bər-həyat idin dün,
Öldün, mənə vermə yoxmu bir ün?
Öldün, nasıl eyləyim təhəmmül?
Öldün, ölüm eyləyir təşəkkül.
Öldün, sənədir bir ömr düşkün.
Qəbrin nəzərimdə məndən üstün.
Sən öldün, ölüm gözəl deməkdir.
Ölsəm yaraşır qəminlə hər gün.

Hər yer qaranlıq, pürnur o mevqi,
Məqribmi, yoxsa Məqbərmi, ya Rəb?
Ya xabigahi dilbərmi, ya Rəb?
Röya deyil bu, eyniylə vaqi.
Bir gülşən olmuş bax bu xarəbə
Əbru səhərmi düşmüş türabə?
Yarımmı məftun? Aymı tutulmuş?
Bax, bax bu sönmüş nuri nigaha!
Qəbri çiçəkdən bir türbə olmuş,
Dönmüş o türbə bir haclagahə.
Bir haclagaha döndüysə türbən
Aç qoynunu aç, məşuqinəm mən!

Bir gün dedi iztirab içində:
— Mən ölməyə gəlmişəm bu Hində —
Ölmək — dedi, qəhqəhəylə güldüm
Duydum ki, fəqət içimdən öldüm.
Etdik biz o anda nimzində
Nifrətlə vida Hindü Zində
"Qaldımmı — demişdi yolda bir gün,—
Hindistanın dənizlərində?"

Keçdik kanalı bu yolda məbhud
Xuni ciyər oldu cürəvü qut.
Olmuşdu həyatı əmri-mevqut
Manəndi üfüq görükdü Beyrut.

Bilməm ki nə oldu, keçdi bir gün,
Sordum onu zahir oldu tabut...
Tabut! O rəhnümayi-məqbər,
Tabut! O heykəli-mükəddər,
Tabut! O xatibi-summü əbkəm,
Tabut! O bürudəti-mücəssəm,
Tabut! O sükuti-pay-dər sər
Tabut! O müsibəti-mükərrər,
Tabut! O vəhşəti-müənnid,
Tabut! O məqbəri-səfərbər...

Səfil səmavəti cay edinsin
Təşrih olunub əcəl təpinsin
Min vəlvələ, min qiyamət olsun,
Min zəlzələ, bir inayət olsun
Məhşər tozaraq məzara minsin
Çarpıb kürələr qırılsın, ensin
Yağsın nəsi varsı kainatın
Lakin bu dərin sükut dinsin!..

***

Mən neyləyəlim böyüksə dövran,
Təqsiri nədir kiçiksə insan?
Kar etmədi verdiyim dəvalar
Keçdi yerə etdiyim dualar.
Gördük səni ey hakimi-mütləq
Ey xəstələrə verən şəfalar...

Dəndan nə bilir qidayi-ruhi
Məqbər nə bilir səfayi-ruhi
Ol əqldən üstüxan nə anlar
Bilməzsə məkan, məkan nə anlar?
Sənsiz bulan intihayi-ruhi,
Bir zərrə görür fəzayi-ruhi
Olmazsa vücud ilə bərabər,
Mən neyləyəyim bəqayi-ruhi?

Həsna mələyim ki, etdi rəhlət
Söylərdi bütün lisani-ismət.
Kim elsinənin odur bihini
Ən ruhşünası, dilnişini.

Hinduya da eyləmişdi rəğbət
Türkiyə isə verirdi ziynət.
Anlardı nə dersə bir fransız
Eylərdi bir ingilislə söhbət.
Ya qəhvə, ya çay içərdik erkən,
Qalxıb piano çalardı; derkən,
Oynardı çocuqlarım bərabər,
Sonra — bu da bəlkə rəqsə bənzər!
Birdən odama fərar edib mən
Həmd eylər idim buna içimdən.
Artıq kəsəyin, yetər, fəğanı
Ərvaha toxunmasın ziyanı
Bir ah ki, candan eyləyir cuş

Artıq ona kəndim eyləyim guş.
Mədfən olayım ona, cahanı
Fövqündə tavaf edə rəvanı.
Artıq qalayın sükut içində,
Fikr etmək üçün o yari-canı.

## NİGAR XANIM BİNT OSMAN
(1862 — 1918)

Fəryad ki, fəryadıma imdad edəcək yox,
Əfsus ki, qəmdən məni azad edəcək yox.
Təsiri məhəbbətlə yıxılmış gözəl, amma
Viranə dili bir daha abad edəcək yox.
Kəs varsa əlaqən mənə ey taleyi-dunum
Sən var ikən aləmdə məni yad edəcək yox.
Haqq ilə bilir zar könül haləti-eşqi
Mahirdir o fəndə, onu ustad edəcək yox.
Yarəb, nə üçün zari-Nigari bu cahanda
Naşad edəcək çoxsa da, bir şad edəcək yox?...

# TOFİQ FİKRƏT
(1867 — 1915)



*Əsl adı Məhməd Tofiqdir. İstanbulda doğulmuş və orada vəfat etmişdir. Tofiq Fikrət Türkiyə ədəbiyyatına tamamilə yeni bir hava gətirmiş böyük şairdir. Əsərlərinin ruhu, məzmunu etibarilə inqilabçı romantik yönlü sənətkardır. Dövrün məşhur şairlərindən Müəllim Nacinin və Rəcaizadə Mahmud Əkrəmin tələbəsi olmuşdur. Əgər yaradıcılığının ilk dövrlərində Divan ədəbiyyatının təsirini Müəllim Nacinin dərsləriylə bağlayırlarsa, Mahmud Əkrəm gənc şairi daha çox Qərb ədəbiyyatına doğru yönəltmişdir. Avropa romantiklərinin (Alfred Müssenin və başqalarının) müəyyən təsiri duyulsa da, Tofiq Fikrət tamamilə orijinal türk şairidir, qədim ədəbiyyatımızın Füzuli, Nədim, Nəfi ənənələrinə dərin hörmətlə yanaşan novator sənətkardır. Şerlərinin mövzusu və ruhu azadlıq, vətənpərvərlik ideyalarının tərənnümüylə bağlıdır. Tofiq Fikrətin məşhur "Millət şərqisi" XX əsrin əvvəllərində Türkiyə gənclərinin hürriyyət və ləyaqət uğrunda mübarizə əzmini ifadə edirdisə, 90-cı illərdə Azərbaycan xalqının milli azadlıq hərəkatının poetik şüarı kimi səsləndi. Əsərlərində milli ideyalar nə qədər vüsətlə əks olunsa da, Tofiq Fikrət özünü ilk növbədə bütün bəşəriyyətə mənsub olan İnsan kimi dərk edirdi. İctimai motivləri qabarıq nəzərə çarpan şerlərlə bərabər Tofiq Fikrətin lirik parçaları, bacısının nakam taleyindən bəhs edən, onun ölümünə həsr olunmuş həzin və təsirli elegiyası, təbiət mənzərələrini təsvir edən şerləri də var. Tofiq Fikrət həm də istedadlı rəssam idi. Əsrin əvvəllərində Tofiq Fikrətin Azərbaycan romantik şerinə və ilk növbədə Məhəmməd Hadiyə böyük təsiri olmuşdur.*

*Nə yazıq ki, ərəb-fars kəlmələrinin, tərkiblərinin sıx-sıx işlədilməsi Tofiq Fikrətin dilini xeyli qəlizləşdirir və bu günün oxucusu tərəfindən qavranılmasını çətinləşdirir. Vaxtilə Tofiq Fikrətin bu dil xüsusiyyətlərini Cəlil Məmmədquluzadə də tənqid etmişdir.*

*Digər tərəfdən Tofiq Fikrətin Qərbə müsbət münasibəti, Türkiyənin inkişa-*

*fını Qərblə bağlaması, oğlunu Avropada təhsil almağa göndərməsi (sonralar oğlu xristian dinini qəbul etmişdir) Türkiyədə etirazlar doğurmuş və bu günün özündə də böyük şairə birmənalı yanaşılmır. Bununla belə, Tofiq Fikrətin adı ədəbiyyatımız, şerimiz tarixində ən yüksək adlardan biridir.*

*"Rübabi-şikəstə" (1900), "Tarixi-qədim" (1905), "Xaluqun dəftəri" (1911), "Rübabın cavabı" (1912), "Doxsan beşə doğru" (1912), "Həmşirəm üçün" və başqaları Tofiq Fikrətin və ümumi Türk-Oğuz ədəbiyyatının şah əsərlərindəndir.*

Kimsədən ümmidi feyz etməm, dilənməm pərrü-bal
Kəndi cevvim, kəndi əflakımda kəndim tahirəm.
İnhina tövqü əsarətdən girandır boynuma
Fikri hürr, irfanı hürr, vicdanı hürr bir şairəm.

**("Rübabi - şikəstə"dən)**

## PROMETEY

Qəlbində hər dəqiqə bu ülvü təhəssürün
Minkari-atəşini duy, daima düşün:
Onlar neçin səmada, neçin mən çuxurdayam?
Gülsün neçin cahan mənə, mən yalınız ağlayım?
Yüksəlmək asimana və gülmək nə dadlı şey!
Bir gün bu xəstəlikli vətən canlanırsa... Ey
Müştaqi-feyzü nur olan atii millətin
Məchul elektrikçisi əxtarı fitrətin
Yüklən gətir nə varsa — bir az məskənət-fikən.
Bir parça ruhu, mənliyi, idrakı bəsləyən
Əsmari-bünye-hizini; boş durmasın əlin.
Gör daima önündə əsatiri-əvvəlin
Göydən dehayi-narı çalan qəhrəmanını...
Varsın,bulunmasın biləcək namü şanını.

**("Xaluqun dəftəri"ndən)**

## FÜZULİ

Gözündə şüqlənüma mehri atəşin İraq
baxışlarında hüveyda həzin bir istiqrak
dəhayi nasiyəyi safi mərkəzi işraq
soluq dodaqları pürlərzişi sürudi firaq...
Əsərlərində bu sevdalı çöhrədir zahir
Bu çöhrə məncə Füzuliyə pək münasibdir.

Bu çöhrə çöhreyi qəm, çöhreyi məhəbbətdir
məhəbbətin ona təsiri pür qərabətdir
Sevər və sevdiyi həp dərd, həp müsibətdir
səfası, nəşəsi yoxdur, bütün kədurətdir
Fəzayi ruhuna bir əbru girye taridir!
gülümsüyorsa emin ol ki iztiraridir!
Zaman zaman qapılır qəmli bir təsəllayə
dalıb gedər nəzəri-qəlbi deyl"i sevdayə
Tökərsə xakinə bir sərvi-nazənin sayə
Olur bu ruhu üçün bir nəşadı biqayə
Bütün əməlləri könlündən eyləmiş ibad
"Nə versələr ana şakir, nə qılsalar ana şad"
Lisani-həsrəti lakin şikayətəfşandır.
Düşüncə firqətə aləm gözündə zindandır
Cahana gəldiyinə anbaan peşimandır.
Rəfiqeyi-səfəri bir pəriyə giryandır
onun peşində gəzər daima xərabələri
Onun gözüylə həp ağlar görür səhabələri
Üzündə indi baxarsan, ümidlər görünür.
Nədir ümidi? O bundan da bixəbər görünür
Həyata qarşı nigahında bir kədər görünür...
Həyatı eşqini təmdid üçün sevər, görünür...
Nə varsa eşqi üçündür, onunladır bidar
birər lətifəsidir eşqinin xəzanla bahar.
Əsiri olduğu hüsnü xəyalı pərvərdə
Çəkər mahasinə peşində bir dönük pərdə
bütün bədayiyi xilqət görürsə bir yerdə
dönər, qalar yenə çeşmi o hüsnü əsmərdə...
O hüsni-əsmərə məftunluğu əzəldəndir.
onun qəmiylə Füzuli həyata düşməndir.

## MİLLƏT ŞƏRQİSİ

Çeynəndi yetər, varlığımız cəhl ilə qəhrə
Doğrandı mübarək vətənin bağrı səbəbsiz.
Birlikdə bu gün bulmalıyız dərdinə çarə
Can qardaşı, qan qardaşı, şan qardaşıyız biz.
Millət yoludur, haq yoludur tutduğumuz yol;
Ey haq, yaşa, ey sevgili millət, yaşa, var ol!
Gəl qardaşım, annən sənə möhtac, ona qoşmaq...
Qoşmaq ona, qurtarmaq o bibəxti vəzifən.
Qarşında köküs bağrı açıq, ölgün, yatıyor, bax
Onsuz yaşamaqdansa bərabər ölüm, əhvən,

Hər an o gözəl sinəni xəncərləyir ellər
İmdadına qoşmasaq əgər məhvi mükərrər.
Zülmün topu var, gülləsi var, qələsi varsa,
Haqqın da bükülməz qolu, dönməz üzü vardır.
Göz yumma günəşdən, nə qədər nuru qaralsa
Sönməz əbədi, hər gecənin gündüzü vardır.
Millət yoludur, haq yoludur tutduğumuz yol;
Ey haq, yaşa, ey sevgili millət, yaşa, var ol!
Vaxtıyla baban kimsəyə minnətmi edərdi?
Yox, qalmadı haşa sənə zillət pədərindən.
Dünyada şərəfdir yaşadan, milləti, fərdi
Silkin, bu məzəllət tozu uçsun üzərindən.
İnsanlığı pamal edən alçaqlığı yıx, əz
Billah, yaşamaq yerdə sürüklənməyə dəyməz.
Haqsızlığın ənvahını gördük... bumu qanun?
Ən qəmli səfalətlərə düşdük... bumu dövlət?
Dövlətsə də, qanunsa da, artıq yetər olsun.
Artıq yetər olsun bu dəni zülmü cəhalət...
Millət yoludur, haq yoludur tutduğumuz yol;
Ey haq, yaşa, ey sevgili millət, yaşa, var ol!

## DOXSAN BEŞƏ DOĞRU

Bir dövrü şəamət yenə çeynəndi əminlər
Çeynəndi, yazıq, millətin ümmidi-büləndi
Qanun deyə torpaqlara sürtüldü cebinlər
Qanun deyə, qanun deyə qanun təpələndi...
Beyhudə fəğanlar yenə, beyhudə əninlər!..

Eyvah! Otuz üç il o zəhər giryələriylə
Hüsranları, böhranları, əhvalı, məlalı,
Amali-dəvahisi və sülhü səfəriylə
Bir sel kimi axmış, mütəvəkkil, mütəhali...
Yazsın bunu tarixi-ibrət xətti-zəriylə!

Ey bir dəmi-röya kimi keçmiş qara günlər,
Bir ləhzə edin seyri-cahiminizi təkrar
Dönsün bizə mazi, o dərin nəzriyi-müqbər...
Heyhat! Otuz üç il, otuz üç il bütün əkdar
Heyhat!.. Nə bir dərs, nə də bir fikri mükərrar!

Hala o şəbin zeyli-təmadisi bu əzlam,
Hala o cəhalət, o təcahül və o təchil,
Hala vətənin hissəsi bir tudeyi-ələm

Hala düşünən başlara həp lətmeyi-təngil,
Hala sırıtan dişlərə hər loğmayi-ənam.

Hala tərəfiyyət, hesabiyyət, nəsəbiyyət,
Hala "Bu sənindir, bu mənim" qisməti cari
Hala qəzəb altında həqiqətlə həmiyyət...
Hər günkü tərənnüm, sayıdan, sayqıdan ari
Son nəğməsi yalnız: Yaşasın sevgili millət!

Millət yaşamaz, haqqa təhəssürlə solurkən
Sussun deyə vicdanına yumruqlar enərsə,
Millət yaşamaz Məclisi müstəhkar olurkən
İğfal ilə, təhdid ilə titrər və sinərsə,
Millət yaşamaz məşəli-millət boğulurkən.

Qanun diyoruz, nərdə o məscudi-mühəyyəl?
Düşman diyoruz, nərdə bu? Xaricdəmi, bizmi?
Hürriyyətimiz var diyoruz, şanlı mübəccəl,
Düşman bizə qanunmu, ya hürriyyətimizmi?
Bir həmlədə biz bunları qəhr etdik ən əvvəl.

Bir həmleyi-məhmumi təğəllüblə dəyişdik
Hürriyyəti şəxsiyyətə, qanunu qürura.
Heyhat! Otuz üç il geri düşdük və bu mühlik
Yoldan bu nədamətli və qəflətli mürura
Bişübhə o hummayi-cünun oldu mühərrik.

Düşsən sənə meyyali-təhəkküm əyilən sər,
Qopsun səni — bir Haq deyə alqışlayan əllər!

## XANİ YƏĞMA[1]

Bu süfrəcik, əfəndilər ki, iltiqama müntəzir
Hüzurunuzda titrəyir, bu millətin həyatıdır,
Bu millətin ki, müztərib, bu millətin ki mühtəzir!
Fəqət saqın çəkinməyin, yeyin, udun xapır-xapır
Yeyin, əfəndilər yeyin, bu xani-iştaha sizin
Doyunca, tıxsırınca, çatlayıncaya qədər yeyin!

Əfəndilər, pək acsınız, bu çöhrənizdən bəllidir,
Yeyin, yeməzsəniz bu gün, yarın qalırmı, kim bilir?
Bu nazi-niyam, baxın güdümünüzlə müftəhir !
Bu haqqıdır qəzanızın, əvət, o haq da əldə bir...

---

[1] Xani yəğma—burda "yoxsullara verilən yemək" mənasındadır. Təbii ki, şair bunu istehzayla işlətmişdir.

Bütün bu nazlı bəylərin nə varsa ortalıqda say:
Həsəb nəsəb, şərəf şataf, oyun, düyün, qonaq, saray.
Bütün sizin, əfəndilər, qonaq, saray, gəlin, alay,
Bütün sizin, bütün sizin, hazır-hazır, qolay-qolay...

Böyüklüyün bir az ağır da olsa həzmi yox zərər,
Qüruri-ehtişamı var, süruri-intiqamı var.
Bu süfrə iltifatınızdan iştə abu tab umar
Sizin bu baş, beyin, ciyər, bütün bu qanlı loğmalar...

Verir zavallı məmləkət, verir nə varsa: malını,
Vücudunu, həyatını, ümidini, xəyalını,
Bütün fəraqi halını, olanca şövqü balını
Həmən udun, düşünməyin haramını, halalını...

Bu xırmanın gəlir sonu, tapışdırın gedərayaq!
Yarın baxarsınız sönər bu gün çatırdayan ocaq!
Bu gün ki, mədələr qəvi, bu gün ki, şorbalar sıcaq
Atışdırın, tikişdirin qapış-qapış, çanaq-çanaq
Yeyin, əfəndilər, yeyin: bu xani-pürnəva sizin
Doyunca, tıxsırınca, partlayıncaya qədər yeyin!

## FƏRDA

Fərda sənin. Sənin bu təcəddüd, bu inqilab...
Hər şey sənin deyilmi ki zatən?.. Sən, ey şəbab,
ey çöhreyi-behici-ümid, işdə maqkəsin
qarşında: Bu səmavi səhər, safi-bisəhab,
Ağuşu lərzədan açıq, bəkliyor... Şitab!
Ey-fəcri xandezadi həyat, işdə hər kəsin
ənzarı səndə: sən ki həyatın ümidisən,
altında bir sitareyi-növ, yox, bir afitab
afaqa doğ, önündə bu mazii pürmihən
sönsün müəbbədən.
Sönsün müəbbədən o cəhənnəm. Sənin bu gün
cənnət qədər gözəl vətənin var. Bu gördüyün
zümrüd baxışlı, inci şətarətli qızcağız
kimdir, bilirmisən? Vətənin... İndi sayğısız
bir göz bu nazlı çöhrəyə — Allah əsirgəsin, —
kəm bir nəzərlə baxsa təhəmmül edərmisən?
İstərmisən bu ağ saqqalın paki-möhtəşəm
pişani-vüqarına, bir kirli əl deməm,
hətta yabançı bir əl uzansın? Bu məqbəri,
razı olarmısan daşa tutsun bu sərsəri?
Əlbəttə xeyir. O məqbər, o pişani-vaqur

qüdsi-birər misali-vətəndir... Vətən cəsur
insanların omuzları üstündə yüksəlir.
Gənclər, bütün ümidi-vətən indi sizdədir.
Hər şey sizin, vətən də sizin, hər şərəf sizin
Lakin unutmayın ki, zaman tündü mütməin
Bir hətvə samuğ ilə tüğkiyab edər bizi.
Öndən qoşan, fəqət yenə diqqətlə hər izi
təğmikə yol bulan bu yanılmaz müaqibin
şərməndeyi-itabı qarışsaq, yazıq!... Dəmin
"Fərda sənin" — dedim, məni alqışladın, xeyir,
Bir şey sənin deyil, sənə fərda vədiədir.
Hər şey vədiədir sənə, ey gənc, unutma ki,
səndən də bir hesab arar atii-müştəki.
Maziyə indi sən baxıyorsan pür intibah
Ati də səndən eyliyəcək boylə iştibah.
Hər üzvü girdabadi-havayiclə sarsılan
bir nəslin oğlusan. Bunu yad et zaman-zaman.
Əsrin, unutma, barigalar əsri feyzidir:
Hər ildırımda bir gecə, bir kölgə devrilir
Bir üfüqü iqtila açılır, yüksəlir həyat
Yüksəlməyən düşər: Ya tərəqqi, ya inhitat!
Yüksəlməli, toxunmalı alnın səmalara
Doymaz bəşər dedikləri quş iqtilalara...
Uğraş, didiş, düşün, ara, bul, qoş, atıl, bağır
Durmaq zamanı keçdi, çalışmaq zamanıdır.

## MAVİ DƏNİZ

Safü rakid... Hanı axşamki təğəyyür, həyəcan
Bir çocuq ruhu qədər pür nisyan,
Bir çocuq ruhu qədər indi münəvvər, ləkəsiz,
uyuyor mavi dəniz.
Mən bütün bir gecəlik cuşişi-əhzanımla
o xəyalati-pərişanımla
mütəşəkkil, laim,
qarşıdan səfvəti-məhrumunu seyr etmədəyəm...
Yox, bulandırmasın aludeyi-zülmət bu nəzər
ruhi-məğzumunu, ey mavi dəniz.
ah, lakin nə zərər,
Mən bu gözlərlə mükəddər, aciz,
sənə baxdıqca təsəlli buluram, aldanıram,
Mavi bir göz ələmi qəlbimə ağlar sanıram...

## İNANMAQ EHTİYACI

Bütün boşluq: zəmin boş, asiman boş, qəlbi-vicdan boş
tutunmaq istəyirəm, bir nöqtə yox pişi-hasarımda.
Bütün boşluq: dənər bir hiyçi-muhiş civarında.
Dönər beynim bərabər, ixtiyaram, sanki bir sərxoş
düşər, lağzıdenpa, hər səhai-ümmidəbir kərrə...
Bu yalnızlıq, bu bir qürbət ki, bənzər qürbəti-qəbrə
inanmaq... İşdə bir ağuşi-ruhani o qürbətdə.
Qaranlıq: hər tərəf, hər şey qaranlıq, bir həzin yelda!
Qaranlıq: Fəhmi-daniş, əqli-istihrac hər müzlüm.
bütün ruhumda müzic bir cəmadiyyət olur naim
kəsafətdən ibarət bir təcəlli ərz edər əşya
həqiqət zahir olmaz dideyi-idrakə bir zərrə...
Bu vəhm-alud bir zülmət ki, bənzər zülməti-qəbrə
inanmaq... İşdə bir şehraxi-nurani o zülmətdə.

## SABAH OLURSA

Bu məmləkətdə bir gün sabah olursa, Xaluq,
Əgər bu məmləkətin sislənən bu nasiyeyi
Müqəddəratlı qəvi bir əlin qəvi, mühyi
Bir ehtizazi-təmasıyla silkinib bu donuq,
Bu paslı çöhrəyi-millət bir az gülərsə... — o gün
Mən ölməmiş belə olsam, həyata pək ölgün
Bir irtibatım olur şübhəsiz. O gün məndən
Ümidi kəs, məni götrüm və boş mühitimdə
Məraratımla unut. Çünki ləngi-pəjmürdə
Nəzərlərim səni maziyə çəkmək istər. Sən
Bütün hüvüyyətü üzviyyətinlə atisən:
Tərənnüm eyləyir ələn qulaqlarımda səsin!

Əvət, sabah olacaqdır, sabah olur, gecələr
Tülui həşrə qədər sürməz. Aqibət bu səma,
Bu mavi göy sizə bir gün açılır. Məlul olma,
Həyatə nəşə günəşdir. Məlal içində bəşər
Çürür bizim kimi... Siz, ey fəzayi fərdanın
Kiçik günəşləri, artıq birər-birər oyanın!
Üfüqlərin əbədi iştiyaqı var nura.
Tənəvvür... əsrimizin işdə ruhi amalı.
Silin buludları, silkin zilali əhvalı,
Ziya içində qoşun bir xilasi məşkurə.
Ümidimiz bu: ölürsək də biz, yaşar mütləq
Vətən sizinlə, bu zindan qaranlığından uzaq.

## XALUQUN AMENTÜSÜ
(Xalıqın inam əsasları, əqidəsi)

Biq qüdrəti-külliyyə var ülvi və münəzzeh
Qüdsi və müəlla, ona vicdanla inandım.
Torpaq vətənim, növi-bəşər millətim... İnsan
İnsan olur ancaq, buna izanla inandım.
Şeytan da bizik, cin də, nə şeytan, nə mələk var
Dünya dönəcək cənnətə insanla, inandım.
Fitrətdə təkamül əzəlidir — bu kəmalə
Tövrat ilə, İncil ilə, Quranla inandım.
Əbnayi-bəşər bir-birinin qardaşı... Xülya!
Olsun, mən o xülyaya da min canla inandım.
İnsan əti yenməz. Bu təsəlliyə içimdən
Bir an üçün əcdadımı nisyanla inandım.
Qan şiddəti, şiddət qanı bəslər. Bu müadət
Qan atəşidir, sönməyəcək qanla, inandım.
Əlbət bu məzar ömrünü bir həşri-ziyahiz
Təqib edəcəkdir, buna imanla inandım.
Əqlin o böyük sahirin ecazı önündə
Batil keçəcək yerlərə xüsranla, inandım.
Zülmət sönəcək, parlayacaq həqqi-dirəxşan
Birdən birə bir tabişi-bürkanla, inandım.
Qollar və boyunlar cözülüb bağlanacaq həp
Yumruqlar o zənciri-xuruşanla, inandım.
Bir gün yapacaq fən bu siyah torpağı altun
Hər şey olacaq qüdrəti-irfanla.... İnandım.

## TARİXİ - QƏDİM
(Bir parça)

Bəşərin köhnə sərgüzəştindən
Bizə əfsanələr tərənnüm edən
Bizə abayi bir vücudumuzun
Ceffi mazidə bir siyah və uzun
Gecə təşkil edən həyatından
Ninilər ixtira edib ovudan
Bizə: "Ən doğru, ən gözəl örnək!"
Deyə əvvəl zamanı göstərərək
Gələcək günlərin keçən gecədən
Fərqi yox, hökmü yox, səhabı verən
Və cəbinində altı min illik

Buruşuqlarla şübhələr qarışıq
Səsi maziyə, yəni röyaya,
Payi-ati deyilən heyulaya
Sürünən heykəli qədim... onu gah
Durdurub mənzərimdə biikrah
Soraram əski xatiratından.

## MAZİ... ATİ
### (Keçmiş... Gələcək)

Mazi... O şimdi kölgə ikən, şimdi zi-həyat
Bir cism olan. O şimdi ölən, şimdi canlanan
Mövcud. Əvət də dalğa, o girdabi-xatirat
İnsan üçün nədir? Əvət, insan ki doğmadan
Ölməklə uğraşır və bu təqdirə qatlanır,
Mazidə bir təəyyünü haizmidir? Xayır.
Ölmək — həyatı tazələməkdir. Biz ölməsək
Əfkar ölür. Həyati-bəşər şəxsi fitrətin
Bir cümlə təkamülü... Hər fikri-müştərək
Bir sədmədir. Onunla qımıldar bu heyətin
Zərrati-binihayəsi, zərrati-nayimi
Kövnün, xülasə, fikri-bəşərdir münəzzimi.
Mazidə qəbul olsa təəyyün, bəqa, sübut,
Ati nasıl xəyal edilir? bir zəka-şikən
Durğunluq ihtinaki-məluliylə pür-sükut.
Ancaq tənəbbüt eyləyən, ancaq pinəkləyən
Mənsuhü münhəsif, mütənahnih, atəşliqa
Bir varlıq... İşdə, çöhreyi-mizai zi bəqa
Mazi... O bir müəllim, o bir pir, o bir pədər,
Halın tutub sinirli əlindən ağır, sabur,
Atiyə doğru yedməli... Ati, o pür-səhər
Bir üfqü mühtəcib ki Fiyüzata mehdi nur,
Əfkar üçün sipehri təalı, bilinməli,
Ati çıxınca ortaya, mazi silinməli...

## LEYLİ VİDA

Oh, gəl... Ruhi-təbiət kimi məhmuru xamuş
Bu vəfasız gecənin qoynunda
Qalalım bir əbədi saniyə dalğın, bihuş...

Kim bilir, bəlkə də son leyleyi-sevdamızdır
Bunda hər ləhzə bir az ömrü səadət sayılır...
Oh, bax dalğaların cəzbeyi-səfiyyətinə
Sanki bir həmleyi-sevdaya açıq bir sinə.
O qədər raqidi-sakit, o qədər müstəqrak
O qədər uyquda hər şey ki həmən qorxulacaq
Oh, gəl, gəl, bu hafagaha bərabər gedəlim
Orda sənsiz keçəcək günləri təzmin edəlim.
Bir siyah quş kimi amadeyi-pərvazi-fərar
Bu vəfasız gecənin qoynunda
Edəlim gəl, əbədi qalmaq üçün bir israr...
Kim bilir bəlkə də son ləhzeyi-sevdamızdır
Xoş keçən hər dəmi-sevda əbədiyyət sayılır...

## DÜN

Sənə gəldim dün qorxaraq
Gizli bir cürmüm var kimi.
Sənə qoşdum — bir yavrucaq
Nənəsinə qoşar kimi.
Məni gördün, güldün, yenə
Mən ağladım sinə-sinə.

Ta qəlbimə edilmiş də
Soruyordum: bu sənmisən?
Hələ qulağımda işdə
Məni məndən soran səsin.
Sonra birdən güldün yenə
Mən ağladım sinə-sinə.

— Fəqət sonra? — Sonra həzin
Sonra ələm və ayrılıq...
Ayrılacaq, gedəcəksən
— Ayrılacaqmıyıq? Yazıq!
Yazıq! — dedin, güldün yenə
Mən ağladım sinə-sinə.

Əvət boylə gülərkən sən
Mən ağladım için-için...
Mənə gülmən can verərkən
Yenə dün ağladım, neçin?
Xeyir, sən gül, sən gül yenə
Mən ağlayım sinə-sinə.

## BİRLİKDƏ

Birlikdə açılmış iki zanbaq kimi həmsər
Birlikdə keçirdik bütün əyyami-şəbabı
Birlikdə nə yapdıqsa bu insanlığa bənzər
Birlikdə, nə gördüksə müqəssi və münəvvər...

Bir xatirə yoxdur o gözəl günlərə şahid,
Bir xatirə yoxdur ki bu gün mövcü səhabı
Ərz eyləməsin ruhuma hər an mütəbaid
Bir lemhə ki yalnız sənə, yalnız sənə aid.

Birlikdə olursaq yenə bir parça gülümsər
Ömrün. Bu keçən ömrümün iqbali-xərabı
Təzkir ilə mazini - gəl ey həmdəmi-dilbər!
Birlikdə oxurduq, yenə birlikdə, bərabər
Xətm eyləyəlim, gəl bu qəm aludə-kitabı!

## ZƏRRİŞDƏ

"Yaz eşqinə dair" — dediniz... İşdə: Çocuqkən
Qayət afacan bir kədi sevdim ki əlimdən
Bir ləhzə buraxmazdım; uyurkən qucağımda
Ruhumdakı şəfqət
Həp üstünə titrər; gecə bəzən yatağımda
Birlikdə uyardıq. Buraxıb məktəbə getsəm
Diltəngeyi-həsrət
Mütləq məni diqqətsiz edər, "Hey, qoca sərsəm!"
Tənbehi-tokatlarla guruldardı başımda.
Mən aşiqi-şeyda,
Hər qəhrə təhəmmüllə sevərdim... O yaşımda
Sevməkdəki təsiri təsəllini bilərdim.
Hərkəs kimi, hətta
Bəzən də səbəbsizcə olurdum mütəəllim...
Zərrişdə, bu ismiydi onun, sanki xəbərdar
Məxfi kədərimdən,
Yaltaqlanar, atlar, sûrünər, oxşadar, oxşar,
Tətyibimə, əlbəttə, o gün çarə bulurdu:
Lakin üzərimdən
Bir kərrə o hüzn oldumu zail, qurulurdu:
"Sayəmdə bu nəşən" demək istər kimi məğrur
Məğruri mühəkkir,
Başlardı vəfasızlığa; mən acizi məshur,
Hər dürlü xüsusatına, hər keyfinə tabe
Bəzən mütəxəyyir,

Bəzən mütəhəkkim: yenə aciz, yenə qane.
Ən şübhəli bir meylini görsəm inanırdım,
Biçarəliyimdən.
Həp dırmalanır, dırmalanır, dırmalanırdım!
"Yaz eşqinə dair" — dediniz... İşdə misalı:
Sevdiklərimin mən
Hamsında bu dırnaqları, hamsında bu halı,
Hamısında bu xırçın kədi simasını gördüm...
Bir ömrü cahimin bütün əzvakını sürdüm!

## HƏMŞİRƏM ÜÇÜN

Biz çocuqduq, səni dəfn eylədilər
Bivəfa qumlara biqeyd əllər.
O zamandan bəri, müştaqü zəbun
nə zaman Qibləyə dönsəm dilxun
səni bir mafədə puyan görürəm
sonra qumlarda pərişan görürəm.
Bir tikan bəlkə dəlili-qəbrin,
dəvələr bəlkə ziyarətçilərin.
Kim bilir, bəlkə də pamalı qubar
nə tikan var, nə ziyarət, nə məzar.
Nə də sən... Mənsə bu gün dərdimlə
səni inlətməyə gəldim, dinlə.
Dinlə hər nərdə isən, hər nə isən:
Toz, bulud, ruh, mələk, daş ya tikən.
Bunların həpsini giryan edəcək
bir cinayət ki... Cinayət, gerçək!
Bir cinayət ki qavanın, edyan
qoymamış ismini. Lakin vicdan
O böyük hakim, o qanuni-mübin
veriyor, hökmünü: Lənət, nifrin!
Bu lənətiylə fəqət müztəribmi vicdanın?
Sorun fəziləti təhqir edən əsafildən,
sorun təbiəti tərzil edən ərazildən
bu lənətiylə, əvət, müztəribmi vicdanın?
Sorun bu isməti təsmim edən o qatildən.
Zavallı qardaşım! İnsan təsəvvür etdikcə
sonunda torpaq olan sərgüzəşti-mülimini
bu on səkkiz sənəlik dəhşəti-məzahimini
təhəmmül etmiyor... Artıq bu boylə getdikcə
içim zəhərlənəcək yad edib məkarimini

Zərif və adil idin, düşməsən bu ailəyə,
qalırdı bəlkə qadınlıqda bir böyük yadın.
Yaşardı bəlkə onun kölgəsində əhfadın.
Sən enmədin, səni endirdilər o məzbələyə.
Sən ölmədin, səni öldürdülər, zavallı qadın.
Öldürdülər... Bu həm də bu gün, indi olmadı.
Çoxdan gömüldü hüsnü şəbabın, zərafətin
qəlbin, qadınlığın, şərəfin, istirahətin.
Bir an didikləməkdən o xain yorulmadı.
Bitdi çamurlu dırnağı altında gilzətin!
Dırnaq, çamur, tokat... Bu sənin qismətin deyil
ey isməti-mübarəkə, ey həsni-zihicab,
ey xəndeyi-tüluyi-həya, bikri-gülniqab
Dırnaq, çamur, tokat... Sonu bir əmri-mübtəhil
dırnaq, çamur, tokat... Sonu məhvi-əbəd... turab!
Əlbət deyil nəsibi məzəllət qadınlığın,
əlbət deyil mələkliyin ümmidi-zülmü şər,
Əlbət səfil olursa qadın, alçalır bəşər.
Lakin bu gün həp onlara aid yığın-yığın
əndişələr, kədərlər, əziyyətlər, iynələr!
Biçarə qardaşım, əzilib bitdin, oyləmi?
Ən sonda əzdilər səni, öldürdülər səni.
Mən yıxmaq istədim yapılırkən bu mədfəni,
lakin xəta buraxmadı: müzlim, cəhənnəmi
bir qüvvətin əlində müzəhhər fəqət dəni
bir qəbr olan mühitinə gördüm nüzulunu
cəbri, sürüklənir kimi endim addım-addım
Arxanca mən bu halə, bilirlər, çox ağladım.
Qaldın da bir üfüqdə ki hətta üfulunu
islaq nəzərlərimlə uzaqdan salamladım.
Bilməm ki indi hankı təcəllinə ağlaşaq.
Bir tazə məhv olub gedivermək, bu bir kədər,
Məhv olmanın səbəbləri bir ayrı zərbələr
Lakin bu tazənin əbədi eşqə müstəhaq
bir qəlb ikən əzilməsi... Məhv olmadan betər.
Baxsan fəlakətin də olurmuş xeyirlisi:
Qurtuldun işdə ləhzədə min kərrə ölmədən.
Öldürdülər fəqət... Məni yalnız bu titrədən
ölmək deyil, bu öldürüş ən qəhərlisi
Çəkdiklərinə müztəribəm ən ziyadə mən
Namınla, ey vücudunu təzlil edən səfil,
qaldır daşından olsun o cəngi-xəcaləti

kölgən qaraldacaq bu cəbini-şəhadəti
Ey qəhreyi-həyatı olan məlanət, çəkil;
torpaqda barı inləməsin ruhi-isməti!
Siz toplanın başına bu nəqşi-mükərrəmin
siz, ey qadınlığın əbədi iştiqaları,
ey zəqfi-zillətin mütəvəhhiş bükaları
siz toplanın və ağlaşın... Siz bu matəmin
ən doğru, ən yaxın, ən əsil aşinaləri.

## RZA TOFİQ BÖLÜKBAŞI
(1869 — 1949)

### GÖZ AŞİNALIĞI

İsmini bilməzdim, fəqət tanırdım
Nə yosma bir çiçək taxışı vardı.
Qızıl saçlarını atəş sanırdım
Günəş nuri kimi yaxışı vardı.

Öylədir, gün şəfəq sökdüyü zaman,
Göllərə kölgələr çökdüyü zaman,
Saçını çözüb də tökdüyü zaman,
Dalğa-dalğa düşüb axışı vardı.

Hüsnündə bir əda var ki asiydi
Məni xərab edən o ədasıydı.
Sevdalı gönlümün aşinasıydı
Üzümə bir şirin baxışı vardı.

### YUNUS İMRƏYƏ ƏRMƏĞAN

Uca dağlar ardından
Dəniz aşırı gəldim.
Evliyalar yurdundan
Salam tapşırı gəldim.

Ulu bir şara vardım
Dosta ərmağanım var.
Ərənlərin bağından
Güllər dəvşiri gəldim.

Boz bulanıq bir çaydım
Eşq elinə baş vurdum.
Çalxanıb səfa buldum
Süzülüb duru gəldim.

Yunusun torpağına
Vardım üzüm sürməyə.
Sildim könül pasını
Yanıban arı gəldim.

Cuşa gəldim, çağlaram
Aşiq oldum, ağlaram.
Candan coşan əsrarı
Töküb daşırı gəldim.

Rza Tofiq Allahdan
Ayrılma ol dərgahdan.
Mən qurtuldum günahdan
Əyriydim, doğru gəldim.

## BİR ANİ MƏYUSİYYƏT

Ömrümün nəşəsiz keçdi baharı,
Neylərəm baharı gülsüz olunca?
Bir tutsam gərəkdir yarı, əğyarı
Qürbət ellərində öksüz olunca.

Könül əlindədir fəryadi-zarım
Bu nankor eşqimdən mən də bezaram.
Ruhum azad olar, bəlkə məzarım
Ayaqlar altında dümdüz olunca.

Deyirlər ki: "Rza... Dönərmi aləm
Əncamına varır bu dövrü-sitəm"
Mənim gözümdə fər qalırmı, bilməm
Bu uzun gecələr gündüz olunca...

## EŞQ HÜMMASI

Xəstəyəm, yalnızam, səni yanımda
Sanıb da bəxtiyar ölmək istərəm.
Məhmuri-xülyayam cami-ləbindən
Qanıb da bəxtiyar ölmək istərəm.

Bir olmaz əməlin düşdüm peşinə
Vuruldum hüsnünün şən günəşinə

Qara gözlərinin eşq atəşinə
Yanıb da bəxtiyar ölmək istərəm.

Talein qəhri var hər həvəsimdə
Boğulmuş fəğanlar titrək səsimdə.
O nazlı ismini son nəfəsimdə
Anıb da bəxtiyar ölmək istərəm.

## FİKRƏTİN MƏZARINDA

Dedilər ki, izsiz qalan türbəndə
Vəhşi güllər açmış, görməyə gəldim.
O cənnət bağının xakinə mən də
Həsrətlə üzümü sürməyə gəldim.

Dedilər ki, sənə əməl bağlayan,
Qəbrində diz çöküb bir dəm ağlayan
Bərmurad olurmuş. Mən də bir zaman
Ağlayıb murada erməyə gəldim.

Bu hicran ilinin son baharında,
Jalələr titrərkən çəmənzarında,
Gün doğmadan əvvəl mən məzarında
Matəm çiçəkləri dərməyə gəldim.

Səni andım bütün qəm çəkənlərlə,
Eşqi-haq uğrunda yaş tökənlərlə,
Sarı qönçə verən bu tikənlərlə
Daşına bir çələng hörməyə gəldim.

Yadın ölüm kimi bir sirri-mübhəm,
Nəşeyi-sevdamı bu hissi-ələm?
Ruhumda nə füzun eylədin bilməm,
Bu gün sənə gönül verməyə gəldim.

## GÖZLƏRİN

Ruhumda gizli bir əməlmi arar
Gözlərimə baxıb dalan gözlərin?
Ağlıma gəlməyən bilməcə sorar
Məni xülyalara salan gözlərin.

Nigahın könlümə, ey pəri-peykər,
Ləyalı həsrətin hüznünü tökər.
Qaranlıqlar kimi yıxılar, çökər
İçimdə yer edib qalan gözlərin.

Hüzurunda bəzən mənliyim ərir,
Tövrüm hulusundan şübhə göstərir.
Bəzən də nə olmaz ümidlər verir
Səbri-qərarımı alan gözlərin...

Qəmzəndə zahir, ey ömrümün varı
Füzunu hüsnünün bütün əsrarı.
Nəşr edər aləmə rəngi-baharı
Koyu bənövşəyə çalan gözlərin...

Sehirdir, şübhəsiz, bütün bu şeylər,
Baxışın zehnimi pərişan eylər.
Mənə eşq əlindən əfsanə söylər
Eşqə inanmayan yalan gözlərin...

## UÇUN QUŞLAR

Uçun quşlar, uçun doğduğum yerə!
İndi dağlarında mor sümbül vardır.
Ormanlar qoynunda bir sərin dərə,
Tikanlar içində sarı gül vardır.

O çay ağır axar, yorğunmu bilməm
Mehtabı xəstəmi, solğunmu bilməm
Yaslı gəlin kimi məhzunmu bilməm
Uca dağ başında siyah tül vardır.

Orda keçdi mənim gözəl günlərim,
O dəmləri anır bu gün inlərim.
Dastani-ömrümü oxur, dinlərim,
İçimdə oralı bir bülbül vardır.

Uçun quşlar, uçun, burda vəfa yox,
Öylə axar sular, öylə həva yox,
Fəryadıma qarşı əks-səda yox
Bu yanqın yerində soyuq kül vardır.

Hey Rza! Kədərin başından aşqın,
Bitib tükənməyir ələmin, eşqin...
Səndə dərya kimi daima daşqın
Daima çalxanan bir gönül vardır.

## MƏHMƏD EMİN YURDAQUL
(1869 — 1944)

*Türkiyə şerinə sadə xalq dilini, yazılı ədəbiyyata şifahi el ədəbiyyatının biçimlərini, özəlliklərini gətirən tanınmış şairlərdəndir. Əsərlərində vətənpərvərlik duyğuları çox önəmli yer tutur.*

### KƏNDİM ÜÇÜN

Gənc çağdaydım kəndimi bir tikanlı yolda buldum
Hıçqırıqlar eşitdim gül və bülbül bağlarından
Fəlakətlər topladım Anadolu dağlarından
Uzun sazlı aşıqlar diyarında şair oldum
Əzgi qoydum ahlarla, fəğanlarla türk şerinə
Yanıq səslə hayqırdım: "Ey millətim, oyan" deyə
Viran yurdun dolaşdım bir şəhrindən bir şəhrinə
Saç və saqqal ağartdım mən də: "Vətən! Vətən!" deyə.

### BÖYÜK SƏNƏTKAR

Xeyir, sənət yalnız bir süslü xəyal, vəzn deyil
Yalnız quru bir əyləncə, yalnız bir zövq üçün deyil.
Məncə böyük sənətkar peyğəmbərlər soyundandır
Ürəyində müztərib ruhlar üçün acı titrər.
Onun dili Allahın qonuşduğu bir lisandır
Ürəklərə eşq, iman, ümid, röya, ilham edər.
O Musaya bənzər ki, əsasıyla yollar açar
Məzlumları çıxarar əsarətdən hürriyyətə.
Fironlar yurdundan məvud olan məmləkətə
Dünyalarda devrimlər yaradanlar bunlardırlar.
Onun üçün Puşkinə və Danteyə aşiq oldum
Onun üçün Kamalı mən könüldən sevərəm.

### ŞAİR

Əvət sənin nə incin, nə altunun, almazın var
Nə zəncirin vardır ki, biləkləri ram edəsən
Nə sətirin vardır ki, ürəkləri titrədəsən

Sənin xəfif əlində yalnız qırıq bir sazın var
Lakin alnın alovlu təpələrin günəşidir
Beyitlərin yıxılmaz mehrabların atəşidir.
Sən sənətin həyatdan ilham alan çocuğusan
Dünyalara dəmirdən başqa şeylə hökm edərsən
Röyaları fəth üçün yalnız bir şey: eşq istərsən.
Xəzinələrdən dəyərli şeylə dolu sənin ruhun
Onlar ki bunlara cahangirlər taclar verər:
Qəhrəmanlar susamış birər aslan kimi gələr.

## BİZ NASIL ŞER İSTƏRİZ

Koroğlu nə? Anadolu dağlarından görünən,
Həp evləri, yapıları çamurlara bürünən,
Köycüklərdə, rəncbərlərin yurdlarında oxunur.
Bir kitab ki, ya bir yetim keçisini çaldırdır
Ya bir cütcü çocuğunu issız dağa qaldırdır
Oylə şeylər bəllidir ki, ağıllara toxunur.

Fateh nədir? İstanbulun sularının altında
Qara dəniz boğazında, Hisarların sıratında
Qayət gözəl düşünülmüş, qayət iyi duyulmuş
Bir şer ki, şəhidlərin al qanıyla yazılmış.
Bir qılınc ki, bir kitabın alt yanına azılmış
Bir altundan heykəldir ki, bir odaya qonulmuş.
Biz o şeri istəriz ki, cütə gedən babalar,
Əkin biçən gənc qızlarla odun kəsən analar,
Yanıq səsin dinlər ikən göz yaşını silsinlər,
Başlarını açıq, bəyaz sinəsinə qoysunlar
Ürəyinin özləriyçün çırpdığını duysunlar
Bu çırpıntı, bu səs nədir, nələr deyir? Bilsinlər.

## CƏNGƏ GEDƏRKƏN

Mən bir Türkəm, dinim, cinsim uludur
Sinəm, özüm atəş ilə doludur.
İnsan olan Vətəninin quludur
Türk evladı evdə durmaz, gedərəm
Tanrı evi viran olmaz, gedərəm.

Məhəmmədin kitabını qaldırtmam
Osmancığın bayrağını aldırtmam
Düşmanımı Vətənimə saldırtmam
Bu torpaqlar əcdadımın ocağı

Evim, köyüm həp bu yerin bucağı
İşdə Vətən, işdə Tanrı qucağı
Ata yurdun övlad pozmaz, gedərəm.

Tanrım şahid, duracağam sözümdə
Millətimin sevgiləri özümdə.
Vətənimdən başqa şey yox gözümdə
Yar yatağın düşman almaz, gedərəm.

Ağ köynəklə göz yaşımı silərəm,
Qara daşla bıçağımı bülərəm,
Vətənimçün ucalıqlar dilərəm,
Bu dünyada kimsə qalmaz, gedərəm.

## BURAX MƏNİ HAYQIRAYIM

Mən ən həqir bir insanı qardaş duyan bir ruham
Məndə əsir yaratmayan bir Tanrıya iman var
Paçavralar altındakı yoxsul məni yaralar.

Məzlumların intiqamın almaq üçün doğuldum
Vulkan sönər, lakin mənim alovlarım əksilməz
Boran keçər, lakin mənim köpüklərim kəsilməz.

Burax məni hayqırayım, susarsam sən matəm et
Unutma ki, şairləri hayqırmayan bir millət
Sevənləri torpaq olmuş öksüz çocuq kimidir
Zaman ona qan damlayan dişlərini göstərir.
Bu zavallı sürü üçün nə mərhəmət, nə hüquq
Yalnız bir sərt baxışlı göz, yalnız ağır bir yumruq

## MƏNİM ŞERLƏRİM

— Sən qəlbsizsən, hanı sənin gəncliyinin həyatı?
— Eşqlərimmi? Bir nəfəslə sola bilən bu şeylər
Bir yanardağ atəşiylə kömür kimi qaraldı.
İndi isə yerlərində bir sitəmli yel əsər
Əvət, mənim hər şerimdə ilan dişli tikan var
Sizlər gedin, bal verəcək yeni açmış gül bulun.
Bəlkə mənim acı səsim qılaqları dırmalar
Sizlər gedin, gənc qızların türküsüylə şən olun.
Yarın sizlər, onlar ilə qorularda əl ələ
Gəzin, gülün, yalnız kəndi ruhunuzu oxşayın.
Zavallı mən, əlimdəki bu üç telli saz ilə
Millətimin fəlakətli həyatını söyləyim
Dərdlilərin göz yaşını çöhrəm ilə siləyim.

## CƏNAB ŞƏHABƏDDİN
(1870 — 1934)

### ELXANİ ŞİTA

Bir bəyaz lərzə, bir dumanlı uçuş
Eşini qeyb eləyən bir quş kimi qar
Keçən əyyami-növbaharı arar.
Ey kulubun suridi-şeydası,
Ey kəbutərlərin nəşidələri,
O baharın bu işdə fərdası
Qapladı bir dərin sükuta yeri qarlar
Ki, xamuşanə dəmbədəm ağlar.
Ey uçarkən düşüb ölən kəpənək
Bir bəyaz rişeyi-cenahi-mələk kimi qar
Səni olğun hədiqələrdə arar.
Sən açarkən çiçəklər üstündə
Ufacıq bir çiçəkli yelpazə
Nəşin üstündə indi bir müjdə
Başladı parça-parça pərvazə qarlar
Ki, səmadan düşər, düşər, ağlar.
Uçdunuz, getdiniz siz ey quşlar
Kiçicik sər-səfid bayquşlar kimi qar
Sizi dallarda, lalələrdə arar.
Getdiniz, getdiniz, ey mürğan
İndi boş qaldı sər-ta sər yuvalar
Yuvalarda yetimi-biəfqan
Son qalan mavi tükləri qovalar qarlar
Ki, havada uçar, uçar, ağlar.

### SƏNİN ÜÇÜN

Səsin işlər kimi bir şux qanad qəmlərimə
Səni dinlərkən olur qəlbim uçan quşlara eş.
Gün batarkən sanıram kölgəni bir başqa günəş
Sarışınlıq gətirir gözlərin axşamlarıma.

Doğulur ömrümə bir yirmi səkkiz yaş günəşi
Bir quş oxşar kimi sən saçlarımı oxşarkən.

Qoxlaram əllərini gülləri qoxlar kimi mən
Ovcundan alıram qış günü bir yay atəşi.

Könlümə adət edər hər unudulmuş nisan
Nə zaman gəncliyini yolda xuraman görsəm.
Əskidən pəmbə dodaqlarda dağılmış busən
Toplanar ləblərimə, bir gecə dalğın dursam.

Səni zambaq kimi gördükcə açıq pəncərədə
Gül açar baxtımın əvvəlki xəzanlıq qoxusu.
Gənc edər üfqümü xülyalarımın gənc qoxusu
Soraram ağ saçımın örtdüyü illər harada?

Cəbhəmi varsın o solğun sənələr soldursun,
Yeni ulduz kimi doğduqca gözəl hər axşam.
Gəncliyin boylə mənimkən qocamam, heç qocamam
Ruhum, ölsəm belə mən, sən yaşayan ruhumsan.

## HÜSEYN SİRƏT ÖZSEVƏR
(1872 — 1959)

### BOĞAZİÇİ NOTLARI

Axşamın rəngi soldu gün gedəli
Batı maziyə açdı bir dəhliz.
Yaşıl bir lövhə indi mavi dəniz
Abanoz kölgələrlə çərçivəli.

Özlədim pək bu köhnə səhifəni
Orda oğluyla münzəvi Əkrəm.
Qonşu getmiş Səzai, bir görsəm
Onların halı bəlkə məndən eyi.

Bir gün əlbət bu ayrılıq bitəcək
Mövsümün son zamanı yaxlaşıyor.
Qarğalar üfqə bir çələng daşıyor
Bu baharım son baharım olsa gərək.

## MƏHMƏD AKİF ERSOY
(1873 — 1936)



*Məhməd Akif Ersoy İstanbulda doğulmuş və orada ölmüşdür. "Sənət həyat üçündür" cərəyanının qabaqcıl nümayəndələrindəndir. Qərbin işğalçı siyasəti, mədəniyyət adı altında istilaçılığı Məhməd Akifdə qızğın etiraz doğurub, onu "İslami birlik" fikrinə tapındırmışdır. Bu gün Türkiyə Cümhuriyyətinin dövlət himni olan "İstiqlal marşı"nın müəllifidir. Yeddi cildlik "Səfahat" adlı şerlər kitabı var.*

### ÇANAQQALA ŞƏHİDİNƏ

Ey bu torpaqlar üçün torpağa düşmüş əsgər,
Göydən əcdad enərək öpsə o pak alnı, dəyər.
Nə böyüksən ki, qanın qurtarıyor Tohidi
Bədrin aslanları ancaq bu qədər şanlı idi.
Sənə dar gəlməyəcək məqbəri kimlər qazsa,
"Gömməlim gəl səni tarixə" desəm, sığmazsan.
Gərçi mərc etdiyin ədvarra da yetməz o kitab,
Səni ancaq əbədiyyətlər edər istiab.
"Bu daşımdır" deyərək Kəbəni tiksəm başına,
Ruhumun vəhyini duysam da keçirsəm daşına,
Sonra göy qübbəsini alsam da rıza namiylə,
Qanayan ləhdinə çəksəm bütün əcramiylə,
Mor buludlarla açıq türbənə çatsam da tavan,
Yeddi qəndilli Süreyyanı uzatsam oradan,
Sən bu avizənin altında bürünmüş qanına,
Uzanırkən gecə mehtabı gətirsəm yanına,
Türbədarın deyə ta fəcrə qədər bəklətsəm,
Gündüzün fəcr ilə avizəni ləbriz etsəm,
Tüllənən məqribi axşamları sarsam yarana
Yenə bir şey yapa bildim deyəməm xatirinə...

## QİSSƏDƏN HİSSƏ

Keçmişdən adam hissə qaparmış... Nə masal şey!
Beş min sənəlik qissə yarım hissəmi verdi?
Tarixi təkərrür deyə tərif ediyorlar
Heç ibrət alınsaydı təkərrürmü edərdi?..

## İSTİQLAL MARŞI

Qorxma! Sönməz bu şəfəqlərdə üzən al sancaq,
Sönmədən yurdumun üstündə tütən ən son ocaq,
O mənim millətimin ulduzudur parlayacaq,
O mənimdir, o mənim millətimindir ancaq!

Çatma, qurban olayım çöhrəni, ey nazlı hilal;
Qəhrəman irqimə bir gül.. nə bu şiddət, nə cəlal?
Sənə olmaz tökülən qanlarımız sonra halal
Haqqıdır haqqa tapan millətimin istiqlal.

Mən əzəldən bəridir hür yaşadım, hür yaşaram.
Hanki çılğın mənə zəncir vuracaqmış? Şaşaram!
Kükrəmiş sel kimiyəm, bəndimi çeynər, aşaram
Yırtaram dağları, ənginlərə sığmam, daşaram.

Qərbin afaqını sarmışsa çəlik zirehli divar,
Mənim iman dolu köksüm kimi sərhəddim var.
Ulusum, qorxma! Nasıl boylə bir imanı boğar,
"Mədəniyyət" dediyin tək dişi qalmış canavar?

Arxadaş, yurduma alçaqları uğratma, saqın,
Sipər et gövdəni, dursun bu həyasızca axın
Doğacaqdır sənə vəd etdiyi günlər haqqın,
Kim bilir, bəlkə yarın, bəlkə yarından da yaxın.

Basdığın yerləri "torpaq" deyərək keçmə, tanı!
Düşün altındakı minlərcə kəfənsiz yatanı.
Sən şəhid oğlusan, incitmə, yazıqdır atanı,
Vermə dünyaları alsan da bu cənnət vatanı.

Kim bu cənnət vətənin uğruna olmaz ki fəda?
Şühəda fışqıracaq torpağı sıxsan, şühəda!
Canı, cananı, bütün varını alsın da Xuda,
Etməsin tək vətənimdən məni dünyada cüda.

Ruhumun səndən İlahi, budur ancaq əməli
Dəyməsin məbədimin köksünə naməhrəm əli
Bu əzanlar ki şəhadətləri dinin təməli —
Əbədi yurdumun üstündə mənim inləməli. —

O zaman vəcd ilə min səcdə edər varsa daşım,
Hər cərihamdan, İlahi, boşanıb qanlı yaşım,
Fışqırır ruhi mücərrəd kimi yerdən nəşim,
O zaman yüksələrək ərşə dəyər bəlkə başım!

Dalğalan sən də şəfəqlər kimi ey nazlı hilal!
Olsun artıq tökülən qanlarımın hamsı halal
Əbədiyyən sənə yox, irqimə yox izmihlal:
Haqqıdır hür yaşamış bayrağımın hürriyyət,
Haqqıdır haqqı tapan millətimin istiqlal!

## TƏK HƏQİQƏT

Tək həqiqət var, əvət, bəllədiyim dünyada
Əlli-altmış sənə gəzdimsə də şaşqın-şaşqın.
Həpimiz kəndimizin bağrı yanıq aşiqiyik
Sadə, elanı çəkilməz bu əcaib eşqin.

## ÇOCUQLARA

Nə odunmuş babanız - olmadı bir baltaya sap!
Ona siz bənzəməyin, sonra atəşdir yolunuz.
Meşə halında yaşanmaz, o zamanlar keçdi
Gələn incəlmiş adam dövrü, haman yontulunuz
Amma diqqətli olun: Bir qafanız yontulacaq.
Saqın, aldanmayın: incəlməyə gəlməz qolunuz.

## NOVRUZA

İxtiyar amcanı dinləmirsən oğlum, Novruz
Nə böyük söylə, nə çox söylə, igid işdə gərək.
Lafı bol, qarnı geniş soyları təqlid etmə
Sözü sağlam, özü sağlam ol, irqinə çək!

## RƏSSAM HAQLI

Bir zaman vardı ya tarixi-müqəddəs modası...
Yeni yapdırdığı köşkün böyücük bir odası
Mütləqa əski rəsimlər ilə həp süslənsin
Deyə rəssam aradır xeyli zaman bir zəngin
Biri peyda olaraq "Mən yaparam" der, qolunu
Sıvayıb, axşama varmaz, səkkiz arşın salonu

Suvar, amma nə suvar... Sahibi der: — Usta, bu nə?
Qıp-qızıl bir boya çəkdin odanın hər yerinə!
— Bu rəsim, əsgəri basmaqda ikən Fironun
Qızıl dəniz yarılıb keçməsidir Musanın.
— Hanı Musa, bə adam?
— Çıxmış, əfəndim, qaraya[1]
— Firon harada? — Boğulmuş... Bəs bu qan rəngi boya?
— Qızıl dəniz, ay əfəndim, yaşıl olmaz ya bu da!
— Çox gözəl lövhə imiş, doğrusu, şənləndi oda!..

10.

## ETİRAF

Səfahətimdə, əvət, şer arayan heç bulamaz
Yalınız bir yeri haqqında "Həzin işdə bu!" der
Kufə? Yox. Qəhvə! Xeyir. Xəstə? Deyil. Hankisi var ya?
Üç buçuq nəmzə gömülmüş qoca bir ömrü hədər!

## KƏNDİM ÜÇÜN
(son şeri)

Bu sərilmiş görünən kölgəmə imrənmədəyəm:
Nə səadət? Hanı, ondan belə məhrumam mən.
Daha bir müddət əminəm, bu həyatın yükünü
Dizlərim titrəyərək çəkməyə məhkumam mən.
Cöz də, Ya rəb, yükümün kor düyün olmuş bağını,
Mənə çox görmə nəhayət, bir ovuc torpağını.

# ZİYA GÖYALP
(1876 — 1924)

## TURAN
("Qızıl alma" əsərindən)

Nəbzlərimdə vuran duyğular ki, tarixin
Birərdərin səsidir, mən səhifələrdə deyil,
Güzidə, şanlı, nəcib irqimin uzaq və yaxın
Bütün zəfərlərini qəlbimin təninində,

[1] Qara — sahil, quru

Nəbzlərimdə oxur, anlar, eylərəm təbcil.
Səhifələrdə deyil, çünki Atilla, Çingiz
Zəfərlə irqimi tətvic edən bu nasiyələr
O tozlu çərçivələrdə, o iftira-amiz
Mühit içində görünməkdə kirli, sərməndə.
Fəqət şərəfli nümayan Sezar və İsgəndər!
Nəbzlərimdə, əvət, çünki elm üçün mübhəm
Xaqan Oğuz xanı qəlbim tanır tamamilə,
Damarlarımda yaşar şani-ehtişamiylə.
Oğuz xan! İşdə budur könlümə edən məlhəm:
Vətən nə Türkiyədir Türklərə nə Türkistan,
Vətən — böyük və müəbbəd bir ölkədir: Turan...

# "FÜYUZAT" ŞAİRLƏRİ

## ƏLİ BƏY HÜSEYNZADƏ
## TURAN
(1864 — 1940)



*Azərbaycanın və ümumən Türk dünyasının XX əsrdə ən böyük mütəfəkkirlərindən olan Əli bəy Hüseynzadə Salyanda anadan olmuş, ali təhsilini Rusiyada (Sankt-Peterburqda) və Türkiyədə almış, Bakıda ədəbi və ictimai fəaliyyətə başlamış, sonralar Türkiyəyə köçmüş, burada Turan təxəllüsünü qəbul etmiş və elmi, siyasi, ictimai və ədəbi fəaliyyətini davam etdirmişdir. İstanbulda vəfat etmiş və orada da dəfn edilmişdir. Şərq və Avropa dillərini mükəmməl bilən, ali tibb təhsili alan, ədiblikdən başqa, bir rəssam kimi də tanınan Əli bəy Əlimərdan bəy Topçubaşi, Əhməd bəy Ağayev (Ağaoğlu) ilə birlikdə Bakıda "Kaspi", "Həyat", "Təzə həyat" qəzetlərində çalışmış, "Füyuzat" jurnalını nəşr etmişdir. XX əsrin əvvəllərində Azərbaycan şerinin romantik qanadına mənsub olan şairlər "Füyuzat" jurnalında fəal iştirak etmişlər. Əli bəy istər Azərbaycanda, istərsə də Türkiyədə Türkçülük, Turançılıq ideyalarının banilərindən və ən görkəmli ideoloqlarından olmuşdur. Sonralar Ziya Göyalpın da məfkurəsində təməl prinsiplərdən olan "Türkləşmək, müasirləşmək, islamlaşmaq" ideyasını ilk dəfə Əli bəy Hüseynzadə irəli sürmüşdür.*

*Böyük elmi, fəlsəfi, publisistik irsiylə yanaşı Əli bəy Hüseynzadənin şerləri və şer tərcümələri də var. Onlardan bəzi örnəkləri antologiyamıza daxil edirik. Əli bəyin "Turan" şeri turançılıq ideologiyasının (ülgüsünün) ilk şeri hesab olunur.*

## TURAN

Sizlərsiniz, ey qovmi Macar, bizlərə ihvan
Əcdadımızın müştərəkən mənşəyi Turan.
Bir dindəyiz biz, həpimiz haqpərəstan
Mümkünmü ayırsın bizi İncil ilə Quran?
Çingizləri titrətdi şu afaqı sərasər,
Teymurları hökm etdi şahinşahlara yeksər,
Fatehlərinə keçdi bütün kişvəri qeysər...

## ŞAİR

Yürüdüyün yollar ülgü yoludur,
Tanrısal əslinlə könlün doludur.
Ozan! Gur əzginlə Türklüyü sayra
Ər oğlu özgəni Türk haqqın quludur.

## TİBB DÜNYASINA

Sağlam vücudda sağlam beyin, sinir bulunur,
Sağlam beyində sağlam ağıl, fikir bulunur,
Sağlam fikir qurtarır yurdu xəstəliklərdən,
Hər zəhrə qarşı tibbdə bir padizəhr bulunur.

## HALİ - VƏTƏN

Ucundadır dilimin
Həqiqətin böyüyü.
Nə qoydular deyəlim,
Nə kəsdilər dilimi.

Bilirmisən cühəla
Nə etdilər vətənə.
Nə qoydular uyuya,
Nə qoydular oyana.

Durur belə hərəkət
Rəvamı bir diriyə?
Nə getmədə irəli,
Nə dönmədə geriyə.

Ədu qırar qapıyı
Biz evdə bixəbəriz.
Nə başqa-başqa deriz,
Nə ittihad edəriz.

Ayıltmadı qələmim
Bu türk ilə əcəmi.
Nə qoydular yazayım,
Nə qırdılar qələmi.

***

Zülməti-şər bulsa da bir dəm zəfər,
Pərtövə hökm etsə də zülmət əgər,
Sönsə də ənvari kəmali hünər,
Qəm yemə, səbr et, bu da yahu keçər.

Haqqü ədalətdən əsər yoxsa da,
Xarisi-qanun bir ər yoxsa da,
Zülm edənə qarşı süpər yoxsa da,
Qəm yemə, səbr et, bu da yahu keçər.

Millətə, milliyyətə, hürriyyətə
Aşiq olan uğrasa da möhnətə,
Yarü vətən düşsə də gər qürbətə
Qəm yemə, səbr et, bu da yahu keçər.

## ONA İNAN

Qurtuluş Kamala inanla olur,
Hökumət seçilmiş bakanla olur,
Ünlü kölgəsində ol Atatürkün
Dəyişib yüksəlmə uranla olur.

Ucadır ülgüsü ulu Öndərin,
Diləyi: ölkədə türkcə söylənsin.
Ey Türk ozanları irəli gəlin
Bu işlər bir az da ozanla olur.

Onun göstərdiyi yolla yürürəm,
Önümdə gözəllik, işıq görürəm,
Türkü çağırıram əldə çökürəm
Qutlu Türkəm ona qutanla olur.

Yurdun sevgisiylə olmuşam ozan,
Ara-sıra boylə düzgülər yazan,
Olsun yazım mənim yurda ərməğan
Altındakı Turan Turanla olur.

## ONUN VƏFATI TARİXİ

Söylədi tarixini
Ona tapan bir ozan
Öldü ATATÜRK, o dahi insan
Mukimi-ərşi-Yezdan.

Tənvir eylədi fikri,
Doğru yolu göstərdi:
Kamal əfkar rəhbəri
Neyyuri-ərşi-Rəhman!

Gözələ aşiqidi
Sevgilisiydi Vətən.
İndi o uca Qazi
Qəribi-hüsnü Canan.

## GÖTENİN "FAUST"UNDAN TƏRCÜMƏ

Eyvah ki dünyaları fikrim dolaşırkən
Təqibə nə at var, nə qanad var, nə də yelkən.
Sərbəst uçuşub fövqi-çəmənzaridə quşlar
Elhan ilə ixtar qılarlarsa baharı,
Sevdayi-vətən sevgi ilə eylər isəm
Səhraları, dəryaları, bir durna qatarı,
Şamlı uca dağlar üzərində əzəmətlə
Şahin pərübalın açıb eylərsə təalı,
Yüksəlməyə balalara aləmləri seyrə
Hər fərdi edər zövqi onun hissi xəyalı.

## HOMERDƏN TƏRCÜMƏ

Bilirdi canan Nur olduqca bidar
Qərb əhlinə tale olmayacaq yar.
Bir çarə aradı aqibət buldu
Uyutmağa verdi bir an Bidarı qərar.

Bir axşam aradı buldu Menamı
Menam uyğu verən həkimin namı.
Morfidən müəssər dəvası vardı
Qadirdi təskinə bütün aləmi.

## ABBAS SƏHHƏT
(1874 — 1918)



*Şamaxı şəhərində dünyaya gəlmiş Abbas Səhhət romantik şerimizin görkəmli nümayəndəsi, Şərq, Avropa və rus dillərini mükəmməl bilən və bu dillərdən gözəl tərcümələr edən, uşaqlar üçün dəyərli əsərlər yazan və nəhayət, böyük Sabirin irsini toplayıb nəşr edən ziyalı kimi, şair, tərcüməçi və həkim kimi mədəniyyətimiz tarixində layiqli yer tutur.*

### VƏTƏN

Könlümün sevgili məhbubi mənim,
Vətənimdir, vətənimdir, vətənim.

Vətənim verdi mənə nanü-nəmək,
Vətəni, məncə unutmaq nə demək?

Anadır hər kişiyə öz vətəni,
Bəsləyib sinəsi üstündə onu.

Südüdür kim, dolanıb qanım olub,
O mənim sevgili cananım olub.

Saxlaram gözlərim üstə onu mən,
Ölərəm əldən əgər getsə vətən.

Vətənin neməti nisyan olmaz,
Naxələflər ona qurban olamaz.

Vətən əcdadımızın mədfənidir,
Vətən övladımızın məskənidir.

Vətənin sevməyən insan olmaz,
Olsa ol şəxsdə vicdan olmaz.

### ŞAİR, ŞER PƏRİSİ VƏ ŞƏHƏRLİ
*(İxtisarla)*

*Səfalı bir mayıs axşamı... Günəşin qürubundan bir az sonra saf, laciverdi asimana ucalan qürsiqəmərin əşieyi-simini sakin və müəttər bir meşənin kölgəli*

*ağaclarının arasından süzülərək yaşıl çəmənlərin və ən yaxından axan suyun səthini işıqlandırır: suya ən yaxın bir yerdə şair tək-tənha oturub məhtaba qarşı təmaşayi-təbiət edərkən birdən-birə qalxıb deyir:*

İllər, aylar gəzirəm boş-boşuna, bikarə,
Laübalı yaşayış etdi məni avarə...
Bilmirəm mən nə üçün bülhəvəsəm, binəngəm,
Öz halımdan özüm, allah da bilir, diltəngəm.
Bu gözəl mənzərənin seyrinə dalmaqdan isə,
Təkü tənha bu çəmənzardə qalmaqdan isə,
Daha xoşdur gedib öz dərdimə dərman etsəm,
Qəmi-fərdanı düşünsəm, onu saman etsəm.

*Ayağa durub getmək istədikdə, ildırım təraqələri kimi səslər eşidib ətrafdakılar şairin nəzərində titrər və əhvalı pərişan olur. Bu əsnada yaxınındakı uca dağın təpəsində gözəl bir qız surətində nurani bir kölgə zahir olur. Əlindəki santur deyilən musiqi aləti ilə şairə xitabən:*

Şer pərisi

Şairim! Seyr elə ətrafı, təbiət nə gözəl,
Bax mənim hüsnümə, inşad elə bir dadlı qəzəl.

Kölgə şairə yaxınlaşaraq, əlindəki musiqi alətini təqdim edərək deyir:

Al, bu santurumu çal, gəldi bahar əyyamı,
Nəğmə əyyamı, mey əyyamı, xumar əyyamı.
Öp şirin ləblərimi, guşeyi-əbrulərimi,
Sırma geysulərimi, nərgisi-cadulərimi.
Vəcdə gəl, nəğməsəra olmağa ağaz edəlim,
Gəl bərabər uçalım, göylərə pərvaz edəlim.

Şair

Sevgilim, eşqü həvəsdən daha mən bizaram,
İndi bir başqa dilarama pərəstişkarəm.
Ürəyimdə daha yox qönçə dodaqlar dərdi,
Vardır ev dərdi, qadın dərdi, uşaqlar dərdi.
Biri əkmək, biri başmaq, biri paltar diləyir,
Verdiyi qərzi də hər gündə tələbkar diləyir.
Mən bu halətlə necə bir də olum qafiyəsənc?
Get bir asudə adam tap, daha vermə mənə rənc.
Atmışam mən həvəsi, eşqi, dəxi dilbəri də,
Səni də, şeri də, ilhamı da, dəftərləri də [...]

### Şer pərisi

Şairim? Qəm yemə, aləmi-cəhan fanidir,
Cavidani yaşayış ləzzəti-ruhanidir.
Sən mükafatını insanlığa xidmətdə ara,
Əbədi zövqü, təsəllini həqiqətdə ara.
Kölgəyə aldanaraq sevmə cəfa aləmini,
Yüksəl ülviyyətə, seyr eylə səfa aləmini.
Aləmin fani qüyudatına pabənd olma!
Zəhmətindən usanıb eyşinə xürsənd olma!
Uçma alçaqlara, sən tairi-ülviyyətsən,
Qaç əsarətdən əgər aşiqi-hürriyyətsən.
Sən gərək rahi-həqiqətdə cahandan keçəsən,
Xanimandan keçəsən, baş ilə candan keçəsən.
Şair oldur ki, həqiqətlərə dildadə ola,
Şairin fikri, xəyalı gərək azadə ola.
Gəl mənimlə aparım övci-səmavata səni,
Orada nail edim dürlü füyuzata səni.
Orada könlün əlaiqdən olur varəstə,
Sənə təqdim edər əfvaci-mələk güldəstə.
Orada huri pərilərlə edərsən xəndə,
Bəxtiyarlıqla yaşarsan əbədi fərxəndə.

### Şair

Ey əzizi-dilü can, ey fərəhi-qəlbi-məlul!
Edərəm iştə bu təklifini şükranla qəbul!
Tabeəm indi, sənə nərye aparsan, gedərəm,
Necə ilham edəsən, öylə təğənni edərəm.
Tək cahanın qutarım möhnətü alamından.
Gəlmişəm təngə məlali-səhərü şamından.
Al məni şahpərinin üstə, apar balayə,
Oradan ta ki, həqarətlə baxım dünyayə.
Dilrüba nəğmələrim ruha fərəhbəxş olsun,
Ta sözüm sineyi-ərbabi-dilə nəxş olsun.

*Şair bu sözləri vəcd və istiğraq halında söyləyərək bihuşanə yıxılıb hərəkətsiz qalır. Görünməkdə olan bu səmavi sima nəzərdən qaib olur. Şair aşiqanə bir halda mat-məbhut qalmış ikən şəhərli qiyafəsində bir cavan zahir olub, şairə yaxınlaşıb diqqətlə ona baxdıqdan sonra qərib bir təbəssümlə öz-özünə;*

### Şəhərli

Buna bax, gör necə yatmış burada asudə,
Yazmayır, işləməyir, vaxtı itir bihudə.

Bənzi solğun, halı pozğun, hərəkətsiz, məbhut,
Canlı meyyitmi, deyim, ya ki diri bir tabut?

*Şair onun sözünü eşidərək qapanmış gözlərini açdıqdan sonra durub oturur və deyir:*

Şair

Həm də məcnunsifət, aludeyi-qəm, məsti-qəram,
Bunu da söylə ki, təsvirciyin olsun tam.

Şəhərli

Yaxşı təsvirdir, əvət, söylə, nə halətdir bu?
Ölüsən, ya dirisənmi, nə kəsalətdir bu?

Şair

Düşkünəm çox, nə edim?

Şəhərli

Qalx, kişi, aç bir gözünü.
Bulanar könlü bu halda görən olsa üzünü.

Şair

Di buyur, get!

Şəhərli

Utanırsanmı heç ətvarından?
Xəbərin varmı fəna şiveyi-rəftarından?
Belə ciddi və mühüm vəqtdə ərbabi-hünər
Sən kimi atilü batil oturar yoxsa məgər?
Hər kimin qəlbi, ya vicdanı deyildir satılıq,
Hər kimin daş kimi yoxdur ürəyində qatılıq,
Millətin halını gördükdə gərəkdir yansın,
Dərdinə qalmağı daim özünə borc sansın.
Təb-şerin ki, sənin şöhrət edib dövranə,
Məsiyətdir baxasan bunca qəmə biganə.

Şair

Məndə varmış tutalım, sən dediyin fəzlü hünər,
Mən nə iş yapmalıyammış, ya əlimdən nə gələr?

Şəhərli

Bu nə axmaq danışıqdır, kişi, sən şairsən,
Şil deyilsən ki! Yazıb işləməyə qadirsən.

Tərcüman olmaq üçün giryələrə, xəndələrə,
Salı vermış səni xəllaqi-cahan bəndələrə.
Qalx, oyan, cürət elə, rəd kimi fəryad et!
Bu fəlakətdə qalan millətinə imdad et!
Görməyirsənmi bu biçarə vətəndaşlarını,
Bacı-qardaşlarını, sevgili dindaşlarını —
Zülm zəncirinin altında çəkir işgəncə?
Eybdir sən uyasan gəncəfəyə, şətrəncə.
Gecə bulvarda, klublarda, günüz bağlarda —
İtə vaxtın, bitə ömrün, həp oyuncaqlarda,
Mənfəət verməyi bildikdə, bacardıqda, sənə —
Borc deyilmi edəsən nəfli xidmət vətənə?
Ananın dərdinə övlad şərik olmazmı?
Ananın halı zəxim olsa, oğul solmazmı?
Vətən uğrunda gərək şəxs fədakar olsun,
Boylə mövsümdə yatan kimsələrə ar olsun [...]

Ş a i r

Sözlərin həqdir, əvət, zənn edirəm arifsən,
Lakin əhvali-mühitə yəqin az vaqifsən.
Vətənə, millətə sanma deyiləm dildadə,
Yazmaq olmaz fəqət olmazsa qələm azadə.
Həqqə, namusa, nicata, qələmə and olsun,
Ərşə, fərşə, günəşə, sübhi-dəmə and olsun,
Çox həqiqət mənə təlqin eləyir vicdanım,
Yoxdur ondan birini söyləməyə imkanım.
Danışarkən həqi göydən yetişən buyruqla,
Tıxanıb sözlərim ağzımda qalır yumruqla.
Doğru söz söylədiyim halda məsul oluram,
Çarəsiz nəğmə, qəzəl yazmağa məşğul oluram.
İstərəm qoşmağı, lakin yük ağır, yol da yoxuş,
Necə uçsun qanadı sınmış, əzilmiş bir quş?
Çəkmədən bari-qəmi rişteyi-canım üzülür,
İczdən xuni-cigər yaşlı gözümdən süzülür.
Daha tabavəri-qəm olmadığıyçün ürəyim,
Dərgahi-həqdən odur sonku niyazım, diləyim:
Bizlərə səbr, mətanətli ürək etsin əta,
Ta azıb etməyəlim rahi-məhəbbətdə xəta.

## QUŞLAR

Quşlar, quşlar, a quşlar!
Qaranquşlar, a quşlar!
Cəh-cəh vurun burada,
Gah yerdə, gah yuvada,
Qonun bu tək budağa,
Çox getməyin uzağa.
A quşlarım, getməyin.
Məni qəmgin etməyin.
Quşlar, neçün gedirsiz?
Yoxsa ki, seyr edirsiz?
Quşlar uçdu, əkildi,
Vay, səsləri kəsildi.
Bir səs gəlir uzaqdan,
Mən dinlərəm bayaqdan.
Söylər ki: — Qış yavuqdur,
Sizin yerlər sovuqdur.
Var isticə ölkələr,
Qışda bizə xoş gələr.
Səbr eylə, qoy yaz olsun,
Bir qar, yağış az olsun,
Sovqat gətirər quşlar,
Sizə gözəl mahnılar.

## CÜCƏLƏR

Cücələrim birər-birər,
Suyu görüb yaxın gələr.
İçər, gedər eşələnər.
Yeyər, içər cücələrim,
Doyub qaçar cücələrim.

Cücələrim lümək-lümək,
Qanadları gödək-gödək,
Yem axtarar, tapar yemək.
Yeyər, içər cücələrim,
Doyub qaçar cücələrim.

Gecə dönəndə gündüzə,
Cücələrim gəzə-gəzə,
Səhər hindən qaçar düzə.
Yeyər, içər cücələrim,
Doyub qaçar cücələrim.

Cücələrim bəzəklidir,
Bəzəklidir, düzəklidir,
Sarı, çil-çil, hər rənglidir.
Yeyər, içər cücələrim,
Doyub qaçar cücələrim.

### TƏNBƏL

Çox yatma, dur, a tənbəl!
Yatsan, olar iş əngəl.
Gün dağlara yayıldı,
Hər bir yatan ayıldı.
Yar, yoldaşın səhərlər,
Tez məktəbə gedərlər.
Sən çeştədək yatırsan,
Pal-paltarın atırsan.
Xeyrü şərin qan, oğlum!
Öz halına yan, oğlum!
Bir azca himmət eylə.
Bir azca qeyrət eylə.
Hər kim dilər şad olsun,
Getsin çalışqan olsun.

### AYI VƏ ŞİR

Əlbir olub bir ayı bir şir ilə,
Ovladılar dovşanı tədbir ilə.
Olmadılar razı onu bölməyə,
Çıxdı iş axır ölüb-öldürməyə.
Çeynədilər, dişlədilər, diddilər,
Bir-birini al qana qərq etdilər.
Özlərini taqətdən saldılar,
Hər biri bir səmtə düşüb qaldılar.
Tülkü uzaqdan görüb ol haləti,
Bildi ki, yox heç birinin taqəti.
Gəldi götürdü ovu, etdi fərar,
Həsrət ilə baxdı dalınca bunlar!

## TƏRCÜMƏLƏR

### QAFQAZ

(A. S. Puşkindən)

Qafqaz altımdadır, ən müdhiş olan zirvədə mən,
Tutmuşam tək uçurum, qarlı dağ üstündə qərar.

Qaraquş uçmağa qalxarsa uzaq bir təpədən,
Nə qədər yüksək uçarsa, yenə dövrəmdə uçar.
Buradan mən görürəm çeşmələri qaynamada,
Şübhəli, qorxulu uçqunları ilk oynamada.
Burda məndən aşağı göydə bulut oynaqlar,
Arasından bulutun dağda su qaynar, çağlar.
Görünür onların altında böyük daz qayalar.
Onun altında zəif, cığ, qurumuş kol-kos var.
Daha ondan aşağı rəngi yaşıl ormanlar,
Orda quşlar ötər, ətrafı gəzər ceyranlar.
Sığınıb dağda yapılmış komaya insanlar,
Dırmaşır sərt qayalar üzrə bütün heyvanlar.
Yürüyür dağ aşağı, orda çoban da dərəyə.
İştə məftunlaşır insan bu gözəl mənzərəyə.
Orda kim, daim Arağva çayı qəltan-qəltan,
Çaparaq kölgəli sahillərə eylər cərəyan.

Dar keçid içrə fəqir atlı da pünhan oluyor,
Orda şiddətlə Terek nəhri xüruşan oluyor
Oynayır, cəng eləyir daz qayalarla döyüşür,
Acımış dalğaları, daşları çeynər, ötüşür.
Tömə görmüş qəfəsi-ahən içində san şir
Çırpınır, qürriş edir, sahili guya gəmirir.
Leyk, əfsus! Nə var tömə onunçün, nə sürür,
Onu müdhiş qayalar hər iki yandan sıxıyor!

## GÜN Kİ SƏHƏRLƏR

(M. Qorkidən)

Gün ki səhərlər çıxır, axşam batır,
Əksiləməz zülməti zindanımın.
Sanma ki, bir ləhzə keşikçim yatır,
Fikri qalıb məndə nigəhbanımın!
Hər necə istərsən elə, çək keşik,
Arxayın ol, mən buradan qaçmaram,
İstəyirəm gərçi mən azadəlik,
Zənciri amma bacarıb açmaram.
Ax siz, a zəncir, a zəncirlərim!
Siz də dəmir bəkçisiniz hər zaman,
Sizləri müşküldür açım, sındırım,
Çatladı bağrım, aman allah, aman!..

## MƏHƏMMƏD HADİ
(1879 — 1920)



*XX əsr Azərbaycan şerində romantizm cərəyanının ən qüdrətli nümayəndələrindən biri Məhəmməd Hadidir. Əli bəy Hüseynzadənin "Füyuzat" jurnalının müəlliflərindən olan M. Hadi keşməkeşli və faciəvi sonluqla bitən bir ömür sürmüşdür. Mükəmməl təhsil almağa can atan, lakin buna nail ola bilməyən Hadi öz ardıcıl və inadcıl səyləriylə dərin və geniş əhatəli savada malik ola bilmişdir. O, Türk, Şərq və Avropa ədəbiyyatlarını, fəlsəfəsini dərindən mənimsəmiş və bütün bu təsirləri şerlərində yaradıcı şəkildə əks etdirərək, orijinal şair kimi ədəbiyyat tariximizdə öz layiqli yerini tutmuşdur. Əfsus ki, o dövrün bəzi başqa Azərbaycan və Türkiyə şairləri kimi, M. Hadinin də dilindəki qəliz ifadələr, ərəb-fars sözləri, tərkibləri çağdaş oxucunun bu böyük şairi lazımınca qavramasına, dərk etməsinə müəyyən dərəcədə əngəl törədir.*

### CƏHALƏTİMDƏN ŞİKAYƏT

Varmı bundan yuxarı uçmağa istedadım?
Qabiliyyət pərimə zəxm vurub ustadım.

Oxumaqçün nə qədər dadü fəğan etdimsə,
Olmadı zərrə əsərbəxş şu istimdadım.

Dağa dersən eşidir, sonra verir əksi-səda,
Daşa dönmüşlərə əks eyləmədi fəryadım.

Olmadan naili-didari-əməl qəbrə girər —
Eşqi-şirini-ülum ilə yazıq Fərhadım!

Acizəm tərcümeyi-halımı təhrirə, səbəb?
Doludur təlx həqaiqlə dili-naşadım.

Ey Hadiyi-qəmdidə! de şu bülbüli-zarə:
Cəh-cəh deyib axır düşər ağuşu-məzarə.

## ZÜMZÜMATİ - TƏHƏSSÜRAT, YAXUD QARIŞIQ XƏYALLAR

Fikrim yaşayır məniyi-rənalər içində,
Ruhum uçuyor cənnəti-ülyalər içində.

"Lal ol, demə, qanma, gözünü kur elə" derlər,
Gözlü nasıl ömr eyləsin əmalər içində?!

Mən bir əsərəm, anlamadım kimdi müəssir,
Bir şeri-bəliğəm bu müəmmalər içində.

Girsinmi tənimlə bu həqaiq də məzarə,
Kəşf eyləyəyimmi bu həyulalər içində?

Xaki-siyəhi parladacaq nuri-xəyalım,
Qalmış vətənim leyleyi-zülmalər içində.

Zənn eyləmə şəbtab şu məxluqi-müziyyi,
Parlar gecələr nur kimi səhralar içində.

Azadələrin ruhi-münəvvərləridir kim, —
Şol cism ilə parlar şəbi-yeldalər içində.

Nifrət edərik canlı gəzən bu həşəratə,
İmrari-həyat etmədə tənhalar içində.

Hürriyyəti-vicdan ki, deyirlər adı vardır,
Ol huri dərağuş ki, elə röyalar içində,

Ərz etmədədir kəndini ifriteyi-övham,
Dildari-həqiqət hələ xülyalər içində.

Sərbəst bu gün zülmünü icradə məzalim,
Ərbabi-ədalət hanı? Mənfalər içində!

Övladi-zəman fikricə məhdud bu gündə,
Mən istəyən əhbab isə fərdalar içində!

Təşrih edirəm dillərini çox rüfəqamın,
Bir əhli-səfa yox bu əhibbalər içində.

Mən bir diriyəm, etdi məni dəfn təsadüf —
Zində görünən bir sürü mövtalar içində!

Bilməm ki, nolurdu məni-bədbəxt doğulaydım —
Mehdi-mədəniyyətdəki danalər içində.

Hər kəs sanıyor kəndini pərvərdeyi-daniş,
Ləzzətli ədəb yox bu mürəbbalər içində.

Turşdur, deyəməz hiç kəs ayranına, əmma
Dadsa, der acı şəhdi-müsəffalər içində.

İkmali-kəmal etmədə əqvam, biz, əfsus,
Təzyi ediriz ömrü əlifbalar içində.

Fitrətmi, bəşərmi törədir cəngü cidali?
Dünya yaşayır hərb ilə qövğalər içində.

Meydani-vəqa səhni-püraşubi-təbiət,
Ərbabi-zəfər taqi-müəllalər içində.

Dərdəst edib amalını ərbabi-həqiqət,
Zahid, yaşa övham ilə xülyalər içində!

Ey qəlbiqara, sən oxu əlfazü səvadi,
Nur əhli bu gün lübb ilə mənalər içində.

İmzasını qoymuş miləl övraqi-həyatə,
Yox millətimin xətti bu imzalər içində!

"Qumu..." səsi iyqaz edir əbnayi-cəhani,
Millət hələ xabidə bu zövzalər içində.

Bir nəcm deyildirmi cahani-bəşəriyyət —
Bunca kürəviyyat ilə dünyalər içində?

Bir zərrə deyildirmi bu səyyareyi-aləm —
Şu cəvvi-vələhzadəki şəmsalər içində?

Milyonla kəvakib gəzir emaqi-fəzadə,
Milyard cahan var bu müsəmmalər içində.

Xilqət doğuyor, leyk durur hüsn əzəldə,
Varmı belə bir xariqə hüsnalər içində?

Ey madəri-aləm, bu nə heyrətli sərair,
Sən şadmısan bir belə hüblalər içində?

Aya, nədir ol cazibeyi-hüsnü məlahət,
Qaynar, daşıyor dideyi-şəhlalər içində?

Şol yar, qucağında yaşar zövqü səfanın,
Könlüm yanıyor eşq ilə sevdalər içində!

Zülm eyləmədən xoşlanıyorsanmı, ey afət?
Yox sən kimi qəddar dilaralər içində.

İç, iç nə qədər istərisən qanımı, zalim,
Bir gün görərəm qanını səhbalər içində!

Gülçöhrələrin ləbləri, rüxsarıdır ol kim, —
Şimdi içilir, sağəri-minalər içində.

Məhzun təbəssümlər edir nərgizi-məxmur,
Cəzzab nigəhlərdir o məralər içində.

Qəbrimdə açan gülləri seyr et, a şükufəm!
Könlüm dağıdır laleyi-həmralar içində.

Qəlbimdən uçar qəlbinə bir buyi-təhəssür,
Etmə məni məhcub şu mövtalər içində.

Bir fatiheyi-nazini fırlat da, güzar et,
Ehya elə, ruhum, məni həmtalər içində.

Vardır şu yatan kimsələrin fatihəxani,
Mən kimsəsizəm xaki-siyəhzalər içində.

## DAD İSTİBDADDAN!

Qaldıq əlində bir sürü ərbabi-vəhşətin,
Olduq əsiri pənceyi-qəhrü müsibətin!

Hər səmtdən atılmadadır tiri-cangüdaz,
Yoxdur önün alan bu xəndəgi-fəlakətin!..

"Ləyəsəl"in məalına meydan olub vətən,
Keyfi idarələrdə nə karı ədalətin?!

Hər yerdə eyləyir sitəm icra hökmünü,
İştə budur nizami kilabi-dənaətin!

Hər kəs nə bilsə etsin, əvət... kimsə dinməsin,
Məmnu, dur denilməsi sidqin, həqiqətin.

Ehraq olundu zülm ilə nazəndə şəhrlər,
Yaxmaqdadır cahanları ahi cəmaətin.

Bari-girani-zəhmətə yox səbri qulların,
Yarəb, nədir bu rütbə təhəmmüldə hikmətin?

Qan ağlayır əhali, könüllər cərihədar,
Gülməzmi, ey xuda, yenə rüxsari-rəhmətin?

Hər kimsə öz mənafeyi-şəxsiyyəsin arar,
Əshabi-fəqr olmada qurbanı xillətin.

Minlərcə binəva quru yerlərdə can verir,
Beş-on ləim naili dəryayi-nemətin.

Hər kəs gərək bərabər ola hər hüquqda,
Ehsanıdır bu ərz bizə dəsti-qüdrətin.

Mənsux olunsa qaideyi-keyfəmayəşa,
Tərtil edilsə ayəsi şurayi-ümmətin.

Kəsbi-səadət eyləriz, azadi-qəm olub,
Məsudluqla ömr edər əfradı millətin.

Qəti-ümid etməyərək kuşiş eyləyin,
Eylər cibalı qəlhümməti ərbabi-qeyrətin.

Həmdəsti-ittifaq, olunuz, ey rəfiqlər!
Birlikdə fəth olur sizə babi səadətin.

Xabi-nifaq saldı bizi bu səfalətə,
Məhkum qıldı cümləmizi qeydi-möhnətə.

## GÖZLƏRİN

Qıldı, ey ahu, məni vəhşi qəzali gözlərin,
Etdi səhragərdi-cənnət laübali gözlərin.

Xanəbərduş eylədin zülfün kimi aşüftəni,
Qıldı dil cəmiyyətin məhv ol bəlalı gözlərin.

Taleim bənzərkən, ey afət, səbahi-hüsnünə,
Eylədi halın kimi Şami Bilalı gözlərin.

Çeşmi-əfsunpərvərində vardır istedadi-cəzb,
Dilrübadır, dilrüba, əfsunla mali gözlərin.

Etsə də tənzir, xovfum yox, məni şami-fəraq,
Daima təbşir edir sübhi-visalı gözlərin.

Dideyi-səhharının vardır iki xasiyyəti,
Gah səlbü gab cəlb eylər məlalı gözlərin.

Bunca kim, əhli-niyazə nazü istiğna satar,
Ədlgahi-həqdə verməzmi sualı gözlərin?

Abidi-məscidnişini eylədin sağərbədəst,
Eyləyir təhmil üşşaqə vəbalı gözlərin.

Məncə məchul idi hala rəmzi-"əvcüd, vəqtərib",
Bəndənə məlum qıldı bu məalı gözlərin.

Anlamazdım mən nədir dərd içrə əfvaci-xəyal,
Eylədi rövşən, həqiqət, bu xəyalı gözlərin.

Hər zaman qılsam nəzər ayineyi-nəzzarənə,
Pişi-çeşmə ərz edər ol məhcəmalı gözlərin.

Dideyi-xunbarımı gördükdə xab eylər fərar,
Sübhü ərz etməkdə, mahim, ol ləyali gözlərin

İnqilab ərbabı görsün çöhreyi-gülrəngini,
Onlara ifham edər tərzi-qitalı gözlərin.

İnqilabiyyun olur həp zövqyabi-inqilab,
Onlara bəxş etdimi zövqi-cidalı gözlərin.

Sanma eylər xovf Hadi tiği-istibdaddən,
Çoxdan etmiş qətl onu yarim, qitali gözlərin.

## BİZ HƏQİQƏTƏ GÜLÜRÜK, HƏQİQƏT BİZƏ AĞLAYIR

Həqiqəti görürüz biz xəyal şəklində,
Hidayəti oxuruz hər zəlal şəklində.

Süturi-nur ilə məstur ikən kitabi-həyat,
Üyuni-ümmətə çarpar zilal şəklində.

Miləl gözündə mələkçöhrədir bənati-həyat,
Bizə nasıl görünür pirəzal şəklində!..

Bu gülşən içrə çıxar sədhəzar mənbəyi-nur,
Nikahımızda kəsilmiş ləyal şəklində.

Əlində sağəri-şadi, qolunda huri-əməl,
Məsərrət əhlinə bax infial şəklində!

Hüzuzbəxşi-üməmdir bu naşvəgahi-sürur,
Kəsildi bizlərə darülməlal şəklində.

Səlibi-şəşəəpaşi-zəfər görəndə derəm:
Zəvali-millət seyr et hilal şəklində.

Zülamü vəhşətə məğruq olub da qaldıq, ah.
Şu çöhreyi-mədəniyyətdə xal şəklində.

Süxənvəran oxuyur atəşin təranələri,
Bizi bu bağdə kim qoydu lal şəklində?

Yetişdi, dəydi səmərlər şümusi-hikmətlə,
Bizi "müəllimimiz" qoydu kal şəklində!..

Bax ol "rəisə" ki, minbərnişini-nəxvətdir!
Görür nəvaqisin əmma kəmal şəklində.

## MƏN BİR KİTABƏM

Mən bir kitab, hər vərəqim min kitabdır,
Ayati-məhkəmati bütün inqilabdır.

Qılsın mütaliə məni ərbabi-inqilab,
Görsün bu ayələrlə nasıl feyziyabdır!

Sönmüş həvasə şölə verir nuri-fikrətim,
Ruhum füyuzpərvər olan afitabdır.

Olmuş vətən qünudə ləyali-cəhalətə,
Zülmatə qarşı mərifətim mahtabdır.
Hürriyyət ilə etməli məmur milləti,
Yanım, əsarət ilə vətən pək xərabdır.

Tiği-məzalim ilə əvalim cərihədar,
Ey ədl, sürət eylə, zəmani-şitabdır!

Əshabi-zülm ziynətidir təxti-rahətin,
Məzlumlar dilim kimi püriztirabdır.

Bax, bax, şu hurə, qoynuna girmiş səfalərin!
Dildadeyi-cəmalı düçari-əzabdır.

Ağuşuma atılma, a zalim, dayan, dayan!
Son xabigahın iştə kənari-türabdır.

Aldanma rəngü buyinə gülbərgi-hüsnünün,
Beş gün sürər də, sonrası bibuyi-tabdır.

Çox süzdü gözlərim bu riyazi-təbiəti,
Hər qönçənin təravəti mürrəssəhabdır.

Gəl müstəfid olaq, mələkim, gəl, həyatdan,
Hər dəmdə istifadə edən kamiyabdır.

Şeyxüxətin şitasi gəlir, qafil olma kim,
Fürsət zəmani iştə bəhari-şəbabdır!

Yoxsa başında kövsərü huri həvası var?
Olsun nəticəbəxş, nə ləzzətli xabdır?

Tihi-xəyal içində şitaban olan səfil!
Yortma! O parlayan su deyildir, sərabdır.

Sun badeyi-məhəbbəti hürriyyət eşqinə.
İnsanə intibah verən bu şərabdır.

Çıx, çıx məzardan, ərəsati-həyatə gəl!
"İqrə kitabəkə"... bu ki yövmil-hesabdır.

Zülmətpəsəndlər giriyorlar cəhənnəmə,
Rövşəndilani-elm behiştiməabdır.

Əsfəllərə tənəzzülü şayistə görməyən —
İnsanə afərin, necə alicənabdır!

Elm əhlidir cahanda səzavari-iltifat,
Cahil həmişə məzhəri-qəhrü itabdır.

Cahil sənə edərsə cəhulanə bir xitab,
Mənalı bir sükut ona əla cavabdır!

Şeytani-cəhli yaxmağa əflaki-elmdən —
Bu xaki-tirənakə yağanlar şəhabdır.

İnsanları birər ediyor əsr imtahan,
Bu dövrü-irtiqa, məhəki-intixabdır.

Çıxdı niqabdan o həqiqət çiçəkləri,
Millət xəyalət ilə hələ dərhicabdır.

## NASIL YÜKSƏLMƏLİ?

*(Böyük Tofiq Fikrətə kiçik töhfə)*

Yüksəlməli, toxunmalı alnın səmalərə,
Doymaz bəşər dedikləri qoş etilalərə

**Tofiq Fikrət**

Yüksəlməli! Fəqət nə ilə, ey böyük ədib?
Ey bağını xəzan görərək susmuş əndəlib!

Hürriyyətin qanadları lazımdır uçmağa,
Yüksəkdən enməyən mədəni yarı qucmağa.

Yüksəlməyə təməddünün əflaki-pakinə,
Ermək gərək isə səhəri-tabnakinə.

Sərbəst pərlər istəyir ol aləmi-bülənd,
Bizlərsə hər cəhətdən, əvət, bəndi-dərkəmənd.

Əfkarımız əsiri-xürafati-əvvəlin,
Azadədir də cəhlimiz, ey şairi-güzin!

Övham hürr, hakimi-mütləq bu millətə
Ey nəbzaşina, nə dəva var bu illətə?

Nəbzaşina təbibi də sevməz əcəl-qərin,
Gəlməkdədir məşamına pis buyi-ənbərin.

Çünki məşamı dust deyil buyi-ənbərə,
Korkən belə uzatmayır əl gözlü rəhbərə.

Kor rəhbər istəyir gözükor, ah, ah, ah!
Bədbəxt bilməyir ki, yolunda dəhani-çah.

Yol göstərənləri qovuyor gümrəi-səfil — Səbəb?
Çox əsrlər qaranlıq olubdur buna dəlil.

Çox əsrdir ki, gözləri olmuş şəbaşina,
İndi qaranlığı sanıyor sübhi-rövşəna.

Hansı əlacdır ki, kor etdi bu milləti?
Hala bilən də olmadımı bu həqiqəti?

Bilməm nə gündə bir anamız böylə bir həyat —
Doğsun ki, ölsün iştə bu Şərqi udan məmat.

Yəni ki, bir dühayi-xüruşanü atəşin,
Yumşalsın odlarilə bu cəmiyyəti-xəşin.

Artıq yetər, yetər, yetər oldu bu halımız,
Xurşid pək sönük, sönük iştə hilalımız.

Alçalmağa bizdə var ikən bu ibtila —
Bilməm, nasıl müyəssər olur Şərqə etila?!

Alçalmağa rəhbər olanlar səmaməqam,
İrşadkar bu qövmcə şayani-intiqam.

Fikrət, əya Şərqdə yekta doğan düha!
İdealı yox bu millətə varmı rəhi-rəha?

Əfkarı sırf əzməyə ərbabi-fikrəti,
Hala zavallı bilmədi qanuni-fitrəti.

Elani-hərb edən bu qəvanini-aləmə,
Dəvətlidir bu ağladıcı bəzmi-matəmə.

Gəlsin əzayə milləti-mərhumə, ağlasın,
Heç gülməsin, də ayları matəmli saxlasın.

Zatən də matəmə bürünübdür həyatımız,
Göz yaşlarilə həp sulanır kainatımız.

Qərbin üzündə xəndə, bizim çeşmimizdə ab,
Qərbin həyatı şən də, bizimki yazıq, xərab!

# ABDULLA ŞAİQ
(1881 — 1959)



*Abdulla Şaiq Talıbzadə görkəmli şair, nasir, dramaturq, pedaqoq, ədəbiyyatşünasdır. Gənclik illərində ədəbiyyatımızın romantik cərəyanına mənsub olan, müstəqil Azərbaycan Xalq Cümhuriyyəti (1918-1920) dövründə milli-vətənpərvərlik ruhunda əsərlər yazan A. Şaiqin "İntizar qarşısında" şeri türk əsgərinin Azərbaycanda həsrət və ümidlə gözlənilməsinin poetik əksidir. Sovet dövründə A. Şaiq əsasən uşaqlar üçün dəyərli əsərlər yaratmışdır. Şairin oğlu, ədəbiyyatşünas-alim Kamal Talıbzadə atasının arxivindən müəllifin gizlidə saxladığı bir neçə şerini tapıb çap etdirmişdir. Stalin repressiyaları dövründə yazılmış bu şerlərdə istibdada, zülmə qarşı kəskin etiraz ifadə olunmuşdur. Həmin şerlərdən ikisini antologiyamıza daxil edirik.*

## İNTİZAR QARŞISINDA

Neçin boylə gecikdin?
Sənsiz qəlbim qırıq, sönük, çeynənmiş, xırpalanmış,
Ömür şüşəm daşa dəymiş, həyatım parçalanmış.
Qırıq bir saz kimi sızlar qanlı, yorğun telləri,
Yaxılar da, yaxar da bütün qayğı vurmuş elləri.
Şu vətənin öksüzləri, gəlinləri, dulları,
Göz yaşıyla sulamış həp keçdiyiniz yolları.
Yolunuzu bəkləməkdən bənizləri sararmış,
Heç gəlmədin. O şən, gülər ürəkləri qəm almış,
Sən gəlməsən, dolumsanmış ürəklər heç şad olmaz,
Sən gəlməsən, xərabəyə dönən qəlb abad olmaz,
Sən gəlməsən, günəş doğmaz, ümid gülüm açılmaz,
Dodaqlarım gülməz, sönük baxtıma nur saçılmaz.
Başqasını istəməm də, ey türk çabuk sən gəl, sən,
Bəkləməkdən yoruldum, eh, iştə gec qaldın, nədən?
Yollarına daşmı qalanmış? Ya azğın quldurlar

Burakmıyor? Daş, dəmir, polad ya tunc olsa da onlar
Ürəyində şölənənən mətin, qızğın atəşlə,
Yax onları, ərit, söndür, çeynə, boğ, əz, xırpala,
Xain, alçaq düşmənlərə qol gücünü həp göstər
Aç qollarını, çabuk gəl ki, qəlbim səni pək istər.

## MARŞ

*Türk ədəmi-mərkəziyyət firqəsi "Müsavat"a ithaf*

Birləşəlim türk oğlu, bu yol millət yoludur
Ünlə, zəfərlə, şanla tariximiz doludur.
Yürüyəlim irəli, haydı, millət əsgəri,
Keçmişimiz şan, zəfər, durmayalım biz geri,
Yıldırımlı gözünüz qan ağladır düşmənə,
Qorxaq, alçaq, xainin bu meydanda işi nə?
Dəniz kimi coşalım, dalğa kimi qoşalım,
Altun ordu, irəli! Dağlar, daşlar aşalım!
Türk qafasında qorxu yuvalamaz düşmənim
Həp dəmirdən yapılmış ruhum, qəlbim, bədənim.
Süngümüzün ucundan damar qətrə-qətrə qan,
Hürriyyətdən, vətəndən ölüncə keçməm, düşman!
Dalğalanır üstümdə şanlı Turan bayrağı,
Alovlanır qəlbimdə "Ərkənəqon" ocağı.
Haydı, yola çıxalım, haqsızlığı yıxalım,
Turanda gün doğunca zülmətlə çarpışalım!
Arş irəli, irəldə cənnət kimi cahan var,
Günəş orda həp doğar, səadət orda parlar.
Türk firqəsi Müsavat, açalım quş tək qanad,
Sarılıb hürriyyətə, bulalım şanlı həyat.

## İYİRMİNCİ ƏSRƏ XİTAB

Məzlumların ümidisən ey əsri-pürxətər!
İzlər böyük addımlarını bir sürü bəşər.
Tufanlı ildırımların qəhrü hiddəti
Xoflu ümid ilə yaşadır cümlə milləti.
Qaldır buludlu pərdələri, anlasın cahan:
Sönməz günəşmi, ya qara bir kölgədir doğan?
Varmı ümid bir daha feyzi-səadətə?
Ya çəkmədə bizi yenə girdabi-zillətə?

Al qırmızı şəfəqlər içində nihan, nihan,
Doğmazmı nur, mehrü məhəbbət cahan, cahan?
Bilməm şu ildırımlı, məhəbbətli fırtına,
Öksüz şu milləti çıxarırmı bir yana?

## HÜRRİYYƏT PƏRİSİNƏ

Söndün nə çapuq, ruhuma səfvət verən ey nur!
Ümmidi-vüsalınla sənin mən yaşıyordum.
Sevginlə şu daşqın dərələrdən aşıyordum,
Hicrin məni ah, etdi yenə qəmzədə rəncur.
Çırpındıyor qəlbimi ağzımda bir ahəng,
Vulkan kimi püskürmədə ətrafə şərarə,
Nolmuş, yaxıyorsun məni ah, ey dili-parə?!
Tutmuşmu fəzayı şu vərəmlər sənə də təng?
Müzlüm gecə, ətrafı buludlar qapayırkən,
Göz yaşlarımın bəslədiyi, ey gözəl ümmid!
Qarşımda təcəssüm edərək ver mənə təyid,
Şu zülmət ilə sübhə qədər çarpışayım mən.

## HƏPİMİZ BİR GÜNƏŞİN ZƏRRƏSİYİZ!

Əsrlərdən bəri zülmə alışan
Qan içən, qan qusan, ey şər insan!
Aldımı qəlbinizi qəsvəti-şum!
Yaxdımı ruhunuzu badi-səmum?
Görünürmü sizə xoş qanlı həyat?
Unudulmuş bəşəriyyət, heyhat!
Həpimiz bir yuva pərvərdəsiyiz!
Həpimiz bir günəşin zərrəsiyiz!

## DAĞLAR SULTANI

Dan atınca xoruz, beçələr banlar:
Dağ-dərədən çəkilməmiş dumanlar,
Sürüsünü yayar dağa çobanlar,
Təbiətin zövqünü onlar anlar:

Bu yerlərin sultanıdır çobanlar,
Həm bəyidir, həm xanıdır çobanlar.

Gözəl olur bu yerlərin səhəri,
Məncə vardır dünyalarca dəyəri,
Quşlar oxur, səba açar gülləri,
Alır başqa bir lətafət hər yeri.

Bu yerlərin sultanıdır çobanlar,
Həm bəyidir, həm xanıdır çobanlar.

Günəş yaxın dağlar ucundan doğar,
Buludları gözəl rənglərlə boyar,
Dumanları dağlara doğru qovar,
Hər tərəfi bir gözəllik qucaqlar.

Bu yerlərin sultanıdır çobanlar,
Həm bəyidir, həm xanıdır çobanlar.

Gözəl olur bizim elin yaylağı,
Gül çiçəkdir bu yerlərin otlağı,
Bir cənnətə bənzəyir hər bucağı,
Durna gözü kimi vardır bulağı.

Bu yerlərin sultanıdır çobanlar,
Həm bəyidir, həm xanıdır çobanlar.

Mal qapıya gələndə axşam, səhər,
Qoyun mələr, quzu mələr, dağ mələr;
Səsə, küyə düşər köpəklər hürər,
Dərə, dağ, daş həzin-həzin səs verər.

Bu yerlərin sultanıdır çobanlar,
Həm bəyidir, həm xanıdır çobanlar.

Hara baxsan çölə, yamaca, dağa,
Çoban görərsən söykənib çomağa,
Qoymaz gözdən sürüsünü irağa,
Bu sürüyə həm nökərdir, həm ağa.

Bu yerlərin sultanıdır çobanlar,
Həm bəyidir, həm xanıdır çobanlar.

Çomaq əldə dolaşır dağı, daşı,
Qoyun, quzu, köpək, tütək yoldaşı,
Azacıqdır aşı, ağrımaz başı,
Bu xoş bəxtə hər nə desən yaraşır.

Bu yerlərin sultanıdır çobanlar,
Həm bəyidir, həm xanıdır çobanlar.

Sərin-sərin bulaqlardan su içər,
Kəsər, yeyər, kök quzulardan seçər,

Ömrü belə gözəl yerlərdən keçər,
Ot, çiçəklər solunca durmaz, köçər.

Bu yerlərin sultanıdır çobanlar,
Həm bəyidir, həm xanıdır çobanlar.

Dünya malından var: sicim, çatısı,
Patavası, çuxası, həm qartısı,
Bir də qumral gözlü nazlı Fatısı,
Oxuduqca ürək dələr bayatısı.

Bu yerlərin sultanıdır çobanlar,
Həm bəyidir, həm xanıdır çobanlar.

## HEY XƏYANƏTLƏ OYNAYAN KÖLGƏ

Hey xəyanətlə oynayan kölgə,
Dolaşır şübhəli qiyafətlə,
Sürünür izlərində qanlı ləkə,
Oynayır ən sevimli afətlə,
Dağıdır hər yana ölüm rəngi,
Göy də təqlid edir bu ahəngi,
Yenə dəhşətlə sarsılır afaq,
Mehvərindənmi oynamış bu cahan?!
Yenə qan fışqırır dəniz, torpaq,
Bağlıdır dil, fikir, qələm, vicdan.
Damğalanmış ağıl, düşüncə, ürək,
Sehr, tilsimlə oynayır bu fələk.
Yenə hər yanda qorxu, kin, heycan,
Yenə təhkimçilik, yenə zəncir.
Yenə qırğın, talan, soyuq zindan,
Söylə bu macəra, bu fitnə nədir?
Həm də bu xislətinlə sən kimsən?
Ki bu azadə yurda hakimsən?
Saçma kin toxumu bu torpaqda
Ey inadla qürur satan sərxoş.
Nə hünər var yıxıb dağıtmaqda,
Səndə insan təbiəti yoxmuş.
Vətənim inləyir o pəncəndə.
Yırtıcı iştəhası var səndə.

## BU QÜRURLU BOYUN BURULMAZMI?

Bu qürurlu boyun burulmazmı?
Bu bulanıq sular durulmazmı?
Söylə, ey kinli, qan içən xain,
Zülmə, səbrə nəhayət olmazmı?
Şam ki, pərvanəni yaxar, özü də,
Öz odunda yanıb kül olmazmı?
Ey arı, səndə yox laçın qanadı,
Bu fəzalarda o yorulmazmı?
Üzgüçü olmayan dərin dənizə
Girsə, ey "qəhrəman", boğulmazmı?
Kin ilə çapdığın zülüm atına
Bir çidarlı yüyən vurulmazmı?
Gecə-gündüz axan bu al qanlar
Dəniz olsa, yenə soğulmazmı?
Bir zaman haqq-hesab çəkərkən el,
Bu cinayətlərin sorulmazmı?
Verdiyin bu cəzalara qarşı
Sənə də məhkəmə qurulmazmı?
Bu qoyun cildinə girən qurdun,
Fitnəsi, hiyləsi duyulmazmı?
Bu qədər leş yeyən dərə, uçurum,
İntiqam nərəsiylə dolmazmı?
Kim itirmiş mənim itirdiyimi?
Bu "xəzan" yoldu hər bitirdiyimi.

# UŞAQLAR ÜÇÜN ŞERLƏR

## XORUZ

Ay pipiyi qan xoruz,
Gözləri mərcan xoruz,
Sən nə tezdən durursan,
Qışqırıb banlayırsan
Qoymayırsan yatmağa,
Ay canım məstan xoruz!

## KEÇİ

Ala-bula, boz keçi,
Ay qoşa buynuz keçi,
Yalqız gəzib dolanma
Dağa-daşa dırmanma,

Bir qurd çıxsa qarşına,
Sən nə edərsən ona?
Çoban açınca gözün
Qalar iki buynuzun.

## UŞAQ VƏ DOVŞAN

U ş a q

— Dovşan, dovşan, a dovşan!
Qaçma, dayan, a dovşan!
Qaçma səni sevəndən,
Can kimi istəyəndən.

D o v ş a n

— Dayanmaram, a qardaş!
Yanında var alabaş.
Xəbərdaram işindən,
Qurtarmaram dişindən.

## YETİM CÜCƏ

Ay kiçicik soluq cücəm.
Boynu buruq, yoluq cücəm.
Açma o sarı dimdiyin,
Başlama qəmli cik-ciyin.
Tək gəzinib sıxılma çox,
Ağlayıb nalə qılma çox
Qəm yemə, sus, bir az dayan,
Mən olaram sənin anan.
Səni o səslə səslərəm,
Dən, su verib də bəslərəm
Ağlama, ağlama, cücəm,
Qəlbimi dağlama, cücəm.

## HÜSEYN CAVİD
(1882 — 1941)



*Türk dünyasının müqtədir sənətkarı, Azərbaycan ədəbiyyatında ilk mənzum pyeslərin müəllifi, böyük dramaturq, şair Hüseyn Cavid Naxçıvanda doğulmuş, Türkiyədə təhsil almış, 1937-ci ildə repressiyaların qurbanı olmuş, Sibirə sürgün edilmişdir. Heydər Əliyevin şəxsi təşəbbüsüylə Sibirdə məzarı tapılmış, nəşi Azərbaycana gətirilərək Naxçıvanda dəfn edilmiş, üzərində möhtəşəm məqbərə ucaldılmışdır. Romantik ruhda lirik və fəlsəfi şerləri, "Azər" poeması, teatrımız tarixində müstəsna yeri olan səhnə əsərləri ("Şeyx Sənan", "İblis", "Səyavuş", "Peyğəmbər", "Topal Teymur", "Afət", "Xəyyam", "Ana" və b.) Hüseyn Cavidi ədəbiyyatımızın ən böyük klassiklərindən biri kimi şöhrətləndirmişdir.*

*Tarixi mövzularda yazdığı faciələrdə Cavid Şərq taleyinin müxtəlif ciddi problemlərini qaldırır, türkçülük ideyalarını təbliğ edir, ümumbəşəri məsələləri yüksək humanizm mövqeyindən işıqlandırır. "Kəssə hər kimsə ki, qan izini, Qurtaran dahi odur yer üzünü" tarixə Cavid baxışının yığcam ifadəsidir.*

## ÇİÇƏK SEVGİSİ

*Ədibi-möhtərəm Əlibəy Hüseynzadəyə*

Sevimli, nəşəli dörd-beş yaşında sarışın,
Mələk baxışlı, gözəl bir qız iştə oynayaraq
Qoşardı baxçada... bir şey görüb də etdi maraq:
— Əfəndim, anneciyim! Şöylə saçdığın nə?
— Saqın,
Quzum, ayaqlama! Bunlar çiçək toxumlarıdır.
Səninçin iştə bir az sonra pəmbə, mavi, sarı

Gözəl çiçəklər açar həpsi. Anladınmı?

— Xayır.
Xayır, mən onları sevməm. Mənimki pək ayrı,
Bu yanda, bax bu kiçik yerdə ayrı olmalıdır.
— Pəki, mələk çocuğum, hər toxumdan al da bir az,
Bəyəndiyin yerə saç... Kəndin iştə qönçeyi-naz!..
Çocuqcığaz gülərək həp birər-birər ayırır,
Bu çox gözəl, bu nasıl? — der, saçardı həpsindən,
O imdi bir kələbək... hoplayır sevincindən.
Bu vəqədən azacıq bir zaman keçib getdi...
Gülümsəməkdə ikən şəms, o növərusi bahar,
Təbəssüm etməyə üz tutdu büsbütün əzhar,
Sarıb da baxçayı həp rəngə, nura qərq etdi.
Fəqət o nazlı mələk nərdə?!

— İndi yapyalnız,
Dərin bir uyquya dalmış məzar içində o qız!

## BİR RƏSM QARŞISINDA

Həzin bir çöhrə, bayğın bir nəzər, suzişli bir mənzərə.
Geniş bir cəbhə, ülvi bir zəka, düşküncə bir sima.
Əvət, düşküncə bir sima; fəqət pək nazlı, ipək dilbər...
Mənim ən sevdiyim bir lövhə, bir təsviri-pürmənа,

O dalğın gözlərə baxdıqca ruhum eylər istela,
O gözlər hər baxışda fikrə yüz min rəmz edər ima.

O lahuti baxışlar çox dərin, çox heyrətəfzadır,
Nə hikmətlər arar bilməm ki, əlvahi-təbiətdən?
O solğun çöhrədə bir nuri-səfvət var ki, çox nadir...
O, məncə, mürtəsəm bir lövhədir rəngi-həqiqətdən.

Məhəbbət, ya səmimiyyət təcəssüm etsə aləmdə,
Təcəlli eylər ancaq böylə bir ruhi- mücəssəmdə.

Nə küsgün bir nəzər, ya rəb? Nə məsumanə bir surət!
Nə düşgün bir sehr, ya rəb? Nə məzlumanə bir fitrət!
Gülərmi, bilməm ağlarmı? Bütün əczimlə heyranam,
Fəqət bir nazənin sima ki, təqdisə şitabanam.

Silinməz lövhi-qəlbimdən o nəqşi-nazənin, ölsəm;
Ona ruhumla, vicdanımla məftunam. Neçin?
Bilməm!

## QADIN

Qadın! Ey sevgili həmşirə, oyan!
Ana! Ey nazlı qadın, qalx! Uyuyan
Daima mövtlə həmduş oluyor,
Zillü möhnətlə həmağuş oluyor.
İştə sıyrılmada həp zülmətlər!..
Ağarır, dan yeri, qalx, iştə səhər!..
Oyan, ətrafını seyr et də, düşün!
Bütün övladi-vətən iştə bu gün
Yalınız səndən umar sədrə şəfa,
Yalınız səndə bular ruha qida.
Ana övladını bəslər, böyüdür,
Anasız millət, əvət, öksüzdür.
Sənin aləmdə vəzifən, hissən
Nə böyük, həm nə ağırdır, bilsən?!

Qadın! Ey sevgili, şəfqətli mələk!
Bu qədər səbrü təhəmmül nə demək?
O lətafət, o nəcabətlə sana,
Bu əsarət, bu həqarət nə rəva!?
Sən nəsən?.. Kəndini bil, zəfi burax!
Həp nəsibinmi sənin sillə, dayaq?
Çəkmə ah, eylə mükəddər, məhzun,
Ağla göz yaşların axsın, coşsun!
Ağla, fəryadını duysun ərlər,
Bəlkə insafa gəlib rəhm edələr.
"Ağla, həp ağla!" dedim, çox yanılış...
Çınlasın, mövcələnib yüksəlsin,
O səsin qüvvəti, təsiri böyük...
Ağla, ta lərzəyə gəlsin yer, gög.

Bax, bax insan nə qədər aldanıyor?
Xayır, əsla məni sən dinləmə, dur!
"Ağla, həp ağla!" dedim, çox yanılış.
Ağlamaqdan nə çıxar sanki! Çalış!
Oluyor iştə hüququn pamal,
Çalış, öyrən, ara, bul, haqqını al!
Pərdeyi-zülmət içindən sıyrıl!
Qəhrəmanlar kimi qovğaya atıl!
Fəzlü ürfanlar mücəhhəz olaraq
Cəhli yıx, qəfləti yax, əczi burax!
Kimsədən gözləmə yardım əsla;
Yalınız kəndinə kəndin ağla!

## MƏNİM TANRIM...

Hər qulun cahanda bir pənahı var,
Hər həli-halın bir qibləgahı var,
Hər kəsin bir eşqi, bir allahı var,
Mənim tanrım gözəllikdir, sevgidir.

Gözəl sevimlidir, cəllad olsa da;
Sevgi xoşdur, sonu fəryad olsa da;
Uğrunda mənliyim bərbad olsa da,
Son dildarım gözəllikdir, sevgidir.

Gözəlsiz bir gülşən zindanə bənzər,
Sevgisiz bir başda əqrəblər gəzər,
Nə görsəm, hanki bəzmə etsəm güzər,
Həp duyduğum gözəllikdir, sevgidir.

## HƏRB İLAHİ QARŞISINDA

Ey odlu şəhpərilə saçan zəhri-intiqam!
Ey hərb ilahi! Ey sırıtan kinli əjdaha!
Oldunsa bunca qəhrü fəlakətlə şadkam,
Artıq bitir bu səhnəyi, ey müftəris dəha!
Endir bu qanlı pərdəyi, ey rəhnümayi-şər.
Endir də bir qədər nəfəs alsın bəni-bəşər.

Sarmış bütün cahanı həyahuyi-dəhşətin:
Yalnız bəşərmi pənceyi-qəhrində sarsılan?
Hakim havada, yerdə, su altında vəhşətin,
Vəhşilərin də zülmdən olmaqda bağrı qan.
Qaplanlar iztirab ilə hər an dilər aman,
Qartallar iştə etmədə həp tərki-aşiyan.

Ey şiddətü sovuran hamiyi-zəfər!
Artıq yetər, usandı cahan, sən də bir usan!
Tərk et bu qanlı torpağı, artıq çəkil, yetər:
Hər kəs didişmədən yorulub imdi ruh açan
Azadə bir havada çiçəklənmək istəyir,
Pək dadlı bir ümidlə əylənmək istəyir.

Şərr olmadıqca xeyrə qovuşmaq məhal olur.
Qəsvətli, sisli hər gecədən bir günəş doğar.
Hürriyyət öylə nazlı bir afət ki, ipək vəqur,
Qan axmadıqca kimsəyə gülməz o işvəkar.
Zatən bu, köhnə yurdumuzun köhnə adəti,
Hər tanrının qan içməyə var hüsnü-rəğbəti.

Zülmət dağıldı, zülmü fəsad oldu payimal,
Hər yerdə sanki haqqü ədalət gülümsüyor.
Al bayrağın qanadları altında, pürməal
Hər çöhrə, hər dodaq saçıyor ləmə-ləmə nur.
Hürriyyət? Ah, o məncə fəqət dadlı bir xəyal...
Dünyada varmı hürr əcaba? İştə bir sual!..

## GET!

Mənə anlatma ki, eşq, aləmi-sevda nə imiş?
Bilirəm mən səni, get! Hər sözün əfsanə imiş.
Get, gülüm, get, gözəlim! Başqa bir aşiq ara, bul!
Duydum artıq sənin eşqindəki məna nə imiş!..
Bivəfasan, mələk olsan belə uymam daha, get!
Kim ki, uymuş sənə, könlüm kimi divanə imiş.
Yetişir, get! Məni qəhr eyləmə, tərsa qızı, get!
Anladıq şəfqəti-ayini məsiha nə imiş!
Səni bir sadədil, azadə mələk sanmış idim,
Neyləyim!.. Ah... könül ruhun da biganə imiş.
Səni təqdis edərək bir daha sevməm əsla,
Nə imiş sanki bu eşq!? Aşiqi-şeyda nə imiş!
Aləmi-zövqü səfadan mənə bəhs etmə, saqın!
Bildik artıq bu cahan mülkü nə viranə imiş!..

## TÜRK ƏSİRLƏRİ

Erkək, qadın, əsgər, çocuq, ixtiyar
— Əsir — deyə, minlərcə türk övladı:
İssız[1] bir adanın qoynunda sızlar,
Sorulmaz dərdi, duyulmaz fəryadı.

İştə kinli bir məzarlıq ki hər gün
Yığın-yığın insan udar da, doymaz;
Sağlam vücudlar belə düşkün, ölgün,
Ümidsiz bir heykəldən fərq olunmaz.

Gülümsərlər, fəqət həp gözlərində
İntiqamlı şimşəklər çaxar, durur.
Çırpınırlar, solmuş bənizlərində
Bir çox gizli, sönük əməllər uyur.

Yalnız soyuq, yağmur, boran, fırtına
Oxşar durur bu məhzun könülləri;
Üryanlıq, xəstəlik, aclıq bir yana,
Susuzluqdan həp qurumuş dilləri.

[1] Bakıda, Nargin adasında.

## QAÇQIN

Örtünmə, dur! Kimsən, nerəlisən sən?
Gözəl qaçqın, başı bəlalı qaçqın!
Gülümsə, nur saçılsın üz-gözündən,
Ey hər halı mələk ədalı qaçqın!...

Zülfünü qoynunda bəsləmiş gecə,
Süzgün gözlərin, gül üzün pək incə,
Könül məst olur sən gülümsədikcə,
Ey nazlı dağların maralı qaçqın!

Mən istərəm ömrüm səninlə gülsün,
Söylə, nə dərdin varsa anlat bütün;
Aman, nə oldu ki, sən böylə düşdün
Yurdundan, elindən aralı qaçqın!

Ah, səni gördüm də dağıldı huşum,
Vuruldum sənə, sanki bir sərxoşam,
Mən də sənin kimi qərib bir quşam,
Gəl mənə, ey könlü yaralı qaçqın!...

## ÇOBAN TÜRKÜSÜ

Açmasın çiçəklər, gülməsin güllər,
Ötüşməsin şirin dilli bülbüllər,
Dərdim çoxdur, ellər, ellər, ay ellər!
Yar-yar deyib gecə-gündüz ağlaram.

Göz yola dikməkdən bağrım oldu qan,
Bir xəbər yox hilal qaşlı yanımdan,
Yaralı könlümü olmaz oxşayan,
Yar-yar deyib gecə-gündüz ağlaram.

Gülməz, yüz bahar olsa, gülməz üzüm,
Yardan başqa bir gözəl görməz gözüm,
Sanki anadan ayrılmış öksüzüm,
Yar-yar deyib gecə-gündüz ağlaram.

Öz yurdumda bir qəribdən seçilməm,
Əsir kimi bir dost, bir yaxın bilməm,
Cahan cənnət olsa bir ləhzə gülməm,
Yar-yar deyib gecə-gündüz ağlaram.

Məcnun könül Leylasını unutmaz,
Başqa bir gözəl dərdimi uyutmaz.
Bir məsəldir: "Tərlan yerin sar tutmaz!"
Yar-yar deyib gecə-gündüz ağlaram.

***

Amansız qartalın vəhşi dırnağı
Məsum yavruları didib parçalar.
İştə ədalət! İlanlar yatağı
İnsanlara məskən verilmiş qərar.

Nerdə o sərxoşlar ki həp "qardaşlıq,
Birlik, bərabərlik" deyə sayıqlar.
İştə bir vəhşət ki çəkilməz artıq,
Dost deyil, düşmən belə görsə ağlar.

Ey türk eli! Ey milyonlar ölkəsi![1]
Saqın, duyma nədir bu hal, bu dəhşət;
Titrətməsin səni bu qardaş səsi,
Korluq, saqırlıq o da bir səadət!..

## "AZƏR"

(Poemadan parçalar)

### DÜŞÜNDÜM Kİ...

Düşündüm ki, əməl çəmənzarında
Açar pənbə güllər, yaşıl yarpaqlar;
Düşündüm ki, ömrün ilk baharında
Al şəfəqlər saçar gülgün dodaqlar.

Düşündüm ki, yatar qanlı tufanlar,
Keçər zalım fırtınalar, böhranlar,
Çəkilir dumanlar, sönər vulkanlar,
Ninni söylər mənə coşğun irmaqlar.

Düşündüm ki, bitər hicran dəmləri,
Doğar günəş, susdurar matəmləri,
Gülzarı süslərkən xoş qədəmləri
Boyun bükər bənövşələr, zanbaqlar.

Heyhat!.. Ortalığı zülmətlər aldı,
Tale yarı yardan aralı saldı,
Öksüz ruhum didarə həsrət qaldı,
Qanatdı könlümü xain dırnaqlar.

---

[1] Bakı nəzərdə tutulur.

## KÖNLÜM

Heç sorma halımı, yaralıyam mən,
Şən olmaz bir daha viranə könlüm.
Beynimi yaxan bir yığın heçlikdən
Sanki bir şey sorar divanə könlüm.

İssız bir yuvanın qoynunda daim
Qərib bir quş kimi ağlar mənliyim,
Çox küskünəm, bilməm nələr söyləyim!?
Qaldı hər sevgiyə biganə könlüm.

Şaşqın bir yolçuyam, yolum qaranlıq,
Yanğın oldu şəfəq sandığım işıq.
Of, yetər, bir daha vurulmaz artıq
Hər süzgün yıldıza pərvanə könlüm.

## GƏLİN

Of, nə yamandır o süzgün baxışlar,
Ey ipək telləri zərəfşan gəlin!...
Hər kəs gülər, hər kəs səni alqışlar,
Yalnız mənim halım pərişan, gəlin!

Getmə, dur, könüldə min həsrətim var,
Söylənəcək dərdim, fəlakətim var,
Səndən sənə gizli şikayətim var,
Ey mələk ədalı, xuraman gəlin!

Nədir suçum, məndən uzaq qaçırsan,
Yabançı ellərə şənlik saçırsan,
Röya kimi süzülürsən, uçursan,
Bilməzsən ki, bağrım olur qan, gəlin!

Nə söyləyim! Halım əyandır sana;
Sən bir yana, bütün dünya bir yana.
Sənsiz gülüstanlar zindandır mana,
Ey cənnətdən bizə ərməğan gəlin!..

## AZƏRİN CAVABI

Mən yetişdim atəşlə su
Öpüşdüyü bir ölkədən.
İzləyirkən sevgi yolu
Acı duydum hər kölgədən.

Bir yoxsulam, hər diləyim
Diz çökdürür zənginləri.
Bir arifəm, bilmədiyim,
Aşar durar ənginləri.

Mən mülayim bir dənizəm,
Atəşlidir dalğalarım.
Sülhə qoşan bir acizəm,
Əskik olmaz qovğalarım.

Bir ovçuyam,eşq umaram
Hər ahunun gözlərindən.
Dərd əhliyəm, rəmz anlaram
Hər şairin sözlərindən.

Bir aşiqəm, feyz alırlar
Məndən ürfan çobanları.
Bir çobanam, qaval çalar,
İnlədərəm vicdanları.

Mən əbədi hürriyyətin
Sevdalı bir cilvəsiyəm.
Anlaşılmaz bir xilqətin
Parlar, sönər şöləsiyəm.

***

Süzərək Azəri heyran-heyran,
Bir rica eylədi rəssam ondan,
Göstərib bir qocaman daş, dedi: "Gəl,
Yapayım rəsmini, bir bax, nə gözəl!?
Seyrə dal sən yeni doğmuş günəşi,
Nə də xoş mənzərə!.. Bax, varmı eşi?

***

Tutduğun yol böyük... Sən el rəhbərisən,
Bütün səslərdən üstündür sənin səsin.
Bağır, hayqır, can ver issız bucaqlara,
Bilgi nuru yağdır sönmüş ocaqlara.
Zəif biləklərdən çəlik qollar yarat!
Hər uyumuş beyninə bir qıvılcım at!
Çalış bütün boşluqlar əzminlə dolsun,
Hər bataqlıq çiçəkli bir cənnət olsun.
Bilgi saçar hər qaranlıq yurda işıq,
Yalnız əmək verir bizə bəxtiyarlıq.

SƏLMANIN SƏSİ

Hər günəşə vardım ləkəli gördüm,
Hər vicdana girdim kölgəli gördüm,
Parlaq imanları şübhəli gördüm,
Məgərsə hər cilvə bir xülya imiş.

Altun əsiridir həp irzü namus,
Yoxsullara gün yox, ya məhv ol, ya sus!
Hər kəs insanlıqdan dəm vurur, əfsus!
Həp yalan, təməlsiz bir sevda imiş.

Yaralı könlümü tikənlər deşdi,
Kimdən vəfa umdum qanımı içdi,
Cavan ömrüm fəryad içində keçdi.
Səadət əməli bir röya imiş.

***

Bunu Azər keçiyorkən duydu.
"Nə gözəl səs!" deyə dərhal uydu.
Çox maraq etdi, dərin zövq aldı,
Xilqətin şerinə heyran qaldı.
Sordu "Kimdir əcaba?" - bildiklər
"Bir yetim qız, adı Səlma" dedilər.
Öncə yoxsuldu, alıb bir makinə,

Çalışır, yardım edər annəsinə,
Tikiyor incə-ipək kömləklər,
Həm gözəl şərqi təğənni eylər.
Sandı Azər görüyor bir röya,
Girdi çox sadə kiçik bir odaya.
Gəldi Səlma, gülərək əl verdi.
"Nə səadət!" deyə yer göstərdi.

*(Xəstəlikdən yeni qalxmış annəsinə işarətlə)*

İştə annəm yeni qalxmış, baxınız,
Sağalıb həp sizi özlər yalnız.

Qonuşub içdilər azcıq qəhvə,
Yad deyildir əvət, Azər bu evə.
Bir zamanlar yağaraq dəhşətlər
İki biçarəyi etdikdə hədər,
Qurtuluş yolları bulmuş Azər,
Qoşaraq yardıma olmuş rəhbər.

Həsbhal eylədilər, söylədilər,
Gəldi həp xatirə keçmiş günlər.

Dedi Azər: "Nə çıxar keçmişdən,
Fəzlə bəhs etməyəlim bir heçdən.
Varsa ən doğru həqiqət, o "bu gün!"
"Bu gün"ün hökmünü öyrən də düşün!
Keçiyorkən məni cəlb etdi səsin,
Sözlərindən səni gördüm bədbin".

### ANNƏSİ

Neyləsin, həp çalışır, zəhməti çox,
Yenə bir güldürəcək taleyi yox...
Güldü Azər dedi: "Tale nə demək!?
Yetişir olsa təşəbbüslə əmək.
Öncə kəşf etməlisən mənliyini,
Etsə məsud edər ancaq o səni.
Var hər insanda böyük istedad,
Onu bul, yoxsa nə yapsan bərbad...
"Gedəlim, gəl!" — dedi gəl, izlə məni,
Sənə Azər tanıdar taleyini".
Uydu Səlma ona, qalxıb getdi,
Bu tühaf rəhbəri təqib etdi,
Keçdilər dar və geniş yollardan.
Vardılar bir evə... Azər o zaman
Göstərib bax dedi: "Yavrum! Burası
Möhtəşəm bir yapı, sənət yuvası.
Səndə var bülbülə bənzər bir hal,
Gəl bu əlhan ocağından feyz al!
Musiqi rəmzini öyrən, lakin
Gecələr evdə çalış ətmək için".
Durdu Səlma...
Dedi: — Çox qız ləkələnmiş burada,
Bu mühit iştə çox azğın, hətta
Mələk olsam da görən tən edəcək,
Məni əxlaqı sönük zənn edəcək.
Dedi Azər:
Sağır ol, dinləmə hər kölgəni sən,
İncəlir hər qabalıq sənətdən.
Bəşərin uyduğu əxlaq, adət
Bir yığın yıpramış ölgün hikmət.
Güldü Səlma, düşünüb haq verdi,
Aqibət ismini qeyd etdirdi.
Keçdi illər, dəyişib mövsümlər,
Yazın axşamdı... Yürürkən Azər
Daldı birdən-birə... munis, şaqraq,

İncə bir səs duyaraq etdi maraq.
Saparaq girdi şəhər bağçasinə,
Buldu çox süslü, böyük bir səhnə.
Baxdı, səs yaz kulubundan gəliyor,
Dalğalar nəşələnib yüksəliyor.

SƏLMANIN SƏSİ

Hər gülşənə vardım, çiçəklər güldü,
Sevdalı bülbüllər səlamə gəldi.
Hər bəzmə uğradım, meylər töküldü,
Qədəhlər öpüşüb xuramə gəldi...

Almaslar, incilər qarşımda söndü,
Gözəllər yanımda xəyalə döndü.
Büllur qəhqəhələr susmuş göründü,
Susmuş kamançalar ilhamə gəldi.

Pərişan zülfümü dağıtdım üzə,
Sehr etdi hər teli sanki bir gözə,
Gördülər qarışmış gecə gündüzə,
Ölülər nəşədən qiyamə gəldi.

Baxdı Azər, coşaraq alqışlar,
Qadın, erkək qızı həp sarmışlar.
"Yaşa, var ol!" — deyə səs yüksəldi,
Töhfələr, süslü dəmətlər gəldi.
Qızda parlardı qürur, istiğna,
Qoşdu hər kəs kimi Azər də ona
Dedi: "Təbrik eləyim gəl səni mən,
Sənə nerdən bu səadət bilsən?
Düşün əvvəlki səfalət dəmini!
İnqilab atəşi parlatdı səni.
İnqilab açdı sənin şəhpərini..."
Qız gülümsər kimi, şən rəhbərini
Öpdü ruhundakı şeriyyətlə,
Gözlərindən süzülən hörmətlə...

ÜSYAN

Azər düşünür, dalğa keçərkən...
Birdən-birə həp dalğalı, həp şən
Bir vəlvələ qopdu,

Bir fırtına, bir zəlzələ qopdu.
Sarmışdı bütün ölkəni heyrət,
Lakin...
Çox üzdə gülümsərdi şətarət,
Hər nəşəli gəncin
Ruhunda açılmışdı çiçəklər,
Coşmuşdu diləklər.
Bir yanda şəfəq dalğalı, nazəndə axınlar,
Qızlar və qadınlar
Oynar, sevinər, şənlik edərlər,
Həp pənbə dodaqlarda zəfər şərqisi gurlar.

Qızlar və qadınlar!..
Həsrətkən işıq aləmə onlar,
Zillətdə əsrlərcə bunalmış da əzilmiş,
Hürriyyəti ancaq yeni bilmiş...
Sıyrıldı günəş sisli buluddan
Hər kəs süzüyorkən onu heyran...
Parlarkən üfüqlər,
Birdən-birə çarşaflar atıldı,
Həp coşdu nütüqlər.
Erkəklərə meydan oxunurkən,
Onlar da qatıldı,
Çarşaf kimi, qalpaq da yox olsun... deyə birdən
Erkək və qadın dalğalanıb gurladı, coşdu,
Məbədlərə qoşdu.
Gənclik dedi: "Onlar da dəyişsin,
Məktəb və kütubxanəyə keçsin".

Üsyan!..
Üsyan deyə hər gözdən, ağızdan
Bir nifrət uçardı.
Üsyan!..
Keçmişlərə, keçmişdəki adətlərə üsyan!
Hər üzdə təhəkküm izi vardı.
Üsyan!
Məbədlərə, qalpaqlara, çarşaflara üsyan!..
Şaşqınlığa yox zərrəcə imkan.
Hər fəlsəfə, qanun dəyişirkən,
Bir nöqtədə dursan da düşünsən,
Məqbər yapacaqlar gəmiyindən.
Üsyan!
Həp əski hürufata da üsyan!..
Üsyan!
Həp köhnə xurafata da üsyan!..

Ətrafı süzən yaşları keçkin
Erkək və qadınlar buna şaşmış...
Çarşafların altında duyulmaqda qəzəb, kin,
Həp hövsələ daşmış...
— Bir bax nə rəzalət!..
Artıq nə həya qaldı, nə ismət!..
Gənclik azaraq, həddini bilməz,
Yox, yox bu çəkilməz,
— Hər gün bir oyun, bir yeni fitnə,
Məbədlə işin nə?!
— Mən tanrıya tapdım, nə vəzifən,
Mən, etmədim əsla səni yoldan sapıyorkən...
Çarşaflar atılsın! — deyə əlbət
Namusa təcavüz eləyir, bəlli həqiqət.
Onlar köpürürkən...
Azər gülərək söylədi: "Sizdən
Heç bir yenilik ummadı bir kimsə, əzizim!
Bilməm bu köpürmək nəyə lazim?..
Yox, sizlərə aid deyil əsla çalınan saz
Bəsbəlli, kötüklər aşılanmaz.
Yalnız yeşərən tazə fidanlar,
Az-çox yenilik zövqünü anlar.
Əcdadımızın adəti bəlli,
Hər haləti bəlli...
Lakin biz o adətləri atdıq,
Atdıq, bu gün artıq
Onlardakı əfsanəli şeylər,
Bizlərcə sönük uyquya bənzər.
Söz yox ki, bu gün gəncliyə baxsan,
Bir sel kimi hər an,
Sağlam, yeni məfkurələr izlər.
Bizlər!?.
Bizlərdəki adət də təbii
Bunlarca sönük, yıpramış əski...
Bilməm ki, bu yorğun yürüyüşlə
Gənclik neçin uysun bizə, söylə!
Bizlər yeniləşsək belə, daim
Bir əskilik az-çox bizə hakim...
Ən doğru yol iştə!
Heç olmayalım onlara əngəl bu gedişdə.
Onlar qoşacaq, çarpışacaqlar,
Bir çox uçurumlar aşacaqlar.
Lazımsa cəhalətlə güləşmək,
Bir çarə var: ancaq yeniləşmək!..
Onlardakı himmət və mətanət

Qırbaclayacaq Şərqi nəhayət,
Onlardakı qüdrət və məharət
Er-gec verəcək xalqa səadət.
Onlar mədəniyyətlə günəşlər yaxacaqlar,
Keçmişlərə üstdən baxacaqlar.
Onlar güləcək, yüksələcəklər,
Həp yüksələcək, həp güləcəklər.
Onlar güləcək, güldürəcəklər
Bizdən daha xoş gün görəcəklər!"

## "ŞEYX SƏNAN" FACİƏSİNDƏN

### KOR ƏRƏBİN MAHNISI

Nə eşq olaydı, nə aşiq; nə nazlı afət olaydı,
Nə xəlq olaydı, nə xaliq; nə əşki-həsrət olaydı.
Nə dərd olaydı, nə dərman, nə sur olaydı, nə matəm
Nə aşiyaneyi-vüslət, nə bari-firqət olaydı.
Könüldə nuri-məhəbbət, gözümdə pərdeyi-zülmət...
Nə nur olaydı, nə zülmət; nə böylə xilqət olaydı.
Nədir bu xilqəti-bimərhəmət, bu pərdəli hikmət?
Bu zülmə qarşı nolur bir də bir ədalət olaydı.
Tükəndi taqəti-səbrim, ədalət! Ah ədalət!
Nə öncə öylə səadət, nə böylə zillət olaydı.

## "PEYĞƏMBƏR" FACİƏSİNDƏN

### PEYĞƏMBƏRİN MONOLOQU

Qadın, qadın?! Onu duymaq, duyurmaq istərkən
Yaxır düşüncəmi bir şölə, bir zəhərli tikən.
Bütün həyatı çiçəkləndirən fəqət o... neçin,
Neçin əzilsin o, bilməm neçin sürüklənsin?!
Qadın - günəş, cocuq - ay... nuru ay günəşdən alır,
Qadınsız ölkə çapuq məhv olur, zavallı qalır.
Qadın əlilə fəqət bəxtiyar olur bu cahan.
O bir mələk... onu təqdis edər böyük yaradan.
O çox sevimli, gözəl, incə, nazlı bir xilqət
Onun ayaqları altındadır fəqət cənnət.
Qadın gülərsə bu issız mühitimiz güləcək,
Sürüklənən bəşəriyyət qadınla yüksələcək.

## “İBLİS” FACİƏSİNDƏN

A r i f:

Bir fəzilətsə öldürüb ölmək,
Canavar bizdən əşrəf olsa gərək.

İ b n  Y ə m i n:

İştə bir söz ki, büsbütün yanlış...
Yaşamaq istiyormısan, çarpış,
Hərbə qoş, həp vuruş, ya əz, ya əzil!
Onsuz irmək muradə pək müşkül.

V a s i f:

Türk ordusu daim basaraq ölkələr almış,
Ən sonda siyasətdə basılmış da bunalmış,
İdrakı sönük başçıların qəfləti ancaq
Etmiş, edəcək milləti həp əldə oyuncaq.
Turana qılıcdan daha kəskin ulu qüvvət,
Yalnız: mədəniyyət, mədəniyyət, mədəniyyət...

E l x a n:

Sanki sərsəm yaşayışdan nə çıxar?
Məncə bilmərrə bütün insanlar
Həp gözəl olmalı, yaxud çirkin,
Həp fəqir olmalı, yaxud zəngin,
Həp həkim olmalı, yaxud nadan,
Həp mələk olmalı, yaxud şeytan.

İ b l i s:

Səni pək aldatıyor hissiyyat.
Öylə yekrəng olaraq keçsə həyat,
Bıqar insan, yaşamaqdan yorular,
Yaşayış bəlkə də mənasız olar.

Dərdə bax, millətə bax, niyyətə bax!
Ölülərdən ölülər feyz alacaq!

### İBLİSİN SON MONOLOQU

İblis! O böyük ad nə qədər calibi-heyrət!
Hər ölkədə, hər dildə anılmaqda o şöhrət.
Hər qülbədə, kaşanədə, viranədə İblis!
Həp Kəbədə, bütxanədə, meyxanədə İblis!
Hər kəs məni dinlər, fəqət eylər yenə nifrət,

Hər kəs mana aciz qul tikən, bəslər ədavət,
Lakin məni təhqir edən, ey əbləhü-miskin!
Olduqca müsəllət sana, bil, nəfsi-ləimin,
Pəncəmdə dəmadəm əzilib qıvrılacaqsan,
Daim ayaq altında sönüb məhv olacaqsan.
Mənsiz də, əmin ol, sizə rəhbərlik edən var:
Qan püskürən, atəş savuran kinli krallar,
Şahlar, ulu xaqanlar, o çılğın dərəbəylər,
Altın və qadın düşkünü divanə bəbəklər,
Min hiylə quran tülkü siyasilər, o hər an
Məzhəb çıxaran, yol ayıran xadimi-ədyan,
Onlar, əvət, onlar sizi çeynətməyə kafi,
Kafi, sizi qəhr etməyə, məhv etməyə kafi...
Mən tərk edərim sizləri ələn, nəmə lazım!
Heçdən gələrək heçliyə olmaqdayam azim,
İblis nədir?

- Cümlə xəyanətlərə bais...

Ya hər kəsə xain olan insan nədir?

- İblis...

## "XƏYYAM" PYESİNDƏN LİRİK PARÇALAR

1.

Gəldin də, neçin pənbə buludlar kimi axdın,
Bilməm, niyə getdin, niyə döndün, niyə baxdın?
Şimşək kimi çaxdın da, neçin könlümü yaxdın,
Bilməm, niyə getdin, niyə döndün, niyə baxdın?

Sərpildi alov ruhuma süzgün baxışından,
Sarsıldı da həp mənliyim, ey afəti-dövran!
Gəl, gəl, olayım səndəki hər cilvəyə qurban,
Bilməm, niyə gəldin, niyə döndün, niyə baxdın?

2.

Nədir, bilməm, günahım, məst kimi gözlər vüsalından,
Mənəm məhrum olan, ey nazlı afət, gül camalından:
Dəmin ilham alırkən şerə bənzər hər məqalından,
Keçər illər, xəbər tutmam sevincindən, məlalından.

Könül sənsiz səfa duymaz şəfəqlərdən, çiçəklərdən,
Bütün ruhumda, vicdanımda sənsən, ah... yalnız sən...
Sənin eşqinlə ruhum çırpınarkən, sızdar, inlərkən,
Pərişan, xəstə halım heç keçərmi bir xəyalından?

# “MOLLA NƏSRƏDDİN” ŞAİRLƏRİ

*1906-cı ildə Tiflisdə Azərbaycanın dahi yazıçısı Mirzə Cəlil Məmmədquluzadə dostu və məsləkdaşı Ömər Faiq Nemanzadə ilə birlikdə “Molla Nəsrəddin” mizah jurnalını nəşr etməyə başlayır. Dövrün ən qabaqcıl, demokratik fikirlərini təbliğ edən bu jurnalın ətrafında ədəbiyyatımızın “Molla Nəsrəddin” məktəbi adlanan güclü bir cərəyanı yaranır. Mirzə Ələkbər Sabir kimi böyük şairin də istedadı məhz bu jurnalın səhifələrində parlamağa başlayır. “Molla Nəsrəddin” ədəbi məktəbinin və şerdə özəlliklə Sabirin təsiri çox böyük olur. Yalnız Qüzey və Güney Azərbaycanda deyil, başqa Şərq və Türk xalqları ədəbiyyatında da satirik-tənqidi istiqamətdə yaranan poeziya aparıcı mövqe qazanır. Bu jurnalda bilavasitə çap olunmayan bəzi şairləri də, məsələn Güney Azərbaycanın böyük satira ustası Mirzə Əli Möcüz Şəbustərini də Sabir məktəbinə aid etmək olar. Onu da qeyd edək ki, “Molla Nəsrəddin” səhifələrində əsasən nasir və dramaturq kimi tanınan Mirzə Cəlilin, habelə sonralar məşhur tarixi romanlar yaratmış M. S. Ordubadinin şerləri də dərc edilib.*

*“Molla Nəsrəddinçilər”in çoxunun taleyi faciəli olub. Sabir ehtiyac içində, maddi və mənəvi təzyiqlər altında, ağır xəstəliklərə düçar olaraq əlli yaşına çatmadan dünyanı tərk edib. Jurnalın çıxmasında redaktor kimi böyük xidmətləri olan Əliqulu Qəmküsar 1919-cu ildə bir qatilin qurbanı olub. Sovet hakimiyyəti dövründə yaşamalı olan digər “Molla Nəsrəddinçilər”in də taleyi acı olub. Jurnalın yaradıcısı C. Məmmədquluzadənin özü də, sovet vaxtında da nəşr olunan jurnal da bir çox ciddi siyasi təzyiqlərə məruz qalıb. Yazıçı 1932-ci ildə ömrünü maddi və mənəvi sıxıntılar içində başa vurub. Jurnalın digər yaradıcısı Ömər Faiq, “Molla Nəsrəddin” şairlərindən Əlabbas Müznib, Salman Mümtaz, Əli Razi Şəmçizadə 1937-ci il repressiyalarının qurbanları olublar. “Molla Nəsrəddin”in satirik ruhunu sovet dövründə davam etdirməyə çalışan, 37-ci il repressiyalarından on il qabaq öz əcəliylə ölən Səməd Mənsur “Həpsi rəngdir” şerilə zamanın fəlsəfi simasını rəsm edən, yeni quruluşun, Rusiyanın Azərbaycanda apardığı riyakar yeni müstəmləkəçilik siyasətini ifşa edən şerlər yazır (bu şerlərin bəzilərini antologiyamıza daxil edirik) və buna görə də adı ədəbiyyat tarixlərindən silinir, unutdurulur.*

*Səməd Mənsurun da, adı yasaq olunmuş başqa şairlərimizin də yaradıcılığı ədəbiyyat tariximizə qaytarılmaqdadır. Və bu ədəbiyyat tarixində “Molla Nəsrəddin” şairlərinin şərəfli yeri var.*

# CƏLİL MƏMMƏDQULUZADƏ

( "Molla Nəsrəddin" )

(1869 — 1932)

## OLACAQSAN



Mən eylə bilirdim ki, mənə yar olacaqsan,
Aləmdə mənə yari-vəfadar olacaqsan,
Mən eylə xəyal etmiş idim, ah, bəradər!
İranda olan qəmlərə qəmxar olacaqsan.
Dərdi-dilimi annamayıb zərrəcə, axır
Məndən, nə bilim ki, belə bizar olacaqsan.
Biçarə vətən tarü qaranlıqda qalanda,
Əğyara gedib şəmi-şəbi tar olacaqsan.
Söz verməz idim mən sənə, ey dusti-dilazar,
Bilsəydim əgər böylə dilazar olacaqsan.
Sərməsti-meyü mütribü tiryakisan indi,
Bir vaxt ayılıb axırı huşyar olacaqsan
Məğrurisən indi, xəbərin yoxdur özündən,
Əldən vətənin getsə, xəbərdar olacaqsan.
Xar eylədi qəflət səni əğyar yanında,
Yatdıqca bu qəflətdə yenə xar olacaqsan.

## OYANMADIM

Dərədə yatmış idim, oyatdılar, oyanmadım,
Burnuma tikanları uzatdılar, oyanmadım,
Bomba parta-partnan, top atdılar, oyanmadım,
Saqqalımdan bir ovuc qopartdılar, oyanmadım.
Müxtəsər, hər bir əməl çıxartdılar, oyanmadım.

Şəhrimizdə cəm olub cavanlar naz ilən gəlib,
Qumarbaz, uşaqbazlar matuşkabaz ilən gəlib,
Mar, meymun oynadan söhbətü saz ilən gəlib,
Mütribi-xoşləhcələr pək xoşavaz ilən gəlib,
Müxtəsər, hər bir əməl çıxartdılar oyanmadım.

Qarışdı aralıqlar, qopdu məhşər qiyaməti,
Müsəlmanlar bir-birin qırdı unudub qeyrəti,
Hər gələn alim olub çapdı, taladı milləti,
Mən yuxuda ol zaman çəkirdim rahət ləzzəti,
Burnuma tikanları uzatdılar, oyanmadım.

Gördülər, yuxlamışam, hər kəs sınadı gücünü,
Atlı atın üstümə, qurbağa saldı qıçını,
Hoppanıb Araz bu tay yığıb dərənin bicini,
Hiyləbazlar tutdular bütün Qafqazın içini,
Saqqalımdan bir ovuc qopartdılar, oyanmadım.

Biz fəqirə axırı rəhm eyləyib biganələr,
Açdılar mədrəsələr, klub, qiraətxanələr,
Yazdılar kitab, qəzet, xərc etdilər xəzanələr,
"Molla Nəsrəddin" dedi hər həftə bir əfsanələr,
Müxtəsər, hər bir əməl çıxartdılar, oyanmadım.

## MƏMMƏD SƏİD ORDUBADİ

(1872 — 1950)

### GÖZƏL

(Vaqifə bənzətmə)

Bu dünyada varsa əgər bir dilbər,
Onda bu nişanlar müəyyən gərək:
Əndamı ayinə, qəddi mötədil,
Siyah zülfü qamətinə tən gərək.

Yanağı lalətək, bahari kimi,
Ləbləri yaqutun kənari kimi,
Bir danə nasüftə mirvari kimi
Başdan-ayağatək ağ bədən gərək.

Təmizliyə ola bir az həvəsi,
Olmaya aşiqə nazü qəmzəsi,
Soğan qoxa danışanda nəfəsi,
Amma sarımsağı az yeyən gərək.

Qovli sadiq ola, hər feli halal,
Bilməyə ki, fitnə nədir, məkr, al,
Qultək dura qabağında, nitqi lal,
Kəsilsə də başı dinməyən gərək.

Növrəsidə: on dört, on beş yaşında,
Eyb olmaya kiprigində, qaşında,
Əgər olmasa da ağlı başında,
Şərt budur, bəyənə Hac Həsən gərək.

## YAĞLI PLOV

Ey yağlı plov, sən hamı aşiqlərə cansan.
Dillərdə bəyansan.
Lakin bizə bir sevgili məşuqi-zamansan,
Məşhuri-cahansan.
Gördükcə səni buğlana-buğlana gələndə,
Taqət hanı məndə.
Ətrin gəlir aşpaz səni boşqabə çəkəndə,
Qovurmanı səpəndə.
Ağlım dağılır, ruhum uçur nimçəni görcək,
Cana, səni görcək.
Gəl söhbət edək mən səni, sən də məni görcək
Biganədən əl çək.
Səndən dəxi mən kəsmərəm heç vəchlə ülfət,
Ey işvəli nemət.
Bir loğma əgər səndən ola aclara qismət,
Bidət qaldı, bidət.
Həsrət qalacaq vəslinə dərvişilə sail,
Ey nikşəmayıl.
Rəhm eylə məni-zarə ki, oldum sənə mayil,
Ey nimçəyi-kamil.
Hər yerdə sən olsan iki min verst, sürünnəm,
Təklifimi billəm.
Səndən yana mən ağlayaram, gah də gülləm,
Ta görməsəm ölləm.
Ol gün ki, sən oldun küreyi-ərzdə zahir.
Ey teyyibi-tahir.
Yanında varam indiyətək haziri-nazir,
Əmrində mübaşir.
Heyhat ki, mən eşqin bir ləhzə unutmam,
Ey yari-dilaram.
Səndən çəkib əl bozbaşı ya küftəni tutmam,
Ülfət gərək itmam.
Xam,
Avam,
Həmam,
İslam.

## MİRZƏ ƏLİ MÖCÜZ ŞƏBÜSTƏRİ

(1873 — 1934)

### ANAN TƏLİM EDƏN DİLDƏ

Mənə lütf eylə saqi, genə ol cami-sərşarı
Ki, ta rəf eyləyim nəştəbkarın rənci-xummarı.

Nə püstəm var, nə badamım, nə toxmi sur, nə nevtağım,
Məzə olsun-məni biçizə yarın ləli-şəhvarı,

De gəlsin məclisə mütrib, əlində sazı, mizrabı,
Çalıb tarü dəfi, şad eyləsin məni-aşiqi-zarı.

Nə kisədə zərim vardır, nə anbarımda bir həbbə,
Əlim boşdur, üzüm qarə, doyunca mey içim barı.

Nə məllakam, nə tüccaram, nə xani-mərdüməzaram,
Mətaim şerdir, ancaq onun da yox xiridarı.

Dilim türki, sözüm sadə, özüm səhbaye-dildadə,
Mənim tək şairin əlbəttə, olar kasad bazarı.

Dünən şer ilə namə apardım şahi İranə,
Dedi: Torki nəmidanəm, məra to beççə pəndarı?

Özü türk oğlu türk, amma deyir Türki cəhalətdir,
Xudaya, müzhəmil qıl taxtdan bu ali Qacarı...

Ümidin kəsmə Möcüz, yaz anan təlim edən dildə,
Gəzər bir ərmağan tək dəftərin Çin və Tatarı.

### FƏRZƏNDANİ — ŞƏBÜSTƏR

Yemiyək, içmiyək, boş sözlər danışmayaq,
Möhtac olluq düşmənə biz əgər çalışmayaq.
Fərzəndani-Şəbüstər, vətən bizdən elm istər.

İzzəti, dövlətidir hər insanın sənəti,
Hünərsiz millətlərin yoxdur qədri-qiyməti:
Fərzəndani-Şəbüstər, vətən bizdən elm istər.

Elmsiz əgər biz yaşasaq gecə-gündüz,
Vallah, billah, vətəndə gülməz hərgiz üzümüz,
Fərzəndani-Şəbüstər, vətən bizdən elm istər.

Çalışan alişan olur, olmaz pərişan,
Fərz edib axer bizə nəbiyi-zişan,
Fərzəndani-Şəbüstər, vətən bizdən elm istər.

Oxuyaq, anlayaq, qardaş, cahil qalmayaq,
Cahil qalaq biz? Niyə vətəndən kam almayaq?
Fərzəndani-Şəbüstər, vətən bizdən elm istər.

## VƏTƏN

Neçin ah eylədin, ey bülbüli-nalani-vətən,
Yaduva düşdü məgər hali-pərişani-vətən?
Xəsü xaşak basıb gülşəni, güllər saralıb,
Niyə bu halə qalıb bəs bu gülüstani-vətən?
Nə yatıbsan, ayıl, ey milləti-biçarə, ayıl!
Satır axır vətəni düşmənə əyani-vətən.
Dərü divarını qan eyləyib əlvan, ey dad!
Nə qəməngizdi, ya rəb, bu şəbustani-vətən!
Balişi-tazə qoyub başını naz eyləmə, dur,
Sürünü qurd dağıdar yuxlasa çobani-vətən!
Əcnəbi mülkü dolub bisərü pa millətlə,
Niyə, ya rəb, belə xar oldu əzizani-vətən?
Düşmən elm ilə bizi eylədi həmmal özünə,
Kim zəlil etdi bizi? - Cəhl! A müsəlmani-vətən!
Vətəniz cismidi, siz də vətənə can kimisiz,
Razı olmun qala cansız vətən, ey cani-vətən!
Verəlim əl-ələ, təhsilü kəmal eyləyəlim,
Xabi-qəflətdən ayılsın gərək əxvani-vətən!
Olmayıb şad, üzü bir gülməyib əfsus, əfsus!
O zamandan ki, olub Möcüzə İran vətən!

## SİZƏ MƏN NEYLƏMİŞƏM

Başıma zülf qoyub saqqalı yoldurmamışam,
Xəlqdən rüşvət alıb kisəmi doldurmamışam,
Cəddizin vəqf suyun mülkümə saldırmamışam,
Ey şəbüstərli dadaşlar, sizə mən neyləmişəm?

Bir qran pul aparıb dövləti-İran dəridən,
Zülm edir firqeyi-qəssabə, utanmır tarıdan,
Möhri-zibhiyyə alır bac ölüdən, həm diridən,
Mən belə zülmü sitəm xəlqə rəva görməmişəm,
Ey şəbüstərli dadaşlar, sizə mən neyləmişəm?

Görürsüz mən nə ajanam, nə qazax, ay kişilər,
Görməyir qondara hərgiz bu ayaq, ay kişilər,
Salmışam lifəli şalvarıma bağ, ay kişilər,
Pantalon geyməmişəm, bığlarımı burmamışam,
Ey şəbüstərli dadaşlar, sizə mən neyləmişəm?

Küfrimə hökm elədiz hansı günah ilə mənim?
Cürmümü sabit edin bircə günah ilə mənim.
Nə təlaq ilə işim var, nə nikah ilə mənim,
Qızızı hazır edib məclisə, dindirməmişəm,
Ey şəbüstərli dadaşlar, sizə mən neyləmişəm?

Mən filankəs deyiləm, siğəmə irad edəsən,
"Get, kəbin kəsmə" deyə, üstümə fəryad edəsən,
Yıxasan xəlqin evin, öz evin abad edəsən.
Mən hələ hiç kəsin qəlbini sındırmamışam,
Ey şəbüstərli dadaşlar, sizə mən neyləmişəm?

Ey əmu, çək qılıncın, eylə mürəbbayə hücum,
Şirbirincə[1], xamaya, həm qara dolmaya hücum,
Bicahət eyləmə çox Möcüzi-şeydayə hücum.
Mən məgər ildə beş-on yol sizi güldürməmişəm?
Ey şəbüstərli dadaşlar, sizə mən neyləmişəm?

## ƏMOĞLU

*(Sabirə nəzirə)*

Beş gündü cahan, dövləti neylərsən əmoğlu?
Elmi, hünəri, sənəti neylərsən, əmoğlu?
Ölç kölgəni gündüz, gecə bax ulduza, ayə,
Kafər qayıran səati neylərsən, əmoğlu?
Bozbaş dediyin başə bəla, canə xətərdir,
Yat, dur səhər olsun, əti neylərsən, əmoğlu?
Üryan gələcək məhşərə məxluq təmamən,
Alma nisiyə, xələti neylərsən, əmoğlu?
Biqeyrət edər ağlamaq insanı, deyərlər,
Xərc eylə gedə, qeyrəti neylərsən, əmoğlu?
Bağla belüvə qeyrəti, namusu, həyanı;
Sat qəddərəni, Hacəti neylərsən, əmoğlu?
Arxa yaralı, baş xoralı, sinə cərahət,
Bu zəhmət ilə cənnəti neylərsən əmoğlu?
Sən rum qızını bəslə Bəyoğlunda[2], danış gül!

---

[1] Şirbirinc - südlüsıyıq.

[2] İstanbulun böyük məhəllələrindən biri.

İrandakı ac külfəti neylərsən, əmoğlu?
Huri verəcəklər sənə: xərmən kimi zülfü,
Bir kəlləsi daz övrəti neylərsən, əmoğlu?
Vaiz ki, satıbdır sənə cənnati-nəimi,
Şahiddi xuda, Höccəti neylərsən, əmoğlu?
Saqqalı uzun, kəlləsi küt, fikri darısqal.
Sən surətə bax, sirəti neylərsən, əmoğlu?
Möcüz danışar bal kimi, aç ağzuvi, dinlə,
Qəndi, rətəbi, şərbəti neylərsən, əmoğlu?

## OXUYUN!

Arvadın bilsə yazı
Özü yazar kağızı,
Yalvarmaz yad kişiyə,
Sən keçəndə Arazı.

Mane olma yazıya,
Gedin deyin qazıya:
Qeyri millət öyrədir
Yazı yazmaq tazıya.

Oxu rusca, almanca,
Möhtac olma dilmanca.
Hər kəs desə "Günahdı",
Başın dola qırmanca.

Eşit dədən sözünü,
Oxu, öyrən yazını,
Qara yazı ağ eylər
Oxuyanın üzünü.

Oxur urus qadını,
Anlar elmin dadını,
Bizim Hacı kişilər
Yazammaz öz adını.

Gözün sil bax maşına,
Dolanır özbaşına.
Biz də bir zad qayıraq,
Əyləşməyək boşuna.

İranlı qənd qayırsa,
Möhtac olmaz Prusa.
Axund deyər: Müsəlman
Kafər olar oxusa.

İtalyanlar - imansız,
İngilis, həm fransız
Bizə iynə verməsə,
Qalacağıq tumansız.

Avtomobil yürüdü,
Toz aləmi bürüdü,
Arvadlar baxıb dedi:
— Bu cindi, ya pəridi?

Avtomobil qoşdu getdi,
Dağları aşdı getdi.
Bizim ulaq yeriməz,
Hövsələm qaşdı getdi.

Yayda suyu dondurar,
Rus, erməni və bolqar.
Bacarmırsan qışda sən
Bə cəhənnəm, bə finnar.

Mən gedirəm Mərəndə,
Tamaşadı gələndə.
Bizim millət yuxlayıb,
Ayılacaq öləndə.

Dalın çevir Miyana,
Baxma zərər-ziyana.
Saqqalı qırx tök yerə,
Culfanı keç o yana.

Təyyarə çıxdı göyə,
Gəlirlə bizim köyə,
Biz neylərik görəsən,
Od yağdırsa Güneyə?

Bir dənə yox Almanda,
Hətta Frəngistanda
Falçı darülfünunu-
Min dənə var İranda.

Öküzü danammaram,
Duzəxdə yanammaram.
Yer havada dolanır?
Mən buna inanmaram.

Deyirəm, sür dərəyə!
İnanma cin, pəriyə,
Hər kəs gəlir qabağa,
Biz gedirik geriyə.

## QÜRBƏT

Kim, görəsən, qürbəti icad edib?
Hər kəs edib, mən kimi bimar ola!
Tərki-diyar eyləməyin baisi
Olsa gərək zülmi-tələbkar ola.

Qalsa vətəndə gedəcək izzəti,
Həm Tükəzin çadrəvü çərqəti,
Canuvi incitmə, oğul, övrəti
Boşla, vəlov ki, məməsi nar ola.

Təzkirə on dörd tümənə maldır,
Qol pulu ondan da qırışmaldır,
Yolçu nə eşşək və nə hambaldır,
Ta bu qədər zülmə xiridar ola.

Sən də bilirsən ki, o, tacir deyil,
Bunca pulu verməyə qadir deyil,
Boşla yaxasın, bura bir yer deyil,
Qoy gedə İstanbula, tüccar ola.

Göndərə həq hər gün əgər rəhmətin,
Etməz ucuz təzkirənin qiymətin,
Eyləyin agah rəsul ümmətin,
Cibdə gərək dirhəmü dinar ola.

Xərci var həştad tümən getmağın,
Ya evi qoy beh, ya da ki, sat bağın,
Qorxuram axır yıxıla mitbağın,
Pərdiləri azimi-bazar ola.

Türk mənə verdisə, dörd yüz lirə,
Qüssə və qəmdən tutular xirxirə,
Ya zəhər iç, ya sal özün təndirə,
Qoyma, qərəz, hövsələ çox dar ola.

Qarət əgər eyləyələr xeyməni,
Hərmələvü Xuli və Şimri-dəni,
Qüssə boğar yoxsulu, biçarəni,
Əllərin, ey mərsiyəxan, var ola!

Sinniz əgər baliğ olub əlliyə,
Qəddərəni bərk vurun kəlləyə,
Bəlkə sizi axirətə yolluya,
Xəlq geyə qarə, əzadar ola.

Bəs ki, içər şireyi-əngurdən,
Şairin olmaz xəbəri surdən,
Məst çıxar daireyi-gurdən,
Kaş hamı Möcüz kimi dindar ola!

## NƏ ANLADIQ BU GƏLMAQDAN?

Nə anladıq bu gəlmaqdan,
Bu altı aylıq qonaqdan?
Kabab olduq ağlamaqdan,
Allah, özün imdad elə!

Təzkirəni aldı ələ,
Canıma saldı vəlvələ,
Yarım gedib, nə vaxt gələ?
Qəmli könül, fəryad elə!

Aşıq ağlar acı-acı,
Yar baxar ona qiyğacı,
Saxla atın, arabaçı!
Aşiqləri bir şad elə!

Sənin ilə könlüm xoşdur,
Necə görüm yerin boşdur?
Yarın qəfəsdə bir quşdur,
Tez gəl, onu azad elə!

Əmoğlucan, səni tarı,
Dön bir də bax mənə sarı,
Yıxıldı könlüm divarı,
Gəl, gəl, onu abad elə!

Ağ gərdəndə qara şəvə,
Mən baxaram sevə-sevə,
Sil göz yaşın, qayıt evə,
Yıx köyümü, bərbad elə!

Yarım gözdən nəhan oldu,
Dağlar başı duman oldu,
İşim ahü fəğan oldu,
Allah, özün imdad elə!

## BAYRAMƏLİ ABBASZADƏ ("HAMBAL")

(1859 — 1926)

### İRANLILAR

Şurə gəlib şad olun, iranlılar!
Qüssədən azad olun, iranlılar!

Aləmə təsir elədi ahınız,
Doğdu yenə behcət ilə mahınız!
Yadə salır sizləri öz şahınız:
Günbəgün abad olun, iranlılar!
Qüssədən azad olun, iranlılar!

Yar olacaq sayeyi-sultan sizə,
Eyliyəcək lütfi-firavan sizə,
Çün gələcək Məmdəli mehman sizə,
İndidən irşad olun iranlılar!
Qüssədən azad olun, iranlılar!

Dərdü qəmu qüssəni bir yan atın!
İstəyəcək məqsədə yeksər çatın!
İndi dəxi həşrə qədər bərk yatın.
Xab görüb şad olun, iranlılar!
Qüssədən azad olun, iranlılar!

## ƏLİ NƏZMİ

(1878 — 1946)

### İSTİXARƏ

Fikr edirik biz də bir iş başlayaq,
Eyləyirik istixarə, bəd gəlir.
Səbr edirik, bir saət xoşlayaq,
Xoşlayırıq, istixarə bəd gəlir.

İstəyirik biz övladi-ümmətə
Açıb məktəb çataq dadi-millətə.
Cəmiyyətin təşkilinə, himmətə.
Qalxışırıq, istixarə bəd gəlir.

Cəm oluruq bir məclisə yüz nəfər,
İşlədirik neçə batman çay-şəkər,
Danışırıq, bitişirik... müxtəsər,
Eyləyəndə... istixarə bəd gəlir.

Sonra bir də eyləyirik məsləhət,
Cəmləşirik, həm çay olür, həm də ət.
Təsbihə də molla edir məşvərət,
Andır genə istixarə bəd gəlir.

Üç ay, beş ay gedib genə yatırıq,
Çaysız, aşsız lakin itib-batırıq,
Ortalığa tazə bir söz atırıq
Ki, etməyin, istixarə bəd gəlir.

Sebarə biz bu şuraya cəmləşib,
Ən lazımlı məktəb işin səsləşib
Düzəldirik zəhmət çəkib əlləşib,
Pul deyəndə istixarə bəd gəlir.

Söyləyirik: elm, məktəb, itti had,
Saylayırıq cümləsini adbaad,
Boylə edir neçə məclis iniqad,
Axırında istixarə bəd gəlir.

## MƏXLUQDAN XALİQƏ

Bilmirəm mən yeri, dünyanı yaratdın nə üçün?
Dağları, bağı, gülüstanı yaratdın nə üçün?
Quş, cücü, yırtıcı heyvanı yaratdın nə üçün?
Sənə qurban olum, insanı yaratdın nə üçün?
Hələ, xaliq! Bu müsəlmanı yaratdın nə üçün?

Bir cəhənnəm olacaqdı buna dünyası bunun,
İndi ki, bitməyəcəkdi ağısı, yası bunun,
Qeyri-qabil olacaqdı, hələ əhyası bunun,
Bəs bu məfluc, yarımcanı yaratdın nə üçün?
Söylə, xaliq! Bu müsəlmanı yaratdın nə üçün?

Keçməyir gün ki, o bir guşədə qan eyləməsin,
Hədəf öz gülləsinə bir neçə can eyləməsin,
Etdiyi cümlə ticarətdə ziyan eyləməsin,
Bunca qatilləri, qurbanı yaratdın nə üçün?
Söylə, xaliq! Bu müsəlmanı yaratdın nə üçün?

Olduğun adəm o, bir gunə gətirməz yadına,
Atmaq əl qarət üçün sənəti erkək, qadına,
Baxmamış elm, təməddün nədir, əsla dadına,
Mötəqid, tabeyi-Quranı yaratdın nə üçün?
Söylə, xaliq! Bu müsəlmanı yaratdın nə üçün?

Lap kiçikkən alışır əyriliyə, oğruluğa,
Ölsə bir kəlmə belə dil bulamaz doğruluğa,
Qeyrəti, ari tamamilə qoyub bir qoluğa!
Atmış insanlığı, vicdanı, yaratdın nə üçün?
Söylə, xaliq! Bu müsəlmanı yaratdın nə üçün?

Qafası dopdolu mohum, xurafat bütün,
Puç edib əqlini qondarma rəvayət bütün,
Bundan adəmmi olar, bir daha, heyhat... bütün,
Xaliqim! Molla Süleymanı yaratdın nə üçün?
Söylə, xaliq! Bu müsəlmanı yaratdın nə üçün?

Asyada Çin belə, Turan belə, Əfğanı belə,
Türkiyə, Hind, Ərəbistan belə, İranı belə,
Xasə Qafqazyası - bu faciə meydanı belə,
Gəncəni, Bakını, Salyanı yaratdın nə üçün?
Söylə, xaliq! Bu müsəlmanı yaratdın nə üçün?

## SƏMƏD MƏNSUR
(1879 — 1927)

### SÖYÜŞÜN



Söyüşün, ey nəciblər, söyüşün!
Fəxri-millət ədiblər, söyüşün!

Söyüşün, görsənə şücaətiniz,
Söyüşün, vazeh ola qeyrətiniz,
Söyüşün, kəşf ola nəcabətiniz,
Söyüşün, artıq ola hörmətiniz!
Söyüşün, ey nəciblər, söyüşün!
Fəxri-millət ədiblər, söyüşün!

Çünki yoxdur bir özgə sənətiniz,
Həcv satmaq olub ticarətiniz,
Pul qazanmaq olarsa niyyətiniz,
Gərək hökman ola rəqabətiniz.

Söyüşün, ey nəciblər, söyüşün!
Fəxri-millət ədiblər, söyüşün!

Yazılar aləmin bazar eləyin,
Ərsəni bir-birinə dar eləyin,
Bir-birin səhnədən kənar eləyin,
Nə xəcalət çəkin, nə ar eləyin.
Söyüşün, ey nəciblər, söyüşün!
Fəxri-millət ədiblər, söyüşün!

Hər kimin xılt olursa xununda,
Şübhə yoxdur onun cünunda,
Nə ola kuzəni dərunundа,
Əsəri görsənir birununda.
Yəni siz ey nəciblər, söyüşün!
Fəxri-millət ədiblər, söyüşün!

## BİZDƏ DƏ VAR, SİZDƏ DƏ VAR!

Bir qaç ərbabi-həya sizdə də var, bizdə də var.
Hədəfi-tiri-qəza sizdə də var, bizdə də var.

Nəfsi-mənhusi üçün müttəsil hər cildə girən
Aşiqi-zövqü-səfa sizdə də var, bizdə də var.

Sanma biganə məni xoş görünən halınıza,
Toqi-zənciri-bəla sizdə də var, bizdə də var.

Bigünah kəsləri mührumi-səadət eləyən
Qəlbsiz əhli-cəfa sizdə də var, bizdə də var.

Mərifət qanmayan ərbabi-rəyasət min-min
Qan udan əhli-ziya sizdə də var, bizdə də var.

Sanma səhvən özünü mehri-məhəbbət kanı,
Ədəmi mehri vəfa sizdə də var, bizdə də var.

Vətənin satmayan, əhbabinə təqdim eləyən
Şanlı ərbabi-səxa sizdə də var, bizdə də var.

Gərçi bizlər elədik qibleyi-aləm tərkin
Təzədən xan, bəy, ağa sizdə də var, bizdə də var.

Müstəbidlik bəşərin mayeyi-zatində imiş,
Qan içən Şümri-dəğa sizdə də var, bizdə də var.

Derlər ərzi-bəşər axır olacaqdır cənnət,
Boylə bir zənni-xəta sizdə də var, bizdə də var.

## HƏPSİ RƏNGDİR

Uyma, ey dil, xəlqdə yoxdur sədaqət, rəngidir,
Məscidü meyxanə rəng, eyşü ibadət rəngidir.
Mey, riya, məşuqə, ğəş, hüsni-vəcahət rəngidir.
Rəngidir hər dürlü matəm, hər məsərrət rəngidir.
Anla, ey əbnayi-xilqət, cümlə xilqət rəngidir.

Görmədim bir zərri-xalis büteyi-nasutidə,
Mənəvi min ləkkə gördüm ləlidə, yaqutidə.
Biqərəz insan olur görmək, fəqət, tabutidə,
Bilməzəm varmı sədaqət aləmi-lahutidə,
Azma, fikrim, cümlə ecazü kəramət rəngidir.

Hər kəsin Cibrili kəndi qəlbidir, vicdanıdır.
Var isə insafı şəxsin dinidir, imanıdır,
Bədniha insanların öz nəfsi, öz şeytanıdır.
Lohi-qəlbi arifin ayatıdır, Quranıdır,
Mabəği-övhamidir, şərü təriqət rəngidir.

Bir zaman vardı ki, mən həmfikr idim zühhad ilə,
Sonra gördüm fərqi yoxmuş zahidin cəllad ilə,
Dedim: əyyaş olmalı, ta gün keçə mötad ilə,
Cümlə eyşü nuşu gördüm müxtəlif fəryad ilə,
Anladım ki, zöhdü təqva, eyşü işrət rəngidir.

Qıl təsəvvür bir daha şairlərin xülyasını,
Aşiqi-zarın başında seyr qıl sövdasını,
Qəbri aç, göstər ona Şirinini, Leylasını,
Bir ayılsın da, düşünsün gördiyi röyasını,
Bax, — deyər, — həqqi bütün eşqü məhəbbət rəngidir.

Tapmadım aləmdə bir həmdəm ki, olsun biriya,
Görmədim heç kəsdə bir niyyət qərəzdən maəda,
Külli-əbnayi-bəşər öz nəfsinə olmuş fəda,
Nəfsi uğrunda görərsə hər bəla, hər macəra,
Məsləkə isnad edər, məslək, dəyanət rəngidir.

Bilmədim neyçünmiş aləm, bunca da yəsü ələm,
Zövrəqi-ömrün mühiti-vərtəban dəryayi-qəm,
Böylə halda kimsədən bihudədir ummaq kərəm,
Hər gələn bulmaq dilər öz nəfsinə asudə dəm,
Arxalanmam kimsəyə, ülfət, rəfağət rəngidir.

İmdi ki, mümkün deyil aləmdə olmaq kamiyab
Ey gözün qurbanı saqi, ver genə sağər şərab,
Ver genə sağər şərab, ey saqiyi-alicənab.
Bəlkə badənlə edə Mənsur rahət-iktisab,
Yoxsa, bu aləmdə yoxdur istirahət, rəngidir.

## GÜLMƏLİDİR

Mən dedim: "Rəng!" Yenə rəngi-mükərrər, deyirəm,
Rəngidir ərzü səma, bərzəxü məhşər, deyirəm.
Rəngidir ruhi bədən, məsnədü çənbər, deyirəm.
Rəngidir bütgədə, atəşgədə, minbər, deyirəm.
Duyaraq cümleyi-afaqə bərabər, deyirəm,
Etirazın mənə, ey tazə cavan, gülməlidir.

Tayiri fikrim ilə göyləri gəzdim yeksər,
Ta görüm ki, nə imiş şəmsü kəvakib və qəmər.
Parlayır dideyi - əcubə kimi min əxtər,
Hərə ulduz arayır baxtına həp ondan əsər-
Gözləyir, mənzərəsi etdi məni zirü-zəbər,
"Nöh fələk"dən hanı bəs namü nişan? Gülməlidir.

Parçalar gördüm uçur hər tərəfə sərgərdan,
Bilmək olmaz belə saylarını - milyan-milyan.
Hamı bihuş-şüur etmədə daim dövran,
Ədəmi-nəzmi-nizam əqlimi qılmış heyran,
Nə demək Əqrəbü Cövza, o Həməl, ya Sərətan.
Vəhmdir həpsi xəyalat, inan, gülməlidir.

Göyü, əflakı burax, ərzdən et əzm-kəlam,
Bu nədir fırlaniyor ortada top kimi müdam?
Milyon illər dönüyor, lüccədə tutmaz aram,
Milyon illər edəcəkdir yenə şuğlunda davam,
Neçin, aya, nəyə lazım bu təkabu, bu xuram?
Ədlin olsun necə gör bu dövəran, gülməlidir.

Parça bu cismi-müdəvvərdə doğulmuş insan,
Bir takım gəlməlidir, bir takım ifnayə rəvan,
O gələnlər, yaşayanlar gedəni görməz, aman!
Bu nə qəflət, səbəbi rəngidir, ey adəmyan,
Rəngi qoymuş bu kiçik şeyləri həp sərgərdan,
Hirsi-sevda ona heç verməz aman, gülməlidir.

Görə bildinmi bu aləmdə sədaqətdən əsər?
Kimdə gördün, nə zaman? Ver bizə də barı xəbər.
Müstəiddirmi sanırsan şərəfə, sidqə bəşər?
Hansı bir qüvvə bunu qılmış ona müstəhzər?
Bəlkə mən səhvdəyəm, səhvimi, vazeh, göstər,
Yoxsa bu səndəki hiddət, həyəcan gülməlidir.

Bu səadət, bu təcahül, bu cəram ağlamalı,
Xalq təhzibinə manedi, müdam ağlamalı.
Hamı məmnundur özündən, bu, tamam ağlamalı,

Hamı vermiş fərəsi-nəfsə lücam, ağlamalı.
Xasü am ağlamalı, püxtəvü xam ağlamalı,
Bunu inkar eləyən mötərizan gülməlidir.

Rəngi anlatdı məni təcrübələr çox əyyam,
Nərəyə baxdım isə rəngi göründü mənə tam.
Bircə misra da qoyub Xacə bütün bəhsə xitam:
"Hər kəsi ruzi-behi mitələbəd öz əyyam"[1].
Cam doldur mənə, ey saqiyi-şəngül, mənə cam,
Mənü sən gülməlidir, pirü cavan gülməlidir.

Rəngi bu dəhrdə təlin eləmişdir bəşəri,
Gəlməz heç guşədən aləmdə ədalət xəbəri
Al da tədqiq elə "Timon Afinski" əsəri,
Gör: Şekspir nə deyir - Hikmətin ali pədəri,
Rəngidir, rəngi-deyir, xilqətin ancaq səməri,
Sarı bir rəngə boyanmış bu cahan, gülməlidir.

## SƏNİ MƏN SEVMƏYİRƏM, SEVMƏYİRƏM

Bir zaman millətimiz alim idi,
Bilmirəm noldu ki, yatdı əbədi.
Get-gedə qəflət edib, elmə dedi:
"Səni mən sevməyirəm, sevməyirəm".

Cahil olduq da qapandı gözümüz,
Qanmadıq, evmizi yıxdıq özümüz.
Sənətə, elmə bu oldu sözümüz:
"Səni mən sevməyirəm, sevməyirəm".

Rövzəxan söydü bizi hilət ilə:
Xəlqin ağzın qapadı lənət ilə.
Anlayan şəxsə dedi nifrət ilə:
"Səni mən sevməyirəm, sevməyirəm".

Mollalar təfriqəyə oldu səbəb,
Çıxdı yetmiş ikidən çox məzhəb.
Dedi yek digərə bunlar əğləb:
"Səni mən sevməyirəm, sevməyirəm".

Zillətə, cəhlə düşəndən bu yana
Düşmən olduq mədəniyyətlə fəna.

---

[1] Hər kəs zamanından yaxşı gün gözləyir (Hafiz Şirazi).

O bizə söylədi, bizlər də ona:
"Səni mən sevməyirəm, sevməyirəm".

Yar ararkən özünə Sonya xanım,
Deyirik: "Gəl, başına mən dolanım".
O bizə söylər: "İtil, get, a canım,
"Səni mən sevməyirəm, sevməyirəm".

Çatacaq övladımız on yaşına,
Qətlü qarət dolur ancaq başına.
Deyir öz qovmuna, öz qardaşına:
"Səni mən sevməyirəm, sevməyirəm".

Günü-gündən işimiz oldu yaman,
Rahətü afiyətü əmnü aman
Əlvida etdi bizə, qıldı bəyan:
"Səni mən sevməyirəm, sevməyirəm".

## NAZ ET

Ey rəhmli canan, eləmə ülfətə adət,
Nazınla vüqarın verər ətvarına zinət,
Bihudə gülümsünmə, vüsalında nə ləzzət,
Sıx qəlbimi, yansın ciyərim, qanımı qəynət,
Cövrünlə dəri-sirri-nihanı mənə baz et!
Naz et mənə, ey sevgili yarım, mənə naz et!

Gər olmaya dövründə gülün xari-dilənduz,
Gər mümkün ola bülbül üçün vəsl şəbü ruz,
Nə bülbül olur dəhrdə, nə nəğmeyi-cansuz,
Qoyma ki, cəmalın ola üşşaqına dilduz,
Hicrində məxatib səbəbi-talei-biruz,
Təlimimi, təhsilimi, ey şux, diraz et!
Naz et mənə, ey sevgili yarım, mənə naz et!

Mahiyyətin əsrin nə bilir mərdümi-məsud,
Məsud olanın hər diləyi kəndinə mövcud,
Şeri, qəzəli, musiqisi, qəlbi qəmalud,
Onlar da sanır hər üçünü kəndinə məbud.
Qoyma, gözəlim, mən olayım heykəli-bisud,
Mən əhli-qinayəm, məni yıx, əhli-niyaz et!
Naz et mənə, ey sevgili yarım, mənə naz et!

Hicranı sevən görməsin ömründə vüsali,
Firqətlə yanan yalnız olur mətləbə hali,
Təzyiqdədir fəzl, hünər, rəncü məlali,

Məsud mənə, dilbər, o rəbbanı cəmali,
Dindirmə məni, qeyriləri məhrəmi-raz et!
Naz et mənə, ey sevgili yarım, mənə naz et!

İnsanlar hamı görmədiyi aləmin istər,
Sağlam ürəyin xəstə sanıb, mərhəmin istər,
Nəfsi, həvəsiyçin səni yox, həmdəmin istər,
Hər kəs özün istər, deyərəm xoş dəmin istər,
Mən istəmərəm vəslini, könlüm qəmin istər,
Mən söyləmərəm çövrü, cəfanı mənə az et!
Naz et mənə, ey sevgili yarım, mənə naz et!

Eşqdir əzəldən yaradan kövnü məkani,
Dünya denilən əski binayə odu, bani,
Kibrində, qürurunda rümuzati-məani,
Şairlərə cövrün veriyor təbi-rəvani,
Mənsurun, əya, tanrısı, ey sevgili cani,
Yax qəlbimi hicranın ilə, təbimi saz et!
Naz et mənə, ey sevgili yarım, mənə naz et!

## İKİ AŞIĞIN DEYİŞMƏSİ

Q o c a  a ş ı q

Cavan aşıq bir qulaq ver amandır,
Səndən soruşmalı neçə sözüm var.
Düşünməsən, onda halın yamandır,
Alaram sazını, onda gözüm var.

C a v a b

Sözlərini soruş, qorxutma məni,
Söz bilməsəm ortalığa girmərəm.
Cavanlığım aldatmasın heç səni,
Cavabın verərəm, sazı vermərəm.

Q o c a  a ş ı q

O kimdir ki, qan ağlayır qəmindən?
O kimdir ki, heç düşməyir dəmindən
O kimdir ki, ayrılıb həmdəmindən
Buna cavab verən aşıq var olsun!

C a v a b

O kəndlidir qan ağlayır qəmindən,
İspalkomdur heç düşməyir dəmindən,
O Çagindir ayrılıb həmdəmindən
Söz soran aşığa allah yar olsun!

Q o c a   a ş ı q

O nədir ki, surətləri soldurur?
O nədir ki, cibişdanı doldurur?
O nədir ki, toyuqları güldürür?
Buna cavab verən aşıq var olsun!

C a v a b

O ÇEKA-dır surətləri soldurur,
O rüşvətdir cibişdanı doldurur.
Təriflərdir toyuqları güldürür,
Söz soran aşığa allah yar olsun.

Q o c a   a ş ı q

O nədir ki, qazan kimi qaynayır,
O kimdir ki, dil-dodağın çeynəyir,
O kimdir ki, heç bilməyir neyləyir?
Buna cavab verən aşıq var olsun!

C a v a b

İnqilabdır qazan kimi qaynayır,
Dövlətlidir dil-dodağın çeynəyir,
Narkomlardır heç bilməyir neyləyir,
Söz soran aşığa allah yar olsun.

Q o c a   a ş ı q

O kimdir ki, alov yağır gözündən?
O kimdir ki, mənə çıxmır sözündən?
O kimdir ki, qorxar özü-özündən
Buna cavab verən aşıq var olsun.

C a v a b

Mirzoyandır alov yağır gözündən,
Mirbəşirdir mənə çıxmaz sözündən,
Qəzənfərdir qorxar özü-özündən
Söz soran aşığa allah yar olsun.

Q o c a   a ş ı q

O kimdir ki, aran bilməz, qış bilməz?
O kimdir ki, pul qazanar, iş bilməz?
O kimdir ki, aylarla bişmiş bilməz?
Buna cavab verən aşıq var olsun.

Cavab

O fəhlədir, aran bilməz, qış bilməz,
Dövlətlidir pul qazanar, iş bilməz,
O kəndlidir, aylarla bişmiş bilməz,
Söz soran aşığa allah yar olsun.

## BACIOĞLUNUN DAYIYA ƏRİZƏSİ

Ay dayı, gəl bölüşək hər nə ki var vəlvələsiz,
Mən cəsarətsiz uşaq, sən kələmərd, hövsələsiz.
Yer mənim, lehmə mənim, vışka mənim, neft sənin,
Beləliklə, düzələr müşkül işi hər kəsənin.

Mənim olsun suları, çayları bu dəryanın,
Balığı, ikrası olsun a dayı, qurbanın.
Muğanın çölləri, səhrası mənim, arxı mənim,
Pambığı al sənin olsun, kim olar söz deyənim.
O dəmir yollarının altı mənim, üstü sənin.
Yük vaqonları, klaslar, paravoz, tüstü sənin.
Varidatı sənin olsun, buna yoxdur sözümüz.
Poçtu da, gömrükü də al, veririk lap özümüz
Qoy Böyük şor duzu qalsın bizə bozbaş yeməyə,
Dilimiz olsun Azərbaycana bir söz deməyə.
Nə qədər misü-dəmir var, sənin olsun, nə sözüm!
Nə dənizdə, nə qıraqda əbədə yoxdu gözüm!
Əmri-fərman sənin olsun, onun icrası mənim,
Hər şeyin nəfi sənin, davası, qovğası mənim.
Can dayı, səndən ufaq bir diləyim var mənim.
Mən ölüm sanma ki, başqa kələyim var mənim.
Mənə bir avtomobil, bir gözəl ev, bir kabinet,
Ver ki, daim eləyim əmrinə qul tək xidmət.
Bizim el qorxma yatıbdır, yeri rahatdır ona
Ona gəl dəyməyinən, bir yekə minnətdir ona.

## DAYININ BACIOĞLUYA CAVABI

Bacıoğlu, a qırışmal, bu nə sözdür, nə kələk?
Aramızda a gədə, "sən" nə demək, "mən" nə demək?
"Bu sənin, o biri mənim" yazdığını anlamadım.
Sərhədindən dışarı sən deyəsən atdın addım.
Mən dayı, sən bacıoğlu, sən uşaq, mən yekəyəm,
Sən bir ovlaq kimi şeysən sürüdə, mən təkəyəm.

Görünür boşdu başın, yoxdu sənin mərifətin,
"Bölüşək" nə? A ədəbsiz, gicişir yoxsa ətin?
Naəlac oldum əzəldən sənə tapşırdım işi:
Çaşaraq yoxsa sanırsan özünü sən də kişi?
Sənə verdim kabinet, avtomobil, portfeli,
Əqlini aldı başından səni lap etdi dəli.
"Mən", "mənim" bir də desən, bax kəsərəm lap dilini,
Bir də dinsən verərəm qoltuğuna zənbilini.
Əbləh oğlu, səni qoydum ora huşyar olasan,
Tutasan göz qabağın, bir uca divar olasan.
Arxada mən işimi sazlayım, əncama salım,
Azəri türklərini qafil edib damə salım.
Əbləhanə bu xəyalatı başından uzaq et!
Gecə ye bozbaşını, iç çayını, get işə yat!
Yer mənim, neft mənim, kənd ilə xırman da mənim.
Qəsəbə, şəhr mənim, bağ ilə gülşən də mənim.
Ortağım yoxdu dənizdə, quruda, dağ-daşda,
Bir özün yaxşı düşün, var isə ağlın başda?
Sən özün, varü-yoxun, əhlü-əyalın da mənim,
Baxışın, tərpənişin, fikrü xəyalın da mənim.
Adə russan? Malorus, ermənisən? Sarsaq adam,
Səni millət sanaraq qeydinə bir zərrə qalam?
Sən unutma ki, mənim bəndeyi-fərmanımsan!
Əmrimə etsən itaət, gözəl oğlanımsan!
Sözümə baxmasan, onda çəkərəm Moskvaya!
Səni də bənd edərəm adı görünməz yuvaya.

## OĞLUM ƏHMƏD TOFİQƏ VƏSİYYƏTİM

Bizim də ölkədə Əhməd, gələr bir oylə zaman,
Hüquqa malik olur millət, gülür vətənim.
Hüquq-hüquq nə gözəl şey! Yetişməz isə əlim,
Mən ölmüş olsam, unutma hüquqa həsrətimi,
Qızıl qüyuddə mənən çəkən əziyyətimi.
O gün məzarıma qoş! Sanma bir ovuc xakəm
O gün vürudunu gözlər o xaki-qəmnakim.
Qoşub məzarıma ver Əhmədim, bəşarətini
Duyar qubarım inan giryeyi-səadətini.

## ƏLİQULU QƏMKÜSAR
(1880 — 1919)

### EYLƏMƏ QƏM

Eyləmə qəm, ey başıboş bambılı.
Dümbəyi çal, düşgilə meydanə sən.
Mütribə, cindarə, meyə səp pulu,
Sərf eləmə başqa bir ehsanə sən.

Gündə həna bağlagilən yalına,
Açma gözün, baxma bir öz halına.
Cəlb elə ənzarı yoğun şalına,
Eylə səfər ildə Xorasanə sən.

Tazəbatazə elə siğə, nikah
Bilgilən icrayi-təlaqi mübah.
Feyz qazan kəndinə şamü sabah,
Fövt eləmə ömrünü əfsanə sən.

Səy eləyib başına topla mürid,
Mədrəsəni, məktəbi et napədid.
Qoyma açılsın bir üsuli-cədid,
Görmə rəva elmi müsəlmanə sən.

Başını qırxdırgilən, həm pak elə,
Diqqət elə, qoymagilən tük gələ.
Salma bu dünyada özün əngələ,
Dik gözünü cənnəti-rizvanə sən.

Qız götürüb qaçmağı bil çox hünər,
Dərdin ola vermə təbibə xəbər.
İncimə üz versə qəzavü qədər,
Eylə fəda canını cananə sən.

### HARDA DÜŞÜR

Harda düşür, vur şitil iranlıya,
Pampaca sal hər mitil iranlıya.

Baxma ki, təbrizlidi, tehranlıdı,
Rəştlidi, qəzvinlidi, zəncanlıdı,

Eylə ki, gördün diridi, canlıdı,
Boynuna dırmaş, səril iranlıya.

Xoyluya, salmaslıya bel bağlama,
Ölsə mərəndli, gününə ağlama,
Yəzdlidən ötrü ürəyin dağlama,
Rəhm eləmə, zir-zibil iranlıya.

Qılma nəzər onlara insan kimi,
Bağrına basma oları can kimi,
Hansı biri çeşminə çarpan kimi,
Qeyz ilə söylə: itil, iranlıya.

Qorxma, əzəldən kötəyə öyrənib,
Hər yetən ovsarlayıb axır minib,
Qeyrətinin məşəli çoxdan sönüb,
Birdi söyüş, yağlı dil, iranlıya.

Şiədi, dünyada cəlal istəməz,
Elm oxumaz, fəzlü kamal istəməz,
Cənnətə müştaqdı, mal istəməz,
Kövsər olub səlsəbil iranlıya.

Sal sixəki[1], qoy yıxıla palçığa,
Vur, təpik altında bulaşsın zığa,
Baxmaz, əgər çıxdısa aydınlığa,
Yalvarasan yüz min il iranlıya.

Boş tutasan, alsa ayaq üstünə,
Üz verəsən, büzsə dodaq üstünə,
Şər atacaq onda bayaq üstünə,
Yüz dəfə get, sən əyil iranlıya.

Yaxşı Səməd xan başarır fəndlərin,
Odlara qurban eləyir kəndlərin,
Qorxmasalar, keçsələr sərhədlərin,
Söyləmək olmaz; "çəkil!" - iranlıya.

Görmədin osmanlıların başına
Əngəl açıb qatdılar su aşına?
Zülm eləmək qardaşı qardaşına
Sənət olub səngdil iranlıya.

Gördü əzirlər yazığın baş-gözün,
Qeyrətə gəldi, bu da dürtdü özün,
Fövri soxub ortaya sərhəd sözün,
Hökm elədi gir, təpil, iranlıya.

---

[1] Sixəki salmaq — boynuna şillə vurmaq.

Aləmi-islama vurub min ləkə,
Sünnüyə yanmaz ürəyi bir tikə,
Türk adı yanındaca hər kəs çəkə,
Güllə vurur, eylə bil, iranlıya.

## ƏLABBAS MÜZNİB
(1882 — 1938)

### ATA OĞULA DEYİR

Yat, cocuğum durma, yat, elm adını boşla, yat,
Yat, yat, oğul, yat, hələ dillənmə, yat!

Qeyrə baxıb durma, həvəslənmə,yat,
Sübh deyil, bax ki, xoruz bannamır,
Qarğa ilə xalq xoruzu annamır,
Başqanı səntək atası dannamır.
Yat, yat, oğul, yat, hələ dillənmə, yat,
Qeyrə baxıb durma, həvəslənmə, yat,

Məhdi-cəhalətdə yatıb eylə naz,
Durma vurulsa belinə gər buraz,
Açma gözün başına dəysə qapaz,
Yat, yat, oğul, yat, hələ dillənmə, yat,
Qeyrə baxıb durma, həvəslənmə yat!

Kəllənə zor ilə döyə əcnəbi,
Qardaşına kəşf eləmə mətləbi,
"Xan məni dindirdi" de sən, ay səbi,
Yat, yat, oğul, yat, hələ dillənmə, yat,
Qeyrə baxıb durma, həvəslənmə yat!

Mömin olan şəxs gərək xar ola,
Həm döyülə, həm söyülə, zar ola,
Ac ola, susuz ola, murdar ola,
Yat, yat, oğul yat, hələ dillənmə, yat,
Qeyrə baxıb durma, həvəslənmə, yat!

Elmü ədəb, məktəbü sənət nədir?
Bir-birə qardaş deyə rəğbət nədir?
Sidqü səfa, mehrü məhəbbət nədir?
Yat, yat, oğul, yat, hələ dillənmə, yat,
Qeyrə baxıb durma, həvəslənmə,yat!

## AĞRIN ALIM

Ağrın alım, boynu qıraxmallı bəy,
Bəsdi sataşdın yekəsaqqallara.
Rövzəxana, mollaya etmə hənək,
Dəymə dəxi unçuya, baqqallara.

Sən get öz əngəllərini pak elə,
Baqqalın eybi hamıya faşdır.

Qoyma ki, sirrin düşə dildən-dilə,
İşləriyin cümləsi bozbaşdır.
Məslək, əfkar və kəsbi-məram,
Həpli-həpodur hamısı, vəssalam.

Rumka, matuşka, kafe-şantan, qumar,
İntelligent bundan ibarət deyil?
Əyri dolaş, kizb, kələk hər nə var
Bunlar hamı bizlərə adət deyil?

Dərdin alım, boynu qıraxmallı bəy
İndi gəlib millətə oldun kəfil?
Getdin İranda niyə qurdun kələk?

## MƏRSİYƏXAN DEYİR

A qəzetçi, de görüm: Molla filanam, sənə nə?
Mey içən, bəng çəkən, gündə piyanam, sənə nə?

Kimdir ol təyin edən üstümə qəyyum səni?
Tasquranəm, sənə nə, falabaxanam, sənə nə?

Dut ki, hər gün gedərəm Rəştdə həmmamə gecə,
Maladoy dəllək üçün dam quranam, sənə nə?

Eylə bil sağ ili toylarda edərdim lotuluq,
Gəlcəyin mahi-əza mərsiyəxanam, sənə nə?

Bircə fikr et ki, bəşərzadə deyil mərsiyəxan?
Nəfsi-əmmarə[1] əlində həmədanam[2], sənə nə?

İndi ki, milləti-islam sevirmiş yalanı,
Təpədən-dırnağacan kizbü yalanam, sənə nə?

Bəs qoyur Mirzə Həsən rumkanı əmmaməsinə,
Dinməyirsən, deyirəm: gündə piyanam, sənə nə!

---

[1] Nəfsi-əmmarə — şəhvət düşkünü, şəhvət hissi.

[2] Həmədan — hər şeyi bilən.

***

Azərbaycan çəlik qollar bağçası,
Bakıxanlar güzarıdır bu ölkə.
Məhəmməd xan, Əhməd xanlar məskəni
Cavad xanlar məzarıdır bu ölkə.

Turan irqi bu ölkədə boy atmış,
İyidliyin sancığını ucaltmış,
Dünyaları qeyrət ilə donatmış
Qəhrəmanlar peykarıdır bu ölkə.

Mədənləri fironları qudurtdu,
İsgəndəri uzaq yerdən gətirtdi,
Nüşabəni, Sədanları böyütdü,
Sərkərdələr qəmxarıdır bu ölkə.

Turan soyu başqa soya qarışmaz,
Qul olmağa heç bir zaman alışmaz,
Qucağında yad tutmağa çalışmaz,
Düşmənlərin əğyarıdır bu ölkə.

Moskovlular gözlərini yumdular,
Turanlıya barbar deyə cumdular,
Pozuldular, axır geri döndülər,
Xırsızların qəhharıdır bu ölkə.

Məbudumuz üç boyalı bayrağı,
Kəbəmizdir hər bir ovuc torpağı,
Sevməz bu yer hər xaini, alçağı,
Doğruların asarıdır bu ölkə.

*(Bu mətnə Üzeyir Hacıbəyli musiqi bəstələmiş, 1918-ci ildə Azərbaycanın dövlət himni kimi təklif olunmuşdur.)*

## FƏRYAD

Vətən bərbad olub getmiş cəfavü cöhr ilə badə.
Qalıb heyrətdə aləmlər bu ahə, boylə fəryadə.

Vətən süngülər üstündə, əsir olmuşdur övladı,
Vurulmuş azərilər boynuna atəşli qəlladə.

Vətəndə daşnaq ilə bolşeviklər əlbir olmuşlar,
Qırırlar ölkənin aşiqlərin dəryadə, səhradə.

ÇEKA-yla tribunallar etdiyi təqdirə gəlməzdir
Qızıbdır gözləri, dönmüşdür onlar əsl səyyadə.

Dənizlər dolu insan nəşiylə bir görən yoxmu?
Şahidani-vətən fəryadıdır ol ərşi-əladə.

Nəcabət sahibi əl qoltucunda qalmış avarə,
Qul olmuşdur gəda oğlu gədayə şahü şahzadə.

Atasından xəbərsiz tülkülər meydan sular, ya rəb!
Belə gündə Koroğlular, Ziyadxanlar gəlir yadə.

Qoyub vicdanını, namusunu hərracə alçaqlar,
Dönüblər hiyləgər cəlladə, bir quyruqlu həmzadə.

Həqiqət pərdədə qalmaz, bunu isbat edib tarix,
Nərimanlar, Qarayevlər qala bilməz bu sövdadə.

Cahanda çox olub qan təşnəsi talan edib xəlqi,
Və lakin görməmiş kimsə belə talan bu dünyadə.

Bu zülmü, bu cəfanı seyr edən kəslər oxur rəhmət,
Yezidə, Şümrə, Firona, bəla timsalı Şəddadə!

İşilə sözləri düz gəlməyən rəhbər adın almış,
Atır Şərq ilə Qərbə əl cahangirlik təmənnadə.

Pyotr məqsədin gizlər, üzü əlvan, içi al qan.
Dilər sahib ola İstanbula, Tehrana, Bağdadə.

Əmin ol, ey millət, satan biara bivicdan,
Sizi qoymaz yedi-qüdrət bir öylə təxti-bəladə!

Gələr bir gün, yenə təmin-istiqlal edə millət,
Görərsən nəşini itlər önündə xarü üftadə.

O şanlı günləri mən görməsəm də, ey cavan nəslim,
Olun təbrik üçün siz də mənim ruhumla amadə!

Ümidi verməyin əldən, dözün, ey gözlərim nuri,
Keçirsəz də bəlalı günləri tufanda, qovğadə.

Vətən həsrətilə göz yumub getsəm, salın yadə,
Olarsa torpağım burda və yainki Sibiryadə!

## SALMAN MÜMTAZ
(1884 — 1938)

### BU DA YAHU, KEÇƏR

Qonşuların elmə həvəskar ola,
Tibb oxuya, fənnə xəbərdar ola,
Leyk müsürman gedə cindar ola
Dinmə, danışma, bu da yahu, keçər.

Rus minə ominibosu, seyr edə,
Nems minə derjabili teyr edə,
Molla Cəfər həmzadı təxsir edə,
Dinmə, danışma, bu da yahu, keçər.

Xivə xanı saxlaya altmış bala,
Sim bədən, zəhrəcəbin, göz ala,
Məsti-meyü şəhvət olub dal qala,
Dinmə, danışma, bu da yahu, keçər.

Əbdüləhəd xan sata milləti,
Badə verə namus ilə qeyrəti,
Puç eyləyə Rusiyyədə sərvəti,
Dinmə, danışma, bu da yahu, keçər.

Kərpic atan millətə salar ola,
Qatır satan ləşkərə sərdar ola,
Sırf avam şəxs süpəhdar ola
Dinmə, danışma, bu da yahu, keçər.

Layihə təqdim edə İngiltərə,
Hökm verə zabitə, həm əsgərə,
Daxil edə Ləngə ilə Bəndərə,
Dinmə, danışma, bu da yahu, keçər.

Hacı Məmiş ayda bir arvad ala,
Keyf eyləyə, işrət edə, dad ala,
Xansənəmi boşlaya, Pərzad ala,
Dinmə, danışma, bu da yahu, keçər.

Bəylərimiz qasdinara keyf edə,
Dəstə ilə fahişəni zeyf edə,
Verməyə pul millət üçün heyf edə,
Dinmə, danışma, bu da yahu, keçər.

İntelligentlər gəzələr naz ilən,
Gülşənara dilbəri-tənnaz ilən,
Evdə qala Gülpəri Çimnaz ilən,
Dinmə, danışma, bu da yahu, keçər.

## BİR TULUQ

*"O mələkzadəni mütləq sevirəm".*

***Xalidbəy Səbribəyzadə***

Şeri-Cavidi görüb gülmüş idim,
Demə, biçarədə yoxdur təqsir.
Qəhqəhəylə uğunub ölmüş idim,

Səbribəyzadədən imiş təğyir,
Bən onu çox sevirəm, gop sevirəm.

Yeni şair, o müdiri-məğlub,
Görmüşə gülmüşü qılmışdı rədif,
Gərək, əlbəttə, dəyişsin üslub,
Qaba Qafqaz dilin etsin də zərif,
Bən onu gop sevirəm, çox sevirəm.

Gör nə xoş qafiyələr işlətmiş:
Diqqət et, ağlayaraq, sallayaraq,
Üdbayə dodağın dişlətmiş,
İki dedim, iki dedin sayaraq,
Bən onu gop sevirəm, gop sevirəm.

Heyfsən, qəti-ümid etmə, gözüm,
Sən ki, varsan, səmər eylər Qafqaz,
Hər söz ilə dəlirib, bitmə, gözüm,
Dediyin, işlədiyindir dəmsaz,
Səni bən çox sevirəm, çox sevirəm.

Kədərim yox, sevərim bən səni çox,
Gözəlim, noəməlim, bibədəlim,
Şüəra çeşminə əşarını sox,
Sən xuram et, dalıdan bən də gəlim,
Səni bən hey sevirəm, gop sevirəm.

## ƏLİ RAZİ ŞƏMÇİZADƏ
(1888 — 1938)

### TÜRKLƏR

Ol qoçaq iranlılar,
Ol igit osmanlılar,
Qılıncları qanlılar,
Səhrası heyvanlılar,
Milləti nadanlılar,
Qırmızı fəsli türklər,
Qara qotazlı türklər,
Yekə ip papaqlılar,
Cübbəsi büzməlilər
Aləmə səs saldılar,

Məşrutəni aldılar.
Bir-birini çaldılar,
Qırılıb azaldılar,
Uzanıb ucaldılar,
Rüstəmdilər, Zaldılar,
Qırmızı fəsli türklər,
Qara qotazlı türklər,
Yekə ip papaqlılar,
Geyməsi büzməlilər.
İstanbulda bir arvad
Üzündən atıb çarqat,
Polis görcək qalıb mat,
Deyib: ay alçaq, bədzat,
Üzə niqabını at.
Arvadlar üçün heyhat
Verə bilməz müsavat
Qırmızı fəsli türklər,
Qara qotazlı türklər,
Yekə ip papaqlılar,
Geyməsi büzməlilər.
Məşrutə mərdan üçün
Verildi oğlan üçün,
Nəinki nisvan üçün,
Molla və bəy-xan üçün!
Nəinki dehqan üçün,
Bir neçə nadan üçün!
Qırmızı fəsli türklər,
Qara qotazlı türklər,
Yekə ip papaqlılar,
Geyməsi büzmə tatlar.
Hərçənd bu dünyada,
Hətta ki, Avstriyada
Müsəvat var arada,
Həm kişi, həm arvada
Eylə olmaz burada,
Arvad matəmsəradə.
Qırmızı fəsli türklər,
Qara qotazlı türklər,
Yekə papaqlı tatlar,
Başı çanaqlı tatlar.
Deyir: osmanlı, həm tat:
Hürriyyətü müsavat,

Hüquqü ixtiyarat,
Arvadları kənar at,
Bunlar kişi üçündür,
Verə bilmərik heyhat...
Qırmızı fəsli türklər,
Qara qotazlı türklər,
Yekə papaqlı tatlar,
Çox qanacaqlı tatlar.
Arvad məgər insandır?
Üzü yoluq heyvandır,
Saçı uzun bir candır,
Ağlı gödək, nadandır,
Arvad yeri zindandır,
Di gəl bunlara qandır!
Qırmızı fəsli türklər,
Qara qotazlı türklər,
Yekə papaqlı tatlar,
Kirli, pasaqlı tatlar.

## MƏSLƏHƏT

*Məşədi Sijimquluya cavab*

Sijimqulu, eyləmisən məsləhət,
Utanma heç, gəl, səni evləndirim.
Eyləmişəm istixarə yaxşıdır,
Beş-on günə, gəl səni evləndirim

Məşdi Səfdər qızı sənə verməsə,
Qızıl, gümüş, paltar, palaz istəsə,
Toy xərcinə əgər gücün yetməsə,
Düzəldərəm, gəl, səni evləndirim.

Bir qız alım mən sənə tərlan kimi,
Ahubaxış, işvəli ceyran kimi,
Gözəl -göyçək, qönçeyi xəndan kimi,
Tez ol durma, gəl, səni evləndirim.

Saqqalına gecə həna bağlasın,
Başın keçəl olsa, yusun, yağlasın.
Kötəkləsən, uşaq kimi ağlasın,
Qoy ağlasın, gəl, səni evləndirim.

Hər yan molla, nikahiniz müftədir,
Əgər versən, təmənna bir küftədir,
Çətinliyi sənə bircə həftədir,
Xoşun gəlsə, gəl, səni evləndirim.

Əgər yoxdu pulun, pul da taparam,
O məhləyə, bu məhləyə çaparam,
Sənə özüm bir pullu toy yaparam,
Qəm eləmə, gəl, səni evləndirim.

Yığışarlar toya hamı cavanlar,
Kablayı, məşədi, həmi də xanlar,
Mütrüb oynar, hamı ləzzətin annar.
Bax sözümə, gəl, səni evləndirim.

Nədir bizlərdə çox balaca qızlar,
Nəyə lazım otuz yaşlı Tükazlar?
Allah özü çətin işləri sazlar,
Dəxi durma, gəl, səni evləndirim.

# TÜRKİYƏ ŞAİRLƏRİ

## YƏHYA KAMAL BAYATLI
(1884 — 1958)



*XX əsr Türkiyə ədəbiyyatının ən önəmli simalarından olan Yəhya Kamal Bayatlı divan ədəbiyyatına, əruz vəzninə sadiq qalmaqla bərabər bu biçimdə, bu vəzndə tamamilə yeni mətləbləri ifadə etməyi bacarmış, türk şerini neoklassik motivlərlə, duyğusal və fəlsəfi tapıntılarla zənginləşdirmişdir.*

### AKINÇI

Min atlı, axınlarda cocuqlar kimi şəndik
Min atlı, o gün dev kimi bir ordunu yendik!
Ağ tolqalı bəylərbəyi hayqırdı, irəllə!
Bir yaz günü keçdik Tunadan qafilələrlə...
Şimşək kimi bir səmtə atıldıq yeddi qoldan
Şimşək kimi türk atlarının keçdiyi yoldan.
Bir gün dolu düzgün boşanan atlarımızla
Yerdən yeddi qat ərşə qanatlandıq o hızla...
Cənnətdə bu gün gülləri açmış görürüzdə
Hala o qızıl xatirə titrər gözümüzdə!
Min atlı, axınlarda cocuqlar kimi şəndik
Min atlı, o gün dev kimi bir ordunu yendik!

### AÇIQ DƏNİZ

Balkan şəhərlərində keçərkən cocuqluğum
Hər ləhzə bir alov kimi həsrətdi duyduğum.
Qəlbimdə vardı Bayronu bədbəxt edən məlal

Gəzdim o yaşda dağları, xülyam içində lal.
Aldım Rakofça qırlarının hürr havasını
Duydum axınçı cədlərimin ehtirasını.
Hər yaz şimalə doğru əsrlərcə bir qoşu
Bağrımda bir əks kimi qalmış uğurtulu...
Məğlubkən ordu, yaslı dururkən bütün vətən
Röyama girdi hər gecə bir fatihanə zənn.
Hicrətlərin baqiyyəsi hicranlı duyğular
Məhzun hüdudların ötəsindən axan sular
Gönlümdə həp o zənnlə bərabər çağıldadı
Bildim nədir üfüqdəki sonsuzluğun dadı!
Bir gün dedim ki, istəməm artıq nə yer, nə yar
Çıxdım sürəkli qürbətə, gəzdim diyar-diyar.
Getdim o diyara ki, sərhəddidir əsrin,
Hala dilimdədir duzu əngin dənizlərin!
Qərbin ucunda, son qıyıdan ən gurultulu
Bir mədzamanı, göy üzü qurşunla örtülü
Gördüm dəniz dedikləri min başlı əcdəri
Gördüm gözəl vücudunu zümrüdləyən dəri
Kəskin bir örpərişlə qımıldadı anba-an
Baxdım və anladım ki o əcdərdi canlanan.
Sonsuz üfüqdən ah o nə coşqun gəlişdi o!
Birdən nasıl toparlanaraq kükrəmişdi o!
Yelkən, vapur, nə varsa qaçışmış limanlara,
Yalnız onundu qosqoca meydan və mənzərə.
Yalnız o qalmış ortada, asi və bağrı xun,
Min mağara ağzı açmış ularkən uzun-uzun.
Sezdim bir aşina kimi heybətli hüznünü!
Ruhunla qarşı qarşıya qaldım o med günü
Şevqanə dinlədim, əzəli müztərib dəniz!
Duydum ki, ruhumuzla bu qürbətdə sən dəniz.
Dindirməz anladım bunu heç bir gözəl qıyı
Bir bitməyən susuzluğa bənzər bu ağrıyı.

## SƏSSİZ GƏMİ

Artıq dəmir almaq günü gəlmişsə zamandan
Məchula gedən bir gəmi qalxar bu limandan...
Heç yolçusu yoxmuş kimi səssizcə alır yol:
Sallanmaz o qalxmışdı nə məndil, nə də bir qol.
Rıhtımda qalanlar bu səyahətdən ələmli
Günlərcə siyah üfüqə baxar gözləri nəmli.
Biçarə könüllər! Nə gedən son gəmidir bu!

Hicranlı həyatın nə də son matəmidir bu!
Dünyada sevilmiş və sevən nafilə bəklər
Bilməz ki, gedən sevgililər dönməyəcəklər
Bir çox gedənin hər biri məmnun ki yerindən
Bir çox sənələr keçdi: dönən yox səfərindən.

## BİR TƏPƏDƏN

Röya kimi bir axşamı seyr etməyə gəldin
Çox bənzədiyin məmləkətin hər təpəsində.
Baxdım: qonuşurkən daha bir kərrə gözəldin
İstanbulu duydum daha bir kərrə səsində.

İrqin səni iqliminə bənzər yaradırkən
Qaç fəthə qoşan tuğlar üfüqlərdə yarışmış.
Tarixini əks etdirə bilsin deyə çöhrən
Qaç fatehin altun qanı mərmərlə qarışmış.

## RİNDLƏRİN AXŞAMI

Dönülməz axşamın üfüqündəyiz, Vaxt çox gec.
Bu son fəsildir ey ömrüm. Nasıl keçərsən keç!
Cahana bir daha gəlmək xəyal edilsə belə
Ovunmaq istəməyiz oylə bir təsəlliylə.
Geniş qanadları boşluqda simsiyah açılan
Və arxasında günəş doğmayan böyük qapıdan
Keçincə başlayacaq bitməyən sükunlu gecə.
Qüruba qarşı bu son baxçalarda, keyfincə.
Ya şövq içində xərab ol, ya eşq içində könül!
Ya lalə açmalıdır köksümüzdə, yaxud gül!

## RİNDLƏRİN ÖLÜMÜ

Hafizin qəbri olan baxçada bir gül varmış
Yenidən hər gün açarmış qanayan rəngiylə
Gecə, bülbül ağaran vaxta qədər ağlarmış
Əski Şirazı xəyal etdirən ahəngiylə.

Ölüm asudə bahar ölkəsidir bir rində,
Könlü hər yerdə buhurdan kimi illərcə titrər.
Və sərin sərvlər altında qalan qəbrində
Hər səhər bir gül açar, hər gecə bir bülbül ötər.

## ƏNDƏLİSDƏ RƏQS

Zil, şal və gül.Bu baxçada rəqsin bütün hızı...
Şövq axşamında Əndəlis üç dəfə qırmızı...
Eşqin sehirli şərqisi yüzlərcə dildədir
İspaniya nəşəsiylə bu axşam bu zildədir.
Yelpazə çevrilir kimi birdən dönüşləri,
İşvəylə devriliş, saçılış, örtünüşləri...
Hər rəngi istəməz gözümüz, indi aldadır.
İspaniya dalğa-dalğa bu axşam bu şaldadır.
Alnında halqa-halqa aşüftə kakülü
Köksündə yosma Qrenadanın ən gözəl gülü
Altun qədəh hər əldə, günəş hər könüldədir
İspaniya varlığıyla bu axşam bu güldədir.
Rəqs ortasında bir durub oynar, yürür kimi
Bir baş çevirməsiylə baxar-öldürür kimi
Gül tənli, al dodaqlı, kömür gözlü, sürməli...
Şeytan deyir ki, sarmalı, yüz kərrə öpməli
Gözlər qamaşdıran şala, məftun edən gülə
Hər qəlbi dolduran zilə, hər sinədən: "Ole!".

## BƏBƏK QƏZƏLİ

Nə qaldı ruha təsəlli şərabdan başqa
Boğazda üç gecəlik mehtabdan başqa.
Cahanda olmadı bir hisseyi-vərasətimiz
Bəbək köyündə təmaşeyi-abdan başqa.
Bu xalqa vəqf edəcək mülki malımız yoxdur
Beş on qəzəllə bu qəlbi-xarabdan başqa.
Sükuni-layətenahiyə varmamız yeydir
Nədir həyat uzanan iztirabdan başqa.
Fələkdən istəməyiz yer üzündə varsa huzur
Kamal əmti xamuşanda xabdan başqa.

## QAR MUSİQİLƏRİ

Min ildən uzun bir gecənin bəstəsidir bu
Min il sürəcək zənn edilən qar səsidir bu.
Bu kuytu manastırda dualar kimi qəmli
Yüzlərcə ağızdan xoro halında devamlı
Bir ərqanun ahəngi yayılmaqda dərindən...

Duydumsa da zövq almadım Slavyan kədərindən.
Zehnim bu şəhərdən, bu devirdən çox uzaqda
Tənburu Cəmilbəy çalıyor əski plakda.
Birdən-birə məsudam eşitmək həvəsiylə
Könlüm dolu İstanbulun ən özlü səsiylə.
Sandım ki, uzaqlaşdı yağan qar və qaranlıq
Uyğumda bütün bir gecə Körfəzdəyəm artıq.

## AXŞAM MUSİQİSİ

Qəndillidə, əski baxçalarda
Axşam qapanınca pərdə-pərdə
Bir xatirə zövqü var kədərdə.

Artıq nə gələn, nə bəklənən var.
Tənha yolun ortasında rüzgar
Təşrin yarpaqlarıyla oynar.

Getdikcə dərinləşir saatlar,
Riqqətlə, yavaş-yavaş və yer-yer
Səssizlik daima irəllər.

Ürpərmə verir xəyala sıx-sıx
Hər bir qapıdan girən qaranlıq
Çox bəlli ayaq səsindən artıq.

Gözlərdən uzaqlaşdıqca dünya
Min bir gecədən birində guya
Başlar röya içində röya.

## DƏNİZ TÜRKÜSÜ

Dolu rüzgarla çıxıb üfüqə gedən yelkənli!
Gedişin seçdiyin axşam saatından bəlli.
Ömrünün keçdiyi sahildən uzaqlaşdıqca
Və xəyalında doğan aləmə yaxlaşdıqca
Dalğa qıvrımları ardında böyük tənhalıq
Başqa bir çərçivədir get-gedə dünya artıq.
Daldığın məhvəri getdikcə sarar başqa ziya
Mavidir hər tərəf. Üstün-gecə. Altın-dərya.
Yol da bənzər həm uzun, həm də gözəl bir masala
O saatlar ki keçər baş-başa ulduzlarla.
Lakin az sonra ləziz uyğu bir əncama varır

Xilqətin gördüyü röya bitər, ətraf ağarır.
Som gümüşdən sular üstündə gedərkən irəli
Ta uzaqlarda şəfəq bir-bir açar pərdələri.
Musiqisiylə bir aləm kəsilir çalxantı
Və nəhayət görünür göy və dəniz səltənəti.
Girdiyin aynada keçmiş kimi digər kürəyə
Sorma bir saniyə, şübhəylə, saqın: "Yol nərəyə?"
Ayılıb nəşənin yüksəldici sərxoşluqdan
Yılma qorxunc uçurum zənn edilən boşluqdan.
Duy təbiətdə sən də bir az ilah olduğunu
Ruh verər varlığının zövqünə duymaqla bunu.
Çıxdığın yolda bu gün yelkən açıq, yapyalnız
Gözlərin arxaya çevrilməyəcək, pərvazsız.
Yürü! Hürr maviliyin bitdiyi son həddə qədər
İnsan aləmdə xəyal etdiyi müddətcə yaşar.

## HÜZN VƏ XATİRƏ

Qürbətdə duyduğum sonu gəlməz hüznləri
Yarpaqların töküldüyü hicranlı günləri
Andım birər-birər, acıdım kəndi halıma
Əks etdi bir dəqiqə uzaqdan xəyalıma
Tənha Əmirqanın Çinaraltında qəhvəsi
Poyrazla söyləşir kimi yarpaqların səsi.
Həm başqa, həm də xeyli yaxın qarşı məbədə
Mərmərlə Qaplıçeşmədə, mövzun kitabədə
Baxtım Yesari xatlarının bir nəfəsinə
Daldım coşub gedən dənizin musiqisinə.

## ŞƏRQİ

Dün qəhqəhələr yüksəliyorkən evinizdən
Məndim keçən, ey sevgili, sandalla dənizdən.
Könlümlə uzaqlarda bütün bir gecə sizdən,
Məndim keçən, ey sevgili, sandalla dənizdən.

Dün bəzminizin bir əzəli nəşəsi vardı,
Saz səsləri ta fəcrə qədər körfəzi sardı.
Vəqta ki sular şərqilər inlərkən ağardı,
Məndim keçən, ey sevgili, sandalla dənizdən.

## BAĞÇALARDAN UZAQ

İstəməm artıq işıq, rayihə, rəng aləmini,
Qoxlamam yosma qərənfillə gözəl yasəməni.
Məni bir ləhzə müsaid bulamaz idlalə,
Nə bəyaz bakirə zanbaq, nə atəşdən lalə.
Bəkləməm fəcrini leylaklar açan nisanın,
Özləməm vaxtını dağdağ qızaran ərqüvanın.
Hər sabah başqa bahar olsa da mən uslandım,
Uğramam baxçaların səmtinə güldən yandım.

## KEÇMİŞ YAZ

Röya kimi bir yazdı. Yaratdın həvəsinlə,
Hər anını, hər rəngini, hər şerini yazdan.
Hala doludur baxçalar ən dadlı səsinlə
Bir gün, bir uzaq xatirə özlərsən o yazdan.

Körfəzdəki dalğın suya bir bax, görəcəksən:
Keçmiş gecələrdən biri durmaqda dərində;
Mehtab... iri güllər... və sənin ən gözəl əksin...
Vəlhasil o röya duruyor yerli yerində!

## GECƏ

Qəndili üzərkən uyğularda
Mehtabı sürüklədik sularda.
Bir yolda parıldayan gümüşdən
Getdik, bəhs açmadıq dönüşdən.
Xülya təpələr, xəyal ağaclar
Durğun sularda dinlənən yamaclar...
Mövsim sonu oylə bir zaman ki,
Qaib bir musiqiydi sanki.
Getmiş, qeyb olmuşuz uzaqda...
Röya sona ermədən şəfəqdə...

## ƏSKİ MUSİQİ

Çox insan anlayamaz əski musiqimizdən
Və ondan anlamayan bir şey anlamaz bizdən.
Açar bir altun anaxdarla ruh üfüqlərini
Həmən yayılmağa başlar səda və nur axını.

Və səslənir böyük İtri, səmanı örtən ruh
Peşində dalğalanır bəstəsiylə Seyyid Nuh.
O mutlu devrədə İtriyə ən yaxın bir dost
İşıqlı dantelələr bəstəkarı Hafiz Post...
Bu nəslin ortada dahicədir başladığı iş,
Vətən nasıl qarışır musiqiylə, göstərmiş.
Bu yaz kamançanı bir dinlədinsə Qanlıcada
Baharda bir gecə tənburu dinlə Çamlıcada.
Bu sazların duyulur hər telində sadə vətən
Sehirli rüzgar əsər daima bu torpaqdan.
Əvət bu əski nəsil bir şərəfli aləm açar,
Duyuşda incə zamanlardan inkiraza qədər.
Yüz əlli il sıra dağlar birər-birər ucalır
Və aqibət Dədənin anlı-şanlı devri gəlir.
Bu musiqini o son qüdrətiylə parlatdı
Ölüncə, ölkədə bir möhtəşəm günəş batdı.

## BÖYÜ ŞER

Parisdə gənc ikən koyu Bodlerpərəst idim
Balkonla, Yolculuqla, Gözəlliklə məst idim.
Sinmişdi şeri ruhuma, ülvi kədər kimi
Absentə damla-damla sızan bir şəkər kimi.
Xülyasının yaratdığı iqlim o başqa yer
Gur dəfnələrlə çevrili, afyonlu bağçalar.
Hər zövqü bir haram olan əfsunlu cənnətin
Qoynunda vardı ləzzəti min dürlü nemətin.
Bir gün vida edib o diyarın həyatına,
Döndüm bütün-bütün vətənin kainatına.
Lakin o bağçalarda keçən devrədən bəri
Qəlbimdə solmamışdır o şerin çiçəkləri.

## RÜBAİLƏR

Bilməm kimə, yaxud nəyə uyduq getdik
Gahi meyə, gahi neyə uyduq getdik
Ərbabi-zəka riyanı məzhəb bildi
Bizlər dəli-divanəyə uyduq getdik.

Yarəb, nə müsavatı, nə hürriyyəti ver
Hətta nə o yoldan gələcək şöhrəti ver
Həp nəşvə verən eşqi tərənnüm dilərəm
Yarəb, mənə bir səs yaradan qüdrəti ver.

İqbalə keçən xeyli tərəfdən öyülür
İbrarə düşən də hər tərəfdən söyülür
Axır öyülən, öyən, söyən birlikdəcə
Hər eyni dəyirmanda qarışmış döyülür.

Dünyada nə iqbal, nə sərvət diləriz
Hətta nə ada üqbada səadət diləriz
Eşqin gül açan, bülbül ötən vaxtında
Yaranla tərab, yar ilə vüslət diləriz.

Çıx, teyyi-zaman et, açılıb bir pərdə
Bir devr keçir istədiyin hər yerdə
Mən hicrət edib zəmanəmizdən, yaşadım
İstanbulu fəth etdiyimiz günlərdə.

## ƏHMƏD HAŞIM
(1885 — 1933)

*XX əsr Türkiyə şerinin görkəmli nümayəndələrindən biri də Əhməd Haşımdır. Nəsrdən fərqli olaraq şer dilinin anlaşılmaqdan artıq duyulmaq özəlliyini əsas sayan Əhməd Haşım poeziyasında sözün musiqi ahəngi, musiqi gözəlliyi daha önəmlidir.*

### SON BAHAR

Bir tərəf bağça, bir tərəfdə dərə
Gəl uzan sevdiyim mənimlə yerə.
Suyu yaquta döndərən bu xəzan
Bizi qərq eləyir düşüncələrə...

### HOVUZ

Axşam yenə toplandı dərində...
Canan gülüyor əski yerində.
Canan ki, gündüzləri gəlməz.

Axşam görünür hovz üzərində,
Mehtab kəmər tazə belində.
Üstündə səma gizli bir örtü,
Ulduzlar onun güldür əlində...

## YARI YOL

Nasıl istərsən oylə dinlə, baxın:
Dalların zirvəsindəyik ancaq.
Yarı yoldan ziyadə yerdən uzaq
Yarı yoldan ziyadə maha yaxın...

## ORMAN

Su deyil, mövsümün havası axan
Duyduğum yarpağın, dalın səsidir.
Suda ulduzların parıltısıdır
Bu qaranlıqda bazi-bazi çaxan...

## AĞAC

Gün bitdi, ağacda nəşə söndü,
Yarpaq atəş oldu, quş da yaqut.
Yarpaqla quşun parıltısından
Hovuzun suyu ərgüvana döndü...

## PİYALƏ

Zənn etmə ki, güldür nə də lalə
Atəş doludur, tutma yanarsan
Qarşında şu gülgün piyalə...

İçmişdi Füzuli bu alovdan,
Düşmüşdü bu iksir ilə Məcnun
Şerin sənə anlatdığı halə...

Yanmaqda bu sağərdən içənlər
Doldurmuş onunçün şəbi-eşqi
Başdan başa əfğan ilə nalə...

Atəş doludur tutma, yanarsan
Qarşında şu gülgün piyalə...

## BÜLBÜL

Bir qəmli xəyalın səhərində
İsrarə nə hacət yenə bülbül!

Bil, qəlbimizin baxçalarında
Can verdi sənin söylədiyin gül!

Sovrulmada gül indi havada,
Gün doğmada bir başqa ziyada.

## ŞƏFƏQDƏ

Dönsəkmi bu eşqin şəfəqindən,
Getsəkmi əkalimi ləyalə?
Bizdən daha əvvəl erişənlər
Ağlar bu gün əvvəlki xəyalə...

Dönməkmi? Nə mümkün geri dönmək
Düşdüysə gönüllər bu məlala?
Bir əldir üfüqlərdən uzanmış
Zülmət bizi çəkməkdə vüsala.

## QƏRƏNFİL

Yarın dodağından götürülmüş
Bir qətrə alovdur bu qərənfil
Ruhum acısından bunu bildi.

Düşdükcə vurulmuş kimi yer yer,
Qızğın qoxusundan kələbəklər,
Könlüm ona pərvanə kəsildi.

## NƏRDİVAN

Ağır-ağır çıxacaqsan bu nərdivanlardan
Ətəklərində günəş rəngli bir yığın yarpaq
Və bir zaman baxacaqsan səmaya ağlayaraq...

Sular qaraldı... Üzün pərdə-pərdə solmaqda,
Qızıl havaları seyr et ki, axşam olmaqda.

Əyilmiş ərzə, qanar, müttəsil qanar güllər...
Durur alov kimi dallarda qanlı bülbüllər...
Sularmı yandı? Nədən tunca bənzəyir mərmər?

Bu bir lisani-xəfifdir ki, ruha dolmaqda,
Qızıl havaları seyr et ki, axşam olmaqda...

## TƏXƏTTÜR

Bir Əcəm baxçası, bir səccadə,
Dolduran hovzu atəşdən badə
Nə qədər qəmli bu axşam vaxtı
Baxışın bənzəməyir mötadə.

Göy yaşıl, yer sarı, mərcan dallar,
Dalmış üstündəki quşlar yada
Bizə bir zövqü-təxəttür qaldı
Bu sönən, kölgələnən dünyada.

## PARILTI

Atəş kimi bir nəhr axıyordu
Ruhumla o ruhun arasından.
Bəhs etdi dərindən ona halım
Eşqin bu onulmaz yarasından.

Vurduqca bu nəhrin ona əksi
Qaçdım o baxışdan, o dodaqdan.
Baxdım ona səssizcə uzaqdan
Vurduqca bu eşqin ona əksi.

## BİR YAZ GECƏSİ XATİRƏSİ

İşvəylə, pıçıltıyla, gülüşlə
Olmuş şəbi-sevda yenə bixab.
Oxlar kimi saplanmada qəlbə
Düşdükcə səmadan yerə mehtab.

Busəylə kilidlənmiş ağızlar,
Gözlər nələr eylər, nələr işrab?
Uçmaqda bu atəşli havada
Vüslət dəmi bir quş kimi bitab.

## SÜVARİ

Bu bakır zirvələrin ardından
Bir süvari gəliyor qan rəngi.
Başlayır indi məlul axşamda
Son işıqlarla buludlar cəngi.

Bir bakır tasda alov indi hovuz
Suya saplandı qızıl mizraqlar.
Açılıb qıvranaraq göylərdə
Uçuyor parçalanan bayraqlar.

## BAŞIM

*Yaqub Qədriyə*

Bixəbər gövdəmə gəlmiş, qonmuş
Mütəheyyiç, mütəkəllis bir baş.
Ayırır sanki bu başdan ətimi
Ömrü ehrama müadil bir yaş!

Ürkərəm kəndi xəyalatımdan
Sanki qandır, saqqalımdan axıyor.
Bir qızıl çöhrədə atəş gözlər
Mənə guya ki içimdən baxıyor.

Bu cəhənnəmdə yetişmiş qafaya
Qanlı bir loğmandır ancaq mihənim.
Ah ya Rəbbi! Nasıl birləşdi
Bu çətin başla, bu suçsuz bədənim?

Dişi, dımaqları keçmiş ətimə
Gövdəm üstündə duran ifritin.
Bir kiçik ləhzeyi-arama fəda
Bütün alayışı nami sıytın!

## BİR GÜNÜN SONUNDA ARZU

Yorğun gözümün halqalarında
Güllər kimi fəcr oldu nümayan.
Güllər kimi... sonsuz iri güllər
Güllər ki, qamışdan daha nalan
Gün doğdu yazıq arxalarında.

Altun qüllələrdən yenə quşlar
Təkrarını ömrün edər elan.
Quşlarmıdır onlar ki hər axşam
Aləmlərimizdən səfər eylər?..
Axşam, yenə axşam, yenə axşam,
Bir sırma kəmərdir suya baxsam.
Axşam, yenə axşam, yenə axşam,
Göllərdə bu dəm bir qamış olsam.

## MİDHƏT CAMAL KUNTAY
(1885 — 1956)

### TÜRKÜN ŞAHNAMƏSİNDƏN

#### YURD DUYĞULARI

Düşməz yerə haşa, o, bizim bayrağımızdır,
Bir fəcr olaraq doğmadadır hər dağımızdan.
Ay ulduz o mazidəki bir süsdür, əmin ol
Atidə günəşlər doğacaq bayrağımızdan.

Altında yatarkən da bizimdir yerin üstü,
Bir qələ olur torpağımız, vəcdə gəlir də...
Dağlar, qayalar köksümüz üstündə təpinsə,
Düşmanları biz ram edəriz, qan kəsilir də.

Dəryaları qan, daşları bitməz gəmik olsa,
Min son nəfəsin eyni olub bitsə nəsimi,
Ölməz bu vətən, fərzi-muhal ölsə də hətta
Çəkməz kürrənin sırtı o tabutu cəsimi.

#### ƏSKİ BOĞAZİÇİ

Siz indi inanmazsınız amma, bu sərabın
Sahilləri var, ayları, ulduzları vardı.
Mən boylə deyildim, bu dəniz boylə deyildi
Bambaşqa bir aləmdi, qımıldardı, axardı.

Mehtabını yaxdıqca, əritdikcə xəyalım
Torpaqları maviydi, səmaviydi, gümüşdü.
Ulduzları alnımda, nigahımda birikmiş,
Sahilləri ömrümlə bərabər yürümüşdü.

Vaxtıyla bu hicranlı pərilər masalında
Hər kölgə bir insan qədər incəydi, dərindi.
Ormanlarının, dağlarının səltənətiylə
Hər aləmi könlüm kimi bir dərbədərindi.

Dünyaları bir fərd əvət oynatdı yerindən,
Sarsıldı dəmirlər əvət əzmin dəmirindən.

Mazi yıxılıb getdi əvət fəsli, qəfəsli;
Lakin bu günün ey qranit bünyəli nəsli,
Bir şey elə keçməz şərəfin sadə adından
Sən ərşi burax, varsa xəbər ver qanadından.
Göydən nə çıxar? Göy ha böyükmüş, ha deyilmiş,
Sən alnını göstər, nə qədər yüksələ bilmiş.
Göylər çıxa bildinsə, uça bildinsə dərindir,
Tarixini kəndin yazıyorsan - əsərindir.
Bəhs etmə bu gün sadə günün möcüzəsindən,
İnsan utanır sonra yarın kəndi səsindən.
Əsrin yaşamaq haqqını verməz sənə kimsə
Sən əsrini, üstündə izin varsa, mənimsə.
Bayraqları bayraq yapan üstündəki qandır
Torpaq əgər uğrunda ölən varsa, vatandır.

## "QÜVVƏT"Ə

Qeyb olurkən göylərin qoynunda daşdan nasiyən
Sormadın, yatmış, sərilmiş boylə kimdir inləyən.
Sormadın kimdir bu dağ? Dağdan böyük, lakin sakat!
Ah bilməzsən nə müdhişdir, nə əngindir fəqət,
Ağlayan bir üzdə bir an titrəyən bir damla su:
Çırpınır qoynunda zülmün ən yenilməz ordusu.
Mən ki heç bir qorxu duymam hayqırarkən ildırım
Sonra bir səssiz, sədasız bir adamdan qorxarım.
Qələlərdən heç çəkinməm, sonra, bax, bilməm nədən
Qorxaram isminde bir dövlət yatan viranədən.
Bir qığılcımdır, yaxar dünyanı bir qəbrin gülü
Bürcü barılar yıxar bir kölgə, bir məchul ölü.
Səs çıxarmaz, canlıdır zənn etdiyin bir nasiyə,
Bir məzarın könlü vardır, bir ovuc torpaq demə.
Bir cəhənnəm gizlənir tək bir nigahın altına
Çıxmayan bir səsdə bəzən gizlənir bir fırtına.
Qələlər, daşlar, dəmirlər, bəldələr, məmurələr
İldırımdan cəhənnəmlər, çəlikdən cəhrələr
Qan saçar məqbər saçarkən durmayıb ətrafına
Ram olur bir gün gələr, bir tək şahidin tayfına.
Qorxaraq bax, sən səbəbsən, daima bir matəmə
Bir məzarın könlü vardır, bir ovuc torpaq demə.
Bir ovuc torpaq əzərsən, bir çəlik, bir tunc olur
Ağlayan bir millətin siması pək qorxunc olur.

## ORXON SEYFİ ORXON
(1890 — 1972)

### KÖNLÜM

Mənim könlüm bir kəpənək
Dolaşıyor çiçək-çiçək.
Tükənəcək ömrü boylə
Çırpınaraq, titrəyərək.

Nə şərəfli bir adı var,
Nə bir böyük məqsədi var,
Hər gün bir az zədələnən
İki ipək qanadı var.

Səbirlidir, gözü toxdur,
Zavallının dərdi çoxdur,
Yorulunca qonacağı
Bir yuvası belə yoxdur

Hər şey ona qarşı durur,
Günəş yaxar, qış dondurur,
Bəzən tutar qanadından
Bir fırtına yerə vurur.

Mənim könlüm bir kəpənək
Dolaşıyor titrəyərək.
Zavallının bir baharlıq
Ömrü boylə tükənəcək.

### DUA

Ulu Tanrım, bu qaranlıq yolları
Bizi sənə ulaşdıran yollar et!
Ehtirasla kilidlənmiş qolları
Bir-birini qucaqlayan qollar et!

Məhəbbətin könlümüzdə hız olsun,
Getdiyimiz haqqa varan iz olsun,
Önümüzdə uçurumlar düz olsun,
Yolumuzda tikanları güllər et!

Dəlalətdə buraxıb da insanı
Yapma ərzin ən qorxulu heyvanı.
Unutdurma doğruluğu, vicdanı
Bizi sənə layiq olan qullar et!

## GÖZLƏRDƏ SƏYAHƏT

Çıxdım bu gün gözəllərin gözlərində səyahətə
Bu yolçuluq bilməm nasıl erəcəkdir nəhayətə?
Mavi gözlər... pək əsəbi, dalğalı bir dəniz kimi
Yaşıl gözlər ən ziyadə mütəmayil xəyanətə.
Sarışınlar... Yorğun bir yaz səmasını andırıyor,
İlk busədə başlayacaq taleyindən şikayətə.
Ala gözlər... Axşam kimi kölgə dolu, hicran dolu,
Bu gözlərdə heç təsadüf etmədim mən səadətə.
Gecə oldu... Ən sonunda siyah gözlər gəldi, durdum;
Bu qaranlıq yolda artıq imkan yoxdu səyahətə!

## DEYİRLƏR

Ölürsəm yazıqdır sənə qanmadan,
Qollarım boynunda halqalanmadan,
Bir günüm keçməyir səni anmadan,
Dərdinə qatlandım heç usanmadan.
Deyirlər: Kül olmaz atəş yanmadan,
Dənizlər durulmaz dalğalanmadan...

Səadət bənzəyir boş bir sərabə,
Düşüyor hər sevən könül əzabə,
Gəlməyir çəkilən dərdlər hesaba.
Deyirəm: Səbəb nə bu iztiraba?
Deyirlər: Kül olmaz atəş yanmadan,
Dənizlər durulmaz dalğalanmadan...

## ŞÜKUFƏ NİHAL BAŞAR
(1896 — 1973)

### SU

Qəlbindən qəlbimə axan bir səsdi
Axşam kölgəsində çağlayan o su.
Səsini ən dadlı yerində kəsdi
Bizi sonsuzluğa bağlayan o su.

O su bir sirr kimi mırıldanırdı,
Köksündə bir sarı ay yıxanırdı
Bizi Leyla ilə Məcnun sanırdı
Şamlı yolumuzda ağlayan o su...

Səssiz ruhumuzu o bəstələrdi,
Bizə "unudalım dünyanı" derdi.
Bir aldı, sonunda verdi min dərdi,
Bizi bizdən fazla anlayan o su.

İndi nə axşam var, nə səs, nə dərə,
Yolumuz ayrıldı başqa ellərə.
Bənzətdi bizi bir qırıx mərmərə
Ruha zəhər kimi damlayan o su.

Qəlbindən qəlbimə axan bir səsdi
Axşam kölgəsində çağlayan o su.
Səsini ən dadlı yerində kəsdi
Bizi sonsuzluğa bağlayan o su.

## FARUQ NAFİZ ÇAMLIBEL
(1898 — 1973)

### ÇOBAN ÇEŞMƏSİ

Dərindən dərinə irmaqlar ağlar
Uzaqdan uzağa çoban çeşməsi.
Ey suyun səsindən anlayan bağlar
Nə söylər bu dağa çoban çeşməsi?

"Könlümü Şirinin eşqi sarınca,
Yol almış həyatın üfüqlərincə.
O hızla dağları Fərhad yarınca,
Başlamış axmağa çoban çeşməsi..."
O zaman başından aşqındı dərdi,
Mərməri oyardı, daşı dələrdi.
Qaç yanıq yolçuya soyuq su verdi
Dəydi qaç dodağa çoban çeşməsi.
Vəfasız Əsliyə yol göstərən bu,
Kərəmin sazına cavab verən bu,
Quruyan gözlərə yaş göndərən bu...
Sızmazdı torpağa çoban çeşməsi.
Leyla gəlin oldu, Məcnun məzarda,
Bir susuz yolçu yox indi dağlarda,
Atəşdən qızaran bir gül arar da
Gəzər bağdan bağa çoban çeşməsi.
Nə şair yaş tökər, nə aşıq ağlar
Tarixə qarışdı əski sevdalar.
Beyhudə səslənər, beyhudə çağlar
Bir sola, bir sağa çoban çeşməsi...

## ƏRİYƏN ADAM

Gözlərim gözlərində dincəlirkən əriyir
Əriyir yaxlaşarkən dodağına dodağım.
Zərrələrim çözülmüş kimi səslər veriyor
Mən sıcaq bir dənizə enən buzdan bir dağam.

Yanında damla-damla bitdiyimi duyaram,
Yoxlaram yerindəmi üzüm, alnım, saçlarım?
Bir köküs keçirərək derəm ki: Yenə varam
Fəqət bir röya kimi indi qeyb olacağam.

Bir gün için içimdə nəyin varsa alacaq,
Varlığım bir su olub qabından boşalacaq.
Məndən nişan olaraq qucağında qalacaq
Boş bir yığın: əlbisəm, köynəyim, boyunbağım.

## ALLAHA İSMARLADIQ

Əlimi beş yerindən dağladı beş barmağın,
Bağrımda da yanmamış bir yer buraxmadan get...
Köçdüyünü bir elin, çökdüyünü bir dağın
Görmək istəmirsənsə, arxana baxmadan get.

Yavrusunun yoluna dalan bir dul baxışı
Andırıyor işıqsız evində pəncərələr.
Bir az yaşarmaq üçün bəkləsən artıq qışı
Çağlayansız yamaclar, suyu donmuş dərələr...

Bir sarı yarpaq kimi düşdü könlüm yoluna,
Qapalı gözlərimdən keçmədiyin gün olmaz.
Mənim qədər titrəməz heç bir igid oğluna,
Heç bir ana qızına bu qədər düşkün olmaz.

## QISQANC

Saqın, bir söz söyləmə... üzümə baxma, saqın!
Səsini duyan olar, sənə göz qoyan olar.
Düşmanımdır səni kim bulursa cana yaxın,
Anan belə oxşasa, mənim bağrım qan olar...

Dilərəm Tanrıdan ki, sənə açıq qucaqlar
Bir daha qapanmadan qara torpaqla dolsun!
Qan tüpürsün adını candan anan dodaqlar,
Sənə mənim gözümlə baxan gözlər kor olsun!

## AŞIQ VEYSƏL ŞATIROĞLU
(1894 — 1973)



*Aşıq Veysəl Türkiyə el ədəbiyyatının son böyük nümayəndəsidir. Yeddi yaşında ikən kor olan Aşıq Veysəl bütün həyatını sözə, saza bağladı. Anadolunu qarış-qarış dolaşaraq, 1933-cü ildə Ankarada milli bayramda şerlərini söylədi və bundan sonra Türkiyədə tanınan və sayılan sənətçilərdən oldu. Bütün şerləri "Dostlar məni xatırlasın" adlı kitabında toplanmışdır.*

### QARA TORPAQ

Dost-dost deyə neçəsinə sarıldım
Mənim sadiq yarım qara torpaqdır.
Beyhüdə dolandım, boşa yoruldum
Mənim sadiq yarım qara torpaqdır.

Neçə gözəllərə bağlandım, qaldım
Nə bir vəfa gördüm, nə fayda buldum.
Hər dürlü istəyim torpaqdan aldım
Mənim sadiq yarım qara torpaqdır.

Qoyun verdi, quzu verdi, süd verdi,
Yemək verdi, əkmək verdi, ət verdi,
Qazma ilə döyməyincə qıt verdi,
Mənim sadiq yarım qara torpaqdır.

Adəmdən bu dəmə nəslim gətirdi,
Mənə dürlü-dürlü meyvə yedirdi,
Hər gün məni təpəsində götürdü,
Mənim sadiq yarım qara torpaqdır.

Qarnın yardım qazma ilən, bel ilən,
Üzün yırtdım dırnağınan, əlinən,
Yenə məni qarşıladı gül ilən,
Mənim sadiq yarım qara torpaqdır.

İşgəncə yapdıqca mənə gülərdi
Bunda yalan yoxdu, hər kəs də gördü.
Bir çəyirdək verdim, dörd bostan verdi
Mənim sadiq yarım qara torpaqdır.

Havaya baxarsam hava alaram,
Torpağa baxarsam dua alaram,
Torpaqdan ayrılsam nərdə qalaram?
Mənim sadiq yarım qara torpaqdır.

Diləyin var isə istə Allahdan
Almaq üçün uzaq getmə torpaqdan.
Cömərdlik torpağa verilmiş haqdan
Mənim sadiq yarım qara torpaqdır.

Həqiqət arasan açıq bir nöqtə,
Allah qula yaxın, qul da Allaha.
Haqqın gizli xəzinəsi torpaqda
Mənim sadiq yarım qara torpaqdır.

Bütün qüsurumuzu torpaq gizləyir,
Məlhəm çalıb yaralarım duzlayır.
Qolun açmış yollarımı gözləyir
Mənim sadiq yarım qara torpaqdır.

Hər kim ki, olursa bu sirrə məzhər,
Dünyaya buraxar ölməz bir əsər.
Gün gələr Veysəli bağrına basar
Mənim sadiq yarım qara torpaqdır.

## FƏLƏK VURDU BAŞIMA

Gənc yaşımda fələk vurdu başıma,
Aldırdım əlimdən iki gözümü.
Yeni yetmiş idim yeddi yaşıma
Qeyb etdim baharımı, yazımı.

Bağlandım guşədə qaldım bir zaman,
Neçə kimsələrə dedim əlaman.
On-on beş yaşıma girincə haman
Yavaş-yavaş düzən etdim sazımı.

Üç yüz onda gəlmiş idim cahana,
Dünyaya baxmadım mən qana-qana.
Qədər boylə imiş, çiçək-bəhanə
Levhi qələm qara yazmış yazımı.

Keçirdim ömrümü havayi-həvəs,
Dərdim bir kimsəyə deyildir qiyas.
Hər zaman, hər vaxt qəlbimdə bir yas
Çərxi-dövran güldürmədi üzümü.

Bir vəfasız zalım yara bağlandım,
Tarix üç yüz otuz beşdə evləndim.
Səkkiz sənə bir arada əyləndim
Zalım kafir yetim qoydu quzumu.

Elə-geniş, mənə dünya dar oldu,
Təhəmmülsüz könlüm biqərar oldu.
Könlüm zindan, gecələrim zar oldu
Qədər ilə böləmədim kozumu.

Veysəl der dünyaya mən niyə gəldim?
Hər zaman ağladım, nə zaman güldüm?
Könlümə təsəlli kəndimdə buldum
Səbir ilə təskin etdim özümü.

## YENİ MƏKTUB ALDIM GÜLÜZLÜ YARDAN

Yeni məktub aldım gül üzlü yardan
Gözlətmə yolları, gəl-deyə yazmış.
Sivrələn köyündən, bizim diyardan
Dağlar mor bənövşə, gül-deyə yazmış.

Bəsərəkdə lalə sümbül yürüdü,
Güldədəni çayır çəmən bürüdü,
Qaradaşda qar qalmadı, əridi,
Axar gözüm yaşı sel-deyə yazmış.

Əylənmə qürbətdə yayla zamanı
Mevlanı sevərsən ağlatma məni.
Bənək-bənək məktubdadır nişanı
Göz yaşım məktubda pul[1] - deyə yazmış.

Qoxuyor burnuma Sivrələn köyü
Sərindir dağları, soyuqdur suyu.
Yar məndil göndərmiş yadigar deyə
Gözünün yaşını sil-deyə yazmış.

Veysəl, bu qürbətlik kar etdi cana
Qarışdır köçünü ulu karvana.
Gün keçirib fürsət vermə zamana
Saqın uzanmasın yol-deyə yazmış.

[1] Pul—poçt markası.

## BU ALƏMİ GÖRƏN SƏNSƏN

Bu aləmi görən sənsən
Yox gözündə pərdə sənin.
Haqsıza yol verən sənsən
Yoxmu suçun burda sənin?

Kainatı sən yaratdın
Hər şeyi yoxdan var etdin.
Məni çılpaq dişar atdın
Comərdliyin nərdə sənin?

Evlimisən, ergənmisən?
Eşin yoxdur, bir sənmisən?
Çərxi-səma, nur sənmisən?
Bu balqıyan nur da sənin.

Kəlisada despot keşiş:
—İsa — Allahın oğlu — demiş.
Məryəm Ana nəyin imiş?
Bu işin var bir də sənin.

Kimdən qorxdun da gizləndin,
Çox arandın, çox izləndin,
Göstər üzün, çox nazlandın,
Üzün məhrəm fərdə sənin.

Min bir ismin, bir cismin var
Oğlun, qızın, nə qismin var?
Hər bir irəngdə rəsmin var
Nərdə baxsam orda sənin.

Dürlü-dürlü dillərin var,
Nə əcaib halların var,
Nə qaranlıq yolların var,
Sirat körpün nərdə sənin?

Adəmi sürdün, baxmadın,
Cənnətə də buraxmadın,
Şeytanı neçin yaxmadın?
Cəhənnəmin var da sənin.

Veysəl nədən ağlın erməz?
Uzun, qısa dilin durmaz.
Əllər tutmaz, gözlər görməz.
Bu əcaib sirr də sənin.

## NAZLI-NAZLI

Çırpınır könüllər haray çəkərkən
Davud coşqun, tel nazlı-nazlı.
Kəklik olub ucdan uca səkərkən
Ayaq qıvraq-qıvraq, bel nazlı-nazlı.

Yazmalar başlarda pul-pul gülüşür,
Açılır yanaqlar gül-gül gülüşür,
Sovrulur fistanlar al-al gülüşür,
Çiçək başqa-başqa, dal nazlı-nazlı.

Görüşdü, sevişdi gözlər düyündə,
Gülüşdü, qızardı üzlər düyündə,
Zeybək halay çəkdi qızlar düyündə,
Əllər liymə-liymə, qol nazlı-nazlı.

## SƏNİ

Sən bir ceyran olsan, mən də bir ovçu
Ovlasam çöllərdə saz ilə səni,
Bulunmaz dərmanı, yoxdur əlacı
Vursam, yaralasam söz ilə səni.

Qurulma sevdiyim gözələm deyin,
Bağlanma qaraya, alları geyin.
Mən bir çoban olsam, sən də bir qoyun,
Səsləsəm əlimə duz ilə səni.

Qoyun olsan otladardım yaylada,
Tellərini yoldurmazdım xoyrata,
Balıq olsan, takla dönsən dəryada,
Düşürsəm toruma bez ilə səni.

Veysəl der ismini qoymam dilimdən,
Ayrı düşdüm vətənimdən, elimdən.
Quş olsan da qurtulmazdın əlimdən
Əgər görsə idim göz ilə səni.

## DOSTLAR MƏNİ XATIRLASIN

Mən gedərəm adım qalar
Dostlar məni xatırlasın.
Düyün olar, bayram olar
Dostlar məni xatırlasın.

Can qəfəsdə durmaz, uçar
Dünya bir xan, qonan köçər.
Ay dolanar, illər keçər
Dostlar məni xatırlasın.

Can bədəndən ayrılacaq
Tutmaz baca, yanmaz ocaq.
Salam olsun qucaq-qucaq
Dostlar məni xatırlasın.

Nə gəlsəmdi, nə gedərdim,
Gündən günə artdı dərdim.
Qərib qalıb yerim-yurdum
Dostlar məni xatırlasın.

Açar, solar dürlü çiçək
Kimlər gülmüş, kim güləcək?
Murad-yalan, ölüm-gerçək
Dostlar məni xatırlasın.

Gün ikindi, axşam olur
Gör ki başa nələr gəlir.
Veysəl gedir, adı qalır
Dostlar məni xatırlasın.

## AŞIQ DƏRYAMİ
(? — ?)

### AY BACANI KEÇDİ, HEY...

Sağlığımda qiymətimi bilmədin,
Mən ölmüşəm, ay bacanı keçdi, hey!
Xoş günümdə mənə ortaq olmadın
Ömrüm daşı divarından düşdü, hey!

Söhbət sarayıma qapı açardım,
Dinləyəndə müşkü ənbər saçardım,
Bu könüldən o könülə uçardım,
Bir yalanmış, yuxumdakı duşdu, hey!

İxtiyar çağında namaz-niyazın
Nə oxunur yazın, nə gəlir yazın,
Dəryami, vədəsiz çalınan sazın
Dinləyən uyumuş, dadı qaçdı, hey!

## ÖLDÜRƏRSƏN

Könüldəki qəndilləri
Yaxma, məni öldürərsən.
Oturuşun bir həyatdır
Qalxma, məni öldürərsən.

Görəm ağzında dişləri,
İçəm gözündən yaşları,
Səndəki qara qaşları
Yıxma, məni öldürərsən.

Sənlə belə vuruşmaqdan,
Dadlı-dadlı qonuşmaqdan,
Boylə gözəl sarışmaqdan
Bıkma, məni öldürərsən.

Şəkər kimi şirin sözün,
Həyat verir cilvə-nazın,
Süzdürərək mənə gözün
Baxma, məni öldürərsən.

Nə dadlıdır səndə dillər,
Əlində pənbə məndillər,
Saçlarına qızıl güllər
Taxma, məni öldürərsən,

Dəryami der: qəmbər kimi,
Başındakı çəmbər kimi,
Gözəl, mişki - ənbər kimi
Qoxma, məni öldürərsən.

# KƏRKÜK ŞAİRLƏRİ

*İraqın şimalında, Kərkük, Ərbil, Mosul dolaylarında yaşayan, özlərini türkman adlandırsalar da, dilləri çağdaş türkmənсəylə deyil, azəricəylə eyni olan yarım milyonluq bir xalqın zəngin ədəbiyyatı var. Füzulinin, Ruhi Bağdadinin, türk dilində yazan bir sıra başqa şairlərimizin bu mühitdə yaşadıqlarını, Azərbaycanda, Türkiyədə olduğu kimi İraqda da məskunlaşan Bayat qəbiləsinə mənsub olduqlarını nəzərə alsaq, bu ədəbiyyatın çoxəsrlik ənənələrindən danışmaq mümkündür. Bununla bərabər İraq türklərinin həm də çox zəngin şifahi yaradıcılıqları var. Kərkükdə yaşayan görkəmli alim Ata Tərzibaşı İraq türklərinin şifahi və yazılı ədəbiyyatını toplayıb nəşr etmişdir. Rəsul Rza bayatılarımızın əkiz qardaşları olan Kərkük xoyratları haqqında Azərbaycan oxucusuna ilk dəfə "Uzaq ölkələrin yaxın töhfələri" adlı geniş məqaləsində məlumat vermişdir. Sonralar ədəbiyyatımızın bu qolunun ardıcıl araşdırıcısı Qəzənfər Paşayev İraq - Kərkük xalq şerinin örnəklərini dəfələrlə Rəsul Rzanın ön sözüylə kitab şəklində nəşr etmişdir. Biz antologiyamızın azəri bayatılarından, türkmən lələrindən, xüvdülərindən, Türkiyə və qaqauz manilərindən və digər folklor örnəklərindən ibarət olan "Xalq yaradıcılığı" bölməsinə "Arzı—Qəmbər" dastanının Kərkük variantından şerləri, Kərkük xoyratlarını da daxil etmişik. Burada isə Kərkük türk yazılı ədəbiyyatından bəzi örnəkləri veririk. Kərkük türklərinin XIX-XX əsrlərdə yetişdirdikləri ən böyük şair Hicri Dədədir. Əsl adı Mahmuddur. Əsas əsərlərini azəricəylə eyni bir dildə yazan Hicri Dədənin farsca şerləri də var. Bağdadda bir neçə kitabı nəşr olunmuşdur. Ən məşhur şerlərindən biri Kərkükün 20 kilometrliyindəki Baba Gur-gur deyilən müqəddəs ocağa həsr olunub ki, bu yerdə torpaqdan təbii od çıxır. İraq türklərinin XIX-XX əsrlərdə Xıdır Lütfi, Haşım Nahid Erbil, Məhməd Sadiq, Məhməd Raseh Öztürkmən, Rəşid Akif Hürmüzlü, Əsəd Naib kimi şairləri də məşhurdur. Həmin şairlərin əsərlərindən bəzi örnəkləri təqdim edirik.*

## HİCRİ DƏDƏ

(1880 — 1952)

### BABA GUR-GUR

Ey əski imam, əski ocaq xan Baba Gur-gur,
Ey şəhrimizə şaşayi-əfşan Baba Gur-gur,
Ey qutlu ziyarətgahımız can Baba Gur-gur,
Var müşkülümüz, eylə sən asan baba Gur-gur.

Kərkükdə bizim bir babamız, bir dədəmiz var,
Zəngin baba, yoxsul dədəmiz qəmzədəmiz var,
Bir piri muğan, bir də əcəb meykədəmiz var,
Qeyri mey içər biz quru səkran Baba Gur-gur.

Ey kənzi-zəhəb mürşidi-ərbabi-məharət,
Ettik səni biz xeyli zaman canla ziyarət,
Göstərmə də əğyarə bu gün kəşfi-kəramət
Həmşəhrini də gözlə ki bir an Baba Gur-gur.

Ey köksümüz üstündə çıxan məşəleyi-nuh əfsun,
Cövhərli olan şəhərdə nəfi qara altun,
Didarına ey yar, krallar daha məftun,
Məhbubi-cahan xalqına sultan Baba Gur-gur.

Var postunun altında ki bir boylə xəzinə,
Gəldikcə daşar, yenə tükənməz bu dəfinə.
Artıq sığamaz sərvətin əmlaki-zəminə
Lazım sənə bir başqaca dövran Baba Gur-gur.

Məstəqbəli təmin edəcəksən bizə əlbət,
Öz əhlinə göstərməlisən lütf ilə şövkət.
Əhlin dəxi eylər sənə ruh ilə xidmət
Lakin qoyma məyusi-pərişan Baba Gur-gur.

### KƏRKÜK XATİRATI

Cənnət-vətənim, aləmi-qürbət də cəhənnəm
Mən cənnətimi zəhməti-niranə dəyişməm.

Mən müftəhirəm milli lisanımla cahanda
Öz postumu yüz atlası əlvana dəyişməm.

Hər xoryatı nəğmeyi-Davuda müşabih
Hər pərdəsini əvçi əşirana dəyişməm.

## RÜBAİ

Yox səməndi təbimə cövlan üçün cayi-mahal
Rüyi meydanım kiçik, əzmiş cigərgahım məlal.
Mən də İstanbul kimi bir yerdə doğsaydım əgər
Yüksələrdim bürcü əflak üzrə manəndi-Kamal.

## KƏNDİSİ ÜÇÜN

Geyişim xirqeyi-rindanə, məlamətzədəyəm
Məsləkim gizli deyildir, Dədə oğlu Dədəyəm.

## XOYRAT VƏ MANİLƏRİ

Bilmirəm mənim nəmdi,
Gözüm dolu nəm, nəmdi.
Yoldaşıv naəhl olsa
Cənnət də cəhənnəmdi.

Dəryanın sağ alması,
Aldı al bağ alması.
Dost mənə bir ox vurdu
Çətindi sağalması.

Gül tikənnən,
Ayrılmaz gül tikənnən.
Sən gülün qədrin anna
Zəhmətdən gül tikənnən.

Xoş çağır, xoryat oxu,
Rast oxu, Bayat oxu.
Yol qorxu, yayan getmə
Əsil at min, at oxu.

Kərküküm qoca Kərkük,
Hamısınnan uca ərkük.
Kəncində cövhər gənci
Bənzəməz tunca Kərkük.

Yüz ağla get,
Bir gül sən, yüz ağla get.
Üç kərəlik əl verməz
Sən haqqa yüz ağla get.

## XIDIR LÜTFİ
(1880 — 1959)

Uzanıb getmədədir ömrü-səfil
Olacaq atidə bundan da zəlil.

Nə ağır yük, nə də müşkül bir iş
Nə çətindir bu gəlişlə, bu gediş.

Bir günah işləmədim zövqüm üçün
Olmadım nəfsimə ram eşqim üçün.

Küfrə qarşı qüvvətli imanım var
Haqqa qarşı qurban edəcək canım var.
Kimə fəryad edəyim, yalvarayım?
Bu yaman dərdimə dərman arayım?

Lütfi, şükr eylə bu gün allahına
Mücri olmaz sığınan dəhgahına.

### MƏNİ

Gəlirəm yanına hər gün dedi, qandırdı məni,
Çeşmi-fəttanına bənd etdi, dolandırdı məni.

Çox zaman keçdi, fəqət gəlmədi ol yevmi-vüsal,
Bəkləməkdən yolunu candan usandırdı məni.

O qədər qəhrini çəkdim ki, tükəndi səbrim,
Mən itab etdim,o naz ilə utandırdı məni.

Bir gecə xabda gördüm-gözəlim yanımda,
İşvəyi-naz edərək çəkdi, oyandırdı məni.

Yuxudan qalxıb oyandım da peşiman oldum,
Görmədim yarımı yanımda, o yandırdı məni.

Lütfünün halı müşəvvəş, nə etsin?
Dilbərim etdiyi andlarla inandırdı məni.

### RÜBAİ

Ey ilahi bizi ettinsə fəqir,
Etmə barı boylə namərdə əsir.
Hür yaşatmışsan, ilahi, bizi sən
Qılma bu dəhri-fücur içrə həqir.

## HAŞIM NAHİD ERBİL
(1880 — ?)

### VƏTƏNLƏ MƏN

Əsir düşdük bir gündə ah, sən də, mən də
Sən zəncirə bağlandın, mən də kəməndə.

Aramızda uçurum var, atəşdən sədd var
Boynumuzda zəncir var, qopmaz kəmənd var.

İkimizin də dərdi, bax, işdə birdir
Bizi boğmaq istəyən eyni zəncirdir.

### İDEAL

Mən bir gün dalmışkən qəm dəryasına,
Yalnızlığın sonu gəlməz yasına.

Yavaş-yavaş gəlib tutdun qolumdan
Gəl — dedin — yaraşmaz sənə bu zindan.

Qapalı könlümü nasıl də kəndim
Yeni bir zindana, bax, sürüklədim.

Artıq nəmə lazım sənin varlığın?
İstər zəhər olsun, istərsə yanğın.

Aydınlat ruhumun qaranlığını
Qumral saçlarının çəlik axını.

Atəşdən bir köynək kimi mənə sar
Ey sevgisində min möhnət olan yar.

### AXŞAM

Toxunma könlümə könlüm qırıqdır,
Mənim gülməm belə bir hıçqırıqdır.

Toxunma könlümə ey dəli rüzgar,
Onun hər telində bir hıçqırıq var.

Sallama bu qırıq dalı, qırıqdır,
Düşürdüyün yarpaq bir hıçqırıqdır.

İstəməm artıq mən indi nə səni,
Nə sularda işıq əyləncəsini.

Qanlı bir kəfənə bənzəyən rənglə,
Axşamı al götür, kəndin sürüklə.

Saçımla oynama, saçımı yolma,
Bir hıçqırıq kimi içimə dolma.

Saçımda varsa əlindən bir şey,
Hər telində inlər birər qırıq ney.

Lakin qalmamışsa əlinin izi,
Nafilə süsləmə mavi dənizi.

İstəməm artıq mən indi nə səni,
Nə sularda işıq əyləncəsini.

Sən sadə toxunma könlüm qırıqdır,
Mənim hər nəfəsim bir hıçqırıqdır.

## MƏHMƏD SADİQ
(1886 — 1967)

### EY KƏRKÜK

Müalif əsrdən döndük yanan vulkana, ey Kərkük
Ayaq altında qalmış sahayi-Balkana, ey Kərkük.

Görüncə qəmli-qəmli göz önündə qup-quru çayın
Gözümdən yaş axar, yaşlar dönər al qana, ey Kərkük.

Yazıq, əğyar əlində indi nazik güllərin qalmış
Dəyərkən hər gülün min rövzi-rizvana, ey Kərkük.

Yazıq, əğyarə təslim oldu ən qiymətli əmlakın
Alınmışkən onun hər daşı yüz min cana, ey Kərkük.

Sənin bu şanlı yurdunda axarkən su kimi altun,
Nədən oldu əhalin dərbədər hər yana, ey Kərkük?

Qəriblər yerli oldu, yerlilər-qürbətdə sərgərdan
Fələk əks üzrə indi başlayır dövrana, ey Kərkük.

Qafalardan səmayə yüksələn xoyradın
Nədən dönmüş bu gün naleyi-əfqana, ey Kərkük?

Münəvvər oldu London şöleyi-qazınla hər yanı
Dumanı, yurdunu döndərdi bir gülxana, ey Kərkük.

Səni qurtarmaq istərkən yanar atəş kimi gönlüm
Dönər cismimdə hər bir tüklərim peykana, ey Kərkük.

Tutaydım qoltuğumda kəlləmi, uğrunda qoşaydım,
Alaydım intiqamın göz görə mərdana, ey Kərkük.

Görəydim ölmədən əvvəl səni mən əski halında,
Olurdum şəmi-hüsnün üzrə bir pərvanə, ey Kərkük.

Məzarım üzrə əbnayi-vətən bir lövhə tiksinlər
Ki yazsınlar bu şeri lövheyi-elana, ey Kərkük.

Ki mən Türk oğlu Türkəm, Türk üçün tərki-həyat etsəm,
Dəyər məncə bu ölmək ömrü-cavidana, ey Kərkük.

Pərişan xaneyi-viran, dərbədər, məhzun ikən Sadiq
Əmin etmiş: gəlir bir gün sənə qurban, ey Kərkük.

## RƏŞİD AKİF HÜRMÜZLÜ
(1893 — 1973)

### MƏQBƏRƏDƏ

Ağlama ana, burax,
Türkmən qızı ağlamaz.
Onların göz yaşları
Yerə düşməz, çağlamaz.
Sən pək uzaq və parlaq
Bir tarixin qızısan.
Hər zaman hür yaşamış,
Üfüqlərdə parlayan,
İnci almas donanmış
İşıqlı ulduzusan.

Türkmənin göz yaşları
Bir kin fırtınasıdır.
Vaxtı gəlincə coşar,
Bir sel olur, süpürür
Xain, namərd başları.

Fəqət ana bir şey var
Əsəfimiz həp ondan.
Yalnız buna ağlarız:
Keşkə bir mərd olaydı
Bizi öldürən əllər.

İşdə ana axşamlar
Cocuqlara masalın,
Deyəcəyin bu olsun:
İntiqamlar alındı,
Qutlu bayram yapsınlar.

## MƏHMƏD RASEH ÖZTÜRKMƏN

(1889 — 1936)

### İKİ QƏZƏL

Ən nəşəli, ən işvəli, ən şivəli, ən şən
Sənsən bu gün ey sevdiciyim, ey gözəlim, sən!

Hüsnündə olan cazibəni hər kimə sorsan,
Söylər: Onu üqbaya qədər kəşf edəməzsən.

Rahatsa, təhəmmülsə, təsəbbürsə, sükunsa,
Qəsb etdi o cadu nagəhan hamsını məndən.

Bir kimsəni haqq eyləməsin eşqə giriftar
Eşqin nə bəla olduğunu, mən bilirəm, mən.

Eşqin bütün aləminə qatlanmaq üçün mən
Şərt eyləmişəm sanki bu dünyaya gələrkən.

***

O gözəl gözüylə baxsan boyu bayraq görünür
Üzü aydan daha aydın, daha parlaq görünür.

Kəpənəklərdən, işıqlardan, ötən kəklikdən
Daha oynaq, daha parlaq, daha şaqraq görünür.

Sən də kəndin kimi bir çapqına vurğunmu, nəsən?
Nədən ey göz bəbəyim, kipriyin islaq görünür?

Kişinin ulduzu iş görməlidir, kəndi deyil,
Neçə qartal kimi ər var elə çaylaq görünür.

O gözəl gözlərinizlə, o gözəl qaşlarınız
Bir-birindən daha çapqın, daha oynaq görünür.

Rasehin tutduğu yoldan yürü, söz söylər ikən
Boylə söz ərlərinə sözlər oyuncaq görünür.

## ƏSƏD NAİB
(1900 — 1992)

### QUMRU

Həmdərd arayırsan məgərsə boylə
Hər sabah baxçama gəlirsən qumru.
Boşluğu dolduran yanıq səsinlə
Məni də uyğudan alırsan qumru.

Bəlli, hicran səni salmada dərdə
Sərvdən sorarsan: Sevgilim nərdə?
Sənə mən deyəyim, mənə sor bir də
Bu hicran bağında qalırsan qumru

Bir sənmisən yalnız eşindən cüda?
Sor, bu bağda kimlər ermiş murada?
Sən heç olmaz isə yenə burada
Mən kimi bir həmdərd bulursan qumru.

Gəl, hər sabah qumru, səni bəklərəm,
Səninlə ovunur mənim dərdlərim.
Beş günlük dünyada indilik yarım
Kim bilir yarın nə olursan qumru

***

Ey saqi, badə sun ərənlər üçün
Sənə keçər ancaq nazımız bizim.
Bahar kimi zövqlə sayəndə keçsin
Güzümüz, qışımız, yazımız bizim.

Könüldən içəlim eşq şərabını,
Oxumuşsuz biz də haqq kitabını,
Biliriz lütfünü, həm hesabını,
Hər kəsə açılmaz razımız bizim.

Başımızda əsən başqa havadır,
Xəstə könlümüzə badə - dəvadır
Nəğməmizi dinlə, o da nəvadır.
Həp bu teldən ötər sazımız bizim.

# AZƏRBAYCAN ŞAİRLƏRİ

## MƏMMƏD ƏMİN RƏSULZADƏ

(1884 — 1955)

*İlk müstəqil Azərbaycan Cümhuriyyətinin (28 mayıs 1918—28 aprel 1920) qurucularından biri, "Müsavat" partiyasının yaradıcısı, böyük siyasi xadim və dövlət adamı Məmməd Əmin Rəsulzadənin bədii əsərləri, o cümlədən şerləri də var. Antologiyamıza daxil etdiyimiz "Çəkil bir yanə, sakitləş!" şeri ilk dəfə Əli bəy Hüseynzadənin "Füyuzat" jurnalının 30-cu sayında (1907,19 oktyabr) dərc olunmuşdur. "Mayıs duyğuları" şerini Azərbaycan Xalq Cümhuriyyəti devriləndən sonra Türkiyəyə qaçmağa məcbur olmuş Məmməd Əmin Rəsulzadə orada yazmışdır.*

### ÇƏKİL BİR YANƏ, SAKİTLƏŞ!

Qaranlıqdır mənə dünya,
Bütün dünyavü mafiha,
Deyirlər cümləsi guya:
Çəkil bir yanə, sakitləş!

Daraldı qəlb vəsi ikən,
Qaraldı şəms, lami ikən,
Eşitməz quş, sami ikən,
Çəkil bir yanə, sakitləş!

Təhəmmül, səbr mümkünmü?
Həyata cəbr mümkünmü?
Zəvali-qəhr mümkünmü?
Çəkil bir yanə, sakitləş!

Çıxıb gedən cilo gəlməz,
Mənə yarü ədu gəlməz.
Bu dərdə çarəsi gəlməz
Çəkil bir yanə, sakitləş!

Dolu heyrətlə hər yanım,
Toxunmuş daşə peykanım.
Ədu insafə ihvanım
Çəkil bir yanə, sakitləş!

Nə vəhşidir bəni adəm,
Mücəssəm zülmdür aləm!
Deyirlər cümləsi yekdəm:
Çəkil bir yanə, sakitləş!

Çəkilməm ey hərifan mən,
Bu meydani-şücaətdən...
Bütün dünya mənə derkən:
Çəkil bir yanə, sakitləş!

## MAYIS DUYĞULARI

İlk çağındaydı gözəl mövsimin
Qışdan çıxılmışdı, bahar gəlmişdi.
İyirmi səkkizində idi Mayısın
Azərbaycan istiqlalə ermişdi.

Derkən qopdu bir qasırğa quzeydən,
Baharımız heyhat döndü qış oldu.
Azərbaycan Moskovların əlində
Əsarətin zəhrini dadmış oldu.

Azərilər sarsıldı bu zərbədən,
İstilaya qarşı üsyanlar oldu.
İstiqlalı bir kərə dadmış millət
"Hürriyyət" fikrinə candan vuruldu.

Milli fikir toxumları səpildi,
İslatdı torpağı axan qızıl qan.
Bu əkindən yarınki bir baharda
Əlbət bitər bir yeni Azərbaycan.

Şiddətliysə əgər mövsimin qışı,
Yeni bahar, demək, parlaq olacaq.
Verdiyimiz qurbanların bahası
Bizə yalnız hürriyyətlə dolacaq.

Tarixin yeni bir gözəl çağında
Qaranlıq qış keçib bahar gələcək.
Hər hanki bir ilin aydın günündə
Azərbaycan istiqlala erecək.

## ÜMMÜGÜLSÜM
(1899 — 1944)



*İlk soyadı Rəsulzadə olan Ümmügülsüm xanım Məmməd Əmin Rəsulzadənin əmisi qızı, görkəmli nasir və tənqidçi Seyid Hüseynin həyat yoldaşı idi və hər ikisinin acı taleyini paylaşmalı oldu. İlk müstəqil Azərbaycan Cümhuriyyəti dövründə milli vətənpərvərlik və türkçülük ruhunda şerlər yazmış Ümmügülsüm 37-ci ildə əri tutulduqdan sonra həbs olunur və Sibirə sürgün edilir. Bayıl həbsxanasında və sürgündə yazdığı həsrət şerləri xoşbəxtlikdən hifz olunmuş və şairənin 1992-ci ildə çapdan çıxan ilk kitabına daxil edilmişlər.*

*Birinci cahan hərbində ruslar tərəfindən əsir alınan türk əsgərləri Xəzərin Nargin adasında çox ağır, dözülməz bir şəraitdə saxlanılırdı. 1917-ci ildə Azərbaycan qələm sahibləri türk əsirlərinə mənəvi yardım məqsədiylə "Qardaş köməyi" adlı məcmuə buraxmışlar. Hüseyn Cavidin əvvəllərdə gətirdiyimiz şeri də, Ümmügülsümün "Turan düdüyü" şeri də həmin məcmuədəndir.*

### DƏRDLİ NƏĞMƏ
("Turan düdüyü")

*Nargin əsirlərinin dilindən*

Dərdli-dərdli sürükləndim, inlədim,
Acı-acı fəryadları dinlədim,
Gəldim iştə dərdim sənə söylədim
Ərzimi dinləyən, soran nərədə?
    Uyudulmaz dərdim, ovulmaz könlüm,
    İlk bahar olsa da açılmaz gülüm.
    Gəl yaramı sən özün sar, sevgilim,
    Duyulmaz dərdimə dərman nərədə?
Dağıtdılar yuvasını bülbülün,
Susdurdular nəğməsini bu elin,
Xəzan vurdu yarpağını hər gülün
Canana can verən o can nərədə?

Məskənimiz bir fəlakət ocağı,
Bəsdərimiz fırtınalar ocağı,
Sönmüşmüdür, əcəb yurdun ocağı,
Anadolu nərdə, Turan nərədə?
Qərib sürgün olur bizim adamlar,
Ninni söylər uğultulu dalğalar,
Mərhəmət naminə səni haraylar,
Ədalətin nərdə, vicdan nərədə?
Təlatümə uğramışız həpsimiz,
Qalmamışdır inan daha səbrimiz.
Bir sahil yoxmudur çıxa gəmimiz?
Ağlaşır analar, duyan nərədə?
Səba, yetir sevgilimə sözümü,
Mükəddər halımı, gülməz üzümü,
Yanıqlı ahımı, ağlar gözümü,
Aşiqlər nərədə, canan nərədə?

## MƏNİM ANDIM

Görməzsə gözüm bir an üzünü,
Ruhumu oxşayan munis gözünü,
Dinləməzsəm əgər dadlı sözünü,
Ötən bülbüllərdən soraram səni.

Səni düşünürəm, ey gözəl xülya,
Sənsən kirpiyimdən asılmış röya.
Nuhun dövrü gəlsə, dağılsa dünya,
Yenə kainatda araram səni.

Uyutmaz qəlbimi başqa bir şəfqət,
Ruhumu oxşamaz heç bir məhəbbət,
Əgər aralığa düşərsə firqət,
Əsən küləklərdən soraram səni.

Ey Sadiq, sadiqəm əhdimə, sənə,
And olsun allaha, doğma vətənə,
Sənsiz nəsib olan ölümdür mənə,
Haraya getsən də, taparam səni.

## TƏBİM

Axı, hər vaxt şən idin sən
İndi susdun, nədən, təbim?
Nəşə saçır bağça, çəmən,
Zövq al, sən də dillən, təbim!

Bizim elə gəlsə bahar,
Günəş doğar al laləzar.
Güllərin də ilhamı var,
Gül açanda güllən, təbim!

Gül bülbülün həmdəmidir,
Bahar sevgi aləmidir.
İlqarımız böyləmidir-
Ayrılırsan məndən, təbim?

İgidlərin hünər çağı,
Üzə gülür vətən bağı,
Çəkmə mənə sinə dağı,
Şer yarat, şənlən, təbim!

## BÖYÜK SABİRƏ

Yadımdadır, bir gün, bir axşamçağı,
Yayıldı aləmə həzin bir xəbər:
- Gülərkən gülşəndə gülün yarpağı,
Sabir, böyük şair öldü, - dedilər.

O zaman ağrılı bir ürəklə mən,
Ağlamışdım sənə, ey dahi şair!
Düşündüm, yatmadım ta səhərəcən,
Söz qoşmaq istədim hüznünə dair.

Cocuq da olsaydım, tanırdım səni,
"Molla Nəsrəddin"in hər səhfəsindən.
Az güldürməmişdi sözlərin məni,
Müdriklik duyardım xoş nəfəsindən.

Tanırdım mən səni, ey cəsur insan,
Dözürdün həyatın çətinliyinə.
Səni qorxutmurdu nə ölüm, nə qan,
Hamı heyran idi mətinliyinə.

Hər sözün aynadı qaraya, ağa,
Qorxmazdın bəylərdən, şahlardan belə.
Əyməzdin başını, dönmüşdün dağa,
Daim vuruşardın cəhalət ilə.

Bəzən də ən həssas şair diliylə
Oxşardın qəzəllə qönçəni, gülü.
Necə qıydı sənə ölüm əliylə,
Ağlatdı hicranın vətəni, eli.

## BAYRAĞIM ENƏRKƏN

Sən Bayrağım! O yüksək şanlarınla enərkən,
Mavi göyə bir duman gəldiyini sezdim mən.
Qoynundakı ağ nurlu ay-yıldızım sönərkən,
Üzərimə doğacaq günəşlərdən bezdim mən.

Al-yaşıllı bağında çiçəklərin solarkən,
Ürəyimdə pək acı bir inilti yüksəldi.
Hıçqırıqlar içində bayılırkən, düşərkən,
Məni tutub qaldıran xain, murdar bir əldi.

Yazıq səni Bayrağım, endirdilər öyləmi?
Səni yıxıb devirən o zəhərli ruzigar,
O haqq yeyən haqsızlar, vəhşilər, tanrısızlar,
Yanar ocağımı da söndürdülər, öyləmi?

Bir röyamı oldu o gördüklərim, həpisi?
Bağlandımı üzümə türk elinin qapısı?

1920

## HİCRAN

Bir solğun çiçəyəm, bir sarı yarpaq,
Candan şikayətkar, canandan iraq.
Çıxdım ki, yollardan alayım soraq,
Xəbər verən yoxdur, sorma dedilər.

Ayrılınca hilal qaşlı yarımdan,
Mən yaslara batdım, geymədim əlvan.
Düşünüb o yıldız gözləri hər an,
Ağlarkən, kəndini yorma dedilər.

Könül şəkvəsini kimə söyləsin?
Qəlbimin dərdini kimlər dinləsin?
Səni sevən, sənsiz ömrü neyləsin?
Dalınca qoşarkən, varma dedilər.

Mənim gözlərimdən günəş çəkildi,
Parlaq həyatıma zülmət töküldü.
Vərəmli qəlbimə oxlar dikildi,
Qoy axsın qanları, sarma dedilər.

Günəşim bir daha doğmayacaqmı?
Vəhşi qaranlığı boğmayacaqmı?
Kölgələri şəfəq qovmayacaqmı?
Sordum, ümidini qırma dedilər.

## XƏZƏRƏ XİTAB

Yenə bu gecə də keçdi yarıdan,
Gözümdə yuxu yox, yenə bidaram.
Yenə qaranlığın bağrını yaran,
Xəzərin suyudur, tutmayır aram.
Çağla çoşğun dəniz, qollarını aç,
Qucaqlaşaq, verək köks-köküsə.
Gül də, biz ki, dostuq hər qəmli səsə,
Qovulduq evimizdən, yollarını aç.
Gözümüz yaşlıdır, sinəmiz dağlı,
Mən deyim dərdimi, dinlə ey dəniz!
Ana qəlbi olur balaya bağlı,
Dinlərmisən məni, söylə ey dəniz.
Bir gecə yarısı əziz balamız,
Alındı əlimizdən bir laçın kimi.
Söndü işığımız, uçdu yuvamız
Həyat tarixində bunu gördünmü?
Çağla, coşğun dəniz, göz yaşımıztək,
Dağıt sularını bizdən əks edən,
Nə gələr payımız gen təbiətdən,
Ağla bir səmimi yoldaşımıztək.
Darmadağın eylə dalğalarınla
Bizi dar divara alan qalanı.
Heçliklərə sovur nalələrinlə
Çıxılmaz tilsimə salan qalanı.
Nəymiş təqsirimiz, neyləmişik biz?
Bunu sən sual et, mənim dilim yox.
Hansı xəyanətin şərməndəsiyiz,
Bunu sən sual et, mənim dilim yox.

1937, Bayıl həbsxanası

## KÖNÜL

Dərdli könül, söylə nə ahü-zardır,
Coşğun dəniz kimi üsyan eylərsən.
Gen dünya başına yenə də dardır,
Gizlin eşqləri bəyan eylərsən.

Yenə sığışmırsan bu dar qəfəsə,
Alovlar qatırsan çıxan nəfəsə.
Keçdi xəyalımdan yenə də kimsə
Gözümün yaşını rəvan eylərsən.

Yenə dərd əlindən gəlmisən cana,
Eyləmisən məni dəli-divanə.

Əridi şam kimi can yana-yana
Kəsilir, doğranır, fəğan eylərsən.

Qaranlıqdır sənə hər işıqlı gün,
Yanarsan daima, çıxmaz tütünün.
İnsafa gəl könül, mənə şən görün,
Axan yaşlarımı ümman eylərsən.

7 dekabr 1937, Bayıl həbsxanası

## MARAQ

Dəmir pəncərədə qalmış gözlərim,
Araram fəzada son qismətimi.
Od saçar ağzımdan çıxan sözlərim,
Hiss edərmi göylər fəlakətimi?

Görün gözlərimə, sən ey gələcək,
Görün ki, tükəndi, qalmadı səbrim.
Qaldır pərdələri ey çərxi-fələk,
Nə gözləyir məni, yoxdur xəbərim.

Söylə ki, nəsibim, müqəddəratım,
Hansı əllərdədir? Tanıtdır mənə.
Yəni vicdan varmı, ya ki, həyatım
Qatacaq göz yaşı dərinliyinə?

1937, Bayıl həbsxanası

## AYRILIQ

Mən saralıb sollam qərib ellərdə,
Sözüm dastan olar bütün dillərdə,
Gözüm qaldı çiçəklərdə, güllərdə,
Gül dərmədim, düşdüm çəmən ayrısı,
Sürgünəm, düşkünəm vətən ayrısı.

Ağlaram gözümün yaşı bitincə,
Sızıldaram əlim sizə yetincə,
Şerlər düzərəm incədən incə,
Canım candan cida, bədən ayrısı,
Sürgünəm, düşkünəm, vətən ayrısı.

Könül həsrətidir gül bənizlərin,
Lalə yanaqların, gülər üzlərin,
Xurmayı tellərin, ala gözlərin,
Gül dərmədim, düşdüm çəmən ayrısı,
Sürgünəm, düşkünəm vətən ayrısı...

Aprel 1938, Bayıl həbsxanası

## DOĞMA MUSİQİ

Qopardı ruhumu bu gün yerindən,
Elimin qəlbindən gələn nəğmələr.
Dinlərəm mən səni ey doğma vətən,
Könül dalğalanar, heycana gələr.
Titrərkən telləri tar, kamançanın,
Ürəyim döyündü, əlim titrədi.
Ey gözəl vətənim! Eşqinlə sənin
Gözlərim yaşardı, dilim titrədi.
Ah gözəl musiqi, susma bir az da
Qoy ötsün bülbüllər, onlar mənimdir.
Bir aləm canlanır hər tarda, sazda,
Bütün o sənətkar canlar mənimdir.
Çal, doğma musiqi, çal ki, səsinə
Qərib könüllərin ehtiyacı var.
Vurğun aşiqlərin hər nəfəsilə
Xəstələr dərdinə min şəfa tapar.
Çal, gözəl musiqi, gözəl muğamat,
Çal, bir az ağlayım, gülüm səninlə.
Qoy bəlkə özümü bir yarım saat
Elimin qəlbində bilim səninlə.
Bütün varlığımla dinlərəm səni,
Sən öz canım kimi yaxınsan cana.
Mən könül dostuyam, yad sanma məni
Canım səninlədir, getsəm hər yana!

Aprel, 1941, Temlaq.

# AZƏR BUZOVNALI
(1870 — 1951)

Uçuşur bülbüli-şuridə çəməndən-çəmənə,
Vəsf edir arizi-cananı səməndən-səmənə.

İstəyir bənzədə ləli-ləbi-canana özün,
Bağda qönçeyi-noxizə güləndən-gülənə.

Təlx ikən hicrdə eyşim oluram şirinkam,
Ləbi-dildarı xəyalımda əmməndən-əmənə.

Düşəli eşqinə məcnunluğum oldu məşhur,
Sözüm əfsanə kimi düşdü dəhəndən-dəhənə.

Can meşamini müəttər eləyir badi-səba,
Toxunub türrəyi-canana dəgəndən-dəgənə.

Zülfinə dil verəli böylə pərişan halın,
O zamandan gəlirəm rast mihəndən-mihənə.

Vurmuşam tarə qəmi-hicrimə mizrab-sitəm,
İnlədir xatiri-zarimə dəgəndən-dəgənə.

Aldanıb xalına dil mürği dolaşdı damə,
Şikəni-zülfdə bağlandı rəsəndən-rəsənə.

Ağlaram ruzi-vüsalındakı dəmlər, Azər,
Şəbi-hicrində xəyalıma düşəndən-düşənə.

## HACI KƏRİM SANILI
(1878 — 1937)

### UCA DAĞLAR

Könlümün sevdiyi ey uca dağlar,
Ölməyib səfanı bir də sürəydim.
Göy üzü güzgü tək saf olan çağlar,
Çiçəyin tək ulduzları görəydim.

Gün çıxıb hər yana nur yayılanda,
Şeh salmış damcılar dürr sayılanda,
Bülbüllər çırpınıb, gül ayılanda
Gəzəydim üstündə, lalə dərəydim.

Gümüş tək parlayan şiş qayaların,
Dibindən qaynayan soyuq suların,
Gözündə əllərin yuyan qızların
Dərdiyim gülləri yoluna sərəydim.

Qalxaydım bir də mən çənli bellərə,
Baxaydım doyunca yaşıl göllərə,
Günlüklü lilpara, çılpaq çöllərə,
Dərəydim, sonrakın zənbil hörəydim.

Dağlar toy eyləyib mağar salanda,
Çiçəklər oynayıb, quşlar çalanda,
Naxırlı, ilxılı el yığılanda
Boynuna salmağa qolum gərəydim.

## ARAN KÖÇÜ

Gəldi yayın ortası,
Kəsdi dağın laylası.
Yandı gözəl çiçəklər,
Pozuldular bəzəklər.
Güney yandı, qaraldı,
Qüzeylər də saraldı.
Asırqallar qırıldı,
Yarpaqları cırıldı.
Quzuqulaqlar qatdılar,
Cil otları yatdılar.
Kəkotları tumlandı,
Arı səbəti mumlandı.
Ağ çiçəklər soldular,
Yarpızlar çöp oldular.
Boy çiçəyi yetişdi,
Bağlara ətri düşdü.
Qız-gəlinlər dərdilər,
Yaylıqlara sərdilər.
Yasdıqlara basdılar,
Döşlərindən asdılar.
Kisələrə tikdilər,
Boğçalara tökdülər.

## QOYUN YUYULMA

Bol fəsəli yağlandı,
Süfrələrə bağlandı.
Sürüləri yüməyə[1],
Fəsəlini yeməyə
Getdi bütün cahıllar,
Evdə qaldı ahıllar.
Cumpuzlardan[2] basdılar,
Dərin yüyəd[3] kəsdilər.
Keçiləri böldülər,
Qoyunu gölə sürdülər.
Qaldırdılar fışqırtı,

---

[1] Yüməy—yumaq.
[2] Otu üstündə qazılıb götürülmüş torpaq parçası.
[3] Çayda qoyunları yumaq üçün düzəldilən göl.

Tüfəngatma, çığırtı.
Birin tutub qolundan,
Öyəşləyib[1] dalından,
Çoban gölə tulladı,
Qoyunları urladı[2].
Bu qoyunun dalınca,
Birisi qalmayınca
Sürü bütün sığandı[3],
Batdı suya, islandı.
Sadırları[4] yüyüldü,
Çirki, pası töküldü.
Gün dəydi, qızındılar,
Çıxdılar çırpındılar.
Yunları pardaqlandı,
İpək kimi sallandı.
Ondan sonra çobanlar-
Cahıllar, beyniqanlar
İtələyib bir-birin,
Batırdılar özlərin.
Patavalı, papaqlı,
Başlı, gözlü, ayaqlı,
Süzələnmiş çıxdılar,
Paltarların sıxdılar,
Yüyədçilər[5] - zirçiklər[6],
Uşaqlar, həm böyüklər.
Ala iti tutdular,
Onu da gölə atdılar.
Qaqqıldaşıb güldülər,
Qayıdıb evə gəldilər.

---

[1] Qoyunun dal ayaqlarını qaldırıb, qabaq ayaqları üstə aparmaq.
[2] Qoyunları suya çağırmaq.
[3] Suya tökülüb o biri taya keçmək.
[4] Qoyunun yununa bələşmiş çirk.
[5] Yüyədçi—qoyun yuyan.
[6] Zirçik—şitlik edən adam.

## SƏFVƏT
(1878 — 1946)

### BAKIDAN AYRILARKƏN

Gəldi ziyarətə səni, ey xak, övladın,
İllər boyunca canıma qüvvət verib adın.
Odlar yığıncağı yerin altında səndədir,
Yoxsa səbəb odur ki, soyuqlarda solmadın.
Ey şanü şöhrəti dutan afaqı sərbəsər,
Ey qəhrəman doğan ana, ey mehriban qadın,
Şən qal, gözəl yaşa, analar yurdu ey vətən,
Zillət kəməndinə özünü çünki salmadın.
Düşmənlər ölkəsində əsir pərçəmin sənin,
Qaytarmağa faşizm elin avarə qalmadın.
Tarix səhifəsində yazılmış fəzilətin,
Fəxrimdi bu ki, onları tapdın, unutmadın.
Yrfana doğru elmü təməddün yolun dutub,
Dərk eylədin də mərifətin ləzzətin, dadın.
Açdın səadətin yolunu xəlqinə bu gün,
Gördüm səni ki, bir gecə olsun da yatmadın.

### MİRZƏ CƏLİL NAMINA

Mühiti-cəhldən insanları ürfana sövq etmək,
Olur mümkün zəkadan, olsa əldə məşəli-fitrət.
Səadət xidməti-millətdir, ancaq kimsə istərsə,
Zəfəryab olmağa lazımdır olsun hümmətü ğeyrət.
Necə bavər olur binaya nabina ola rəhbər,
Gərək irşad üçün ayinə olsun sürətü-sirət.
Məgər hər tifli-əbcədxan olurmu Molla Nəsrəddin?
Qələmi pərçəmi-hürriyyət olmuş, dəftəri fikrət.
Vətənə aşiqi-şeyda cəlilülqədr olan Molla,
Yaşasın hörməti dünya durunca, mən alım ibrət.
Keçənlər yadına əşkim gözümdən çeşmə tək axdı,
Gələnlərdə mənim halım fəqət təsir edib heyrət.

## SƏİD SƏLMASİ
(1889 — 1909)

### XƏYALİ - MƏFUR

Çəkil, həyatımı müdhiş edən xəyal, çəkil.
Müdam nifrətə bais o hali-tənnazın.
Çəkil də qılma mənə şux müşribanə nigah,
Sübati-əzmimi qırmaz o çeşmi-qəmmazın.

Danışma! Sus deyirəm, istəməm, yəqin etmə,
Gəlirmi yadına bir şəb başın sinəmdə ikən
O almalıq denilən yerdə biz oturmuşduq...
Ağacların arasında qüruba qarşı yenin.

Qəmər üfül eləyərkən, dərin-dərin bir ah
Çəkib, yapışdın əlimdən, o dəm dedin, ey vah.
Sabah yaxlaşıyor məncə sizdən ayrılmaq.

"Təhəmmüli-bəşərin xaricində nikbətdir"
Şu söz ah... yalanmış, bu bir xəyanətdir.
Çəkil, çəkil! Məni aldatma!.. istəməm mütləq.

### TƏHƏSSÜR

Yetişir guşə dadi-istimdad,
Hər tərəfdən havayi-istibdad.
Eləyir cismi-milləti məsmum,
Hökmfərma, nifaqü məhv və dad.
Şad olur dil görüncə millətinin
Bir bölük mərifətli ehrarın.
Qət edərlər qələmlə rişəsini
Şəcəri-zülm olan məlainin.

### AMALİ - VƏTƏN

Amalımız, əfkarımız üqbali-vətəndir,
Sərhəd bizə, qələ bizə xaki-vətəndir.
Dəva günü yeksər görünən qanlı kəfəndir,
İranlılarıq, can veribən nam alarıq biz.
Dəvada şəhadətlə hamı kam alırıq biz.

Qanilə qılıncdır görünən baydağımızda,
Can qorxusu yoxdur dilimizdə, canımızda,
Hər guşədə bir şir yatıb torpağımızda,
İranlılarıq, can veribən nam alarıq biz.
Dəvada şəhadətlə hamı kam alarıq biz,

## SEYİD ZƏRGƏR
(1880 — 1920)

Pərişan qarə zülfüntək pərişan olmayım, neylim?
Qapında, padişahım, söylə, dərban olmayım, neylim?

Təmənnayi-vüsal eylər dili sədparə, mümkün yox,
O meygün ləli-nabıntək çigərqan olmayım, neylim?

Gözün səyyad, zülfün dam, qaşın tici-xunaşam,
Bu üç cəllad əlində qanə qəltan olmayım, neylim?

Görəndə surəyi-Quranda hökmi "ikraməzzəyfi",
Əzizim, xani-vəslin üzrə mehman olmayım, neylim?

Görənlər oldu heyran qamətü rəftarü govtarın,
Gülüm, bu sehrə, bu ecazə heyran olmayım, neylim?

Vəfa toxmini səpmə şurəzarə söylədim, səpdin,
Rəqibə aşinasan, didə giryan olmayım, neylim?

Könüldə qaldı həsrət, ah kim, ey Seyyidi-Zərgər,
Bu sevdadan ziyan gördüm, peşiman olmayım, neylim?

***

Ey səba, bu necə səsdi məni heyran etdi?
Göz yaşım cari edib, bağrımı al qan etdi?
Bu necə ləhndü kim eylədi bidar məni,
Xabdən bu dili-büryanımı büryan etdi?
Guş verdikcə o avazeyi-dilsuzə, əcəb
Çıxarıb əqlimi, halimi pərişan etdi.
Taqəti-səbrimi əldən alıb ol İsadəm,
Cəzb edib ləhni onun cismimi bican etdi.
Yüksələn dəmdə səhər vaxtı o sövti-Davud
Çeşmi-giryanımı nəzzarəyi-hər yan etdi.
Heyf kim bilmədim o həzrəti-İsadidə
Kimdü ol sövti-cahan içrə nümayan etdi.
Deyin ol bülbüli-sübhə ki, siz, ey ariflər,
Canını Seyyidi-Zərgər sənə qurban etdi.

***

Bu könlümün quşuna dur ver abü danə, gözəl
Amandü, rəhm elə, ey Yusifi-zəmanə, gözəl.
Yanar fəraqüvə könlüm misali-pərvanə,
Əlac eyləgilən, qoyma yanə-yanə, gözəl.

## MƏŞƏDİ XANIM LEYLİ
(1892 — 1912)

*Məşədi xanım Leyli XIX əsrin ikinci yarısında Bakıda yaranmış "Məcməüş-şüəra" adlı ədəbi məclisin gənc üzvlərindən olan şair Mir Əbdülvahab Seyid Zərgərin həyat yoldaşıdır. Uşaq üstündə xəstələnərək, iki cərrahiyyə əməliyyatı keçirən bu istedadlı şairə çox cavan yaşlarında vəfat etmişdir. "Ölürəm" rədifli şerini ölüm yatağında əri Seyid Zərgərə diktə etmişdir.*

Həlal qıl məni, ey şairi-fikar, ölürəm,
Edib daha məni gürgi-əcəl şikar, ölürəm.

Zəmanə qoymadı bir dəm deyim gülüm, danışım,
Gözümü qoydu mənim səndə intizar ölürəm.

Bahari-ömrümü dövrani-dun xəzan etdi,
Olundu işrətimin rəxti tarümar, ölürəm.

O ağlayan gözünə gözlərim fəda olsun,
Dayanma, al kəfənim, hazır et məzar, ölürəm.

Məni bağışlaginən, çox xəcalətəm səndən,
Cəfamı çəkmisən, əfsus səd həzar, ölürəm.

Nişanə qalmadı məndən, qızım da öldü mənim,
Gözümə oldu əcəb tirə ruzigar, ölürəm.

Qızımla mən sənə, ey aşiqim, fəda olduq!
Bu bir qəzəl sənə məndəndi yadigar, ölürəm.

Həlal qılginən, ey dust, xəstə Leylini,
Görüm ola sənə pərvərdigar yar, ölürəm.

## ƏLİ FİTRƏT
(1890 — 1945)

### AZƏRBAYCANIM, YAŞA!

Yaşa, yaşa, Azərbaycanım, yaşa,
Sənsən mənim dinü imanım, yaşa!

Günəş kimi nurun saçır hər yana,
Gözəl vəsfin gəlməz sənin bəyana,
Canlar qurban sənin kimi məkana,
Şərafətli mənim məkanım, yaşa,
Yaşa, yaşa, Azərbaycanım, yaşa!

Torpağın mişki-ənbərdən yaxşıdır,
Daşların ləli-gövhərdən yaxşıdır,
Suların abi-Kövsərdən yaxşıdır,
Sənsən mənim bağı-cinanım, yaşa,
Yaşa, yaşa, Azərbaycanım, yaşa!

Sən Babəklər, Koroğlular yurdusan,
Yatıb sənin hər guşəndə min aslan,
Sən yetirdin Səttarxan tək qəhrəman,
Oldun mənim ruhi-rəvanım, yaşa,
Yaşa, yaşa, Azərbaycanım, yaşa!

Vətən qədri bilən insan var olsun,
Oğlu, qızı onun bəxtiyar olsun,
Vətənin sevməyən daim xar olsun,
Daim şərəfli aşiyanım, yaşa,
Yaşa, yaşa, Azərbaycanım, yaşa!

Qızıl bayraq, qızıl ləşkər yaşasın,
Bizim əziz, şanlı rəhbər yaşasın.
Bu millətə olan sərvər yaşasın,
Bir onadır mənim gümanım, yaşa,
Yaşa, yaşa, Azərbaycanım, yaşa!

# ƏHMƏD CAVAD
(1892 — 1937)



*Böyük milli şairimiz Əhməd Cavad Şəmkirin Seyfəli kəndində doğulmuşdur. Bədii yaradıcılığa XX əsrin əvvəllərində başlayan Əhməd Cavadın "Qoşma" adlı ilk şer kitabı 1916-cı ildə nəşr edilmişdir. Cavad yaradıcılığının ən məhsuldar illəri Cümhuriyyət dövrüdür. Şerlərində milli istiqlal ruhunu ifadə edən, Azərbaycana yardıma gələn türk ordusunu, müstəqil Azərbaycan bayrağını tərənnüm edən şair bu dövrün ən parlaq ədəbi istedadıdır. Cümhuriyyətin süqutuna da Cavad ən yanıqlı misralarını həsr etmişdir. Yzeyir Hacıbəylinin həmin illərdə bəstələdiyi, hazırda ikinci dəfə müstəqillik qazanmış Azərbaycanın Dövlət Himninin sözlərini də Əhməd Cavad yazmışdır. Cavadın başqa bir şeri — "Çırpınırdın Qara dəniz" şeri (onun da musiqisini Üzeyir bəy bəstələmişdir) Türkiyədə milli himn səviyyəsində populyardır.*

*Əhməd Cavad 37-ci il repressiyalarının qurbanı olmuş, həmin il oktyabrın 12-də güllələnmişdir.*

## BİSMİLLAH

Atıldı dağlardan zəfər topları,
Yürüdü iləri əsgər, bismillah!
O xan sarayında çiçəkli bir qız
Bəkliyor bizləri zəfər, bismillah!

Ey döyünən ürək, dumanlı şəhər,
Bilirmisən bu zır gurultu nədir?
Aç sisli qoynunu ordumuz gəlir.
Nişanlın qoynuna girər, bismillah!

Ey hərbin taleyi bizə yol ver, yol!
Sən ey gözəl dəniz, gəl türkə ram ol!
Sən ey sağa, sola qılıc vuran qol
Qollarına qüvvət gələr, bismillah!

Ey Bakı, sən qorxma, gəldik, gələli
Sənin üçün biz atıldıq iləri,
Sağ olan annelərə olur təsəlli
Şəhidlərin ruhu gülər, bismillah!

Ey düşmən, alnının yazısı qara,
Öldürməz bizlərə vurduğun yara,
Yolladığım qurşun ərmağan sənə
O kirli alnını öpər, bismillah!

Sən mərd olub dursan qarşımda əgər,
Qudurğan saçmalı növbətin keçər.
Sağlandığın torpaq qanını içər,
Yurdum olmaz sənə sipər, bismillah!

Yurdumuzda bizə meydan oxuyan,
Murdar cəmdəkləri murdar qoxuyan,
Təkbir səslərini uzaqdan duyan
Düşmanımız aman istər, bismillah!

## AZƏRBAYCANIN DÖVLƏT HİMNİ

Azərbaycan, Azərbaycan!
Ey qəhrəman övladın şanlı Vətəni!
Səndən ötrü can verməyə cümlə hazırız!
Səndən ötrü qan tökməyə cümlə qadiriz!

Üç rəngli bayrağınla məsud yaşa!
Minlərlə can qurban oldu!
Sinən hərbə meydan oldu!
Hüququndan keçən əsgər
Hərə bir qəhrəman oldu!

Sən olasan gülüstan,
Sənə hər an can qurban!
Sənə min bir məhəbbət
Sinəmdə tutmuş məkan.

Namusunu hifz etməyə,
Bayrağını yüksəltməyə,
Cümlə gənclər müştaqdır!
Şanlı Vətən, Şanlı Vətən!
Azərbaycan, Azərbaycan!

## NƏDƏN YARANDIN?

Sən qüdrətin aşıb-coşan vaxtında
Mələklərin gülüşündən yarandın.
Sehr dilli bir fırçanın əliylə
Ahuların duruşundan yarandın.
Ay işığı, gözəlliyin, qızlığın
Çiçəklərlə öpüşündən yarandın.
Sərinlətdin baxışınla könlümü,
Buludların uçuşundan yarandın.
Qaranlıqda boğulurkən ümidim
Dan ulduzu yürüşündən yarandın.
Masəvadan uçmuş birər kölgənin
Dan yeriylə görüşündən yarandın.
Gözəllikçin təbiətlə qüdrətin
Yavaşca bir soğuşundan yarandın.
Qələm əldə ilhamımı dinlərkən
Sən qəlbimin duruşundan yarandın.

## AZƏRBAYCAN BAYRAĞINA

Türküstan elləri öpüb alnını,
Söyləyir dərdini sana, bayrağım!
Üç rəngin əksini Quzğun dənizdən,
Ərməğan yolla sən yara, bayrağım!

Gedərkən Turana çıxdın qarşıma,
Kölgən dövlət quşu, qondu başıma.
İzin ver gözümdə coşan yaşıma,
Dinlətsin dərdini ahə, bayrağım!

Qayıxan soyundan aldığın rəngi,
Qucamış İlxanla müsəlman bəgi.
İlxanın övladı, dinin dirəyi,
Gətirdin könlümə səfa, bayrağım!

Köksümdə tufanlar gəldim irəli,
Öpüm kölgən düşən mübarək yeri.
Allahın yıldızı, o gözəl pəri,
Sığınmış qoynunda aya, bayrağım!

## TÜRK ORDUSUNA

Ey şanlı ölkənin şanlı ordusu,
Unutmam Qafqaza girdiyin günü!

Gəlirkən qovmaya Turandan Rusu
Ayağını Qara dəniz öpdümü?

İlk atarkən əski bürcə addımı,
Qars qalası salam topu atdımı?
Sən yaparkən orda zəfər şənliyi,
Məğlub duşmən qaşlarını çatdımı?

Çıxdığın gün Allahəkbər Dağına
Dağıstan dağları qibtə eylədi.
Baxdı Xan Sarayı viran tağına,
"Sən gəlirsən şən oluram" - söylədi.

Gəldiyin gün Kürün axar-baxarı,
Əski günahlardan silkindi, çıxdı.
Eşidib Gümrüdə təkbir səsini,
Araz sevincindən dünyayı yıxdı!

1918, Gəncə

## ŞƏHİDLƏRƏ

*Azərbaycandakı osmanlı şəhidlərinə*

Qalx, qalx! Sarmaşıqlı məzar altından,
Gəlmiş ziyarətə qızlar, gəlinlər.
Ey karvan keçidi, yollar üstündə,
Hər gələn yolçuya yol soran əsgər!

Sənin qovduqların yabançı xanlar,
Qurtardı ölkəmi tökdüyün qanlar!
Bax nasıl öpməkdə tozlar, dumanlar,
Qərib məzarını mənlə bərabər!

Sənin qanındanmı düzlərdə böylə
Qüdrət bitirmişdir sayılmaz lalə?!
Dost elindən qopdu bir yanıq nalə,
Yoxsa o nalənin ruhumu söylər?!

Keçərkən göylərdən bir qatar durna,
Ağlar buraxdığın gözləri sorma!
- Bax doğru çıxmaqda gördüyün röya,
Bəslədiyin əməl bu gün gülümsər.

Çarıqlı qardaşın sadədil köylü,
Gəldi məzarına bir örük urdu.
Toplanıb baş-başa hər üçü-dördü
Hər gün köylü qızlar dərdini dinlər!

10 mayıs 1919, Gəncə

## ÇIRPINIRDIN QARA DƏNİZ

Çırpınırdın Qara dəniz
Baxıb türkün bayrağına.
"Ah" deyirdin heç ölməzdim
Düşə bilsəm ayağına!

Ayrı düşmüş dost elindən
İllər var ki, çarpar sinən...
Vəfalıdır gəldi, gedən
Yol ver Türkün Bayrağına!

İncilər tök, gəl yoluna,
Sırmalar düz sağ-soluna
Fırtınalar dursun yana
Salam Türkün Bayrağına!

Hamı deyə o türk qanı
Heç birinin bitməz sanı.
"Kazbek" olsun ilk qurbanı,
Salam Türkün Bayrağına!

Dost elindən əsən yellər
Bana şer... salam söylər.
Olsun bizim bütün ellər
Qurban Türkün Bayrağına!

## AZƏRBAYCAN, AZƏRBAYCAN

Dağlarının başı qarlı,
Sinəsi yaşıl ormanlı,
Dərələrin şirin barlı
Azərbaycan, Azərbaycan!

Səhraların sünbüllüdür,
İl müdam üstü güllüdür.
Baxçaların bülbüllüdür
Azərbaycan, Azərbaycan!

Durna gözlü bulaqların,
Cənnət kimi yaylaqların,
Geniş-geniş oymaqların
Azərbaycan, Azərbaycan!

Ormanında maral gəzər,
Çöllərində ceyran süzər,
Göllərində qazlar üzər
Azərbaycan, Azərbaycan!

İlxında ayğır kişnəşir,
Naxırında buğa güləşir,
Süründə əmlik mələşir
Azərbaycan, Azərbaycan!

Qayaların əlvan, mərmər,
Belində var qızıl kəmər,
Bir yanında Bəhri-Xəzər
Azərbaycan, Azərbaycan!

Sinən odu şölə salır,
Dünya səndən işıq alır,
Verməyəndə zülmət qalır
Azərbaycan, Azərbaycan!

İpək, pambıq, yunun çoxdur,
Arpa, buğda, düyün çoxdur,
Hər şeyin var, nəyin yoxdur?
Azərbaycan, Azərbaycan!

Yer üzündə yoxdur tayın,
Gur-gur axar neçə çayın,
Bol veribdir fələk payın
Azərbaycan, Azərbaycan!

Laçının var, tərlanın var,
Çoxlu şirin dastanın var.
Qorxun yoxdur, düşmanın var
Azərbaycan, Azərbaycan!

## DAN ULDUZU

Bu qaranlıq gecə nə qədər sürdü,
Yetiş imdadıma, ey dan ulduzu!
Barı sən gəl, mənə yuxu gəlmədi,
Yetiş fəryadıma, ey dan ulduzu!

Qudurğan qasırğa, çarpaşıq yollar,
Yolumda zülmət var, uçurumlar var,
Yetiş ki, ömrümün karvanı ağlar,
Aman, gəl dadıma, ey dan ulduzu!

Bu sönük ulduzlar məni aldadır,
Süzgün gözlərinlə gəl onu andır,
Gözlərim yolunda, üzüm haqdadır
Aman, sən yox demə, ey dan ulduzu!

## YENİLƏRƏ

Mən bir aşiqəm ki, bu çaldığım saz
Dumanlı dağlara səs salacaqdır.
Ağlatdığım teldə inləyən avaz
Elin xatirində çox qalacaqdır.

Doğrayacaq səsim dağda dumanı,
Dinləyəcək məni dağın çobanı.
Mən sorduğum zaman: sevdiyim hanı?
Təbiət dəyişib yaz olacaqdır.

Qorxutmayır məni bu anmayanlar,
İsrafil surindən oyanmayanlar.
Göstərdiyim yola inanmayanlar
Bu yeni dünyada ad alacaqdır.

## GÖYGÖL

Dumanlı dağların yaşıl qoynunda
Bulmuş gözəllikdə kamalı Göygöl.
Yaşıl gərdənbəndi gözəl boynunda
Əks etmiş dağların camalı Göygöl!

Yayılmış şöhrəti Şərqə, Şimala,
Şairlər heyrandır səndəki hala.
Dumanlı dağlara gələn suala
Bir cavab almamış soralı Göygöl!

Bulunmaz dünyada bənzərin bəlkə,
Zəvvarın olmuşdur bu böyük ölkə.
Olaydı könlümdə bir yaşıl kölgə
Düşəydi sinənə yaralı Göygöl!

Sənin gözəlliyin gəlməz ki, saya,
Qoynunda yer vardır, ulduza, aya.
Oldun sən onlara mehriban daya,
Fələk busatını quralı Göygöl!

Kəsin eyşi-nuşi, gələnlər, susun!
Dumandan yorğanı, döşəyi yosun.
Bir yorğun pəri var: bir az uyusun.
Uyusun dağların maralı Göygöl!

Zümrüd gözlərini görsünlər deyə,
Şamlar boy atmışdır, uzanmış göyə.
Keçmişdir onlara qəzəbin niyə,
Düşmüşlərdir səndən aralı Göygöl!

Dolanır başına göydə buludlar,
Bəzənmiş eşqinlə çiçəklər, otlar,
Öpər ayağından qurbanlar, otlar,
Ayrılıq könlünü qıralı Göygöl!

Bir sözün varmıdır əsən yellərə?-
Sifariş etməyə uzaq ellərə...
Yayılmış şöhrətin bütün dillərə,
Olursa, olsun qoy haralı Göygöl!

*1925*

## KÜR
*(İxtisarla)*

"Mərcan suyu" qaynağın,
Ellər sənin oylağın,
Nə gözəldir yaylağın,
Gəlin kimi baxan Kür!

Dünyanın ilk çağından,
Ərdəhanın dağından,
Əski bürcün sağından
Çıxıb keçən, axan Kür!

"Alagöz"dən bu yana,
"Ağbaba"dan o yana,
Hey dayana-dayana
Gəzintiyə çıxan Kür!

Gürcücə "Matkovari",
Türklərin qədim yarı,
Gəzib bir çox diyarı,
Aşiqləri yaxan Kür!

Dinləyib hay-huyunu,
Çox içmişəm suyunu,
Beş vilayət boyunu
Əndamına taxan Kür!

"Araqva"nı al yoldaş,
"Alazan"la qucaqlaş,
"Arazı" götür birbaş
Get Xəzərdə yıxan, Kür!

Get sallana-sallana,
Suyunda çimsin sona.
Girmə Tiflisdə qana,
Nə bir ləkə, nə qan Kür!

Məğrur olma çox elə,
Ellərə bir şey söylə.
Ceyran çölündən belə,
Qıvrılaraq çıxan Kür!

Gürcü, ləzgi, moğoldan,
Güc yığıb sağdan, soldan,
Sonra çıxınca yoldan
Şimşək olub çaxan Kür!

Çatıb bəzən qaşını,
Bulayırsan başını,
Yığıb çölün daşını
Ölüm, barıt qoxan Kür!

"Qaraoğlan" düzündə
Şimşək çaxar gözündə,
Nə duyulmaz sözündə,
Hey canından doyan Kür!

Hərdən çıxıb Muğana,
Başlayırsan talana.
Doydurdun bizi cana;
Ölməzdi hər yıxan Kür!

Gəl başını bulama,
Get yolunla dolama,
Pambıqları bulama,
Çox kirlidir çuxan, Kür!

Öt çəkinə, çəkinə,
Dəymə bostan ləkinə,
Girmə belə əkinə,
Əldə qalar yaxan, Kür!

Kür!
Bir az dur!
Bu doğrudur!

***

Bir səs duydum dərindən
Çıxdım Qaf yoxuşunu;
Zalımların əlindən
Qapdım dövlət quşunu.

Qururam yeni həyat,
Mən hara, durmaq hara?
Quşlardan aldım qanad-
Dırmandım buludlara.

Qorxunu mən qaldırdım
Dövranın gərdişindən.
Çox qurbanlar saldırdım
Aslanların dişindən.

"Məndədir qüvvət" deyə
Mən söylədim ucadan;
Mən bağırdım fələyə:
"Buyur, bu top, bu meydan".

Kür,
Bu gün dünya qovuşmuş haq bağıran səsimdən,
Cahanın məzlumları feyz alır nəfəsimdən.
Möcüzələr yaradır alnımdakı qan-tərim,
Dünyanın hər yerində söylənməkdə hünərim.
Mən tərənnüm etdiyim əmək qəsidəsindən,
İdrakımla vurduğum çəkicimin səsindən
Çatlayır divarları qaranlıq zindanların,
Mənədir hər ümidi əzilmiş insanların.
Mən oldum ilkin quran dünyada düzgün əsas;
Mən yıxdım, mən devirdim,
mən aldım gücdən qisas.

Mən artıq tək Kür deyil,
Dənizləri boğaram.
Məğrur olma çox, əyil;
Qudurdunmu, qovaram.

Qul olarsan istəsəm,
Dırmaşarsan dağlara;
Gəzməzsən belə sərsəm,
Can verərsən bağlara.

Tutaraq cilovundan
Azdıra da bilərəm.
Bu gün qətlinə fərman-
Yazdıra da bilərəm.

Əlimdədir cilovun,
Sıxaram çıxar suyun;
Sönər odun, alovun,
Qısalar uzun boyun.

Hər şeyini soyaraq
Püflərəm çırağını.
Məngənəyə qoyaraq
Çıxararam yağını.

Güvənmə çox qoluna,
Düş doğruca yoluna.
Sərsəm gəzmək yaramaz
Peyin daşı, tarla qaz.

Çevir dəyirmanımı,
Calıb döy xırmanımı
Qırxaraq qoyunumu,
Əyir, dara yunumu.

Dolaşıb dağı, daşı,
Qatırım ol, yük daşı.
Əyil Kürüm, əyil keç!
Meydan sənin deyil, keç!

18 aprel, 1930.

***

Səhər zamanıydı əsərkən yellər,
Düşərkən jalələr oyatdı səni.
Çatıldı qaşların, darıldın mənə,
İslatdı jalələr nazik bədəni.

Bütün bir səhəri yalvardım durdum,
Boş qalmış qoynuna çiçək doldurdum.
Gülzarına Quran deyə əl vurdum,
İnanmadın niyə, gülmədin niyə?

And içdim ki, könlüm sənsiz yaşamaz,
Sənsiz, o bir ağlar telli sınıq saz.
Qollarına verdin o dəm bir pərvaz,
Oxşadın sinənə cansız düşəni.

İndi sənsiz xəstə könül sərsəri,
Dolaşmaqda bütün qürbət elləri,
Ey könlümü bir yol güldürən pəri,
Niyə ağlar qoydun illərcə məni?

## QIZIMA

Qüdrətim olsaydı, yaza bilsəydim,
Bir kağız üstünə bu dərdi, qızım!
Sənin müsibətin mənim dərdimdən
Neyləyim ki, qat-qat betərdi, qızım!

Bunu kim deyərdi bir səhər çağı,
Tarımar olacaq ömrümün bağı?
İpək tellərinin gəlsə sorağı,
Qəlbimdə nə güllər bitərdi, qızım!

Mənim müsibətim gəlməz ki, başa,
Dur dedim - durmadı - gözümdə yaşa.
Desəydin dərdimi qəbirdə daşa,
O da dil-dil olub ötərdi, qızım!

Süzülüb bir daha gələ bilsəydin,
Barı bircə dəfə gülə bilsəydin,
Ya da rahat-rahat ölə bilsəydin,
Bütün qəmim, qüssəm itərdi, qızım?!

Məktəb bacıların gördülər zatən,
Can verən sən idin, canı çıxan mən.
Sən çıxıb gedərkən təzə aləmdən,
Mənim alnımdakı nə tərdi, qızım?!

Gözlərim qurudu, sonam ağladı,
Sonama səs verdi anam ağladı,
Toyuna aldığım xınam ağladı,
Mənə qara daşlar gül verdi, qızım!

Səndən bir yadigar qalacaq deyə,
Of.. yaza bilsəydim bircə mərsiyə;
Biçarə qəlbimi sərinlətməyə,
İnan, ömürlükcə yetərdi, qızım!

## ŞÜKRİYYƏM ÜÇÜN

Bir gülsən, dərmişəm gənclik bağından,
Bir gülü, çiçəyi dərmərəm sənsiz.
Kam aldım ömrümün oğlan çağından,
Bir bağa, bağçaya girmərəm sənsiz.

Söylə yadındamı Çakva, Batumi?
Ovladın könlümü, çaldın ruhumu!
Kamana dönmüşdü qəlbimin simi,
Hurini, mələyi görmərəm sənsiz!

Nə çoxdur dünyada qənirsiz pəri,
Gözümə görünməz daha heç biri!
O qızıl saçları, ipək telləri
Əl atıb birini hörmərəm sənsiz.

Məndən xoşbəxt varmı dünyada, deyin?!
Ey telli yavrusu Süleyman bəyin!
Bəxtim tərlan imiş: yeyindən yeyin!
Heç kəsə bu bəxti vermərəm sənsiz!

Səninlə gəzərəm eldən-elə mən,
Bataram, çıxaram seldən-selə mən.

Düşsəm də ağıza, dildən-dilə mən,
Yaşaya bilmərəm bir kərəm sənsiz!

Sonatək göllərdə üzsən də mənsiz,
Quş olub göylərdə süzsən də mənsiz,
Sən Əsli qalsan da, dözsən də mənsiz,
Alışıb yanaram mən Kərəm sənsiz!

Şükriyyə taleyim, şükür xudaya!
Gördüyüm doğrumu, yoxsa pək röya?!
Dolub ürəyimə bu dadlı xülya,
Şirin günlərimi sürmərəm sənsiz!

Əvət, bu sevdanın səfası çoxdur,
Sevdasız həyatın mənası yoxdur!
Gözlərin yıldızdır, kipriyin oxdur,
Ürək qubar olar - can verəm sənsiz...

Şerimin özüsən, sözü - ahəngi!
Üzündə bərq vurur güllərin rəngi!
Xəyalın, cəmalın gözəl çələngi!
İlham yetim qalar, ağıl kəm sənsiz!

## SƏN AĞLAMA

Mən deyən yox, fələk deyən oldusa,
Əsdi yellər, gül yanağın soldusa,
Dərd əlindən ala gözlər doldusa,
Sən ağlama, mən ağlayım, gözəlim!

Uğrunda olmuş ikən sərsəri,
Mən öpmədən o qıvırcıq telləri,
Dağıtdısa təbiətin yelləri,
Sən ağlama, mən ağlayım, gözəlim!

Hanı sənin hər eşqinə, hər gəncə
Eşq oxuyan qəlbin, sönmüşdür məncə,
Bulamayırsa qəlbin artıq əyləncə,
Sən ağlama, mən ağlayım, gözəlim!

Bir quş idim gecə-gündüz sizlərə,
Yazıq, məni güldürmədin bir kərə...
Baxıb indi alnındakı izlərə
Sən ağlama, mən ağlayım, gözəlim!

Mən baxarkən sən vurduğun yaraya,
İndi zalım fələk girdi araya...
Bax, xəstə qəlbimlə gəldim haraya,
Sən ağlama, mən ağlayım, gözəlim!

## MAYIS

Mən hər ildə bir mayısa
Lap çox ümidlər bağlaram.
Hər gələcək mayıs üçün
Nisan ağlar, mən ağlaram.

Düşdüm çorluq biyabana,
Sığınamam bir insana.
Gözəl mayıs ümid səna
Hər yan ağlar, mən ağlaram!

Bax dumana - dağ başında,
Dərdə düşmüş - gül yaşında,
Coşmuş gözlər - yaz başında,
Duman ağlar, mən ağlaram!

Sənsiz bir gül, ya bir şer
Hərdən məni məmnun edir.
Sorsa bir kəs dərdin nədir?
Soran ağlar, mən ağlaram!

Açmazmı gül sağda, solda,
Görünməzmi bəyaz alda?!
Sənsiz böylə, yarı yolda,
Qalan ağlar, mən ağlaram!

Olmadan axşam əzanı,
Yola çıxart yol azanı.
Kəsmiş yolu dərd tufanı,
Karvan ağlar, mən ağlaram!

Səccadəyə alın sürtən,
Birlikdə bir cənnət görən,
Haqq yolunda Xəlil verən
Qurban ağlar, mən ağlaram!

Boş çıxarsa bunca əmək,
Babalarca bu nə demək?!
Qədərmidir, yoxsa fələk,
Duyan ağlar, mən ağlaram!

Xoş hər mayıs batmaz yasa,
Hər zamanmı mənə taza?!
O gün də bir gün olmasa,
Vicdan ağlar, mən ağlaram!

## YARALI QUŞ

Yaralıdır könlüm quşu, yaralı,
Yaralandı yazıq aşiq olalı.

Bir dərinlikdə ki, hər düşən çıxmaz,
Qurtulmaq istəyir, qanad yaramaz.
İmdadına gələn, ümidindən az,
Yaralıdır könlüm quşu, yaralı!

Dost ararkən ovçu çıxdı yoluna,
Əzrail sağına, ölüm soluna!
Vurma, ovçu qanadına, qoluna,
Yaralandı yazıq şair olalı!

Aman ovçu, bunun halına düşün!
Gözündə yaşı var, qoy onu töksün.
Sonra amadədir ölümə hər gün,
Yaralıdır könlüm quşu, yaralı!

Kədərli bir qəlbin yanıq fəğanı
Yandırır ürəyi daşdan olanı.
Ovçu, bu çırpınır, öldürmə bunu!
Yaralandı yazıq aşiq olalı!

Yurdundan ayrılmış, yuvadan uzaq...
Dostunun gözündən, könlündən iraq.
Ümidi sənədir, ey yaradan haqq!
Yaralandı yazıq şair olalı.

## MƏN KİMƏM?

Soranlara mən bu yurdun,
Anlatayım nəsiyəm:
Mən çeynənən bir ölkənin
Haqq bağıran səsiyəm.

Mən şairəm, doğru amma
Başqa dilim, diləgim.
Bu gördüyüm viranədə
Nə nəşidə söylədim?

Toxundumu yazdıqlarım
Qəlbin incə telinə?
Bax nə haqsız bir axın var
Yoxsulların elinə?..

Sən nə dersən bu sevdalı,
Həm bu dərdli gedişə?
Ey yarımın həsrətilə
Boynu bükük bənövşə?

Mən qıyamam yar gəlirkən
Salladığım məndilə.
Ah ey fələk, ağlar isəm,
Göz yaşımı kim silə?

## MƏMMƏD SADIQ ARAN (SƏNAN)

(1895 — 1972)

*Məmməd Sadıq Aran qədim oğuz torpaqlarında, indi Ermənistan adlanan ölkənin Urud kəndində doğulmuşdur. Babası Tiflisdə Qafqazın Şeyxül-islamı olmuşdur. İlk şerləri Bakıda "Açıq söz" qəzetində dərc edilmişdir. Azərbaycanda ilk müstəqil cümhuriyyət qurularkən Məmməd Sadıq Zəngəzurdan Azərbaycan Parlamentinə millət vəkili seçilmişdir. Sovet hakimiyyəti dövründə 20-ci illərdə həbs edilmiş, Tiflis ÇEKA-sında işgəncələrə məruz qalmış, dəlilik bəhanəsiylə həbsdən qurtula bilmişdir. İrana, oradan da 1924-cü ildə Türkiyəyə keçmiş, ədəbi və siyasi fəaliyyətini orada davam etdirmiş və İstanbulda vəfat etmişdir.*

### AĞLADI KEÇDİ

Mən qərib yurdumu andım, ağladım
Ayrılıq oduna yandım, ağladım.
Könül istəyini qandım ağladım
Göz yaşım sel oldu, çağladı keçdi.

O mənim köksümdə solmaz bir gülüm,
Açdıqca üzünü tutuşur könlüm,
Ayırar ruhumdan onu bir ölüm
Bağrımı həsrətlə dağladı keçdi.

Sırma saçlarını könlümə taxdı,
Pəmbə şəfəq kimi qəlbimə axdı,
Çaldı imanımı, bağrımı yaxdı,
Boynuma bir zəncir bağladı keçdi.

Mən onun əsiri, o da yağının,
Solmuş qoynundakı gülü bağının,
Xarabəsi qalmış əski çağının,
Hıçqıra-hıçqıra ağladı keçdi.

Qaralar geyinmiş, bürünmüş yasa,
Dağları dumanlı, bağrında tasa,
O yurdun halını bir soran varsa,
O da mənim kimi ağladı keçdi...

## TANRI DAĞLARI

Qızıl alovlarla qəlbi çağlayan
Məğrur təpələri dumanlı dağlar.
Səcdəyə diz çöküb səssiz ağlayan
Pəmbə bulutlara nişanlı dağlar.

Sığınmış sizlərə ovçu laçınlar,
Ceyran yatağıdır sizin yalçınlar.
Çoban türküsündən bağrınız çınlar
Çağlayanlarınız fəğanlı dağlar.

Şimşəklər alovla sizi qamçılar,
Ürpərir sislərdən keçən yolçular.
Yad ellərdən gələn xain ovçular
Olmuşlar sizlərə ziyalı dağlar.

Dağlar biz sizə vurğunuq
Sanmayın biz də durğunuq
Uzaq yolun yolçusuyuq
Nə usandıq, nə yorğunuq.

Qurban dedik varımızı
Ağlar qoyduq yarımızı
Köksünüzə yaslanınca
Bulacayıq tanrımızı.

# ƏLİ VOLKAN (ƏLİ USTA)

(1897 — 1981)

*Əli Volkan Gəncədə anadan olmuşdur. Təhsil ala bilməməsinə baxmayaraq, savadlı bir adam kimi yetişmiş, ilk gənclik illərindən başlayaraq milli vətənpərvərlik ruhunda şerlər yazmışdır. Xərrat işlədiyi üçün Usta Əli təxəllüsüylə də tanınmışdır. Azərbaycanda bolşevik işğalından sonra baş verən Gəncə üsyanının iştirakçılarındandır. Türkiyəyə keçə bilmiş Əli Volkan ədəbi yaradıcılığını*

*orada davam etdirmiş, azəri kökündən olub Türkiyədə yaşayan başqa şairlərimiz kimi Vətən həsrətiylə dolu şerlər yazmışdır:*

*Düşmüş qürbət elə dalğındır başım,*
*Nə bir aşinam var, nə də yoldaşım,*
*Dinmədi bir kərə qanlı göz yaşım,*
*Göstərdi taleyim həyatı qara.*

## AĞLARAM

Yurdumda nədəndir ocaqlar tutmaz,
O viran bağlarda bülbüllər ötməz,
Pozulmuş hər yanı, lalələr bitməz,
Məlul, məzhun çağlar, axar, ağlaram!

Gözlərimdə yaşar hər bir guşəsi,
Qəriblərin ağlamaqdır peşəsi.
Nə xəbər var, nə də ümid nəşəsi,
Gözəl yurda dönüb baxar, ağlaram.

## MÖHTƏRƏM EMİN BƏYƏ 70-ci DOĞUM İLİNƏ

Dastan yazar, çalışır
Burada Usta Əli.
Təbrik edirəm Sizi
Ey vətənin məşəli!

Məşəlisən, işığın
Parladır vətən yolun!
Yürü, əzmin var olsun
Bükülməz çəlik qolun!

Yürü ki, yollarında
Yasəmənlər açacaq.
Yürü ki, vaxt yaxlaşdı
Altun şəfəq doğacaq!..

## ALTUN YURDUMA

Axşam oldu, günəş çıxdı aradan,
Bəşarət ulduzu parlar səmadan,
Arzumdur, köçmədən fani dünyadan
O altun yurduma yazım dastanı...

Qarabağ ovası cənnətdir cənnət,
Azəri eyləməz düşmənə minnət,
Xoşdur vətən üçün çəksəm də zillət,
Can kimi sevərəm o Əsgəranı...

Siz ey zülmə qarşı haykıran gənclər,
Durmadan düşmənə saldıran gənclər,
Üç rəngli bayrağı qaldıran gənclər,
Verməyin yadlara gözəl Salyanı...

Quba, Qazax - yurdumuzun bəkçisi,
Göyçay - əziz vətənimin incisi,
Azərbaycan - dünyanın birincisi,
Ölsəm də unutmam canım Şirvanı...

Ordubadın yaşıl, şamlı dağları,
Qərənfilli, mişk qoxulu bağları,
Dəli-dolu coşuyor irmaqları,
Kimsəyə mən vermərn o Naxçıvanı...

Coşar qəlbim, qələm gələr tüğyana,
Dünya qalxsın yurdum üçün üsyana,
Haydı gənclər, atılalım meydana,
Yox edəlim yurdumuzdan düşməni...

Şuşa qalasından toplar atıldı,
Toz-dumandan yer göylərə qatıldı,
O qızıl cəlladlar yurdu batırdı,
Alalım geriyə o Lənkəranı...

Şəki, Ağdaş hücum etdi düşmana,
Qəhrəmanlar saldırdılar hər yana,
O tarixdə biz şan verdik cahana,
Bu gün qoparalım yenə tufanı...

Düşmən leşi sərilmişdi düzlərə,
Hərb meydanı duman oldu gözlərə,
Qurtuluş günəşi doğsun bizlərə,
Bayrama döndirin qanlı Nisanı...

Dünyaya şan verdi nazlı istiqlal,
Buraxma yurdunu, yabançıdan al!
Qardaşım yaraşmaz sənə bu əhval,
Çiynətmə düşmənə o Xırdalanı...

Gəncədir yurdumun gözəl diyarı,
Çayları daşqındır, axar pinarı,
Cənnətə bənziyor dörd bir kənarı,
Dünyaya dəyişməm mən Afşaranı...

Əsgər ikən vətən üçün yaşardım,
Millət üçün dağı, daşı aşardım,
Düşmən gəldi mən yolumu şaşırdım
Necə unudayım mən Nardaranı...

Yetər Volkan, yetər artıq ağlama,
Yaralı qəlbini bir də dağlama,
Sil göz yaşlarını, qara bağlama,
Alırız yaxında Azərbaycanı!..

## HƏMİD DÖNMƏZ
(1899 — 1996)

*Həmid Dönməz Gəncədə anadan olmuşdur. Bakıda Pedaqoji İnstitutda təhsil almışdır. 1926-cı ildə 50-yə yaxın dostu və Türkiyədən gəlmiş müəllimləri ilə birlikdə həbs edilib. 8 aydan sonra azadlığa buraxılan Həmid Dönməz İrandan Türkiyəyə keçə bilib, çox illər İqdirdə yaşayıb, şerlərini Türkiyə mətbuatında dərc etdirib. Həmid Dönməzə başqa vətən həsrətli nəsildaşlarının bəxtinə düşməyən səadət nəsib oldu: o, 1991-ci ildə ixtiyar yaşında Azərbaycana gələ bildi, Bakıda mühacir Azərbaycan ədəbiyyatına həsr olunmuş simpoziumda iştirak etdi.*

*Elə həmin vaxt Həmid Dönməz Azərbaycan Yazıçılar Birliyinin fəxri üzvü seçildi.*

### AH, GƏNCƏ!..

Sinəndə mən məsud və hürr yaşardım,
Gün olurdu quzğun kimi coşardım,
Uğrundakı hər əngəli aşardım
　　Cənnətdən də daha şirinsən məncə
　　Həsrətindən yandım, yandım ah, Gəncə!

Qoçaqlarla dolmuş idin sən yer, yer
Cavad xan tək yetişdirdin neçə ər
Sənsən mənim dilimdəki tək əzbər
　　Gül açardı o gözlərin gülüncə
　　Həsrətindən yandım, yandım ah, Gəncə!

Hansı zalım səni vurdu arxadan?
Göy göllərin görünməyir al qandan
Yanar, yanar tutuşursan hicrandan
        Sənin dərdin ürəyimi dəlincə
        Həsrətindən yandım, yandım ah, Gəncə!

Dönməz könül nedim eşqi-əməldən
Tanrım firsət versə əgər əcəldən
Son bir kərə öpsəm o san teldən
        Bir can nəzrim var üzünü görüncə
        Həsrətindən yandım, yandım ah, Gəncə!

## QƏRİB BÜLBÜL VƏ MƏN

İllərdir bir yaram var ki, sağalmaz,
Bülbül sənmi dərdlisən, yoxsa mənmi?
Dərdimin çarəsin loğman da bulmaz,
Bülbül sənmi dərdlisən, yoxsa mənmi?

Aldılar zülm ilə əlimdən yarı,
Qaçırdı bir alçaq ol vəfadarı.
Cəhənnəmə döndü yarın diyarı,
Bülbül sənmi dərdlisən, yoxsa mənmi?

Bir bahar günüydü, buluşduq yarla,
Böyük əhdi-vəfa, kəsgin şüarla,
Aşdıq biz Aranı o vəfakarla,
Bülbül sənmi dərdlisən, yoxsa mənmi?

Verdik əl-ələ biz getsin həsrətlər,
Bəlkə bir az dinə əsrlik dərdlər.
Mane oldu bizə o pis namərdlər,
Bülbül sənmi dərdlisən, yoxsa mənmi?

İndi o günlər həp xatirə qaldı,
Qəddar fələk bizi dərbədər saldı.
Qanımla yetişən güllərim soldu,
.Bülbül sənmi dərdlisən, yoxsa mənmi?

Dönməzəm yarımdan, heç bir xəbər yox,
İçimdə dərd, ələm, möhnətim çox, çox,
Saplanmış qəlbimə sayğısız bir ox
Bülbül sənmi dərdlisən, yoxsa mənmi?

## ƏLİ YUSİF

(1898 — ?)

*Əli Yusif 1918-ci ildə Azərbaycan Xalq Cümhuriyyəti qurularkən yenicə 20 yaşına çatmış, milli hökumət tərəfindən Avropaya oxumağa göndərilən gənclərdəndir. Təhsilini başa vurub qayıdandan sonra Sovet rejimi onu Sibirə sürgün etmiş, orada da məhv olmuşdur. Əli Yusifin Qarabağa aid bu gün özəlliklə aktual səslənən publisist məqaləsi və Qarabağa həsr olunmuş şeri var. 20-ci illərin şəhid şairlərindən olan Əli Yusifin bu şerini antologiyamıza daxil edirik.*

### QARABAĞ XAİNLƏRİNƏ

Ucalır göylərə həşmətli, mübarək qayalar,
Qarlar altında məhabətlə parıldar hər dağ.
Dərələr, məşcərələr, vəhşi, qaranlıq kahalar.
Yəni qiymətli, fəzilətli bir ölkə - Qarabağ!

Uçuyor onda qürur ilə bütün qartallar,
Nerə baxsan, meşə var, çay var, ağac var, dağ var.
Hər səda əks ilə dağlara əlhan oluyor,
Sanki hər bir daşı söylər də qəzəlxan oluyor.

Qarabağ şerlərin, nəğmələrin məskənidir,
Vaqifin, Asilərin türbəsidir, mədfənidir,
Qarabağ - yəni qəsaid və qəzəl dəryası
Azəri tacının ən şəşəədar alması!

Çəkil, ey çöhreyi-alması tutan jəng, çəkil!
Ey o dağlarda gəzən teyf-siyəhrəng, çəkil!

## ƏMİN ABİD GÜLTƏKİN
(1898 — 1937)

*Şair, ədəbiyyatşünas və tənqidçi Əmin Abid Bakıda doğulmuşdur. Əlabbas Müznibin qardaşıdır. İlk dəfə Türkiyəyə 1919-cu ildə səfər edən Əmin Abid sonralar İstanbul Universitetinin ədəbiyyat fakültəsində təhsil almış və 1926-cı ildə oranı bitirib vətənə qayıtmışdır. Azərbaycan ədəbiyyatına, folkloruna, o cümlədən "Kitabi Dədəm Qorquda" aid dəyərli araşdırmaları var. Türkiyədə yaşadığı illərdə Gültəkin təxəllüsüylə bolşevik rejiminə, ÇEKA repressiyalarına qarşı kəskin etiraz şerləri yazmışdır. Bu şerlərdə vətən həsrəti də güclüdür. On minlərcə Azəri türkünün sürgün yeri olan Sibiri "Buzlu cəhənnəm" adlandıran Əmin Abidin taleyinə də ömrünü bu buzlu cəhənnəmdə bitirmək yazılıbmış. 37-ci ildə o da qardaşı Əlabbas Müznib kimi tutulub məhv edildi. Türkiyədə Əmin Abid Gültəkinin şerləri "Buzlu cəhənnəm" adlı kitabda toplanıb nəşr edilmişdir.*

### SEVGİLİ BAKIYA

Ey sevgili Bakı, solğunsan yenə,
Bir acıyan könül yoxmu dərdinə?
Övladların kimi öksüz qaldınsa,
Mən yanaram, sənə ey yetim anne!
Xəzərin suyunda çox göz yaşım var,
Bağrına yaslanmış dərdli başım var.

Dünyaya gəldim mən — torpağım oldun,
Altaylardan endim — durağım oldun.
Yaşıl çəməninlə, mavi göyünlə,-
Qırmızı gülünlə bayrağım oldun.
Dağların mehrabım, daşın minbərim,
Mən sənin adına səcdə eylərim.

Ey qəlbinə matəm bağlayan vətən,
Düşmən qucağında ağlayan vətən,
Əzmimlə mən səni qurtaramazsam
Xalqımla bərabər sən də yan vətən!
Hürr olan imanım — indi qalxanım,
Sənə halal olsun mənim al qanım!

## ALDI, GETDİ!

Könül baxçasında bir qönçə vardı:
Onu da bir zalım yel aldı, getdi.
Ordakı hər sabah şəbnəm ağlardı,
İndi o cənnəti sel aldı, getdi!

Azəri qızı, ey nazənin gözəl,
Nə oldu bizləri yaşadan əməl?
Öpüb qoxlamadan yabançı bir əl
Saçından iki, üç tel aldı getdi...

Ey qəlbinə ələm dolan sevgilim,
Hər addımda könlü solan sevgilim,
Öz yurdunda qərib olan sevgilim,
O yuvanı hanki əl aldı, getdi?..

## BUZLU CƏHƏNNƏM

*Ruslar tərəfindən Sibiriyaya*
*sürülən azəri qardaşlarıma*

Sibiriya, ey soyuq və qorxunc dəniz,
Şimalın köksündə uyuma səssiz,
Qalx bir müsafir gəldi, diqqət et:
Sənə hədiyyələr gətirdi - vəhşət...
Elinin buzunu eşqlə ərit,
Çıx, acıyan qəlb ilə qucağını aç,
hədiyyən: bir dəmət saralmış igit,
Hamsı bitkin, hamsı xəstə, hamsı ac!

Ey siz, ey ölümün qorxunc yolunda
Dəmir addımlarla yürüyən gənclər!
Siz ey bir taleyin gizli qolunda
Yürürkən quzeydə çürüyən gənclər.

Uzadınız mənə siz əlinizi,
Təbrik edirəm mən, igidlər sizi!
Baş əymədiniz siz haq yeyənlərə,
Dediniz yaşamaz Azəri haqsız.
Sizi kəsmək üçün enən xəncərə
"Hürriyyət istəriz" deyə yazdınız.
Səlamat yoludur getdiyiniz yol.

Günəşlər doğacaq izlərinizdə.
Yalnız deyilsiniz, yoldaşınız bol,
Bir limanlı millət var yerinizdə
Düşmən saldırsa da dörd qoldan sizə
Qorxmayın: "qurtuluş pək muhal" - deyə,
Biz də gəliyoruz o yoldan sizə,
İstiqlal... istiqlal... istiqlal, deyə!
Düşün ki, hamsını düşmən soldurmuş...
Hicran qəlblərinə bir damğa vurmuş...
Onları yollamış bədbəxt bir diyar:
Qəlblərində kədər, gözlərində nəm,
Onları incitmə, yetimlər onlar,
Ey soyuqla yaxan buzlu cəhənnəm!

Söylə tapındığın məbudun qışa:
Qucağında çılpaq uyuyanlar var;
Acısın məhv olan bu yaşayışa
Dinsin qasırğalar, həp fırtınalar.

Soyuğun altında bir yumaq kimi,
Gömüldüyü qara,
Ruzigarların ılıq bir qucaq kimi,
açılsın onlara.

Uf... bu boğucuq qaranlıq
Nerdən endi gözəl yerə?
Tıxandı hər nəfəs artıq
Sanki boğuluyor kürə...
Bulanlıq bir kökün kirli yaxası
Yerdə sürünüyor, iştə: tundra...
Sibirya, Sibirya... əvət Sibirya;
Təbiətin o bir zalım ÇEKA-sı

Anne!
Yenə nələr düşündün ki, doldu gözlərin?
Rahatsızmı yoxsa sənin də yerin?
Yoxsa oğlunumu sən xatırladın?
Yox... onu düşünmə, indi övladın
Buzlu üfüqlərin qucağındadır;
Əmdikcə soyuğu "daha ver" deyir.
Qəlbindəki alov, bax, nələr deyir.
Sil göz yaşlarını, dur, bəklə onu
Hər donduran qışın bahardır sonu.

## AZƏRBAYCAN İSTİQLALI

İstiqlal, o sönməyən müəbbəd bir məşalə
Könüllərdə tutuşur, gözlərdə sönsə belə.

Ansızın bəldəmizi sardı bir gecə,
Xırpaladı həyatı bir qara pəncə,
Üfüqləri titrətdi şiddətli yellər
Bir qiyamət fəryadı yüksəldi yer-yer.

Dağ, daş, dəniz çarparaq biri-birinə
Könüllər gömüldü yerin dərinlərinə.
Yalçın dağlar başından şimşəklər daşdı.
Ortalıqda bir dəli tufan qaynaşdı.

Yıxdı, yaxdı qarşısına çıxan şeyləri
Məmləkət oldu artıq bir yanğın yeri.
Əski vətəndən bizə bir viran qaldı,
Yurdumuz pək qorxulu matəmə daldı.

Hər qayanın altında bir ruh inlərdi,
Yüksələn fəryadlara yellər səs verdi.
Bir ölüm əl uzatdı şanlı millətə,
Dünki böyük səadət döndü nikbətə.

Devrildi həp taxtından şərəfli həyat,
Məhbəs kəsildi bizə böyük kainat.
Artıq qeyb eyləmişdi kəndini hər kəs,
Ağızlarda donmuşdu hıçqırıqlı səs.

Mənliyi alınmışdı Türkün əlindən,
Ayrılmışdı vəhşətlə öz gözəlindən.
Bütün millət uçuşub daşlar başına,
İltica eyləmişdi son göz yaşına.

Vətən xərabəsində bürünüb ahə,
Yalvarıyordu candan böyük Allaha.
Yalvarıyordu haqqa öz haqqı üçün
Yanıyordu ələmlə həp için-için...

İllər keçdi... Türk eli inlədi yenə...
Azərilər dərdini gömdü qəlbinə,
Bəklədi tanrısının böyüklüyünü
Bəklədi qurtaracaq müqəddəs günü.

Çünki haqqın nuru idi alnında yanan,
Yurdunun haləsinə etmişdi iman.
Biliyordu sönməz yaxdığı ocaq
Səltənəti ta həşrə qədər duracaq.

Nəhayət bir gün gəldi, durdu göz yaşı,
Yüksəldi çoxdan bəri əyilən başı!
Millətin ta ruhundan bir günəş doğdu
Məmləkəti qaplayan zülməti boğdu...

## QORX

Yaxlaşma ey zalım qəhr edər səni,
Qəlbimdən yüksələn fəğanımdan qorx!
Gətirmə yurduma sən dəsisəni,
Hər şeydən pak olan vicdanımdan qorx!

Əsrlərdən bəri viransan demə,
Qarşımda bir fağır insansan demə,
Kölgəsindən qorxan düşmansan demə,
Bu yılmaq bilməyən imanımdan qorx!

Əzmim bir qılıcdır, xəncər istəməm,
Yurduma yabançı bir ər istəməm,
Sənin kimi əsla rəhbər istəməm,
Mənə yol göstərən Quranımdan qorx!

Heybətli əsrlər aşan Türkəm mən,
Yataqda ölənə şaşan Türkəm mən,
Dünyaya sığmayan daşan Türkəm mən,
Getdikcə böyüyən Turanımdan qorx!

## BAYRAĞIM VƏ İSTİQLALIM

Hər dedim kəndimə, zəncir qıraraq,
Get də kəməndini cəhənnəmdə yax.
Yurdumun müəbbəd nigahbanıdır,
Əsrlər altından yüksələn bayraq.
Bayrağım öləməz, ölürsə əgər,
Torpağın altına keçər ölkələr...
Azəri qanıyla yıxandın yetər,
Yapdığın Neronun zülmündən betər,
Bir zəhər sunsa da, əməl doğurdu
Türklüyün qəlbinə vurduğun neştər.
Qaldıqca ruslarda diyarım mənim
İntiqam olacaq şüarım mənim.
Azəri oğluyam, adımda şan var,
Damarımda zülmə hayqıran qan var.
Məni öksüz sanıb kükrəmə düşmən
Bax arxamda haqqı sevən cahan var.

Paçavra bayrağın əlbət solacaq
Azərbaycan yenə mənim olacaq.
Qurtuluş, ey nazlı, sevimli pəri!
Vurğundur könüldən sənə Azəri.
Dişimlə qıraram bir gün gəlib də
Bağrıva sancılan qanlı xəncəri.
Yaşa ey həsrətlə doğan istiqlal!
Yaşa ey Türk, yaşa ey gözəl hilal!

## ANAMA

*İstanbul məktubu*

Bilirsən ki ana uzaqda qaldım,
İllər aramızda oldu bir yığın,
Bir yarpaqdım, düşdüm torpaqda qaldım,
Nərdədir, nərdə o müşfik qucağın?
Dərdlərim çox böyük, ağırdır ana!
Dinləyən yox, hər şey sağırdır ana!
Barı sən mənə bir azacıq acı,
Sən dinlə ruhumu gəmirən dərdi.
Bir cəhənnəm indi içimdə acı
Qədər əli mənə gör nələr verdi...
Hər şeyə baş əyən deyildim ana!
Sevginin önündə əyildim ana!
Doğduğum zamandan bəri mənim də
Bir məşuqəm vardı, cananım vardı...
Şimdi bilməm ki, o hankı iqlimdə,
Hanki bir yabançı könülə vardı..
Mən ki eşqlə pək yorğunam ana!
Vurğunam hüsnünə, vurğunam ana!
Ana, sən daha çox yaxınsan ona,
Get bildir ki, hələ əsiridir can.
Bilməyirsən əgər sor da qonşuna,
Sevdiyimin ismi: şən Azərbaycan!
Azərbaycan mənim gözəlim ana!
Azərbaycan mənim əməlim, ana!
Get onun bağrına üzünü sürt də,
Rusun çeynədiyi torpağını öp.
Azəri oğlunun böyük ümidə
Gömdüyü üç rəngli bayrağını öp!
Bəlkə də ölərəm qürbətdə ana!
Ruhumsa qalmasın həsrətdə ana!

# ƏLAĞA VAHİD
(1895 — 1965)



*Əlağa Vahid Bakıda doğulmuşdur. İlk şerlərini 1914-1915-ci illərdə çap etdirmişdir. Müasir dövrdə qəzəl janrının ən ardıcıl yaradıcısıdır. Şair Sovet dövründə də aşiqanə qəzəllərin ənənəvi mövzularına sadiq qalmışdır. Vahidin qəzəlləri muğam sənətimizdə də mühüm yer tutur. Çağdaş xanəndələrimiz Füzulidən sonra ən çox Vahidin qəzəllərinə müraciət edirlər.*

## QƏZƏLLƏR

Gəlməsə üstümə yanım mən öləndən sonra,
Tutmaz aram məzarım, mən öləndən sonra.

Hansı gülçöhrəni məşhuri-cahan eyləmədim,
Qoy desin şanlı diyarım, mən öləndən sonra.

Gördüyüm hər gözəli şövq ilə təsvir elədim,
Sən də xatırla, nigarım, mən öləndən sonra.

Vətənə, xalqa çalışdım əbədi xidmət edəm,
Solmasın bağü-baharım, mən öləndən sonra.

Aşiqəm, sənətə, şerə və gözəl musiqiyə,
Dillən ey sevgili tarım, mən öləndən sonra.

Vahidəm, qaldı sözüm dəhrdə bir dürr kimi,
Yaşayar eldə şüarım, mən öləndən sonra.

***

Dedi ol yar mənə: dəftərimiz evdə qalıb,
Eşqə dair yazılan sözlərimiz evdə qalıb.

Naz ilə, qaş-göz ilə can alırıq aşiqdən,
Ev yıxan, qan axıdan xəncərimiz evdə qalıb.

Bu gözəlliklə ki, biz naz ilə min can alırıq,
Hələ bizdən də gözəl dilbərimiz evdə qalıb.

Çeşmi-cadumuza heyran olan aşiq çoxdur,
Fitnələr yağdıran afətimiz evdə qalıb.

Biz əsir eyləmişik zülf ilə biçarələri,
Neçə Məcnuni-vəfapərvərimiz evdə qalıb.

Şeyx Sənan kimi aşiqləri yoldan çıxaran,
Düni dil qarət edən kafərimiz evdə qalıb.

Hələ mən Vahidiyəm Azərbaycanımızın,
Atəşi-eşqə yanan Azərimiz evdə qalıb.

***

Sevgilim! Seyri-gülüstan yaxşıdır, sən yaxşısan?
Aşiqinçün başqa canan yaxşıdır, sən yaxşısan?

Min mənim tək aşiqi heyrətdə qoymuş gözlərin,
Sevgilim, bir söylə ceyran yaxşıdır, sən yaxşısan?

Bir dönüb baxmaqla tez aldın, apardın gönlümü,
Ovlayıb çalmaqda tərlan yaxşıdır, sən yaxşısan?

Göy üzün ay rövşən etmiş, hüsn ilə sən yer üzün,
Nazəninim, mahi-taban yaxşıdır, sən yaxşısan?

Sən kimi canan üçün candan keçən bir aşiqə,
Ey gözəllik tanrısı, can yaxşıdır, sən yaxşısan?

Səndə varkən naz, gülmək, danışmaq, incəlik,
Lütfdə gülbərgi-xəndan yaxşıdır, sən yaxşısan?

Məclisin xəlvət, nigarım, Vahid, əldə mey tutub,
Gör bu xoş aləmdə sultan yaxşıdır, sən yaxşısan?

***

Bəxtiyar aşiq odur ki, onu cananı sevir,
Binəva bülbülünü öz güli-xəndanı sevir.

Mən o zülfün azı yüz dəfə bəlasın çəkdim,
Dəli könlüm yenə ol zülfi-pərişanı sevir.

Etibar olmaz özün göstərən aşiqlərdə,
Əhsən ol aşiqə cananını pünhanı sevir.

Əsri-hazırkı gözəllikləri görmür zahid,
İndi də cəhlini gör, rövzeyi-rizvanı sevir.

Sevirəm mən o nəzakətli dilbəri ki,
Musiqi elmini, rəssamı, qəzəlxanı sevir.

Pir könlüm gəlir ilhamə görərkən, hərdən,
Bir nəcabətli gözəl qız, gözəl oğlanı sevir.

Vahidin ovçuluğu olsa da, insafı da var,
Öz kəməndinə düçar etdiyi ceyranı sevir.

***

Sevgilim, eşq olmasa, varlıq bütün əfsanədir,
Eşqdən məhrum olan insanlığa biganədir.

Sevgidir, yalnız məhəbbətdir həyatın gövhəri,
Bir könül ki, eşq zövqünü duymasa, qəmxanədir.

Mən əsiri-eşqiyəm öz xalqımın, öz yurdumun,
Sevməyən öz xalqını, öz yurdunu divanədir.

Qoy Vətən daim işıqlansın gözəl bir şəm, tək,
Könlüm ol şəmin ziyasın seyr edən pərvanədir.

Nazənin, rəna gözəllərdir-baxırsan hər yana,
Bəs bu torpaq indi bir cənnət deyil, ayə nədir?

Ölkəmizdə gör nələr var, başqa bir aləmdəyik,
Hər çiçək bir nazənin, hər qönçə bir cananədir.

Vahidəm mən, sevgilim, məndən xəyanət görməzsən,
Şairəm, eşqim də öz qəlbim kimi mərdanədir.

***

Hərdən ki, naz edir mənə canan, xoşum gəlir,
Naz eylədikcə könlüm olur qan, xoşum gəlir.

Məndən küsüb, acıqlı baxır sevgilim mənə,
Canım ola gözlərə qurban, xoşum gəlir.

Bir an rəqibi görməyə yoxdur görən gözüm,
Öz yarım incidir məni hər an, xoşum gəlir.

Zəhləm gedir nigarimə baxdıqca özgələr,
Saymır rəqibi ol güli-xəndan, xoşum gəlir.

Mümkünsə, bir gözəl sev, onun mübtəlası ol,
Gördükdə hər gözəl demə: - Bundan xoşum gəlir.

Gül bülbül ilə olmalıdır, xar xar ilə,
Yar olsa bir qız ilə bir oğlan, xoşum gəlir.

Vahid, vətən gözəllərinin mübtəlasıyam,
Dönmüş behiştə Azərbaycan, xoşum gəlir.

***

Dedim: — Ey qönçədəhan, könlümü qan eyləmisən,
Dedi: — Bica yerə eşqimdə fəğan eyləmisən!

Dedim: — İnsaf elə, incitmə məni, aşiqinəm,
Dedi: — Get, sirrimi dünyaya əyan eyləmisən!

Dedim: — Ağlatma məni sərv boyun şövqində
Dedi: — Göz yaşını bihudə rəvan eyləmisən.

Dedim: — Axır, gözəlim, bağı-baharım sənsən,
Dedi: — Sən ömrünü həsrətlə xəzan eyləmisən!

Dedim: — Az çəkməmişəm gözlərinin həsrətini,
Dedi: — Öz könlünü yersiz nigaran eyləmisən!

Dedim: — Eşqində əsirəm, mənə bəs xeyri nədir?
Dedi: — Əvvəldə bu sövdadə ziyan eyləmisən!

Dedim: — Eşq atəşi neylər mənə, qorxan deyiləm!
Dedi: — Biçarə, yanarsan, nə güman eyləmisən?!

Dedim: — Ey gül, mən əzəldən də gözəl aşiqiyəm,
Dedi: — Sən ruhini eşq ilə cavan eyləmisən!

Dedim: — Hər gün səri-kuyində dolanmaqdır işim,
Dedi: — Vahid, nə gözəl yerdə məkan eyləmisən!

***

Könül, həmişə səadət bizimlə yar olacaq,
Xəzan qəmi bitəcək, ölkəmiz bahar olacaq!

Tərənnüm eyləyəcək hər çəməndə bülbüllər,
Bu Odlar ölkəsi bir başqa laləzar olacaq.

Deyib, gülüb, danışır xalqimiz məhəbbət ilə,
Fərəhli ölkəmiz hər fitnədən kənar olacaq.

Şərəflə ömr edəcək hər kəs öz diyarında,
Nə dərd, möhnəti-qürbət, nə intizar olacaq!

Gözəlləşir günü-gündən həyatı xəlqimizin,
Həmişəlik Vətən övladı bəxtiyar olacaq.

O xoş zamanı görən əhli-halə eşq olsun,
Ümum aləmə fərxəndə ruzigar olacaq.

Cahan işıqlanacaq sülh ilə, ədalət ilə,
Bizim üfüqdə zəfər nuru payidar olacaq!

Bizim diyardədir qədrü qiymət insanə,
Bütün cahanə nümunə bizim diyar olacaq!

Bu gün vətənimizə, Vahid, nə xidmət eylərsək,
Bu şanlı iş gələcək nəslə yadigar olacaq!

***

Daim bu gözəllik o cəfapişədə qalmaz,
Tünd olsa, axar qanı meyin şişədə qalmaz.

Şirin sözün ol lalərüxün gər görə Fərhad,
Dağı çalar öz başına, bir tişə də qalmaz.

Bir zərrə əgər mehrini görsəydim o mahın,
Ölsəm də, nə qəm, ruhum o əndişədə qalmaz.

Müjganları qanlar içər mərdümi-çeşmin,
Kim der ki, əsər bərgə yetər, rişədə qalmaz?

Vahid, bu gözəldir ki, deyib Gəncəli Şövqi:
"Gül qönçədə, söz qəlbdə, mey şişədə qalmaz".

***

Vəfasız eyləyən ol nazlı yarı mən özüməm,
Salan nəzərdən o çeşmi-xumarı mən özüməm.

Zaman olur, gülə bülbül də bivəfalıq edir,
Rəqibə mail edən ol nigarı mən özüməm.

O nazənin gözələ çox cəfalar eyləmişəm,
Sevimli dilbərimin zülmkarı mən özüməm.

Mən olmasam, o gül əğyarə etina eləməz,
Ona verən belə bir ixtiyarı mən özüməm.

Vüsali-dilbərə can nəqdin etsələr qiymət,
O nazənin gözəlin cannisarı mən özüməm.

Gülüzlü, nazlı gözəllərlə xoş keçib ömrüm,
Elin sevimlisi, ən bəxtiyarı mən özüməm.

Deyirdim, əhli-qələm, Vahid, əfv edərsə məni,
Böyük Füzulimizin yadigarı mən özüməm.

***

Gözəllər içrə sən, ey mahiparə, bir dənəsən,
Gözəllərin gözüsən, zülfü qarə, bir dənəsən.

Gülüzlü, nazlı sənəmlər düşər qədəmlərinə
Bu çeşmi-məst ilə qılsan işarə, bir dənəsən.

Sən olmasan, məni hicran qəmi həlak eylər,
Şikəstə könlümə aləmdə çarə bir dənəsən.

Zəmanə əhlinə məşhursan gözəllikdə,
Bu sirr gizli deyil, aşikarə bir dənəsən.

Rəqibi qoyma yaxın vəslinə, xəyanət edər,
Ki, qorxuram səni çəksin kənarə, bir dənəsən.

O zövqü dövləti-dünyayə vermərəm hərdən,
Məni-fəqirə də qılsan nəzarə, bir dənəsən.

Gözəl həyatını, Vahid, fənaya sərf etmə,
Səni zəmanə yetirməz dübarə, bir dənəsən.

***

Oxu, ey bülbüli-şeyda, güli-xəndan oxusun,
Görsün öz aşiqini, şur ilə canan oxusun.

Bu gözəl ləhcən ilə aləmə göstər özünü,
Özgəni qoyma muğamatına dastan oxusun.

Vətənin bülbülü-şeydalərini şurə gətir,
Oxu bir nəğmə, bütün Azərbaycan oxusun.

Musiqi sənətini Azərbaycan yaradıb,
Qoy bu tarixi həqiqətləri Tehran oxusun.

Ləhni-Davudi bizim xəlqimiz icad eləyib,
Böylə icadı gərək yaxşı qəzəlxan oxusun.

Qarabağdır bizim öz ölkəmizin Şirazi,
Öz muğamatını lazımdı hər insan oxusun.

Əsrlərlə yaşasın musiqi xadimlərimiz,
Qoy eşitsin, bu sözü Mustafa Payan, oxusun.

Təbrizin nəğməsini xəlq yaratmış, Vahid,
Qoy desin fikrimə əhsən bütün ürfan, oxusun.

***

Hər aşiqə öz istədiyi yarı gözəldir,
Hər bülbülə öz sevdiyi gülzarı gözəldir.

İlqarı gözəl olmayanı istəməz aşiq,
Can ver elə canana ki, ilqarı gözəldir.

Mən bir uca boylu gözəlin zülfünə bəndəm,
Rüxsarı gözəl, şivəsi, rəftarı gözəldir.

Yüzlərcə gözəl başqa vilayətdə də çoxdur,
Amma bizim ölkə bütün elcarı gözəldir.

Yar olsa mənimlə, mənə biganə nə eylər,
Uçmaz elə bir xanə ki, memarı gözəldir.

Mən istədiyimçün o gülü qeyri də sevdi,
Qiymətli o şeydir ki, xiridarı gözəldir.

Vahid, mənə insaf elə sima ilə baxma!
Əhsən elə bir şairə - əşarı gözəldir!

***

Bilməm bu nazənin kimin istəkli yarıdır?
Ya hansı bəxtiyarların bəxtiyarıdır!

Açdıqca gül camalını, ellər fərəhlənir,
Guya gözəllik aləminin novbaharıdır.

Dünya bu nazənin mələyin həsrətin çəkir,
Xəlqin sevimli afəti, həm şəhriyarıdır.

Yüz dəfə yansaq eşq oduna, qorxu bilmərik,
Çünki diyarımız bizim Odlar diyarıdır.

Bir vaxt səcdəgah idi atəşpərəstlərə
Şəhri-Səba ki, mərkəzi dərya kənarıdır.

Qan etmə, saqi, bağrımızı, badə tez gətir,
Doldur qədəhləri, gecəmiz keçdi, yarıdır.

Hər kim deyirsə, sevmə bu rəna gözəlləri,
Bilmir ki, sevgi aləmi biixtiyardır.

Bir gün gələr ki, mən gedərəm, xəlq söyləyər:
Biçarə Vahidin bu qəzəl yadigarıdır.

***

Ey gül, səni hər kəs ki, sevib, bəxtəvər oldu,
Eşqində bir ancaq mənim ömrüm hədər oldu.

Kim sevdi, qara zülfünü, ağ günlərə çıxdı,
Tale mənə yar olmadı, bir dərdəsər oldu.

Mən ağladım öz halıma, biganə sevindi,
Şükr eylə ki, mən qaldım, o məndən bətər oldu.

Kuyindən mənə zülm eyləyəndən biri qalmıb,
Ahım odu yandırdı, hamı dərbədər oldu.

Yıxmaqdı məni məqsədi namərd rəqibin,
Bar vermədi məqsudi, bütün bisəmər oldu.

Ayrılmaz idik bir-birimizdən, aramızda,
Göz dəydi bizə, bəlkə də bir bədnəzər oldu.

Ev yıxmağı, qan tökməyi, zənn etmə hünərdir,
Hər kim vətənin sevdi, o əhli-hünər oldu.

Vəhşiliyə, namərdliyə, nadanlığa nifrət!
İnsanlıq ilə ömr eyləyən bəxtəvər oldu.

Səndən sora, Vahid, ayıq ol, qoy deməsinlər,
Dünayaya gəlib-getdi, hayıf, bixəbər oldu.

## DƏLİ CEYRAN

Gözəlim, aşiqini salma nəzərdən,
Həsrətindən ölürəm, gəl bizə hərdən,
Sənə çoxdan vurulub bu dəli könlüm,
Neyləyim ki, xəbərin yoxdu xəbərdən,
Gəl mənə naz eləmə, ay dəli ceyran,
O qara gözlərinə olmuşam heyran.

Bir dönüb baxmaq ilə canımı aldın,
Məni Məcnun eyləyib çöllərə saldın.
Mən inandım, sənə öz könlümü verdim,
Məni atdın, gedib əğyar ilə qaldın,
Gəl mənə naz eləmə, ay dəli ceyran,
O qara gözlərinə olmuşam heyran.

Sən gəzirsən, gözəlim, qeyrilə mənsiz,
Yuxu getməz gözümə bir gecə sənsiz.
Özün insaf elə, ey sevgili dilbər,
Hansı bülbül yaşayar bağü çəmənsiz?
Gəl mənə naz eləmə, ay dəli ceyran,
O qara gözlərinə olmuşam heyran.

## MÜŞAİRƏ

Sadiqül Əyyam:

Aşiqəm, xakistəri-möhnət yatağımdır menim.

Ağadadaş Dərviş:

Bari-qəmdə qərqəm, ey dil, bu məraǧımdır mənim.

Ağadadaş Müniri:

Daima sənsiz tutub güllərdə məskən ağlaram,
Ahü naləm atəşi-rövşan çırağımdır mənim.

Mirzə Əbdülxaliq Cənnəti:

Söylə, ey dildari-şirinləb mənə, ey xosrəvim,
Cənnət istərsən əgər, cənnət qucağımdır mənim.

Mirzə Cəlal Yusifi:

Cənnətin gülzarinə gər şövqi-zövqün varisə,
Qönçəsi ləli-ləbin, gülsə yatağımdır mənim.

Vahid:

Huriyi-qilmani verdin zahidə, Vahid demə,
Rövzəyi-rizvanə meyl iştiyaqımdır mənim.

Məşədi Azər:

Atəşi-eşqiylə büryan oldu sinən, Azəra,
Bir tərəhhüm qıl, gəlib gör kim nə çağımdır mənim.

İbrahim Tahir:

Ey könül, fikri-xəyali-vəslilə keçdi ömür,
Mürqi-hicran didədə daim qonağımdır mənim.

Sadiqül Əyyam:

Sadiqül Əyyam olmaq dəhridə asan deyil,
Aşiqəm, payin öpərsəm, eşq ocağımdır mənim.

## HİTLERİN

El tüpürür vicdanına Hitlerin,
Qorxu düşübdür canına Hitlerin.

Boynu uzanmış Hacıleylək kimi,
İylənib hər bir yeri cəmdək kimi,
Qarnı şişib un yemiş eşşək kimi,
Bit daraşıb yorğanına Hitlerin,
Qorxu düşübdür canına Hitlerin.

Qapdı lap əvvəldə daşın zorbasın,
Vurub dağıtdılar qol-qabırğasın,
Ölüm yeli tutub qıçın, ombasın,
İt qanı vurulur qanına Hitlerin,
El tüpürür vicdanına Hitlerin.

Zənn eləyir, evində məhbəsdədir,
Əl-ayağı iflic olub, xəstədir,
Bəzi faşistin qulağı səsdədir,
Od vuracaq ehsanına Hitlerin,
El tüpürür vicdanına Hitlerin.

Yaman düşüb Əzrayılın çənginə,
Rəngi ruxu dönüb meyit renginə,
Yavaş-yavaş ölüm çatıb əngina,
Adam qoyulmur yanına Hitlerin,
El tüpürür vicdanına Hitlerin.

# CƏFƏR CABBARLI
(1899 — 1934)



*Bakının Xızı kəndində doğulmuşdur. Azərbaycanın ən qüdrətli dramaturqlarından olan Cəfər Cabbarlı şair kimi də tanınır. Sabir üslubunda ilk satirik şerləri 1915-ci ildən başlayaraq "Məktəb", "Babayi-Əmir" jurnallarında dərc olunmuşdur. Cümhuriyyət dövründə milli vətənpərvərlik ruhunda bir çox şerlər, "Ədirnənin fəthi", "Trablis müharibəsi", "Aydın", "Oqtay Eloğlu" kimi pyeslər yazmışdır. Sovet dövründə yaratdığı "Od gəlini", "Sevil", "1905-ci ildə", "Almaz", "Yaşar", "Dönüş" kimi səhnə əsərləri Azərbaycan teatr tarixində yeni bir mərhələ təşkil edir. Cəfər Cabbarlının lirik şerlərinə bir çox gözəl mahnılar bəstələnmişdir. Bəstəkar Asəf Zeynallının "Ölkəm" mahnısı belə nəğmələrdəndir.*

## AZƏRBAYCAN BAYRAĞINA

Buraxınız seyr edəyim, düşünəyim, oxşayayım,
Şu sevgili üç boyalı, üç mənalı bayrağı.
Mələklərin qanadının üzərinə kölgə salan
Nə imiş bu? Aman Allah! Od yurdunun yaprağı.

Göy yapraqlı, al çiçəkli, yaşıl otlar topasımı?
Xeyir, Xeyir, çiçək solur, otlar yerdə tapdanır.
Fəqət bizim bayrağımız ucalan pək seviyor-
Ulduzlardan, hilaldan da yüksəklərdə fırlanır.
Bu ay-ulduz, boyaların qurultayına demək?
Bizcə böylə söyləmək:
Bu göy boya göy moğoldan qalmış bir türk nişanı-
Bir türk oğlu olmalı.
Yaşıl boya islamlığın sarsılmayan imanı,
ürəklərə dolmalı.
Şu al boya azadlığın, təcəddüdün fərmanı
mədəniyyət bulmalı.
Səkkiz uclu şu ulduz da səkkiz hərfli "Od yurdu"[1].

[1] "Od yurdu" sözləri ərəb əlifbası ilə səkkiz hərfdən ibarətdir.

Əsarətin gecəsindən fürsət bulmuş quş kimi
sərhədlərə uçmuşdur.
Şu hilal da türk bilgisi, düzgün sevgi nişanı
yurdumuzu qucmuşdur.
Allah əməllərini edib şu bayrağa intiqal
Birər-birər doğru olmuş, bir ad almış: "İstiqlal".
Ürəyimdə bir dilək var, o da doğru kəsilsin,-
O gün olsun bu göy bayraq Turan üstə açılsın.

## TURAN ELLƏRİNƏ SALAM SÖYLƏYİN

*Məhəmmədzadə Mirzəbala qardaşıma töhfə*

Huma quşu Şərqə doğru uçarkən,
Gündoğuşdan murad suyu içərkən,
Sabah yeli altun dağdan keçərkən,
Turan ellərinə salam söyləyin.

Bir gözəl görsəniz göylər elindən,
Öpün dalğalanan ipək telindən.
Od yurdunun yavruları dilindən
Turan ellərinə salam söyləyin.

Baykalda görsəniz ördək izləri,
Unutmayın tapşırdığım sözləri.
And verirəm, durnalarım, sizlərə
Turan ellərinə salam söyləyin.

İntizar gözlərdən Xəzər doğuldu,
Həsrət ürəyimiz yanar dağ oldu.
Dillərimiz Turan deyə yoruldu
Turan ellərinə salam söyləyin.

Ulduzlu bir göy, tac üstə aypara,
Bir al yaylıq verim yetirin yara.
Durnalar, durnalar bizdən dübarə
Turan ellərinə salam söyləyin.

## ÖLKƏM

Şiş ucları buludlarla döyüşən
Dağlarında buzları var ölkəmin.
Göy otlardan ipək paltar geyinən
Tarlaları, düzləri var ölkəmin.

Verimli torpağı, geniş çölləri,
Çalışqan ərləri, iyid elləri,
Böyük gəmiləri, dəmir yolları,
Keçidləri, rizləri var ölkəmin.

Göllərində ördəkləri üzərlər,
Çöllərində maralları gəzərlər,
Güllərindən gəlinlər tac bəzərlər,
Ceyran gözlü qızları var ölkəmin.

Coşğun Xəzər oynar ayaqlarında,
İşıq saçan nefti torpaqlarında,
Tarixlərin qızıl yarpaqlarında
Dadlı-dadlı sözləri var ölkəmin.

1919.

## MƏNİM TANRIM

Mən bir zaman öz-özümdən uzaxdım,
Dün bir işıq buldum, ruhuma taxdım.
Bütün əski tanrıları buraxdım,
İndi artıq bir tanrım var - gözəllik!

Bütün əski tanrılara darıldım,
Həp məcazi sevgilərdən yoruldum.
Bir həqiqət buldum, ona vuruldum,
Dünyada bir şüarım var - gözəllik!

Oxşa məni, yeni tanrım, sevindir!..
Artıq fikrim, ruhum, duyğum sənindir!
Çıx könlümdən, əski dünya, sonundur,
Çünki yeni bir yarım var - gözəllik!

## EY DAN ULDUZU

Qaranlıq gecədə səni gözləyib,
Durmaqdan yoruldum, ey dan ulduzu!
Uzaq üfüqlərə göz gəzdirməkdən
Az qala kor oldum, ey dan ulduzu!

Öksüz taleyim tək gecikdin nədən?
Karvanqıran doğdu, görünmədin sən,
Oxşatdım, yanıldım, könül verdim mən.
Bilmədən vuruldum, ey dan ulduzu!

Arxasınca qoşdum sonsuz bir yola,
Hər addımda tuş gəlincə bir kola,
Qaranlıqda çox baxındım sağ-sola,
Hər yana buruldum, ey dan ulduzu!

Büsbütün yorulub gücdən düşərkən,
Bir ulduz parladı uzaq üfüqdən.
Bu görünən səndin, artıq gəldin sən
Axır səni buldum, ey dan ulduzu!

## ŞƏRQİ

Mən bir solmaz yarpağam ki, çiçəkləri bəzərim,
Mən bir susmaz duyğuyam ki, ürəkləri gəzərəm.
Mən səninçin ömrüm boyu cəfalara dözərəm,
Sənsiz güllər açılmasın, axar çaylar dayansın,
Oxu, bülbül, bəlkə yarım oyansın!..

Mən bir sönməz ulduzam ki, daim işıq saçaram,
Mən bir oyaq bülbüləm ki, güldən-gülə uçaram.
Mən bir gizli aləməm ki, sevgilərdir açarım.
Sənsiz günəş görünməsin, qaralara boyansın,
Oxu, bülbül, bəlkə yarım oyansın!..

Mən səninçin şəfəqlərdən süslü bir tac yaparam,
Yol ver mənə, gül dərmişəm, sevdiyimçin aparım!
Arar, arar, arar, arar, axır səni taparam;
Sənsiz solsun göy yarpaqlar, axar sular bulansın,
Oxu, bülbül, bəlkə yarım oyansın!..

## ANA

Əgər bütün bəşəriyyət ədüvvi-canım ola,
Ürək süqut eləməz aldığı mətanətdən.
Ricavü xövfə məkan verməərəm gər alimlər
Min il də vəz edələr dəhşəti-qiyamətdən.

Pələnglər tuta dövrüm, çəkinmərəm əsla,
Və ya ki, vəd edələr dövləti-cahani mənə
Ki, bir kəsə baş əyib iczimi bəyan eyləyim,
Əyilmərəm nə ki, yer, versələr səmanı mənə.

Yanımda gər dura cəllad əlində şəmşiri,
Ölüm gücilə mənə hökm edə təslim,
Əyilmərəm yenə haşa! Ölüm nədir ki, onun
Gücilə xalqa həqiranə eyləyim təzim?

Cahanda yox elə bir qüvvə baş əyim ona mən
Fəqət nə güclü, zəif bir vücud var, yahu,
Ki, hazıram yıxılıb xaki-payinə hər gün,
Öpüm ayağını icz ilə. Kimdir o? Nədir o?

Ana! Ana!.. O adın qarşısında bir qul tək
Həmişə səcdədə olmaq mənə fəxarətdir;
Onun əliylə bəla bəhrinə yuvarlansam,
Yenə xəyal edərəm bəzmi-istirahətdir.

Əs, ey külək, bağır, ey bəhri-biaman, ləpələn!
Atıl, cahana sən, ey ildırım, alış, parla!
Gurulda, taqi-səmavi, gurulda, çatla, dağıl,
Sən, ey günəş, yağışın yağdır, ey bulud, ağla!

Bunlar mənə əsər eylərmi? Mütləqa yox! Yox!
Fəqət ana! Ona müqəddəs adın qabağında
O pak bağrına bassın məni, desin lay-lay,
Təbəssüm oynadaraq titrəyən dodağında.

Bütün vücudum əsər, ruhum eyləyər pərvaz,
Uçar səmalara o aləmi-xəyalətdə.
Yatar, ölər bədənim, nitqdən düşər bir söz:
- Ana... Ana... Sənə mən rahibəm itaətdə!..

## YADA DÜŞDÜ

Gördüm üzünü, bağçada laləm yada düşdü,
Əmdim dodağın bal kimi, ağzım dada düşdü.

Bir lalə yetişmişdi bu viranə çəməndə,
Bad əsdi, xəzan vurdu da, laləm bada düşdü.

Bir qönçə yetirdim, bəzədim, nazını çəkdim;
Aldı fələk əldən onu, yarım yada düşdü.

Bənd oldu könül bir gülə, səs tutdu mahalı;
Guya ki, bu dünyada qan oldu, qada düşdü.

Söz verdi, sözün tutmadı, and içdi, unutdu;
Bəlkə, deyirəm, yar usanıb innada düşdü?

Bəxt onda ki, paylandı, biri çatmadı payə,
Dünyada o bədbəxt də bizim bərbadə düşdü.

Bir ovçu kimi göldə gözəl bir sona vurdum,
Çaldı qanadın göydə, gedib dəryada düşdü.

## TELLƏR OYNADI

Bir mən idim, bir sən idin, bir də yamaclar...
Meşə yolu, yarpaq dolu, yaşıl ağaclar.
Onda ki, ağ omuzlara töküldü saçlar,
Əsdi yarpaq, coşdu irmaq, güllər oynadı,
Ürəyimdə kaman kimi tellər oynadı.

Bir biz idik, bir düz idi, bir də al boya...
Dağ başında uçan quşlar endilər çaya.
Sən dedin ki: "Bütün dünya qoy dönsün toya"
Çaldı qaval, uzaq kənddə ellər oynadı,
Ürəyimdə kaman kimi tellər oynadı.

# TÜRKİYƏ TÜRKCƏSİNDƏ XALQ ŞERİ ÖRNƏKLƏRİ

## (Anadolu, Rumeli, Balkan, Kıprıs türklərinin maniləri, türküləri)

Dünyaya yayaq gəldim,
Yatmadım, oyaq gəldim.
Ömür der: yüz il keçdi
Könül der: bayaq gəldim.

Qədifə biçim-biçim,
Ölürəm sənin içün.
Dostlarım düşman oldu
Səni sevdiyim içün.

Baxçasaray güzarım,
Həm sevib, həm bəzərəm.
Səndən ayrı düşərsəm
Atəş olsun məzarım.

Vətən deyib ağladım,
Ürəyimi dağladım.
Dedilər, yol açılır
Ümidə bel bağladım.

Dağdan ürkütdüm qurdu,
Atım tərlədi durdu.
Baxdım: vətən görünməz
Yıxaram belə yurdu.

Naçar ağlama,
Gündür keçər, ağlama.
Biri bağlayan qapın
Biri açar, ağlama.

Bu dağlar olmayaydı,
Çiçəyi solmiyeydi.
Ayrılıq, ölüm, həsrət
Heç biri olmayaydı.

Gəlinə bax, gəlinə,
Əlin qoyub belinə,
Gəlinə söz deməyin
Küsər, gedər elinə.

Yolladım yarı yola,
Gözlərim dola-dola.
Buluda çox yalvardım
Nazlıma kölgə ola.

Qərənfil dəsti kimi,
Yar məndən küsdü kimi.
Ayda, ildə bir salam
Onu da kəsdi kimi.

Qaşları oydu məni,
Gözləri soydu məni.
Vurdu, öldürəmədi
Yaralı qoydu məni.

Dənizə dalan bilir,
Gözəli saran bilir.
Gözəli sarmayanlar
Dünyanı yalan bilir.

Ağac başında durdum,
Dibində duzaq durdum.
Nakəs yarın əlindən
Həm ağladım, həm güldüm.

Qaşların var qələmdən,
Gözlərin var, kömürdən.
Sənsiz keçən günləri
Necə sayım ömürdən?

Adalarda idarə,
Vallah, etməm müdarə.
Mənim bir sevdiyim var
İstanbulda bir tanə.

Ağrı dağından uçdum,
Çayır çəmənə düşdüm.
Nə bəlalı başım var
Vəfasız yara düşdüm.

Ah öyləmi Karsa yaz,
Hava bulut, Kars ayaz.
Katib qurbanın olum
Mənim halım Karsa yaz.

Alı var, yaşılı var,
Yaşılı var, alı var.
Bilməm nədən öpüm ki,
Hər tərəfdə balı var.

Ağ buğdayım, buğdayım,
Süräyim, qurudayım.
Keçmə qapım önündən
Mən səni unudayım.

Ağ dəvəm duzdan gəlir,
Yükü Kıprısdan gəlir.
Bir oğlan xəstə olsa,
Əlacı qızdan gəlir.

Araz suyun bulanıq,
Ağlaram yanıq-yanıq.
Sevgili yar öləli
El uyur, mən oyanıq.

Atımızı qoşalım,
Dağı-daşı aşalım.
Sən yağmur ol, mən bulut
Yağarkən qovuşalım.

Ay doğar Dağıstandan,
Gün doğar Gülüstandan.
Könlüm bir qarpız istər
Otuz iki bostandan.

Heyva yolla, nar yolla,
Ürək yandı, qar yolla.
Anan, baban duymasın
Məndilinə sar yolla.

Bağlar başı,
Üsgüdar bağlar başı.
Sənin sinən aynamı?
Hər gələn bağlar başı.

Bağ üstündə gəzərəm,
Altun inci düzərəm.
Bu viranə Oxriddə
Hələ bekar gəzərəm.

Balı qoydum qazana,
Yolladım Trabzona.
Trabzon, salam söylə
Ordudakı Hasana.

Başdan-başa,
Su vurur daşdan-daşa.
Bu dünyanı fəth etdi
Mustafa Kamal paşa.

Başındakı yaylığı,
Yuyuram qurumuyor.
Yarın rəsmi var məndə
Gülüyor, konuşmuyor.

Mən bir hüma quş idim,
Yoluna qonmuş idim.
Niyə uçurtdun məni?
Mən sənin olmuş idim.

Mənim yarım çox gözəl,
Taksi içində gəzər,
Gözlükləri taxınca
Zəki Mürenə bənzər.

Bəyköyünün yoğurtu,
Ruzgar ilə sovurdu.
Anamın işi vardı
Məni babam doğurdu.

Mindim kiraz dalına,
Baxdım Üsküp yoluna.
Üsküp yolu düz gedər
Fayton dolu qız gedər.

Bingölə, Bingölə,
Sular axar Bingölə.
Yar soyunmuş yıxanır
Oğlan, sən də gir gölə.

Bir ay çıxdı kənarsız,
Ağam keçər fənarsız.
Öylə bir ah çəkərəm
Məhlə ilə yanarsız.

Bitlis ətrafı dağlar,
İçində viran bağlar.
Mən dərdimə yanmanam
Dərd dərdə dəyər ağlar.

Bursadan Ankaraya
Körpü olsa qüdrətdən,
Konuşalım sevdiyim,
Qurtulalım bu dərddən.

Dama çıxasım gəldi,
Çadır qurasım gəldi.
Çadır deyil muradım,
Səni görəsim gəldi.

Gəmim dəryada qaldı,
İşim fəryada qaldı.
Öldüyümə yanmıram,
Hayıf yar yada qaldı.

Gəmi gəliyor, gəmi,
Yüklədilir pirinci.
Şu Trabzonun içində
Mənim yarım birinci.

Qərənfilin fil-fili,
Nərdən aldın bu dili?
Bu dil buranın deyil
İstanbulun bülbülü.

Getdim Arda boyunca,
Durdum teşti dolunca.
Rodopları dolaşdım,
Nazlı yarı bulunca.

Gül taxılmış yaxaya,
Bax yapdığı şakaya.
Məni buraxıb uçdu,
Quş olub Ankaraya.

Hələbdən çıxdım yayan,
Məndili dolu payam.
Mən sevdim, ellər aldı
Dayan ürəyim, dayan.

Halılırda Xorasan,
Ara, məni bulasan.
Gündüz xəyalən gətir,
Gecə röya görəsən.

İki tabaq balım var,
Biri yeyilsə, biri var.
İki tanə yarım var,
Biri ölsə, biri var.

İnci sərdim günəşə,
Baxan gözlər qamaşa.
Elin yarı gül isə
Mənim bir top bənövşə.

İrəfə fincan qoydum,
İçinə mərcan qoydum.
Qaynanamın adını
Quyruqlu sıçan qoydum.

İstanbul yaza bənzər,
Çil ördək qaza bənzər.
Yarımın yanaqları
Təzə kiraza bənzər.

İstanbul yolu dardır,
Məktubun dili vardır.
Durmayasan, gələsən,
Dünyada ölüm vardır.

İşdə mən gediyorum,
Ya İstanbul, ya Konya.
Sevdim də, alamadım
Ey gidi, yalan dünya.

İşdə gəldim Mərdindən,
Dolandım köşk ardından.
Duramadım, a Zöhrəm
Mən də sənin dərdindən.

Qərənfilim üç çatal,
Üçü də ayrı açar.
Şu Təkirdağ qızları
Alır boğçanı qaçar.

Qayalar buz bağladı,
Bülbüllər zarda qaldı.
Könlüm qapısı kilidli
Anaxdar yarda qaldı.

Qaz ayağı qumdadır,
Babam uzaq yoldadır.
Səsləndim səsim getməz
Van dağları daldadır.

Kətan köynək səkkiz qat,
Dördünü gey, dördün sat.
Məndən başqa yar sevsən,
Qalxmaz döşəklərdə yat.

Məktub Vana var da gəl,
Yardan xəbər al da gəl.
Bir ikən iki olduq
Üç olunca sor da gəl.

Minarədə əzan var,
Xas bağçada gəzən var.
Şu Konyanın içində,
Ürəyimi əzən var.

Maydanoz ot deyilmi?
Yarpağı dörd deyilmi?
Ərzincandan ayrılmaq
Bizlərə dərd deyilmi?

Oda yandı,
Ot düşdü o da yandı.
Əyildim su səpməyə
Səpdiyim su da yandı.

Səbr et, deyirsən mənə,
Mən səbir daşımıyam?
Döndərib dürüyorsan
Dəyirman daşımıyam?

Sarı kağız yazılmaz,
Dəryalarda gəzilməz.
Könül bir əbrişimdir
Düylənincə açılmaz.

Sabahdır, əzana bax,
Qəbrimi qazana bax.
Əzrayılın suçu nə?
Dəftərə yazana bax.

Bu dağlar bizim olsa,
Qoruqlar üzüm olsa,
Yar qürbətdən gəlincə
Gecələr uzun olsa.

Şu dağlarda ordu var,
Ordu getmiş yurdu var.
Gözlərindən anladım
Səndə könül dərdi var.

Şu dağlar kömürdəndi,
Gedən gün ömürdəndi.
Fələyin bir quşu var,
Dırnağı dəmirdəndi.

Şu dərənin uzunu,
Qıramadım buzunu.
Aldım türkmən qızını
Çəkəmədim nazını.

Tabaqamda mis tütün,
Könlümün eşqi bütün.
Əgər yarım gəlməsə,
Yıxılsın Bursa bütün.

Tası yox, tası yox
Nə viran çeşmə imiş,
Su içəcək tası yox.
Yıxıldı qərib könlüm
Yapacaq ustası yox.
Bu vəfasız dünyanın
Ucu var, ortası yox.

Təbriz mənəm, Xoy mənəm,
Didarına doymanam.
Necə ki, can təndədir,
Səni əldən qoymaram.

Tokat bir dağ içində,
Gülü bardağ içində.
Tokatdan yar sevənin
Ürəyi yağ içində.

Vay İstanbul, İstanbul,
Gördüm qonaqlarını.
Öpmə ilə qanamam
Yesəm yanaqlarını.

Vur xəncəri qəlbimə,
Qəlbim qana bulansın.
Fəzlə dərinə getmə
Çünki orda sən varsan.

Üzdürdüm qayığımı
Rizəliyəm, Rizəli.
Adam cibində bəslər
Sənin kimi gözəli.

## RAMAZAN DAVULÇULARI VƏ DAVULÇU MANİLƏRİ

*Bundan yarım əsr əvvəllərə qədər İstanbulda ekzotik bir tip təşkil edən "məhəllə bəkçiləri" ("məhəllə gözətçiləri") vardı. Onlar əsasən Doğu Anadoludan gəlmiş insanlar idi, ya bir məscidin, ya bir camenin yanında yaşar, keçinib dolanarlardı. Əksəriyyəti bazburudlu, iri saqqallı, başı sarıqlı kişilər idi. Ramazan gəlincə davul çalar, Ramazanın gəldiyini elan edərlərdi. Davulçuların yanında bir fənər tutan və mani söyləyənlər də vardı.Bayramda bu manilərlə bəxşiş dilənər və alınardı.*

*Davulçu maniləri İstanbul şəhər folklorunun maraqlı formalarındandır. Bundan başqa mani (bayatı) biçimində yaranmış bir "Bəkçi dastanı" da var. Türk şəhər folklorunun bu örnəyiylə oxucuları tanış etmək məqsədilə antologiyamıza bir neçə davulçu manisini və "Bəkçi dastanı"ndan Paşa fəslini daxil edirik. Manilərdə də, dastanda da xoş bir zarafat ovqatı, bayram ruhu, yumor çalarları var.*

Ramazan gəldi dayandı,
Camilər nura boyandı.
Top atıldı, qəndil yandı
Cümlə aləm buna inandı.

Bəsmələylə çıxdım yola,
Salam verdim sağa-sola.
A mənim şövkətli əfəndim,
Ramazani-şərifin mübarək ola.

Ramazanın ibtidası,
Quruldu cənnət binası.
Bu ayda oruc tutanın
Qəbul olur hər duası.

Nə uyursan, nə uyursan,
Bu uyqudan nə bulursan?
Al abdəsti, qıl namazı
Cənnəti-əlayi bulursan.

Davulumun ipi qaytan
Sırtımda qalmadı mintan.
Ver əfəndim bəxşişimi,
Alayım sırtıma mintan.

Yeni cami dirək istər,
Söyləməyə ürək istər.
Mənim qarnım toxdur, amma
Arkadaşım böyrək istər.

## BƏKÇİ DASTANI
(Paşa fəsli)

Bax bəkçinin izanına,
Aclıq gəlmiş də canına.
Paçav yapdırmağa varmış
Paçaçı dükanına.

Sahanın əlinə alır,
Qazanın dibinə varır.
Bir iyicə yapsın deyə
Paçaçıya pək yalvarır.

Paçaçı qazanı açar,
Bəkçi də yanına keçər.
Qazan içinə baxarkən,
Başından sarığı düşər.

Sarığı gedər bir yana
Bax bəkçinin seyranına.
Sarığı alayım derkən
Düşər paça qazanına.

Bəkçi bir yol dalar çıxar,
Paçaçı atəşi yaxar.
Bəkçi başlarkən fəryada
Paçaçı da dönər baxar.

Bəkçini qazanda görər,
Başına bir kəfgir vurar.
Der ki: Nə ararsan orda?
Sahanın dişarda durar.

Qazan fukur-fukur qaynar,
Bəkçinin əl-ayağı yanar.
Bəkçi hop-hop-hop sıçrar,
Paçaçı sanır ki, oynar.

Bəkçi o haldaykən yenə,
Paça doldurur qoynuna.
Paçaçı der ki: Dışarı çıx
Bax eylədiyin oyuna.

Çıxardılar bunu hələ
Paçaçılar gülə-gülə.
Bişməyə az qalmış bəkçi
Bir azca qızarmış belə.

Paçaçı qazanı tökər,
Vafir qərib zərər çəkər.
Bir sillə vurar bəkçiyə,
Bəkçi düşər təkər-məkər.

Bəkçiniz qaçar gülərək,
Sizlərə gəldim bilərək.
Ağam, əfəndim, sultanım
Bəkçinizə bəxşiş gərək.

## TÜRKÜLƏR

— Bir sarı ilan sarıldı belimə
On yeddi yerimdə yaraladı məni.

— Varın söyləyin də babam gəlsin
Alsın ilanı da sarsın əlinə.

— Alamam ilanı, saramam əlimə
Sənsiz olaram, əlsiz olamam.

— Varın söyləyin anama gəlsin
Salsın əlini alsın ilanı.

— Alamam ilanı, saramam əlimə
Sənsiz olaram, əlsiz olamam.

— Varın söyləyin sevgilimə gəlsin
Salsın əlini alsın ilanı.

— Salaram əlimi alaram ilanı
Əlsiz olaram, sənsiz olamam.

***

Dan ulduzu parlayır,
Ürəyimi dağlayır,
Ayrılıq mənə zor gəldi, nazlı Leylam
Ürəyimi dağlayır.

Yaşım yirmi dolmadı,
Al bənizim solmadı,
On beşində bir yar sevdim, Leylam
O da mənim olmadı.

Qaşların var qələmdən,
Gözlərin var kömürdən,
Sənsiz keçən günləri, Leylam
Saymayıram ömürdən.

***

Siqaramı yandırdım, Bədriyəm
Gül dalına qondurdum.
Yarım uyquda ikən, Bədriyəm
Öpdüm də oyandırdım.

Mən gedərəm yolumca, Bədriyəm
Mor çiçəklər boyunca.
Düşmən girdi araya, Bədriyəm
Sevəmədim doyunca.

Bağçada gördüm səni, Bədriyəm
Portağal saydım səni.
Sevməyə qıyamazdım, Bədriyəm
Ellərə verdim səni.

***

Qalx gedəlim, Xədicəm
Dağlar olsun evimiz.
Kürkən yarpaqları da, Xədicəm
Olsun kirəmetimiz.

Dəniz kimi əngindir,
Balıqçılar zəngindir.
Anası da verməyir, Xədicəm
O qız mənim dəngimdir.

Qaryolanın dəmiri
Kim görmüş güldüyümü?
Sevgilimi almazsam, Xədicəm
Öldürərəm kəndimi.

Qaynar qazan daşmazmı?
Yol buradan aşmazmı?
Sil gözünün yaşını, Xədicəm
Sağ olan qovuşmazmı?

## KIPRIS MANİLƏRİ

Adam aman der məni
Nə anam var, nə babam,
Sən olsun acı məni.
Mənə derlər: nə ağlarsan?
Buraxmaz acı məni.

Duzaq qurdum bülbülə
Tutulan sərçəmidir?
Nəfəsin güllər qoxar
İçərin bağçamıdır?

Axşam olsun, gələyim,
Halım kimə söyləyim?
Var get vəfasız axşam
Yarsız səni neyləyim?

Ağ üzümün salxımı
Qız, sən aldın ağlımı.
Alacaqsan, al məni
Qaçırmadan ağlımı.

Ağaclar qələm olsa,
Yarpağı kağız olsa,
Yazılmaz mənim dərdim
Dəniz mürəkkəb olsa.

Ah qarğalar, qarğalar,
Dənizdəki dalğalar.
Topçuköyün qızları
Cifdə göbək çalxalar.

Çaldığı sazdır,
Etdiyi nazdır.
Nə qədər sevsəm,
Yenə də azdır.

Çalınsın kəmanələr,
Oynasın divanələr.
Lefkoşanın içində
Yıxılsın meyxanələr.

Avtomobilin arxası,
Kadillakdır markası.
Yarı öpəyim dedim
Söndü trafik lampası.

Ovalarda isırqan
Sən urumsan, mən islam.
Əyil bir şaftalı ver,
Vallah, billah, sırmam.

Bir gün sabah olacaq,
Yenə günəş doğacaq.
Unutmayın kafirlər
Ada Türkün olacaq.

## QARŞILIQLI SÖYLƏNƏN MANİLƏR

— Adiləm sən naçarsan,
İnci, mərcan saçarsan.
Dünya dəniz olunca
Gülüm, nərə qaçarsan?

— Ağam, derəm:naçaram,
İnci, mərcan saçaram.
Dünya dəniz olunca
Mən quş olub uçaram.

— Adiləm, sən naçarsan,
Ləli-gövhər saçarsan.
Mən bir şahin olunca
Yavrum, nərə qaçarsan?

— Ağam, derəm: naçaram,
Ləli-gövhər saçaram.
Sən bir şahin olsan
Mən yerlərə qaçaram.

— Adiləm, sən naçarsan,
Ləli-gövhər saçarsan.
Mən Əzrayıl olunca
Quzum, nərə qaçarsan?

— Ağam, derəm: naçaram,
Ləli-gövhər saçaram.
Sən Əzrayıl olunca
Mən cənnətə qaçaram.

# BOLQARISTAN TÜRKLƏRİNİN MANİLƏRİ

Endim çeşmə başına,
Yazı yazdım daşına.
Sevda nədir bilməzdim
O da gəldi başıma.

Uzaqlar seçilməyir,
Könüldür keçilməyir.
Könül bir top əbrişim
Dolaşmış açılmayır.

Sevginin mumu sönməz,
Gözyaşları heç dinməz.
Dənizdə su tükənər
Aşıqdə dərd tükənməz.

Qəhvə deyil, çay deyil,
Sözlərim alay deyil.
Eşq qəlbə qolay girər
Çıxarmaq qolay deyil.

Qara çocuq, qara çocuq,
Pərçimini dara çocuq.
Məndən sənə fayda yox
Qismətini ara çocuq.

Ay doğar, gün doğmazmı?
Mənə yar bulunmazmı?
Mən də yarsız ölürsəm
Namazım qılınmazmı?

Quyu üstündə qapaq,
Üstündə yaşıl yarpaq.
Mən dünyama doymadım
Saxlama qara torpaq.

Ceviz, fındıq, badam var,
Keçirəcək xoş dəm var.
Qulağını mənə ver
Sənə böyük müjdəm var.

Quş olur, qanadlanır,
Dürlü xəndək atlanır.
Gənclik çağında insan
Hər möhnətə qatlanır.

Qala qalaya qarşı,
Qalanın ardı çarşı.
Açılmalı gül olsam,
Açıllam yara qarşı.

At üstündə durulmaz,
Göz yaşlarım qurumaz.
Ürəkdən sevilən yar
Ölmədən unudulmaz.

Cıra-sıra çarşılar,
Yarım məni qarşılar.
Yeddi il sevda çəkdim
İndi duydu qonşular.

Qaladan eniyoram,
Dön desən dönüyoram.
Eşqinlə kibrit oldum
Üfləsən yaniyoram.

Səbihə adlı yarım,
Cilvəsi dadlı yarım.
Büllur bardaq içində
Baldan da dadlı yarım.

Süpürgəsi yoncadan,
Beli qayət incədən.
Mən yarımı qısqandım
Yerdəki qarıncadan.

Qəlb eşqə şikar oldu,
Sirlər aşikar oldu.
Yarla xoş keçən günlər
Könlümə qubar oldu.

Bağa getdim, üzüm yox,
Başqasında gözüm yox.
Sənə bir cift sözüm var
Söyləməyə lüzum yox.

Dəniz mil ilə olur,
Sevda dil ilə olur.
Bu göz çoxunu görür
Könül bir ilə olur.

Qara qoyun otlasın,
Dərələrdən atlasın.
Sevgilimə gedəcəm
Düşmənlərim çatlasın.

Bir dəstə gül almışam,
Günəşlərdə yanmışam.
İstər al, istər alma
Alnına yazılmışam.

Çəkməçəmi çəkəməm,
Dündə oraq biçəməm.
Sultan taxtını versə,
Mən yarımdan keçəməm.

Saçları bükülə-bükülə,
Gözəl yar, məni bəklə.
Mən də səni sevməsəm,
Öldür məni tüfənglə.

Siyah saçı hörməzlər,
Səni mənə verməzlər.
Gəl bərabər qaçalım
Qaranlıqda görməzlər.

Ağ gülüm dəstə-dəstə,
Məni babamdan istə.
Əgər babam verməzsə,
Diz çök, Mevladan istə.

Su dərə aşmaq istər,
Al yanaq yaşmaq istər.
Mənim kimi gənc qızlar
Yarla sarmaşmaq istər.

Almanı bıçaqladım,
Məndili saçaqladım.
Yar ağlıma gəldikcə
Yastığı qucaqladım.

Yarımın gözü qara,
Açdı sinəmə yara.
Dolaşma, sokak-sokak
Sevdiyini evdə ara.

Yaşıl yarpaq solmasın,
Səni saran doymasın.
Səni sardığım gecə
Üç gün sabah olmasın.

Atladım bağdan-bağa,
Soldum döndüm yaprağa.
Qoynunda solmayınca
Girməm qara torpağa.

Bəyaz geymə toz olur,
Yaşıl geymə söz olur.
Geyəcəksən allar gey
Qovuşmamız tez olur.

Pəncərədə pərdəsən,
Qara gözlüm nərdəsən?
Söyləyəcək sözüm var
Qalabalıq yerdəsən.

Kətan köynək tikəyim,
Aç qoynuna girəyim.
Uyu, oyan sar məni
Yar olduğun biləyim.

Gedin, buludlar, gedin,
Yarıma salam edin.
Yar unudub yatdısa,
Uyqusun haram edin.

Bu dağlar bizim olsa,
Hər yanı üzüm olsa,
Yarın yatdığı yastıq
Mənim bu dizim olsa.

Gəmi gəldi durdumu?
İskələyə vurdumu?
Söylə ey səhər yeli,
Yar halımı sordumu?

Dağda xırman olurmu?
Eşqə fərman olurmu?
Yana-yana kül oldum,
Külə dərman olurmu?

Pinar başında dəsti,
Yarım buradan keçdi.
Hər gün salam verirdi
Bu gün salamsız keçdi.

Eşqinə inanmışam,
Mən boş yerə yanmışam.
Sözünə inanmaqla
Çıxmaza saplamışam.

Üzüm qoydum səbətə,
Əsgər gəzər təpədə.
Götürdülər yarımı
Görünməz məmləkətə.

Buğda əkəməz oldum,
Fidən tikəməz oldum.
Artıq qalmadı taqət
Həsrət çəkəməz oldum.

Dağdan kəsdim çinarı,
Çinarın dalı sarı.
Ağlamaqdan qurudu
Gözlərimin pınarı.

Almalı yarım, almalı,
Almanı hardan almalı?
Türk qızları pək bahalı
Bulqar qızımı almalı?

Şumnu içi bazarın,
Kəndim oxub yazarım.
Məndən qeyri sevərsən
Ataş olsun məzarın.

Gediyoram elinizdən,
Qurtulayım dilinizdən.
Yaşıl başlı ördək olsam
Sular içməm gölünüzdən.

# TÜRKMƏN XALQ TÖRƏDİCİLİYİ ÖRNƏKLƏRİ

## AYDIMLAR

Dağlar başı duman-duman, yel gələ, Bibican,
Bulut oynar, çaylar dolar, sel gələ, Bibican,
Tamaşanı dümlü-düşdən elə gələ, Bibican
Aç qucaqna, bas bağrına, soyuq ala, Bibican.

Burdan getsəm Xivə yolu daş bola, Bibican
Ağlar-ağlar iki gözüm yaş bola, Bibican.
Bivəfanın axır sonu puç bola, Bibican
Aç qucaqnı, bas bağrına, soyuq ala, Bibican.

***

Evlərinin keyni arpa
Atlı keçer gurpa-gurpa.
Anası qızından körpə
Çıxar, baxar yola Nərgiz.

Evlərinin keyni üzüm
Nərgiz - mənim qara gözüm.
Mən ayıdan sonki sözüm
Çıxar, baxar yola Nərgiz.

***

Məqsədli qövün içrə
Bir afəti-can gəldi.
Müjkanları xəncər tək
Ol qaşı kəman gəldi.

Həm dərdimədir dərman
Canımdır ona qurban.
Öldürsə - budur fərman
Dövlətli zaman gəldi.

Eşqində onun zaram,
Əlində giriftaram.
Ölüncən xiridaram
Dövlətli zaman gəldi.

Yandırdı Xədicəni,
Göydürdü Züleyxanı.
Şəhrimizin mehmanı
Dövlətli zaman gəldi.

***

Qalanın dibində bir qovun idim,
Ətini yedim də, bıçağı qoydum.
Yiyəsi gələndə gözünü oydum,
Əlində yaylığı yelpəsələndi.

Qalanın dibində nar yemək olmaz,
Ol varan gözələ söz demək olmaz.
Yanında yatmasan yar demək olmaz,
Əlində yaylığı yelpəsələndi.

Qalanın dibində əkərlər narı,
Gecələr yatmazlar, sevərlər yarı.
Qız-oğlan nazikdir, dutarın tarı,
Əlində yaylığı yelpəsələndi.

Atımı bağladım bir qara daşa,
Qılıncım sıyırdım, girdim savaşa.
Allahım yetirsin ol dəli başa,
Əlində yaylığı yelpəsələndi.

***

Mərgan qardaş, nə yatıbsan bixəbər,
Saxla yolun, maral suya gəlibdir.
Çəkimində durdun bir neçə səhər
Saxla yolun, maral suya gəlibdir.

Yar yar qədrin ölüncə bilməz,
Naz ilə gələnlər gözünə ilməz.
Bu çeşmədən özgə yerdə su almaz
Saxla yolun, maral suya gəlibdir.

Camalı var - bir səmanın ayıdır,
Göy içində mələkələr sayıdır,
Aşiqini öldürməyə sayıdır,
Saxla yolun, maral suya gəlibdir.

Sıyadan qaradır, dalında saçı,
Üzünə düşübdür Zülfinin geci.
Cənnətə oxşayır qoynunun içi.
Saxla yolun, maral suya gəlibdir.

İsmayıl der: məni başdan yaxıbdır,
Ləli - mərcan yaxasına taxıbdır.
Qızlar ilən bağa seyrə çıxıbdır
Saxla yolun, maral suya gəlibdir.

***

Sallananda sücut enər qaşına,
Sən hayan vararsa, dön qız, qayıt indi!
Tutam zülfün ucunu, dönəm başına,
Sən bizə eyləmə naz, qız, qayıt indi!

Əylisdə gəlmişəm, mənzildən, yoldan,
Yaşılbaş sonalar ürküşər göldən.
Öpsəm yanaqların, qırmızı güldən,
Dilindi ürəyim, dön, qız, qayıt indi!

Sona kimin dal gərdənin qaldırma,
Hər yetər-yetməzə sirrin bildirmə.
Dostunu ağladıb düşman güldürmə,
Səlatin gərdənlim gəl, qız, qayıt indi!

Gövnünə gətirmə fikri, xəyalı,
Sədqə olsun sənə dünyanın malı,
Həmrahinin sənsən vəfalı yarı,
Qadanı didəmə qoy, qız, qayıt indi!

## XÜVDÜLƏR

Yalanayın adından,
Sallancaqda badından,
Bəzənib ata çıxsan,
Çıxarma sən yadından.

Ayın, günün arası,
Əkmə narın danəsi.
Bazarların alması,
Ol Bağdadın xurması.

Allay-allay almalı,
Ala gözü sürməli.
Səhər durub görməli
Alın saçın hörməli.

Allalasam ər olar,
Hər əlində nar olar.
Yortub evdən çıxanda
Düşmən gözü kor olar.

Quzumun başı yaşdır,
Ölməsə, yolu daşdır.
Oğlumun alcağı qız
Qara göz, qələm qaşdır.

Dərdini mən alayın,
Ürəyimə salayın.
Demə kəlləm ağarar
Sən yerinə öləyin.

Mənim balam baldandır,
Piyələsi taldandır.
Bunun əslini sorsan,
Əsli qızıl güldəndir.

Mənim balam atlanır,
Atları heybətlənir.
Gül üzünə gün düşsə,
Havası buludlanır.

Xüvdü-xüvdüsü gəlsin.
Yatsa uyğusu gəlsin
Balamın iraqdakı
Dayı-dayzası gəlsin.

## LƏLƏLƏR

Ağac başında durdum,
Dibində duzaq qurdum.
Nakəs yarın dərdindən
Həm ağladım, həm güldüm.

Ay doğar aya qarşı,
Su yürər çaya qarşı.
Qəribə qız verməzlər
Çıxarlar bəyə qarşı.

Ağ qalanın uzunu,
Qaytar, oğlan, quzunu!
Varsan ayıt ağana
Bizə versin qızını.

Ala dağın armudu,
Anan, atan varmıdı?
Səni pula satanın
İki gözü kormudu?

Dutarın pərdə-pərdə,
Hər pərdəsi bir yerdə.
Naxşı qız yanan yerdə
Mən yanayın ol dərdə.

El gələr, a el gələr,
Sandıq dolu pul gələr.
Mənim yekə doğanım
Bizə ayda bir gələr.

İrəldən ötən iyid,
Köynəyi kətan iyid.
Heç qızilə sevişmən
Dünyadan gedən iyid.

Sarı donun qatbaqat,
Birini gey, birin sat.
Öz evimizə gəlməsən,
Qonşumuza gəl də yat.

Suya getdim tas ilən,
Su aldım həvəs ilən.
Yarı-yardan ayıranın
Günü keçsin yas ilən.

Uzun-uzun göllərdə
Ördək ilən qaz oynar.
Uzun-uzun gecədə
İyid ilən qız oynar.

Əkin əkdim gördülər,
Göyərmədən vurdular.
Açılmamış tər gülüm
Xəzana döndərdilər.

Vəfasıza yar olmaz,
Binamusa ar olmaz.
Öz vətənin görənlər
Yer üzündə xar olmaz.

# QAQAUZ FOLKLORUNDAN ÖRNƏKLƏR

*Qaqauzlar türk xalqlarının oğuz dil qrupuna daxildir. Adlarını Qara+Oğuz, Göy+Uz, Qağa+Oğuz şəklində izah edirlər. Qaqauzlar hazırda Moldovanın tərkibində Bucaq adlanan bir ərazidə (mərkəzi Komrad şəhəri) yaşayırlar. 1989-cu ilin statistikasına görə burada yaşayan qaqauzların sayı 198 mindir. Qaqauzlar nisbətən az sayda Bolqarıstanda, Rumıniyada, Qazaxıstanda, Özbəkistanda, Qırğızıstanda da yaşayırlar.*

*Bəzi araşdırıcılar qaqauzların mənşəyini qaraqalpaqlarla, bəziləri qumanlarla, bəziləri isə XIII əsrdə II İzzəddin Keykavusun ardınca Rumelinə keçmiş Səlcuq türklərilə bağlayırlar. Qaqauzların dil özəllikləri baxımından axırıncı fərziyyə daha məntiqlidir. Qaqauzlar XIV əsrin əvvəllərində Balıq bəyin rəhbərliyi altında bir dövlət qurmuş və bugünkü Bolqarıstan sərhədləri içindəki Balçıq (Karvuna) şəhərini paytaxt etmişlər. 1417-ci ildə bu kiçik dövlət Osmanlı İmperatorluğuna qatılmışdır. Dini mənsubiyyət baxımından qaqauzlar ortodoks (pravoslav) xristian olsalar da, etiqadlarında əski türk inanclarını da qoruyub saxlamışlar. Xristianlığın təməl ruhuna uyğun olmayaraq qurban kəsir, hətta "Divani-lüğat-it türk"də təsvir olunan İdik qurbanını "Allahlıq" adı altında yaşadırlar. Türk əsatirində müqəddəs sayılan Boz Qurdla bağlı "Qurd bayramı" da keçirirlər.*

*Bu gün Moldovada muxtar qurum yaratmağa çalışan qaqauzlar milli bayraq olaraq əski Göy türklərin bayraqlarını seçmişlər. O da maraqlıdır ki, tapındıqları xristian tanrısını ərəb kəlməsiylə - "Allah" adlandırır və aşağıda örnək gətirəcəyimiz xalq şerlərində "maşallah", "inşallah" kimi kəlmələr işlədirlər. Oğuz dil qrupuna mənsub olan, bəzi cəhətləriylə Türkiyə türkcəsinə, bəzi cəhətləriylə azəri türkcəsinə yaxın olan qaqauz dilində əsrlərlə qonşu olduqları slavyan, rumın və yunan dillərindən alınma kəlmələrin də olmasına baxmayaraq, qaqauzlar doğma dillərinin saflığını qoruyub saxlayıblar. Onu da qeyd etmək lazımdır ki, bugünkü ədəbi qaqauz dilində Türkiyə türkcəsinin təsiri daha çox hiss olunursa, xalq danışıq dili, xüsusilə xalq şerlərinin dili azəri türkcəsinə daha yaxındır.*

*Qaqauzların mani adlandırdıqları şer dördlükləri heyrətamiz dərəcədə Azərbaycan bayatılarıyla yaxın, bəzən əkizdirlər.*

*Qaqauz folklorunda bir çox türk xalqları üçün ənənəvi sujetlər - "Koroğlu", "Aşıq Qərib", "Əsli-Kərəm", "Arzu-Qəmbər" dastanlarıyla, Nəsrəddin lətifələriylə bağlı motivlər haqqında əvvəllərdə, "Koroğlu" şerləri təqdim olunan səhifələrdə danışmışdıq. Ancaq qaqauzların indiki coğrafi məskənləriylə və son əsrlərdəki tarixi taleləriylə bağlı, başqa türk xalqlarında olmayan folklor nümunələri də var. Bunlardan "Sevastopol türküsü"nü, 1877-1878-ci illərin Osmanlı-Rus müharibəsinə aid dastanı, 1828-ci il Varna mühasirəsinə həsr olunmuş dastanı və Türkiyədə də populyar olan "Yəmən türküləri"ni göstərmək olar.*

*Qaqauz dilinin özəlliklərinə gəldikdə, bir neçə nöqtəni vurğulamaq istəyirik. Qaqauz türkcəsində bəzən "H" səsi düşür, məsələn: "hava" əvəzinə "ava", "haçan" əvəzinə "açan", "hər" əvəzinə "ər", "həm" əvəzinə "əm", "hesablanmış" əvəzinə "esablanmış" - deyirlər. Əksinə, bəzən ilk səs kimi "H" əlavə olunur: anbar-hanbar, aylaq-haylaq və s. Bəzən sözün başında "R" əvəzinə "L" işlənir: Rüzgar-lüzgar. "Ğ" səsini, ümumiyyətlə, işlətmirlər: Dağlara yerinə daalara, oynamağa yerinə oynamaa, aramağa yerinə aramaa və s. deyirlər. Bəzən sözün başında və ortasında "Y" səsi düşür. Məsələn: yeddi-eddi, yemək-emək, yer-er, yemiş-emiş. Bəzən isə sözün başına "Y" səsi əlavə olunur: ölüncə- yölüncə, inanmıram-yınanmıram, imdat-yimdat, insan-yınsan, ödəmək-yödəmək və s. Azəri türkcəsində danışıq dilində olduğu kimi, qaqauzlarda da "lar", "lər" şəkilçilərinin yerinə "nar", "nər" işlənir. Məsələn: insannardan (insanlardan), onnar (onlar), keçənnər (keçənlər), fincannar (fincanlar), altunnar (altunlar) və s. Yaxud annını (alnını), dinnənir (dinlənir), annatmış (anlatmış). Türkiyə türkcəsindən fərqli olaraq qaqauzlar da azərilər kimi "qədər" əvəzinə bəzən "dən" işlədirlər. Məsələn: "göy üzünə qədər" deyil, "göy üzünədən", "bazara qədər" deyil, "bazaradan" "qışa qədər" deyil, "qışadan" və s. Belə bir dil fərqi də var: Azərilər və Türkiyə türkləri, məsələn, "sorsaydı" deyirlərsə, qaqauzlar "sorarsaydı" deyirlər, "gəlirsə" əvəzinə "gəlirsəydi", "görürsə" əvəzinə "görürsəydi" deyirlər.*

*Bəzən azəri və Türkiyə dialektlərində, şivələrində belə hifz olunmuş bu qaqauz özəllikləri nəzərə alınmazsa, qaqauz folklorunu heç bir çətinlik çəkmədən orijinalda oxuyub anlaya bilərik. Antologiyanın bu bölümünə daxil etdiyim qaqauz xalq şeri örnəkləri və manilərinin bir kəlməsini dəyişmədən, yalnız fonetik cəhətdən azəri türkcəsinə uyğunlaşdıraraq təqdim edirəm.*

## ANACIĞIMIN TORPAĞINA

Aman Allahım, Allahım,
Yaratsana məni bir quş,
Bir quş, qanadı gümüş.
Mən də uçub gedəyim,
Anacığımın məzarına,
Anacığımın torpağına.
İki yanını açayım
Bir-iki laf danışayım.
— Anacığım, ana, sevgili,
Acıdan dadlı olurmu?
Eldən də qardaş olurmu?
— Acıdan da dadlı olmaz,
Eldən də qardaş olmaz.

## AYŞƏ

Ayşə, nə gözəl saçların var
Saçların səndən, daraması məndən.
Ayrılamam mən səndən.

Ayşə, nə gözəl yanaqların var
Yanaqların səndən, öpməsi məndən.
Ayrılamam mən səndən.

Ayşə, nə gözəl dodaqların var
Dodaqların səndən, öpməsi məndən.
Ayrılamam mən səndən.

Ayşə, nə gözəl məmələrin var
Məmələrin səndən, sıxması məndən.
Ayrılamam mən səndən.

Ayşə, nə gözəl bacaqların var
Bacaqlar səndən, qaldırması məndən.
Ayrılamam mən səndən.

## BÜLBÜL

Bülbülüm, sənin bilginmi var?
Bağçalarda yurdunmu var?
Məncileyin dərdinmi var?
Ötmə bülbül mənim dərdim mənə yetər
Yetər də gün-gündən artar.

Bülbülümün tükü sarı,
Mən çəkərəm ahu zarı.
Əlimdən aldırdım nazlı yarı
Etmə bülbül mənim dərdim mənə yetər
Yetər də gün-gündən artar.
Bülbülümün tükü qara
Salam söylə nazlı yara
Al üstünə geysin qara.

Bülbülüm uslumusan?
Qəfəslərdə bəslimisən?
Mənciləyin yaslımısan?

## ARZIYNAN QƏMBƏR

Arzı:

Mən çeşməyə vardım,
Əlimi, yüzümü yudum,
Əntəşəmi çıxardım,
Daş üstünə qoydum.

Qəmbər:

Mən çeşməyə varmadım,
Əlimi, yüzümü yumadım,
Ənətəşəni almadım,
Bilərzini bulmadım.

Qəmbər:

Ay doğar donuq-donuq,
Bağçalar dolmuş gül tumruq.
Əntəşəni bulana
Arzı, nə var muştuluq?

Arzı:

Ay doğar donuq-donuq,
Bağçalar dolmuş gül tumruq.
Əntəşəmi bulana
Al şəftəli muştuluq.
Bilərzimi alana
Arzı kəndi də muştuluq.

Qəmbər:

Qız, qaşını, gözünü çatmısan,
Qan tərlərə batmısan.

Önümdəki qurbana
Zəhərlərmi qatmısan?

Arzı:

İnnəmə, Qəmbər, innəmə,
Nənəmin sözün dinnəmə.
Önündəki quzuya
Bal şəkər qoysalar yemə.

Qəmbər:

Xaç təpəsi tunc olur,
Yar sevmək güc olur.
Mən gedirəm bəy baba
Vay, sənin halın necə olur?

Qəmbər:

Anasının adı Gülgülüstan,
Babasının adı Xüdüstan.
Arzıynan Qəmbəri
Sən qovuşdur, bəy sultan.

## ƏLİŞİMİN QAŞLARI QARA

Əlişimin qaşları qara,
Sən açdın sinəmə yara,
Bulamadım dərdim çara.
Görmədinmi ol cavan Əlişimi Tuna boyunda?
Görmədinmi ol cavan Əlişimi Macur danda?

Evlərim var xanə-xanə,
Bənlərim var danə-danə,
Saramadım yenə-yenə.

Evlərim var dağ başında,
Bənlərim var sol qaşımda,
Saramadım gənc yaşımda.

Evlərim var sundurmalı,
Bənlərim var qondurmalı,
Bir öpüşdə soldurmalı.

Görmədinmi ol cavan Əlişimi Tuna boyunda?
Görmədinmi ol cavan Əlişimi Macur danda?

## TÜRKÜLƏR

Ah sarayından atılayım,
Əsgərinə qatılayım,
Xərac, məzat satılayım,
Mən ayrılmam əfəndimdən.

Ah bu Krımın adaları,
Moskov dolmuş odaları,
Gəl, Şərif Bəyim Murzalı
Mən ayrılmam əfəndimdən.
Ellər ayıracaq yar, səni məndən
Mən ayrılmam.

***

Bu dünyada yemək-içmək xoşdur,
Bu dünyanın sonu boşdur.
Can qəfəsdə bəsli quşdur,
Vaxtı gələr, uçar bir gün
Qərib ömrüm keçər hər gün.

## HAVADA QAR SƏSİ

Havada qar səsi var,
Arxamda yar səsi var.
Səni sevmişəm qara gözlüm,
Səni sevmişəm.
Əski yarımı heç görəməm,
Yenisinə səbr edəməm.
Səni sevmişəm qara gözlüm,
Səni sevmişəm, tərk edəməm.

## OSMANLI — RUS MÜHARİBƏSİNƏ AİD DASTANDAN

Alaca dağında vardır gözəli,
Sarı saldat gəlir, cibi paralı,
Səfil Nizam gedər topuğu yaralı,
Buna Karsın yolu derlər.
Gedən gəlmədi, yıxılasınız,
Hey Qara dağlar, əsgər qalmadı,
Şu Rumun zakonu zordur,
Qorxuram ölərəm,

Qara dağ başında lətif səsi var
Yarın, baxın, çantasında nəsi var?
Buna Karsın yolu derlər.
Gedən gəlmədi, yıxılasınız,
Hey Qara dağlar, əsgər qalmadı,
Şu Rumun zakonu zordur,
Qorxuram ölərəm.
Qara dağ başında bir uzun tavlı,
Əsgərdən qaçannar qolları bağlı.
Kimisi yavrulu, kimisi evli,
Buna Karsın yolu derlər.
Qıratımı minəyim, çıxalım təlimə
Süngüynən tüfəngi alayım əlimə
Qanlı qılıcımı bağlayım belimə...

## ÇEŞMƏ BAŞINDA

Çeşmə başında batü,
At gəlir takır-takır.
Mən nazlı bir yar sevdim
Qaşları çakır-çakır.

Endim çeşmə başına,
Yazı yazdım daşına.
Sevgi nədir bilmədim
O da gəldi başıma.

Bağçada quyu qazdım,
Həm oxudum, həm yazdım.
Nazlı yarım gəlmədi
Az qaldı ölə yazdım.

## QIZ OTURMUŞ SUNDURMANIN BAŞINA

Qız oturmuş sundurmanın başına,
Hənuz basmış on dörd-on beş yaşına.
Nə də gəlmiş zavallının başına
Gün də vurmuş küpəsinin daşına.

Suya gedər bir incəcik yolu var,
Sudan gələr, bir incəcik səsi var,
Bağçadakı fidan kimi boyu var,
Duvardakı kirəc kimi təni var,
Baldan dadlı, şəkər kimi lafı var.

Anası dedi: "Cehizi yoxdur, verəməm,"
Babası dedi: "Qız kiçikdir, qıyamam,"
Qız dedi: "Yarım gəldi bəkləməm".

## QAL SƏLAMƏT

Bir gəzilən yol göründü
Gənə qərib gözümə.
Dağlar, daşlar dayanamaz,
Necə qıydın canıma?

Qal salamat nazlı yarım
Bir yana sən, bir də mən.

Mən havada uçar ikən
Əl ilən tutun məni.
Mən bahamı bilər ikən
Üç pula satın məni.

Altım torpaq, üstüm yarpaq,
Yenə könlüm xoş idi.
Qal sələmət kömür gözlüm
Sağa sən, sola mən.

## VARNANIN MÜHASİRƏSİNİ YAD EDƏN TÜRKÜ

Varna kimi qala yoxdur,
İçində timarı çoxdur,
Varnaya imdat yoxdur,
Biz varnalıyız, ağalar!
İmdat Varnaya!
Varna Qalataya baxar,
Arasında dərə axar,
Gəmilər Varnanı yaxar
Padişahlar!
İmdat Varnaya!
Varnanın ətrafı dəniz,
Varnanı sardı donuz,
Verin təbələrə omuz,
Biz varnalıyız.
Varnanın ətrafı bağlar,
İçində çeşmələr, çaylar,
Analar övladın ağlar

Biz varnalıyız!
Varnanın qalası daşdır,
Gözümdən axannar yaşdır,
Kafir! Osmanlar-başdır,
Biz varnalıyız.
Düşman və kafir Moskov
Dənizdən və qaradan
Toplardan sıx gülləni saçar.
Qorxar Osmanlı toplarından
Və Moskov hücumdan qaçar,
Biz varnalıyız.
Varnanın ətrafı çadır,
İçində Osmanlı yatır,
Gavur Moskov bilməz xatir
Biz varnalıyız.
Gəmi gəmiyə çatılmış,
Arasında üç top atılmış,
Xəbər gəldi: Varna satılmış,
Biz varnalıyız.

## MANİLƏR

Ah dərə, dərin dərə,
Kölgəsi sərin dərə.
Məni yardan ayıran
Boy versin qara yerə.

Ah havalı, havalı,
Yola düşmüş zavalı.
Oturmuş qaval çala
Çarıqları yamalı.

Ah irincə, irincə,
Qaşıq saldım pirincə,
Bir incəcik tər tökdüm,
Yar üzünü görüncə.

Ah saçak, viran saçak,
Dayansan yıxılacaq.
Topla, qonşu, qızını
Qızın mənə qaçacaq.

Ah uluma, uluma,
Su doldurdum tuluma.
Söyləcək mani söylə
Köpək kimi ulama.

Alçacıqsan dal kimi,
Dadlıcasan bal kimi.
Açdım üzünə baxdım
Təzə yağmış qar kimi.

Al yemiş, qara yemiş,
Dalları suya enmiş.
Mənim vardır bir yarım
Gözləri sıçan imiş.

Armud dalda bir sıra,
Yarım gedər Misirə.
Qoyun olsam otlasam,
Yarımın ardı sıra.

Armud dalda sallanır,
Yerə düşər ballanır.
Bir iyid vəzir olsa,
Yenə qıza yalvarır.

Atəşim var, külüm yox,
Bülbül olsam dilim yox.
Səni sevdim sevəli
Kimsələrdə gözüm yox.

Havada uçan kəpənək,
Qanadı ələk-ələk.
Məni yardan ayıran
Xəlbir satsın həm ələk.

Ay davar əmbər kimi,
Ortası çəmbər kimi.
Qız sənə aşiq oldum
Arzı ilə Qəmbər kimi.

Ay doğar sini kimi,
Oynalır səlvi kimi.
Yar qoxusu gəliyo
Baharın gülü kimi.

Ay doğar sümək kimi,
Sallanar yarpaq kimi.
Mənim var bir yavuqlum
Köynəkdə çiçək kimi.

Ay doğar qamış kimi,
Gün doğar gümüş kimi.
Mənim vardır bir yarım
Öpüşür ququş kimi.

Baxçalarda gəzərsən,
Boxça bulub cözərsən.
Hamımızdan gözəlsən
Genə yarsız gəzərsən.

Baxçalarda gül Fatma,
Qaşların çatma-çatma.
Madam məni sevirsən
Başqasına göz atma.

Bir dalda iki ceviz,
Aramız oldu dəniz.
Necə yatırsan mənsiz?
Saraldım soldum sənsiz.

Bu gün ayın on dördü,
Qız, saçını kim hördü?
Kim hördüsə, o hördü
İsbat etsin kim gördü.

Çeşmə başında durdum,
Doqquz göyərçin vurdum.
On beş bulqar içində
Bir qaqauza vuruldum.

Dağlar dağladı məni,
Görən ağladı məni.
Dəmir zəncir kar etməz
Könül bağladı məni.

Dənizə dalan bilir,
Bir alma alan bilir.
Sevda çəkməyən qızlar
Dünyanı yalan bilir.

Dənizə dalayımmı?
Bir balıq olayımmı?
Bunca qızlar arasında
Mən yarsız qalayımmı?

Dənizlərin qumuyam,
Balıqların puluyam.
Mərhəmətin yoxmu, yar?
Mən də Allah quluyam.

İki dalda bir ceviz,
Aramız Qara dəniz.
Sən orada mən burda
Nə olacaq halımız?

İki köpək bir tazı,
Qız istəməz papazı.
Papazın... saçına
On beş zopa qıçına.

Qar yağar kəpək kimi,
Yapışır ipək kimi.
Gec gələn çocuqları
Qovarlar köpək kimi.

Qaladan enişəlim,
Qoç kimi döyüşəlim.
Sən yağmur ol, mən bulud
Bir yerə qovuşalım.

Qərənfilim sərkarsan,
Açılmağa qorxarsan.
Yar yanına gəldimi
Xəstə olsan qalxarsan.

Qarşıda türk evləri,
Çəkilmiş pərdələri.
İçərdəki qızların
Tər-təmizdir əlləri.

Vardım danın başına,
Aldım yarımı qarşıma.
Bir öpdüm, bir də sardım
Ağlım gəldi başıma.

Varna yolu sıldırım,
Düşdüm, gəlin qaldırın.
Nə anam var, nə babam
Vurun məni öldürün.

Yaşıl ipək bükərəm,
Yarə köynək tikərəm.
O yar məni almasa,
Oturub da sökərəm.

# KƏRKÜK XALQ ŞERİNDƏN SEÇMƏLƏR

## "ARZI-QƏMBƏR" DASTANINDAN ŞERLƏR

(Kərkük variantı)

Aldı Qəmbər:

Arzım endi bulağa,
Səsi gəldi qulağa.
Arzıya peşkəş olsun
Şirvan, Təbriz, Marağa.

Aldı qız:

Çomağını atıbsan,
Nə qayğıya batıbsan?
Səniv kimi xas Qəmbər
Kəpənəkdə yatıbsan.

Aldı Qəmbər:

Çomağımı atmışam,
Mən qayğıya batmışam.
Hamsı sənin dərdivnən
Kəpənəkdə yatmışam.

Aldı qız:

Kəpənəkdə yatan oğlan,
Qəm yükünə batan oğlan,
Sənə sual edirəm
Biləzik tapan oğlan.

Aldı Qəmbər:

Kəpənəkdə yatmışam,
Qəm yükünə batmışam.
Kitab gəti əl basım
Biləzik tapmamışam.

Aldı qız:

Tuluğumu doldurdum,
Dolu deyib qaldırdım.
Dinim, imanım Qəmbər
Biləzigim saldırdım.

Aldı Qəmbər:

Hə gülşəni, gülşəni,
Güllər yerə döşəni.
Biləzigin üstündə
Nə varıydı nişanı?

Aldı qız:

Hə gülşəni, gülşəni
Güllər yerə döşəni,
Biləzigim üstündə
Arzı-Qəmbər nişanı.

Aldı Qəmbər:

Bu sular uluq-uluq,
Qızlar dolduru tuluq.
Biləzigin tapana
Nə verisən muştuluq?

Aldı qız:

Bu sular uluq-uluq,
Qızlar dolduru tuluq.
Biləzigim tapana
Şirin canım muştuluq.

***

Aldı qız:

Hey hatıptı, hatıptı,
Qoyun, quzu yatıptı.

Qəmbər dələmə yemə
Nənəm sütün qatıptı.

Aldı Qəmbər:

Tərəcəmiz dolu daş,
Bir yastığa qoyaq baş.
Bir nənədən olmadıq
Nec ollux bacı-qardaş?

***

Aldı Qəmbər:

Bu gecə çərşəmbədi,
Kövlüvə düşən nədi?
Od yanar tütün çıxmaz
Qazanda bişən nədi?

Aldı qız:

Yemə Qəmbərim, yemə,
Nənəmin əqli kəmə.
Ocaqda quzu büryan
Ağu qatıpdı yemə.

***

Qəmbər dedi:

Şah oğlu, şahımzada,
Gəlmişəm sənə dada.
Malım yoxdu alayım
Xan Arzım getdi yada.

Döndü şah dedi:

Durun, durun görəyin,
Aşıq halın sorayın.
Çağırın xəznədarı
Aşığa mal verəyin.

Aldı Qəmbər:

Aşıq malı neyliri?
Dünya darı neyliri?
Aşıq dada gəlibdi
Sənnən imdad diliri.

## XOYRATLAR, NİNNİLƏR (LAYLALAR), AĞILAR, TÜRKÜLƏR

Qara çadır xaraldan,
Boyun seçdim maraldan.
Nə dərdim var, nə bəlam
Sənsən məni saraldan.

Bülbül kişidi gəldi,
Dərdə tuşudu gəldi.
Bülbül gül havasına
Hələ qış idi gəldi.

Mindim Nuh gəmisinə,
Qorxum var gəmi sına.
Fələk biçkiçi salıb
Ömrümün zəmisinə.

Bağça barıyçün ağlar,
Heyva narıyçün ağlar.
Qarlı dağ günəşiyçün,
Könül yarıyçün ağlar.

Oxu cannan,
Aç kitab, oxu cannan.
Təbib, qurbanın olum
Çıxartma oxu cannan.

Yara neylim,
Sızıldar yara neylim?
Yol uzun, mənzil uzaq
Yetişməm yara neylim?

Arı canım,
Çalıbdı arı canım.
Hər yadıma gələndə
Gediri yarı canım.

Ağ sədələr,
Ağ sədəf, ağ sədələr.
Miskinin göz yaşları
Mərmərə axsa dələr.

Ara çimən,
Göy çimən, ara çimən.
Zülfü üzə vuranda.
Olaydım araçı mən.

Aşina fələk,
Didəm yaşına fələk.
Aqibət quş qondurdu
Qəbrim daşına fələk.

Ağladan oldum,
Ciyər dağladan oldum.
Əvvəl yara bağlardım
İndi bağladan oldum.

Axtaraq,
Güldən daraq axtaraq,
Yarın sürmə zülfündən
Bir tel qırıb ağ daraq.

Qaranı yaz,
Ağı yaz, qaranı yaz.
Əlin qələm tutanda
Mən bəxti qaranı yaz.

Al dodağı,
Öp, qoxla al dodağı.
Yar mənim qanım içib
Olubdu al dodağı.

Ağı sən,
Qaranı sən, ağı sən.
İncətdin qılca qoydun
Mənim kimi dağı sən.

Oxuyandı,
Yar kitab oxuyandı.
Ox atdı, məni vursun
Sinəmdə oxu yandı.

Oxu tər,
Kamanı tər, oxu tər.
Atma könlüm evinə
Qəm tünlükdür, ox itər.

Oxu yara,
Aç kitab, oxu yara.
Sinəmdə yer qalmadı
Məgər ox oxu yara.

O düyünlər,
O toylar, o düyünlər.
Biləydim bu günlər var
Çox ağlardım o günlər.

Oxu sınsın,
Aç sinən oxu sınsın.
Sən dayan gül ağaca
Gülə də qoxu sinsin.

O dinə mən,
Yanıram oduna mən.
Biləydim nə dindəsən
Dönəydim o dinə mən.

İnci tutar,
İnci birinci tutar.
Mənnən yar görüşəndə
Düşməni sancı tutar.

Başa çalar,
Uzun zülf başa çalar.
Yemə namərd çörəyin
Gün olu başa çalar.

Baş ağarda,
İl ildə baş ağarda.
Qorxuram bir ah çəkəm
Bel bükə, baş ağarda.

Bağ işlər,
Bağda bağban bağ işlər.
Boynum cəllad əlində
Nə kəsər, nə bağışlar.

Bağ saydım,
Bostan saydım, bağ saydım.
Öldükdən yüz il sonra
Bir göz açıb baxsaydım.

Bağ sərin,
Bağça sərin, bağ sərin.
Rəqibi dara asın
Dərisin yerə sərin.

Bala vay,
Bal yemədim bala vay.
Çöp yığdım, yuva yapdım
Uçurtmadım bala vay.

Bir büryan,
Kabab bağrım bir büryan.
Mənnən keçən günləri
Sal yadıva bir-bir yan.

Bir də mən,
Doldur içim bir də mən.
Gün keçdi, ömür keçdi
Gənc olmaram bir də mən.

Beş yerdən,
Hörük salıb beş yerdən.
Öpəydim, dişləyəydim
Beş min beş yüz beş yerdən.

Bir güldü,
İki bağban bir güldü.
Yar məni ağlar gördü
İki baxdı bir güldü.

Bitməyən yerə,
Əkib bitməyən yerə.
Ayaqlar necə varsın
Könül getməyən yerə?

Hamı davar,
Qoç olmaz hamı davar.
İyidə kirdar lazım
Yoxsa dil hamıda var.

Calasan,
Suyu yerə calasan.
Gedən gün geri dönməz
Günü-günə calasan.

Dərdə kərəm,
Dərdim çox, dərd əkərəm.
Qoşmuşam qəm cütünü
Sürdükcə qəm əkərəm.

Dərdə neyşə,
Düşmüşəm dərdə neyşə.
Çıxmışam qəm yoxuşu
Enmişəm dərd enişi.

Dəmdə gəl,
Qəmdə bülbül dəmdə gəl.
Şadlıqda hər kəs gələr
İyid isən qəmdə gəl.

Zaman qalar,
Gün gedər zaman qalar.
Yıxılar uca dağlar
Tozu bir zaman qalar.

Səksən düyün,
Sinəmdə səksən düyün.
Hüsnün meydana gəldi
Ay batdı, səksəndi gün.

Qəm dağıdır,
Gözəllər qəm dağıdır.
Enişim dərd dərəsi
Yoxuşum qəm dağıdır.

Qala yeri,
Yıxılsın qala yeri.
Qiyamət onda qopar
Dost gedə qala yeri.

Namaz dərdi,
Can davar namaz dərdi.
Aləmi dərd öldürər
Məni annamaz dərdi.

Vaya vaydan,
Kim görüm sayə vaydan.
Əkdim qəm, biçdim hicran
Vurdum yüz taya vaydan.

Yar dayandı,
Sinəmdə yar dayandı.
Könlümə atəş düşdü
İçində yar da yandı.

Ya sindən,
Min əlifdən ya sindən.
Dünya mənim deyənin
İndi gəldim yasından.

Yüz davar,
Çoban yedi yüz davar.
Ayaq var, öpülməli
Tüpürməli üz də var.

Altundu dişin sənin,
Xubdu yerişin sənin.
İçmədən sərxoş edər
Bir tək öpüşün sənin.

Oynadaram yatınca,
Bəklərəm ay batınca.
Qolum yastıq edərəm
Baban evə gəlincə.

Leylev edim yatınca,
Bələrəm ay batınca.
Gözümə şiş batırram
Sən hasilə yetincə.

Leylev dadı bal dadı,
Leylev məni aldadı.
Nə balda, nə şəkərdə
Heç tapmadım leylev dadı.

Gedirəm, yolum dağdı,
Gör nə bağçalı bağdı.
Mən sənə leylev edərəm
Nə qədə canım sağdı.

Öz nənəm,
Qarnı dolu göz nənəm.
El yığlar, qələt yığlar
Qoy yığlasın öz nənəm.

Qəhvə yükü fərdə mən,
Necə düşdüm dərdə mən.
Açılmamış gülüydüm
Necə yatım yerdə mən?

## O YANA DÖNDƏR MƏNİ

O yana döndər məni,
Bu yana döndər məni,
Sağ yanım yaralıdı
Sol yana döndər məni.
Ürəyimdə yara var
Təbibə göndər məni.

Çayır qısa biçilməz,
Su dərindi keçilməz.
Mənə derlər: Yardan keç!
Yar şirindi, keçilməz.

Məni gördü güldü yar,
Dərdlisiydim bildi yar.
Açdı qulac qolların
Göz yaşımı sildi yar.

Hər gözəldən yar olmaz,
Sevən bəxtiyar olmaz.
Yarı gözəl olanın
Könlü ixtiyar olmaz.

## OĞLAN, YAYLIĞIN HANI?

Halay təpmə, toz olar,
Mavi şalvar boz olar.
Əyil yaylığın qaldır
Mən qaldırsam söz olar.

Oğlan, yaylığın hanı?
Durmaz barmağım qanı.
Mənim sevdiyim sənsən
Sənin sevdiyin hanı?

Oğlan azar olasan,
Cannan bezar olasan.
Salta gey, ciftə bağla
Daha gözəl olasan.

Oğlan geyər saltanı,
Halay təpər yaltanı.
Boyum boyuna qurban
Gözəllərin soltanı.

## EVLƏRİNİN ÖNÜ YONCA

Evlərinin önü yonca,
Yonca qalxıb dam boyunca.
Boyu uzun, beli incə.
Ninnə, yavrum, ninnə,
Əsmər yavrum ninnə, ninnə, ninnə.

Evlərinin önü lalə,
Saqi doldur, ver piyalə.
Sərxoş olaq düşək yola
Ninnə, yavrum, ninnə, əsmər yarım, ninnə.

Evlərinin önü darçın,
Fələk qoymaz qəddim açım.
Səni alıb hara qaçım?
Ninnə, yavrum, ninnə, əsmər yarım, ninnə.

Evlərinin önü süsəm,
Sıyrılıb qoynuna düşəm.
Hər gün sabah boyun görsəm
Ninnə, yavrum, ninnə, əsmər yarım, ninnə.

# AXISQA (MƏSHƏTİ) TÜRKLƏRİNİN XALQ YARADICILIĞI

*Axısqa türkləri əsrlər boyu Cənub-Qərbi Qafqazla Anadolu arasında, indiki Gürcüstan ərazisində yaşayan, tarix boyu çox əzab-əziyyətlərə qatlaşmış, vətənlərindən didərgin salınmış faciəli taleli bir xalqdır. Onları "məshəti türkləri", "türk mesxetlər", "Adıgün türkləri", "Çıldır türkləri" də adlandırırlar. Axısqa mahalı Çıldır yörəsindən Mesxet-Cavaxet dağ silsiləsi boyunca Borçalıya qədər uzanır, qərbdə Acarıstanla həmsərhəddir.*

*Axısqa türklərinin mənəvi, mədəni həyatlarını, məişətlərini araşdırmış, folklor və ədəbi örnəklərini toplamış və nəşr etmiş Asif Hacılı qeyd edir ki, "Axısqa türkləri Türkiyə və Azərbaycan türkləri arasında keçid mövqeyində duran özünəməxsus etnoqrafik qrupdur... Şərti olaraq desək, əgər Borçalının qarapapaq elatı tarix meydanına osmanlılığa meylli azəri türkləri kimi çıxmışlarsa, Axısqa eli - azərbaycanlılığa meylli osmanlı türkləri hesab oluna bilər".*

*Axısqa türklərinin Ömər Faiq Nemanzadə, Əhməd bəy Pepinov kimi övladları Azərbaycan mədəniyyətinin, mətbuatının, ədəbiyyatının inkişafında böyük xidmətlər göstərmiş, Azərbaycanın və Gürcüstanın ictimai siyasi həyatında önəmli rol oynamışlar.*

*Axısqa türkləri 1944-cü ildə bir çox başqa müsəlman xalqları, o cümlədən Krım, Qaraçay, Balkar türkləri, Göyçə, Zəngəzur, Ağbaba, Borçalıda yaşayan azərilər kimi dədə-baba yurdlarından uzaqlara, Orta Asiyaya, Qazaxıstana və başqa yerlərə sürgün edildilər. Bu da azmış kimi, Axısqa türklərinin millətini, adını, türklüyünü belə inkar etməyə, yaddaşlarından silməyə çalışdılar.*

*1989-cu ildə Özbəkistanda, Fərqanə vadisində Axısqa türklərinə qarşı törədilmiş cinayət və zorakılıq bu xalqın yeni faciəsi oldu. Axısqa türklərinin böyük qismi Azərbaycana pənah gətirdi, Gəncə, Muğan, Quba, Şamaxı bölgələrində məskunlaşdı. Bu xalqın bir qisminə Gürcüstandakı doğma yurdlarına qayıtmaq müyəssər oldu.*

*Antologiyamızın "Axısqa (Məshəti) türklərinin Xalq yaradıcılığı" bölməsində, habelə "Çağdaş Axısqa türk şairləri" bölməsində verdiyimiz örnəklərdə əbədi motivlərlə bərabər, bu xalqın başına gətirilən müsibətlər, onun acı taleyi ilə bağlı mövzular da mühüm yer tutur.*

## DUALAR

Salxum-salxum Şəhəmməd,
Bir sevdiyim Məhəmməd,
Yazı yazar əlləri,
Quran oxur dilləri.
Xasbaxçanın gülləri,
Ötüşür bülbülləri,
Cənnətdə bir qapı var,
Üstündə xəncər sapı var,
Cənnətdə bir quyu var,
İçində zəmzəm suyu var.
Onu içər dərvişlər.
Allah-Allah demişlər.
Allah dedim oyandım,
Süfrələrə boyandım.
Əlif-Turan başıdır,
Cümləmizin işidir,
Kim bu duanı oxusa
Yarın cənnət quşudur.

***

Allahım mayatut,
Ağzın bağla, dilin tut.
Ağzın keçə, dilin keçə,
Mənim sözüm sənə keçə,
Sənin sözün yerə keçə.

## TÜRKÜLƏR

Mən bir türkəm, adım-sanım uludur,
Mənim içim həsrətinən doludur,
Mənim yolum zəhmətlərin yoludur.
　　Ey insanlar eyiliklərə alışın,
　　Hər bir işə ümidinən çalışın,
　　Ümid yaşadır bizi, coşdurur qəlbimizi.

Mən bir türkəm, sülh-dostluq araram,
Sevdiyimin boynuna qol sararam,
Mən ki varam, el günümə yararam.

Mən bir türkəm, əkib-biçən əlim var,
Qüvvətim var, adətim var, dilim var,
Haqq yolunda həp çalışan elim var.

***

Gedə-gedə getməz oldu dizlərim,
Ağlamaqdan görməz oldu gözlərim,
Yabançıyam, keçməz oldu sözlərim,
Məni şad et, şad et vətənim üçün.

Biz quş idik uçarıdıx havada,
Ovçu vurdu, düşürtdülər yuvadan.
Nə vaxt qurtulacağıq bu bəladən?
Məni şad et, şad et vətənim üçün.

Zalım fələk həsrət qoydu Vətənə,
Çox əlləşdim, yetəmədim mətləbə.
Bu dərdimi mən söyləyim kimlərə?
Məni şad et, şad et vətənim üçün.

***

Qaralar geymisən, qaradır qaşın,
Qüdrətdən çəkilmiş, yasdadır başın,
Bilməm baban ölmüş, yoxsa qardaşın,
Ahu gözlüm, nə dönərsən məzarı?

Ana yox ki, yaxa yırta, yaş tökə,
Bacı yox ki, dal gərdənə saç tökə,
Qardaş yox ki, məzarına daş tikə
Bir çaladır məzar daşı qəribin.

Qaralar geymişəm, qaradır qaşım,
Qüdrətdən çəkilib,yasdadır başım,
Nə babam ölmüşdür, nə də qardaşım,
Yar eşqinə dolanıram məzarı.

Çayır-çəmən dörd yanını bürümüş,
Sam yel vurmuş, yarpağını qurutmuş,
Yeddi il ölmüşsə, yeni çürümüş
Ahu gözlüm, nə dönərsən məzarı.

## TÜRK MARŞI

Arş irəli, marş irəli,
Arş irəli, süngün irəli,
Osmanlının türk əsgəri,
Alanq düşməndən əski yerləri!

Buyurdunuz, əmriz ilə silahıma sanldım.
Mən köyümdən firounu vurmax üçün ayrıldım,
Silah mənim namusumdur, çəlikdəndir biləyim,
Kəndim doğru, qəlbim pakdır, poladdandır ürəyim.

Müsəlmanam, dinim haqdır, kitabımız bir Quran,
Peyğəmbərim Məhəmmədər, padişahım, min yaşa.
Gözəl Allah, türk oğlunu dünya şahı yaratdın,
Təslim etdin bu sancağı, ay-ulduzu bağlatdın.

Anam məni yetişdirdi, bu yerlərə yolladı,
Təslim etdi bu sancağı, Allaha ismarladı,
Boş oturma, çalış dedi, xidmət eylə vətənə,
Südüm sənə halal olmaz saldırmasan düşmənə.

Osmanlıyıq, həp qardaşlar, vətən bizim yurdumuz,
Can verməkdir, çalışmaqdır vətən üçün borcumuz.

## ZEYNƏBİM

Zeynəbim, Zeynəbim, şallı Zeynəbim,
Üç göylər içində varmı Zeynəbim?
Bir köynək içində öldü Zeynəbim,
Çiçəklər içində soldu Zeynəbim!
Zeynəbə yapdırdım altundan sini
Üstünə yazdırdım Zeynəbi-ismi
Zeynəbə yapdırdım altundan qaşıq
Üstünə yazdırdım Zeynəbə aşiq.

## MANİLƏR

Çəpərlər, ay çəpərlər,
Yıxılanda yaparlar.
İçəridən yaniyerim
Dişardan su səpərlər.

Mən öldüm ağlamaqdan,
Qəlbimi dağlamaqdan.
Bağda yarpaq qalmadı
Yarama bağlamaqdan.

Məni, məni mət məni,
Üşümüşəm, ört məni.
Yorğanda üşümüşəm,
Qoynunda isit məni.

Göydə ulduz əllidir,
Əllisi də bəllidir.
Mən yarımı tanıram,
Gəzişindən bəllidir.

Qala qalaya qarşı,
Qalanın önü çarşı.
Açılmamış gül olam,
Açılam yara qarşı.

Ay çıxar bədir, Allah,
Bu nə sevdadır, Allah?
Ya mənə - sevdiyimi,
Ya mənə - səbir Allah!

Ay çıxar bədir, Allah
Bu nə sevdadır, Allah?
Sevdanı sən yaratdın
Dərmanı nədir Allah?

Uzun boylu laz oğlan,
Gəl odamı gəz oğlan.
Mən dərdimi söyləyim
Sən dəftərə yaz oğlan.

Bu yazı deyil,
Gönlüm tərəzi deyil.
Yıxılsın Muğan çölü,
Heç könlüm razı deyil.

Gəmi gəlir aralı,
İçi dolu yaralı.
Elə bir yar sevmişəm
Abbastuman maralı.

Su gəlir lülə-lülə,
Yar gəlir gülə-gülə.
Əlində ipək məndil
Tərini silə-silə.

Bu dərənin uzunu,
Qıramadım buzunu.
Aldım Azqur qızını
Çəkəmədim nazını.

Dağıstan dağ yeridir,
Gürcüstan bağ yeridir.
Adıgünün qızları
Xurmanın bol yeridir.

Xəlbirim dalda qaldı,
Gözüm yollarda qaldı.
Andır qalsın Axısqayı
Nişanlım orda qaldı.

Qəribəm bu vətəndə,
Qərib quşlar ötəndə.
Gönlüm göyərçin oldu
Durmayır yad vətəndə.

Əzrayıl, azma dedim,
Bacamda gəzmə dedim.
Mən cavan, yarım cavan
Dəftərə yazma, dedim.

Atım qaşqa qabaqdı,
Yüküm təknə tabaxdı.
Xoruz, dilin çürüsün,
Niyə dedin: - sabahdı!

Bir quş çıxdı dəryadan,
Xəbər aldı dünyadan.
Dedi: "Ölüm var imiş,
Niyə doğduq anadan?"

## BEYTAL QASIM
(? — ?)

### GÖRÜNSÜN

Başı yüksək, köşkü dumanlı dağlar,
Alçaq durun, o cananım görünsün.
Ürəyim dolubdur, çeşmim qan ağlar,
Bir yan durun, o cananım görünsün.

Bir fələk mənimlə eylədi dava,
Çəkilsin buludlar, açılsın hava.
Of, çeşməli dağlar, səndə nələr var?
Əyyam olsun, o cananım görünsün.

Fələk mənə bu vaxtımda sataşdı,
Mənim ahım asimana yetişdi.
Beytal Qasım zülmət dağını aşdı,
Dövran dönsün, axır-zaman görünsün.

## XASTA HASAN
(XIX əsrin sonu — XX əsrin əvvəli)

### PƏRİŞAN

Çıxdım bu dağları seyran eylədim,
Gördüm yar gəzdiyi yerlər pərişan.
Durdum, öz-özümə fikir eylədim,
Bir mən deyiləm də, aləm pərişan.

Ahü-zar çəkərəm, Bursalı dağlar
Yarından ayrılan of çəkər ağlar.
Saralmış tənəklər, virandı bağlar
Bülbülün qonduğu dallar pərişan.

Xasta Hasan der: öldüyümü duysalar,
Yığılsalar, bir araya gəlsələr,
Məzarımı yol üstündə qursalar,
Bəlkə-bəlkə yolu düşə qızların.

## MOLLA MƏHƏMMƏD SƏFİLİ
(1870 — 1937)

### CAMECAN

Xerolilər Osmannıya qaçarlar,
Ermənilər sədirliyə keçərlər,
Cami havlusunda şərab içərlər
Nə gündən günlərə qaldın, Camecan.

Ermənilər gəlir burda dururlar,
İstəkanı bir-birinə vururlar.
Əzanın yerinə zəngi vururlar
Oxunmaz əzanlar, qaldın, Camecan.

Ermənilər kəndi dinin taparlar,
İstəkanı bir-birindən qaparlar,
Mehrabın yerinə bir xaç taxarlar
Nə gündən günlərə qaldın, Camecan.

Fərağımdan mənim başım ağarır,
Pozulur mehrabım, came dağılır.
Keşiş gəlib "bico-bico" bağırır
Nə gündən günlərə qaldın, Camecan.

Səfili bekar gəlib burda gəzməsin,
Ermənilər cameləri pozmasın,
Allah sənin işin hillə bəzəsin
Xeyir olur sənin işin, Camecan.

# TAXTAÇI TÜRKMƏNLƏRİN FOLKLORUNDAN

*Taxtaçı türkmənlər "Ağac əri" türkmənlərinin nəslindəndir. Taxta işləriylə məşğul olduqları üçün belə adlanırlar. Taxtaçılar Oğuz türklərindəndir. Alp Arslandan əvvəl Anadoluya gəlmiş və burada məskunlaşmışlar. Daha əvvəllər yaşadıqları yerlər Türküstan, Xorasan və Azərbaycandır. Taxtaçılar indi də özlərinə türkmən deyirlər. Onların xalq yaradıcılığı başqa oğuz xalqlarının ənənəvi şer biçimlərindədir. Antologiyamızda Taxtaçı türkmənlərin folklorundan bəzi örnəklər veririk.*

Sabahınan qalxdım düşdüm izinə,
Qanları da donmuş daşın üzünə.
Zalım ərəb nasıl qıydın quzuma?
Ah edər ağlaram, duymadınızmı?

Dayısı yatdığı yerdən bağırır,
Ufaq quzuları Mevla kayırır.
Ədəm, ədəm deyə Fatmam çağırır
Ah edər ağlaram, duymadınızmı?
Hallarım pərişan, bilmədinizmi?

Bir bölücək duman çökdü qarşımda,
Yetiş pirim, yetiş bun var başımda.
Böyükləri Hasan yeddi yaşında
Ah edər ağlaram, duymadınızmı?
Hallarım pərişan, bilmədinizmi?

Tikildi ağrı da, yanıyor ürək,
Pək əcələ etdin, ey qəhbə fələk.
Alacaqsan bəklə yavrular ufaq
Ah edər ağlaram, duymadınızmı?
Hallarım pərişan, bilmədinizmi?

***

Gedəyim dedim də üzümə baxdı,
Ala gözlərindən çay kimi axdı.
Zalım ayrılıq da ciyərim yaxdı
Gedəyim yavrular, əyləmin məni.

Qazancınız bol eyləsin yaradan,
Qurtarsın bizi də dərddən, bəladan.
Pərişan oldum da qaldım aradan
Gedəyim yavrular, əyləmin məni.

Gedəyim dedim də mən gedəmədim,
Pərişan könlümü əyləyəmədim.
Usandım canımdan qurtulamadım
Gedəyim yavrular, əyləmin məni.

***

Bu fani dünyaya gəldim gələli
Heç bir zaman üzüm gülmədi, fələk.
Üç yaşımda yetim qaldım anamdam
Analıq əlinə düşürdün, fələk.

Analığım məni pək çox sövərdi,
Hər sövdiyi gündə üç yol dəyərdi.
Babam onu qarım deyə öyərdi
Bütün çilələrə qatlandım, fələk.

Aradan keçmədi analıq öldü,
Qərib babacığım yenə dul qaldı.
Fələyin zərbəsi başımı dəldi
Bu böyük zərbənə qatlandım, fələk.

Əkini çiynəməz gedərdim ana,
Kül oldu ciyərim ah, yana-yana.
Aldın anam, babam, nə verdin mənə?
Alacağın varmı, bitirdin, fələk.

Söylər Aşıq Dilər bu mən nedərəm?
Məni bu yollara saldı qədərim.
Nəşəsiz dünyanı ya mən nedərəm?
Nəşəsiz dünyaya gətirdin, fələk.

# STAVROPOL TÜRKMƏNLƏRİNİN XALQ YARADICILIĞINDAN ÖRNƏKLƏR

Can sakar at, mal sakar at,
Dağ aşanda bəllənirsən.
Qaranlıqda alqır vursam,
Sapa tutub sallanırsan.

Qayçı qulaq, nazik belin
Söhbətisən bizim elin.
Göy meydanlı uzun elin
Otun otlar yallanırsan.

Nədir oğlu xətt ibərdi
Səni almaqdadır dərdi.
Min tümən bahanı verdi
Onu eşitsən hallanırsan.

Berdi oğlu Berdi at bilən,
Üstün yapar hər zat bilən.
Beli yoğun güclü at bilən
Duşun alsa yellənirsən.

## GÖRÜNDÜ

Siyahdan qara gözləri,
Şirindən dadlı sözləri,
Altundan açıq üzləri,
Bir əcaib can göründü.

Sağ qolunda altun üzük,
Sol qolunda var bilərzik.
Boyu uzun, beli nazik
Bir əcaib hal göründü.

Qara saçı altı hörümlü,
Şunqar layın tək görümlü,

Bağında misli almalı,
Bir əcaib yar göründü.

Mahi-taban türkmən qızı
Min gəlinə dəyər nazı.
Sazlanıb aşıq avazı
Bir əcaib gül göründü.

Altun-gümüşdən naxışı,
Üzü nurlu, əyri qaşı.
Yaş igiddir on yoldaşı
Bir əcaib can göründü.

## XƏBƏR VER

Toylar olsa barı gələn,
Saz ilən söhbətlər quran,
Kiçiyin, ulusun bilən,
Ulularımdan xəbər ver.

Düzə getsəm, izim qaran,
Evə getsəm, halım soran,
Mənim üçün ağlar qalan,
Qız doğanımdan xəbər ver.

Ağlar göz yaşını tökən,
Ayrılıq bağrını yaxan.
Mənim üçün cəfa çəkən
Canım əcəmdən xəbər ver.

Qara günlər dağnıq salan,
Bir-birinin halın soran,
Belə oynub, belə gülən,
Dəni duşumdan xəbər ver.

Düşmənə qarşı duranam,
Sirrim verib sirr alanam,
Saz ilən söhbət quranam,
Doğan dayımdan xəbər ver.

## ŞAİR QURBANLA DAĞIN DEYİŞMƏSİ

Şair Qurban:

Burma otlar qara dağlar
Mən sizdən xəbər alayın.
Qalmadı dizimdə hallar
İndi mən hara varayın?

D a ğ :

Mənim adım dağlı Vulum
Çəkəm olar ulu elim.
Nə səbəbdən çəkdin zulum?
Bilmən mən hara varırsan.

Ş a i r  Q u r b a n :

Közərdi qəribin dərdi
Gözüm kop yamanlıq gördü.
Elimizə aclıq girdi
Doğru xəbər verin mənə.

D a ğ :

Ovnik dağlardan ötənsən,
Zat görmən bunda yetənsən,
Bir etsən iki yatarsan,
Bilmən mən hara varırsan.

Ş a i r  Q u r b a n :

Nəzir üstünə çıxar mən,
Şahmar ilan tək çaxar mən,
Qazan asıb od yaxar mən,
Bu saat üstündə, dağlar.

D a ğ :

Neçin gəldin başdan-başa?
Vulum dağlarında aşa.
Görnüşün bənzər bir yaşa
Bilmən mən hara varırsan.

# QAŞQAY TÜRKLƏRİNİN XALQ YARADICILIĞI

*Qaşqay türkləri İranın cənubunda, Fars vilayətində məskunlaşmışlar. Yay-da-qışda İsfahan, Şiraz və Sava dolaylarında köçəri həyat tərziylə yaşayırlar. Azəri türkcəsinin dialekti adlana biləcək bir dildə danışırlar. Rus şərqşünası A. A. Romaskeviç 1914-cü ildə qaşqaylardan topladığı və nəşr etdirdiyi "Pesni kaşkaev" adlı kitabda onların xalq yaradıcılığından orijinalda və rus dilinə tərcümədə örnəklər verir. Bura həm anonim müəlliflərin, həm Allahyar, Məhzun, Nemətulla, Fağır kimi el şairlərinin, həm də başqa oğuz xalqları kimi Qaşqay türkləri arasında geniş yayılmış "Aşıq Qərib", "Əsli-Kərəm" kimi dastanlardan şer parçaları daxildir. Qaşqay türklərinin şifahi ədəbiyyat nümunələrindən bəzilərini antologiyamıza daxil edirik.*

Ay adındır, işıqdur,
Ləyən dolu qaşuqdur.
Qız, qaş-gözün oynatma
Oğlan sənə aşıqdur.

Qarşıda mən olaydım,
Vurulu dam olaydım.
Qız nənəsinən[1] yatmışdur
Mən soyuqdan öləydim.

Aya bax, ulduza bax
Gəlinə bax, qıza bax.
Bir əlində şor kabab
Bir əlində duza bax.

Ay aydındur, ay batmaz,
Yetlabı[2] sağdır, yatmaz.
Nənəsin şahmar vursun
Qızınnan ayrı yatmaz.

---

[1] Nənə — ana
[2] Yetlab — it

## GÖRÜNDÜ

Ay ağalar, bu qürbətdə
Dünya mənə dar göründü.
Çıxdım Maləsqan dağına
Köksündə Hezab göründü.

Bərqarardır xani şahım,
Ərşə yetməz mənim ahım.
Zəkka burnu mənzilgahım
Şahraq bərabər göründü.

Yarımın cəbri cəfası
Xub olub zövqü səfası.
Səfalı Daşdağ havası
Köysündə hasar göründü.

Musam, ömrün oldu baqi,
Budur sərhəddin torpağı.
Şikarlı Mirvari dağı
Vətən Bəhmənzar göründü.

***

Bahar oldu yengi ellər köçməyə
Quşlar səslənir bir-birinə qoşmağa.
O Məhzun şuri-eşqdən düşməyə
Yaz oldu bağçalar doldu reyhannan.

Ağ alma, qızıl alma
Yollara düzül alma!
Ya ver mənim muradım
Ya mənnən üzül alma.

Ah, alma dişlədim,
Dişlədim, gümüşlədim.
Qardaş gəldi vermədim
Yar gəldi bağışladım.

Göydə ulduz peydadur,
Sərim yara fədadur.
Qorxma, ürəksiz oğlan
Mətləb verən xudadur.

***

Cənnətin laləsi, huri qılmanın
Məddahisi ləbü ləli mərcanın
Hindistan tovuzu, Xutan ceyranı,
Tər eyləyib məməsi — buyi-hil qalıb.

Cənnətin laləsi, firdovsun güli
Çin Maçin mixəyi, urusun hili[1]
Sərində sayəban tovuzun teli
Ya açılıb cənnət dari-hil qalıb.

***

Hey ağalar, gəlin tərif eyləyim
Səbzanə xalların nazınan qalıb.
Bir xalın əlifdir, bir xalın lamdır
Bir xalın dəfdərə yazılan qalıb.

Bir xalın yaxşıdır, bir xalın yaman
Bir xalın salıbdır könlümə güman.
Bir xalın gəştiyi-dəryayi-tufan
Bir xalın seylabdur — durdunan qalıb.

Bir xalın bibidir — buyur kənizə
Bir xalın sürmədir — çəkilir gözə.
Bir xalın fitnədir — naz elər bizə
Bir xalın vəsmədir — nazınan qalır.

Bir xalın atlıdır — çapar elləri
Bir xalın seyradur — vurur yolları.
Bir xalın xəzandır — pozar gülləri
Bir xalın bahardur — yazınan qalır.

Bir xalın dükandur — açar kaysarı
Bir xalın nuş edib abi-kövsəri.
Bir xalın sariban — çəkər ofsarı
Bir xalın aspayın — narınan qalır.

***

Qarşıda durubdur xurşidi-xavər
Sinəsinda vardur bir cift sənubər.
Arası meydandır dəyməz bir-birə
Baxar bir-birinə yar məmələri.

Heç kimə şikayət etmə qışdan
Zimistandır, gərək hamı lök qıza.
Qoy da yağış yağa düzə, dağlara
Rəftə-rəftə səfa düşə bağlara.
Bülbül ötə, həsrət qala zağlara
Tovuzlar məst ola bələnə qaza.

---

[1] Hil — hil-mixək mənasında

Hər yana baxayım hamı gül ola
Su axa dağlardan, göl-bəgöl ola.
Məşuqin obası gül-bəgül ola
İşarə eyləyək gəlinə, qıza.

Dağlar, gəlin sizi tərif eyləyim
Başı boran, buz, dumanlı, qarlı dağ!

Bağların yaylağı kərməsər bağı
Duzağa tutulub bağların quşu.
Min topa verməbəm bir zərrə daşı
Poladdan qayrılıb qalalı dağlar!

Onun şikarını mən vura idim,
Qismət ola öz yarımı görəydim.
Babasının qulluğunda duraydım
Bulhaplı, qumaşlı, səfalı dağlar!

***

Q ı z:

Suyumu verməbəm yada
Səni kimi çox dünyada.
Əslin kürddür, haramzada
Su iç, qalma yollarından.

O ğ l a n:

Çobanam, qoyna gedərəm,
Yarım var, yarı nedərəm?
Qız, sənnən hara gedərəm?
Su ver, içim əllərindən.

Q ı z:................

O ğ l a n:

Onda ki, özün öyərdin,
Tunca dəmirlər döyərdin,
Qaraca oğlanı söyərdin,
Onda bildim hallarını.

Q ı z:

İndi ki bildin halımı
Bir xəlvətdə pus yolumu.
Əm məməmi, quc belimi
Hər nə gəlir əllərindən.

***

Ürəyimdə neçə dərdlər var idi
Saxlada bilmədim pünhana qızlar!
Bu dünya vəsi də mənə dar idi
Şayəd doldura peymanə qızlar!

Zərdi zəif etdin məni, dərbədər,
Tir müjganları dəydi, yarədür cigər,
Neçə nüsxə təbib yazdı mükərrər,
Sizdə var dərdimin dərmanı, qızlar!

Ya məni qurtarın möhnəti qəmnən,
Ya bir əyri baxın, can çıxar tənnən.
Sidqinən satıram, alınuz mənnən
Bir yarım busəsi — imanım, qızlar!

Hər vaxt xoş gün yada gətirrəm,
Haq da bilir ağlı-huşu itirrəm,
Bilsəydim ki haçan yara yetirrəm.
Olardım o günün qurbanı, qızlar!

***

Su gəlir lülə-lülə
Yar gəlir gülə-gülə.
Alnında mavi yaylıq
Tərini silə-silə.

Dam üstündə damxana
İçində mehmanxana.
Kətan köynək içində
Ağ məmələr yayxana!

Qara atın qulunu,
Məxmər edin çulunu.
Biz gəlmişik aparaq
Sizin bağın gülünü.

Bu kəklik, xəstə kəklik,
Quyruğu dəstə kəklik.
Öldürəm, kabab edəm
Yollayım dosta kəklik.

***

Ay ağalar, gəlin vəsfin verəyüm
Sərinə mən dönəm imam Rızanın.
Xəlayiqlər çahar guşəndən baxar

İlahidən gümbəzinə nur yağar.
Gunahla gələnlər günahsız çıxar
Həmişə dövründən[1] imam Rızanın.

Şamları alışıb çıl-çırağına,
Şöləsi düşübdür Məşhəd dağına.
Qəndillər asılıb solu-sağına
Həmişə içində imam Rızanın.

Yeddi ağacdan gəlir imamın suyu,
Gülabdan xoşbudur o suyun buyu.
Cənnət olsun şah Abbasın ruhu
Zinətini verdi imam Rızanın.

İmamlar üstünnən qalxan buludlar,
Qəribəm, vətənə tez yolla məni.
Kərbəladan gələn saçlı seyyidlər
Qəribəm, vətənə tez yolla məni.

Məhəmməd Mustafa onlara sərvər,
Sədi bistü çahar həzrət peyğəmbər.
Əliyi-Murtuza imami-rəhbər
Qəribəm, vətənə tez yolla məni.

Yetim, çəkmə ahı, çağır Allahı,
Qəriblikdə qalan çəkər bu ahı.
Sərinə mən dönəm, Xorasan şahı
Qəribəm, vətənə tez yolla məni.

Bəlkə məni yetirəydin elimə,
Əlinin eşqini salan dilimə.
Əli Zülfüqarı alam əlimə
Qəribəm, vətənə tez yolla məni.

***

Bu dünyada evinə gələndən bəri
Fələk ayırmadı möhnətxanadan.
Özümü tanıyan, biləndən bəri
Ayırdı atadan, üzdü nənədən.

Ceyranum, kim qəfil atdı tir sənə?
Hənuz çox tez idi mərgimir sənə.
Köhnə ləhəd layiq degildi sənə
Dur, yürü qoynuma zindanxanadan!

Gəl, ey məni gözü yaşlı qoyan yar,
İşrətimdən, söhbətimdən doyan yar.

[1] Dövründən — burada "dövrəsindən".

Nə yatmısan? Xabi — nazdan oyan yar
Dur, gileylik edək şum zəmanədən.

Taxta tabut sənin taxtın degildi,
Şum baxtına kəfən rəxtin degildi,
Hənuz ayrılmağın vaxtı degildi
Dur, yürü qoynuma zindanxanadan!

Sən bülbülü, məskən etdin bağa gül,
Miskin Allahyarı etdin nasəbur.
Saqiyə kövsərdən şəraban tahur
Versinlər əlinə o meyxanadan.

***

Əziz, gecələri ayrılıb getmə
Sabah kimlər olar qurbanın sənin?
Qurban ki deyəllər, ildə bir olur
Həmişə mən idim qurbanın sənin.

Bir dəm əylən getmə, sən bilən Tarı
Bu fani dünyanın yox etibarı.
Yusifü Xosrovun bivəfa yarı
Həmişə mən idim qurbanın sənin.

***

Sərinə mən idim vəfalı qasid
Qasid, ərzi-halım yara deyərə[1].
Gözəl sənin ilən qoyduğum iqrar
Kəlamallah bilib durub bərqərar.
Gecə-gündüz fikrim-zikrim sənnən yar,
Daha yox xəyalım yara deyərə.

Dilbər, halım soruşmağa ar etmə,
Gen dünyanı başımıza dar etmə,
Daha bundan artıq bağrum qan etmə
Qoyma həsrət öləm — yara deyərə.

Heç təbib etmədi dərdimə dərman,
Gecə-gündüz elə dedim yara, can,
Od götürdü bağrım — yara deyərə.

***

Gəl, ey saqi, doldur cami-məstanə
Gedər mey içənlər, meyxanə qalur.
Keçər bu dünyanın yaxşı-yamanı
Qalsa, bir yaxşılıq ehsana qalur.

Bülbüllər qurudur bica bağa gül,
Qıymaz gülə qona binəva bülbül.
Bu gülşəndə nə gül qalıb, nə bülbül
Belə bir yamanlıq bağbana qalur.

Hər namərdə sən vurmayan üzünü,
Xiridar görməsən, açma sözünü.
Dəli, davalıya vermə qızını
Ölüb itər, dava divana qalur.

Dünyanı vermənəm dövrəsi pəncə
Kim yeyə dövləti, kim çəkə rənci.
Dövlətli dövlətin çəkiyib rəncin
Məhzunnan şirin söz nişana qalur.

***

Məmələr, məmələr, xırda məmələr,
Dərdindən uğradım yurda, məmələr!
Birinə qənd desəm, birinə nabat
Baldan şirin şəkər olur məmələr.

Camalın gün kimi doğar İrana,
Alnın aydur, gözün bənzər ceyrana.
Ürküşüb yerinnən çıxar seylana
Çak verib kətanı dələr məmələr.

Yarın qarşısında bir məskən quraq,
Qulluğun eyləyək, qarşıda duraq,
Yarın sinəsinə bir cift şəbçıraq
Bəndə kövhər başı bulur məmələr.

Mən səni sevmişəm, daha bəsimdir,
Zəliləm, zəifəm, daha nəsimdir,
Atəşi-hicranın daha bəsimdir
Fağır deyər: öz yarımın qurbanı.

***

Başı parə-parə, buz, dumanlı dağlar!
Təpənə qonan ellər nec/oldu?
Əslim köç eyləti, biz də dalıyca
Əslim gedən uzaq yollar nec/oldu?

Əsli xanım, gəl də söyləyim sənə
Atan, nənən sitəm eylədi mənə.
Bir namə yazayım gedə vətənə
Görəm mənim xanımanum nec/oldu?

Göy üzünü top-top bulud tutubdur,
Ah, sinəndə qoşa narlar bitibdir.
Bu il on bir ildir Kərəm itibdir
Heç demədin: öldü, qaldı, nec/oldu?

***

Bir yaşılbaş sona dilbər
Uçdu bizim gölə düşdü.
Orda sən ağla, burda mən
Bizimki də belə düşdü.

Bad əsdi dəydi telinə
Hər telin bir yana düşdü.
İlahidən gələn qismət
Bizimki də belə düşdü.

Yeri, ey dilbər, sən yanan
Məgər dolubdur peymanən?
Gəldi, gördü bizi nənən
O da güldü, yola düşdü.

Bu bağ Süleyman bağıdur,
Bad əsib telin dağıdur,
Yarın görməli çağıdur
Əcəb fırsət ələ düşdü.

Rəqibin yurda qonmağı,
Oların da inanmağı,
Kərəmnən Əsli yanmağı,
Getdi eldən - elə düşdü.

***

Bir qaşı gözü qaranın
Dad əlindən, dad əlindən!
Bir zülfü əzab verənin
Dad əlindən, dad əlindən!

Bizim ilən baxışlının,
Alı-əlvan naxışlının,
Gözəl kəklik səkişlinin
Dad əlindən, dad əlindən!

Kərəm deyər barın aldım,
Heyvasını, narın aldım,
Dilinnən iqrarın aldım
Əsli xanın dad əlindən!

***

Lələ canım, doğru xəbər ver görüm
Söylə görüm, neçün Kərəm gəlmədi?
Əsli xanım, gəl də xəbər verəyim:
Kərəm sevdi sənnən yeytab, gəlmədi.

Kərəm bir Kərəmdir, kərəmi çoxdur
Qaşları kamandır, kipriyi oxdur.
Nə toydur ki, əlin hənası yoxdur?
Söylə görüm, neçün Kərəm gəlmədi?

Əlin ver də gedək elə, ulusa
Mən Məhəmməd dinində, sən də "ya İsa!"
Ağ üzünnən ver lələyə bir busə
Gəl, busəni mən alım, Kərəm almadı.

Gəl də gedək sənin elinə,
Sağ varmayan ulusuna, elinə,
Əli Zülfüqarı dəysin belinə
Nədən qıydın dedin: Kərəm gəlmədi?

***

Ağa çoban, mirzə çoban, xan çoban,
Söylə görüm, neçin qara geymisən?
Geyginən alı sən, çıx da qaradan
Şum rəqibi götürsünlər aradan.
Nec oldu Tağır getdi buradan?
Soylə görüm, neçin qara geymisən?

Kosa molla bu işləri qayırdı,
İki dostu biri-birdən ayırdı.
Xatəm Soltan ona sürgün buyurdu
Onun üçün mən də qara geymişəm.

Dağların başını tutub dumanı,
Şikəstə könlümə saldın gümanı.
Mən Novruzam — Zöhrə xanım çobanı
O qara geymişdir, mən də geymişəm.

***

Çəkəydim yarın nazını
Çəkəm nazınan, nazınan.
Öpəydim gözü qaşından
Öpəm nazınan, nazınan.
Məməsin alım ağzıma
Əməm nazınan, nazınan.

Cavan belini bükəydim,
Qanlı yaş gözdən tökəydim,
Köynək pərdəsin sökəydim,
Sökəm nazınan, nazınan.

Vurubam dağınan aşam,
Gəlibəm yurduna düşəm.
Ala gözinən barışam
Bulam nazınan, nazınan.

Sazımın cildi "bulqarı"
Ciyərbəndim qabar-qabar.
Zöhra xanım, verin xəbər
Gəldim nazınan, nazınan.

***

Ay ağalar, Şamın Hələb şəhrində
Misrin şərabını içdim də gəldim.
Üç aylıq yolları üç gündə gəldim.

Xudam verdi mənə qeyb atını,
Sıçradım, qaynadım, coşdum da gəldim.
Əlim verdim həzrət Əli əlinə,
Sıçradım minibən Düldül belinə,
Gözüm düşdü əcəmlərin gölünə
Əcəm göllərini keçdim də gəldim.

Şam Hələbdə şamı verdilər bizə,
Gün çalanda gəldik qar salan düzə.
Axşam namazını Sultan Tiflisə
Dərdli yaralarım deşdim də gəldim.

Axşam idi mən də gəldim xanəmə
Sirrimi demədim bacı, nənəmə.
Eşqin xəncərini vurdum sinəmə
Bu canı-başımnan keçdim də gəldim.

# AZƏRBAYCAN XALQ ŞERİ ÖRNƏKLƏRİ

## LAYLALAR VƏ OXŞAMALAR

Lay-lay dedim yatasan,
Qızıl gülə batasan.
Qızıl gülün içində
Şirin yuxu tapasan.

Lay-lay dedim ucadan,
Səsim çıxmaz bacadan.
Tanrı səni saxlasın
Çiçəkdən, qızılçadan.

Bir səs gəlir ellərdən,
Şirin-şirin dillərdən.
Allah səni saxlasın
Gələn ağır illərdən.

Yol üstə bulaq ollam,
Axaram, bulaq ollam.
Sən mənim bir dənəmsən
Özüm göz-qulaq ollam.

Lay-lay beşiyim, lay-lay,
Evim, eşiyim, lay-lay.
Sən get şirin yuxuya
Çəkim keşiyin, lay-lay.

Lay-lay dedim yatınca,
Gözlərəm ay batınca.
Canım cəzanə gəldi
Sən hasilə çatınca.

Lay-lay çaldım həmişə,
Karvan enər enişə.

Yastığında gül bitsin,
Döşəyində bənövşə.

Yeni gül-çiçək olsun,
Yarpağı ləçək olsun.
Bir bala göstərin ki,
Balamdan göyçək olsun.

Bala dadı bal dadır,
Bala adamı aldadır.
Şirin sözün, söhbətin
Hələ sənin daldadır.

Bala dadı - bal dadı,
Bala adamı aldadı.
Yaxşısına mən qurban,
Pisi yenə bal dadı.

Balamsan, bir dənəmsən,
Sədəfim, dürdanəmsən.
Mən ölsəm sənə qurban
Sən ölmə, bir dənəmsən.

Dağlara sərin düşər,
Kölgəsi dərin düşər.
Hər vaxt layla deyəndə
Yadıma Pərim düşər.

Yaylığı kirli balam,
Qəlbi fikirli balam.
Cahıl-cuhul içində
Mənim şikilli balam.

İyid qalasın istər,
Dağın lalasın istər.
Mən balamı istərəm
Balam balasın istər.

Layla dedim adına,
Haqq yetişsin dadına.
Boya-başa çatanda
Məni də sal yadına.

Balam lay-lay, a lay-lay!
Körpəm lay-lay, a lay-lay!

***

Dağda danlar,
Sünbülü sanlar,
Qoca qanlar
Bu balama qurban.

Dağdakı atlar,
Quyruğun qatlar.
Göyçək arvadlar
Bu balama qurban.

Göydə ulduzlar,
Şaxtalı buzlar.
Cehizsiz qızlar
Bu balama qurban.

Balama qurban inəklər,
Balam ha vaxt iməklər?
Balama qurban buzovlar,
Balam ha vaxt düz oynar?

Qızdı nazdı
Yüz tümən azdı.
Min tümən gətirin
Bu qızı götürün.

Oğlandı oxdu
Dərd-səri çoxdu.
Götürün tullayın
Məlyəti yoxdu.

Atın-tutun bu balanı,
Şəkərə qatın bu balanı.
Şəkərdən acı olsa,
Götürün atın bu balanı.

Sarımsağım, soğanım,
Yad qızından doğanım.
Candan olub canımı
İlan kimi boğanım.

## UŞAQ OYUN NƏĞMƏLƏRİ

### DÜZGÜLƏR

Tağı, Tağı tumanbağı,
Göydə aşır mayallağı...
Hayıl-mayıl İsmayıl
Yuxudan ayıl, İsmayıl.
Həsənağa
Mindi ulağa
Girdi bağa
Bir quş vurdu
Oldu qurbağa

Verdi qonağa
Qonaq yemədi
Saldı yağa
Özü tələdi
Bizə vermədi.
Yedi qurbağa,
Düşdü yatağa.
Hədiydi, huduydu
Sənin yarın gədiyidi,
Al başına, kül başına
Ət taxtasın vur başına.

## A TEŞTİ

A teşti, teşti, teşti,
Atım Gilandan keçdi.
İki xoruz dalaşdı
Biri qana bulaşdı.
Qan getdi çaya düşdü
Çaydan göyərçin uçdu.
Göyərçin, alabaxta,
Yuvası qəlbi, taxta.
Görüm onu kim vursa,
Qan qussun laxta-laxta.

## TÜLKÜ, TÜLKÜ TÜNBƏKİ

Tülkü, tülkü, tünbəki
Quyruq üstə lümbəki.
Ayı axmaq,
Donuz toxmaq,
Qurd qlavuz,
Çaqqal çavuş,
İlan qamçı,
Tısbağa çanaq
Biz ona qonaq

## ƏKİL-BƏKİL

Əkil-Bəkil quş idi,
Ağaca qonmuş idi.
Getdim onu tutmağa
O məni tutmuş idi,

Meydana salmış idi.
Meydanın ağacları
Dən gətirir quşları.
Çəpər çəkdim, yol açdım
Qızıl gülə dolaşdım.
Bir dəstə gül dərməmiş
Nənəm gəldi, mən qaçdım.

### İYNƏ-İYNƏ

İynə, iynə,
Ucdu düymə,
Bal balınca.
Ballı keçi,
Şam ağacı,
Şatır keçi.
Qoz ağacı,
Qotur keçi.
Hoppan-hoppan,
Yırıl-yırtıl,
Su iç, qurtul.

### BİR-İKİ

Bir, iki, bizimki,
Üç, dörd, qapını ört.
Beş, altı, daşaltı.
Yeddi, səkkiz, Firəngiz,
Doqquz, on, qırmızı don.

### MƏN DƏ, MƏN DƏ...

— Gəl gedək bağa
— Mən də, mən də.
— Çıxaq budağa
— Mən də, mən də.
— Şaftalı yığaq
— Mən də, mən də.
— Bağban gəlsin
— Mən də, mən də.
— İti qışqırsın
— Mən də, mən də.
— İt mənə hürsün
— Mən də, mən də.

— Ağaca çıxaq,
— Mən də, mən də.
— Dibinə s...
— Mən də, mən də.
— Qarğalar yesin
— Mən də, mən də...

## YANILTMACLAR

Yorğana yoğrul yorğun
Küp qulpu, xub küp qulpu.
Ağa evinin dar aralığı
Ay dəyirmilənməyə nə qalıb?

Getdim gördüm bir dərədə
İki kar, kor, kürkü yırtıq kirpi var.
Dişi kar, kor, kürkü yırtıq kirpi
Erkək kar, kor, kürkü yırtıq kirpinin
kürkünü yamamaqdan
Erkək kar, kor, kürkü yırtıq kirpi
Dişi kar, kor, kürkü yırtıq kirpinin
Kürkünü yamayır.

***

Bazarda nə ucuz?
Mis ucuz, duz ucuz, küncüt ucuz...
Bu mis nə pis mis imiş,
Bu mis Kaşan misi imiş.

***

Aşbaz Abbas bozbaş asar
O başda, bu başda...

***

Atı min, iti qov,
İti qov, atı min.
Atı min, iti qov,
İti qov, atı min...

***

Mollanı əmmamələməlimi, əmmamələməməlimi?

## HOLAVARLAR VƏ SAYAÇI SÖZLƏRİ

Axşamlar, ay axşamlar,
Şamlar yanar axşamlar.
El-ulus evdə yatar,
Xodək harda axşamlar?

Qara kəlim aranda,
Çıxar gün qızaranda.
Xodək murada çatar
Gəlindən bar alanda.

Qara kəl asta gedər,
Dolanar dosta gedər.
Ay qaranlıq gecədə
Hastabahasta gedər.

Qara kəl, ilim barı,
De dərdin bilim barı.
Məni mağmın eyləmə
Açılsın dilin barı.

Qara kəl qoşa gəldi,
İşlədi boşa gəldi.
Kotan maccı qırıldı,
Zəhmətim boşa gəldi.

Kotanın xodəkləri,
Partlayıb dodaqları.
Qarğayın kotan sınsın,
Dincəlsin xodəkləri.

Sayada bax, sayada,
Torun qurmuş qayada.
Gözdə-könüldə sənsən,
Düşərmi kimsə yada?

Saya-saya sayadan,
Qoyun gəlir qayadan.
Sayaçıya pay verin,
Damazlığı mayadan.

Örüşdən qoyun gəlsin,
Dərisin soyan, gəlsin.
Əmliyi sizin olsun,
Anasın qoyun gəlsin.

Ellərin xan çobanı,
Sürünün yan çobanı.

Qoyun yuxuya qalsa,
Oyadar ban çobanı.

Ağ qoyun aya bənzər,
Dağ aşar, yaya bənzər.
Qoyunsuz evlər gördüm,
Qurumuş çaya bənzər.

Nənəm, a nazlı qoyun,
Qırqovul gözlü qoyun.
Pendiri kəsmə-kəsmə,
Qatığı üzlü qoyun.

Nənəm, qoyun qarası,
Qırxar, olar narazı.
Yaz günü dələməsi,
Qış günü qovurması.

Nənəm, a ağbaş qoyun,
Qarlı dağlar aş qoyun.
Yağından plov olar,
Quyruğundan aş qoyun.

Nənəm, a qəşəng qoyun,
Yunu bir döşək qoyun.
Bulamanı tez eylə,
Qırıldı uşaq, qoyun.

Nənəm, qoyunun ağı,
Dolandı gəldi bağı.
Çobanın çarıq bağı,
Qızlara cehiz ağı.

Nənəm, boz ala qoyun,
Tükü toz ala qoyun.
Yeyən sənin ucundan,
Gedə qız ala qoyun.

Tut qoyunun belini,
Ələ gəlmir yelini.
Bir doyunca görəydim,
Onu sağan gəlini.

## MÖVSÜM NƏĞMƏLƏRİ

### SƏMƏNİ

Səməni, saxla məni
İldə göyərdərəm səni.
Səməniyə saldım badam

Qoymazlar bir barmaq dadam.
Dörd tərəfin alıb adam.
Səməni, bezana gəlmişəm
Uzana-uzana gəlmişəm.

## GÜN ÇIX!

Gün çıx, çıx, çıx!
Kəhər atı min, çıx!
Keçəl qızı qoy evdə
Saçlı qızı götür, çıx!
Oğlun qayadan uçdu,
Qızın təndirə düşdü,
Gün getdi su içməyə,
Qırmızı don biçməyə.
Gün çıxıbdı yetirəcək,
Qarı yerdən götürəcək,
Keçəl qızı itirəcək,
Saçlı qızı gətirəcək.
Duman qaç, qaç, qaç!
Səni qayadan asarlar!
Buduna damğa basarlar!

## KOS-KOSA

Ay kos-kosa gəlsənə,
Gəlib, salam versənə,
Çömçəni doldursana,
Kosanı yola salsana.

Ay uyruğu, uyruğu
Saqqalı it quyruğu.
Kosam bir oyun eylər
Qurdunu qoyun eylər.

## YEL BABA

A Yel Baba, Yel Baba,
Qurban sənə, gəl Baba.
Taxılımız yerdə qaldı,
Yaxamız əldə qaldı.

Heyva, narın iyi gəlir
Əs, ay giləvar, giləvar.
Güldən xarın iyi gəlir
Əs, ay giləvar, giləvar,

Səndən yarın iyi gəlir
Əs, ay giləvar, giləvar.
Ay xoş giləvar, giləvar.
A Yel Baba, Yel Baba,
Qurban sənə gəl Baba.

## KEÇƏL

Keçəl-keçəl, daz keçəl,
Hər yanda pərvaz keçəl.
Qış gəlib qurtarmısan
Budu gəlir yaz, keçəl.

Keçəl, keçəl mərəndi,
Qolları düymələndi.
Eşitdi saçlı gəlir
Başına kül ələndi.

Keçəl-keçəl noxudu keçəl,
Başı-gözü qoxulu keçəl.
Keçəl, keçəl Mərəndə,
Arpa, buğda sərəndə.

Bir arpanı beş eylər,
Yeddi qazan aş eylər.
Gəlin, yığılaq başına,
Zəhər qataq aşına.

Keçəl, aşın bişibdi,
Noxudların şişibdi.
On iki keçəl bir yanda
Xarta-xurta düşübdü.

Keçəlin xondu başı,
Eşşəyə mindi başı.
O yanda dava düşdü
Bu yanda sındı başı.

## BAYATILAR

Yağaram yağış kimi,
Əsərəm qamış kimi.
Oğlana qız yaraşır
Xəncərə gümüş kimi.

Bu dağlar qoşa dağlar,
Verib baş-başa dağlar.

Səndə yarım gəzibdir
Səni yüz yaşa, dağlar.

Əziziyəm yarı tər,
Yarı qonça, yarı tər.
Kiprik çalma, gözlərim
Kölgə salsan, yar itər.

Təbriz üstü Miyana,
Qızıl gülə boyana.
Oxu, bülbülüm, oxu,
Bəlkə yarım oyana.

Mən aşıq incə belə,
Ay belə incə belə.
Qulpun sınsın, ay səhəng,
Minibsən incə belə.

Əziziyəm gül-gülə,
Bülbül gülə, gül gülə.
Yar başına gül taxdım,
Calaq oldu gül gülə.

Əziziyəm bu bağa,
Bu bağçaya, bu bağa.
Bir dəfə üzün gülsə,
Canım verrəm sadağa.

Xəncəri işlə yolla,
Üstün gümüşlə yolla.
Mənə beş alma göndər,
Birini dişlə yolla.

Dan yeri söküləndə,
Zülf üzə tökülendə,
Şeh düşmüş gülə bənzər
Ağ üzdən öpüləndə.

Alma atdım, nar gəldi,
Kətan köynək dar gəldi.
Qapıya kölgə düşdü
Elə bildim yar gəldi.

Eləmi o güneylər,
O qüzey, o güneylər.
Yar yara qovuşanda,
Bayramın o gün eylər.

Əlində saza yannam.
Qəmzəyə, naza yannam.
Baş qoyub dizin üstə,
Qış yatsam, yaz oyannam.

Sən mənim baxtımı gör,
Qızıldan taxtımı gör.
Üz döndərib gedən yar,
Bir bəri baxdımı gör.

Göydə göyərçin ağlar,
Yuvada laçın ağlar.
Sən yadıma düşəndə
Başımda saçım ağlar.

Kağız yazdım qarasız,
Dərdə düşdüm çarasız.
Gərək mənim dilimdən
Yarıma yalvarasız.

Sevdi aldatdı məni,
Güldü ağlatdı məni.
Getdim köləsi oldum
Götürdü satdı məni.

Əzziyəm baxannan,
Qızıl düymə taxannan.
Bir dəstə gül olaydım
Asılaydım yaxannan.

Bu yol Kaşana gedər,
Aşar, Kaşana gedər.
Sənin bu yaraların
Yara nişana gedər.

Arxalığın üçdümü?
Düyməsi gümüşdümü?
Yarım getdi gəlmədi
Müjdəsi öpüşdümü?

Zülfünü bağda dara,
Düşübdü bağ da dara.
Vəfalı bir dost üçün
Rumu gəz, Bağdad ara.

Mən aşıq qala məndə,
Bürc məndə, qala məndə.
Qorxuram düşəm öləm
Həsrətin qala məndə.

Əzziyəm yüz incidi,
Qablara düz. İncidi.
Öpüş sevgi artırır
Dişləmək üz incidi.

Əzziyəm bağa duvar,
Çəkmişlər bağa duvar.
Gözün - bağ, qaşın - bağban
Kirpiyin - bağa duvar.

Apardı çaylar məni,
Ulduzlar, aylar məni.
Yüküm dərd-qəm yüküdür
Yordu bu taylar məni.

Bulağın başı ilə,
Dibinin daşı ilə.
İyidə alqış dedim
Gözümün yaşı ilə.

Od yaxır bu şən yeri,
Yar gəlib düşən yeri.
Göz yaşım oda dönüb
Yandırır düşən yeri.

Hər sözün qandı, ürək,
Səni dost sandı ürək.
Dinəndə dilim yandı,
Dinmədim yandı ürək.

Eləmi dərdə Kərəm,
Bağlanıb dərdə Kərəm.
Qoşaram qəm kotanın,
Sürərəm, dərd əkərəm.

Elədimi vay dərdim,
Vay dərmanım, vay dərdim.
Xalq gül əkdi, gül dərdi
Mən gül əkdim, vay dərdim.

Azalmaz mənim dərdim,
Sağalmaz mənim dərdim.
Meşələr qələm olsa,
Yazılmaz mənim dərdim.

Dağdan ünüm keçirtdim,
Qara günüm keçirtdim.
Ağladım bacarmadım,
Güldüm günüm keçirtdim.

Göy üzü kilim-kilim,
Yar itdi ilim-ilim.
Kəsin düşmən dilini
Doğrayın dilim-dilim.

Keçməyir sözüm neylim?
Bu dərdə dözüm, neylim?
Ah çəksəm aləm yanar,
Çəkməsəm özüm neylim?

Qaynar qazanım mənim,
Oynar ozanım mənim.
Düşsün qələmin əldən
Yazı yazanım mənim.

Yad üzdü canım mənim,
Töküldü qanım mənim.
Ömrü başa vurmağa
Yoxdu gümanım mənim.

Dağın maralı qurban,
Gözüm qaralı qurban.
Sənin təzə yarana
Köhnə yaralı qurban.

Göyərçinəm, uçdum, gəl,
Əldən-ələ düşdüm, gəl.
Yaxşı günün aşnası,
Yaman günə düşdüm gəl.

Ürəkdə yara sızlar,
Hovlanıb yara sızlar.
Yaralılar dərdini
Nə bilər yarasızlar.

Əzizim nə mindirir?
Nə salır, nə mindirir?
Dərdlini dindirməyin
Dərd onsuz da dindirir.

Dağlar dağımdı mənim,
Qəm ovlağımdı mənim.
Dindirmə qan ağlaram,
Yaman çağımdı mənim.

Dərd məndə üz görübdü,
Meydanı düz görübdü.
Gedir, gedir, qayıdır,
Məni yalqız görübdü.

Arazda daşqına bax,
Suyunun məşqinə bax.
Dərd əlindən oxuram
Deyirlər eşqinə bax.

Çaylar daşdı, çağladı,
Dərd üstdən dərd bağladı.
Getdim dərdsiz yanına
O məndən çox ağladı.

Bir yerdə binə qaldı,
El köçdü, binə qaldı.
Qəmdən bir ev tikdirdim
Bilmədim kimə qaldı.

Su axdı, su dayandı,
Süsənbər suda yandı.
Dərdimi suya dedim
Alışdı su da yandı.

Yatmış idim oyandım,
Dərdə, qəmə boyandım.
Daş olsaydım ərirdim
Torpaq idim dayandım.

Bağman düzər hasarı,
Bağa qoymaz yasarı.
Qəmdən bir ev tikmişəm
Hicrandandır hasarı.

Aşıq neylər yad aşı?
Çaxçaq döyər ha daşı.
Yükün hicran yüküdü
Kirəkeşsən, ha daşı.

Anam, bacım, qız gəlin!
Əl-ayağı düz gəlin.
Yeddi oğul istərəm
Bircə dənə qız, gəlin.

İstəkanın sarısı,
İçdim qaldı yarısı.
Arvadların əri var,
Qızların da tarısı.

Göz üstündə qaş ağlar,
Bulut gələr yaş ağlar.
Bir evdə sonsuz ölə
Ocaq yanar, daş ağlar.

Əzziyəm tən dirə,
Odun qala təndirə.
Dədəsizin nə həddi
Dədəliyə tən dura?

Başdan mənəm, başdan mən,
Duraram obaşdan mən.
Nə atam var, nə anam
Yaranmışam daşdan mən.

Bağçalarda yaz oldu,
Bülbül, dərdin az oldu.
Oxu, dedim, ağladın,
Bu necə avaz oldu?

Ana, mənə az ağla!
Qış sızılda, yaz ağla!
Nə vaxt yadına düşsəm,
Ağ kağıza yaz, ağla!

Mən aşıq oda gir yan,
Mən giryan, o da giryan.
Dedim: könlüm odun al,
Demədim: oda gir, yan!

Su gələr daşa dəyər,
Kirpiklər qaşa dəyər.
Yarın bir cüt öpüşü
Qohum-qardaşa dəyər.

Kəməndin atan tellər,
Naz-qəmzə satan tellər.
Əl vurma çalar səni
Qıvrılıb yatan tellər.

Araz axar axımnan,
Suyu durmaz axımnan.
Yardan necə doyum mən
Bircə kərə baxımnan?

Araz buruldu getdi,
Suyu duruldu getdi.
Nə dedim yar incidi?
Demə, yoruldu getdi.

Əzizim sürmə məni,
Yad elə sürmə məni.
Təşnədir, yandı ürək,
Ağzıma sür məməni.

Araşqının yan qoyar,
Ürəyinə qan qoyar.
Sənin can alan gözün
Kimdə din, iman qoyar?

Təndirə daş qoymuşam,
Üstə lavaş qoymuşam.
Gündüz gəlmə, gecə gəl
Böyrümü boş qoymuşam.

Durna süzər səs eylər,
Səs eylər, həvəs eylər.
Dar həsir üstə bir yer
İkimizə bəs eylər.

Qaşları çatmalısan,
Hil-mixək qatmalısan.
Səndə bir gözəllik var
Götürüb qaçmalısan.

Burda sar alar məni,
Zülfün qaralar məni.
Sənsiz yatağa girsəm,
Yataq yaralar məni.

Ağac ağaca yovuq,
Çıxdı ağaca toyuq.
Bir əlim yar qoynunda
Birin apardı soyuq.

Araşqının çin-çini,
Öpüm ağzın içini.
Olum bir tülək tərlan
Tutum sən göyərçini.

Tanrı məni quş eylə,
Qanadım gümüş eylə.
Dar yolda, dar küçədə
Yarı mənə tuş eylə.

Qərənfiləm qələmsiz,
Qərarım gəlmir sənsiz.
Yuxuna od tökülsün
Necə yatırsan mənsiz?

Bu gələn yar olaydı,
Əlində nar olaydı.
İkimiz bir köynəkdə
Yaxası dar olaydı.

Şeşgilan bizim olaydı,
Kərpici qızıl olaydı.
Girəydim yar qoynuna
Gecələr uzun olaydı.

Dağ başında quş durmaz,
Payız girər qış durmaz.
Cahıl oğlan, cahıl qız
Yüz and işsə diş durmaz.

Səhərin dan yeridi,
Sübh yeri dan yeridi.
İki məmən arası
Yatmağa can yeridi.

Mən aşıq çəmən yerdə,
Gül bitər çəmən yerdə.
Yara köynək olaydım
Soyunub çimən yerdə.

Qızıl üzük firuzə,
Gedin deyin xoruza.
Bu gecə banlamasın
Yar gələcəkdir bizə.

Əziziyəm Tərtərə,
Bu yol gedir Tərtərə.
Üz qoyum üzün üstə
Qoy qarışsın tər tərə.

Baharda xəzəl olmaz,
Yar yardan bezar olmaz.
Sevgi eybsiz olsa,
Eybsiz gözəl olmaz.

Həyətimiz nanədi,
Üstü balaxanadı.
Əyil üzündən öpüm
Əcəb xəlvətxanadı.

Ağ donu ağartmışam,
Qolların daraltmışam.
Özüm qarabuğdayı
Çoxların saraltmışam.

Başında var şal bunun,
Yanaqları al bunun.
Şeytan vəsvəsə verir
Dur qadasın al bunun.

Mən aşığəm gizdən yar,
Arxalığın dizdən yar.
Atan səni döyəndə
Gəl qoynumda gizdən yar.

Saçın ucun hörməzlər,
Səni mənə verməzlər.
Qoy öpüm ağ üzünnən
Qaranlıqdır, görməzlər.

Balaca cib bıçağı,
Oldum yarın qaçağı.
Bir səhər gəl, bir axşam,
Bir də günorta çağı.

Nə dad vardır məzədə,
Qismət olsun bizə də.
Sənə də qurban olum
Sənə baxan gözə də.

Yolun sal yel əsəndən,
Dolan gəl beləsindən.
Gündə bir qurban kəsim
Gözümün giləsindən.

Əziziyəm gündə mən,
Kölgədə sən, gündə mən.
İldə qurban bir olar
Sənə qurban gündə mən.

Mən aşıq, səfa gəldin,
Xoş gəldin, səfa gəldin.
Nə mən öldüm qurtardım,
Nə sən insafa gəldin.

Aşığın zil səsi var,
Həm zili, həm pəsi var.
Sındırma ürəyimi
Onun da kimsəsi var.

Dağ üstə güzarım var,
Ürəkdə azarım var.
Yar yanına qoymasa,
Getməyə məzarım var.

Əzizim kəsə gəldin,
Yolları kəsə gəldin.
Vədə verdin gəlmədin
Ağladım, səsə gəldin.

Ağacda püstə sarı,
Dolan gəl dosta sarı.
Saçların kəfən eylə
Cənazəm üstə sarı.

Gün getdi batan yerə.
Ay getdi yatan yerə.
Sinəm nişanə oldu
Yar oxun atan yerə.

Saç qara kömürdəndi,
Gün keçər ömürdəndi.
Sənə dil öyrədənin
Ürəyi dəmirdəndi.

Sözün de, dinləyim mən,
Qapında inləyim mən.
Qoy axsın gözüm yaşı
Bir az sərinləyim mən.

Mən aşıq qara tellər,
Ağ üzdə qara tellər.
Sənin bu nazü-qəmzən
Ömrümü qarət eylər.

Yar məni yada saldı,
Dağlara səda saldı.
Gəldi hayıma çatdı,
Apardı oda saldı.

Əziziyəm oyansın,
Yar yuxudan oyansın.
Yuxu gördüm mən yandım,
Qoy oyansın o yansın.

Aşıq ala gözlərin,
Cüt piyala gözlərin.
Qorxuram erkən öləm
Yada qala gözlərin.

Dəyirmanın püskünə,
Çaxmağına, püskünə.
Özün öldün qurtardın
Məni qoydun pis günə.

Dağda çiskin olurmu?
Duman çiskin olurmu?
Ağlar gözüm çox ağla
Bundan pis gün olurmu?

Quşa bax ha, quşa bax,
Qanadı sınmışa bax.
Aləmə yaz açıldı
Bizə gələn qışa bax.

Yol üstə bulaq imiş,
Nə sərin sular imiş.
Əzrayıl, adın bədnam
Can alan bular imiş.

Dağlarda qar qalandı,
Qar yağdı, qar qalandı.
Qarğalar laçın oldu
Laçınlar qarğalandı.

Bir vecsiz daşdı dünya,
Çürük ağaşdı dünya.
Kimə deyim dərdimi?
Tamam qan yaşdı dünya.

Əziziyəm belə yaz,
Qələm götür, belə yaz.
Nakam qəlblər şad olmaz
Yüz il gəlsə belə yaz..

Apardı tatar məni,
Qul edib satar məni.
Vəfalı yarım olsa
Axtarar tapar məni.

Dağ başına tökdü qar,
Uçdu tərlan, qondu sar.
Ürək ki, var şüşədir
Sındırarsan kim yamar?

Aşıq hənəklə gedər,
Salxım tənəklə gedər.
Kələk ilə gələn şey
Dönər, küləklə gedər.

Sürü bir vamda mələr,
Naharda, şamda mələr.
Yaxasız köynək geyən
Bacasız damda mələr.

Əziziyəm gülən az,
Bülbül eylər gülə naz.
Dünya bir qəmxanadır
Ağlayan çox, gülən az.

Yaman gün keçər gedər,
Ömrünü biçər gedər.
Dünyada qəm şərbətin
Hər gələn içər gedər.

Əzizim günü günə,
Gəl satma günü günə.
Keçən günə gün çatmaz
Calasan günü günə.

Namərdi gəl yüz qandır,
Əlli qandır, yüz qandır.
Kəbə yıxmaq bir evdir,
Könül yıxmaq yüz qandır.

Əziziyəm tən gərək,
Pay bölünsə tən gərək.
Sarvanla dost olanın
Darvazası gen gərək.

Su gələr, axar gedər,
Dağ-daşı yıxar gedər.
Dünya bir pəncərədir
Hər gələn baxar gedər.

Çay axar dağı neylər?
Bağçalar bağı neylər?
Bir çıraq haqdan yana
O çıraq yağı neylər?

Mən aşiq qəlbi nara,
Ay doğar qəlbi nara.
Dil ilən dost olanın
İş ilən qəlbin ara.

Bulaq üstə bəsti var,
Bəstinin bir dəsti var.
Sirr vermə öz dostuna
Dostun da bir dostu var.

Üzüyün qaşı mənim,
Üstünün daşı mənim.
Yar deyib kim ağlasa,
Gözünün yaşı mənim.

Pərişanam, pərişan,
Yoxdur halım soruşan.
Varmı mən tək yar üçün
Dərdi dərdə qarışan?

Daş gəlir sellərinən,
Dərd gəlir ellərinən,
Yarın dərdi öldürməz,
Yandırar illərinən.

Bir gül aldım o xandan,
Alıb asdım yaxamdan.
Bir lal axan sudan qaç,
Bir də yerə baxandan.

İnci burdan, dür burdan,
Min atını sür burdan.
Məclisdə yerin tanı
Deməsinlər dur burdan.

Biçarayam, biçara,
Biçaraya nə çara?
Ürəyimi açmağa
Kimə gedim açara?

Mən aşiqəm dər, de nə?
Gül budaqdan dər, de nə?
Axtardım bir dərdli yar,
Qatım dərdim dərdinə.

Mən aşiqəm Salyana,
Dara zülfün, sal yana.
Necəsən bir ah çəkim,
Kür quruya, sal yana.

Bu çaydan gəmi gəldi,
Şeh düşdü, nəmi gəldi.
Gəl gözlərindən öpüm
Ayrılıq dəmi gəldi.

Qoltuğumda bağlama,
Mən gedirəm, ağlama!
Gedərəm, yenə gəlləm
Yadlara bel bağlama.

Quşum gəl, a quşum gəl!
Qanadı sınmışım, gəl.
Xalqlar ölər ayrılar
Diri ayrılmışım, gəl!

Qızıl gül əsdi neylim?
Səbrimi kəsdi neylim?
Yar getdi, qayıtmadı
Bu imiş qəsdi neylim?

Aşıq naçar ağlama,
Gündür keçər, ağlama.
Qapın bağlayan fələk
Bir gün açar, ağlama.

Dağların yağışından,
Təngindən, axışından.
Bu gediş ömürlükdür
Duymuşam baxışından.

Dəryada var balıqlar,
Bağdadda xurmalıqlar.
Nə bu vüsal olaydı,
Nə də bu ayrılıqlar.

Ağacda xəzəl ağlar,
Dibində gözəl ağlar.
Yardan ayrılan aşıq
Sərgərdən gəzər, ağlar!

Ox dəydi yaralandım,
Ürəkdən paralandım.
Mən sənnən ayrılmazdım
Zor ilən aralandım.

Gedən! Getmə, dayan dur!
Halım sənə əyandur.
Gəlişinə mən qurban
Gedişin nə yamandur.

Qızıl gül həşəm oldu,
Dərmədim, həşəm oldu.
Səndən ayrılan gündən
Ağlamaq peşəm oldu.

Ay qız adın Hürüdü,
Gün dağları bürüdü.
Verdiyin qızıl üzük
Barmağımda çürüdü.

Qızıl gül olmayaydı,
Saralıb, solmayaydı.
Bir ayrılıq, bir ölüm
Heç biri olmayaydı.

Bu bağlar olmayaydı,
Saralıb, solmayaydı.
Ölüm Allah əmridir
Ayrılıq olmayaydı.

Burdan uzaq Gəncədir,
Zülfün pəncə-pəncədir.
Ölüm birdəfəlikdir
Ayrılıq işgəncədir.

Aşıq ellər ayrısı,
Şana tellər ayrısı.
Bir günə dözəmməzdim
Oldum illər ayrısı.

Mən aşiqəm Gəncə var
Şəki, Şirvan, Gəncə var.
Yar yardan ayrılsa da
Məhəbbət ölüncə var.

Mən aşiqəm keşkəsən.
Körpü üstən keş gə sən.
Gəldin, dərdim artırdın,
Gəlməyəydin keşkə sən.

Yaraşıq gözdə qara,
Qaş qara, göz də qara.
Yolunu gözləməkdən
Qalmadı gözdə qara.

Xoya gəl, Mərəndə gəl,
Sinəm qan verəndə gəl.
Sağlığında gəlmədin,
Barı can verəndə gəl!

Əlində gül dəstə gəl,
Dərdi qoy dərd üstə gəl.
Can verirdim gəlmədin,
İndi qəbrim üstə gəl.

Əzizim söz deməkdən,
Yoruldum söz deməkdən.
Nə sən yoldan yoruldun,
Nə mən yol gözləməkdən.

Cavan gəlin, dul gəlin,
Ollam sənə qul, gəlin.
Bu yol gedər-gəlməzdir
Gəl gözləmə yol, gəlin.

Dağda duman yeri var,
Qaşda kaman yeri var.
Bir itkim var ürəkdə
Səndə güman yeri var.

Təndir üstə kösöylər,
Kösöy yanar his eylər.
Desələr yarın gəlir
Sınıx könlüm səs eylər.

Dağ başın ayaz aldı,
Qar gəldi ayaz aldı.
Saydım, günüm il keçdi,
Saymadım, ay azaldı.

Kəklik yola səksənə!
Koldan-kola səksənə!
Deyələr: "Yarın gəlir!"
Ürəkciyim səksənə.

Qızıl gül ləpələndi,
Meh vurdu ləpələndi.
Yarımnan xəbər gəldi
Ürəyim ləpələndi.

Qızıl gül oyum-oyum,
Dərim qoynuma qoyum.
Yağış yağar, yer doymaz
Mən sənnən necə doyum?

Göydə bulut cidadı,
Canım yara fədadı.
Mən ölsəm sənə qurban
Sən ölmə, əlvidadı.

Aşıq mən görəndimi?
Xalın mən görəndimi?
At ürbəndi üzündən
Görüm, mən görəndimi?

Mən aşiq bir-bir düşər,
Ox yaydan bir-bir düşər.
Yarla keçən günlərim
Yadıma bir-bir düşər.

Fələyin öz əlindən,
Açmadım göz əlindən.
Kimə şikayət edim
Baxtımın əzəlindən?

Eləmi qar qamışa,
Qar yağıb qarqamışa.
Yüz dil-ağız neyləsin
Bir fələk qarğamışa?

Dərya səndən kim keçdi?
Kim qərq oldu, kim keçdi?
Fələyə bel bağladım
Ürəyimdən sim keçdi.

Apardılar gülümü,
Eylədilər zülümü.
Nə qoydular danışam,
Nə kəsdilər dilimi.

Mən aşıq əsdi fələk,
Səbrimi kəsdi fələk.
Burda bir çadır qurdum,
Kənəfin kəsdi fələk.

Əziziyəm gül əllər,
Şana barmaq, gül əllər.
Dəryacan ağlın ola,
Kasıb olsan güləllər.

Oba qalxdı köçərlər,
Köçü köçdən seçərlər.
Yetimin göz yaşından
Körpü salıb keçərlər.

Qapının yanı yetim,
Sözümün canı yetim.
Yeyib doyandan sonra
Deyərlər: hanı yetim?

İş qalsa məcəldəndir,
Dağ döşü qəcəldəndir.
Yetimi dərd öldürsə,
Deyərlər əcəldəndir.

Yatıbsan, oyan dağlar
Al-yaşıl boyan dağlar.
Bura zülmətxanadır,
Necədir o yan, dağlar?

El bu dağda ya qışlar,
Ya köç elər, ya qışlar.
Başım cəllad əlində
Nə vurar, nə bağışlar.

Əzizim nə xandılar,
Nə sultan, nə xandılar.
Aparıb öldürdülər
Tayfalıqca dandılar.

Dağın döşü düz, hamar,
Nə bağça var, nə bar var.
Ölkəyə bir şah gəlib
Qılıncından qan damar.

Əzizim biçin gördüm,
Yol ötdüm, biçin gördüm.
Mən səndən ayrılmazdım
Fələyin gücün gördüm.

Dağlar mənə qar göndər,
Əsirgəmə bar göndər.
Ya dərdimə çarə tap,
Ya dərmanı var göndər.

Görmədi ozan günü,
İlqarı pozan günü.
Falçı tasın sınaydı
Bəxtimi yozan günü.

Fələyin qəhri mənə,
Heç gəlmir rəhmi mənə.
Doldurub qəm kasasın
İçirdir zəhri mənə.

Əzziyəm quş apardı,
Vətənə tuş apardı.
Qolumu qandal kəsdi,
Ayağım daş apardı.

Gülün nəyin alarlar?
Dərib iyin alarlar.
Varlı qız çirkin olsa,
Gözəl deyib alarlar.

Əzizim kasa dolmaz,
Mərd əli kasad olmaz.
Yüz namərdin çörəyin
Doğrasan kasa dolmaz.

Bağçanın üstü olmaz,
Ocaqsız tüstü olmaz.
Dostdan düşmən tapılar
Düşmənin dostu olmaz.

Bir ev tikdim dəyirmi,
Dirəkləri iyirmi.
Namərd nə şadlanırsan
Bu yurd sənin deyilmi?

Əzizim çeşmə məndən,
Çay məndən, çeşmə məndən.
Yad sözü yalan olur
İnanma, keçmə məndən.

Mən aşıq neylim sənə?
Düşübdü meylim sənə.
Mən dönsəm üzüm dönsün,
Sən dönsən neylim sənə?

Mən aşıq sini-sini,
Doldur ver sini-sini.
Mənə öz yarım gərək
Neylirəm özgəsini?

Təbriz üstü Marağa,
Zülfün gəlməz darağa.
Axtarıram yarımı
Düşüb soraq-sorağa.

Sözün demə tərsinə,
Tər təni qoy, tər sinə.
Su öz səmtinə axır,
Dövran gedir tərsinə.

Altımda at gedirəm
Üstümdə mat gedirəm.
Əvvəli sərdar canım
İndi saldat gedirəm.

Arxın suyun sel əydi,
Üzdə telin yel əydi.
Qürbətdən qazancım var
Saç ağartdı, bel əydi.

Əzizim vətən yaxşı,
Geyməyə kətan yaxşı.
Qürbət yer cənnət olsa,
Yenə də vətən yaxşı.

Elədimi dad ola,
Fəryad ola, dad ola.
Qorxuram qərib öləm,
Ağlayanım yad ola.

Bu qala daşdı qala,
Çınqıllı daşdı qala.
Qorxuram qərib öləm,
Yar gözü yaşdı qala.

Veribdir ağı yada,
Yar çəkib dağı yada.
Bizdən bağban olmadı
Tapşırdıq bağı yada.

Gün keçdi ilə gəldi,
Göz yaşım gilə gəldi.
Təbrizin naləsindən
Dağ-daş da dilə gəldi.

Gedim, hara yaxşıdır?
Çəksə dara, yaxşıdır.
Düşmən ağ geyinəndə
Mənə qara yaxşıdır.

Əzizim sinəsinnə,
Çim yaz gəl, sinə-sinə.
Nə ləbim ləbə dəydi
Nə sinəm sinəsinə.

Aşığam, Güləndərdi,
Gül əkdim gülən dərdi.
Cannan əziz saxlaram
Canandan gələn dərdi.

Eləmi hindu zülfün,
Gərdənə mindi zülfün.
Dəstələ qoy qoynuna
Qan elər indi zülfün.

Əzizim səndən iraq,
Düşmüşəm səndən iraq.
Qoy dərdin mənə gəlsin
Tək olsun səndən iraq.

Əzizim yaram nədi?
Qəm ilə aram nədi?
Bu dərdə sən salmısan
Çəkməsəm çaram nədi?

Qara yazı,
Sərt olar qar ayazı.
Məskənim Lök dərəsi
Oylağım Qara yazı.

Bu oba Sadaxlıdı,
Çörəkli, qonaqlıdı.
O gözələ söz demə
Özgəyə adaxlıdı.

Su gəlib bəndə dəyər,
Gümüş kəməndə dəyər.
Sənin bir kəlmə sözün
Cəmi Dərbəndə dəyər.

Dərbəndin dağı birdi,
Düzü çox, dağı birdi.
Balama dəymə fələk,
Gözümün ağı birdi.

Dəvələr düzdə qaldı,
Yükü Təbrizdə qaldı.
Karvan yola düzəldi
Ağ dəvə bizdə qaldı.

Əzizinəm qalasız,
Şəhər olmaz qalasız.
Çünki mən gedərgiyəm
Siz sağlıqnan qalasız.

Qızıl gül xəndan oldu,
Açıldı dən-dən oldu.
Mən səndən ayrılmazıdım
Ayrılıq səndən oldu.

Göy üzü pərdəlidir,
Bulud yox, pərdəlidir.
Bu zalımı dindirmə
Hər sözü pərdəlidir.

Aşıq dedi qara yaz,
Qara bulud, qara yaz.
Fələk, sənə kim dedi
Mənim bəxtim qara yaz?

Əziziyəm ağa xan,
Qurban olum sənə xan.
Bu qırğına xan dözməz,
Bəlkə göydən yağa xan.

*Bayatılar bizim günlərdə də yaranır. Çağdaş şairlərimizin yazdıqları bayatılar onların kitablarına daxil edilir. Amma bəzən şair olmayanlar da bayatı yaradır və onların müəllifləri də qədim bayatılarımızın bir çoxlarının müəllifləri kimi anonim qalır. Belə bayatılardan birini görkəmli geoloq-alim mərhum Xudu Məmmədov yaradıb. Bu bayatını müxtəlif variantlarda söyləyirlər. Mən həmin bayatını Xudu müəllimin yaxın dostu professor Nurəddin Rzayevin "Xudu açarı" kitabında gətirdiyi şəkildə verirəm:*

Bu qala bizim qala,
Qaldıqca bizim qala.
Qurmadım, özüm qalam
Qurdum ki, izim qala.

## AĞILAR

Gəl məni fağır ağla!
Kimsəm yox, sağır ağla.
Çıx dağların başına,
Adımı çağır ağla!

Yaşım gözüm dolusu,
Axar üzüm dolusu.
Gir qapıdan içəri
Baxım gözüm dolusu.

Gəl gedək baş bulağa,
Suyu sərxoş bulağa.
Birin sən de, birin mən
Tökək qan-yaş bulağa.

Ay doğub batarmola?
Ülkərə çatarmola?
Ana baladan ayrı
Dincəlib, yatarmola?

Yayıldı gün bağlara,
Şeh düşdü yarpaqlara.
Yarımın cavan canı
Qarışdı torpaqlara.

Köynəyim buta-buta,
Kim yapışa, kim tuta.
İkimiz birdən ölək
Bir qoyalar tabuta.

Balam vay, günü düzdə,
Nalam ay, günü düzdə.
Qəbrinə çəpər olub
Qalam yay günü düzdə.

Əzizim tikə-tikə,
Doğrandım tikə-tikə.
Anan saçını yolur
Kəfənin tikə-tikə.

Bənövşə çiçəkləndi,
Yarpağı ləçəkləndi.
Yatdığı yalan oldu
Ölümü gerçəkləndi.

Əziziyəm fənər keçdi,
Bu dağda fənər keçdi.
Əzrayıl sinən üstə
Qəlbindən nələr keçdi?

Burdan bir atlı getdi,
Atın oynatdı getdi.
Gün kimi şəfəq saçdı
Ay kimi batdı getdi.

Bu dərdi qanan gərək,
Odlara yanan gərək.
Yad ağlar, üzdən ağlar
Ağlasın anam gərək.

Dərdin çoxdur döz anam,
Ürəyi göz-göz anam.
Qohum-qardaş dayansın
Qoy ağlasın öz anam.

Dağların qarı mənəm,
Gün yoxdur ərimənəm.
Qəbrimi dayaz qazın
Cavanam, çürümənəm.

Bir quş gəlir Kərgərdən,
Kətan köynək, ağ gərdan.
Özün öldün qurtardın
Məni qoydun sərgərdan.

Mən ölürəm çiçəkdən,
Üzüm örtün milçəkdən.
Yad gələr ağı söylər
Anam ağlar gərçəkdən.

Araz axar lilinən,
Bülbül oynar gülünən.
Səni necə ağlayım
Bu qurumuş dilinən?

Göy üzündə pərdəsən,
Gəlib düşdün dərdə sən.
Sən ki, bir od-alovdun,
Necə yatdın yerdə sən?

Əzizim yazı qəm mən,
Qış möhnət, yazı qəm mən.
Mən ölsəm nişanam var
Sən ölmə yazığam mən.

Ağacda xəzəl ağlar,
Dibində gözəl ağlar.
Oğlu ölən analar
Sərgərdan gəzər ağlar.

Göy üzü damar-damar,
Göydən yerə nur damar.
Düşdün düşmən əlinə
Doğradı damar-damar.

Dağlara dolu düşər,
Qar yağar dolu düşər.
Qəbrim yol üstə qazın
Anamın yolu düşər.

Qəbristan bir kənd oldu,
Nədənsə erkən doldu.
Viran qalsın oranı
Hər kim getdi bənd oldu.

Ay doğdu, laxtalandı,
Doğduqca laxtalandı.
Yarıma xəbər verin
Məzarım taxtalandı.

Qızıl gül axçalandı,
Dərmədim axçalandı.
Sənə kimlər qarğıdı
Paltarın boxçalandı.

Qamış tapdım yazılı,
Dörd bir yanı qazılı.
Çıxdım əcəl köşkünə
Gördüm qəbrim qazılı.

At aldın, al yorğanı,
Yollara al yorğanı.
Gələn əcəl təridi
Üstümdən al yorğanı.

Bülbül gül barabarı,
Ceyran çöl barabarı.
Burda bir oğlan ölüb
Bütün el barabarı.

Aman-aman oldu gəl,
Halım yaman oldu gəl.
Bir də səni görəydim
Axır zaman oldu gəl.

Aşıq nəşəli yerdə,
Gül bənövşəli yerdə.
Sənin gözəl bədənin
Qaldı döşəli yerdə.

Əziziyəm bar getdi,
Bağban getdi, bar getdi.
Bietibar dünyadan
Etibarlı yar getdi.

Əlif mənəm, bey mənəm,
Əlif üstə tey mənəm.
Apar əcəl köynəyin
Mən cavanam, geymənəm.

Çiynimdə çuxa mənim,
Şal mənim, çuxa mənim.
Səni ölmüş görüncə
Gözlərim çıxa mənim.

Küçədən xonça gedir,
İçində nimçə gedir.
Aləmin gülü getsə,
Bizimki qonça gedir.

Sən məni ağlar qoydun,
Sinəmə dağlar qoydun.
Yıxdın atam evini
Qapısın bağlar qoydun.

Apardılar, qoydular,
Ağladılar, doydular.
Ağca sinən üstünə
Ağır sallar qoydular.

## MEYXANALAR

*Meyxana şifahi xalq ədəbiyyatımızın əsasən Bakıda, Bakı kəndlərində, Abşeronda yayılmış populyar janrıdır. Müasir meyxanalardan bəzi örnəklər veririk.*

### XEYLİ CAVANLAŞDI BU MEYXANƏMİZ

Q ə n i :

Məclisimiz məclisi-meyxanədir
Əhli də başdan-başa fərzanədir.

Ş a h i d :

Sənət bağçasının açıb gülləri,
Lalələri, süsəni, sünbülləri,
Bu gün bizik meyxana bülbülləri,
Sözlərimiz ləldi, dürdanədir,
Məclisimiz məclisi-meyxanədir.

Q ə n i :

Meyxananın var özünün ləzzəti,
Zahir edər, batin olan "illəti".
Səy elə ki, "lağ" eləmə söhbəti,
Dinləyici hamısı rindanədir,
Məclisimiz məclisi-fərzanədir.

Ş a h i d :

Qədim "Meyxana" yolunu izləyək,
Ömür boyu ənənəsin gözləyək.
Bu şer ilə ruhə yatan söz deyək,
Görən desin: - bəh, bu nə meyxanədir-
Məclisimiz məclisi-fərzanədir.

Q ə n i :

Məsələ "dümbək yanı döymək" deyil,
Hərzə deyib, hər kəsi söymək deyil.
Naşını qandırmalı, "döymək" deyil,
Söhbətimiz cümləsi mərdanədir,
Məclisimiz məclisi-fərzanədir.

Ş a h i d :

Şair Qəni, budur təklifim sənə:
Meyxana bəzmində kömək et mənə.
İtib-batmasın bu gözəl ənənə,
Meyxana qədmidən bir nişanədir,
Məclisimiz məclisi-fərzanədir.

Q ə n i :

Kimsəyə yoxdur hədəsi, ya zoru,
"Dilxor" edər söhbətimiz "dilxoru".
Oğrunu, alverçini, rüşvətxoru,
Faş edərik, çün bizə biganədir,
Məclisimiz məclisi-fərzanədir.

Ş a h i d :

Əlağa Vahid məzəli söz deyən,
Hər sözünün məntiqini gözləyən,
Boylə deyibdir: - vətənin sevməyən,
Deyil ağıllı, dəli-divanədir-
Məclisimiz məclisi-fərzanədir.

Q ə n i :

İndi tutub şöhrətimiz aləmi,
Meyxananın başqalaşıbdır "çəmi".
Keçdi dəxi hərzəvü hədyan dəmi
İndi o sözlər dəxi əfsanədir,
Məclisimiz məclisi-fərzanədir.

Ş a h i d :

Adam gərək adamlığın dərk edə,
Hər bir işin möhkəm edə, bərk edə.
Yaxşı əməllə tanına ölkədə,
Bəd əməlin mənzili viranədir,
Məclisimiz məclisi-fərzanədir.

Q ə n i :

Ötdü dəxi "can qadasın aldığım,
Gözləri mərcan qadasın aldığım".
Parladı ürfan qadasın aldığım
İndi tələb elm ilə ürfanədir,
Məclisimiz məclisi-fərzanədir.

Ş a h i d :

Biz şairik, unutmaz ellər bizi,
Həftələr, aylar, həmi illər bizi,
Dinlədikcə gələn nəsillər bizi,
Deyər: - bu sözlər ki həkimanədir,-
Məclisimiz məclisi-fərzanədir.

Q ə n i :

Sevməli bir dövrə düşüb baxtımız,
Peyk aparır indi aya vaxtımız.
Ulduza bir gün yetəcək taxtımız,
Gör nə gözəl şövqlü kaşanədir,
Məclisimiz məclisi-fərzanədir.

Ş a h i d :

Bizim şerlərdə tapılmaz əyər,
Şeri deyəndə, deyərik müxtəsər.
Şerimizi bəyənməyən "bədnəzər",
Şer deyil, şerimiz, aya, nədir?
Məclisimiz məclisi-fərzanədir.

Q ə n i :

İndi dəxi "meyxanaçı" az deyil,
Nəzmi bilir, "qafiyəpərdaz" deyil.
İndiki saz, "nalə çəkən saz" deyil,
İndi onun hər teli bir şanədir,
Məclisimiz məclisi-fərzanədir.

***

Soruşmaq istərdim pərvərdigardan
Nə üçün dünyaya bəs gəlib insan?!

Yaşayıb həyatda çox dolanmışıq,
Yağışdan islanıb, oddan yanmışıq,
Həvva ilə Adəmdən yaranmışıq,
Sübut edir bunu müqəddəs Quran.

Gəzirdim bağçada gözəl yar ilə,
Ömrüm, günüm keçib kaman, tar ilə,
Süzüb gözlərini intizar ilə,
Eylədi bir sual mənə yavaşdan.

Bu sözün önündə çəkirdim əzab,
Sıxılırdı ağlım, olurdu xarab.

Dedim bu suala çətindir cavab,
Vaxt, zaman göstərər olma pərişan.

Əsəndə küləklər çalxanır ləpə,
Lərzəyə gəlir dağ, dərə, çöl, təpə.
İnsanlar dünyaya gəlirlər körpə,
Fikrimdə gəzərək dolanır hər an.

Bunu təsdiq edir bütün nəsillər,
Həyatı dörd yerə bölür fəsillər
Körpə yaşadıqca şütüyür sellər,
Böyüyür, boy atır, olur növcavan.

Görsənir qaməti, görsənir boyu,
Nəhayət, edərək çox götür-qoyu,
Onu evləndirib çalırlar toyu,
Xonçası əllərdə bəslənir əlvan.

İnsan gəlməyir qəmə, qüssəyə bata,
İnsan yaratmağa gəlir həyata.
Aylar, illər ötür, o olur ata,
Övlad ondan tələb edir güzəran.

Hər daşın üstündə qurulur soba,
Həyat qanunudur bilir el-oba,
Atalar qocalıb olurlar baba,
Nəvələr söyləyib deyir babacan.

Kimi nökər gəlir, kimisi ağa,
Ya dərəyə düşür, ya qalxır dağa.
Torpaqdan yaranan dönür torpağa,
Belə qanun qoyub bizi yaradan,
Bilmirəm dünyaya nöş gəlib insan?!

## VAHİDİN

*"Gəlin tutaq qafiyəsin Vahidin, Qoy eşidək bir də səsin Vahidin" meyxanasına təxmis.*

El içində hörməti var Vahidin,
Şairlikdə qiyməti var Vahidin,
Eşqdə məhарəti var Vahidin,
Gəlin, tutaq qafiyəsin Vahidin,
Qoy eşidək bir də səsin Vahidin.

Vahidsiz keçməz idi meyxanələr,
Biganə idi ona qəmxanələr,
Olmuş idi mövzusu dürdanələr,
Gəlin, tutaq qafiyəsin Vahidin,
Qoy eşidək bir də səsin Vahidin.

Bir şölə idi o bizim diyara,
Gəlməyəcək belə ustad dünyaya,
Ruhu uçsun ol behişti - səmaya,
Gəlin, tutaq qafiyəsin Vahidin,
Qoy eşidək bir də səsin Vahidin.

Onunla fəxr edir bizim xalqımız,
Onun amalı idi amalımız,
Behiştlik etsin onu Allahımız,
Gəlin, tutaq qafiyəsin Vahidin,
Qoy eşidək bir də səsin Vahidin.

Həmrəy olub inşa edək məzarın,
Ruhu şad olsun deyə sənətkarın,
Səvabı olsun bizim oğulların,
Gəlin, tutaq qafiyəsin Vahidin,
Qoy eşidək bir də səsin Vahidin.

Vahid qəzəlxandır Azərbaycana,
Ustad qəzəlxandır Azərbaycana,
Şairlər şairi Azərbaycana,
Gəlin, tutaq qafiyəsin Vahidin,
Qoy eşidək bir də səsin Vahidin.

Şair - qəzəlxan bizə Vahid olub,
Meyxanələrdə əzəm Vahid olub,
Qəzəl yazan dürr sözə Vahid olub,
Gəlin, tutaq qafiyəsin Vahidin,
Qoy eşidək bir də səsin Vahidin.

Möhnəti - hicran ona zindan idi,
Bir ala gözlü ona sultan idi,
Vahidimiz yaxşı qəzəlxan idi,
Gəlin, tutaq qafiyəsin Vahidin,
Qoy eşidək bir də səsin Vahidin.

Rəhimayağam, deyirəm rəhmət ona,
Hər sözümdə edirəm hörmət ona,
Ürəyimdə vardır məhəbbət ona,
Gəlin, tutaq qafiyəsin Vahidin,
Qoy eşidək bir də səsin Vahidin.

***

Oturmusan səmavərdən yuxarı,
Deyir sənə səmavərin buxarı.
Ağzuva qənfet, cibivə suxarı-
Vur bədənə şurə gələ quş canın,
Nuş elə, ey xanəxərab, nuş canın.

Zurnaçı Petros nəçidir, ay qada,
Sarı səmavər kimi o züy tuta?
Tər səni həll etmiş, əritmiş daha,
Vardı səmavər kimi koppuş canın,
Nuş elə, ey xanəxərab, nuş canın.

Qəlyana az qat o "zibildən" belə,
Nöysüvü boğ, nəfsivi yığ, dəstələ.
Öz-özüvə az giriş, az qəsd elə,
Lap quruyub taqqanaq olmuş canın,
Nuş elə, ey xanəxərab, nuş canın.

Hamı səni xəstə-məcaz fərz edir,
Bir-birinə qaş-göz ilə ərz edir.
Ki, bu odur, yoxsa onun tərsidir?
Qoydu xərabə səni bayquş canın,
Nuş elə, ey xanəxərab, nuş canın.

Tüstüdən ud, çaydan ötür - çortdasan,
Yum gözüvi, fərz elə importdasan.
Bu gedişnən partdamasan, çartdasan,
Billahi, daşdır, deyərəm, daş, canın,
Nuş elə, bundan belə ta, nuş canın.

***

Bir lotu Cabbar olub,-
"Sortu" Miyanə sortu.
Onda o Cabbar idi,
İndi bu Cabbar lotu.

Onunku, toyxanələr,
Bununku meyxanələr,
Ondan abad xatirə
Bununku viranələr.
O güldürüb alırdı,
Bununku qanun "xodu".
Onda o Cabbar idi,
İndi bu Cabbar lotu.

Lap elə bil uyqudur,
Lap elə bil röyadır-
O qoca Cabbar kişi
İndi cavan sudyadır.
Onun seyfi cibiydi,
Bunun yeddi bank şotu.
Onda o Cabbar idi,
İndi bu Cabbar lotu.

O Cabbar bu Cabbarın
Fəqir quluydu, billah.
Halallıca gələndə
Bundan uluydu, billah.
O, dilotu yemişdi,
Bu qaradinməz otu.
Onda o Cabbar idi,
İndi bu Cabbar lotu.

Onun arxası eldi,
Bununkusa - sədridir.
Boy - gəncəli pəhləvan,
Sifətsə ay bədirdir.
Bir haqlı söz deyərsən,
Hırıldar şortu-şortu,
Onda o Cabbar idi,
İndi bu Cabbar lotu.

Sudya döyül, ay kişi;
Bəladu bu, lovdu bu.
Gah Starovoytova,
Gah Qorbaçovdu bu.
Rəhmət o rəhmətliyə,
Fağır potuymuş, potu,
Amma bu Cabbar dadaş,
Amma bu Cabbar lotu.

## BƏDİHƏ

Yenə salıb gül məab,
Başına qarə məcər.
Bülbül edər iztirab,
Dolanu şamü səhər.

Qumriyi-bəxtiqarə,
Düşdü yenə avarə.
Çıxıbdı kuhsarə
Əyləşibdi mükəddər.

Hökm elədi ol zaman,
Gülşənə sərvi-rəvan.
Güli-suri, nəstəran
Gərək ola növhəgər.

Bəndeyi-alicənab,
Həqdən edər ictinab.
Yenə zülmi-bihesab
Tutdu cahanı yeksər.

İki gözləri cadu,
Eyləmişəm cüstcu.
Əyləşibdir rubəru
Bu gecə şəmsü-qəmər.

Birsidi alinəsəb,
Olunubdu müntəxəb.
Bu məclisdə ba ədəb,
Əyləşibdir müsəddər.

Çöhreyi-ərğəvani,
İstəyir ala cani.
Dolanasan cahani
Yoxdur ona bərabər.

Üzü gül, xətti reyhan,
Boyu sərvi-xuraman.
Gözü nərgizi-məstan,
Üzü laleyi-əhmər.

Qəmzələri möcüzat,
Zənəxdanı müşkülat.
Şəhdi-dəhəni nabat,
Ləbi qəndi-münərrər.

Başına endi sövda,
Eşqi oldu hüveyda.
Hanı bülbüli-şeyda?
Yenə düşdü dərbədər.

Saqiyi-gülpirəhən,
Zinətü-hər əncümən.
Tutiyi-şəkkərşikən,
Əzmi-gülüstan edər.

Qaşları qövsü kaman,
Danışıb açmır dəhan.
Halı əxtəri-Keyvan,
Özü mahi-münəvvər.

Şəqayiq açmış dəhən,
Olub rövnəqi-çəmən.
Dəsteyi-zağü zəğən,
Kühü biyaban gəzər.

Qaş-gözünü süzgilən,
Ürəyimi üzgilən.
Meyxanəçi, görgilən
Bu Bağırı müxtəsər.

## HİTLERƏ BAŞSAĞLIĞI

Kiyev də getdi əldən, Hitler, başın sağ olsun,
Az qalıbdır, darıxma, işin bir sayaq olsun.

Ukraynanı tutanda, aldın ələ piyalə,
Xeyli sulandı ağzın, düşdün şirin xəyalə,
Məğlubiyyət xəbəri salmış səni məlalə.
Çağır Gerinq dostunu, dərdinə ortaq olsun,
Kiyev də getdi əldən, Hitler, başın sağ olsun.

Bəs, sən coşub cahana bərkdən haray salırdın,
Rusiyanı bir ayda "zəbt eləyib alırdın",
"Sovet qoşunlarını əzdik" - deyə bağırdın.
Goplarına inanan, gərək ki, axmaq olsun,
Kiyev də getdi əldən, Hitler, başın sağ olsun.

Güvənirdin zirehli "Bəbir"lərə, "Pələng"ə,
Bütün güclü topları çəkib salmışdın çəngə.
Bəs nə oldu axırda, işiniz düşdü ləngə?
Kimdir buna müqəssir - sal həbsə, dustaq olsun,
Kiyev də getdi əldən, Hitler, başın sağ olsun.

## YAXŞI ŞEYDİR
(Dostum Mirzə Müştağa)

Nağaraçı, nağarə yaxşı şeydir,
Mator nədir, bacarə yaxşı şeydir.

Adın Mirzə, mirzələrin mirzəsi,
Çalsın səni Cavadlının "gürzəsi".
Çox itidir meyxanamın nizəsi,
Zənnimcə, bu ibarə yaxşı şeydir.

Fikrim yoxdur sənə qoşam meyxana,
Adın düşə dilə, dişə, dastana,
Əvvəl özün öcəşmisən Soltana,
Çəkilmisən kənarə, yaxşı şeydir.

Axır düşdün bəlaya öz dilindən,
Çoxdan zəncir çeynəyirdim əlindən,
İndi özün utan öz əməlindən,
Arifə bir işarə yaxşı şeydir.

Simicliyi dərs almısan Səfərdən,
Eşitmişəm bu sözü yüz nəfərdən.
Min dayçanı, yapışginən yəhərdən,
Əyil-düzəl dübarə, yaxşı şeydir.

İstədik ki, oğurlayaq, qoymadın,
Bir balonu təkcə yedin doymadın.
Sən ki, bizə göy pamidor qıymadın
Gəl qonaq ol xiyarə, yaxşı şeydir.

Təklifimi qan bala, qurban sənə,
İncimə gər sataşsa Soltan sənə.
Meylin çəksə, verrəm badımcan sənə,
Badımcanım nahara yaxşı şeydir.

## YADDA, GÜMANDA YOXDUR
(Deyişmə)

Bir söz deyək yadda, gümanda yoxdur.

Ağamirzə:

Soyuq olanda pencək geyə bilmirəm,
Ac olanda çox da yeyə bilmirəm,
Bundan artıq heç nə deyə bilmirəm,
Bəy qabağında dayanan da yoxdur
Bir söz deyək yadda, gümanda yoxdur.

Ağasəlim:

Bu oğlan da xalqın tərəfdarıdır.
Meyxananın da bu injinarıdır,
Ölməz Vahidin bu yadigarıdır.
Ağasəlimdən Azərbaycanda yoxdur
Bir söz deyək yadda, gümanda yoxdur.

Ağamirzə:

Bu inspektir, yoxsa Qayımdır,
Söz deyirəm Haşım mənim tayımdır,
Ağasəlimdir - bu ki, mənim dayımdır,
Bunda olan zəhər ilanda yoxdur
Bir söz deyək yadda, gümanda yoxdur.

A ğ a s ə l i m:

Adam gərək sözü deyə düzünə,
Qurban olum həm qaşına, gözünə,
Bacıoğlu ki, gəlir dayının üzünə,
Bunun kimi, vallah, cavan da yoxdur
Bir söz deyək yadda, gümanda yoxdur.

A ğ a m i r z ə:

Bu işlərin hamısına yol qoymuşam.
Bir yana sağ, bir yana sol qoymuşam,
Haşım canı hər yerə qol qoymuşam,
Bunu satıram, dayını alan da yoxdur
Bir söz deyək yadda, gümanda yoxdur.

A ğ a s ə l i m:

Göz dikmirəm əlündəki ətirüvə,
İstəyirsən ətir töküm çətirüvə,
Bacıoğlumsan, heç dəymirəm xətirüvə,
Meyxanada məndən "paxan" da yoxdur
Bir söz deyək yadda, gümanda yoxdur.

## EL MAHNILARI

### LAÇIN

Araz üstə buz üstə
Kabab yanar köz üstə.
Qoy məni öldürsünlər
Bir ala göz qız üstə.

*N ə q ə r a t:*

Ay Laçın, can Laçın.
Mən sənə qurban Laçın.
Ay Laçın, can Laçın
Gəl səni götrüm qaçım.

Alma atdım nar gəldi,
Kətan köynək dar gəldi.
Qapıya kölgə düşdü
Elə bildim yar gəldi.

*Nəqərat*

Baxçaların barı gül,
Yarı qönçə, yarı gül.
Gec açıldın, tez soldun
Olmayaydın barı gül.

*Nəqərat:*

## SARI GƏLİN

Saçın ucun hörməzlər,
Gülü qönçə dərməzlər,
sarı gəlin
Bu sevda nə sevdadır?
Səni mənə verməzlər.
Neynim aman-aman
Neynim aman-aman
sarı gəlin
Bu dərənin uzunu,
Çoban qaytar quzunu.
Nə ola bir gün görəm
Nazlı yarın üzünü.

## TUT AĞACI BOYUNCA

Tut ağacı boyunca
Tut yemədim doyunca.
Yarı xəlvətdə gördüm
Danışmadım doyunca.

Qızıl üzük laxladı,
Verdim anam saxladı.
Anama qurban olum
Məni tez adaxladı.

Gedirdim yavaş-yavaş,
Ayağıma dəydi daş.
Səndən mənə yar olmaz
Gəl olaq bacı-qardaş.

## AY BƏRİ BAX

Pəncərədən daş gəlir, ay bəri bax, bəri bax.
Xumar gözdən yaş gəlir, ay bəri bax, bəri bax.
Səni mənə versələr, ay bəri bax, bəri bax,
Allaha da xoş gələr, ay bəri bax, bəri bax.

*Nəqərat:*

Ay bəri bax, bəri bax, gülüm,
Ay bəri bax, bəri bax, balam,
Ay bəri bax, bəri bax.
Akoşkanın milləri, ay bəri bax, bəri bax.
Açıb qızıl gülləri, ay bəri bax, bəri bax.
Oğlanı yoldan eylər, ay bəri bax, bəri bax,
Qızın şirin dilləri, ay bəri bax, bəri bax.

*Nəqərat*

## QALANIN DİBİNDƏ...

Qalanın dibində bir daş olaydım
Gələnə, gedənə yoldaş olaydım.
Qaladan qalaya nar yemək olmaz,
Bu gələn sonaya yar demək olmaz.

## ÇALPAPAQ

Qaraca qızın yarı da var, ay çalpapaq.
Üzündə bir xalı da var, ay çalpapaq.
Hey-hey çalpapaq,
Hey-hey gülyanaq,
Bozarxalıq, çalpapaq.

## AY LOYLU

Bizim yerlər aran olur,
Yağış yağır boran olur,
Ay loylu, vay loylu.
Bizi burda görən olur,
Çıxma dağlar sinəsinə
Ay loylu, vay loylu.

## GEDƏN GƏLMƏDİ

Qalanın düzündə yıxıldım yatdım,
Aynalı tüfəngi doldurdum atdım,
Xanlarla vuruşda qan-tərə batdım,
Bu yol nə yaman, bu yol nə yaman,
Ah vay, aman, dağlar duman.
Gedən gəlmədi, ay aman,
Kor olasan, düşman gözü, cavan qalmadı.

## SÖHBƏT SAZİLƏN

Getdim gördüm bulaqdadır, ay qız mənə bax, bax.
Əl üzünü yumaqdadır, ceyran mənə bax, bax.
Qoşa xallar yanaqdadır, ay qız mənə bax, bax.

*Nəqərat:*

Dur gəl nazilən
Söhbət sazilən
Gəl, gəl nazilən, ay nazilən
Söhbət sazilən.

Getdim gördüm su doldurur, ay qız mənə bax, bax.
Su yerinə qum doldurur, ceyran mənə bax, bax.
Qəmzəsi oğlan öldürür, ay qız mənə bax, bax.

*Nəqərat*

## NƏ DURMUSAN DAĞ BAŞINDA

Nə durmusan dağ başında qar kimi,
Bağçalarda heyva kimi, nar kimi.
A balam, ay gülüm
Neynim, neynim, neynim, neynim,
Ay sarı telli,
Ay incə belli.
Dağlara gedərsən,
Boz atı minərsən,
Ay qadan alım,
Vay qadan alım,
Yar cəfan alım.

## NEYLƏRSƏN

Qaşın qara, gözün qara,
Vəsməni neylərsən?
Qaşın gözündən qaradır
Vəsməni neylərsən?
Yaylığının yanı yaşıl, sürməni neylərsən?
Sənin ki, yarın var imiş,
Bəs məni neylərsən,
Ay qız məni neylərsən?
Vəsməni qaşa yaxanda
Canımı oda yaxanda
Bayram olur hər baxanda
Vəsməni neylərsən?
Ay qız məni neylərsən?

## GÜL OĞLAN

Evləri köndələn yar,
Bizə gül göndərən yar,
Gülün yarpıza dönsün
Məndən üz döndərən yar.

*Nəqərat:*

Ay qara çuxa,
Boz arxalıq,
A çalpapaq
Gül oğlan.
Atını yan çək,
Top qara birçək,
Hamıdan göyçək,
Gül oğlan.

Alma versəm almazsan,
Sən almadan qalmazsan,
Hansı bağın gülüsən?
İylədikcə solmazsan.

*Nəqərat.*

## SONA XANIM, ÇIX EYVANA

Sona xanım, çıx eyvana,
Bir bax bu gözəl oğlana.
Doğrusun söylə mərdana,
Hüsnü-cəmalı yaxşıdır.

Altında vardır göy atın,
Pələng kimi əl-qol atır.
Bir anda mənzilə çatır,
Cahi-cəlalı yaxşıdır.

## KÜÇƏLƏRƏ SU SƏPMİŞƏM

Küçələrə su səpmişəm,
Yar gələndə toz olmasın.
Elə gəlsin, elə getsin,
Aralıqda söz olmasın.

Samavara od salmışam,
İstəkana qənd salmışam,
Yarım gedib tək qalmışam.
Nə şirindir yarın canı,
Nə əzizdir yarın canı...

## YAR BİZƏ QONAQ GƏLƏCƏK

Piyalələr irəfdədir,
Hərəsi bir tərəfdədir,
Görməmişəm bir həftədir
Yar bizə qonaq gələcək, balam,
Bilmirəm haçaq gələcək, gülüm,
Bəlkə də sabah gələcək.

## TELLO

Çayda balıq yan gedər, Tello
Açma yaram qan gedər, Tello.
Yüz min təbib neyləsin, Tello
Əcəl gələr, can gedər, Tello.

Tello can, Tello.
Bağa girdim, gül dərdim, Tello.
Gülü yara göndərdim, Tello.
Aləm sənsiz dolansa, Tello,
Mən sənsiz dolanmaram, Tello.
Tello can, Tello.

## ALMA

Alma almaya bənzər,
Alma ağacı bəzər.
Bu yerlərin qızları
Ahu ceyrana bənzər.
Ay balam, öz gülümsən,
Gülümsən, bülbülümsən.
Bir yandan yaxın qonşum,
Bir yandan sevgilimsən.

## YARIMA BAX

Mənim öz yarıma bax, gör nə cəlal ilən gəlir,
Özü ceyran balası, bir cüt maral ilən gəlir.
Dad əlindən, ay gəlin,

Fəryad əlindən ay gəlin.
Aşaram Gürcüstanı sənin əlindən, ay gəlin,
Sənin əlindən ay gəlin.

## MEYVƏLƏRDƏ ÜÇ MEYVƏ VAR

Meyvələrdə üç meyvə var, üçü də, balam, yeməli.
Biri alma, biri armud, biri nar.
Alma sənin, armud da sənin,
Nar mənim, mənim, nar mənim,
İndi bildim sən mənimsən, mən sənin.

Bu yerlərin üç yolu var, üçü də, balam getməli,
Biri eniş, biri yoxuş, biri düz.
Eniş sənin, yoxuş da sənin,
Düz mənim, mənim, düz mənim,
İndi bildim sən mənimsən, mən sənin.

## AY DADAŞ!

Ay dadaş!
Atma daş
Mən yaralıyam.
Şəkinin, Şirvanın
Mən maralıyam.
Uca barıdan aşaram mən,
Yanıma kəniz qoşaram mən.

Versələr müftinin qızını
Keşişin qızını boşaram mən.

## BULUT ZÜLFLÜ

Bulut zülflü, ay qabaqlı gözəlin
Duruban başına dolanmaq gərək.
Bir evdə ki, sən tək gözəl olmaya
Od düşübən o ev talanmaq gərək.

*Nəqərat:*

Qadanı mən alım,
Bəlanı mən alım,
A tərlan, a ceyran,
Bəxtəvər, mən öləm.

Sara xanım sarayından baxanda,
Ağ gərdənə həmayillər taxanda,
Qaşa sürmə, gözə vəsmə yaxanda
Ağzı, burnu, qaşı, gözü tən gərək.

## EVLƏRİ VAR XANA-XANA

Evləri var, a balam, xana-xana
Mən kül oldum, a balam, a balam,
Yana-yana.
Yaylığının, a gülüm, yanı buta
Məni saldın, ay aman, ay aman,
Yaman oda.
Aman diləm, diləm, diləm,
Yandı canım.

## YARIN BAĞINDA

Yarın bağında üzüm əsgəri,
Bağın dalından həzin səs gəlir.
— Sağ ol gəl, var ol gəl,
Sən mənə mehman ol gəl.

Yarın bağında qonaq qalaydım,
Yarın bağından üzüm alaydım.
— Sağ ol gəl, var ol gəl,
Sən mənə mehman ol gəl.

## AMAN TƏKLİK ƏLİNDƏN

Haray getdi dəm əldən, balam,
Qoymaz məni qəm əldən.
Getsə dünyalar getsin, balam,
Getməsin həmdəm əldən.

*Nəqərat:*

Aman təklik əlindən, balam,
Bidad təklik əlindən.
Baş götürüb gedərəm, balam,
Bivəfa yar əlindən.

Qərənfiləm dəstəyəm, balam,
Bülbüləm qəfəsdəyəm.
Gedin deyin yarıma, balam,
Həsrətindən xəstəyəm.

*Nəqərat.*

## BİZƏ YAR GƏLİR

Ay dərya kənarında bir ev tikmişəm.
Ay hasarın çəkməmiş üstün örtmüşəm.
Ay bu gələn oğlana gözüm tikmişəm.
Bağçada güllər
Oxur bülbüllər
Belə deyirlər:
Bizə yar gəlir.

## NƏ BAXIRSAN YANI-YANI

Nə baxırsan yanı-yanı,
Olum gözlərin qurbanı.
Əvvəlki məhəbbət hanı,
Öldürmə məni ey,
Yandırma məni hey.
Dur gəl nazilən, nazilən...
Söhbət sazilən, sazilən.

## ÜÇ TELLİ DURNA

Corabının üstü buta,
Məni saldın yanar oda,
Mənim ahım səni tuta.

*Nəqərat:*

Üçtelli, dördtelli, beştelli durna.
Sən haralısan, haralı durna?
Sən getsən dağlar saralı durna,
Ovçu əlindən yaralı durna.
Yaralı, yaralı, yaralı durna,
Haralı, haralı, haralı durna?

Evlərinin dalı qaya,
Qayadan baxarlar aya,
Durnalarım gəlməz saya.

*Nəqərat:*

Evlərinin dalı təpə
Yağış gəlir səpə-səpə
Oyadıram öpə-öpə.

*Nəqərat:*

## ARAZ ÜSTƏ, BUZ ÜSTƏ

Araz üstə, buz üstə
Kabab yanar köz üstə.
Qoy məni öldürsünlər, balam
Bir alagöz qız üstə.

Araz üstə milçəyəm
Əl vurma köynəkçəyəm.
Hamıya çirkin olsam
Öz yarıma göyçəyəm.

## YAR, NEYLƏDİM SƏNƏ?

Arxalığım məndədir,
Sərmişəm çəməndədir.
Aləm gözələ dönsə
Mənim gözüm səndədir.
Yar, neylədim, neylədim sənə?
Bir dönüb baxmadın mənə.

Ay doğdu düzə düşdü,
Qara saç üzə düşdü.
Dövranın çarxı dönsün
Ayrılıq bizə düşdü.
Yar, neylədim, neylədim sənə?
Bir dönüb baxmadın mənə.

## BAZARDA ALMA

Bazarda alma, allam, sataram,
Xəlvətdə qalma, gəlləm, alaram.

*Nəqərat:*

Yar haray dillərindən,
O qara tellərindən.
Hərgah izin versən, gülüm,
Öpərəm gözlərindən.

Dağlarda çiçək, dərrəm, sataram,
Bir üzü göyçək haradan taparam?

*Nəqərat:*

Bağlarda alma, dərrəm, sataram
Uzaqda durma gəlləm, taparam.

*Nəqərat:*

Bağlarda püstə, dərrəm, sataram
Bir boyu bəstə haradan taparam?

*Nəqərat:*

Bağlarda xurma, dərrəm, sataram
Bir saçı burma haradan taparam?

*Nəqərat:*

## YERİ, DAM ÜSTƏ YERİ

Yeri dam üstə yeri, balam,
A qızıl cam üstə yeri.
Ayaqların incisə, gülüm,
Ay çıx sinəm üstə yeri.

*Nəqərat:*

Getdim gördüm yar otaqda
Qoşa-qoşa xal yanaqda.
Ay yanaqda, al yanaqda,
Ay ölürəm.

Zərxaradan arxalıq, balam,
Ay əşrəfidən yaxalıq.
Bir busə ver o xaldan, balam,
Ay dadına yetsin xalıq.

*Nəqərat:*

Ayağında çəkməsi balam,
Ay qızıldandır düyməsi.
Nazlı ceyrana bənzər, gülüm
Yarın özün öyməsi.

## AY QIZ, SƏNƏ MAYİLƏM

Ay qız, sənə mayiləm,
Boynunda həmayiləm.
Dost payı şİrin olar
Hər nə versə qailəm.
Qaşın, gözün, şirin sözün
Aldı mənim canımı.
Mən sənə qurban

Ay xanım-xanım
Sən mənim canım
Gəl səni alım
Qadanı alım
Ay gözəl.

## GƏLİRƏM, GEDİRƏM...

Gəlirəm, gedirəm xəbərin olsun,
Gümüş piyalələr mey ilə dolsun, a dilbər.

## YADIMA SƏN DÜŞƏNDƏ

Dağlara çən düşəndə,
Sünbülə dən düşəndə,
Ruhum qəfəsdə oynar, gülüm
Yadıma sən düşəndə.

## QALADA YATMIŞ İDİM

Qalada yatmış idim
Top atdılar oyanmadım,
Sazilən, söhbətilən oyatdılar.
Qışa yalvardı payız,
Bülbül oxut, oxutmadı,
Yaz ilən, bahar ilən oxutdular.

## GÖZƏLİM — SƏNSƏN

Gözəlim — sənsən
Gözümün nuri
Cənnətdə yoxdur
Sən kimi huri.
Öldürür məni
Yarımın cövri
Ona mən yar oldum
Ona mən vuruldum.
Yaralıyam, dəymə, dəymə
Dəymə, dəymə.
Gülümün butasın
Əymə, əymə.

## SÜSƏN SÜNBÜL

Süsən-sünbül, ay gülüm, bitirmişəm,
Mən yarımı, ay gülüm itirmişəm.
Ömrü başa yetirmişəm
Aman Gülgəz, yarım hanı, a gülüm, balam hanı?

*Nəqərat:*
Ağ üzdə xalın, a gülüm,
O məh camalın, a gülüm.
Yandırdı məni, a gülüm
Nədir xiyalın?

Yar əlindən, a gülüm, badə içdim,
Mətləbimə, a balam, mən yetişdim.
Gəcavəsin mən özüm bəzəmişdim
Aman Gülgəz, yarım hanı, a gülüm, balam hanı?

*Nəqərat*

## ÜÇ GÜNDƏN BİR, BEŞ GÜNDƏN BİR

Könlüm istər görəm yarı
Üç gündən bir, beş gündən bir.
Arzularam vəfadarı
Üç gündən bir, beş gündən bir.
Gəl, gəl ay gəl, gəl, ay gözəl yar.
Səndədir, səndədir hər ixtiyarım.
Verməərəm, verməərəm mən səni əldən
Mən necə əl çəkim, ey gözəl, səndən?

## QARA TELLƏR

Qara tellər, qara tellər
Şəvə kimi qara tellər.
Qıvrılanda qara tellər
Yar könlümü qarət eylər.

Qara tellər, qara tellər
Yar könlümü qarət eylər.

Qara gözlər, qara gözlər
Qapqaradır qara gözlər.
Cilvələnib şux baxanda
Qara gözlər kimi gözlər?

Mən aşiqəm, ağ barama
Qıvrım teli çox darama.
Sənin ki, könlün məndədir
Özgəsini gəl arama.

## GİRDİM YARIN BAĞÇASINA

Girdim yarın bağçasına
Çiçəklər açmış.
O yar mənim ürəyimə
Yaralar sancmış.

Gəl, gəl, gəl gözəl yarım, gəl alım səni
Əgər qismətim olarsa alaram səni.

Ömrüm boyu daş daşıdım
Gəmim dolmadı.
Gənc yaşımdan bir qız sevdim
Mənim olmadı.

## AMAN NƏNƏ

Asta yeri, kəmər düşər belindən
Aman nənə, zalım nənə, yar, nənə!
Ayrı düşdüm, gülümdən, bülbülümdən
Aman nənə, zalım nənə, yar nənə.
O qədər sevirəm düşməz dilimdən.

*Nəqərat:*

Ay aman yar, ay zalım yar,
Ay gözəl yar, ay gül yarım.

Yarıma demişəm mənə saz alsın
Onu çalım dərdi qəmim azalsın.
Məgər mən ölmüşəm yarım qız alsın?

*Nəqərat*

Bir yaylığım vardır gülü özündən
Dolanır boynuma özü özündən
Mən nə dedim küsdün mənim sözümdən?

*Nəqərat*

## QOY GÜLÜM GƏLSİN

Mən aşiqəm zirəsən,
Zəfəransan, zirəsən.

O günə qurban olum
Sən qapıdan girəsən.

*Nəqərat:*

Qoy gülüm gəlsin, ay nənə,
Qoy yarım gəlsin, ay nənə.
Qapıda duran oğlana
İrəhmin gəlsin nənə.

Qarabağın düzü var,
Düzlərində quzu var
İki könül bir olsa
Kimin ona sözü var?

*Nəqərat*

## QALALI

Bu gün ayın üçüdür
De gülüm nanay, ay naninay.
Girmə bostan içidir,
Yar girmə bostan içidir.
Dodaqların bal şəkər,
Dilin badam içidir.

Qız, belin incədir, incə,
Ləblərin qönçədir qönçə.

Dam üstədir damımız
De gülüm nanay, ay naninay.
Qoşadır eyvanımız.
Sən ordan çıx, mən burdan
Kor olsun düşmanımız.

## SONA BÜLBÜLLƏR

Su atdım hara dəydi, sona bülbüllər?
Əlim divara dəydi, sona bülbüllər.
Dilim-ağzım qurusun, sona bülbüllər
Nə dedim yara dəydi, sona bülbüllər?

Elə yar-yar deyirlər
Heç məni demirlər.
Elə bil yar deyiləm
Heç məni dindirməz.

Dəryada gəmim qaldı
Biçmədim zəmim qaldı.
Çox çəkdim cəfasını
Mənə dərd-qəmim qaldı.

## QADAN ALIM

Araz axır qıyqacı
Ay qız, ay qız, amandır
Budur gəlir cüt bacı
qadan alım.
Biri mənim öz yarım,
Biri başımın tacı.

Araz axar lil ilə,
Dəstə-dəstə gül ilə.
Sənlə peyman etmişik
Şirin-şirin dil ilə.

Qızıl gül oyum-oyum
Dərim sənəmə qoyum.
Yağış yağar yer doymaz
Mən səndən necə doyum?

## QUBANIN AĞ ALMASI

Qubanın ağ alması
Şirindir bağ alması.
Yarım gələnə qalıb
Yaramın sağalması.

Qubadan alma aldım
Yarıma yola saldım.
Gözlədim yar gəlmədi
Heyva kimi saraldım.

## ALMANI ATDIM XARALA

Almanı atdım xarala
Qaldı sarala-sarala.
Dağlarda döndüm marala.
A tirmə köynək,
A tirmə köynək, sarı çəpkən gəlin haralısan?
Özü göyçək, sözü göyçək hara maralısan?

## GEDİRƏM AXI

Mən gedirəm Zəngilana
Ay ana, ana,
Günləri sana
Gedirəm axı.
Atlarımız yəhərlidir
Qızıl, gümüş kəmərlidir.
Ana, məndən arxayın ol
Sənin oğlun hünərlidir.
Ay ana, ana,
Günləri sana
Gedirəm axı,
Gedirəm axı...

## ŞUŞANIN DAĞLARI

Şuşanın dağları seyrək dumanlı,
Qırmızı qoftalı, yaşıl tumanlı,
Dərdindən ölməyə çoxdur gümanlı,
Ay qız bu nə qaş-göz, bu nə tel
Ölərəm dərdindən onu bil.
Danışmasan da bala barı gül.
Şuşada axşamlar yanar ulduzlar
Onlardan gözəldir gəlinlər, qızlar
Yol üstə dayanıb yarını gözlər.

## DAĞLARA ÇƏN DÜŞƏNDƏ

Dağlara çən düşəndə,
Sünbülə dən düşəndə,
Ruhum bədəndə oynar, bala
Yadıma sən düşəndə.

Dağların qarı mənəm,
Gün vursa ərimərəm.
Qəbrim qüzeydə qazın
Cavanam, çürümərəm.

## AY GÜLƏBƏTİN

Mən aşiq gözlərinə,
Sürmə çək gözlərinə.
Özüm özünə qurban
Gözlərim gözlərinə.

Dağlarda çiçək, ay Güləbətin,
Hamıdan göyçək, ay Güləbətin
Doldur ver içək, ay Güləbətin, hey...

Əzizim od yandırmaz,
Yar, səni od yandırmaz.
Elə ki, sən yandırdın
Heç vədə od yandırmaz.

Papirosum yana-yana,
Od düşüb şirin cana.
Qoyub səni gedərəm
Qalarsan yana-yana.

## QARAGİLƏ

Gəlmişəm otağına oyadam səni, Qaragilə,
Oyadam səni.
Nə gözəl xəlq eləyib yaradan səni, Qaragilə,
Yaradan səni.
Götürüb mən qaçaram aradan səni, Qaragilə,
Aradan səni.
Qızıl gül əsdi,
Səbrimi kəsdi,
Sil gözün yaşın,
Qaragilə,
Ağlama, bəsdi.

Təbrizin yolları dolanbadolan.
Qaragilə, dolanbadolan.
Sən ki, məni sevmirsən, get ayrı dolan, Qaragilə,
Get ayrı dolan.
Nə mənə qız qəhətdir, nə sənə oğlan, Qaragilə,
Nə sənə oğlan.

Göz yaşımla sularam Tehran yolunu, Qaragilə,
Tehran yolunu.
Bir ildir görməmişəm yarın boyunu, Qaragilə,
Yarın boyunu.
Ağac olaydım,
Yolda duraydım,
Sən gələn yola, Qaragilə,
Kölgə salaydım.

# KİTABIN İÇİNDƏKİLƏR

### XIV-XVI əsrlər Cağatay şairləri



### XV-XVI əsrlər Azərbaycan şairləri



### XV-XVI əsrlər Türkiyə şairləri



## XVII-XVIII ƏSRLƏR



### XVII əsr Türkiyə şairləri

XVII əsr Azərbaycan şairləri



XVIII əsr Türkiyə şairləri



XVIII əsr Azərbaycan şairləri

### XVIII əsr türkmən ədəbiyyatı



## XIX ƏSR

### XIX əsrin birinci yarısı Azərbaycan ədəbiyyatı



### XIX əsrin birinci yarısı və ortalarında Türkiyə ədəbiyyatı

## XIX əsrin birinci yarısı türkmən şairləri



## XIX əsrin ikinci yarısı Azərbaycan ədəbiyyatı

### XIX əsrin ikinci yarısı Türkiyə şairləri



### XIX əsrin ikinci yarısı türkmən şairləri



### XX ƏSR
### (30-cu illərə qədər)

### Azərbaycan və Türkiyə şairləri



### "Füyuzat" şairləri

**"Molla Nəsrəddin" şairləri**



**Türkiyə şairləri**



**Kərkük şairləri**



**Azərbaycan şairləri**

## XALQ YARADICILIĞI



Nizaminin “Sirlər xəzinəsi” poemasına miniatür.

Nizaminin "Leyli və Məcnun" poemasına miniatür.





Nizaminin "Yeddi gözəl" poemasına miniatür.



Nizaminin “Leyli və Məcnun” poemasına miniatür.




M.Füzulinin "Həqiqət üs-süada" əsərinə miniatür.



Bakıda Məhəmməd Füzulinin abidəsi.



Abasqulu ağa Bakıxanov
(Qüdsi)



Əli bəy Hüseynzadə. "Bibiheybət məscidinin görünüşü".




Bakıda Hüseyn Cavidin abidəsi.



Bakıda Cəfər Cabbarlının abidəsi.